Mətni hazırlayıb tərtib edənlər: **İsrafil Abbaslı**
**Bəhlul Abdulla**

Redaktoru: **İsrafil Abbaslı**

**398.2'094754 - dc 21**
**AZE**
**Koroğlu.** Bakı, "Lider nəşriyyat", 2005, 552 səh.

Azərbaycanın şifahi xalq ədəbiyyatının qiymətli əsəri olan "Koroğlu" dastanında xalqımıza məxsus qəhrəmanlıq, vətənpərvərlik, humanizm, dostluq, qardaşlıq, qonaqsevərlik və başqa xüsusiyyətlər öz parlaq bədii ifadəsini tapmışdır. Aşıq yaradıcılığının bu əzəmətli abidəsi dəfələrlə müxtəlif şəkillərdə nəşr edilmişdir. Hələ XIX əsrin 30-cu illərindən başlayaraq müxtəlif mətbuat səhifələrində eposun əsas qəhrəmanı və ayrı-ayrı surətləri, eləcə də onların adları ilə bağlı abidələr haqqında ilk məlumatlar, rəvayətlər, əfsanələr və kiçik epizodlar nəşr olunmağa başlamışdır.

"Koroğlu" eposunun bu nəşri elmi arxivlərdə qorunan mövcud qollar, həmçinin son illərdə toplanmış materiallar əsasında tərtib olunmuşdur. Bu qollar eposun süjet xəttinə müvafiq olaraq ardıcıllıqla, əsərin obrazlar sisteminin inkişaf dinamikasına uyğun sıralanmışdır. Tərtib işi "Ön söz" və "Koroğlu" arxivinin təsviri" bölmələri ilə də təchiz edilmişdir.

**ISBN 9952-417-45-2**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
“**Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# AZƏRBAYCAN QƏHRƏMANLIQ EPOSU

Poetik söz sənəti aləmində Koroğlu – Goroğlu – Qurqulu silsiləsindən ibarət qəhrəmanlıq dastanlarının xüsusi siqləti olmuşdur. Bu zəngin mənəvi irsdə ümumbəşəri məsələlərlə yanaşı yerli zəminlə, milli adət-ənənələrlə, hər bir yaradıcının – xalqın həyat tərzi, ovqatı ilə bağlı qəhrəmanlıq səhifələri üstünlük təşkil etmişdir ki, bunun da təbii səbəbləri vardır.

Bir sıra türk, həmçinin qonşu xalqlar arasında geniş vüsət almış "Koroğlu" versiyaları sırasında Azərbaycan eposunun özünəməxsus mövqeyi olmuşdur. Azərbaycan "Koroğlu"sunun qaynaqları çoxşaxəlidir və yüzilliklərin dərinliyinə gedən əski köklərə malikdir. Zəngin bir tarixi axarda formalaşan, doğma torpaq və zəmində intişar tapan Azərbaycan qəhrəmanlıq eposu bu ölkənin mədəniyyəti çərçivəsindən çox-çox uzaqlarda yayılıb yaşamışdır. Dastanın bir sıra Avropa və rus dillərində nəşrləri isə onun geniş ictimaiyyət arasında böyük rəğbət qazanmağına zəmin yaratmışdır.

"Koroğlu" dastanının ayrı-ayrı qol və epizodları, hekayət və rəvayətləri, başlıcası isə nəğmələri əlyazmasından daşbasmasına qədər uzun bir təkamül yolu keçmişdir. XVII-XVIII yüzilliklərə aid Azərbaycan cünglərində, eləcə də həmin əsrlərdə qonşu xalqların əlifbaları ilə toplanmış onlarla əlyazmalarında, şeir məcmuələrində, o cümlədən "Nəğmələr kitabı"nda (Təbriz, 25 yanvar, 1721), Əndəlib Qaracadağinin "Şeirlər məcmuəsi"ndə (1804) Koroğlunun adı ilə bağlı onlarla örnəklərin özünə yer tapması eposun Qafqaz xalqları içərisində geniş vüsət aldığını nümayiş etdirir.

Dastanın zəngin və önəmli nəşr tarixçəsi vardır. Onun ilk çapı XIX yüzilliyin 30-cu ilinə təsadüf edir. Həmin mənbədə dastanın kiçik bir epizodu verilmişdir ki, bu da daha çox məlumat səciyyəli rəvayət – hekayət kimi diqqəti cəlb edir[1].

Eposun başqa bir variantı 1840-cı ildə çap olunmuşdur. Onun müəllifi İ.Şopen Cənubi Azərbaycanda Araz çayı sahilindəki kənddə Ömər adlı türk aşığından topladığı bu nümunəni rus dilinə təbdil-tərcümə etmişdir[2].

Toplayıcının qeydlərindən bəlli olur ki, ifaçı-aşıq çunqurun müşayiəti ilə Koroğlunun əfsanəvi qəhrəmanlığını tərənnüm etmiş və onun şücaəti barədə həyəcanlı nəğmələr oxumuşdur. Lakin İ.Şopen toplamış olduğu bu mətni bir

---

[1] Деревня Огруджа, замок разбойника Урушана-Кероглы, его история, рассказ об эриванском Сардаре, – "Тифлисские ведомости", 1830, №68.

[2] И.Шопен. Кер-оглу. Татарская легенда, – Журн. "Маяк современного просвещения и образованности. Труды ученых и литераторов русских и иностранных", гл. I-II, СПб., 1840, гл.III., с.12-25.

erməninin tərcüməsindən sonra yazıya köçürmüşdür. Məhz bu səbəbdən də o, mövcud mətnin dəqiq olmayacağını etiraf etmişdir.

İ.Şopen variantının məzmun çalarları, burada cərəyan edən hadisə və əhvalatların inkişaf dinamikası belə bir qənaət doğurur ki, araşdırıcıların göstərmiş olduqları bir çox qüsurlara[1] baxmayaraq bu toplama-təbdil işi "Koroğlu"nun süjet xəttinin əsas düyün nöqtələrini qoruya bilmişdir. Diqqətəlayiq cəhət isə onda özünü göstərmişdir ki, İ.Şopen dastan qəhrəmanının mənşəyini bilavasitə türk aləmi ilə bağlamışdır. Bu isə eposun genezisi baxımından xüsusi dəyərə malik bir təşəbbüs kimi qiymətləndirilməlidir.

1830-cu ildən İranda Rusiya missioner təşkilatında, Təbrizdəki rus səfirliyində tərcüməçi işləmiş, sonralar isə Rəştdə, Gilanda (1832-1834) səfir vəzifəsini tutmuş polyak şərqşünası, şair və tərcüməçi Aleksandr Xodzko "Koroğlu" dastanının hazır əlyazmasının əldə edilməsi, onun ingiliscəyə tərcüməsi və çapı işində təqdirəlayiq xidmət göstərmişdir[2].

Bir il sonra bu nəşr O.Volfun tərcüməsində almanca çap olunmuşdur (1843). "Koroğlunun sərgüzəşt və improvizasiyaları" 1853-cü ildə Jorj Sand və Adolf Brelyenin tərcüməsində fransız oxucularına da çatdırılmışdır.

A.Xodzko nəşrinin ruscaya tərcüməsi və çapı isə S.S.Pennin adı ilə bağlıdır[3]. Bu nəşr eposun rusdilli oxucular arasında geniş şöhrət qazanmasına zəmin yaratmış, bundan sonra dastanın bir sıra qol, epizod və nəğmələri müxtəlif peşə sahibləri – müəllim, tələbə, etnoqraf, şərqşünas və b. tərəfindən toplanaraq ayrı-ayrı mətbuat səhifələrində dərc olunmuşdur[4].

Bəllidir ki, S.S.Penn "Koroğlu" eposu ilə yaxından tanış idi. O, Tiflis ədəbi mühiti üçün adi hal sayılan aşıq-saz məclislərinin iştirakçısı olmuş, burada xalq qəhrəmanının şəninə qoşulmuş dastan və nəğmələrə dəfələrlə qulaq asmışdı. Bu münasibətlə S.S.Penn tərcüməsinə yazmış olduğu "Mütərcimdən" başlıqlı müqəddimədə qeyd edirdi ki, "Koroğlunun improvisiyaları Qafqazda yerli sazəndələrin, gəzib-dolaşan nəğməkarların dilində tez-tez eşidilir. Burada təqdim olunan improvizasiyalar tanınmış şərqşünas Aleksandr Xodzkonun Şərqə səyahəti və onun burada olduğu on üç il müddətində fars

---

[1] В.М.Жирмунский, Х.Т.Зарифов. Узбекский народный героический эпос, М., ОГИЗ, 1947, с.507; Б.А.Каррыев. Эпические сказания о Кер-оглы у тюркоязычных народов, М., изд-во "Наука", 1986, с.23-24; M.H.Təhmasib. Azərbaycan xalq dastanları (orta əsrlər), Bakı, "Elm", 1972, s.11-12.

[2] A.Chodzko. Specimens of the popular, poetry of Persia, as found in the adventueres and improvisations of Korroqlu, the bandit Strel of Persia, ete London, 1842.

[3] Кер-оглы, восточный поэт-наездник, полное собрание его импровизаций с присовокуплением его биографии, перевод с английского С.С.Пенн, "Кавказ", 1856, №21, 24, 26, 27, 30, 34, 36-42; Отдельный оттиск, Тифлис, 1856.

[4] P.Əfəndiyev. "Koroğlu" dastanı rus mətbuatında, Azərb. SSR EA Xəbərləri, ictimai elmlər seriyası, 1958, №1, s.53-64; М.З.Садыгов "Кер-оглы" в русской прессе 1856-го года; Azərb. SSR EA Məruzələri, XV cild, 1959, s.973-975.

və türk dilində topladığı müxtəlif dövrlərə aid yerli rəvayətlərdir. Xodzko kimi nüfuzlu şərqşünasın şəxsiyyəti, habelə mənim bilavasitə koroğluxanları dinləmək imkanı əldə etməyim, belə bir fikir söyləməyə əsas verir ki, bu toplama işini qüsurlu improvizasiya kimi qəbul etmək doğru olmaz"[1].

Buradan hər şeydən qabaq o qənaət doğur ki, Parisin Milli Dövlət kitabxanasında saxlanılan "Koroğlu"nun əlyazması həqiqətən də A.Xodzkonun Cənubi Azərbaycandan əldə etdiyi və tərcümə zamanı faydalandığı yeganə qaynaq – eposun ən qədim əlyazma nüsxəsi olmuşdur. O da maraqlıdır ki, S.S.Penn öz tərcüməsində şərq ənənələrindən doğan koloriti, xüsusilə dastançılıq üslubunu qorumağa çalışmış, eposda özünə yer tapmış bir sıra arxaik sözləri, o cümlədən milli zəminlə, xalq təfəkkürü ilə bağlı söz və anlayışları orijinalın dilində olduğu kimi saxlamışdır. S.S.Pennə görə Koroğlunun mənşəi dəqiq şəkildə müəyyənləşdirilməsə də, onun şəxsiyyəti yalnız Asiyada deyil, Avropada da geniş şöhrət tapmışdır.

Xatırladılan bu nəşrlərlə yanaşı XIX yüzilliyin ortalarından etibarən Zaqafqaziyanın əsas mədəni mərkəzlərindən sayılan Tiflisin rusdilli mətbuat orqanlarında bir aşıq-şair kimi Koroğlunun şəxsiyyəti, apardığı mübarizələrin məqsəd və amalı, el qəhrəmanının hakim dairələrə olan münasibəti, dəstə başçısı kimi yenilməzliyi və s. barədə geniş məlumatlar, o cümlədən dastan səpgili rəvayət-hekayətlər özünə əsaslı yer tapmışdır[2]. Bu qəbil yazılar içərisində Zaqafqaziya müəllimlər seminariyasının tələbəsi Mirzə Vəlizadənin "Koroğlu" başlıqlı məqaləsi diqqəti daha çox cəlb edir. Maraqlıdır ki, toplayıcı – müəllif hər şeydən öncə, Koroğlu nəğmələrini orijinalda təqdim etməyi zəruri saymış, sonra isə onların rus dilinə tərcümələrini vermişdir. Bu nəğmələrin xalq içərisində geniş vüsət almasından danışan M.Vəlizadə yazmışdır:

"Zaqafqaziya tatarları (türklər-İ.A) bilavasitə yaradıcısı saydıqları Koroğlunun nəğmələrini böyük həvəslə oxuyurlar. Xalq aşıqları (nəğməkarları) balalaykanın (sazın-İ.A.) müşayiəti ilə Koroğlunun həmin nəğmələri hansı şəraitdə qoşduğunu ətraflı təsvir edirlər. Ancaq bütün bunlara baxmayaraq Koroğluya aid edilən bir çox nəğmələrin yaranması qaranlıq və müəmmalı qalmaqdadır şübhəsiz ki, öz qaynaqlarına görə bu nəğmələr xalqa aiddir – çünki hər şeydən öncə, onlarda tamamilə xalqın rəngarəng düşüncə tərzi aydın şəkildə öz ifadəsini tapmışdır"[3].

---

[1] С.С.Пенн. От переводчика, Кер-оглы – восточный поэт-наездник, с.1-3.

[2] А.В. Сказка о Кер-оглу, Тифлис, "Кавказ", 1846, №39; Из записок кавказского старожила, селение Огруджа, замок Кер-оглы, "Кавказ", 1853, №51; К.Горбунова. Замок Кер-оглы из грузинских легенд, "Живописная Россия", 1903, т.III., №148; П.Краснов. "Кер-оглы и Керем", "Русский инвалид", 1903, №5; yenə onun: Кавказские заметки и легенда о Кер-оглы, "Кавказ", 1903, №17.

[3] М.Велизаде. Предание о разбойнике Кер-оглы, СМОМПК, IX, отд.II, 1890, с.122.

“Koroğlunun rəvayət və sərgüzəştləri”nin gürcü xalqı içərisində yayılması, gürcü aşıqlarının iştirakçısı olduğu saz-söz məclislərində özünə əsaslı yer tapması da ötən yüzilliyin ortalarına təsadüf edir[1]. Milliyyətcə gürcü olan Xristafor Cəlalov “Koroğlu” başlığı ilə çap etdirdiyi rəvayətdə bu barədə yazırdı: “Xalq arasında Koroğlunun həyatına dair külli miqdarda gözəl, xoşagələn əfsanə və hekayətlər dolaşır. Onun igidliyi səyyar gürcü aşıqlarının ən sevimli nəğmə və rəvayətlərini təşkil edir... Asiyada aşıqlar tarixçilərin yerini tutmaqla, hamının hörmət və rəğbətini qazanmışlar. Belə şairlərin sırasında demək olar ki, birinci yeri hazırkı dövrdə hamı tərəfindən oxunan, hərarətli hisslər və yüksək ideallarla dolu qoşmaları olan Koroğlu tutur”[2].

Təsadüfi deyildir ki, eposun S.Penn nəşrindən bir müddət sonra həmin çapdan götürülmüş gürcücə ilk sərbəst tərcümə meydana çıxmışdır[3]. Yenə həmin nəşrin I, II və III məclislərinin gürcü dilinə sərbəst tərcüməsi S.Dieli tərəfindən müxtəlif illərdə iki dəfə dərc olunmuşdur[4].

“Koroğlu”nun yurd (nəsr) hissəsini gürcü dilində nəzmə çəkməklə dastanın şeirlərinin əsas formasını saxlayan David Givişvili eposu ayrı-ayrılıqda (1887, 1891, 1911 və 1912-ci illər) dörd kitab şəklində dərc etdirmişdir. Kitabların titul səhifələrindəki “tatarcadan (azərbaycancadan) tərcümə olunub şerə çevrilmişdir” – qeydləri də təsdiq edir ki, D.Givişvili nəşrinin əsasını Azərbaycan “Koroğlu”su təşkil edir. Maraqlıdır ki, mütərcim dastanı nəşrə hazırlayarkən Aşıq Zülali, Aşıq Camali və Y.Stepanovdan topladığı qollardan da faydalanmışdır.

“Koroğlu” dastanının iki rəvayətini də Zaxari Çiçinidze (Z.Mtasmindeli) toplayıb dərc etdirmişdir[5].

Gürcü ziyalıları tərəfindən toplanmış “Koroğlu” rəvayətlərinə “Сборник материалов для описания местностей и племен Кавказа” (СМОМПК) məcmuəsinin səhifələrində də rast gəlirik. Zaqafqaziya müəllimlər seminariyasının tələbəsi G.Şamilovun yazıya aldığı bu nümunədə[6] qeyd edildiyi kimi “...heç bir məqsədi, ictimai dünyagörüşü olmadan igidliyə girişən və “yarımvəhşi həyat sürən” Koroğlu surəti” canlındırılmışdır[7].

---

[1] Д.Алиева. Из истории азербайджанско-грузинских литературных связей, Баку, изд-во АН Азерб. ССР, 1958, с.56-61; В.Гаджиев. Грузинские ашиги, творившие на азербайджанском языке, автореф. канд. дисс., Баку, 1984, с.11-12; H.Vəliyev. Azərbaycan folkloru və ədəbiyyatı gürcü mənbələrində, Yazıçı, Bakı, 1984, s.11-40.

[2] Х.Джалалов. Кер-оглы, “Кавказ”, 1847, №22.

[3] “Tsiskari” jurn. 1872, №2, s.95-107 (gürcü dilində).

[4] Знаменитый ашыг и именитый герой Кер-оглы, Тифлис, 1887, 1908.

[5] Z.Mtasmindeli. Koroğlu, “Droeba” qəz., 1878, №147 (gürcü dilində).

[6] “Грузинские предания и сказки”, “Koroğlu”, СМОМПК, 1898, вып.XXIV, с.82.

[7] F.Fərhadov. “Koroğlu” dastanının Zaqafqaziya versiyasına dair, “Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər”, üçüncü kitab, Bakı, “Elm”, 1968, s.50.

“Koroğlu” eposu ilə maraqlanan və onu yazıya alan müəlliflərdən biri də akad. N.Y.Marr olmuşdur. O, “Рассказ Кер-оглы” başlığı ilə topladığı nümunəni (1904) erməni və gürcü filologiyasına dair araşdırmalarında çap etdirmişdir. Bu qol – rəvayətin yurd hissəsinin gürcü dilində, şeirlərinin isə gürcü və Kirill əlifbasında Azərbaycan türkcəsində verilməsi belə bir qənaət doğurmuşdur ki, Zaqafqaziyanın digər qonşu xalqlarındakı kimi Gürcüstandakı “Koroğlu” dastanı da əsasən Azərbaycan saz-söz sənətkarlarının yaradıcılıq məhsulu olmuşdur[1].

Erməni aşıqları, həmçinin mütərcimləri də “Koroğlu” eposunun təbdil və tərcüməsinə xüsusi fikir vermiş, bu silsilədən sayılan bir neçə qol-əhvalatı ayrıca kitabçalar şəklində nəşr etdirmişlər. Əlbəttə, bu ənənənin özünəməxsus tarixi kökləri olmuşdur. Maraqlıdır ki, hələ 1872-ci ildə eposun bir hissəsi erməni əlifbası ilə Azərbaycan türkcəsində nəşr edilmişdir[2].

Aşıq Camalinin təbdil-tərcüməsi ilə dərc olunmuş ikinci kitab eposun Giziroğlu Mustafa bəy və Bolu bəy qollarını əhatə edir[3]. Mütərcim kitaba müqəddiməsində sadə kənd camaatının Azərbaycan dastanlarını, o sıradan “Koroğlu” hekayətlərini böyük məhəbbətlə sevdiyini nəzərə çatdıraraq o vaxt yeddi qolu yayılmış bu eposun ancaq üç əhvalatını (hissəsini) kitab halına salmağı qərara almış, yaxın vaxtlarda isə qalan dörd qolu da aşıqların söhbətləri əsasında işləyib oxuculara çatdırmağı vəd etmişdir.

Tərcüməyə müqəddiməsində – “bu nağılları (dastanları – İ.A.) tərcümədən məqsəd xalq arasında mütaliəni gücləndirməkdir”, çünki son illərin təcrübəsi əyani şəkildə təsdiq edir ki, elmi və tarixi kitablara nisbətən dastanlar daha çox oxunur – deyən aşıq belə qənaətə gəlmişdir ki, erməni əməkçiləri kiçik yaşlarından başlayaraq Azərbaycan aşıqlarından müxtəlif dastanları dinləyərək təsirlənmişlər. “İndiki ictimaiyyət türkcə dinlədiyi o dastanları, erməni dilində də oxumağı arzu edir”[4].

Alimlərin “Koroğlu” eposu haqqında müxtəlif fikirlər söylədiyini, həmin məsələni araşdırmağın isə öz imkanlarından yüksəkdə dayandığını xatırladan müəllif tarixi şəxsiyyət kimi xalq qəhrəmanının yaşadığı dövrü də müəyyənləşdirməyə çalışmışdır. O yazır: “...aşıqlar qeyd edirlər ki, Koroğlu 280-290 il bizdən əvvəl yaşamışdır. Bu isə İran şahı Şah Abbas və türk hökmdarı Sultan Muradın dövrünə təsadüf edir. Koroğlunun nəğmələrində də çox yerdə onların adı xatırlanır”. Aşıq Camali daha başqa misallar gətirərək, nəhayət, belə nəticəyə gəlmişdir ki, Koroğlu 1600-cü illərdə yaşamışdır.

---

[1] Н.Ю.Марр. Тексты и разыскания по армяно-грузинской филологии, кн.VI, СПб., 1911.

[2] Hekayəti Koroğlu, İstanbul, Hovsen Kavafyanın mənbəəsi, 1872.

[3] Koroğlunun nağılı. Giziroğlu və Bolu bəylə baş vermiş əhvalatlar, türkcədən tərcümə edəni M.Taliantsi Aşıq Camali, I hissə, Tiflis, M.Vartanyantsın mətbəəsi, 1897.

[4] Koroğlunun nağılı. Giziroğlu və Bolu bəylə baş vermiş əhvalatlar, müqəddimə, s.2.

“Koroğlu”nun Aşıq Camali variantı eposun həmin illərdə, həmçinin az sonra Türkiyə və Azərbaycanda[1] çap olunmuş nüsxələri ilə qarşılıqlı şəkildə müqayisə edilərsə, belə bir qənaətə gəlmək olar ki, dastanın əsas süjeti eynilə erməni nəşrində də qorunmuşdur. Lakin dastan-tərcüməyə bir sıra əlavələr də olunmuşdur. Bu baxımdan təbdildəki milliləşdirmə (özününküləşdirmə) xətti üstünlük təşkil edir.

“Koroğlu” eposu silsiləsindən ayrı-ayrılıqda üç kitabça nəşr etdirmək fikrində olan Aşıq Camali ikinci kitabını “Koroğlu nağılları”nın ikinci və sonuncu hissəsi adlandırmaqla öz işini tamamlamışdır. Dastanın Azərbaycanda nəşr olunan variantındakı süjet, başqa sözlə Dəmirçioğlu ilə baş vermiş əhvalatlar və Telli xanımın Çənlibelə gətirilməsi, həmçinin Həmzənin Çənlibelə gəlib Qıratı qaçırması epizodları cüzi fərqlərlə Aşıq Camali nəşrində də nəql olunur[2].

“Koroğlu” eposunun tərcüməsi, təbdili, nəşri ilə məşğul olan başqa bir müəllif Nəğməkar Həyat təxəllüslü aşıq-şairdir. Müəllif kitaba yazdığı müqəddimədə dastan barədə məlumat verməyə çalışmış, tərcümənin məqsəd və vəzifələri haqqında maraqlı mülahizələr söyləmişdir. Eposu elmin müxtəlif sahələri ilə müqayisə edən mütərcim yazır: “Təbiətşünaslıq üçün roman (dastan – İ.A.) lazım olmadığı kimi dastançılıq üçün də təbiətşünaslıq və fəlsəfə bir o qədər gərək deyil. Elmin başqa sahələri də belədir.

Bunların hamısını bir yana qoyub xalqın sadə, həmçinin orta təbəqəsini nəzərə alsaq aydın olar ki, onlar kifayət qədər təhsil almayıb, yaxud tamamilə savadsızdırlar. Demək, bu qəbil adamların mütaliəsi üçün onların səviyyəsinə uyğun kitablara, böyük ehtiyac duyulur. Şübhəsiz, hamı qəbul edər ki, aydın və anlaşıqlı tarixi mənqəbələr, dastanlar xalqın savadlanması işində böyük əhəmiyyət kəsb edə bilər. Bunun üçün də biz, camaatın kütləvi mütaliəsi üçün əksər xalqlar içərisində dünya şöhrəti qazanmış “Koroğlu nağılları”nın bir hissəsini türkcədən çevirməyi vacib saydıq”[3].

Aşıq – müəllif bir sıra mənbələrə, xüsusilə A.Təbrizliyə istinad edərək “Koroğlu” eposunun, o cümlədən bir şəxsiyyət kimi Koroğlunun tarixiliyi haqqında da məlumat vermişdir. O yazır: “Koroğlu əfsanəvi obraz, yaxud ehtimal edilən bir adam olmayıb real tarixi şəxsiyyətdir. Həm Koroğlu, həm də Mustafa bəy 1605-ci ildə türk və fars işğalçılarına qarşı üsyan edən, öz igid dəstələri ilə hər iki dövləti sarsıdan Cəlalilərdən idilər ki, xalq onların şücaətini yaradıcılıq süzgəcindən keçirib “Koroğlunun nağılı”nı düzəltmişdir”[4].

---

[1] Məşhur Koroğlu hekayəsi, İstanbul, 1330 (daş basması); Koroğlu, İstanbul, 1923; Zaki Rza. Koroğlu, aşiqi bir hekayədir, nəşriyyatı bərədaran Orucov, Bakı, 1913.

[2] Koroğlunun nağılı. Dəmirçioğlu və Həmzə bəylə baş vermiş əhvalatlar, türkcədən çevirəni Aşıq Camali, ikinci və sonuncu hissə, Tiflis, Tavartkiladze mətbəəsi, 1904.

[3] Bolu bəy (Koroğlunun nağıllarından biri), türkcədən tərcümə edən Nəğməkar Həyat, Aleksandropol, G.S.Sanoyantsın mətbəəsi, 1900, müqəddimə, s.2.

[4] Yenə orada.

Nəğməkar həyat, daha sonra dastanın yeddi qoldan ibarət olması, bu söhbətlərin əsrlər boyu yaşayıb dövrümüzə qədər gəlib çatması haqqında bəhs açmış, nəhayət, eposun müəllifi – yaradıcısı məsələsi barədə də öz fikrini bildirməyə çalışmışdır.

Təbdil-tərcümə dastanın iki qolunu – “Giziroğlu Mustafa bəylə baş vermiş əhvalatlar” və “Koroğlu ilə Bolu bəy”i əhatə edir.

Hər üç nəşrin (1897, 1900 və 1904) qarşılıqlı müqayisəsindən belə bir qənaətə gəlmək olar ki, istər Aşıq Camali, istərsə də Nəğməkar Həyat təbdil-tərcümələr üzərində işləyərkən xalq dastanının eyni variantına müraciət etmiş, eyni çapından faydalanmışdır. Bu isə eposun Azərbaycanda formalaşmış ən qədim variantıdır (A.Xodzko nəşrinin orijinalı).

“Koroğlu” eposunun mühüm qollarından biri olan “Kürdoğlu ilə baş vermiş əhvalatlar” da Aşıq Camalinin tərcüməsi ilə ictimaiyyətə çatdırılmışdır[1].

Ötən yüzilliyin əvvəllərində Bakıda nəşr olunmuş “Koroğlu” dastanı da ictimaiyyət arasında xüsusi maraş doğurmuşdur. Rza Zəkibəyin çap etdirdiyi bu kitab nəsrlədir və mətn daxilində ara-sıra nəğmələr də özünə yer tapmışdır[2].

“Koroğlu” dastanının toplanması, tərtibi və nəşri sahəsində Vəli Xuluflu, Hümmət Əlizadə və Əliheydər Tahirovun da mühüm xidmətləri olmuşdur. Eposun bəzi qollarını əvvəl ərəb[3], sonra isə latın əlifbası ilə dərc etdirən Vəli Xuluflu sonuncu nəşrə qeydində yazırdı: “Kitabın ərəb əlifbası çapında aşığın ifadəsini saxlamışdıqsa da, kəlmələrinin tələffüzünü olduğu kimi yazmamışdıq. Yeni əlifba (ikinci) çapında da bundan imtina etdik. Çünki Aşıq Hüseyn və Aşıq Əsəd ikisi də qazaxlı olduğundan onların tələffüzündə bir çox xüsusiyyətlər vardır. Onların tələffüzləri olduğu kimi yazılsa idi başqa qəzaların oxucuları üçün anlaşılması çətin olardı[4].

Yaxud, dastanın Gürcüstandan toplanmış qolu barədə məlumat verən tərtibçi qeyd edirdi ki, bu nümunə Bakı Pedaqoji Texnikumunun məzunu Məhəmməd İbrahim Budzinov tərəfindən Axaltsxa qəzasının Polate kənd sakini, xalq aşığı Məhəmməd Yusifzadə Kozayevdən yazılmışdır. “Bu nağılda mənim vəzifəm mümkün qədər bəzi yerlərdə imla səhvini düzəltmək və bəzi əhəmiyyətsiz ixtisar etmək olmuşdur. Azərbaycan xalq dilinə nisbətən bunun dili qəliz hesab olunur. Ancaq oranın şivəsini və tələffüzünü bilmədiyimizdən yoldaş Budzinovun yazısını dəyişdirmədik”[5].

---

[1] Kürdoğlunun nağılı şeirlərlə, türkcədən tərcümə edəni və işləyəni Aşıq Camali, Tiflis, N.Ağacanın elekt. mətbəəsi, 1912.

[2] Zaki Rza. Koroğlu, aşıqi bir hekayədir, nəşriyyatı bərədaran Orucov, Bakı, 1913; Təkrar nəşr, Bakı, Elm, 2000

[3] V.Xuluflu. Koroğlu, Bakı, Azərnəşr, 1927.

[4] V.Xuluflu. Koroğlu, ikinci təbi, Bakı, Azərnəşr, 1929, s.3.

[5] V.Xuluflu, Koroğlu, ikinci təbi, s.125.

Əlbəttə, Vəli Xuluflunun bu mülahizələri söylədiyi illərdə eposun yazıya alınması, tərtibi və nəşri prinsipləri barədə elmi konsepsiya, müəyyən bir nəzəri fikir yaranmamışdı. Lakin buna baxmayaraq tərtibçi-müəllif eposun dilini, üslubunu, aşıq – söyləyicinin ifa tərzini olduğu kimi saxlamağı üstün tutmuş, apardığı dəyişiklikləri isə qeyd etməyi özünə borc bilmişdir. Əsas cəhət isə onda özünü göstərmişdir ki, Vəli Xuluflu dastanın məzmununa, süjet xəttinə müdaxilə etməmiş, aşıqdan toplanmış variantı eynilə xalqa çatdırmağı düzgün yol saymışdır.

Eposun mühüm bir hissəsinin[1], az sonra isə əldə olunmuş əsas qollarının[2] ayrı-ayrılıqda rus dilində çapı da abidənin geniş şöhrət qazanmasına səbəb olmuşdur.

1930-cu illərin əlaqədar mətbuat orqanlarında müxtəlif qəzet və jurnal səhifələrində dastanın ayrı-ayrı qol və epizodlarının, külli miqdarda nəğmələrinin dərc olunması – gələcək elmi nəşrlər, həmçinin də araşdırmalar üçün əsaslı zəmin rolunu oynamışdır[3]. O dövrdə dastanın toplanması və nəşrinə göstərilən qayğı barədə məlumat xarakterli bir yazıda deyilirdi: "AzOZFAN-ın folklor seksiyası məşhur xalq qəhrəmanı Koroğlu haqqında dastanın müxtəlif variantlarını toplamaqdadır. Azərbaycandan başqa türk, gürcü, özbək, tatar və Krım variantı əldə edilmişdir. Krımda iyirmi il "Koroğlu" üzərində çalışan Çibanov Bakıya dəvət olunmuş, ondan Krım variantı yazılmışdır... Ermənistanda da materiallar toplanır"[4].

"Koroğlu" dastanının toplanması və nəşri işində V.Xulufludan gələn ənənəni H.Əlizadə davam etdirmişdir. Onun ayrı-ayrı aşıqlardan toplayıb tərtib etdiyi mətn ifaçının – söyləyicinin danışdığı tərzdə oxuculara çatdırılmışdır[5]. 1941-ci ildə eposdan müəyyən parçalar da ayrıca kitab şəklində buraxdırılmışdır[6].

Eposun seçmə qollarının sistemləşdirilərək elmi mətninin hazırlanması, tərtib və nəşri M.H.Təhmasibin adı ilə bağlıdır[7]. Sonralar bu mətn müəyyən

---

[1] Антоголия Азербайджанской литературы, под. ред. В.А.Луговского и С.Вургуна, ГИХЛ, М., 1939.

[2] Кер-оглы. Азербайджанский народный эпос, составил Гуммет Али-заде, перевод с азербайджанского Азиза Шарифа, под.ред. и с предисловием Г.К.Шарифова, Баку, 1940.

[3] P.Əfəndiyev. Sovet hakimiyyəti illərində "Koroğlu" dastanının nəşri və tədqiqi tarixinə dair, V.İ.Lenin adına APİ-nin əsərləri, VII cild, 1959, s.81-90; M.Həkimov. "Koroğlu" dastanının toplanması, nəşri və tədqiqi, "Azərbaycan dili və ədəbiyyatı tədrisi", metodik məqalələr məcmuəsi, 1975, №1.

[4] Folklor toplanır, "Ədəbiyyat qəzeti", 18 mart, 1936.

[5] Koroğlu, toplayanı Hümmət Əlizadə, Bakı, Azərnəşr, 1941; Təkrar nəşr: Azərbaycan ədəbiyyatı inciləri. Dastanlar, tərtib edəni B.Abdullayev, Bakı, Yazıçı, 1987, s.271-420.

[6] Azərbaycan xalqının qəhrəmanlıq eposu (parçalar), Bakı, 1941.

[7] Koroğlu, tərtib edəni M.H.Təhmasib, Bakı, Azərb.SSR EA Nəşriyyatı, 1949.

əlavə və dəqiqləşdirmələrlə təkmilləşdirilib dəfələrlə nəşr olunmuşdur[1]. M.H.Təhmasibin tərtibi rusdilli oxuculara da çatdırılmışdır[2].

Daha sonrakı illərdə eposun ustad aşıqların yaddaşında qorunan və geniş ictimaiyyətə bəlli olmayan bir sıra yeni qolları da toplanıb əlaqədar tərtib işlərinə salınmışdır[3].

"Koroğlu" dastanının yazıya alınma (toplanma), tərtib, tərcümə, nəşr tarixçəsinə bu ötəri baxışdan bəlli olur ki, xalq epopeyasının çap edilib əbədiləşdirilməsi iki əsrə yaxın bir inkişaf yolu keçmişdir. Lakin bu iki yüz illik tarixi kəsimdə koroğluşünaslıqda külli miqdarda araşdırmalar meydana çıxsa da, epos üçün istər tədqiq, istərsə də nəşr baxımından daha səciyyəvi sayılan, hər şeydən qabaq dastanı tam, bütöv şəkildə əhatə edən əlyazmasından Tiflis nüsxəsi bu günə kimi nə dərc olunmuş, nə də əsaslı bir araşdırmaya cəlb edilmişdir.

* * *

Parisin Milli Kitabxanasında və Tiflisin G.Kekelidze adına Əlyazmaları İnstitutunda qorunan "Koroğlu" dastanları eposun ən qədim əlyazma nüsxələridir. Onlar hər şeydən öncə, əbədiləşdirilmiş folklor abidələridir. Eposun əsas qaynağını, kökünü təşkil edən bu nüsxələr onların zəngin süjet və epizodları, obrazlar silsiləsi, başlıca ideya və məzmun çalarları dastanın sonrakı variantlarında bu və ya digər dərəcədə qorunmuşdur.

Qələmə alındığı tarixdən 170 ilə yaxın bir dövr keçən "Koroğlu"nun Paris Milli Kitabxanasında qorunan əlyazması illər boyu müəmmalı örtüyə bürünərək gizli saxlanmış real bir həqiqəti üzə çıxarır. Əlyazmasının sonunda dastanın söyləyicisi (ifaçısı), toplayıcısı, bu işin səbəbkarı, təşkilatçısı barədə verilmiş çox nadir məlumatı burada eynilə təqdim etməyə ehtiyac duymadıq. Lakin A.Xodzkonun çoxsahəli yaradıcılıq fəaliyyətinə, xüsusilə "Koroğlu"nun ingilis dilindəki nəşrinə bu qeydlər hansı yeniliyi gətirir? Bu sorğunun cavabı, hər şeydən öncə, unudulmuş varisliyin təntənəsi deməkdir, onu ədalət və həqiqətin bərpası kimi də səciyyələndirmək mümkündür.

Bu gün bizə bir əsr yarımdan sonra aşkar olur ki, A.Xodzkonun Cənubi Azərbaycandan ömrünün son günlərini keçirdiyi Parisə apardığı "Koroğlu" eposunun əlyazması Hacı Mirzə İsgəndərin təşəbbüsü ilə qələmə alınmışdır.

---

[1] Koroğlu, yenidən işlənmiş və tamamlanmış ikinci nəşri, tərtib edəni M.H.Təhmasib, Bakı, Azərb. SSR EA Nəşriyyatı, 1956; Koroğlu, tərtib edəni M.H.Təhmasib, Bakı, 1959 və s...

[2] Кер-оглы, составитель М.Г.Тахмасиб, перевод прозаического текста Ю.Гранина, перевод стихотворного текста И.Оратовского и А.Плавника, предисловие Г.Араслы, Баку, изд-во АН Азерб.ССР, 1959.

[3] Azərbaycan dastanları, toplayıb nəşrə hazırlayanı A.Nəbiyev, Bakı, "Gənclik", 1979, s.87–144; Xalqımızın deyimləri və duyumları, toplayıb yazıya alanı və tərtib edəni M.Həkimov, Bakı, "Maarif", 1986, s.218–300.

Dastanın söyləyicisi (informatoru) Aşıq Sadıq adı ilə şöhrət qazanmış Sadıq bəy olmuşdur;

Dastanı Mirzə Əbdülvahab qələmə almış, Mirzə İsgəndərin nökər və qulluqçuları – Mirzə Mehdi Gilani, Həzrətqulu bəy və Yaqub bəy isə bu işə şahidlik etmişlər;

Qələmə alınma tarixi: çərşənbə günü, rəbüləvvəl ayının 15-i, hicri-qəməri 1250-ci il.

Əlyazmasının müəllifindən soraq verən son qeyd isə belədir: "Bu nüsxəni əvvəldən axıra qədər Mahmud xan Dünbüli Dircuy toplamışdır. Mətn düzgündür, lakin türki rəsmülxəttində bir neçə səhv gedibdir. Ulu Mirzə İsgəndər bunu qeyd etsə də, onları düzəltməyə fürsət olmadı"[1].

"Koroğlu" dastanını toplayıb əlyazması şəklində hazırlayanların özləri barədə vermiş olduqları bu məlumata nə şərh, nə də izah verməyə ehtiyac qalmır.

Azərbaycan qəhrəmanlıq eposunun tam halında olan bu ilk əlyazma nüsxəsinin süjet xətti, mövzu və ideya əlvanlığı, obrazlar sistemi, poetik fiqurları, bədii xüsusiyyətləri, tarixiliyi, xalq hekayəçiliyi ənənələri ilə bağlılığı və bu kimi onlarla digər problemi barədə bəhs açmaq imkan xaricindədir. Çünki bu hər şeydən öncə, ayrıca araşdırma mövzusudur və sözsüz ki, gələcəkdə dastan-əlyazması nəşr olunandan sonra belə bir addım atılacaqdır.

Bütövlükdə bu dastan-əlyazması, daxilində cərəyan edən hadisələrin məntiqi ardıcıllığı ilə səciyyələnən dolğun süjetə, əlvan poetik nəğmələrə malik yetkin bir folklor incisidir.

Eposun məzmunu, süjet axarı ilə tanışlıq belə qənaət doğurur ki, bu əlyazması sonrakı "Koroğlu" variantlarının əsasını, kökünü, mayasını, başlanğıcını təşkil etmiş, buradakı əksər macəra və əhvalatlar sonrakı variantlarda (həmçinin ayrı-ayrı nəşrlərdə) bu və ya digər fərqlərlə qorunub saxlanılmışdır. Bununla belə, elə epizodlara, motivlərə də təsadüf edilir ki, onlar ancaq bu əlyazması ilə bağlı olaraq qalır. Belə epizodlar daha çox müstəqil məclis (qol) səciyyəsi daşıyırlar.

Paris Milli Kitabxanasındakı, on üç məclisdən (qoldan) ibarət olan "Koroğlu" əlyazmasının yurd hissəsi fars dilində, şeyrləri isə bütünlüklə türkcədir. Şeirlərin orijinalları ilə yanaşı onların farscaya sətri tərcümələri də verilmişdir. Bu cəhət təbdil-tərcümə olunmuş xalq romanları silsiləsində sıx-sıx rast gəlinən bir ənənədir. Xüsusilə Azərbaycan dastanlarının gürcü və ermənicəyə təbdil-tərcümələrində bu üsuldan geniş istifadə edilmişdir.

Aşıq yaradıcılığının sankretik xüsusiyyətləri, xalq dastanları və dastançılıq ənənələrinin inkişaf meylləri, dastan-saz məclislərinin icra tərzi və başqa bu kimi əlamətlər belə bir fikir yürütməyə imkan verir ki, Azərbaycan dastanları məxsus olduğu xalqın dilində formalaşdığı kimi təbii ki, bu dildə də

---

[1] Koroğlu (Paris nüsxəsi), çapa hazırlayan, On söz, lüğət, izah və qeydlərin müəllifi İ.Abbaslı, Bakı, "Ozan" nəşriyyatı, 1997, 198 səh.

ifa olunmuşdur. Məsələyə bu baxımdan yanaşılarsa haqqında söhbət gedən "Koroğlu" əlyazmasının özündən əvvəl Azərbaycan dilində ayrıca nüsxəsi olması qənaətinə inam artar. Və çox güman ki, dastan farscaya həmin orijinal mətn vasitəsilə çevrilmişdir ki, az da olsa yuxarıda bunu təsdiq edən bir sıra cəhətlərə mövcuddur.

Həcm və məzmun etibarilə eposun daha geniş süjetini əhatə edən Tiflis əlyazması[1] barədə isə otuz ildən artıqdır ki, elmi ictimaiyyətə məlumat verilmişdir. Dastan-əlyazması haqqında ayrıca tədqiqat aparmış L.G.Çlaidzedən[2] sonra X.H.Koroğlu ayrı-ayrılıqda eposun 28 məclisinin qısa məzmununu təqdim etmiş, onları xalq romanının təşəkkül tapdığı dövrün tarixi hadisələri fonunda nəzərdən keçirmişdir[3].

Tiflis əlyazmasından əlaqədar tədqiqatlarda da bu və ya digər dərəcədə bəhs olunmuşdur[4]. Əlyazmasının surəti (mikrofilmi) Azərbaycana gətirildikdən sonra onun iki məclisi nəşr olunmuş, yazıya alınma tarixi, elmi mahiyyəti barədə müəyyən mülahizələr söylənilmişdir[5].

Tiflis nüsxəsinin dil və üslubundan bəhs açan X.Koroğlu belə qənaətə gəlmişdir ki, "Dil və üslubuna görə o, eposun Azərbaycan versiyasına aiddir və bu günə kimi onun daha çox tam variantı sayılmaqdadır"[6].

"Əlyazması dastanın məlum Azərbaycan versiyasının məzmununu, demək olar, tam əhatə edir" deyən L.G.Çlaidze də təxminən həmin fikirdə olmuşdur[7].

Tiflis nüsxəsində dastanın yazıya alınma tarixi barədə heç bir qeyd verilməmişdir. Əlyazmasının ayrı-ayrı vərəqləri üzərində olan möhürlərə istinadən onun yazıya alınma tarixi XIX yüzilliyin birinci yarısına aid edilmiş[8], kağızının istehsal tarixinə görə isə o, 1856-cı ildən sonrakı dövrlə bağlanmışdır[9].

Şübhəsiz ki, "Koroğlu"nun Paris əlyazması kimi Tiflis nüsxəsi də özündən qabaq mövcud olmuş müəyyən mətn əsasında qələmə alınmışdır. Bunu dastandakı məclislərə verilmiş adlar (Paris əlyazmasında məclislər ancaq

---

[1] Gürcüstan EA K.Kekelidze adına Əlyazmaları İnstitutu, "T" fondu, inv. №140.

[2] Л.Г.Члаидзе. Об одной неизвестной рукописи эпоса Кер-оглы, Труды Тбилисского Государственного Университета, т.121, 1967.

[3] Х.Г.Короглы. Взаимосвязи эпоса народов Средней Азии, Ирана и Азербайджана, М., изд-во "Наука"; 1983, с.182-247.

[4] А.А.Петросян. История народа и его эпос, М., изд-во "Наука"; 1982, с.80-81; H.Vəliyev. Azərbaycan folkloru və ədəbiyyatı gürcü mənbələrində, Bakı, Yazıçı, 1984, s.28-32.

[5] D.Əliyeva. "Koroğlu"nun yeni əlyazma nüsxəsi, "Ədəbiyyat və İncəsənət" qəzeti, 6 oktyabr, 1989; "Azərbaycan" jurn., 1990, №3, s.133-146.

[6] Х.Г.Короглы. Взаимосвязи эпоса народов Средней Азии, Ирана и Азербайджана, с.182.

[7] Л.Г.Члаидзе. Об одной неизвестной рукописи эпоса "Короглу", с.191.

[8] D.Əliyeva. "Koroğlu"nun yeni əlyazma nüsxəsi, "Azərbaycan" jurn., 1990, №3, s.133.

[9] Х.Г.Короглы. Взаимосвязи эпоса народов Средней Азии, Ирана и Азербайджана, с.183.

rəqəmlərlə sıralanmışdır), həm də bu adların ərəb-fars tərkibli sözlərlə təqdim olunması faktı da sübut etməkdədir. Çünki Azərbaycan aşıqlarının, o sıradan eposun mahir ifaçıları sayılan koroğluxanların “Koroğlu” qollarına fars dili üslubunda başlıqlar vermələri inandırıcı deyildir. Dastanda təsadüf olunan ərəb-fars tərkibli söz-terminlər, ayrı-ayrı frazeoloji birləşmələr, ideomatik ifadələr, başlıcası isə mətn üçün səciyyəvi sayılan nağıl üslubu (“Rəvayət əxbar və nağılani asar belə rəvayət eylər ki, bir gün...” və s.) bir daha təsdiq edir ki, bu əlyazması “Koroğlu”nun söz-saz məclisində ifa edilən variantı sayıla bilməz.

Bir cəhəti də nəzərə çatdırmaq yerinə düşər ki, Paris əlyazmasından fərqli olaraq bu variantda dastanda cərəyan edən hadisələrin xronoloji və məntiqi ardıcıllığı pozulmuş, məclislərin düzülüşündə, heç bir prinsip gözlənilməmişdir. Məsələn, dastan-əlyazmasının ikinci məclisində Koroğlunun Nigar xanımı Çənlibelə gətirməsindən söhbət gedir. Nigar Çənlibelə çatan kimi haqqında xoş sözlər eşitdiyi Eyvazı görmək istəyir. Koroğlu Eyvazı Nigar xanıma nişan verməkdən əlavə onun şəninə bir şeir də söyləyir. Bundan sonra gələn üçüncü məclis isə başdan-ayağa Eyvazın Çənlibelə gətirilməsi əhvalatlarına həsr olunmuşdur. Yaxud, beşinci məclis dastanın Dəmirçioğlunun Telli xanımın dalınca Ərzuruma getməsi, Cəfər paşaya əsir düşməsi, sonda isə Koroğlu tərəfindən azad olunub Çənlibelə gətirilməsi macəralarını əhatə edir. Bundan çox-çox sonra isə (19 və 20-ci məclislər) Koroğlunun və Qıratın doğulması, Cəlali Koroğlunun üsyanı, onun İranı tərk edib Ruma gəlməsi əhvalatlarından bəhs açan qollar verilmişdir.

Eposun Paris nüsxəsinin başlıca süjet xətti və epizodları Tiflis əlyazmasında da qorunmuşdur. Müqayisəli qarşılaşdırma belə bir qənaət doğurur ki, Paris əlyazmasında rast gəlinən bütün obrazlar silsiləsi Tiflis əlyazmasında da qorunmuşdur. Koroğlunun Cəlali Koroğlu, Çənlibelin isə Çamlıbel şəklində xatırladlıması hər iki əlyazması üçün müştərək cəhətlərdir.

Paris əlyazmasında Koroğlunun Təkə-Türkmandan olması tez-tez xatırladılır. Belə xatırlatmaya Tbilisi əlyazmasında da ayrıca yer verilmişdir. Əlyazmasının dördüncü məclisindəki şeirlərdən biri isə epos qəhrəmanının təkəli elindən olduğunu bir daha yada salır:

Bolu bəgi tutub Eyvaz balanı,
Deyin Təkəludan ellərim gəlsin.
Eyvazsız neylərəm dünya malını,
Deyin Təkəludan ellərim gəlsin.

“Koroğlu”nun folklor abidəsi, “xalq kitabı” səciyyəsi daşıyan hər iki əlyazmasına müqayisəli baxış belə bir qənaət doğurur ki, dastanın Paris nüsxəsi daha erkən yazıya alınmış əlyazma toplusu olmuş və onun süjeti qəhrəmanlıq eposunun, Tiflis nüsxəsi də daxil olmaqla, sonrakı variantlarında əsasən qorunub saxlanmışdır.

* * *

Müxtəlif etnik soya malik on beşə yaxın xalqın şifahi və yazılı irsində qeydə alınmış "Koroğlu" eposu əksər tədqiqatçıların qeyd etdiyi kimi, yayılma arealı etibarilə qarşılığı olmayan bir folklor abidəsidir.

Çoxsaylı versiyalar, variantlar, müstəqil qollar, hekayətlər, məclislər, epizodlar, həmçinin nəğmələr şəklində yaranıb formalaşmış bu folklor incisi əsasən iki şəkildə – bəzi xalqlar içərisində tamamilə nəzmlə, bəzilərində isə nəzmlə nəsrin qarşılaşması formasında yayılmışdır.

"Koroğlu" eposu məzmun və süjet fərqinə görə əsasən üç yerə bölünmüşdür: 1. Türkmən, 2. Azərbaycan, 3. Kiçik Asiya variantları. Dastan haqqında xüsusi araşdırmanın müəllifi olan türk folklorşünası P.N.Boratav həmin bölgüyə uyğun gələn "Koroğlu"ları tədqiq edərək belə bir qənaətə gəlmişdir ki, bütün bu variant və versiyaların əsasını – kökünü Azərbaycan eposu təşkil edir[1]. Dastanın əsas süjetinin Azərbaycan ərazisində təşəkkül tapması fikri də məhz həmin mülahizənin davamı kimi diqqəti cəlb edir[2]. Eposun Qafqaz versiyasının (gürcü, erməni, kürd, ləzgi, avar) Azərbaycan variantı, türkmən, tacik, qazax, ərəb (Orta Asiya ərəbləri) variantlarının isə özbək "Koroğlu"su ətrafında mərkəzləşdiyi mülahizəsi də[3] müəyyən qədər qeyd edilən bölgü ilə səsləşməkdədir.

Qeyd edilən bu problemlə bağlı V.M.Jirmunski ilə H.T.Zərifov öz fikirlərini belə ümumiləşdirmişlər: "Koroğlunun Azərbaycan versiyasına bilavasitə yerdə qalan bütün və Yaxın Şərq Zaqafqaziya – türk, gürcü, erməni variantları daxildir. Bütün bunlar dastanın əsas məğzini, başlıca epizodlarını – öz igidliyini tərənnüm edən qəhrəmanın "xeyirxah cəngavər", xalq müdriki, yenilməz mübariz və nəğməkar kimi keyfiyyətlərini qoruya bilmişdir"[4].

Eposun tamamilə bir-birindən fərqlənən variantları əsasən qərb və şərq regionları qrupuna ayrılmışdır. Azərbaycan "Koroğlu"su özünün də daxil olduğu qərb regionu variantları sistemində nəzərdən keçirilərsə, onun daha real tarixi hadisələr fonunda formalaşdığı aşkar görünür. Başqa sözlə, şərqə nisbətən eposun qərb versiyasında mifoloji əlamətlər ön plana çəkilməmiş, onun qəhrəmanı, həmçinin əksər obrazlar silsiləsi real, inandırıcı hadisələr zəminində epik və lirik bədii boyalarla təcəssüm etdirilmişdir. Belə ki, qəhrəman da, onun başına toplaşan dəlilər də daha çox xalqın arzu və idealının, haqq, ədalət işi uğrunda mübarizəsinin mücəssəməsi kimi canlandırılmışdır.

---

[1] P.N.Boratav. Koroğlu dastanı, İstanbul, Evqaf mətbəəsi, 1931, s.13.

[2] Х.Г.Короглы. Взаимосвязи эпоса народов Средней Азии, Ирана и Азербайджана, с.169.

[3] M.H.Təhmasib. Müqəddimə, "Koroğlu", Bakı, Azərb. SSR EA Nəşriyyatı, 1956, s.12.

[4] В.М.Жирмунский, Х.Т.Зарифов. Узбекский народный героический эпос, М., Гос. изд-во худ. литер., 1947, с.183.

Azərbaycan eposu mifoloji aspektdən daha çox tarixi səpkidə öyrənilmişdir. Bunu hər şeydən öncə, dastanın mövzu və ideyası, xalq epopeyasında cərəyan edən hadisələrin dinamikası doğurmuşdur. "Koroğlu"nu qədim türk mənbələri ilə bağlı araşdıran N.S.Banarlı "ehtimal ki, bu dastan əslində göytürklər dövründəki Türk-İran savaşları əsasında təşəkkülə başlamışdır" – deyərkən, belə nəticəyə gəlmişdir ki, eposun "...islamiyyətdən qabaqkı Oğuz-İran savaşlarından doğduğunu və islamiyyətdən sonra müsəlman oğuz-türkləri arasında dolaşdığını söyləmək mümkündür"[1].

Yaxud, dastanın türkmənlər içərisində dolaşan iyirmi beş qoldan ibarət çovdur variantının nəşrində deyilir: "Çovdur variantındakı "Koroğlunun törəyişi" adlanan qolda Koroğlu gorda deyil, cənazə saxlanan yerdə doğulur". Qolda təsvir edildiyinə görə həmin yerdə qoyulan meyidin baş və ayaq uclarında çıraq yandırarmışlar. Dastanda öz əksini tapan odla bağlı bu kimi inamlar (o sıradan gəlinin oğlan evinə gətirilərkən üç dəfə od üzərindən atdanması, bayram törənlərində tonqal başına toplaşıb onun üzərindən tullanmaq və s.) şamanizmdən qalma adətlər kimi səciyyələndirilmiş və bu baxımdan da "Koroğlu" eposu islamiyyətdən əvvəlki tarixi kəsimlə bağlanılmışdır[2].

Eposun dünyada, xüsusilə Qafqazda yayılmış beynəlxalq "korun övladı" motivi ilə qarşılıqlı şəkildə öyrənilməsi daha geniş və maraqlı mülahizələr doğurmuş, istər Avropa, istərsə də, Zaqafqaziya folklorşünaslığında diqqət mərkəzində duran məsələlərdən olmuşdur. Fransız və erməni tədqiqatçıları "Koroğlu"nu Arşak-Tiran mənqəbəsinə bağlamağa cəhd göstərmişlər.

Əlbəttə, J.Dyumezil və A.Berberyan tərəfindən əsası qoyulmuş bu konsepsiyanın, başqa sözlə, Tiran-Arşak mənqəbəsi ilə "Koroğlu" eposu arasındakı paralellərin, müştərək və oxşar epizodların bəzi bölmələrində mübahisəli görünən, inandırıcı olmayan qeyri-obyektiv cəhətlər yox deyildir. Məsələyə bu baxımdan yanaşılarsa "Koroğlu"nu IX yüzilliyin əvvəllərində Azərbaycanda ərəb istilasına qarşı çevrilmiş Xürrəmilər hərəkatı ilə, bu hərəkatın başında dayanan Babək haqqında yaranmış rəvayət-hekayətlərlə müqayisə edən folklorşünas M.H.Təhmasibin mülahizələri daha obyektiv görünə bilər. Təsadüfi deyil ki, həmin mülahizələr türk koroğluşünaslığında da müsbət qiymətləndirilmişdir[3].

Araşdırmalardan bəlli olur ki, Babək haqqında, onun misilsiz mübarizələri ilə bağlı hələ özü həyatda ikən onlarla rəvayət-hekayətlər yaranmış, bu nümunələr ildən-ilə, əsrdən-əsrə adlayaraq xalq içərisində dolaşdıqca yeni çalarlar kəsb etmiş, epikləşməyə doğru bir yol keçmişdir. Babəklə bağlı tarixi

---

[1] N.S.Banarlı. Rəsmili türk ədəbiyyatı tarixi, İstanbul, Yeddigün nəşriyyatı, 1947, s.177.

[2] Ata Rəhmanov. "Koroğlu" eposunun təzə tapılan variantı, "Sovet ədəbiyyatı" jurnalı, Aşqabad, 1964, №9, s.55-56.

[3] İslam ensiklopediyası, VI cild, İstanbul, Maarif basımevi, 1955, s.908-914.

mənbələrdə qələmə alınan, həmçinin xalq içərisində söylənilən bu kimi nümunələrlə "Koroğlu" dastanının bir sıra epizodları arasında səsləşən aşağıdakı bənzər, oxşar cəhətlər müəyyənləşdirilmişdir:

Koroğlunun atasının kor edilməsi əhvalatı eynilə Babəkin də anasının başına gəlmişdir (Rəvayətlərdən birinə görə onun kor edilməsi islam şəriətinə boyun əyməyib, Xürrəmi yolu ilə ərə getməsiylə əlaqələndirilmişdir);

Koroğlu Eyvazı atası qəssab Alıdan alıb Çənlibelə apardığı kimi Cavidan da gənc Babəki anasından alıb Bəz qalasına gətirir;

Əbu-İmranla Cavidan arasındakı münaqişənin mahiyyəti "Koroğlu"nun Koroğlu ilə Giziroğlu Mustafa bəy epizodunu xatırladır. Maraqlıdır ki, Əbu-İmran ərəb olsa da, ərəblərə qarşı vuruşur. Mustafa bəy isə Gizir oğludur, lakin o da gizirlərə, sədr-əzəmlərə qarşı çıxır;

Əbu-İmranla Cavidan sinfi düşmən olmadıqları kimi Koroğlu ilə Giziroğlu Mustafa bəy də bu mövqedə onlarla bənzəyirlər;

Çənlibel də Bəz qalası kimi əzəməti, möhtəşəmliyi ilə diqqəti cəlb edir. Onlar arasında olan oxşarlıq, sakinlərinin mənəviyyatca bir-birlərinə yaxınlıqları, yaxın amal və məqsəd uğrunda mübarizələri eyni mahiyyət daşıyır.

Bütün bu bənzər və oxşar cəhətlər, bir-birilə yaxından səsləşən epizodlar, paralellər bir daha göstərir ki, "Koroğlu" eposu... öz rişələrini çox dərinlərə ata bilmiş, bu xalqın Cəlalilər üsyanından daha əzəmətli olan qədim Babəkilər-Xürrəmilər hərəkatından da qidalanmış, eposun əsas sütunlarını, əsas rüknlərini, dayaqlarını təşkil edən dörd ünsür, yəni Koroğlu, Qırat, Çənlibel, Misri qılınc kimi adlar da Babəkiliyin, Xürrəmiliyin və onların əsaslandıqları qədim atəşpərəstliyin əqidələrindən, görüşlərindən şirə çəkmiş, ətə-qana dolmuşdur[1].

Qədim mənbələr, tarixi hadisələr əsasında yaranmış xalq rəvayət-hekayətləri ilə aparılmış bu müqayisə və paralelləri, oxşar və səsləşən cəhətləri doğuran bir səbəb vardır ki, o da bu mövzu-motivin vahid beynəlxalq süjetə bağlanmasıdır. Dövrünü keçirib tarix səhnəsini tərk etimş, habelə hazırda yaşayan bir sıra xalqların folklorunda – qədim şifahi irsində təsadüf olunan bu süjet "haqsız yerə gözləri kor edilən bir adamın oğlunun böyük qəhrəman olması", yaxud "bir kor oğlunun qəhrəman mərtəbəsinə qalxması" və yaxud, sadəcə "korun övladı" adlanır. "Koroğlu" eposunun (əsasən qərb versiya və variantlarının) daxil olduğu bu beynəlxalq süjetin Böyük Qafqazın şimalında, habelə Zaqafqaziyada yaşayan xalqlar içərisində nə dərəcədə yayıldığını aydınlaşdırmaq üçün tarixi qaynaqlara, yazılı və şifahi ənənələrə müraciət edib bu motivin əhatə çevrəsini, mahiyyətini nəzərdən keçirmək lazımdır.

Maraqlıdır ki, bu motivə miladdan qabaq VII-III yüzilliklərdə Qara dənizin şimal sahili yaxınlığındakı çöllərdə məskən salan skiflər içərisində təsadüf edilməkdədir. Onların döyüşlərindən, məişət və təsərrüfat həyatlarından

[1] M.H.Təhmasib. Azərbaycan xalq dastanları (orta əsrlər), Bakı, "Elm", 1972, s.139.

bəhs edən Herodot "korun övladları" süjeti ilə yaxından səsləşən "kor qullar" əhvalatı barədə maraqlı məlumat vermişdir. Tarixçi yazır: "...skiflər 28 il yuxarı Asiyada hökmranlıq etmişlər. Onlar kimmeriləri sıxışdıraraq Asiyaya hərəkət etmiş və midiyalıların hökmranlığına son qoymuşlar (Skiflərin gəlməsinə qədər Asiyada midiyalılar hökmranlıq etmişlər). 28 illik uzun fasilədən sonra ölkələrinə qayıdan skiflər midiyalılarla müharibədən daha ağır olan fəlakətlə üzləşmişlər. Onlar burada qüvvətli düşmən qoşunu ilə qarşılaşmışlar. Çünki ərlərinin uzun müddət yanlarında olmamasından istifadə edən skif qadınları qullar ilə əlaqəyə girmişdilər"[1]. Herodot skiflərin öz qullarını kor etmələri barədə də müfəssəl məlumat vermişdir. Maraqlıdır ki, Herodot "Tarix"inin mütərcimi Q.A.Stratanovski tarixçinin təqdim etdiyi bu əhvalatı" "qədim skif rəvayəti" adlandırmışdır. Həmin rəvayətə görə skiflər öz qullarının hamısını kor edirmişlər. Bunun səbəbini izah edən Herodot yazır ki, skiflər içdikləri atın südünü sağmaq üçün tütək formasında olan bir sümük götürüb onu atın balalıq yoluna uzadır, sonra ağızları ilə üfürüb ora hava doldururmuşlar. Beləliklə, süd aşağı yenir, biri üfürüb, digəri atı sağırmış. Sağımdan sonra südü çənlərə boşaldır, qulları çənin dövrəsində oturdub onu çaldırırmışlar[2].

Məhz bu səbəbə görə də – başqa sözlə, at südünün əldə edilməsi üsulunun gizli saxlanması məqsədilə qulları dünya işığından məhrum edirmişlər. Lakin kor qullar ilə ərləri müharibəyə getmiş skif qadınlarının izdivacından törəyən yeni nəsil təhlükəli düşmənə çevrilib Midiyadan qayıdan skiflərə qarşı mübarizəyə başlamışlar. Skiflər dəfələrlə döyüş meydanına girsələr də, rəqiblərini məğlub edə bilməmişlər.

Herodot "Tarix"ində hifz olunmuş bu yarım tarixi-yarıməfsanəvi rəvayətdən göründüyü kimi, "korun övladı" beynəlxalq süjeti skiflər arasında yeni məna kəsb etmiş, kor qullardan törəyən yeni nəsil qəhrəmanlıq göstərib skif döyüşçülərini sarsıtmışdır. Bu süjet eyni zamanda Şimali Qafqaz xalqları içərisində yayılmış, bəzi tədqiqatçıların skiflərin qalıqları saydığı osetinlərin "Nart" eposunda özünə yer tapmışdır. Rus şərqşünası V.F.Millerdən sonra Jorj Dyumezil bu barədə xüsusi araşdırma aparmışdır[3].

"Korun övladı" motivinə eposun "Xamıs və Batrazd" rolunda təsadüf edilir[4]. Burada danışılır ki, korun övladı baş Nartın, habelə Batrazdın yurdunda olmamasını öyrənib atasının nəsihətinə qulaq asmayaraq nartların içərisirə gəlir, onların şənliklərində iştirak edir. Nəhayət, nartlar kor divin oğlu tərəfindən təhqir olunur. Səhərisi gün Batrazd geri qayıdır, korun övladını meydana çağırıb onunla rəsq edir... Nəticədə baş nart kor divin oğlunun bir

[1] Геродот. История в девяти книгах, с.188.

[2] Yenə orada, s.187.

[3] Ж.Дюмезиль. Осетинский эпос и мифология, М., изд-во "Наука", 1976; Yenə onun: Скифы и Нарты, М., изд-во "Наука", 1990.

[4] Нартские сказания. Осетинский народный эпос. М., ОГИЗ, 1949, с.245-352.

qolunu qoparmaqla onu cəzalandırır. Korun oğlu qaçır, nartlar kimi cəngavərlik göstərmək istəyərkən həlak olur. Bu əfsanəyə görə div ilə oğlu nartların məğlub edilmiş düşmənləridir[1].

Xatırladılan motiv "Nart" eposu ilə yaxın bir epoxada – "ananın müqayisə edilməyəcək dərəcədə möhkəm hüquqa malik olduğu bir dövrdə yaranmış"[2] "Amiraniani" eposunda da özünə yer tapmışdır. Bu baxımdan əsərin svan variantı diqqəti daha çox cəlb edir. Ötən yüzilliyin sonlarında yazılmış bu variantda meşədə yaşayan bir ovçunun macəralı həyatı təsvir olunmuşdur.

Ovçu Dardjelani "başı buludlara toxunan" meşəlikdə yaşayır. Bir gün o, çox axtarışdan sonra əzəmətli qayanın ayağına gəlir. Qayadan qadın hənirtisinə oxşar səs eşidilir. Səs ovçunun diqqətini cəlb edir. Lakin qaya hündür olduğundan Dardjelani ora çıxa bilmir. O, dərhal evə qayıdır, deyingən və çolaq arvadına yemək bişirtdirir, dəmirçiyə isə balta, gürz düzəltdirir.

Baltalar ilə gürz sınana qədər ovçu əlləşir, ayaq yeri açıb qayanın başına çıxır. Ovçuluq ilahəsi Dalini yatmış görən Dardjelani ona vurulub üç gün burada qalır. Nəhayət, Dardjelaninin sehrkar arvadı ərinin izinə düşüb onu Dali ilə yatmış tapır. Qadın Dalinin uzun hörüklərini kəsib evə qayıdır. Səhər hörüklərini kəsilmiş görən Dali ovçuya bildirir ki, artıq o hamilədir, həyatı isə sona çatır. Dalinin təkidinə əsasən Dardjelani kədərlə onun qarnını yarıb "günəş tək parlaq" oğlanı çıxarır, onu nənniyə qoyub İamaninin bulağına gətirir. Bu uşaq gələcək qəhrəman Amiranidir. İamani tərəfindən tapılıb himayə olunmuş Amirani böyüyür. İamani Amirani ilə oğlanları Usipi, Badriyə fərq qoymur.

Gənclər arasındakı qohumluq münasibətləri eposun ayrı-ayrı variantlarında müxtəlif şəkildə verilmişdir. Svan variantında Badri ilə Usipi Amiraninin qardaşlarıdır. Pşav variantında qəhrəmanların hər üçü qardaş kimi təqdim edilmişdir. Badri böyük, Usipi ortancıl, Amirani isə kiçik qardaşdır. Eposun Kartalin variantında Amirani Badri və Usipi ilə dostlaşır. Onlar Amiranidən güclü olsalar da onun təklifi ilə razılaşıb qardaşlaşırlar[3].

Eposda təsvir edilmiş bu üç gənc korun övladlarıdır. Lakin onlar İamaninin bir gözünün çıxarılmasının səbəbini bilmir. Yeniyetmələrin şücaətini görən camaat onları atalarının intiqamını almağa çağırır. Amirani, Badri və Usipi analarından bu işin baiskarını öyrənməyə çalışsalar da ondan bir cavab ala bilmirlər. Nəticədə qadına işgəncə verməklə (onlar xaçapuri bişirtdirib isti-isti onun sinəsinə qoyurlar) atalarının qatilini öyrənirlər. Bəlli olur ki, uzun illər İamanidən bac alan div nəhayət, onun oğlanlarından birini (Usipi ilə Badri nəzərdə tutulur), yaxud da onun bir gözünü tələb etmiş, nəticədə məqsədinə çatmışdır.

---

[1] H. Berberyan. II Arşak və Koroğlu, s.9; P. N. Boratav. Xalq hekayələri və xalq hekayəçiliyi, s.191.

[2] М. Чиковани. Амираниани (Грузинский эпос), Тбилиси, изд-во Союза писателей Грузии, "Заря Востока", 1960, с.98.

[3] М. Чиковани. Амираниани (Грузинский эпос), с.101.

Svan variantında İamaninin gözünü axtarmağa gedən üç bahadır (Amirani, Badri və Usipi) müxtəlif çətinliklərlə üzləşir. Onlar ağır döyüşlərdən sonra atalarının intiqamını alır, divləri öldürüb onun gözünü tapırlar[1].

Bu qısa xülasədən göründüyü kimi svan variantının "bir gözü kor edilmiş İamaninin oğlanlarının qəhrəman səviyyəsinə yüksəlməsi" epizodunda xatırladılan süjet daha geniş şəkildə qorunmuşdur.

Xatırladılan skif, osetin, svan, Tiran-Arşak dastan-rəvayət və mənqəbələrinin "Koroğlu" eposu ilə qarşılıqlı şəkildə öyrənilməsi Jorj Dyumezilin belə bir mülahizəsinə haqq qazandırır ki, "Koroğlu" hekayətləri ilə yuxarıdakı süjetlər arasında müəyyən səsləşmələr nəzərə çarpsa da, əsaslı genezis olmamışdır.

Kontaminasiya bu süjet və motivlərin əksəriyyətində özünə yer tapmışdır. Maraqlıdır ki, skif, Tiran-Arşak mənqəbələri və Azərbaycan "Koroğlu"su rəvayət-hekayətlərində ataların cəzalandırılması məhz at məsələsi ilə bağlanmışdır. Bu səpgidə olan səsləşmələr bir sıra başqa cəhətlərdə də özünü göstərmişdir. Eposun özbək variantına görə qəhrəman bir qəbirdə doğulur ki, bu onun anası kimi səciyyələndirilir. Türkmən variantında isə Koroğlu gorqəbir oğludur. Burada diqqəti cəlb edən cəhət ondadır ki, qəhrəmanın atasının gözlərini at üstündə çıxartmırlar. Deməli, eposun şərq versiyası məzmununa görə qərb versiyasından – dastanın Azərbaycan və Kiçik Asiya variantlarından fərqlidir. Azərbaycan – Kiçik Asiya "Koroğlu"larında isə Koroğlu gözləri at üstündə çıxarılmış kor kişinin övladıdır.

Azərbaycan eposunda Koroğlu cavan ikən həmin adı (Koroğlu) daşımır. O, Rövşən (işıqlı) adlanır. Koroğlunun dilindən verilmiş nəğmələrin birində deyilir:

> Adımı soruşsan bil, Rövşən olu,
> Atadan, babadan cinsim Koroğlu.

Bu kimi faktlardan çıxış edilərək nəsil, cins, soy, qəbilə, tayfa, sülalə kimi mənalandırılan Koroğlu-Goroğlu, Qaraoğlu ad-titulları həm də qaranlıqla, işıqla, günəşlə əlaqələndirilmişdir[2]. O da maraqlıdır ki, atasının gözlərinin kor edilməsi ilə bağlı yaranmış Koroğlu adı epos qəhrəmanının daşıdığı titulun epik əlaməti kimi mənalandırılmışdır. Lakin onun tarixi şərhi də mövcuddur. Bəllidir ki, Səfəvi tarixçisi İsgəndərbəy Münşi Koroğlunu cəlalilər hərəkatının başçısı kimi xatırlatmamışdır. O, Koroğlu sözünü daha çox tayfa, qəbilə, soy adı kimi qeyd etmişdir ki, bu cəhət Azərbaycan "Koroğlu"sunda da qorunmuşdur. Belə ki, burada etnonim eponimə çevrilmişdir[3]. Özgə sözlə,

---

[1] М.Чиковани. Амираниани (Грузинский эпос), с.223-230; Е.Б.Вирсаладзе. Грузинский охотничий миф и поэзия, М., изд-во "Наука", 1976, с.92-112.

[2] M.H.Təhmasib. Azərbaycan xalq dastanları (orta əsrlər), s.145-146.

[3] Х.Г.Короглы. Взаимосвязи эпоса народов Средней Азии, Ирана и Азербайджана, с.174-175.

eposun “müəllifi” sayılan şair-aşıq-dastançının adı Rövşən, mənsub olduğu qəbilə ilə bağlı ləqəbi, ayaması isə Koroğlu olmuşdur[1].

Eposdan bəlli olur ki, Rövşən əsasən atasının intiqamını almaq fikrinə düşəndən sonra Koroğlu adlandırılmağa başlanmışdır. Şübhəsiz ki, xalq, konkret şəkildə isə dastanın yaradıcı və ifaçıları Koroğluya igidliyi, qəhrəmanlığı, şücaəti, qorxmazlığı, yenilməzliyi ilə əlaqədar ad versəydi həmin keyfiyyətləri özündə təcəssüm etdirən daha münasib ad seçərdilər. Çox güman ki, Koroğlu-Rövşən mənqəbələri ilə tarixi şəxsiyyət Koroğlunun rəvayətləri həmin adı birləşdirmiş və bu müxtəlif şəkillərə düşmüşdür.

Koroğlu ad-titulunun başqa yozumlarına da cəhd göstərilmişdir. Yazıçı Q.Ağayan erməni rəvayətlərinə əsaslanaraq qeyd etmişdir ki, Rövşənin atası kor olmamışdır. O, xor (hor) adlanan xor-xoronilər kral sülaləsinə mənsub bir erməni olmuş və onun “çuxur, dərin” mənalarını daşıyan “Xor” adı dəyişərək “kor” şəklini almışdır[2]. Həmin məsələ ilə bağlı olaraq P.N.Boratav “Bolu bəyim, mən Koroğlu deyiləm” qoşmasındakı “Mən Koroğlu deyiləm, Xor oğluyam” misrasının bu şəkilə salınmasını doğru olaraq “söz oyunu” adlandırmış və bu fikrin ortaya çıxmasını özbək-türkmən rəvayətlərinin izi hesab etmişdir[3]. Bu məsələ ilə bağlı özgə bir mənbədə haqlı olaraq deyilir ki, “...araşdırıcılar şairin (Koroğlunun – İ.A.) adı ətrafında əski imlanın oxunuşu üzündən Koroğlu, yaxud Güroğlu olacağı barədə fərqə varmamışlar. Güroğlunun mənası yoxdur. Koroğlu isə mənalıdır.

Şübhəsiz ki, bu mülahizələr həqiqətə daha yaxındır.

Bəlli olduğu üzrə “qor” parlaq, atəş deməkdir. Buna görə, biz, Koroğlu olaraq qəbul etməyi daha uyğun görürük”[4].

---

[1] M.H.Təhmasib. Azərbaycan xalq dastanları (orta əsrlər), s.150.

[2] Q.Ağayan. Koroğlunun həyatına görə sərgüzəştləri, İstanbul, Purat kitabxanası, 1924 (erməni dilində).

[3] P.N.Boratav. Koroğlu dastanı, s.55; İslam ensiklopediyası, VI cild, İstanbul, 1955, s.911.

[4] Cahid Öztelli. Yeni bilgilərlə Koroğlu, “Türk folklor araşdırmaları”, 1969, sayı 238, s.5277-5279.

Bu barədə başqa fikir söyləyən türkmən folklorşünası B.Axundov yazmışdır: “Xalqdan toplanan örnəklərin əksəriyyətində, o cümlədən Daşkənd nəşrində Rövşən adının din vəkilləri tərəfindən qoyulduğu, Qoroqlı, Koroğlu adının isə xalq tərəfindən verildiyi aydınlaşır. Onların biri qəhrəmanın gorda doğulduğunu (Goroğlu), əksinə qaranlıqdan işığa çıxdığını (Rövşən) anladırsa, üçüncüsü onun atasının Xunxar şah tərəfindən qulağının kar (Keroğlu), gözünün kor (Koroğlu) edildiyini aydınlaşdırır.

XII yüzillikdə yaşayan Mahmud Kaşğari “Divanü lüğət-ət-türk” kitabında “gör”, “gür” sözünü “qayduvsız”, “batır” mənasında verir. Ol “gör ər”, “gür ər” sözlərini “batır ər”, “div ürəkli buysanjan igid, ağras adam”, deyib düşündürür. Məsələn, həmin sözün atalar sözündə işlənməsinə bir nümunə:

Kim gör (kür) bolsa, küpez bölar. Bu sözün (“Gör”, “kür”) etimologiyası boyunca düşünülərsə “Koroğlu”, “Güroqlı” sözləri “Batır oğlu”, “Endermen”, “Qayduvsuz” (qorxusuz – *İ.A.*) mənalarını verər” (Bax: B.Axundov. “Qeroqlı” eposunun kəbir məsələləri haqqında, “Sovet ədəbiyyatı” jurn., Aşxabad, 1956, №8, s.80).

Bəllidir ki, "Koroğlu" eposunun əsas sütunlarından biri də Çənlibeldir. Dəlilərin, Koroğlunun tərəfdarlarının məskən saldıqları bu yurd yeri əzəmətli bir qala kimi təsvir olunmuşdur. Bu istehkamı Bəzlə, Arşakavanla müqayisə edən müəlliflər onun harada yerləşməsi, nə üçün Çənlibel adlanması barədə maraqlı mülahizələr söyləmişlər. Çənlibelin coğrafi istiqaməti, mövqeyi barədə xüsusi qeyd verilmiş təbdil-tərcümələrin birində yazılır: Çənlibel Sebastiyanın qərb tərəfindədir. Dağılmış qalası, köhnə tikintisi indi də durur və həmin adla tanınır. Sebastiyadan sonra gözəl bağları, müxtəlif meyvə ağacları, zəngin təbiəti olan Ardava çölündən keçib bir gün yol gedib ora çatırsan. Çənlibel şam ağacları ilə örtülmüş meşəlik dağdır, sərin, tamlı suyu var[1]. Başqa bir qaynaqda Koroğluya aid edilən məskənlər barədə məlumat verilərək qeyd edilir ki, Çənlibel İranın Azərbaycan vilayətindəki Salmast yaxınlığında, yaxud da Türkiyədə – Sebastiya tərəflərdə yerləşir. Bu baxımdan E.Muşeğin qeydləri də maraqlıdır. Koroğlunu dağları, çəmənlikləri, meşələri sevən, bununla bərabər paşalara, sultanlara qarşı döyüşən və saysız-hesabsız davamçıları olan bir qəhrəman-aşıq kimi təqdim edən müəllif ("Nəğmələr kitabı" 1721, yanvar) onun yaşadığı yerin Gərni ilə Qars arasındakı Soğanlı adlı meşəlik olduğunu xatırlatmışdır[2].

Göründüyü kimi, fikirlər müxtəlif olsa da, Çənlibelin eposun yarandığı ərazilərdə (Azərbaycan, Kiçik Asiyanın şərqi) yerləşdiyi əksər müəlliflər tərəfindən təsdiq edilmiş və bütün bu mülahizələri vahid bir ideya birləşdirmişdir: – Çənlibel harada olursa-olsun onun varlığı unudulmamışdır. Bu istehkam yüzilliklər boyu azadlıq, bərabərlik simvolu kimi xalqın, dastanı yaşadanların hafizəsində qorunmuşdur. Eposun ayrı-ayrı variantlarına əsaslanıb Çənlibeli Zaqafqaziyanın müxtəlif yerlərində – əsasən, Azərbaycanda, habelə Ermənistan və Gürcüstanda (Tiflis ətrafında), Anadolu və Orta Asiyada (Türkmənistan və Özbəkistanda) axtaran tədqiqatçılar isə bu şaxələnməni dastanın həmin ərazilərdə geniş vüsət tapması ilə bağlamış, adın daşıdığı çaları isə "şamlı meşə", "şamlı bel" kimi mənalandırmışlar[3].

---

[1] Koroğlunun nağılı. Giziroğlu və Bolu bəylə baş vermiş əhvalatlar, s.20.

[2] E. M u ş e ğ. Nəğmələr kitabı, yanvar, 1721 (Əlyazmasının fotosurəti Azərb. EA Nizami adına Ədəbiyyat İnstitutunun elmi arxivində saxlanılır, inventar №608).

[3] В. М. Ж и р м у н с к и й, Х. Т. З а р и ф о в. Узбекский народный героический эпос, с.170. Çənlibel türkmənlər içərisində Çandıbel, Çardaqlı Çandıbel, Çandıbil, Çembil, Çemenli bil şəkillərində, özbəklərdə Çandıbil, Çandıbek, "Çemle bil deşti", Kazan nəşrlərində isə Çembel bil, Jambel bil formalarında işlənmişdir. Həmin məsələ ilə bağlı türkmən folklorşünası B.Axundov yazır: "Doğrusunu desək, burada bu adlar müəyyən bir nəticəyə gəlmək imkanı vermir. Bunların arasında "Çəmənli bil" sözü bu yerin bağbağçalı, səfalı bir yerdə olduğunu əlamətləndirir. Koroğlunun özü yaşayış yerini:

İl – ulusu Çandıbildir,
Qin yaylağı qızılgüldır –

deyə vəsf edir" (Bax: B. A x u n d o v. "Qeroqlı" eposunun kəbir məsələləri haqqında, s.80).

Əlbəttə, bu mülahizə dastanın türkmən variantına əsasən söylənmişdir.

Eposun bəzi türk nəşrlərində isə Çənlibelin şam ağacları ilə əhatə olunmuş bir yerdə salındığı göstərilmişdir[1].

Çənlibelin mövqeyindən, şöhrətindən asılı olmayaraq onun sakinləri şücaətlərini bu qalanın hüdudlarından çox kənarda göstərmiş, beləliklə də adları dillər əzbəri, məclislər bəzəyi olmuşdur. Onun haqqında dolaşan dastanlar... "türkdilli xalqlar içərisində elə sevilmişdir ki, başqa yerlərdə Şahnaməxanlar, Quranxanlar olduğu kimi, Azərbaycanda da Koroğluxanlar, başqa sözlə, ancaq "Koroğlu" dastanını söyləyənlər yetişmişdir"[2].

Türkiyə tərəflərdə bu dastanı danışanlar koroğluçu adlanmışlar. Onlar uzun qış gecələrində xalq qəhrəmanının cəngavərliyindən söhbət açmış, sazın müşayiəti ilə onun haqqında qoşulmuş, yaxud ona aid edilən şeirləri oxumuşlar. Antep rayonunda isə bu dastanı ifa edənlər "abdal" adlanırmışlar. Kiçik Asiyanın şərq ərazilərində "Koroğlu"nun ifaçıları əsasən aşıqlar olmuşdur. Fəratdan tutmuş Mərvə kimi bütün türk tayfaları Koroğlunu məhəbbətlə yad edib nəğmələrini oxumuş, onu nümunəvi bir şəxs və aşıq kimi səciyyələndirmişlər[3].

Deyilənlərdən belə bir nəticə doğur ki, epos qəhrəmanı onu yaşadanların düşüncəsində, yaddaşında ikiləşmişdir. O, həm çalıb-çağıran aşıq-şair sənətkar və nümunəvi şəxsiyyət, həm də xalqın arzu və istəklərini təcəssüm etdirən bədii obraz[4], dastan qəhrəmanı kimi şöhrət qazanmışdır. Bəllidir ki, Koroğlunu tarixi şəxsiyyət hesab edən təbdilçi-mütərcimlər də əvvəldə qeyd olunduğu kimi, onun dövrünü müəyyənləşdirməyə çalışmış, bu barədə dəyərli mülahizələr söyləmişlər. Bu fikirlərin bəzi cəhətləri həm tarixi sənədlərdə, həm də bu sahədə aparılan araşdırmalarda özünə xüsusi yer tapmışdır.

Eposla bağlı nəğmələrin, həmçinin Koroğlu haqqında rəvayət və hekayətlərin yaranması və formalaşması XVI-XVII yüzilliklərə təsadüf edir. Özgə sözlə, "Koroğlu"nun bünövrəsi məhz həmin yüzilliklərdə baş vermiş əzəmətli kəndli hərəkatı illərində qoyulmuşdur.

Bəllidir ki, XVI əsrin sonları və XVII yüzilliyin başlanğıcında Türkiyədə "Cəlalilər" adı daşıyan böyük xalq üsyanları başlamışdır. Üsyan Azərbaycanda da geniş vüsət almışdır. Bu üsyanların ən böyüyü Qara Yazıçı – Dəli Həsən (1599-1603), Qələndər oğlu (1606) və Canpolad oğlunun (1607) adı ilə bağlıdır. Hərəkatın tanınmış iştirakçıları Arabaçı Süleyman, Arnavudlu

---

[1] Tam və təkmil Koroğlu, İstanbul, Maarif kitabxanası, 1958, s.18.

[2] H.Berberyan. II Arşak və Koroğlu, s.20.

[3] Yenə orada, s.21.

[4] A.Təbrizliyə istinad edən tədqiqatçılar Koroğlunu tarixi şəxsiyyət kimi təqdim etmişlər ki, İ.Petruşevski də bu fikrin tərəfdarı olmuşdur. Eposun Azərbaycandakı qədim variantına əsaslanan V.Jirmunski ilə H.Zərifov isə belə bir qənaətə gəlmişlər ki, o yarımtarixi, yarıməfsanəvi şəxsiyyət olmuşdur.

Gizir Mustafa, Dündar, Təpəsi Tüklü, Ulduzlu İbrahim, Kafır Murad olmuşdur[1]. 1519-cu ildə Toqat ətrafında baş qaldıran qiyamın rəhbəri Cəlalın adı ilə "Cəlalilər" (yəni hökümətin əmrlərinə və padşahın fərmanlarına asi olanlar, başqa sözlə, "qiyamçılar, quldurlar") adlandırılan bu hərəkat haqqında A.Təbrizli geniş məlumat vermiş, Koroğlunu da bu qiyamın iştirakçılarından biri kimi xatırlatmışdır. A.Təbrizli hökmdara qarşı üsyan edən Hüseyn paşa (1599), Kosa Səfər (1599), Əhməd paşa (1601), İncixan (1604), Yollarkəsdi (1605), Tavul (1593), Məhəmməd paşa, Man oğlu, Canpolad oğlu, Əli paşa və b. adlarını çəkdikdən sonra yazır:

"Koroğlu (bu həmin Koroğludur ki, indi aşıqların oxuduğu saysız-hesabsız nəğmələr qoşmuşdur).

Gizir-oğlu Mustafa bəy min nəfər ilə (o Koroğlunun yoldaşıdır, hansı ki, öz nəğmələrində çox yerdə onun adını xatırlamışdır).

Sonra özgə Mustafa bəy.

Qaraqaş, Dəli Nəsib, Yola Sığmaz, Tanrı Tanımaz, Göyəbaxan Çıplaq, Kosa-kosa, Qırlı, Qara Saad, Ağacan Piri.

Onların hamısı cəlali idilər..."[2]

Koroğlunu həm tarixi şəxsiyyət, cəlalilər hərəkatının iştirakçısı, həm də nəğmələri oxunan aşıq kimi təqdim edən A.Təbrizli dastanın fəal iştirakçılarından olan Giziroğlu Mustafa bəyin də adını çəkmiş, bu qiyamların baş qaldırdığı yerləri də xatırlatmışdır. Tarixçi yazır ki, onlar (cəlalilər) "...Konstantinopolun həndəvərindən tutmuş İrəvan şəhərinə, Bağdaddan tutmuş Dəmir-Qapıya (Dərbəndə – İ.A.) qədər, Ağ dənizdən başlamış Qara dənizə kimi olan ölkələri dağıtmışdılar"[3]

Maraqlıdır ki, eposun yaranması da məhz bu ərazinin müəyyən hissəsinə düşmüşdür. Sonralar o, geniş intişar tapıb A.Təbrizlinin xatırladığı ərazilərdə şöhrətlənmiş, yayılıb-yaşamışdır[4].

Aşıq-şair Koroğlunun tarixi şəxsiyyət olmasını təsdiq edən başqa tarixi məlumatlar da vardır. Bu barədə türk ədəbiyyatşünası Sadəttin Hüzhətin məlumatı xüsusi maraq doğurur. O yazır: "Mənim son zamanlarda əldə etdiyim bir vəsiqə Koroğlu adında saz şairinin mövcudiyyətini qətiyyətlə bildirməkdədir. XVII əsrin divan şairlərindən Cevri (vəfatı 1654-cü il) IV Murad

---

[1] А.С.Тверитинова. Восстание Кара Языджи – Дели Хасана в Турции, М.-Л., изд-во АН СССР, 1946, с.4; İslam ensiklopediyası, VI cild, s.340

[2] А.Даврижеци. Книга историй. М., изд-во "Наука", 1973, с.94-95.

[3] Yenə orada.

[4] Bax: В.М.Жирминский. Некоторые итоги изучения героического эпоса народов Средней Азии, В кн: Вопросы изучения эпоса народов СССР, с.42-46; И.С.Брагинский. О таджикском эпосе "Гургули" и его художественных особенностях, yenə orada, с.126-148; Л.И.Климович. Заметки об эпическом творчестве народов советского Востока, yenə orada, с.239-252; S.Qarrıyev. Türkmən dastanları və Şərq xalqlarının folkloru, "Sovet ədəbiyyatı" jurnalı, 1966, №2, s.66-67.

dövründəki məşhur musiqi ustalarından bəhs edən "Hərami humayunda olan xanəndə və sazəndələr vəsfidir" başlıqlı mənzuməsində bir münasibətlə Koroğlunu da xatırlatmaqdadır". Cevri IV Muradın hüzurunda çunqur çalıb:

Çunqurun belə kamalın görcək şərmindən,
Adəm abadə fərar etdi Koroğlu naçar –

deyir[1]. Buradan aydınlaşır ki, Koroğlu IV Murad dövründə, yaxud ondan az əvvəl vəfat etmiş sazəndədir. Bu yeni vəsiqə Övliya Çələbinin yanlış məlumat vermədiyini və Koroğludan başqa Koroğlu adı ilə tanınmış bir saz şairinin mövcudiyyətini göstərir və yaşadığı dövrü müəyyənləşdirir. Ərzurum bəylərbəyi Abaza Mehmet Paşanın Yeniçəri kəndxudası Mehmet ağaya yazdığı məktubdan da aydınlaşır ki, Koroğlu saray münaqişələrində iştirak edən, gözəl çunqur çalan aşıq-şair olmuşdur[2].

"Koroğlu" eposuna dair araşdırmaların əksəriyyətində Koroğlu həm tarixi şəxsiyyət, şair-aşıq, həm cəlalilər hərəkatının iştirakçısı, həm də dastan qəhrəmanı – obraz kimi təqdim edilmiş, bu barədə bir-birindən fərqlənən mülahizələr söylənmişdir. Əzəmətli kəndli hərəkatı iştirakçılarının eposun qədim Azərbaycan variantlarının (Paris və Tiflis əlyazmaları), habelə həmin variantlar əsasında işlənmiş müxtəlif təbdil-tərcümələrin iştirakçısı olması bir daha təsdiq edir ki, bu dastan hər halda Koroğlu həyatda ikən, yaxud da onun həyat səhnəsindən getməsindən az sonra təşəkkülə başlamış, onu yayıb-yaşatmaqda isə dastançı aşıqlar, saz-söz şairləri mühüm rol oynamışlar.

Koroğlunun adı ilə bağlı şeirlər müxtəlif xarakterli ədəbiyyatlara daxil edilmişdir ki, burada da onun şəxsiyyəti və epos barədə müəyyən fikirlər söylənmişdir. Belə mülahizələrə dastanın ayrı-ayrı nəşrlərinə yazılmış qeyd və müqəddimələrdə də təsadüf olunur.

Araşdırmalar belə bir qənaət doğurur ki, "Koroğlu" eposu (dastanın Azərbaycan versiyası) Azərbaycan və Kiçik Asiyada (Anadolunun şərq əraziləri) meydana gəlmiş, Orta Asiyada yayılmış eyni adlı dastan silsilələrindən asılı olmayaraq yaranıb formalaşmışdır;

Eposun Zaqafqaziya və Yaxın Şərq variantları (türk, kürd, gürcü və s.) Azərbaycan versiyasına daxildir[3]. Dastanın yuxarıda xatırladılan gürcü, erməni-cəyə təbdil-tər-cümələri də məhz qədim Azərbaycan variantı əsasında işlənib nəşr olunmuşdur.

---

[1] S.Hüzhət Koroğlunun XVI əsrin sonlarında Anadoluda yaşamış şair kimi xatırlatmış, onun Özdəmirçioğlu Osman paşanın başçılığı altında olan Osmanlı ordusu ilə İran müharibələrində iştirak etdiyini göstərmişdir (Bax: S.Hüzhət. Türk ədəbiyyatı tarixi, İstanbul, 1932, s.244-245).

[2] C.Öztelli. Yeni bilgilərlə Koroğlu, "Türk folklor araşdırmaları", 1969, sayı 238, s.5277-5279.

[3] В.М.Жирмунский, Х.Т.Зарифов. Узбекский народный героический эпос, с.183.

"Koroğlu" skif, svan (gürcü), osetin və ermənilərin yazılı tarixi qaynaqları və şifahi irsində qorunan "korun övladı" beynəlxalq motivinə genezis cəhətdən deyil, daşıdığı adın (Koroğlu) formal məna və şəkil baxımından daxildir;

Koroğlu adlı aşıq-şair həyatda olmuş, çox ehtimal ki, o XVI-XVII yüzilliklərdə yaşayıb-yaratmış və cəlalilər hərəkatına qoşulmuşdur. Yaxud, bu aşıq-şairin kəndli qiyamının qabaqcıl iştirakçılarından birinin adını özünə təxəllüs, yaxud soy adı seçməsi də həqiqətə yaxın görünə bilər;

Koroğlu özünün və başına topladığı dəlilərinin şücaəti, qəhrəmanlığı barədə şeirlər qoşmuş, nəğmələr oxumuşdur. Bu nəğmələr əsrlər boyu aşıq-saz məclislərini rövnəqləndirmiş, aşıq musiqisinin, onun havacatlarının inkişafında müstəsna rol oynamışdır.

"Koroğlu" eposu nəinki Koroğlu haqqında söhbətlərdir, əksinə, həm də onun özünün söylədiyi, yaxud nəğmələr qoşub-oxuduğu əhvalatlar barədə dastanlardır;

Dastanın qonşu dillərdə nəşr olunmuş təbdil-tərcümələrindəki milliləşdirmə, özününküləşdirmə meylləri mütərcim aşıq-şairlərin, yaxud da ki, naşirlərin aşıq sənətinə "yaradıcı" münasibətindən doğmuşdur. "Koroğlu" qollarını ifa edən belə sənətkarlar az olmamışdır.

Nəhayət, bəlli bir həqiqətdir ki, eposa yüzilliklər boyu ayrı-ayrı əlavələr, artırıb-əksiltmələr edilmiş və bu proses sonralar da öz təsirini itirməmişdir.

* * *

"Koroğlu" eposu Azərbaycan xalqının ictimai-siyasi görüşlərinin, ayrı-ayrı tarixi hadisələrə fəlsəfi-etik baxışlarının axarında zənginləşmişdir. Bu səbəbdən də dastanın ayrı-ayrı qollarında öz əksini tapan və xalqın gündəlik həyat tərzi, məişəti ilə yaxından səsləşən hadisələri tək bir yüzilliklə, müəyyən tarixi kəsimlə bağlamaq eposun məzmun və ideya siqlətini azaltmağa, onun əhatə çevrəsini məhdudlaşdırmağa gətirib çıxarır.

"Koroğlu"nun yaradıcı-ifaçı-daşıyıcıları yaşadıqları epoxanın hakim ideologiyasının siyasi-ictimai düşüncələrinə biganə qalmamışlar. Zamanın, dövranın zidiyyətlərlə dolu ictimai mənzərəsi dastançı aşıqların təfəkküründən süzülərək poetik çalarlarla zənginləşə-zənginləşə onların yaradıcılıq aləminə yol tapmış, bu isə ilk növbədə söylənilən qol-əhvalatın həyatla bağlanması üçün real zəmin yaratmışdır.

Dastanın (istər əlyazması, istərsə də çap şəklində olsun) bütün variantlarına kompleks yanaşma belə bir qənaət doğurur ki, cəmiyyətin hakim ideologiyasının səciyyəsi bu və ya digər səpgidə öz izlərini xalq epopeyasının ideya-məzmun çalarlarında qoruyub saxlaya bilmiş, həyata ictimai-siyasi baxış dəyişdikcə bu öz təsirini eposa da göstərmiş, onun ideya-məzmunu təhkiyəçilik-macəraçılıqdan

ictimai motivlərə doğru bir istiqamət götürmüşdür. Bu inkişaf meyarı eposun Paris, Tiflis əlyazmalarından, ayrı-ayrı təbdil-tərcümələrindən, həmçinin əlaqədar arxivlərdə qorunan onlarla qollarından tutmuş bəlli çapları da daxil olmaqla əksər variantlarının mövzu və mündərəcə axarından bir xətt kimi keçməkdədir.

Eposun ayrı-ayrı qollarının müqayisəli tədqiqi müəyyən edir ki, dastana ictimai motivlər aşılanmasında sovet dövrü Azərbaycan aşıqları öz sələflərindən tamamilə fərqlənmişlər. Onlar yaşadıqları cəmiyyətin siyasi baxışlarının təsirindən kənarda qala bilməmiş, çox vaxt özləri də duymadan hakim ideologiyanın təbliğatçılarına çevrilmişlər. Şübhəsiz ki, bu da öz təsirini, iz və əlamətlərini eposun bir çox epizodlarında nəzərə çarpacaq dərəcədə qoruya bilmişdir.

Eposa ümumi nəzər təsdiq edir ki, yüz əlli ildən artıq toplanma, yazıya alınma və nəşr tarixçəsi olan Azərbaycan "Koroğlu"sunun formalaşma, yayılıb-yaşama ərazisi baxımından əsasən üç qaynar nöqtəsi olmuşdur: Cənubi Azərbaycanda formalaşıb yaranan variant eposun Paris və Tiflis əlyazmaları vasitəsilə qorunmuşdur; dastanın yayılıb-yaşadığı özgə bir bölgə Qazax, Borçalı, Gəncəbasar mahalları olmuşdur ki, həmin yerlərdən toplanmış qollar əsasən V.Xuluflu, H.Əlizadə və M.H.Təhmasib nəşrləri ilə həyata vəsiqə almışdır; müəyyən hissəsi Azərbaycan Milli Elmlər Akademiyası Ədəbiyyat İnstitutunun elmi arxivində saxlanan və bilavasitə Ə.H.Tahirovun iştirakı ilə qələmə alınmış, sonrakı illərdə A.Nəbiyev tərəfindən toplanmış qollar isə təsdiq edir ki, "Koroğlu"nun intişar tapdığı üçüncü bölgə Azərbaycanın şimalı – Dərbənd və onun ətraf məntəqələri olmuşdur.

Dastanın xatırladılan bölgələrində tarixən geniş vüsət almış, həmçinin müəyyən dərəcədə bu gün də yaşayan əksər qol və epizodları tamlıqda xalq epopeyasının vahid silsiləsi kimi qəbul edilməlidir. Bu silsilə regional xarakterinə, məzmun və süjet axarına görə daha çox variantlar şəklində qruplaşdırılmalıdır.

Eposun bəlli olan bütün variant və qollarına nəzər salınarsa belə bir qənaət doğar ki, bu xalq dastanı onilliklər boyu ayrı-ayrı folklor daşıyıcılarının – yaradıcı informatorların, başlıcası isə aşıq-ifaçıların saz-söz məclislərindən süzülərək həyatla bilavasitə bağlı real tarixi hadisələrin axarında sabitləşmişdir. Doğrudur, eposu mifoloji, etnoqrafik, fəlsəfi, etik, ictimai-siyasi, tarixi baxımdan araşdırmaq üçün zəngin material olsa da əsərdə real həyat həqiqətləri daha çox üstünlük təşkil edir. Bəllidir ki, dastanın birinci qolunda Alı kişi oğluna vəsiyyətində deyir: "Necə ki, Misri qılınc sənin belində, sən də Qıratın belindəsən, özü də bu Çənlibeldəsən, sənə heç kəs dov gələ bilməz". Göründüyü kimi, elə ilk andan eposun əsas sütunlarını – dayaqlarını müəyyənləşdirən komponentlər: Rövşən, Misri qılınc, Qırat,Çənlibel meydana çıxır və bütün bunlar eposda hadisələrin axarından aparıcı bir xətt kimi keçir.

Maraqlıdır ki, Rövşənin Koroğlu adını daşıması ayrı-ayrı araşdırmalarda rəngarəng fikirlər doğursa da, eposda bu cəhət müəmmalı deyil, sadə tərzdə səciyyələndirilmişdir. Rövşən qarşısına çıxan ilk cəngavərə ("Koroğlu ilə Dəli Həsən") öz nəslini-soyunu belə təqdim edir: adım Rövşən, atadan-anadan isə cinsim Koroğludur. Eyni mətləb dastanın üçüncü qolundakı şeirdə də qorunmuşdur:

Qıratı çapdırıb yollarda yordum,
Düşmən qarşısında mərdanə durdum,
Adım Rövşən iyid, Çənlibel yurdum
Laçın oylağına gəldim, ha gəldim.

Bəlli bir həqiqətdir ki, dastanın əldə olan bütün variantlarında Koroğlu adı Rövşənə atası Alı kişi tərəfindən verilmiş ləqəbdir. Əsərdə atanın oğlunu nə üçün Koroğlu adlandırması mənalandırılmır. Alı kişi deyir: "... bu həndəvərdə məşhur bir qaçaq var, adına Dəli Həsən deyərlər. Özünü bircə ondan gözlə. Get, sənin adını Koroğlu qoydum". Eyni qolun sonrakı illərdə toplanmış variantında da ("Rövşən") həmin mənzərə ilə qarşılaşırıq. Fərq isə ondadır ki, burada Dəli Həsən Rövşənin qardaşı kimi verilir və Alı kişi hər iki oğluna üz tutub deyir: "Oğul, sənin adını Dəli Həsən, səninsə adını Koroğlu qoydum"[1].

Koroğlu yüzilliklər boyu xalqın təfəkküründə, yaddaşında əbədi yer tutmuş dastan qəhrəmanı, bədii obraz, aşıq-şair, həmçinin tarixi şəxsiyyət kimi böyük şöhrət qazanmışdır. Onun sevilməsi, ürəklərə yol tapmasının sirri aşağıdakı fikirlərdə daha yığcam ümumiləşdirilmişidr: "Xalqın təsəvvürünədə cəngavər Koroğlu zorakı və işğalçı olmayıb, əslində "xalq intiqamçısı", bütün hakim qüvvələrə, varlı və ünlü kimsələrə qarşı yenilməz mübariz, eyni zamanda yoxsul kütlələrin müdafiəçisidir. Bu qəhrəmanlıq obrazının fövqəladə şöhrət qazanmasının başlıca səbəbi də məhz bununla bağlıdır"[2].

Çənlibeldə epos qəhrəmanının başına toplaşan dəlilər nə qədər cəngavər, igid olsalar da dastanda Koroğluya bərabər tutulan əsasən üç şəxsiyyət daha canlı səciyyələndirilirlər. Bunlar Dəli Həsən, Ərəb Reyhan və Giziroğlu Mustafa bəydir. Hər biri haqqında ayrıca əhvalatlar, qollar söylənilən bu qəhrəmanlar Koroğlu ilə birləşib onun dəlilərinə qoşulmağa meyl göstərsələr də, daha çox müstəqil dəstə başçısı kimi canlandırılmışlar.

Eposda dərya cinsindən törəyən və Alı kişinin tapşırığı ilə xüsusi təlim görən atlar fövqəladə, qeyri-adi qüvvəyə malik varlıq kimi təsvir olunsalar da

---

[1] "Rövşən", söyləyəni Aşıq Vəli Atalıyev (1908), Dərbənd, Qayakənd; toplayanı A.Nəbiyev, 1973 (əlyazmasının surəti Folklor İnstitutunun elmi arxivində saxlanır).

[2] В.М.Жирмунский. Некоторые итоги изучения героического эпоса народов Средней Азии. В кн.: "Вопросы изучения эпоса народов СССР," М., изд-во АН СССР, 1958, с.43.

onların törəməsi adi şəkildə təcəssüm etdirilmişidir. Bu barədə ilk qolda ("Alı kişi") deyilir: "Alı kişi dərya atı olmağını eşitmişdi, amma heç görməmişdi. Atlar gəlib ilxıya qarışdılar... "Qıratla bərabər Misri qılınc da Rövşənə" gənc yaşlarından qol-qanad verir. O, uşaq vaxtı çöldə oynadığı vaxt yerdən bir daş tapır. Daş balaca olmasına baxmayaraq ağır, sanballı olur. Onun yeli örüşdə otlayan buzovu öldürür. Alı kişi daşı əli ilə yoxladıqdan sonra başa düşür ki, bu göydən düşmüş ildırım parçasıdır. Alı bu daşdan əvvəl biz, sonra qılınc düzəltdirir. Qılıncı oğluna verən Alı deyir: "Rövşən, al bu qılıncı belinə bağla, bu qılınc özgə qılınca bənzəməz. Bu qılınca ildırım deyərlər.., bundan sonra bunun adına Misri qılınc deyərsən". Digər bir variantda qılıncı Rövşənə onu hazırlayan dəmirçi verir. O, qılıncın keyfiyyətini belə səciyyələndirir: "Bu qılıncın malı ildırım daşından, suyu Misxana suyundan, ağzının axarı da Alxar gümüşünün xam tozundandır. Bunun adını Misri qılınc qoydum"[1].

Koroğluşunaslıqda Msiri qılıncla, bu sözün məna çalarları ilə bağlı rəngarəng mülahizələr söylənilsə də dastanda bu silahla əlaqədar təsvirlər sadə və inandırıcı boyalarla təqdim olunmuşdur. Eposun əsas dayaqlarından sayılan Çənlibelin təsviri də Misri qılınc kimi təbii şəkildə canlandırılıb. "Alı kişi" qolunda Koroğlu atasına əvvəlcədən bəlli olan Çənlibeli belə təqdim edir:

" – Ata, bura hər tərəfi sıldırım qayalıq, çənli-çiskinli bir dağ belidi.

– Oğul, bax gör bu bel ki deyirsən, bunun hər tərəfində bir uca təpə var, ya yoxdu?

– Ata, var. Biri sağında, biri solunda, özü də başları qarlıdı".

Əlbəttə, dastanda belə bir məskənin yurd yeri kimi seçilməsi daha çox onun istehkam səciyyəsindən doğur və bununla Çənlibel bütün əsər boyu yenilməz bir qala kimi dəlilərin daimi yaşayış məskəninə çevrilir.

Eposda araşdırıcıların mifik elementlər axtardıqları nöqtələrdən biri də Qoşabulağın təsviri ilə bağlı epizodlardır. Dastana görə Qoşabulaq Çənlibeldəki dağlarda yerləşir. Yeddi ildən bir Məğribdən və Məşriqdən bir ulduz axıb bu bulağın üstündə toqquşur. Bu vaxt Qoşabulaq köpüklənib daşır ki, onun suyunun qüdrəti eposun ayrı-ayrı qollarında müxtəlif şəkillərdə səciyyələndirilmişdir. Onlardan başlıcaları aşağıdakılardır:

– suda çimən, ondan içən aşıq olur, nərəsi dağı-daşı titrədir. Su həmçinin Alının gözlərinin dərmanıdır;

– sudan içənə şairlik verilir. Hərgah at bu sudan içərsə sahibinin ürəyindən keçənləri duymaq qabiliyyətinə yiyələnir;[2]

---

[1] Əlyazması, inventar 715 (q), "Mehtər Alı", söyləyəni Balakişi Babayev (1878-1985), yazıya alan Yaqub Babayev, toplayanı M.Həkimov, MEA Folklor İnstitutunun elmi arxivi.

[2] Əlyazması, inventar 715. Toplayanı M.Vəlizadə, 1936, MEA Folklor İnstitutunun elmi arxivi.

Qoşabulağın suyuna salınan qılıncın kəsəri kütləşmir.

Sudan içən at isə heç vaxt sahibini darda qoymur, bir aylıq mənzili yerddi gündə kəsir. Yüz yaşlı qoca bu sudan içsə bənbövşə bığlı novcavan olur, korların gözünə işıq gəlir[1] və s...

Bizcə, bu və ya buna bənzər təsvirlərdə mifik əlamətlər axtarmaq da olar, poetik dillə ğəsvir edilən həyata real baxışlar da. Dastanı yaradan, yaxud onu ifa edən sənətkarı isə çox güman ki, ikinci tərəf daha çox düşündürmüşdür.

Bəllidir ki, eposda adı çəkilən və bir çox hadisələrin cərəyan etdiyi məskənlərdən biri Təkə-Türkman elidir. Azərbaycan tayfalırından biri kimi Təkə-Türkmanların tarix səhnəsində oynadıqları rol bəllidir və bu haqda müəyyən araşdırmalar aparılmışdır. Eposun Paris və Tiflis əlyazmalarından başlayaraq bugünkü çaplarına qədər demək olar ki, bütün variantlarında Təkə-Türkman eli və Təkə-Türkmanlar barədə bir çox yadda qalan epizodlar qorunmaqdadar. Təkə-Türkmanlara xüsusi yer verilmiş "Koroğlunun Türkmən səfəri" qolu bu baxımdan daha səciyyəvidir. Qola görə Eyvaz Türkman elindəndir. O, Aşıq Cününla deyişməsində öz diyarını belə tərənnüm edir:

İgidlikdə vardı eldə adımız
Aşıq, bizə Təkə-Türkman deyərlər!
Hara varsaq qabağımız qayıtmaz,
Aşıq, bizə Təkə-Türkman deyərlər!

Təkə-Türkmanla yanaşı coğrafi ad kimi eposda tez-tez xatırladılan məskənlərdən biri də Muradbəyli kəndidir. Mirzə Mehdi Vəlizadənin topladığı "Koroğlu kim idi? " adlı qola görə Koroğlu İran ölkəsində Osmanlı sərhədi yaxınlığında yerləşən bir kənddən olmuşdur[2]. "Koroğlunun Dərbənd səfəri" qolunda da Koroğlu Muradbəylidən olmasını belə xatırladır:

Ərəb paşa, sənə bir ərz eyləyim,
Yerim xəbər alsan, Muradbəyliyəm.
Yağı düşmən mənnən qovğa başlasa
Əyri qılınc əldə düşmən qovlayam.

Aşıq Mirzə Bayramovun söylədiyi "Cününun gətirilməsi" qoluna görə də Koroğlunun Muradbəylidən olması qeyd edilir[3]. "Həmzənin Qıratı aparması" qolunda Koroğlu öz nəslinə-tayfasına işarə edərək deyir:

---

[1] Əlyazması, inventar №715 (q), "Mehtər Alı", MEA Folklor İnstitutunun elmi arxivi.

[2] Əlyazması, inventar №715. "Koroğlu kim idi?", söyləyəni Aşıq Əsəd, toplayanı M.Vəlizadə, Qazax, 1936.MEA Folklor İnstitutunun elmi arxivi.

[3] Əlyazması, inventar №725 (ü), "Cününun gətirilməsi", söyləyəni Aşıq Mirzə Bayramov, 1936-cı il, MEA Folklor İnstitutunun elmi arxivi.

Muradbəyli derlər bizə,
Meydanda mərdlik işləni.
Qoç iyiddən oğul törər
Düşmən gözündə beşləni.

Eyni şerin qoşma ölçüsündə söylənmiş variantında da bənzər fikirlə qarşılaşırıq:

Paşa, bizə Muradbəyli deyərlər,
Həmşə aralıqda mərdlik işləni.
Elimizdən qoçaq oğlanlar törər
Düşmənin gözünə biri beşləni[1].

Koroğludan başqa dastanın digər iştirakçılarından Bağdadın sədriəzəminin, Mərcan xanımın atası Həsən xanın və b. Müradbəylidən olmalarına da işarə edilmişdir.

"Koroğlu" eposunun haqqında söz gedən bu yeni tərtibinə indiyədək çap edilmişlərdən başqa bir sıra yeni müstəqil qollar da daxil edilmişdir ki, onlardan "Koroğluynan Aypara" həm süjet, həm də məzmun baxımından nisbətən zəfi təsir bağışlayır. Qoldakı şeirlərin poetik səviyyəində də yüksək sənətkarlıq nəzərə çarpmır. Süjet xətti isə tez-tez qarşılaşdığımız ümumi modeli strukturu yada salır: Koroğlu İstanbula Ayparanın dalınca gəlir. Aypara İstanbul hakimi Xəlil paşanın qızıdır. O, əmisi oğlu Osmanın nişanlısıdır. Koroğlunu Ayparadan başqa onun kənizi Sənəm də sevir.

Qolun ən səciyyəvi cəhəti orada özünü göstərir ki, Koroğlunun Ayparadan oğlu olur. Lakin Sənəm intiqam almaq məqsədilə Osman vasitəsilə Koroğlu ilə Ayparanın qollarını bağlatdırıb Xəlil paşanın hüzuruna apararkən yeni doğulmuş uşaq – Səməd sahibsiz qalır. Sənəm ələ keçməsin deyə uşağı bir daşın dalında gizlədir. Yaxınlıqda yurd salan bir qurd isə uşağı tapıb, onu əmizdirir. Qolda Koroğlunun Səmədin qoluna bazubənd bağlamasına işarə edilsə də, sonda onun aqibəti bəlli olmur. Koroğlu isə Aypara ilə qovuşur.

"Koroğluynan – Aypara"da maraq oyadan ən səciyyəvi cəhət körpə uşağın qurd tərəfindən əmizdirilməsi epizodudur ki, bu da qədim türk eposu ilə bağlı ənənənin davamı kimi diqqəti cəlb edir. Maraqlıdır ki, "Zərnişan xanımın Çənlibelə gəlməyi" qolunda da eyni motivlə qarşılaşırıq. Koroğlunun Dərbənddə Möminə xanımdan olan oğlu Həsən sevdiyi Zərnişan xanıma özünü belə təqdim edir:

Mən Həsənəm, qurdoğluyam,
Düşmənimə dərd oğlyam,
Nəsilcən bil Koroğluyam,
Arxası gərək igidin.

---

[1] Əlyazması, inventar №721, "Bağdad səfəri", MEA Folklor İnstitutunun elmi arxivi.

“Koroğlunun Toqat səfəri”ndəki təkəli bəyləri “Bizim təkənin bəyləri” misrası ilə başlanan şerin son misrasında belə səciyyələndirilmişdir:

“Ağzı qanlı boz qurd olu”[1].

İlk dəfə çap olunan “Ağcaquzu” qolunda da Koroğlunun Bilqeyisdən doğulan və kimsəsiz mağarada qalan oğlunu – Ağcaquzunu bir qurd tapıb əmizdirir. Əlbəttə, bütün bunlar eposdakı bir sıra motivlərin xalqın ibtidai təsəvvür və görüşləri ilə bağlılığından doğmuşdursa, onun dini-mistik təəssübkeşliyi nisbətən sonrakı epoxanınn məhsulu olub islam mədəniyyəti ilə qovuşur.

Bəllidir ki, “Koroğlu” eposunda yaradıcısı olan xalqın qədim inam və etiqadları ilə səsləşən motivlər qorunduğu kimi, islamiyyətlə bağlı epizodlar da özünə yer tapmışdır. Bunun da özünəməxsus təbii səbəbləri vardır. Çünki, islamiyyətin intişar tapdığı çağlarda düzüb-qoşan saz-söz ustadları, yaradıcı və ifaçı sənətkarlar, ağuşunda böyüdükləri bu ideologiyadan kənarda qala bilməzdilər. Lakin “Koroğlu”da qorunan dini motivləri də, bu motivləri təbliğ edən sənətkarları da sovet dövrü aşıqları və eposun naşirləri öz əqidə və məsləklərindən uzaşlaşdırdılar. Vaxtilə eposun ən kamil naşir və tədqiqatçılarından sayılmış M.H.Təhmasib qeyd edilən məsələ ilə bağlı öz qənaət və düşüncələrinin əksinə çıxaraq yazmışdır:

“Qəti surətdə demək olar ki, Azərbaycan “Koroğlu”sunda dini heç bir şey yoxdur”. Yaxud: “Bizim dastanda Koroğlunun nə özünün, nə də dəlilərinin heç bir fövqəltəbii varlıqla əlaqəsi yoxdur”[2]. Müəllif daha sonra eposda özünə yer tapmış dini motivlərin mövcudluğunu hiss edə-edə bəzən onu yayındırmağa da çalışmışdır: “...əsərdə, eləcə də Koroğlunun özündə çox aydın şiəlik, hətta müsəlmançılıq tendensiyaları vardır. Zənnimizcə, bunlar hamısı Xodzkonun öz “fəaliyyətinin” nəticəsidir”[3].

A.Xodzko nəşrinin əlyazması (orijinalı) təsdiq edir ki, mütərcim eposa heç bir müdaxilə etməmiş, “müsəlmançılıq tendensiyaları” olduğu kimi qorunmuşdur. Bu ənənənin davamı olan “Ağcaquzu” qolu daha səciyyəvidir və bu səpgili qolların tərtibə salınması da yüzilliklər boyu xalqın düşüncəsində hakim kəsilən dini baxışların nümayişi kimi dəyərləndirilməlidir.

Hələ eposun ilk qolundan bəlli olan epizod – Rövşənin Qoşabulağa gəlməsi, köpüklü sudan içməsi əhvalatlarına əlavə kimi bu qolda deyilir ki, Qoşabulağın üstündə Həzrət Əli bir nurani qoca qiyafəsində gəlib sağ əlini Koroğlunun kürəyinə vurur, ona igidlik badəsi içirdib deyir: “Koroğlu,

---

[1] Əlyazması, inventar №722 (q), “Toqat səfəri”, MEA Folklor İnstitutunun elmi arxivi.

[2] M.H.Təhmasib. Müqəddimə, Koroğlu, Bakı, Azərb. SSR EA nəşriyyatı, 1956, s.10.

[3] M.H.Təhmasib. Müqəddimə, Koroğlu, s.18.

mənim sözümə inan, sən Koroğlusan, heç vaxt heç kimə məğlub olmayacaqsan”. Koroğlu bu sözlərə inanar-inanmaz özündə bir qüvvət, bir güc hiss etməyə başlayır. Bu inam, başqa sözlə, Əli kultuna tapınma qolda özünə yer tapmış bəzi şeirlərdə də qorunmuşdur. Bu baxımdan aşağıdakı bənd səciyyəvidir:

Koroğlu der, xub yetişdim mən cana,
Sərimi top eyləyərəm çovqana.
Varıban gedərəm Təkə-Türkmana
Ollam Əli qullarının yek rəngi.

Qolda Koroğlunun özünə arxa, kömək tapması üçün Təkə-Türkmana gəlməsi, xanın qızı Bilqeyis xanımla evlənməsi, doğulan uşağın qurd tərəfindən əmizdirilməsi, nəhayət, körpəni tapan Əsmər qarının onu himayə etməsi epizodları dastan ənənələrinə xas olan bədii boyalarla canlandırılmışdır. Bu epizodlar bir növ eposun “Aypara” qolundakı hadisələrlə üst-üstə düşür.

Tərtibə yeni daxil edilmiş qollardan biri də “Pərizad xanımın Çənlibelə gəlməyi”dir. Qol “Ağcaquzu”nun davamı kimi xüsusi maraq doğurur. Qoldakı əsas hadisələr, konfliktlər sehr, tilsim, cadu üzərində qurulmuşdur. Qol bu baxımdan daha səciyyəvidir. Çünki mövcud nəşrlərə görə bu səpgili örnəklər bəlii səbəblər üzündən epos üçün “yararsız” sayılmış, onların nəşri yoluna bir növ “çin səddi” çəkilmişdir.

Eposun ayrı-ayrı qollarına xas olan ümumi quruluş burada da davam etdirilir. Ağcaquzu Cəfər paşanın qızı Pərizad xanımı sevir. Pərizad cadugərdir və o, öz sənətinin sirlərini Ağcaquzuya da öyrətmək istəyir. O, öz sənətinin həmin sirlərini belə səciyyələndirir: “...mən cadunun gücüynən çöpü qələmə, siçanı toyuğa, adamı tülküyə, qızı göyərçinə çevirə bilərəm. İstəyirəm sən də belə şeyləri öyrənəsən”.

Pərizad cadugərliyini Ağcaquzunun gözləri qarşısında da həyata keçirir. Onlar atlanıb bir meşəliyə gəlirlər. Qolun bu epizodunda deyilir: “Pərizad bir dua oxuyub alaqanat bir quşa döndü, uçdu, getdi qondu bir ağacın başına. Həmin sehrdən birini də Ağcaquzu oxudu, bu da uçdu qondu onun yanına. Qız ağacdan enib bu dəfə bir ayrı libasa düşdü. Ağcaquzu da eynən həmin libasa düşdü. Pərizad bu dəfə dovşan libasına düşdü. Ağcaquzu bir qurd olub dovşanın qabağını kəsdi. Pərizad bir sehr oxudu pələng libasına girdi. Bu yerdə Ağcaquzu aciz qaldı”. Nəhayət, Pərizad pələng cildinə düşüb heyvanlara qarışır.

Maraqlıdır ki, Ağcaquzunun başına gələn bu macəradan onu agah edən yenə də Həzrət Əli olur. Alçaq boylu, enli kürəkli, üz-gözündən nur tökülən adam Ağcaquzuya bir piyalə içirib deyir ki, mən sağ əlimi sənin kürəyinə çəkib qırx günlüyə öz qüvvəmi sənə verirəm. Qırx gün Allahdan başqa heç kim sənə güc gələ bilməz.

Pərizad xanım sehrin gücünü Koroğluya da göstərir. Dəliləri ilə Pərizadı Ağcaquzuya aparmağa gələn Koroğlu Pərizadın qurduğu tilsimlərdən güclə can qurtara bilir. Nəhayət, Koroğlu onu Ağcaquzu üçün aparacağını bildirib qızın razılığını alır.

Qolda Koroğlunun Ağqayada Həzrət Əli ilə qarşılaşması səhnələri cərəyan edən hadisələrin aşkarlanması üçün əsas rol oynayır. Koroğlu Həzrət Əli ilə macərasını şeirlə də ifadə edir:

Nigar xanım, bir ərəbə tuş oldum
Ağlımı əlimnən aldı da getdi.
Qurumuş dilimnən hədyan eylədim,
Məni Ağqayaya çaldı da getdi.

Koroğluyam, budu sözümün sağı,
Onun hökmündədi göysər bulağı,
Adı Həzrət Əli, dinin dayağı,
Düldülünə suvar oldu da getdi.

Dini motivlər, sehr-tilsim epizodları ilə bağlı qollardan biri də "Koroğluynan Bəylər"dir. Görünür məhz bu əlamətlərinə görə də qol ancaq arxiv materialı kimi qorunmuşdur və bəlli səbəblər üzündən çapa yol tapmamışdır. Qol dastan ənənəçiliyi və ifaçılıq üslubu baxımından zəif təsir bağışlasa da, mövzu və mündəricə etibarilə ayrıca maraq oyadır.

Eposun ümumi axarına tam uyğun gələn və qəhrəman kimi Giziroğlu Mustafa bəyin şücaətini nümayiş etdirən "Mahru xanımın Çənlibelə gəlməyi" qolu da dil zənginliyi və ifa tərzi baxımından ayrıca qiymətləndirilməlidir.

* * *

"Koroğlu" eposunun janr özünəməxsusluğu hər şeydən öncə onun qəhrəmanlıq səciyyəsi ilə müəyyənləşir. Əlbəttə, dastanın bahadırlıq mahiyyəti kəsb etməsi onun yaradıcı və daşıyıcısının həyatında, maddi və mənəvi keçmişində, qan yaddaşında baş vermiş tarixi hadisələrin əks-sədası ilə şərtlənir. Eposdakı tarixiliyin dinamikası təsdiq edir ki, xalqın keçmişində baş vermiş tarixi hadisələr dastanın qəhrəmanlıq siqləti qazanmasında mühüm rol oynamışdır.

"Koroğlu"nun janr özünəməxsusluğunu şərtləndirən digər bir önəmli cəhət onda təsvir edilmiş bütün qəhrəmanlıq ruhlu səhnələrin, epizod və motivlərin aparıcı qəhrəmanın ətrafında mərkəzləşməsidir. Belə ki, dastandakı bütün döyüş, mübarizə, cəngavərlik və qələbələr Koroğlunun adı ilə bağlanır. Azərbaycan xalqı, onun çalıb-çağıran, düzüb-qoşan saz-söz sənətkarları Koroğlu obrazı ilə özünün ideal müdafiəçisini, azadlıq carçısını tərənnüm etmişdir. Zaman ötdükcə bu obraz yeni çalarlar qazanmış, xalqın poetik

təfəkküründəki qəhrəmanlıq düşüncələrinin, azadlıq ideyalarının simvoluna çevrilmişdir.

Epos vasitəsilə Azərbaycan türklərinin vətənpərvərlik, humanizm, yadellilərə qarşı yenilməzlik düşüncələrinin qorunub tərənnüm edilməsi də janrın özünəməxsusluğunu şərtləndirən xüsusiyyətlərindən biri kimi ön planda verilmişdir.

"Koroğlu" dastanında epik tarixiliyin inkişaf qatlarını izləyərkən başlıca olaraq iki cəhəti fərqləndirmək lazım gəlir: Eposu daha çox hansı epik abidələr qrupuna aid etmək lazımdır, o, "mifik"dirmi, yoxsa daha çox tarixi səciyyəmi daşıyır? Məsələyə kompleks şəkildə yanaşılarsa, özgə sözlə, bütövlükdə Koroğlu-Goroğlu-Qurqulu silsiləsi nəzərə alınarsa istər mifik, istərsə də tarixiliyin ayrı-ayrı eposların səciyyələrinə görə birinin o birindən fərqli üstünlük qazandıqlarını müşahidə etmək mümkündür. Bizcə, Azərbaycan "Koroğlu"su özünün ideya-məzmun axıcılığına, daha çox isə söykəndiyi tarixi hadisələrin epikləşdirilməsinə görə əsasən tarixi mahiyyət daşıyır. Bununla bərabər epos mifik əlamət və təzahürlərdən də xali deyildir. Lakin bu cəhət dastanda aparıcı şəkil almamış, əsas yeri tarixiliyin inikası tutmuşdur.

Eposa baxış belə qənaət doğurur ki, əsasən XVII-XVIII yüzilliklərdə formalaşan bu qəhrəmanlıq dastanı epik poetikanın əlamətləri kimi bir çox tarixi həqiqətlərin izlərini özündə qoruya bilmişdir. Bu baxımdan dastandakı şeirlərin – tarixi qəhrəmanlıq nəğmələrinin özünəməxsus yeri olmuş və bu poetik əlamətləri daha canlı, daha dolğun səciyyələndirmişdir.

Azərbaycan "Koroğlu"sunun nəsr və nəzminin bədii özünəməxsusluğu ilk növbədə onun şeirlə nəsrin növbələşməsi prinsipinə əsaslanması ilə ölçülür. Bəllidir ki, "Koroğlu" eposlarından bir çoxu, məsələn tacik "Qurqulu"su poeziya janrında yaranmışdır. Türkmən, özbək, türk, Azərbaycan qəhrəmanlıq eposları isə nəsrlə nəzmin qarşılığı əsasında formalaşmışdır. Maraqlıdır ki, Azərbaycan aşıqları həm "Koroğlu"nun, həm də müxtəlif təsnifləri aparılmış məhəbbət dastanlarının nəsr hissəsini "yurd yeri" adlandırmışlar.

"Koroğlu"nun kompozisiyası və süjet xüsusiyyətlərini izləyərkən bəlli olur ki, onun əsas aparıcı xətti bütün xalq romanları üçün ənənəvi səciyyə daşıyan ümumi mərhələlərdən keçir. Bu mərhələləri: qəhrəmanın anadan olması və təlim-tərbiyəsi, məktubla, yaxud qiyabi yolla buta almaq, aşiq olmaq; məşuqəni əldə etmək üçün səfərə çıxmaq; aşiqin, başqa sözlə, qəhrəmanın yolda qarşılaşdığı maneələr və onların dəf olunması macəraları; aşiq ilə məşuqənin görüşü, döyüş və qələbə; toyun təsviri və qəhrəmanın öz yurduna, vətəninə dönməsi – kimi qruplaşdırmaq mümkündür. İstər bütövlükdə, istərsə də ayrı-ayrı qollar şəklində götürülərsə eposun süjeti əsasən həmin inkişaf qatlarından keçir.

Azərbaycan "Koroğlu"sunun janr özünəməxsusluğunu təyin edən özgə bir əlaməti müəyyənləşdirmək üçün onu türk xalqlarının eyni adlı eposları kontekstində izləmək lazım gəlir. Məsələn, Orta Asiya "Koroğlu" dastanları

təsnif zamanı əsasən romantik eposlar qrupuna daxil edilmişdir. Bu qəbil dastanlarda qəhrəmanın öz butasına qovuşmaq üçün başqa ölkələrə axtarışa çıxması və məşuqəsi ilə birlikdə vətəninə dönməsi səhnələri geniş planda təqdim olunmuşdur. Məhz elə bu cəhətə görə də onlar qəhrəmanlıq dastanlarından fərqlənmişlər. Çünki buta, bir qədər geniş mənada götürülərsə ailə səadəti uğrunda mübarizə aparmaq qəbilə – ataşahlıq cəmiyyətinin ideallaşdırılmış forması olmuşdur. Feodal dövlətinin intişar tapdığı tarixi kəsimdə isə bu kimi meyllər get-gedə öz mövqeyini itirmişdir. Azərbaycan "Koroğlu"sunun ideya-məzmun xüsusiyyətləri belə bir qənaət doğurur ki, epos inkişaf etmiş feodal-dövləti epoxasında formalaşmışdır. Həmin tarixi mərhələdə isə xalqın arzu və diləyi, dastanı ifa edib yayan sənətkarın düşüncə tərzi qəhrəmanın sevgilisi yolunda, ailə uğrunda mübarizəsini bahadırlıq amalı kimi qəbul edə bilməzdi.

Eposun qəhrəmanlıq mahiyyəti daşıması qollarda adları çəkilən silahlar, müharibə, döyüş simvolu olan atlar vasitəsilə də səciyyələndirilmişdir. Hər bir döyüşçünün, qəhrəmanın, eposa məxsus ifadə ilə deyilsə, "dəli"nin hərb meydanında tez-tez istifadə etdiyi yaraqlar – qılınc, əmud, şeşpər, nizə, qalxan, ox, yay, kaman, xəncər, cida, gürz (toppuz), qandal (qandalaq), kəmənd, kündə və s. kimi soyuq silah növləri, həmçinin də qəhrəmanlarla birlikdə sınaq meydanından keçən Qırat, Dürat, Alapaça, Ağcaquzu, Düldül, Sürdat, Qaragöz, Sarınər, Bozqar, Aşqordar, Haçadil, Köhlənşir, Qəmərday, Əltərpənməz, Alagöz kimi atlar eposun qəhrəmanlıq ruhu ilə zənginləşməsində mühüm vasitə rolunu oynamışlar. Dastanın nəğmələrində, eynilə də yurd hissəsində at və silahların hər birinin ayrı-ayrılıqda geniş təsvirinin, tərifinin verilməsi həm bədii, həm də poetik baxımdan maraqlı səhnələrin yaranması üçün əsaslı zəmin hazırlamışdır.

"Koroğlu" eposunda öz əksini tapan əsas hadisələr, əhvalatlar real coğrafi məkanlarda, ölkə, şəhər və kəndlərdə cərəyan edir. Toponimlərin yerli-yerində xatırladılması, təsvir olunan macəraların mərkəzinə çevrilməsi dastanda inkişaf edən hadisələri konkretləşdirmişdir.

Məlumdur ki, dastanın yurd – nəsr hissəsi baş qəhrəmanın və ayrı-ayrı obrazların, eynilə də söyləyici-ifaçı aşığın mükaliməsi, dialoqu üzərində qurulmuşdur. Verilmiş mükalimələr obrazın daxili aləminin açılmasına, onun xarakterinin üzə çıxmasına kömək etmişdir.

Dastanın nəsr və nəğmələrində epitet, metafora, təkrir, hiperbola və s. kimi bədii təsvir vasitələrindən, bir sıra poetik fiqurlardan da istifadə olunmuşdur. Onlar zəngin obrazlar sisteminin, ayrı-ayrı əşyaların, predmetlərin təsvirində, eposun əsas sütunlarından sayılan Qırat, Misri qılınc, Çənlibel və Koroğlunun dolğun səciyyələndirilməsində mühüm rol oynamışlar.

"Koroğlu" nəğmələrində poetik fiqur və vasitələrin işlənmə məqamlarını müəyyənləşdirib nümayiş etdirmək xüsusi araşdırma tələb edir. Qıratın

tərifinə həsr olunmuş qoşmadakı təkririn ən gözəl nümayişi göstərir ki, poetik əlamətlər yerli-yerində böyük bədii məharətlə işlənmişdir.

Əylən, deyim Qıratın qiymətini,
Səksən min sərkərdə mala da vermə!
Səksən min ağ tüklü qəmər öyəcə,
Səksən min xəzinə pula da vermə!

Səksən min ilxıya, səksən min ata,
Səksən min mahaldan gələn barata.
Səksən min kotana, səksən min cütə,
Səksən min kotanlı kala da vermə!

Daha sonrakı bənddə "səksən min yüzə", "səksən min gəlinə", "səksən min qıza", "səksən min ərgənə" kimi təkrarlar[1] şerə ağırlıq yox, əksinə oynaqlıq, lirik axıcılıq gətirmişdir.

Dastan poetikasının zaman və məkan anlayışı yazılı ədəbiyyat və folklor abidələrindən fərqli olaraq "Koroğlu" eposunda tamamilə başqa formada qorunmuşdur. Bəllidir ki, yazılı abidələr tarixən necə yaranmışlarsa, yazıya köçürülmüşlərsə o şəkildə də hifz edilmişlər. Bu səpgili örnəklərdən, məsələn elə "Kitabi-Dədə Qorqud" boylarından fərqli olaraq "Koroğlu" stabil mətni saxlanmayan, dəyişkən, mütəhərrik dastan olmuşdur. Onun abidə xarakterli əlyazmaları (Paris və Tiflis nüsxələri) qorunsa da, mövcud olan bütün qalan qolları saz-söz məclisinin, ifaçı-dinləyici auditoriyasının qayda-qanunlarına uyğun köklənərək dəyişikliyə məruz qalmışdır. Bu baxımdan dastandakı zaman və məkanın işlənmə anlamı qədim türk eposundan da seçilir. Geniş mənalı türk mənqəbələrində təsvir edilmiş dünya modeli (məkan anlayışı) "yeraltı dünya" (qaranlıq dünya), "yerüstü dünya" (yer aləmi), "göy aləmi" kimi səciyyələndirilmişlərsə, "Koroğlu"da bu konsepsiya tamamilə islam ideologiyasına, müsəlman etiqadı və şəriəti qanunlarına uyğunlaşdırılmışdır. Belə ki, eposda məkan anlayışı qollarda adları çəkilən onlarla toponomik məskənlərdən başqa "o dünya", "bu dünya" formalarında qəbul edilmişdir. Dastanın ayrı-ayrı epizodlarından seçilmiş "...Yoxsa Eyvaz çaparı o dünyaya göndərərdi", "Canım xoca, gözüm xoca! Ölüsən o dünyadan, dirisən bu dünyadan mənə bir xəbər", "bu gecə qaçmalıyıq! Yoxsa bir də məni o dünyada görərsən", "Gərək sevənlər o dünyanı dilə gətirməsinlər" və s. kimi təfəkkür tərzi deyilənləri bir daha təsdiq etməkdədir.

Eposda epik zaman anlayışı da öz ifadəsini müxtəlif formalarda tapmışdır. Zaman vahidlərinin işlənmə məqamları rəngarəngdir və onlar hadisələrin ümumi axarına uyğun şəkillərdə bütün dastan boyu səpələnmişlər: "bir gün",

---

[1] "Həmzənin Qıratı aparması", s.171 (*Bu və bundan sonrakı çıxarışlarda mövcud nəşrin mətninə müraciət olunmuşdur*).

"sabahısı gün", "qırx gün, qırx gecə", "qırx gün tamam oldu", "usta yeddi günə daşdan bir qılınc qayırdı", "axşama qədər yol gedib", "yeddi ildən yeddi ilə cümə axşamı", "yeddi il tamam", "gecədən xeyli keçmiş", "ay keçər, il dolanar", "bir cümənin günü", "dörd günlük yolu bir günə gəlib", "ertəsi gün" və s.

Dastanda təbiət lövhələri ayrı-ayrı olayların, yaşayış məskənlərinin ab-havasına, bənzərsizliyinə, rəngarəngliyinə uyğun boyalarla təsvir edilmişdir. Bir-birindən əlvan seçimli təbiət mənzərələri yaradan ifaçı-sənətkar özünün təbiətə münasibətini, təsvir etdiyi yerin səciyyəvi əlamətlərini məharətlə, bədii sözün füsunkar qüvvəsi ilə nümayiş etdirmişdir. Özgə sözlə, yazılı ədəbiyyatda olduğu kimi, "Koroğlu" dastanında da peyzaj aşığın şifahi danışıq üslubu və ifa qabiliyyətinin səviyyəsini üzə çıxarmaqda geniş imkanlar açmışdır. Dastanın "Koroğlunun Ballıca səfəri" qolundakı Çənlibelin təsvirinə həsr olunmuş bədii lövhə peyzajın ən gözəl örnəyi sayıla bilər:

"Çənlibelin qarlı uca dağları, sıldırım qayaları ağ bulutların bağrını deşirdi. Dağlar arasında yerləşən Çənlibel Koroğlunun məskəni idi. Yaz ağzı üstündə qar əskik olmayan təpələrin başında bulutlar oynar, şimşəklər çaxar, göy guruldayar, Çənlibel leysan yağışının altında öz daşlarını, yamaclarını yuyardı. Bir azca keçməmiş bulutlar çəkilər, günəş çıxardı. Bircə saat bundan qabaq qucağında qara bulutlar oynaşan Çənlibel dəyişib başqa bir aləm olardı. Uğuldaşıb bir-birisi ilə savaşan təpələr barışardı. Aralarında uzanan qarı nənə cecimi buraya başqa bir gözəllik verərdi. Kəkliklər qaqqıldaşar, bildirçinlər qıy vurar, bülbüllər Koroğlunun səsinə səs verərdi. Sıldırımların bağrından qaynayan bulaqların töküldüyü ətəklərdə gül-gülü, bülbül-bülbülü çağırar, lalələr bənövşələrə göz vurardı. Bura Koroğlu qoruğu idi. Koroğlunun ipə-sapa yatmayan özü kimi dəli atları burada otlardılar"[1].

Eposun tərtibə daxil edilmiş və haqqında danışılan qolları müxtəlif səviyyəli ayrı-ayrı saz və söz sənəti nümayəndələrinin ifasından yazıya alındığı üçün onlarda dil, dastançılıq üslubu, xalq romanı ənənələri baxımından müəyyən fərqlər nəzərə çarpır. Belə ki, bəzi qollarda nağıl obrazlarının təsvir vasitələrindən istifadəyə meyl daha çox özünü göstərmişdir. Bu səpgili epizodlarda qarı obrazının səciyyələndirilməsi eynilə nağıllardakı qarıları yada salır:

"Qarılar dürlü olur, qarı var iman quran, qarı var iman vuran, qarı var inəyi, qarı var köpəyi, qarı var holdurum hop, qarı var koldurum kup, qarı var balağı baydaq, qarı var dabanı çatdaq"[2].

Eposdakı əsas obrazların səciyyələndirilməsində isə dastan ifaçılığı üslubu daha çox qorunmuşdur və bu, əsər boyu geniş planda nəzərə çarpır.

Bu baxımdan bir-iki məqama diqqət yetirmək kifayətdir: Aşiq qiyafəsində olan Koroğlu obrazının təsviri: "Boyu uca, kürəkləri enli, süksünü kəl

[1] "Koroğlunun Ballıca səfəri", s.310.
[2] "Zərnişan xanımın Çənlibelə gəlməyi", s.337.

süksünü kimi boynunun əti girdin-girdin, bığları burulub keçirilib qulaqlarının dalına”[1].

Aşığın təxəyyülündə yaratdığı Məhbub xanımın gözəlliyi “...vallah qız nə qız. Gözlər qara, qaşlar kaman, dişlər mirvari, dodaqları yaqutun kənarı kimi. Tellər qara, xallar qara, gözlər elədi elədi ki, dərd əhlinə gəl-gəl deyir”[2].

Yaxud, dastandakı başqa bir qadın – obrazı Hürü xanımın səciyyəsi: “...elə boylu-buxunlu, şəstli-bəstli bir qızdı ki, elə bil sərv ağacıdı qalxıb. Qaşlar qara, gözlər qara, tellər qara, xallar qara, o necə deyərlər, aya deyir sən çıxma mən çıxacağam, günə deyir sən çıxma mən çıxacağam”. Hürünün füsünkar gözəlliyinin özgə bir əlaməti: “Hürü xanım rübəndi saldı üzünə. Qara ipək rübənd qırmızı yanaqları elə qucaqladı, elə qucaqladı ki, elə bil laləli, nərgizli dağ başına qara duman çökdü”[3] və s...

Obrazların səciyyələndirilməsindəki bu bədii vasitələrlə yanaşı, dastan boyu xalq danışığında gen-bol rast gəlinən, ifaçı-aşığın dilinin əlvanlığını, yaddaşındakı söz tutumunun çevrəsini nümayiş etdirən, həmçinin birbaşa ifaçılıq sənəti, xalq hekayəçiliyi ənənəsi və üslubu ilə bağlı onlarla deyimlərdən, ifadə və birləşmələrdən yerli-yerində istifadə edilmişdir ki, bütün bunlar eposun poetik xüsusiyyətlərinin zənginləşməsində mühüm amilə çevrilmişdir. Bu kimi poetik vasitələri geniş planda xatırlatmaq və onları təhlil etmək imkan xaricindədir. Lakin ayrı-ayrı qollarda sıx-sıx rast gəlinən ən xarakterik ifadə, frazeoloji söz birləşmələrini yada salmaq məqsədyönlü olardı: “gül-gülü çağırır, bülbül-bülbülü”, “yetmiş iki qələmnən, yetmiş iki rəng vurulub”, “bir başına, bir dizinə vurdu”, “dərdi bir idi beş oldu”, “çox getdi, az getdi, dərətəpə düz getdi”, “gecəni gündüzə qatdı, gündüzü gecəyə”, “bir əlində imanı, bir əlində tumanı”, “dağları, daşları üz elədilər, dərələri, təpələri düz elədilər”, “sən saydığını say, gör fələk nə sayır”, “orda uzun-uzun yol ilə, burda müxtəsər dil ilə”, “biz öz vədimizi yerinə yetirdik, siz də öz sözünüzün ağası olun”, “günə bir mənzil, tey mənzil, az gedib çox, çox gedib az qatdılar gecəni gündüzə, qırdılar yolun damarını”, “nağılçılar dili mübarək köhlən mənzildə yüyrək olar”, “üstdən geyindi altdan qıfıllandı, altdan geyindi üstdən qıfıllandı”, “səhər açıldı, həmişə səhər üzünüzə xeyirə açılsın”, “qarışqanın sayı var idi, qoşunun sayı yox idi” və s.

Dastançı aşıqlar ifa zamanı yeri gəldikcə ara-sıra hikmətli sözlərə, didaktik məna daşıyan kəlamlara da yer vermişlər. Bu səpgili örnəklər xüsusilə dastanın yurd hissəsinə poetik əlvanlıq gətirməklə yanaşı, obrazların danışığındakı məntiqi gücləndirmiş, söylənilən fikirlərdəki gerçəkliyi möhkəmləndirmişdir. Eposun ayrı-ayrı obrazlarının dilində səslənən atalar sözü və məsəllərin ən səciyyəviləri (“qardaş qardaşa tən gərək, tən olmasa gen gərək”,

[1] “Həmzənin Qıratı aparması”, s.180.
[2] “Koroğlunun Rum səfəri”, s.141.
[3] “Koroğluynan Ərəb Reyhan”, s.192.

“igidin adını eşit, üzünü görmə”, “nə tökülən dolar, nə də keçən qayıtmaz”, “igid dil açmaz, əl açar”, “bir sirr ki otuz iki dişin arasından çıxdı, day onu saxlamaq olmaz”, “Cuğul nə ölüf, nə də öləjək, biri öldümü beşi onun yerinə pitəjək”, “sirli söz quyuda da qalmaz”, “mollanınkı azardı, tacirinki bazar”, “ağ gününü büküb göy əsgiyə” və s.) təsdiq edir ki, onlardan faydalanma dastan üslubundakı lakonikliyi artırmış, məna və fikir ardıcıllğını zənginləşdirmişdir.

Bəllidir ki, “Koroğlu” dastanı orijinal kompozisiya, rəngarəng obrazlar aləminə malik folklor abidəsidir. Xalq romanının hər bir qolu ayrı-ayrılıqda müstəqil, bitkin hekayət olsa da, bütövlükdə vahid bir süjet ətrafında birləşir. Bu süjet düzümü mühüm aparıcı xətt kimi inkişaf edərək eposu dolğun və möhtəşəm bir xalq epopeyasına çevirmişdir.

Eposun kompozisiya və quruluşuna uyğun onun obrazlar sistemi də təbii olaraq iki qismə ayrılmışdır. Bu sistemin birinci qütbünü təşkil edən dastanın aparıcı qəhrəmanları (başda Koroğlu durmaqla Nigar xanım, Aşıq Cünun, Eyvaz, Dəmirçioğlu, İsabalı, Dəli Həsən və b.) əksər qolların iştirakçısı olub bütün əsər boyu fəaliyyət göstərirlər. İkinci qrup obrazlar isə ancaq bir, yaxud iki qolun iştirakçısı olub bununla öz fəaliyyətlərini başa çatdırırlar. Nigar xanımdan başqa xalq romanının əksər qadın surətlərini (Telli, Məhbub, Dünya, Dona, Hürü, Aypara, Nərgiz, Ruqiyə, Bilqeyis, Pərzad, Mahrux, Dönməz, Möminə, Zərnişan, Mərcan) qeyd olunmuş ikinci qrupa daxil etmək mümkündür. Eposun mənfi səciyyəli obrazları da (Həsən paşa, Cəfər paşa, Aslan paşa, Bolu bəy, Camal paşa, Qəcəralı, Muştuluq, Mehtər Murtuz, Keçəl Həmzə, Mahmud paşa, Ərəb Reyhan, Xəlil paşa, Ələmqulu xan, Süleyman xan, Xotkar Murad, Cəlil paşa, Bəylər, Qaraxan, Ərəb paşa və b.) cərəyan edən hadisələrdəki iştiraklarına görə ötəri (keçici) mahiyyət daşıyır, ancaq ayrı-ayrı qollarda fəaliyyət göstərirlər.

Xalqın səadətini, istiqlaliyyət və müstəqillik uğrundakı qəhrəmanlıq ideyalarını nümayiş etdirən Koroğlu və onun başına toplaşmış dəliləri (eposda onlar tez-tez 7777 sonsuzluq rəqəmi ilə şərtləndirilir), habelə azərbaycanlı türk qadınının ən ləyaqətli simasını səciyyələndirən Nigar xanım, onun xeyir-duası ilə cəngavərlərin müxtəlif səfərlərdə Çənlibelə gətirdikləri qız-gəlinlər, həm ümumi, müştərək, həm də hər biri ayrı-ayrılıqda fərqli cizgilərə, xarakterlərə məxsus bədii obrazlardılar. Bu zəngin obrazlar qalereyasında döyüş və mübarizə meydanında misilsiz igidliklər göstərən hər bir qəhrəmanın – dəlinin özünəməxsus yeri, mövqeyi və fərdi keyfiyyətləri ilə qarşılaşırıq. Həmin fərdi əlamətlər qadın surətlərinin səciyyəsində də özünü göstərməkdədir.

Eposun poetik-lirik düzümünün forma və şəkilləri əsasən xalq şerinin, bayatı (yeddilik), gəraylı (səkkizlik), qoşma (onbirlik) ölçülərində özünü göstərmişdir. Bəllidir ki, eyni adlı özbək eposu da Azərbaycan dastanı kimi müxtəlif şeir formaları üzərində qurulmuşdur. Ölçü baxımından belə bir poetik rəngarənglikdən fərqlənən türkmən “Goroğlu”su ilə tacik “Qurqulu”su isə

yalnız “mürəbbe” və türkmən “mütakarib” şeir formalarında sabitləşmişlər. Lakin Azərbaycan “Koroğlu”sunuda adı xatırladılan şeir formalarından əlavə dastanın bir sıra əlyazmaları və müxtəlif nəşrlərində xalq şerinin başqa şəkilləri də özünə yer tapmışdır. Belə şeir formalarından biri qoşma ilə bayatının qarşılıqlı işlədilməsindən yaranmış poetik şəkildir ki, bu kimi nümunələrə dastanlarda ara-sıra təsadüf olunur və onlar daha çox aşıq-söz məclisi prosesi ilə bağlı ifa edilən nəğmələrdir:

Qırram qayaları, yıxaram dağı,
Xannar zəhər içər, sultanlar ağı,
Çənlibeldi qoç Koroğlu oylağı
Şah da gəlsə Çənlibelə qoymaram!

Mən aşığam şonqara,
Şikar gərəy şonqara,
Ciy-ciy deyən sərçələr,
Neylər şahin şonqara?[1]

“Nəğmələr kitabında” (1721) Koroğlu qoşmaları ilə yanaşı təqdim edilmiş və əslində onun adı ilə bağlı olmayan bir şeir forması da xarakterikdir və güman ki, daha çox ifa prosesi ilə bağlı nəğmədir:

İllərlə arzumanın çəkərəm
Yeri hay, məlum çəkərəm broy!
Gözüm yaşı ümman olmuş, sel, sonam!
Sel broy-broy!

Aşıq oldum, bən günahkar olmadım,
Yeri hay, məlum olmadım broy!
Zara gəlmiş əfqanımdan el, sonam!
El sonam, broy, broy![2]

Eyni nəğmənin Gürcüstan Dövlət Muzeyində saxlanan əlyazmasından[3] bəlli olur ki, qoşmaya artırılmış nəqarət xarakterli misralar yuxarıdakı şerə sonradan əlavə edilmişlər.

Nəqarət misralar yalnız qoşmalara deyil, gəraylılara da arıtırılmışdır:

Çənlibelin yeri düzdü,
Mən qurban.
Gecələr mənə gündüzdü,
Ala göz!

---

[1] Koroğlu. Toplayanı H.Əlizadə, Bakı Azərnəşr, 1941, əlavə s.171.

[2] İlyas M. “Nəğmələr kitabı” (Təbriz, yanvar, 1721), Əlyazmasının kserosurəti Nizami adına Ədəbiyyat İnstitutunun elmi arxivində saxlanılır.

[3] “Koroğlu”, tərtib edəni M.H.Təhmasib, Bakı, Azərb. SSR EA nəşriyyatı, 1956, s.441.

Koroğlu Eyvazilən,
Mən qurban.
Nazilən, ey nazilən, şahbazım[1].

“Koroğlu” eposu ilə bağlı qaynaqlarda forma və şəkil baxımından bu kimi lirik rəngarəngliyə təsadüf olunsa da, əslində xalq romanının şeirləri bütövlükdə tarixi qəhrəmanlıq nəğmələridir. Bu nəğmələri məzmun və ideya çalarlarına görə tərif, hərbə-zorba, öyüdnamə, çağırış, arzulama, təəssüflənmə, oxşama-ağı kimi bölmələrdə təsnifləmək mümkündür. Əlbəttə, bu bölgüləri tamlıqda eposun bir, yaxud iki qolunda izləmək doğru olmaz. Bütövlükdə götürülərsə, dastanın nəğmələri ideya-məzmun istiqamətlərinə görə həmin bölgülərlə zəngindir.

Tərif xarakterli şeirlərdə qəhrəmanın igidliyi, şücaəti, qüdrəti parlaq dillə tərənnüm olunur. Məsələn, Koroğlu özünü Dəli Həsənə təqdim edərkən deyir:

Məndən salam olsun əcəm oğluna
Meydana girəndə, meydan mənimdi!
Qıratım köhləndi, özüm qəhrəman
Çalaram qılıncı, düşmən mənimdi.

Şerin digər bəndlərindəki “Bir igidəm igidlərin xanıyam”, “Mənəm bu yerlərdə bir dəli, dolu” misraları da əvvəlki bənddəki fikrin davamı kimi qəhrəmanın şəninə söylənmiş ən gözəl tərifdir[2]. Eposda tərif səciyyəli şeirlər əksər qolların iştirakçısı olan Aşıq Cünunun dilindən daha çox verilmişdir. Aşıq Cünun ayrı-ayrı nəğmələrdə Koroğlu ilə Eyvazı belə tərif edir:

...Meydana girəndə, hünər eyləyər,
Leş qalar bir yanda, kəllə söyləyər,
Yüz sar gəlsə bir tərlana neyləyər
Laçın tək havada süzər Koroğlu[3].

“Koroğlu” qəhrəmanlarının hərb meydanında düşmənlə üzbəüz gələrkən ilk anda sazla-sözlə ona təsir etməsi, bununla da qələbəyə olan inamın möhkəmlənməsi hərbə-zorba mahiyyətli şeirlərdə daha çox nəzərə çatdırılmışdır. Koroğlunun Dəli Həsən, Ərəb Reyhan, Bağdad hakimi Aslan paşa, Bolu bəy və b. ilə qarşılaşarkən söylədiyi şeirlər məzmun və ideyalarına görə hərbəzorbanın ən gözəl örnəkləri sayıla bilər. Hərbə-zorba mahiyyətli nəğmələrdən seçilmiş aşağıdakı bəndlər epos qəhrəmanının şücaətini, yenilməzliyini, düşmən üzərində qələbəyə inamını bir daha qabarıq şəkildə nümayiş etdirməkdədir.

[1] Yenə orada, s.443.
[2] “Koroğluynan Dəli Həsən”, s.60.
[3] “Koroğlunun Ərzurum səfəri”, s.110.

...Demə mənə bu hədyanın,
Yəqin bil ki, allam canın.
Qılıncla tökərəm qanın
Savaşaq indi sənnən mən[1].

Yaxud:

Göydən ildırım tökdürrəm
Yurdunda bostan əkdirrəm,
Torpağın dağa çəkdirrəm,
Paşa, qoy gəlsin Eyvazı[2].

Başqa bir bənd:

Qollarını bağladaram
Bolu, mən sənin, mən sənin!
Anacığın ağladaram,
Bolu, mən sənin, mən sənin![3]

"Koroğlu" nəğmələri içərisində bir sıra öyüdnamələrə də rast gəlinir ki, onlar daha çox nəsihətamiz səciyyə daşıyır.

Dəmirçioğlu Telli xanımın dalınca Ərzuruma gedərkən Koroğluya üz tutub deyir: "Olsun ki, bu səfərdən geri qayıtmadım, mənə tapşırığın nədir"? Bu sualın cavabında Koroğlu sözünü şeirlə deyir, ona öyüd-nəsihət verir:

...İyid gərək meydan aça, düz dura,
Düşmən qabağında bığını bura,
Ayaqların üzəngiyə bərk vura,
Şeşpəri şeşpərə çatmağın gərək[4].

Eposun nəğmələri içərisində çağırış məzmunlu şeirlər daha çoxdur. Çənlibelin üstünü təhlükə alanda, yaxud dəlilərdən kimsə dara düşəndə, ölüm qorxusu ilə üzbəüz dayananda Koroğlu onlara müraciət edib ümumi səfərbərliyə ruhlandırır. Bu müraciət-çağırışlar gələcək qələbəni yaxınlaşdırır, düşmən tərəfin məğlub olacağına inamı artırır:

At belinə, dəlilərim,
Sizə qurban can, yerisin!
Tutulubdu Dəmirçioğlu,
İyid, pəhlivan yerisin!

Qoç Koroğlu gələr coşa,
Polad qalxan tutar başa,
İyidlər dursun savaşa,
Qıraq sultan, xan yerisin![5]

---

[1] "Koroğlunun Türkman səfəri", s.102.
[2] "Durna teli", s.135.
[3] "Koroğluynan Bolu bəy", s.155.
[4] "Koroğlunun Ərzurum səfəri", s.115.
[5] Yenə orada, s.122.

Yaxud:

Dəlilərim, bu gün dava günüdü,
Müxənnəs ölkəsi talanmaq gərək!
Qoç iyidlər yarasından bəllənər,
Şərbət tək qanını yalanmaq gərək![1]

Eposun bir sıra epizodlarında həm Koroğlu, həm də müəyyən tapşırıq dalınca səfərə yollanan dəlilər hərdən səhv edir və bu səhvin ağrısını-acısını dadırlar. Obrazların daxili aləmindəki bu kimi psixoloji hisslər daha çox təəssüflənmə səciyyəli şeirlərdə öz əksini tapmışdır. Bolu bəylə bağlı qolda heç kimlə razılaşmadan tək səfərə yollanan Koroğlu Camal paşanın adamları tərəfindən tutulub quyuya salınır. Öz hərəkətini götür-qoy edən Koroğlu təəssüf hissini lirik dillə belə ifadə edir:

...Belimdə yoxdu qılıncım,
Müxxənətə çatmır gücüm,
Nə yorğan var, nə də cecim,
Zülüm ay mədət, ay mədət!

Hanı nizəm, hanı atım?
Kəsildi şanı-şövkətim,
Çənlibel kimi sərhəddim,
Elim ay mədət, ay mədət![2]

Obrazların ovqatında yaranmış təəssüf eyni zamanda nikbin arzu doğurur. Bu arzu qəhrəmanın qəlbindən, düşüncəsindən keçərək şerə, nəğməyə çevrilir. Dastanın əlaqədar epizodlarında bu əhval-ruhiyyədən doğan arzulama məzmunlu qoşma və gəraylılara da sıx təsadüf olunur. Məsələn, eposun aparıcı qəhrəmanlarından sayılan Dəmirçioğlu ölüm ayağında, dar ağacının altında Koroğlunu belə yad edir:

Hanı mənim qoç Koroğlum,
Gələ girə bu meydana!
Çəkəndə Misri qılıncı,
Qəbzəsi qana boyana.

Qırat bir burdan atıla,
Müxənnət, ölkən çapıla!
Koroğlu burda tapıla
Hərəniz qaça bir yana[3].

Eposun "Mərcan xanımın Çənlibelə gəlməyi" qolunda ağı-bayatılardan da istifadə edilmişdir. Bu qolda yeddilik (bayatı) ölçüsündə olan ağılardan

---
[1] "Durna teli", s.135.
[2] "Koroğluynan Bolu bəy", s.162.
[3] "Durna teli", s.134.

başqa oxşama-şivən səciyyəli qoşmalara (onbirlik) da təsadüf olunur. Həmin qolda Eyvazı ölmüş bilən Nigar xanım və doğma anası Zərqələm hərəsi bir ağı çəkib onu belə oxşayırlar.

Nigar xanım:

Əzizim Eyvaz hanı?
Xan balam Eyvaz hanı?
Başım yaman ağrıyır,
Çağırın Eyvaz xanı!

Zərqələm:

Eləmi yarı gəlsin,
Sürülər yarı gəlsin.
Qoxusun onnan allam –
Balamın yarı gəlsin[1].

Eyvazın matəm cənazəsini görən atası qəssab Alı isə öz kədərini belə ümumiləşdirir:

Eyvaz, məni yalqız qoyma, amandı,
Axı bala dərdi çəkmək yamandı.
Qəssab Alı köçür, axır zamandı,
Bala dərdi onu yordu, ay haray!

Eyvazı doğma övladı kimi sevən Koroğlu, habelə Hürü xanım da ayrı-ayrılıqda öz kədərlərini şeirlə bildirirlər[2].

"Koroğlu" eposunun şeirlər silsiləsində məzmun və ideya baxımından aparılmış bu təsniflərdən başqa onlarla digər motivlərə, rəngarəng əlamətlərə də rast gəlmək mümkündür. Bütün bunlar Koroğlunun adı ilə bağlı tarixi qəhrəmanlıq nəğmələrinin qədim və zəngin xalq şeri ənənələrinə söykəndiyini, ondan bəhrələndiyini, bu səbəbdən də yüzilliklər boyu geniş vüsət alıb böyük şöhrət qazandığını təsdiq etməkdədir.

"Koroğlu" eposunun poetikası, obrazlar sistemi, dastanın məzmun və ideyası, ayrı-ayrı variantlarının müqayisəli tədqiqi daha geniş araşdırma tələb edir və bu problemlərə ötəri şəkildə toxunmaq ancaq bu əzəmətli qəhrəmanlıq epopeyası haqqında müəyyən təsəvvür yarada bilər. Dastanın nəşr olunmuş qolları barədə xeyli araşdırmalar mövcuddur. Burada isə yalnız tərtibə ilk dəfə daxil olunmuş qollar barədə qısa bilgi verməyi daha məqsədyönlü saydıq.

***İsrafil Abbaslı***

---

[1] "Mərcan xanımın Çənlibelə gəlməyi", s.398.
[2] Yenə orada, s.399.

# Alı kişi

Alı kişi neçə illər Həsən xana ilxı otarıb ömrünü, gününü onun qapısında çürüdüb, saqqalını ağartmışdı.

O, hər gün səhər dan yeri ağaranda ilxını haylar, bütün günü otarar, gecədən bir pas keçəndən sonra xalxala gətirərdi. Tay dağlarda, daşlarda kövşənlərdə Alı kişinin ayağı dəyməmiş bir yer yox idi.

Yenə də bir gün Alı kişi ilxını sürüb dərya qırağına aparmışdı. Atlar dəryanın qırağındakı otlaqda otlayırdılar. Alı kişi özü də bir tərəfdə daşa söykənib oturmuşdu. Qoca ilxıçı bir də baxdı ki, budu dəryadan iki at çıxdı. Alı kişi dərya atı olmağını eşitmişdi, amma heç görməmişdi. Atlar yavaş-yavaş gəlib ilxıya qarışdılar. İki madyana yaxınlaşandan sonra yenə qayıdıb dəryaya girdilər. Alı kişi nə qədər ilxıçılıq eləmişdi, belə şey görməmişdi. Tez qalxıb madyanları manşırladı. Amma bu barədə heç kəsə bir söz demədi.

Bu işin üstündən bir neçə vaxt keçdi. Alı kişi ayları, günləri sayıb, madyanları gözdən kənara qoymurdu. Bəli, elə ki, vədə tamam oldu, Alı kişi tay madyanların yanından əl çəkmədi. Ta o qədər gözlədi ki, axırda madyanlar doğdu. Alı kişi tamam-kamal iki il dayları bəslədi. Tay az qalırdı ki, gözünün yağını onlara yedirtsin.

Bəli, daylar böyüyüb iki yaşar oldular.

Bir gün Həsən xanın evinə bir paşa dostu qonaq gəlmişdi. Həsən xan dostu paşanı çox yaxşı qonaq elədi. Paşa söhbət arasında dedi:

– Həsən xan, eşitmişəm sənin qəşəng, cins atların var, gərək ilxından mənə iki ayğırlıq at verəsən.

Həsən xan o saat "baş üstə" deyib, Alı kişini yanına çağırıb tapşırdı:

– Sabah ilxını çölə aparma, paşa üçün iki ayğırlıq at tutduracam.

Həsən xan bu sözü deyən kimi daylar Alı kişinin yadına düşdü. O, xanın başını uca eləmək üçün səhər tezdən durdu, dayları tutub xalxala bağladı, ilxını sürüb çölə ötürdü.

Bir az sonra Həsən xan, paşa da yanında, xalxala gəldi. Paşa baxdı ki, xalxalda iki uzunorta, arıq, çöpüklü day bağlanıb. Bildi ki, bu dayları ona vermək istəyirlər; gülüb dedi:

– Həsən xan, mənə demişdilər ki, sənin yaxşı cins ayğırlıq atların var. Bunlar nədir? İş belə əlongə-üləngəyə qalsa, bunlardan mənim özümdə də çoxdu.

Paşanın sözü Həsən xana ox kimi dəydi. Üzünü Alı kişiyə tutub dedi:

– Axmaq qoca, mən sənə deməmişdimmi at tutduracağam, ilxını saxla; niyə saxlamamısan?

Alı kişi dedi:

– Xan sağ olsun, mən qoca ilxıçıyam. Sən bu dayların beləliyinə baxma. Əgər başının uca olmağını istəyirsənsə paşaya bunları ver.

Alı kişinin yekə-yekə danışmağınnan Həsən xan daha da qəzəbləndi. Onun üstünə qışqırıb dedi:

– Mənim ilxımda aləmdə söylənən cins ayğırlıq atlar var. Bu ələngələri qonağa göstərib məni xəcalət eləməkdə məqsədin nədi?

Alı kişi dedi:

– Xan sağ olsun, mənim məqsədim paşanın yanında sənin başını uca eləməkdi. Sənin ilxında bunlardan yaxşı at yoxdu. Bütün dünyanı gəzsən, genə də belə at tapa bilməzsən.

Həsən xan qəzəblənib dedi:

– Bilmirəm. Bir saata qədər yerdə də olsa, göydə də olsa, gərək paşaya layiq, mənim adıma layiq iki yaxşı ayğırlıq at seçəsən. Bu saat get, seç, gəti.

Alı kişi dedi:

– Xan, onda izn ver paşa üçün ayğır seçməyə başqa adam getsin. İlxıda bu daylardan yaxşı at yoxdu. Mən özüm başa düşə-düşə yaxşı atı qoyub pis at seçə bilmərəm. Bu mənim adıma layiq olmaz.

Bu söz xanı cin atına mindirdi. Cəllad çağırıb əmr elədi ki, Alı kişinin boynunu vursun. Paşa da qəzəblənmişdi. Alı kişinin axır sözü onu da dəlil eləmişdi. Odu ki dedi:

– Həsən xan, mən görürəm ki, sənin ilxıçın bu daylara çox böyük qiymət verir. Yəqin ki, elə o haqlıdı. Onda sən belə elə. Bu dayların hər birini onun bir gözünə qiymət elə.

Paşanın sözü Həsən xanın xoşuna gəldi. Əmr etdi, cəllad Alı kişinin gözlərini çıxartdı. Alı kişi nə dindi, nə də səsini çıxartdı. Bir dəfə uf da eləmədi. Elə ki, cəllad işini qurtardı, Alı kişi ayağa qalxıb dedi:

– Həsən xan, insan üçün dünyada hər naz-nemətdən şirin şey gözdü. Sən məni ondan binəsib elədin. Mən sənin qapında canımı çürüt-

düm, ilan kimi qabıq qoydum, saç, saqqal ağartdım, amma sən bunların heç birini bilmədin, qədir-qiymət vermədin, bir paşanın xatırına məni kor elədin. İndi heç olmazsa bu iki çöpüklü dayları mənə ver.

Həsən xan dayları Alının yedəyinə verdirib yanından qovdu.

Kor Alı kişinin Rövşən adında yeniyetmə, iyid bir oğlu var idi. Rövşən baxdı ki, atası qızıl al qana bulanmış, yedəyində iki day budu gəlir. Tez qaçıb onu qabaxladı. Alı kişi oğlunun səsini eşidib dedi:

– Oğul, ömrümün əvvəlindən axırına qədər Həsən xana qulluq elədim, indi əvəzində məni dünya işığına həsrət qoydu. Bala, mənim gözlərim bu atların üstündə çıxıb. Al bu atları töyləyə çək, qapı-bacanı basdır. Yaxşı muğayat ol. Amma gözlə, bu atlar gərək qırx gün, qırx gecə gün işığı görməyələr.

Rövşən atları dama çəkdi, atasının dediyi kimi onlara yaxşı qulaq asmağa başladı.

Bəli, qırx gün tamam oldu. Alı kişi oğlu Rövşəni çağırdı ki:

– Oğlum, Rövşən, məni atların yanına apar.

Rövşən atasının əlindən tutub toyləyə gətirdi. Qoca ilxıçı uzun, caydaqçəkmə sağrılı, nazik ortalı Dürata yanaşdı, əli ilə üzünü, gözünü, yalını, sağrısını tumarladı. Sonra iri başlı, dolu gözlü, qara birçəkli, uzun boyunlu, tökmə döşlü, yoğun, enli sağrılı Qırata yanaşdı. Qırat fınxırıb iki dal ayaqları üstə göyə qalxdı, ağzını açıb Alıya yönəlmək istədi. Qoca Alı atın üstünə qışqırdı. At səsindən onu tanıyıb sakit oldu. Alı Qıratın da başını, üzünü, yalını, belini, sağrısını tumarladı. Amma bunun sağrısında balaca bir batıq olduğunu hiss elədi. Dedi:

– Oğul, Rövşən, bax gör Qıratın üstünə işıq düşən yer yoxdu ki?

Rövşən baxıb gördü ki, pərdənin arasından bir iynə boyda deşik var, dedi:

– Qıratın üstündə bir iynə boyda deşik var.

İlxıçı dedi:

– Oğul, bir iynə boyda deşikdən bir kərən boyda soyuq gələr. Çıx, oranı ört.

Rövşən çıxıb deşiyi örtdü, atlara bir az da yaxşı muğayat olmağa başladı.

Bir gün yenə atası Rövşəndən soruşdu:

– Oğul, atlar necədi, necə yeyirlər?

Rövşən dedi:

– Ata, Qırat dəyirman kimi yeyir, arpa, saman yetirmək olmur; Dürat da yaxşıdı, ancaq Qıratdan az yeyir. Özü də dincdi, amma Qırat durub dincəlmir, qızmış nər kimi oyur-oyur oynuyur.

Qoca ilxıçı gecə oğlu ilə bərabər toylaya gəldi, atları yoxladı, dedi:

– Rövşən, oğul, atlar daha böyüyüb, minmək həddinə çatıblar. İndi atları bir-bir bərkə, boşa salıb, sınaqdan çıxartmaq lazımdı. Əzəl Qıratı, ondan Düratı min, təzəcə sulanmış şumda səyird, sonra qaratikanlığa sür, sonra da sıldırım daşlı dağa çap.

Rövşən atasının öyrətdiyi kimi əzəl Qıratı mindi, yenicə sulanmış şumla səyirtdi, sonra qoca ilxıçının yanına qayıtdı. Təcrübəli qoca ilxıçı Qıratın burnunu tutdu, at öskürmədi. Sonra ürəyinə qulas asdı, baxdı ki, atın ürəyi heç töyşümür. Ondan sonra dırnaqlarını yoxladı. Bir qırıq da palçıq tapa bilmədi. Rövşən indi də Düratı mindi, şuma sürdü, səyirdib yenə atasının yanına qaytardı. Alı kişi Düratın da ürəyini dinlədi, burnunu sıxdı, dırnağını yoxladı. Dürat da öskürmədi, ürəyi töyşümədi, ancaq dırnağının birindən bir qırıq palçıq tapıldı. Rövşən bu dəfə Qıratı minib qaratikanlığa vurdu. Qırat qaratikanlığı yarıb ildırım kimi süzüb ilxıçının yanında dayandı. Qoca ilxıçı onun baldırlarını, çəçiklərini yoxladı, bir yerində nə bir tikan izi tapa bilmədi, nə də bir yara. Dürat da sınaqdan pis çıxmadı. Ancaq dal ayağının birini tikan balaca cırmışdı.

Rövşən axırıncı sınaq üçün Qıratı sıldırım daşlığa saldı. Qırat güllə kimi sıldırım daşlığı endi, qızıl quş kimi uçub qoca ilxıçının barabarında dayandı. Qoca Alı Qıratın qabaq ayaqlarının üylərini bərk sıxdı. Qırat nə diksinmədi, nə də qırpınmadı. İndi Düratı minib sıldırım aşağı əldən qoydu. Dürat çeçiklərini daşlara çırpa-çırpa sıldırımı endi. Qoca Alı:

– Oğul, Rövşən, Qırat sınaqdan çox yaxşı çıxdı. Düşündüyüm kimi, Dürat da yaxşı çıxdı. Əmək itirmədi. Ancaq Qırata tay ola bilməz. Qıratın tayı-bərabəri çarx altında tapılmaz. Həmişə qorxulu səfərlərə, düşmən üstünə, qəflə sındırmağa, qalalar almağa Qıratı minərsən. Qırat səni çox darlardan, çox ölümlərdən qurtarar. Qıratın qədrini yaxşı bil, onu candan əziz saxla.

Sonra Alı kişi bir ah çəkib dedi:

– Oğul, atlar böyüdü, sınaqdan çıxdı. İndi Həsən xandan intiqam almaq vaxtı çatıbdı. Çək atları yəhərlə, gedib Həsən xanla haqq-hesabımızı çəkək.

Hələ uşaqlıqda bir gün Rövşən çöldə oynadığı vaxt yerdən bir daş tapmışdı. Daş balaca idi, amma çox ağır, samballı bir daş idi. Daş işır-işır işıldayır, parıl-parıl parıldayırdı.

Rövşən daşı yerdən götürüb, örüşdə otlayan bir buzova atdı. Daş buzova dəymədi, amma buzov onun yelindən yerə yıxılıb öldü. Rövşən qayıtdı, əhvalatı atasına danışdı.

Qoca Alı təcrübəli adam idi, dünya görmüşdü, çoxlarını yola salmışdı. Rövşənin sözlərinə qulaq asıb, dedi:

– Oğul, Rövşən, get buzov yiyəsini tap, cərimənini ver, razı sal, sonra da haman daşı götür, gətir mənim yanıma.

Rövşən getdi, əzəl buzov yiyəsini razı elədi. Sonra haman daşı tapıb gətirib atasına verdi. Alı kişi daşı əli ilə yoxladı, o üzünə, bu üzünə çevirdi, bildi ki, bu, göydən düşmüş ildırım parçasıdı.

Sabahısı gün Alı kişi Rövşəndən xəlvət ildırım parçasını götürüb tapdana-tapdana bir ustanın yanına getdi. Salam-əleykəssalamdan sonra daşın bir balaca tikəsini ustaya verib dedi:

– Usta, bu daşdan mənə bir biz qayır.

Usta bir daşa baxdı, bir də dönüb diqqətnən Alı kişiyə baxdı. Daşı qaytarıb verdi ki, sən ya özünü dolamısan, ya da ki, məni. Daşdan da biz olar?

Çox çənə-boğazdan sonra axırı Alı kişi ustanı razı elədi ki, daşı bir zindanın üstünə qoyub döysün, görsün döyülür, ya yox. Alı kişi özü bilirdi ki, daş nə daşdı. Bilirdi ki, daş dəmir kimi döyülər. Usta baxdı ki, ədə bu daş mum kimi bir şeydi. Alı kişiyə dediyi sözlərə peşiman olub daşdan bir biz qayırıb ona verdi. Alı kişi ustanın haqqını verib bizi cibində gizlətdi. Daşın qalanını bir qılınc qayıranın yanına apardı ki, bəs, usta bundan mənə bir qılınc çək. Bu usta əvvəlkindən də uzunçu idi. Qərəz, çox baş ağrısı olmasın, uzun çək-çövürdən sonra Alı kişi bu ustanı da razı elədi.

Usta yeddi günə daşdan bir qılınc qayırdı. Elə ki qılınc hazır oldu, usta baxdı ki, nə qılınc? ...Vallah bu elə bir qılınc oldu ki, almas kimi par-par parıldayır, gün kimi yanır, ay kimi işıq salır.

Ustanın qılınca gözü düşdü. Elə ki, vədə tamam oldu, Alı qılınc üçün gəldi. Usta ona öz qılıncını verməyib, əvəzində ayrı bir qılınc verdi. Ancaq qoca Alı işini əvvəldən möhkəm tutmuşdu. Dinməz-söyləməz cibindən bizi çıxardıb, qılıncın tiyəsinə basdı. Biz qılıncı dəlib, o tərəfə keçdi.

Usta baxdı ki, işlər xarabdı. Alı kişini aldada bilməyəcək, axırda naçar qalıb, onun öz qılıncını verdi. Alı kişi qılıncı götürüb evlərinə gəldi. Bu barədə oğlu Rövşənə heç bir söz demədi. Elə ki, Rövşən Qıratı, Düratı ifçin yəhərləyib aatsının barabarına çəkdi, Alı kişi hər şeyi hazır görəndə evə girdi, qılıncı gizlətdiyi yerdən götürüb, oğlu Rövşənə verdi. Dedi:

– Rövşən, al bu qılıncı belinə bağla. Bu qılınc özgə qılınclara bənzəməz. Adi qılınc deyil. Bu qılınca ildırım qılıncı deyərlər. Bu elə bir qılıncdı ki, qabağında heç bir şey dayanmaz. Hər nəyə vursan kəsər, tökər. Bu qılınc ilə sən xanlara, bəylərə, paşalara qan uddura-caqsan. Bu qılınc ilə müxənnəslər, namərdlər, qarı düşmanlar sənin əlindən dad çəkəcəklər. Bu qılınc ilə sən qalalar sındıracaqsan, qəflə-lər, karvanlar dağıdacaqsan. Ancaq bunun ildırım qılınc olduğunu heç kəsə bildirmə. Bundan sonra bunun adına Misri qılınc deyərsən. Nə qədər ki, sən Qıratın belindəsən, qılınc da sənin belindədi, heç bir düşman sənə bata bilməyəcək.

Rövşən qılıncı atasından alıb belinə bağladı. Gözləri çıxarılmış Alı kişi Dürata, Rövşən də Qırata minib yola düşdülər. Atlar ildırım kimi gedirdilər. Qırat yolu dəstələyib əlinə almışdı. Az getdilər, çox getdi-lər, axırda gəlib Həsən xanın imarətinə çatdılar. Rövşən bir tərəfdə dayandı. Qoca Alı kişi Düratı imarətin qabağına sürüb Həsən xanı çağırdı. Həsən xan çıxıb Alı kişini yalmanına əl çatmayan, uzun yallı bir atın üstündə gördü. Xan o tərəfə baxanda gördü Alının oğlu Rövşən də buradadı. Özü də bir ata minib, bir ata minib ki, ruzigarın gözü hələ belə at görməyib.

Alı kişi dedi:

– Həsən xan, bu atlar sənin bəyənmədiyin, o çöpüklü daylardı. Sən bunların üstündə mənim gözlərimi çıxartdırdın. Bax, gör indi necə at olublar. Mən sənə yaxşılıq eləmək istədim, sən anlamadın. Yaxşılığı-mın əvəzində məni dünya işığına həsrət qoydun. İndi səndən qısasımı almağa gəlmişəm. Əlindən gələni əsirkəsən kişi deyilsən.

Həsən xan Alının bu sözündən acıqlandı, qılıncını çəkib ona hücum etmək istədi. Rövşən Qıratı onun üstünə sürdü. İldırımdan qay-rılmış Misri qılıncın göydə parıldamağı ilə xanın başının yerə dığırlan-mağı bir oldu. Səs-küy qopdu. Qoşun yeridi. Rövşən özünü qoşuna vurdu. Bir yandan Qırat, bir yandan Dürat, bir yandan da Rövşən Misri qılıncla qoşunun əvvəlinci dəstəsini əldən, ayaqdan salıb qırıb dağıtdılar.

Qoşunun dalı kəsilmədi. Dəstə dəstənin dalınca gəlirdi. Qarışqanın sayı var idi, qoşunun sayı yoxudu.

Qoca Alı kişi bunu başa düşüb dedi:

– Oğul, bu qədər qoşuna sən tək cavab verə bilməzsən. Axırda ya öldürərlər, ya da tutarlar. Sür atları, özümüzü bu qoşundan salamat qurtaraq.

Rövşən əzəl atasının sözünə baxmadı, yenə də özünü qoşuna vurdu. Başlar kəsdi, qollar qırdı, mərd-mərdanə dava elədi. Ancaq kor atasının tutulmağına qorxub əlacsız davadan əl çəkdi. Atası ilə bərabər atları sürüb çölə üz qoydular. Qoşun əl çəkməyib onların dalından düşdü. Bir xeyli getmişdilər ki, bir də Rövşən Qıratın başını çəkdi, dönüb geri baxanda gördü ki, bir dəstə kəhər atlı ildırım kimi budu dallarınca gəlir.

Dedi:

– Ata bir dəstə kəhər atlı yetirhayetirdədi.

Alı dedi:

– Oğul, Rövşən, ağızlarını sulanmış şuma sal.

Rövşən atları şuma saldı. Kəhər atların hər birisi şumdan çıxa bilməyib batıb qaldılar. Qırat ilə Dürat ilıdırım kimi şumdan çıxıb yola düşdülər. Bir az getmişdilər ki, yenə Rövşən Qıratın yüyənini çəkib dönüb geri baxdı. Gördü bu dəfə də bir dəstə qara atlı budu elə gəlirlər ki, ley kimi.

Dedi:

– Ata, bir dəstə qara atlı yetirhayetirdi.

Qoca Alı dedi:

– Bala, ağızlarını qaratikanlığa sal.

Rövşən atları qaratikanlığa sürdü. Qara atlılar da özlərini tikanlığa vurdular. Qara atların baldırları qızıl qana boyandı. Rövşən bir az getmişdi, bir də atın cilovunu dartdı, qanrılıb geri baxdı, gördü indi də bir dəstə ağ atlı çathaçatdadı. Dedi:

– Ata, bir dəstə ağ atlı budu yetirhəyetirdədi.

Atası dedi:

– Oğul, qorxma, ağızlarını daşlığa sal.

Rövşən atları daşlığa dırmaşdırdı. Ağ atlar sıldırım daşlıqlara çıxa bilməyib yarı yolda qaldılar. Qırat və Dürat qızılquş kimi süzüb sıldırım qayaların dalında gözdən itdilər.

Ata, oğul axşama qədər yol gedib axşam bir çayın qırağına çatdılar. Alı kişi buranın necə yer olduğunu oğlundan xəbər aldı.

Rövşən dedi:

– Ata, bura ağaclıq, otluq bir yerdi. Ortadan da bir çay axır.

Qoca Alı dedi:

– Oğul, burada yurd salmaq olmaz. İlxının, mal-qaranın əlindən dincələ bilmərik. Bir də ki, xanlar, paşalar xəbər tutar, bizə namərdlik eləyər.

Ata, oğul o gecə çay qırağında qaldılar. Sabah açıldı, yenə qalxıb yola düşdülər. Az getdilər, çox getdilər, axşam bir düzəngaha çatdılar. Alı oranın da nə cür olduğunu Rövşəndən soruşdu. Rövşən cavab verdi ki:

– Ata, bura ucu-bucağı görünməyən bir düzəngahdı.

Qoca Alı dedi:

– Burada da qalmaq olmaz. Orada atlanan burda düşər, karvanların ayaqları altında qalarıq.

Bu gecəni də burada gecələyib sabah yenə yola düşdülər. Getdilər, getdilər uca bir dağın belinə çatdılar. Qoca Alı dedi:

– Rövşən, bu necə yerdi?

Rövşən dedi:

– Ata, bura hər tərəfi sıldırım qayalıq, çənli, çiskinli bir dağ belidi.

Alı kişi soruşdu:

– Oğul, bax gör, bu bel ki, deyirsən, bunun hər tərəfində bir uca təpə var, ya yoxdu?

Rövşən dedi:

– Ata, var. Biri sağında, biri də solunda. Özü də başları qarlıdı.

Alı dedi:

– Oğul, axtardığım yer elə buradı. Mən buranı çox yaxşı tanıyıram. Cavan yaşlarımda bu yerlərdə çox at oynatmışam. Çox ceyranlara ox atmışam, çox cüyürlər ovlamışam. Köhnə oylağımdı, mən buranın hər daşına bələdəm. Buraya Çənlibel deyərlər. Əsl yurd salmalı bu Çənlibeldi. İndi özümüz olmağa bir olacaq, atları da saxlamağa bir töylə tik.

Rövşən özləri üçün bir olacaq, atlar üçün də bir töylə tikdi. Ata-oğul Çənlibeldə yurd saldılar. Yaşamağa başladılar. Günlərin bir günündə Alı kişi Rövşəni yanına çağırıb, dedi:

– Oğul, buradakı dağların birində bir cüt bulaq var, adına Qoşabulaq deyərlər. Yeddi ildən-yeddi ilə cümə axşamı məşriq tərəfdən

bir, məğrib tərəfdən də bir ulduz doğar. Bu ulduzlar gəlib göyün ortasında toqquşarlar. Onlar toqquşanda Qoşabulaq köpüklənib daşar. Hər kim Qoşabulağın o köpüyündə çimsə elə qüvvətli bir iyid olar ki, dünyada misli-bərabəri tapılmaz. Hər kim Qoşabulağın suyundan içsə aşıq olar. Özünün də səsi elə güclü olar ki, nərəsindən meşədə aslanlar ürkər, pələnglər tük tökər, quşlar qorxusundan qanat salar, dağlar, daşlar titrəyər, atlar, qatırlar dırnaq tökər. Çox iyidlər, şahzadələr bu su üçün gəlib, heç birinin baxtı yar olmayıb. İndi yeddi il tamam olhaoldu. Vədə çatıb, get axtar, Qoşabulağı tap, o köpükdən bir qab doldurub mənə gətir.

Rövşən getdi dağları, daşları, düzləri əndər-döndər elədi. Axırda bir dağa çatdı. Gördü dağın bir tərəfində bir uca sıldırım daşlı, əl çatmaz, ün yetməz qaya var. Amma qaya elə bir qayadı ki, iyid istəyir, üstünə çıxsın. Rövşən qayanın dörd tərəfinə dolandı. Göz gəzdirdi. Əl tutan bir yer tapa bilmədi. Axırda belindən kəməndini açıb qayaya atdı, min ənvai-müsibətinən qayaya dırmaşdı. Baxdı ki, bura elə bir mənzər, laləzar yerdi ki, day nə deyim. Gül gülü çağırır, bülbül bülbülü, elə bil ki, bu sıldırım qayanın üstündə bir bağça şəkili çəkilib, yetmiş iki qələmnən yetmiş iki rəng vurulub. Qoca kəhənsalə bir ağac gördü. Yaxına gəlib baxdı ki, vallah Qoşabulaq qaynayıb göz yaşı kimi axıb ətrafı süd gölünə döndərir.

Rövşən o qədər gözlədi, axşam oldu. Gecədən xeyli keçmişdi, bir də məşriqdən bir ulduz doğdu, məğribdən də bir ulduz. Bu ulduzlar gəlib düz Qoşabulağın üstündə toqquşdular. Ulduzların toqquşmağından Qoşabulaq coşub-daşdı, ağ köpük adam boyu qalxdı.

Rövşən köpükdən bir qab doldurdu. Köpük elə gözəl, elə içməli idi ki, Rövşən özünü saxlaya bilməyib doldurduğu qabı qabaqca öz başına çəkib doyunca içdi. İkinci dəfə təzədən bir də qabı doldurmaq istəyirdi ki, atasına gətirsin, baxdı ey dadi bidad... köpük hayanda idi, bulaqlar yenə də elə durulub, elə durulub ki, elə bil göz yaşıdı axır. Rövşən bir başına, bir də dizinə vurdu, ancaq hara çatacaq... Qabı da götürüb kor-peşiman geri dönüb əhvalatı atasına danışdı.

Qoca Alı kişi bir ah çəkib, dedi:

– Mənim gözlərimin dərmanı o köpükdə idi. O da ki, ələ gəlmədi. Rövşənin dərdi bir idi, beş oldu. Özünə əl qoydu, başına-gözünə döyməyə başladı ki, niyə qabaqca özüm içdim.

Alı kişi dedi:

– Oğul, cəza-fəza eləməkdən bir şey çıxmaz. Keçənə güzəşt deyərlər. Görünür ki, mənim alnımda belə yazılıbmış. Yəqin ki, mənə bir də səni görmək qismət deyilmiş. Tay mənim əcəlim tamamdı. Qulas as, sənə bir-iki sözüm var:

– Bala, ay keçər, il dolanar, sənin adın məğribdən məşriqətən bütün dünyada məşhur olar. O köpüyü ki, sən içdin, ondan sənin qollarına qüvvət, özünə də şairlik verildi. Bir də sənin səsinə, nərənə elə bir qüvvət gələcək ki, İsrafilin suru onun yanında milçək vızıltısı olacaq. Bəylər, xanlar, paşalar sənin qorxundan tük tökəcək, quşlar qanad salacaq. Necə ki Misri qılınc sənin belində, sən də Qıratın belindəsən, özü də bu Çənlibeldəsən, sənə heç kəs dov gələ bilməyəcək. Ancaq bu həndəvərdə manşur bir qacaq var. Adına Dəli Həsən deyərlər. Özünü bircə ondan gözlə!.. Get, sənin adını Koroğlu qoydum!

Qoca Alı kişi vəli-varisini eyləyib ömrünü öz oğluna bağışladı.

Koroğlu atasını Qoşabulağın yanında dəfn eləyib, o gündən Çənlibeldə yurd saldı.

# Koroğluynan Dəli Həsən

Günlərin bir günü Koroğlu Qırat minib Çənlibelin ətəyindəki yola çıxmışdı. Bir də baxdı budu, bir dəstə yaraqlı-yasaqlı atlı gəlir. Amma atlıların qabağında bir oğlan gəlir ki, dünyalara dəyər. Üzündən, gözündən igidlik yağır. Oğlan Koroğlunu görcək, dəstəsinə hay vurdu. Atlılar o saat Koroğlunu araya aldılar. Koroğlu dayandı. Gözlədi ki, görsün işin axırı nə olacaq. Oğlan atı cövlana gətirdi, süzdürüb düz Koroğlunun qabağında dayandı. Sonra bir Koroğluya baxdı, bir atına baxdı, soruşdu:

– Əyə, de görüm kimsən? Bu yerlərdə nə gəzirsən?

Koroğlu dedi:

– Yoldan keçənəm.

Oğlan bir də Koroğlunun atına baxıb soruşdu:

– Bu atı haradan alıbsan?

Koroğlu dedi:

– Mən sənə məsləhət görürəm öz yolunla düz gedəcən. Yoxsa yaxşı olmaz.

Oğlan bu sözdən qəzəbləndi. Hirslə atının başını çəkdi. At iki dal ayaqları üstünə qalxdı. Üzünü Koroğluya tutub dedi:

– Görünür ki, sən məni tanımırsan? Əgər tanısaydın belə danışmazdın. Mənə Dəli Həsən deyərlər. Bu yollardan kim keçsə, mənə bac-xərac verməlidi.

Koroğlu onu tanıdı. Bildi ki, atasının dediyi Dəli Həsəndi. Bir də diqqətlə atına, özünə baxdı. Gördü yox, Dəli Həsən doğrudan da igid oğlandı.

Koroğlu atası ölən gündən bəri onu axtarırdı. Onunla dostlaşmaq, əlbir olmaq fikrində idi. Ancaq bilirdi ki, bu iş elə-belə baş tutmayacaq. Dava-dalaşsız məsələ düzəlməyəcək. Fikir onu götürdü ki, indi nə təhər eləsin. Elə bu fikirdə idi ki, Dəli Həsən bir də qışqırdı:

– Əyə, sənə atdan düş demirəmmi? Yoxsa əcəlin çatıb?

Koroğlu aramla dedi:

– Dəli Həsən, səsinə qüvvət vermə, igid dil açmaz, əl açar.

Dəli Həsən dedi:

– Əyə, sən kimsən ki, mənim qabağımda belə yekə-yekə danışırsan?

– Dayan, deyim kiməm.

Bunu deyib, Koroğlu atın başını çəkdi. At elə qalxdı ki, dırnağının altından qopan daş bir neçə adam boyu Dəli Həsənin başının üstündən keçib, o tərəfə düşdü. Koroğlunun ətrafını bürümüş atlılar çaxnaşmaya düşdülər. Koroğlu sazı çiynindən aşırıb döşünə basdı, dedi:

Məndən salam olsun əcəm oğluna,
Meydana girəndə, meydan mənimdi!
Qıratım köhləndi, özüm qəhrəman,
Çalaram qılıncı, düşmən mənimdi!

Meydana girəndə meydan tanıyan,
Haqqın vergisinə mən də qanıyam.
Bir igidəm, igidlərin xanıyam,
Bu ətrafda bütün hər yan mənimdi!

Adımı soruşsan, bil, Rövşən olu,
Atadan, babadan cinsim Koroğlu;
Mənəm bu yerlərdə bir dəli, dolu,
Gündoğandan ta günbatan mənimdi.

Dəli Həsən bir Koroğluya baxdı, bir dönüb başının adamlarına baxdı, hündürdən bir şaqqanaq çəkib güldü. Atlılar da gülüşdülər. Onların bu gülüşməyi Koroğluya dəydi. Bir istədi Misri qılıncı çəkib, özünü onlara göstərsin. Sonra lənət şeytana deyib, aldı sazı görək nə dedi:

İgid meydana girəndə,
Qaynayıb coşmamaq gərək.
Əgər olsa haqq vergisi,
Qismətdən qaçmamaq gərək.

Baxmaram düşmən hayına,
Haqq bəla versin, xayına,
İgid igidin payına
Köndələn düşməmək gərək.

Qoç Koroğlu çıxar düzə,
Baxmaram əlliyə, yüzə.
Mən dəlidən öyüd sizə,
Həddindən aşmamaq gərək.

Koroğlunun belə yekə-yekə nəsihət verməyi Dəli Həsənə lap acıq gəldi. Başınının adamlarına hay vurub, Koroğluya hücum eləmək istədi. Koroğlu dedi:

Gəl sənə söyləyim, ay Dəli Həsən,
And içmişəm bu gün döyüş olmasın.
Yoxsa aslan kimi cuşa gələrəm,
And içmişəm bu gün döyüş olmasın.

Mərd igidlər müxənnətdən seçilsin,
Qarı düşmən dərələrə tökülsün,
Bizim aramızda münsif tapılsın,
And içmişəm bu gün döyüş olmasın.

Çəkərəm qılıncı, kəsərəm yolu,
Mənəm igidlərdə bir dəli, dolu
Hələ coşmayıbdı bu qoç Koroğlu,
And içmişəm bu gün döyüş olmasın.

Dəli Həsən elə bildi ki, Koroğlu ondan qorxur. Geri qanrılıb, başının adamlarına dedi:

– Əyə, mən də elə bilmişəm ki, bu doğrudan da igiddi. Sən demə, bu yanşaq gəvəzənin birisi imiş. Tutun, yekə-yekə danışdığına görə atını əlindən alın, özünə də bir-iki vurub yola salın.

Koroğlu baxdı iş davasız keçməyəcək. Misri qılıncı çəkib, aldı görək nə dedi:

Acıqlanma, Dəli Həsən,
Misri qılınca qataram.
Atılaram şeşpər kimi,
Bağrın başına bataram.

Namərd nədi özün öyə?
Meydanda mərd igid söyə?
Qaçıb çıxar olsan göyə,
Kəmənd tullayıb tutaram.

Nə baxırsan küsür kimi?
Yarpaq necə əsir kimi?
İndi sənin yesir kimi
Qolların dalda çataram.

Hayqırıb açsam meydanı,
Su tək axıdaram qanı,
Dəstələyib bəyi, xanı,
Qırat döşünə qataram.

Qoç Koroğlu öz karında,
Yalan olmaz ilqarında.
Çəkib Hələb bazarında
Səni qul deyib sataram.

Koroğlunun bu sözündən Dəli Həsən qızışdı. Özü çəkildi bir kənarda durdu, başındakı adamlara hökm elədi ki, Koroğlunu tutsunlar.

Dəli Həsənin dəstəsi Koroğluya hücum elədi. Koroğlu atı cövlana gətirib, qışmız şir kimi onların üstünə cumdu.

Bir yandan Koroğlu, bir yandan Qırat az vaxtda dəstəni qatım-qatım qatlayıb əldən-ayaqdan saldılar. Dəstədən qırılan qırıldı, qalanlar da qaçıb dağıldılar. Koroğlu dəstəni dağılmış görüb, Qıratı ildırım kimi süzdürdü, çəkilib bir yanda duran Dəli Həsənin üstünə sürdü. Üzünü ona tutub, aldı görək nə dedi:

Qıratı gətirdim cövlana, indi
Varsa igidlərin meydana gəlsin!
Görsün mən dəlinin indi gücünü,
Boyansın əndamı al qana, gəlsin!..

Qorxum yox paşadan, sultandan, xandan,
Gəlsin mənəm deyən, keçirdim sandan,
Ərlər daldalanıb qorxmasın qandan,
At sürsün, qovğaya mərdana gəlsin!..

Koroğlu əyilməz yağıya, yada,
Mərdin əskik olmaz başından qada.
Nərələr çəkərəm mən bu dünyada,
Göstərrəm məhşəri düşmana, gəlsin!..

Dəli Həsənlə Koroğlu dava eləyəsi oldular. Qılınclarını çəkib, bir-birinə hücum elədilər. Qılıncdan murad hasil olmadı, əmuda əl atdılar. Əmuddan murad hasil olmadı, nizəyə əl uzatdılar. Nizədən də kar aşmadı. Axırda atdan düşdülər, güləşməyə başladılar. Dəli Həsən ilə Koroğlu çox güləşdilər, gah o buna güc gəldi, gah bu ona güc gəldi. Qoç

Koroğlu axırda bir dəli nərə çəkib Dəli Həsəni götürüb yerə vurdu. Dizini sinəsinə dayadı, əlini qılınca atanda, Dəli Həsən bir ah çəkdi.

Koroğlu dedi:

– Bir qaşıq qanından qorxub niyə ah çəkirsən?

Koroğlunun cavabında Dəli Həsən dedi:

– Ey igid, mən canımdan qorxub ah çəkmirəm. Əhdim var idi. Əhdimə çatmadım.

Koroğlu soruşdu:

– Əhdin nə idi?

Dəli Həsən dedi:

– Mən əhd eləmişdim ki, hər kim məni bassa, onunla dost, qardaş olam. Ölənə qədər onun yanında qalam. İndi sən məni basdın, ancaq öldürürsən, əhdimə çata bilmirəm.

Dəli Həsənin bu sözü Koroğlunu sevindirdi. Ayağa qalxdı, Dəli Həsənin qolundan yapışıb qaldırdı, əlini üç dəfə onun dalına vurdu.

Dəli Həsən onun qılıncının altından keçdi, ölənəcən ona qardaş olub, qulluğunda durmağa and içdi. Ondan sonra üzünü Koroğluya tutub dedi:

– Qoç Koroğlu, düz yeddi ildi ki, mən bu yolların ağasıyam. İndiyə qədər hələ bir adam mənim qabağıma çöp sala bilməyib. Bu yeddi ilin ərzində bir bəzirgan mənə bac verməmiş bu həndəvərdən keçə bilməyib. Bəylərdən, xanlardan, tacirlərdən alıb yığdığım mal-dövlətin, qızıl-gümüşün, cavahiratın hamısını saxlamışam. İgidlər arasında olan adətə görə indi onların hamısı sənə çatır. Buyur, gedək malına sahib ol!

Koroğlu qabaqca ona inanmadı. Şübhələndi ki, bəlkə hiylə qurub onu topa salmaq istəyir. Sonra fikirləşib öz-özünə dedi: "Eybi yoxdu, elə belə yaxşıdı. Bu başdan yoxlayıb, sınaqdan çıxardaram. Qoy mərddirsə də indidən bilinsin, müxənnətdirsə də indidən bilinsin". Özü Qıratı mindi, sonra da üzünü ona tutub dedi:

– Min atını, sür, gedək!

Dəli Həsən qabağda, Koroğlu dalda az getdilər, üz getdilər, gəlib bir sıldırım qayanın dibinə çatdılar.

Qayanın dibi yaman kol-kosluq idi. Dəli Həsən atını kol-kosluğa vurdu. Koroğlu da onun dalınca. Elə bir az getmişdilər ki, qabaqlarına bir mağara çıxdı. Dəli Həsən atdan düşdü. Sonra Qıratın cilovundan yapışıb dedi:

– Çatmışıq. İndi atdan düş, içəri girək.

Koroğlu yenə də Dəli Həsəni qabağına salıb mağaraya girdi. Baxdı ki, burada o qədər qızıl-gümüş var ki, elə bil yeddi padşahın xəzinəsi buradadı. Koroğlu mağaranı tamam-kamal gəzdi. Hamısını gözdən keçirdi. Sonra Dəli Həsənə dedi:

– Qoy bunlar elə buradaca qalsınlar. İndi bunlar bizə lazım deyil. Amma elə ki, Çənlibeldə yurd-yuva saldıq, başımıza dəlilər, igidlər yığıldı, onda bunlar bizə lazım olacaq.

Doğrudan da elə oldu.

Bu gündən Koroğlunun başına yavaş-yavaş adamlar yığışmağa başladı. Çox çəkmədi ki, Çənlibel qoçaq oğlanların, igidlərin məskəni oldu.

# Koroğlunun İstanbul səfəri

Koroğlu Dəli Həsənlə arxa-arxaya verib Çənlibeldə yurd-yuva salmışdı. Tay iş gəlib o yerə çatmışdı ki, Çənlibelin həndəvərindən bir karvan da keçə bilmirdi. Koroğlunun adı bütün aləmə yayılmışdı. Dünyanın hər tərəfindən iyid oğlanlar onun dəstəsinə gəlirdi. Qızlar, gəlinlər onun həsrətini çəkirdilər.

Bu səs-səda gəlib İstanbula da çatmışdı. İstanbul xotkarının qızı Nigar xanım da görməzə-bilməzə eşq badəsini içib bir könüldən min könülə Koroğluya aşiq olmuşdu. Amma yazıq qız atasının, bir də ki bir namərd qardaşı var idi, onun qorxusundan ləb tərpədib nəfəs çəkə bilmirdi. Koroğlunun dərdini ürəyinə salıb payız yarpağı kimi gündən-günə saralıb solurdu.

Deyirlər İstanbul kəndlərinin birində Bəlli Əhməd adında yeniyetmə, cavan bir oğlan var idi. Bəlli Əhmədin bığ yeri təzəcə tərləyirdi. Amma, neynirsən, sən gəl ki, qüvvətdə-hünərdə Rüstəm pəhləvana bac verməzdi. Bəlli Əhməd nə qədər ki, igid idi, bir o qədər də əli açıq, könlü-gözü tox idi. Tapdığını tək yeməzdi.

Elə ki, Koroğlu sədası gəlib buralara çatdı, Bəlli Əhməd çox götür-qoydan sonra çarıxlarının bağını bərkidib, ağamı Allah saxlasın deyib, Çənlibelə tərəf yola düşdü. Çox getdi, az getdi, o necə deyərlər dərə-təpə düz getdi, bir cümənin günündə gəlib İstanbula yetişdi.

Bəli, elə təzəcə bazara girmişdi, o yan bu yana baxırdı ki, gördü hamı qaçır. Özü də heç dükanı bağlayıb eləmir. Bir su içim saatda bütün bazar qaldı başına. Bəlli Əhməd mat-məhəttəl dayanmışdı. Bir də gördü budu bir çolaq tacir qıçını yel tutmuş qoca qatır kimi haytıya-haytıya qaçır. Tez onun qabağını kəsib soruşdu:

– Ay əmi, bu camaata nə olub? Bu nə qaçhaqaçdı?

Tacir ona diqqətlə baxıb dedi:

– Görünür qərib adamsan.

Bəlli Əhməd dedi:

– Bəli qəribəm, bu gün gəlmişəm.

Tacir qıçının birini sürüyə-sürüyə başladı danışmağa ki, bəs xotkar gedib Məkkə ziyarətinə, hər cümə günündən cümə gününə xotkarın qızı Nigar xanım məscidə gedir. O, evdən çıxanda car çəkib camaata xəbər verirlər ki, gərək hamı evə getsin. Gərək onun boyunu heç kəs görməyə. Dükanların heç birisini bağlamağa da icazə yoxdu.

Tacir dili tutula-tutula bu sözləri doğrayıb tökdü. Tələsdiyindən çolaq qarğa kimi atdana-atdana qaçıb gözdən itdi.

Bəlli Əhməd baxdı ki, doğrudan car çəkilirdi. Fikirləşdi ki, adə, mən Bəlli Əhməd olam, bir kələk qurub xotkar qızını görə bilməyəm, bu heç bir kitaba-dəftərə sığışmaz.

Cəld bir ətrafa göz gəzdirib baxdı ki, yaxında bir göyərti-səbzəvat dükanı var, qapısı da açıqdı. Yavaşca özünü verdi dükana. Qapını çəkdi, özü də piştaxtanın altına girib taxtanın deşiyindən göz qoymağa başladı.

Bəli, gözlə ha gözlə axırda dəstənin ucu açıldı, qaraçılar, fərraşlar keçəndən sonra Bəlli Əhməd bir də baxdı ki, budu Nigar xanım yetmiş iki qələmnən özünə ziynət verib qırx incəbel qızın arasında yüz-naz qəmzəynən sallana-sallana gəlir.

Nigar xanım dükan-bazara tamaşa eliyə-eliyə gəlirdi. Elə ki, Bəlli Əhməd gizlənən dükanın qabağına çatdılar, Nigar xanım yanındakı qızlara üz tutub dedi:

– Bu nə sirdi? Bütün dükanlar qalıb başlı-başına. Böyük sərraflar öz cəvahiratlarını sahibsiz qoyub gediblər. Heç dükanlarını bağlamayıblar, bu tərəvəz dükanı niyə bağlıdı? Yəqin burada bir hikmət var. Mən gərək oraya baxam.

Bəlli Əhməd bu sözləri eşidib qorxudan durdu zağ-zağ əsməyə ki, işdi, əyər xotkar qızı gəlib məni burada görsə, dədəmi qəbirdən çıxaracaq.

Yazıq qorxudan göyərti tağının içinə soxulub gizləndi. Nigar xanım qırx incəbel qızla içəri girib baxdı ki, bir nəfər şəxs başını göyərtitnin içinə soxub gizlənib. Bir təpik vurub qışqırdı ki, baxın görün bu kimdi, burada gizlənib. Qızlar Bəlli Əhmədi bayaqdan qamarladılar. Bəlli Əhməd min ənvayi-müsibətlə, bir təhər ki, özünü onların əlindən qurtarıb Nigarın ayaqlarına yıxıldı ki: “Xanım, qurbanın olum, amanın bir günüdü, bir qələtdi eləmişəm, qoyma bunları, başımda tük qalmadı”. Qızlar elə tökülüşmüşdülər onun üstünə ki, elə bil qarğa leşə tökülüb. Çimdikləyən kim, dişləyən kim, başını yolan kim. Nigar xanımın ona yazığı gəlib soruşdu:

– Yaxşı, de görüm burada nə qələt eləyirsən?

Bəlli Əhməd Nigar xanımın cavabında dedi:

– Xanım, vallah, billah mən qərib, nabələd bir adamam. Bura bu gün gəlmişəm. Elə bazarda gəzirdim. Bir də gördüm qaçhaqaç düşdü, qəriblik pis şeydi, xanım. Bilmədim hara qaçım. Axırda qaçıb buraya girdim.

Nigar xanım soruşdu:

– Ədə, adın nədi? Haralısan?

– Xanım, sənə qurban olum, adım Bəlli Əhməddi. Özüm də Ərzurum tərəfindənəm.

Nigar xanım Ərzurumun adın eşitcək tez soruşdu:

– Yaxşı, deyirlər ki, Çənlibeldə Koroğlu adında bir iyid var. Heç onu görübsən?

Bəlli Əhməd baxdı ki, aha deyəsən burada bir iş var. Yoxsa xotkar qızı Koroğlunu niyə soruşur. Tez özünü düzəldib dedi:

– Xanım, mən elə qoç Koroğlunun dəlilərindənəm.

Nigar xanım bunu eşitcək kağız götürüb bir namə yazdı ki, bəs "Koroğlu, mən İstanbul xotkarının qızı Nigar xanımam. Əyər sən doğrudan da iyidsənsə gəl məni apar".

Naməni büküb möhürlədi, ondan verdi Bəlli Əhmədə ki:

– Bu naməni çatdır Koroğluya. O əyər kişidirsə gəlib məni aparsın.

Bəlli Əhməd naməni öpüb cibinə qoydu, sonra dedi:

– Xanım, bəlkə inanmadı.

Nigar xanım qolundan bazubəndini də açıb ona verdi. Üstəlik bir də bir ovuc qızıl verdi ki, atdan, zaddan alıb, naməni tez çatdırsın.

Bəlli Əhməd oradan çıxıb özünü birbaş yetirdi karvansaraya. Tez bir at alıb Çənlibel deyib yola düşdü. Gecəni gündüzə qatdı, gündüzü gecəyə, az getdi, çox dayandı, çox getdi az dayandı, bir neçə gündən sonra gəlib Çənlibelə yetişdi. Koroğluyu tapıb Nigarın naməsini verdi ona.

Koroğlu naməni oxuyub əhvalatdan halı olandan sonra əmr elədi, Qıratı yəhərlədilər. Ondan üzünü Dəli Həsənə tutub qışqırdı ki:

– Ədə, oradan o zəncirləri buraya gətir.

Bəlli Əhməd zəncir adını eşidəndə getdi fikirə ki, yoxsa bu məni çarmıxa-zada çəkmək istəyir. Elə elə də oldu. Dəli Həsən onu yaxşıca zəncirlədi. Əl-ayağını bağlayıb üstünə də qaraul qoydu.

Deyirlər Koroğlunun belə bir xasiyyəti var idi. Ona kim belə-belə xəbərlər gətirsəydi qabaqcan onu beləcə zəncirləyib üstündə də adam qoyarmış ki, özü gedib gəlincən qaçıb eləməsin. Elə ki, gedib qayıtdı, əyər söz düz çıxdı, yaxşı xələt verib özünə dəli elərmiş, yox əyər yalan çıxdı, ortalıqda hiylə-miylə, oldu, onda tay Allah göstərməsin. Onda iş qalardı Misri qılınca.

Bəli, elə ki, Qırat hazır oldu, dəlilər yerbəyerdən dedilər ki, bəs Koroğlu, gəl bu səfərə sən tək getmə, bu, xətərli, qorxulu səfərdi.

Qoy hamımız birgə gedək. Koroğlu bu sözün üstünnən sazı döşünə basıb, dedi:

İyid gərək yar sevməyə
Özü tək gedə, tək gedə.
Müxənnət qəddin əyməyə
Özü tək gedə, tək gedə.

Nigarın şirin dilləri,
Bağrıma sancıb milləri,
Uzaq-uzaq mənzilləri
Özü tək gedə, tək gedə.

Qəniminə qılınc çala,
Ölkəsinə talan sala,
Düşmənlər üstə baş ala,
Özü tək gedə, tək gedə.

Dala polad yarağına,
Düşə iyid sorağına,
Yüz tülkünün qabağına,
Özü tək gedə, tək gedə.

Koroğluyam, haşa-haşa,
Girrəm xotkarla savaşa,
Qırat döşlətməyə paşa,
Özü tək gedə, tək gedə.

Koroğlu sazla dediyi kimi, sözlə də dedi:

– Dəlilərim, Nigar xanımı gətirməyə özüm tək gedəcəyəm. Siz qalın, Çənlibeli düşmənlərdən qoruyun.

Koroğlu qılınc qurşadı, əmud asdı, nizə götürdü, üstündən də bir saz keçirtdi.

Dəlilərlə halal-hümmət eləyib salamatlaşdı. Dəli Həsəni onların üstünə böyük qoydu. Sonra tərlan kimi tullanıb Qıratı minib yol başladı.

Elə ki, Qırat yüyənin boş gördü, ildırım kimi süzüb dörd günlük yolu bir gündə gəlib axşam üstə İstanbula yetişdi. Qaranlıq düşmüşdü. Koroğlu Qıratı sürüb bir qapını döydü. Qapıya qoca bir arvad gəldi.

Koroğlu dedi:

– Ay bacı, qəribəm, məni bu gecəliyə qonaq eləyərsənmi?

Arvad dedi:

– Niyə qonaq eləmirəm. Düş qal.

Koroğlu düşdü. Qıratı töyləyə çəkdi. Özü də arvadın evinə girib bir tərəfdə oturdu. Arvad çörək gətirdi. Koroğlu yeməkdən sonra söhbət açıb arvaddan kim olduğunu soruşdu.

Arvad dedi:

– Qoca, dul bir arvadam. Ay bala, aman-zaman gözümün ağı-qarası bircə oğlum var. Xotkar qızı Nigar xanımın nar bağında bağbandı.

Koroğlu bu işi yaxşı fal hesab eləyib çox sevindi. Deyəsən işlər yaxşı gətirdi. Elə bacadan düşən kimi qismətin üstünə düşmüşdü. Qərəz, Koroğlu ordan-burdan söz-söhbət salıb öyrəndi ki, bəs xotkar Məkkə ziyarətinə gedib. Sonra qarıdan oğlunu soruşdu ki, bəs oğlun haradadı?

Qarı dedi:

– Xotkar qızı xanım hər ayda, on beş gündə bir qırx incəbelli qızla nar bağına gəzməyə çıxır. İndi sabah yox, o birisi gün vədəsidi. Bağa gəzməyə gələcək. Odu ki, oğlum bağı yör-yöndəmə salır.

Koroğlu nə qədər oturub gözlədisə, qarının oğlu gəlib çıxmadı. Axırda arvad durdu ki, "bəs oğlan gəlmədi, yəqin gecəni bağda qalacaq, yer salım yataq".

Koroğlu baxdı ki, arvad bunun yerini evin yuxarı başında salıb, öz yerini qapının ağzında.

Dedi:

– Sən elə eləmə. Mənim yerimi qapının ağzında sal.

Arvad getdi fikrə. Əslində arvad elə Koroğlunun xotkardan, xotkarın qızından söz-söhbət açmağından, bir dəxi sir-sifətindən, yaraq-əsabəsindən bir az şəkkə düşmüşdü. İndi də belə deməyi ki, "mənim yerimi qapı ağzında sal", arvadı lap dağdağıya saldı, dedi:

– Yox, bala, mən qoca arvadam. Gecələr tez-tez bayıra-bacağa çıxıram.

Koroğlu dedi:

– Heç eybi yoxdu. Sən elə məni ayaqlayıb da keçə bilərsən. Qorxma, qabırğalarım sınmaz. Amma birdən işdi mən çölə-zada çıxmalı olsam, sən gərək xurd-xəşil olasan.

Qərəz, nə başınızı ağrıdım, Koroğlunun yeri salındı, qapının ağzında. Qoç Koroğlu bayax ha elə yerinə gircək getdi yuxuya. Xorultu dünyanı götürdü. Amma arvadın gözünə yuxu getmədi ki, getmədi.

Gecənin bir aləmində Koroğlu oyandı. Baxdı ki, arvad yatmayıb soruşdu:

– Ay ana, niyə yatmırsan?

Arvad dedi:

– Nə bilim, ay bala, yuxum qaçıb.

Koroğlu soruşdu:

– Ay ana, bəlkə məndən qorxursan?

– Yox, ancaq elə belə...

Koroğlu gördü yox arvad deyəsən sözlü adama oxşayır.

Dedi:

– Ana, sən olasan oğlunun canı düzünü de, görüm niyə yatmırsan?

Arvadın dar dünyada əziz-xələf bircə oğlu vardı. Odu ki, tay bu andın üstündən keçə bilməyib məsələni açdı ki:

– Vallah ay bala... elə belə ürəyimə dağdağa gəlib ki, görəsən sən kimsən. Heç bizim yerlərin adamına oxşamırsan.

Koroğlu soruşdu:

– Yaxşı, ay ana, sənin fikrincə mən kim ola bilərəm.

Arvad dedi:

– Ay bala, baxıram sənə... Nə bilim vallah, deməyə də utanıram... Sən elə deyəsən Nəzərgəldi pəhlivansan.

– Yox, ana, tapa bilmədin.

– Onda yəqin Ərəb Reyhansan.

– Yox, yenə tapa bilmədin.

– Onda, Giziroğlu Mustafa bəy deyilsən ki?

– Yox, ana, o da deyil.

– Bala, onda vallah az qalıram... Ay bala, birdən sən o Koroğlu olarsan ha...

– Bax, indi tapıbsan.

Arvadın səsi çıxmadı. Koroğlu bir-iki dəfə onu səslədi gördü yox, səs yoxdu. Axırda durub arvadın yanına gəldi, gördü nə, bu gün ölübsən, dünən. Arvad tir-tab düşüb özündən gedib. Tez bir az sudan-zaddan töküb onu ayıltdı. Arvad elə özünə gəlcək durdu ayağa ki, qaçsın. Koroğlu tutdu onun biləyindən.

– Ay arvad, hara qaçırsan? Mən adam zad yeyən deyiləm ki, niyə məndən qorxursan?

– Niyə səndən qorxuram? Mən hələ çox iyid arvadam ki, sənin adını eşidəndə qorxudan bağrım çatlamayıb. Allah sənin evini yıxsın.

Sənin adını eşidəndə paşalar qarın ağrısına düşür. Sənin yolun yomrulsun. Haradan gəlib mənim evimə çıxdın?

Koroğlu bir az gülüb, arvadı sakitləşdirdi. Ürək-dirək verdi. Ondan çıxardıb bir ovuc da qızıl verdi ki, bu sirri gərək heç yerdə açmayasan. Yoxsa küpə girib yeddinci göyə çıxsan, balıq olub dəryaya cumsan, yenə də əlimdən qurtara bilməzsən.

Arvad dedi:

– Xeyir, arxayın ol. Şücaətinə bələdəm. Səni tanımayana lənət. Heç gör sən gedəndən də bir-iki ay sonraya mən heç yorğan-döşəkdən dura biləcəyəm ki, bir söz də danışam. Məndə sən ürək-göbək qoyubsan ki?..

Qərəz, Koroğlu arvada bir az dəlil-dəlayıl eliyəndən sonra yerinə girdi. Amma elə bil ki, arvadın yerinə gətirib bir kisə birə tökmüşdülər. Yata bilmirdi ki, bilmirdi. Axırda çağırdı ki:

– Ay oğul, bəs axı, heç bir demədin buraya niyə gəlibsən?

Koroğlu baxdı ki, lap yeridi. Dedi:

– Ana, xotkarın qızı Nigar mənə sifariş göndərib ki, gələm onu aparam. Mən də onun üçün gəlmişəm.

Arvad dedi:

– Bax, bu oldu. Doğrudan da, Nigar xanım elə sənə yaraşan candı. Allah mübarək eləsin. Amma, ay bala, onu sən necə aparacaqsan?

Koroğlu dedi:

– Bu işdə gərək sənin oğlun mənə kömək eləyə.

Arvad sevincək dedi:

– O mənim bu əlimin içində. Ağzı nədi ki, eləməsin. İnşəallah sabah keçər, o birisi gün nar bağından birbaş...

Qərəz, gecəni yatdılar. Səhər oldu. Koroğlu durub atı yemlədi, suladı, rahatladı, arvada pul verdi ki, şey-şüy alsın xörək hazırlasın, həm də gedib oğlunu çağırsın, özü də üz qoydu meydana tərəf. Ancaq getməmişdən üst-üstə arvada tapşırdı ki, dilini dişlərinin dalında saxlasın, yoxsa boynunun ardından çıxar.

Qərəz, arvad öz işlərində olsun, sizə kimdən deyim, Koroğludan.

Bəli, Koroğlu burdan birbaş gəldi bir ustanın yanına. Ona bir ovuc qızıl verib xotkarın adına bir möhür qayırtdırıb qoydu cibinə.

Oradan çıxıb gedirdi, bir də gördü budu bir mirzə çeşməyini taxıb burnunun ucuna, əyləşib bir səkinin üstündə müştəri gözləyir. Koroğlu mirzənin yanına gəlib dedi:

– Mirzə, mənim bir qoca nənəm var. Budu bir neçə aydı ki, ölüm yorğan döşəyindədi. Hər nə eləyiriksə sağalmır. İndi mənə səni deyiblər ki, sən çox yaxşı dua yazırsan. Sənə qurban olum, gedək nənəmə bir dua yaz.

Mirzənin gözləri buğa görmüş dana gözlərinə döndü. Cəld ayağa qalxdı, qələm-davatını götürüb bir əlində imanı, bir əlində tumanı düşdü Koroğlunun yanına. Bəli, gəlib axırda yetişdilər qarının həyətinə. Mirzə baxdı ki, həyətdə bir qoca qarı var. Koroğluya baxıb dedi:

– Oğlan, bəs sən deyirdin nənəm naxoşdu. Budu nənən həyətdə gəzir ki.

Koroğlu bayaq ha darvazanı bağlamışdı. Mirzənin lap yanına gəlib dedi:

– Mirzə, əyər canına heyfin gəlirsə, çıxart kağız-qələmini xotkarın dilindən qızı Nigar xanıma bir namə yaz.

– Nə namə?

Mirzənin əlləri əsə-əsə bir parça kağız çıxartdı. Koroğlu başladı deməyə:

– Xotkarın dilindən qızı Nigara yaz ki: “Bu naməni sənə verən adam mənim çovuşumdu. Mənim barigahımda mənə olan hörmət gərək ona da ola”.

Mirzə altdan-altdan Koroğluya baxa-baxa naməni yazıb qurtardı. Tez istədi ki, ağzını bağlasın, Koroğlu dedi:

– Ver görüm nə yazmısan.

Mirzənin rəng urufu qaçdı. Başladı kəkələməyə ki, bəs səhv eləmişəm, ver təzədən yazım.

Koroğlu oxuyub gördü mirzə yazıb ki, “Nigar xanım, bu adam quldurdu. Oraya çatcaq tutub asdırarsan”.

Koroğlu bir əyri-əyri mirzəyə baxdı. Mirzə qorxusundan kağızı cırıb təzədən naməni yazıb Koroğluya verdi. Koroğlu baxdı ki, indi düz yazıb qayırtdırdığı xotkar möhürünü də naməyə vurub cibinə qoydu. Sonra mirzəyə dedi:

– Mirzə, mən sənə yaxşıca hörmət eliyəcəkdim. Sən ki, mənə kələk gəldin, sənə tay ayrı cür hörmət eləmək günahdı. Al, bu sənin zəhmət haqqın.

Bunu deyib Koroğlu mirzənin iki qaşının ortasından bir tərsə yumruq düyünlədi. Arvad qışqırmaq istəyəndə Koroğlu dönüb gözünün ucu ilə ona elə baxdı ki, arvad bayaq ha qaçıb girdi evə. Koroğlu cəld

mirzənin əbasını, əmmaməsini soyundurub onu geyindi, əlinə də bir təsbeh alıb düzəldi xotkarın barigahına tərəf. Qapıçılar onun əlində xotkarın möhürlü naməsini görcək iki qat olub torpağa düşdülər. Qapılar taybatay açıldı. Koroğlu içəriyə keçə-keçə qışqırdı:

– Hanı Nigar? Mənim qabağıma çıxsaydı, ayaqlarına soyuq dəyərdi?

Bütün barigah əhli qorxudan başladılar zağ-zağ əsməyə. Belə-belə Koroğlu qırx qapıdan keçib Nigar xanımın həyətinə girdi. Nigar xanım qırx incəbel qızla pəncərənin qabağında oturmuşdu. Bağa tamaşa eləyirdi. Onu görcək şeyx bilib tez qızlardan birisini göndərdi ki, getsin görsün kimdi, mətləbi nədi?

Koroğlu qızı görcək elə bir nərə çəkdi ki:

– Hanı Nigar? Niyə mənim qabağıma çıxmır? Xotkarın yanından gəlmişəm.

Qız onu bir otağa aparıb özü də tez qaçıb Nigara xəbər verdi. Elə ki, Nigar qırx incəbel qızla onun yanına gəldi, Koroğlu baxdı ki, Bəlli Əhməd doğru deyib. Nigar doğrudan da elə ona layiq Nigardı. Hələ üzünü görməmişdi. Elə boy buxununnan aşiq oldu. İşarə elədi ki, qızlar çıxsın, sənə gizlin sözüm var, xotkar tapşırıb.

Qızlar hamısı çıxdı. Elə ki, Nigarla Koroğlu tək qaldılar Koroğlu əbanı, əmmaməni tulladı. Nigar baxdı ki, çavuş döndü oldu bir iyid oğlan, çiynində saz. Elə qaldı mat ki, bu nədi? Koroğlu iki əlini döşünə qoyub Nigar xanıma salam verdi. Nigar salamı almadı. Koroğlu bir də salam verdi. Nigar yenə də salamı almayıb istədi ki, geri dönsün.

Aldı Koroğlu:

Salam verdim, salam almaz,
Görüm kəssin salam səni.
Axçasız, pulsuz aşiqəm,
Pulum yoxdu alam səni.

Güllü bağlarda gəzərsən,
Cahıllar bağrın əzərsən,
Yuxa kağıza bənzərsən,
Tutmaz qələm, yazam səni.

Xəzinəm yox, ağzın açam,
Dövlətim yox, tökəm saçam,
Əlac budu alam, qaçam,
Çənlibelə salam səni.

Hansı dağların qarısan?
Hansı bağların barısan?
Nigar, Koroğlu yarısan,
Bilir külli-aləm səni.

Nigar xanım baxdı ki, bu adam kimdisə buna eşq elan eləyir. Nə qədər elədisə özünü saxlaya bilməyib ucadan bir qəh-qəhə çəkib güldü, üzünü ona tutub dedi:

– Sən bir aşiq, mən bir xotkar qızı, sənin varın, pulun varmı ki, məni alasan?

Nigar xanımın cavabından aldı Koroğlu görək nə dedi:

Uca-uca dağlar başı,
Çənli də olur, çənsiz də olur.
Cəhd elə bir işdə tapıl
Sənli də olur, sənsiz də olur.

Ağ üzdə busə tək gərək,
Ərənlər İsa tək gərək,
Gözəllər Nisa tək gərək,
Telli də olur, telsiz də olur.

Koroğlunun atı olsa,
Dəmir, polad qatı olsa,
Bir iyidin zatı olsa,
Pullu da olur, pulsuz da olur.

Nigar xanım baxdı ki, bu çox Koroğlu, Koroğlu deyir. Diqqətlə belə baxanda gördü ki, öz bazubəndi ki, vermişdi Bəlli Əhmədə, onun sazının dəstəsindədi. Bildi ki, bu, Koroğludu. Baxdı ki, Koroğlu doğrudan da Koroğludu. Huşu başından elə dağıldı ki, üz-göz hamısı açıldı. Koroğlu tez onu dik götürdü. Elə qapıdan çıxartmaq istəyirdi ki, Nigar dedi:

– Yox, Koroğlu belə olmaz. Sən məni bu qədər qoşunun içindən çıxardıb apara bilməzsən.

Koroğlu dedi:

Ala gözlü Nigar, səni
Mən Çənlibelə aparram.
Çəkərəm Qırat tərkinə,
Dönərəm yelə aparram.

Mailəm gözü, qaşına,
Düşərəm, tər savaşına,
Durub dolannam başına,
Tutaram dilə, aparram.

Tülək tərlan qorxmaz sardan,
Könül ayrılmaz Nigardan,
Səni zor ilə xotkardan,
Alaram belə, aparram.

Saymaram xotkarı, xanı,
Qoşuna vermən amanı,
Meydan içində al qanı,
Döndərrəm selə, aparram.

Koroğlu gəlsə damağa,
Zərbə dözməz sultan, ağa,
Qıratı çapdırram dağa
Çardaqlı belə aparram.

Nigar dedi:

– İyidliyindən dəm vurma. Zorla iş olmaz. Yaxşısı budu ki, camaat şübhələnməmiş bu əba-qəbanı geyib buradan çıx get. Sabah keçər, o birisi gün mən nar bağına gəzməyə çıxacağam. Qaçırda bilsən, məni oradan götürüb qaçırdarsan.

Qərəz, Koroğlu yenə də əba-qəbasını geyib, qapıdan çıxıb özünü qarının evinə saldı. Baxdı ki, arvadın oğlu da gəlib, onu gözləyir. De xoş beş, on beş əyləşdilər. Xörək yeyib toqqanın altını möhkəmlədəndən sonra oğlan üzün Koroğluya tutub kim olduğunu soruşdu.

Koroğlu Nigarı görəndən sonra elə halda deyildi ki, suala sözlə cavab versin. Odu ki, sazı döşünə basıb dedi:

Cavan oğlan, ölkənizə üz tutub,
Bir qız sorağına gəldim, ha gəldim.
Osman gözəlinin düşdüm eşqinə,
Açıq qabağına gəldim, ha gəldim.

Qıratı çapdırıb yollarda yordum,
Düşmən qarşısında mərdanə durdum,
Adım Rövşən iyid, Çənlibel yurdum,
Laçın oylağına gəldim, ha gəldim.

Əskik olmaz Koroğlunun qovğası,
Düşər paşalarla cəngi, savaşı,
İstanbul şəhrində xotkar balası,
Nigar fərağına gəldim, ha gəldim.

Oğlan dedi:

– Ay igid, sən tək oğlansan. Osmanlı qoşununun içindən Nigarı necə çıxarıb aparacaqsan?

Koroğlu dedi:

– Sən məni bağa burax, necə aparacağımda işin olmasın.

Əvvəl-əvvəl bağman bir az çəkindi. Elə ki, bir tərəfdən anası, bir tərəfdən də Koroğlu düşdülər onun üstünə, oğlan razılaşdı. Gecəni yatıb səhər olcaq Koroğlu durdu, Qıratı yəhərləyib bağmanla birlikdə nar bağına gəldilər. Koroğlu atı bir tərəfdə bağladı, özü də gizlənib başladı Nigar xanımın yolunu gözləməyə. Az keçdi, çox keçdi Koroğlu bir də gördü budu Nigar xanım qırx incəbelli qızla gəlir. Koroğlu qızı görcək az qaldı huşu başından dağılsın. Nigar xanım da Koroğlunun bağda olduğunu başa düşdü. Qızları başından dağıdıb özünü o gizlənən tərəfə verdi. Koroğlu pusqudan çıxan aslan kimi onun yolunu kəsdi. Nigar dayandı. Koroğlu onun əlindən tutdu ki, çəksin. Nigar dedi:

– Yaxşı, bəs sən məni indi nə ilə Çənlibelə aparacaqsan?

Koroğlu sazı götürüb dedi:

Qırata çəkdirrəm bir cüt üzəngi,
Uca dağ başında tutaram cəngi,
Qırram osmanlını, hindi, firəngi,
İstanbulda qılınc çallam, inşallah.

Qıratımı bəsləmişəm qəhrində,
Gözəl görməmişəm sənin təhrində,
Qılınc çəkib İstanbulun şəhrində,
Xotkarı taxtından sallam, inşallah!

Qarışmayın Koroğlunun işinə,
Dov gəlləm düşmənin əlli beşinə,
Quzğun qonar yağıların leşinə,
Yağıdan qisasım, allam, inşallah!

Nigar xanım dedi:

– Axır o necə atdı ki, bizim ikimizi də bu qədər qoşunun içindən çıxardıb apara?

Aldı Koroğlu:

Uca dağ başında yel kimi əsər,
Bu günümdə mənə ürək Qıratım.
Bir aylıq mənzili bir gündə kəsər
Köhlən bəsləmişəm, görək Qıratım.

Yolların tozunu göyə qaldırar,
Müxənnət üstünü birdən aldırar,
Meydanın içində düşmən saldırar,
Olar yiyəsinə dirək Qıratım.

Qoç Koroğlu qonar olsa yəhərə,
Yağı düşmənləri salar qəhərə,
Axurda arpasın qoymaz səhərə
Dara düşsəm, mənə kömək Qıratım.

Nigar dedi:

– İndi ki, bu qədər Qırat-Qırat deyirsən gedək görək o necə atdı?

Koroğlu Nigarı Qıratın yanına gətirdi. Nigar baxıb gördü at doğrudan da yaxşı atdı. Koroğlu atın yüyənini ağacdan açıb dedi:

– Nigar xanım, bunun üstünə minməmiş yaxşı, pisliyini görə bilməzsən.

Koroğlu bunu deyib tərlan kimi sıçrayıb atın belinə mindi. Sol əlini də atıb Nigarı dik götürüb tərkinə qoydu. Nigar işi belə görüb qışqırdı ki:

– Ədə, bir qoy görək, bir danışaq, məsləhətləşək sonra.

Koroğlu atı sıçradıb bayaq ha bağdan çıxdı ki:

– Qız, nə fikir, nə məsləhət. Məsləhət elə budu ki, var.

Bəli, Koroğlu ilə Nigar Qıratın üstündə yel kimi sürüb getməkdə olsunlar, sizə kimdən deyim, Nigar xanımın qardaşından.

İstanbul xotkarının Bürcü Sultan adında bir oğlu var idi. Elə ki, xəbər çıxdı, hay-küy düşdü ki, Nigar xanımı götürüb qaçdılar, Bürcü Sultan atı minib qoşuna hay vurdu. Qoşun atlanana qədər Bürcü Sultan özü ata bir-iki tazyana çəkib yola düzəldi.

Koroğlu Nigar da tərkində yeldən qanat taxıb uçan Qıratın üstündə gəl ha gəl, gəlib bir çəməngaha çıxdılar. Bir tərəfdən Koroğlu gecəni yatmamışdı deyin yaman yuxusuz idi. Bir tərəfdən də Nigarı belə davasız-şavasız aparmaq qoç Koroğluya ağır gəlirdi. Odu ki, atdan düşdü, atı yançidar eləyib otlamağa buraxdı. Nigarı da götürüb bulağın

başına gəldi. Nigar nə qədər elədi ki, gəl gedək, atamın qoşunu gəlib bizi tutar, səni öldürər, məni də geri qaytararlar, Koroğlu onu eşitmədi. Koroğlu dedi:

– Qorxma, bizim dalımızca heç kəs gəlməyəcək.

Elə ki, Nigar əyləşdi, Koroğlu başını onun dizinin üstünə qoyub dedi:

– Nigar xanım, mən bir az yatım. Sənin gözün Qıratda olsun, elə gördün otdan ağzın çəkib, ayaqlarını yerə döyüb narahatlıq eləyir, bil ki, düşmən gəlir. Onda məni oyadarsan.

Koroğlu bunu deyib başını alagöz Nigarın dizinə qoyub yuxuladı.

Aradan bir az keçmişdi, Nigar bir də baxdı ki, vallah Qırat bir hərəkətdədi, bu hərəkətdədi ki... Elə bil ki, vaxt eləyir, atın bağrı çatlasın. Nigar tez Koroğlunu oyatdı ki:

– Dur, gör at niyə elə eləyir?

Koroğlu dedi:

– Qorxma, bir şey yoxdu. Düşmən gəlir.

Koroğlu cəld atı mindi, Nicarı da götürüb tərkinə qoydu. Bir də baxdılar ki, budu uzaqdan bir atlı elə gəlir, elə gəlir ki, ildırım kimi.

Nigar onu görcək dedi:

– Qardaşım gəlir.

Koroğlu dedi:

– Qoy gəlsin, görək nə deyir.

Elə onlar bu sözdə idilər ki, Bürcü Sultan gəlib çatdı. Nigarı Koroğlunun tərkində görcək boğazından qovqal tikanı gəlmiş öküz kimi bağırıb dedi:

– Qızı əldən qoy!

Koroğlu dedi:

– Xotkar oğlu, hirslənmə. Qızı aparan yoxdu, gəl apar.

Bürcü Sultan ondan bu sözü eşidib bir az da cürətləndi.

– Necə gəl apar! Gərək səni öldürüb qızı sonra aparam!

Koroğlu gülə-gülə dedi:

– Çox gözəl, mən də razıyam. Ancaq deyəsən çox tələsmisən, atın qarınaltısını yaxşı bərkitməmisən. Onu düzəlt sonra dava eləyək.

Bürcü Sultan əyildi ki, atın qarınaltısına baxsın. Koroğlu onun boynunun ardından bir yumruq vurub atdan yerə saldı. Alıcı quş kimi sinəsinə çökdü. Xəncərini çıxartdı ki, başını kəssin, Nigar ağladı ki:

– Koroğlu, onu mənə bağışla. Tək bircə qardaşımdı.

Koroğlu Bürcü Sultanın sinəsinin üstündən durub dedi:

– Get, səni Nigara bağışladım. Ancaq bir də girimə keçsən öldürəcəyəm.

Onlar yenidən Qırata minib Çənlibelə tərəf yol başladılar. Bürcü Sultan o qədər gözlədi ki, qoşun gəlib çatdı. Hamısı birlikdə Koroğlunun dalınca düşdülər.

Koroğlu bir də baxdı ki, budu qoşun gəlir. Tez Qıratın başını döndərib dayandı. Başladı gözləməyə. Nigar gördü ki, Koroğlu dava eləmək istəyir. Dedi:

– Koroğlu, əzəl məni götürüb qaçmayaydın. İndi ki, aparırsan qayıtma, sür apar get. Atamın qoşunu çoxdu, sən təksən. Onlarla bacarmazsan, dava eləmə.

– Mən səni Çənlibelə bu cür apara bilmərəm. Dəlilər deyərlər Koroğlu getdi xotkarın qızını qaçırdıb gətirdi. Gərək dava eləyəm, qoşun qıram, qan tökəm, paşa öldürəm, səni elə aparam.

Koroğlu bunu deyib Nigar xanım da tərkində Misri qılıncı çəkib qayıtdı, özünü osmanlı qoşununa vurdu.

Koroğlu burada dava eləməkdə olsun sizə Çənlibeldə dəlilərdən xəbər verim. Koroğlu gedəndən sonra dəlilər dedilər:

– Koroğlu tək getdi, sonra ələ keçər tutular, başsız qalarıq. Dalınca getmək gərəkdi.

Dəlilərdən bir neçəsi Çənlibeldə qaldı. Qalanı atlandı, Koroğlunun dalınca yola düşdü. Dəlilər o vaxt yetişdilər ki, qızğın dava idi. Koroğlu sağa-sola qılınc vururdu. Dəlilər nərə çəkib özlərini osmanlı qoşununa vurdular. Qoşun əhli dəlilərin hücumundan qorxub Koroğlunun başından dağıldılar.

Koroğlu göz gəzdirdi. Dəliləri qızğın dava eləyən gördü, könlü açıldı, ürəyi atlandı. Aldı görək tərkində ağlayan Nigar xanıma nə dedi:

Ağlama, telli Nigarım,
Gəldi dəlilərim, gəldi.
Xotkar qızı, gözəl yarım,
Gəldi dəlilərim, gəldi.

Düşmənə qılınc çəkməyə
Başları biçib tökməyə
Paşalar qəddi bükməyə
Gəldi dəlilərim, gəldi.

Qurbanam mərdin adına,
Dostunu salar yadına,
Bu gün bir ər imdadına,
Gəldi dəlilərim, gəldi.

Əldə şeşpəri, qalxanı,
Yağıya verməz amanı,
Öldürməyə bəy, paşanı,
Gəldi dəlilərim, gəldi.

İgidin kəsməz qovğası,
Həmişə olar davası,
Koroğlunun qoç arxası,
Gəldi dəlilərim, gəldi.

Koroğlunun nərəsinə dəlilər daha da qızışdılar. Koroğlu bir yandan, dəlilər bir yandan xotkarın qoşunundan çox qırdılar. Qoşun dəlilərin hücumuna davam gətirə bilmədi, qaçıb dağıldı. Koroğlu tərkində Nigar xanım, başında da dəlilər Çənlibelə yollandı. Uzaq yerləri keçib, yolları, yamacları aşıb gəldilər Çənlibelə çatdılar. Nigar xanım gördü, çatdıqları yer uca dağların başı, güllü-çiçəkli bir oylaqdı, dedi:

– Koroğlu, Çənlibel budurmu?

Nigar xanımın cavabında aldı qoç Koroğlu görək nə dedi:

Çiskinli dağların başı,
Nigar, Çənlibel budu, bu!
İyidlər açar savaşı
Nigar, Çənlibel budu, bu!

Çəkib bəzirgan soyduğum,
Qəflələri boş qoyduğum,
Paşalar gözü oyduğum,
Nigar, Çənlibel budu, bu!

Üst yanı dağ, təpə, dərə,
Müxənnətlər düşər girə,
Mərd iyidə olar bərə,
Nigar, Çənlibel budu, bu!

Xotkarlar bata bilməyən,
Comərdlər tuta bilməyən,
Köksünə yata bilməyən,
Nigar, Çənlibel budu, bu!

Ucalardan uca dağı
Hərgiz gələ bilməz yağı,
Koroğlu tək ər oylağı
Nigar, Çənlibel budu, bu!

Çənlibelə hay düşdü. Dəlilər hamısı at minib Koroğlunun qabağına çıxdılar. Nigar xanımı atdan düşürüb, kəcavəyə mindirdilər. Şənlik başlandı. Koroğlu ilə Nigarı məclisin baş tərəfində oturtdular.

Hamının kefi saz idi. Amma heç kimin kefi Bəlli Əhmədin kefinə çatmazdı. Xələt xələt üstündən tökülürdü. Hərə öz qüvvəsinə görə ona xələt verirdi. Bunu görən Nigar xanım Koroğludan soruşdu:

– Ay Koroğlu, bəs sən niyə Bəlli Əhmədə xələt vermirsən?

Koroğlu dedi:

– Mənim xələtim odu ki, onu azad eləyib dəliliyə götürmüşəm. Nə vaxt ki, Çənlibel dəlisi olmağa layiq olduğunu göstərdi, məndən xələti onda alacaq.

Bu sözün cavabında Bəlli Əhməd dedi:

– Koroğlu, mən Çənlibelə qorxudan, aclıqdan gəlməmişəm. Mən igid olmasaydım adıma Bəlli Əhməd deməzdilər. İnşəallah vaxt gələr səndən də xələtimi alaram.

Məclis əhli onun bu sözünə əhsən dedi. Koroğlu bir Nigara baxdı, bir dəlilərə baxdı, ürəyi telləndi, adlı görək nə dedi:

İstanbuldan buta alıb gəlmişəm,
İstanbulda arzumanım qalmadı.
Çənlibel oylağım, Qırat dayağım,
At minməkdə arzumanım qalmadı.

Qıratı çəkməsəm dağlar sökülməz,
Bəzməndin çəkməsəm sağrı örtülməz.
Qabağından qaçan düşmən qurtulmaz,
Qisas aldım, arzumanım qalmadı.

Koroğluyam, Çənlibeldə oturram,
Harda gözəl görsəm, allam, gətirrəm.
Dəliləri muradına yetirrəm,
Gözəllərdə arzumanım qalmadı.

# Aşıq Cünun

Günlərin birində Koroğlu yenə də Qıratı minib gədiyi kəsmişdi. Bir də baxdı ki, budu bir karvan gəlir. Koroğlu gözlədi, elə ki, karvan gəlib çatdı, bir nərə çəkib atı dağdan aşağıya buraxdı. Karvandakı adamlar əl-ayaq açana kimi Koroğlu onların başının üstünü aldı.

Deyirlər Koroğlu hər karvanı soyub dağıtmazdı. Qabaqca onlardan bac istərdi. Bu karvanın da qabağını kəsib bac istədi. Bəzirganbaşı onu tək görüb sözlərinə fikir vermədi. İstədi ki, karvanı çəksin. O bilmirdi ki, bu adam adı dillərdə dastan olan qoç Koroğludur. Qan vurdu Koroğlunun beyninə. Dəli Koroğlu yenə coşdu. Əvvəl Misri qılınca əl atmaq istədi. Sonra lənət şeytana deyib üç telli sazı döşünə basıb, görək nə dedi:

Gəl sənə söyləyim, bəzirganbaşı,
Gəlmişəm mən səndən bac alam, gedəm!
Dağıdam qəfləni, tökəm malını,
Gəlmişəm mən səndən öc alam, gedəm!

Polad şeşpərinən əzəm başını,
Axıdam gözünün qannı yaşını,
Cidayilən ölçəm al qumaşını,
Nağdın da olmasa, vec alam, gedəm!

Koroğluyam, sərt qayadan atıllam,
Harda dava olsa orda tapıllam,
Ac qurd kimi cümlənizə təpilləm,
Ortadan olmazsa, uc alam, gedəm!

Bəzirganbaşı bunun Koroğlu olmağına inanmadı. O eşitmişdi ki, Koroğlunun yeddi min yeddi yüz yetmiş yeddi dəlisi var ki, onlar düşmən görəndə, şirə, pələngə dönürlər. İndi onu görüb Koroğlu olduğuna inanmadı, bac vermək istəmədi. Atını sürüb yola düzəlmək istəyirdi ki, Koroğlu aldı başının üstünü, görək nə dedi:

Almamış al qumaşını,
Buraxmaram səni burdan!
İçib doymamış qanını,
Buraxmaram səni burdan!

Tutubsan yükünü uca,
Sənsən tacirbaşı xoca.
Matahını soymayınca
Buraxmaram səni burdan!

Meydanda şeşpər atmamış,
Qolların dalda çatmamış,
Qırat döşünə qatmamış,
Buraxmaram səni burdan!

Haradan tutdun sorağı,
Al eylədin qannı yağı,
Sinənə çəkməmiş dağı,
Buraxmaram səni burdan!

Qoç Koroğlu istər xərac,
İyidsənsə gir, meydan aç.
Malını eylərəm tarac,
Buraxmaram səni burdan!

Koroğlu sazla dediyi kimi sözdə də dedi:

– Bəzirganbaşı! Mən səninlə dava eləmək istəmirdim. İndi ki, bac vermədin, öz xoşunla dava-dalaşsız karvanı Çənlibelə çək! Yoxsa zorla aparacağam.

Bəzirganbaşı özünü elə göstərdi ki, guya razıdı, karvanı Çənlibelə çəkir. Amma hiylə yolu ilə göz altı öz yaraxlı-yasaqlı adamlarına him elədi ki, Koroğlunu vursunlar. Yaraqlı tacirlər Koroğluya hücum elədilər. Elə bil ki, beş-on dənə siçan bir qızmış kərgədanı öldürmək istəyirdi. Bu qabaqca Koroğluya gülməli gəldi. Sonra boynunun qat-qat duran əti qızardı. Koroğlu aşdı, daşdı, aslan kimi coşdu, qaplan kimi qeyzə gəldi. Misri qılıncı çəkdi, tərlan kimi Qıratın belinə yatıb meydana təpildi. Sağdan vurdu soldan çıxdı, soldan vurdu sağdan çıxdı, tacirləri xurd-xəşil elədi. Baxdılar ki, yox bu zarafat eləməli adam deyil, silahlarını töküb dayandılar. Koroğlu hamısını Qıratın döşünə qatıb Çənlibelə gətirdi. Dəlilər qabağa çıxdı. Malları yerə düşürdülər, yerbəyer eləməyə başladılar. Koroğlu baxdı ki, tayların içində bir böyük dəmir sandıq var. Fikirləşdi bu yəqin qızıl-gümüşdı. İşarə elədi sandığı açdılar. Nə çıxsa yaxşıdı. Baxdılar ki, sandığın içində saçı çiynində bir adam uzanıb. Koroğlu qaldı məhəttəl ki, bu nə sirrdi? Döndü

bəzirganbaşı tərəfə ki, ondan soruşsun, gördü bəzirganbaşı meyit kimi tir-tap uzanıb yerə. Yanına yüyürdü, gördü xeyir ha... dünən ölübsən, bu gün! Bəzirganbaşı qup-quru quruyub. Dəlilərdən birisi dedi ki, bəs sən sandığı açanda o özündən getdi. Sudan-zaddan tökdülər, kişi bir az özünə gəldi. Koroğlu soruşdu: "Bu nə sirrdi?".

Bəzirganbaşı dedi:

– Koroğlu, indi ki, belə oldu, düzünü deyəcəyəm. Bu mənim aşığımdı. Adı da Aşıq Cünundu. Bu o qədər ayağı yüngül, xeyir bərəkətli adamdı ki, mənim yanıma gələndən bəri mal-dövlətim həddini aşıb. Sən bizə hücum eliyəndə mən havanı bulut görüb onu sandıqda gizlətdim ki, bəlkə malım, dövlətim getsə də, o qalsın.

Koroğlu fikrə getdi. Bir tərəfdən Aşıq Cünunu öz yanında saxlamaq istəyirdi, bir tərəfdən onu bəzirganbaşının əlindən zorla almaq istəmirdi. Bir də başını yuxarı qaldıranda Aşıq Cünunu qabağında diz çökmüş gördü.

Aşıq Cünun dedi:

– Qoç Koroğlu, gözüm, könlüm səni tutub. Ömrümün axırınacan sənə qulluq edəcəm.

Aşıq Cünun o gündən Koroğlunun yanında qaldı. Ömrünün lap axır gününəcən onun aşığı oldu.

Deyirlər ki, Aşıq Cünun həmişə şəhərləri, kəndləri, obaları, oymaqları gəzib dolanardı, harda bir iyid, nəcib, ana südü əmmiş oğlan görsə gəlib Koroğluya xəbər verərdi. Koroğlu da onları öz dəstəsinə gətirdərdi.

# Koroğlunun Türkman səfəri

Deyirlər Koroğlunun oğlu yox idi. Nigar xanımı almışdısa da, amma övladı olmamışdı. Koroğlu Qarsın ətəklərindəki Alacalar adlı dağda Osmanlı qoşunu ilə toqquşduğu zaman çox bərk dara düşüb, yeddi gün, yeddi gecə o mahasırada qalmışdı. Bundan çox qorxduğuna görə kişilikdən kəsilmişdi.

Günlərin bir günü yenə də Çardaqlı Çənlibeldə kef məclisi qurulmuşdu. Xanımlar, dəlilər, mehtərlər geyinib-keçinib Koroğlunun, Nigar xanımın sağ-solunda əyləşmişdilər. Neçə vaxt idi ki, bir yana səfər yox idi. Koroğlunun başı davadan, qalmaqaldan bir az ayazımışdı.

Koroğlunun Cünun aşığı da bu kef məclisində idi. Bir tərəfdə oturub Koroğlunu gözləyirdi ki, nədən desə ondan oxusun. Hamı kefdəydi. Bunların içində bircə Nigar xanım qəmgin idi.

Deyirlər Nigar xanım əlini uzadıb cibindən balaca bir güzgü çıxartdı. Özünə güzgüdə baxıb dərin bir ah çəkdi.

Koroğlu bunu görüb soruşdu:

– Ay Nigar xanım, kef bizdə, damaq bizdə, mal-dövlət bizdə, sən niyə belə qəmginsən?

Koroğlunun cavabından Nigar xanım bir də aynaya baxdı. Genə ah çəkib, aldı görək nə dedi:

Qəm-qüssəm başımdan aşıb,
Mən tək dərdə dalan yoxdu.
Qürbət eldə bağrım bişib,
Necə yada salan yoxdu.

Necə baxım ev-eşiyə,
Yaralı könlüm üşüyə.
Toz bürümüş boş beşiyə,
Şirin layla çalan yoxdu.

Çənlibeldə qar görünür,
Güllər mənə xar görünür,
Günüm ahu-zar görünür,
Bir qaydıma qalan yoxdu.

Tutun məclisdə yasımı,
Geymişəm qəm libasımı,
Bu fələkdən qisasımı,
Nə zamandı alan yoxdu.

Çənlibeli güllər bəzər,
Güllər saralsa kim üzər?
Hər quş balasıynan gəzər,
Niyə sənin balan yoxdu?

Koroğlusan hay salarsan,
Paşalardan bac alarsan,
Neçə şəhərlər talarsan,
Sən tək şəhri talan yoxdu.

Nə dərd olsa məni tapar,
Sonsuzluq bir yanım çapar,
Yarılğan uçar, toz qopar,
Görəsən ki, qalan yoxdu.

Nigarı dərdə gətirən,
Cəsədin qəbrə yetirən,
Koroğlu namın götürən
Yurdunda son olan yoxdu.

Nigar xanımın sözlərindən Koroğlu da qəmləndi. Onu da dərd aldı. Aşıq Cünunun işi belə görüb sazı sinəsinə basıb dedi:

Bürüyüb aləmi şanın, şöhrətin,
Bir de, qoç Koroğlu, nədən məlulsan?
Adın çəkiləndə yağı titrəyir,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Dəlilər yeriyir, alaylar bükür,
Düşmanlar əlindən dad, həzar çəkir,
Quşlar qanad salır, şahlar tük tökür,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Dağların başından keçəmmir karvan,
Ovsarı əlində ağlayır sarvan,
Tacirlər əlindən çəkirlər aman,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Nərəndən meşədə əsir aslanlar,
Zərbindən titrəyir xotkarlar, xanlar,
Sənə baş əyirlər bəylər, sultanlar,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Qıratın üstündə dili-təng olan,
Paşalar varına talanlar salan,
İsgəndər tək sudan bac-xərac alan,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Çənlibeldə ağır məclislər quran,
Tuncular döşdəyən, əyəşlər qıran,
Ayaqlarda əsən, başlarda duran,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Yanında əyləşib ala göz Nigar,
İyidlər, dəlilər bütün hər nə var,
Aşıq Cünun şoğa gələr, oxuyar,
Bir de, qoç Koroğlu, nədən məlulsan?

Aşıq Cünunun oxumasından Koroğlunun qəlbi coşa gəldi, köhnə yaraları təzələndi, sazı aldı, görək nə dedi:

Sənə deyim, Aşıq Cünun,
Gözlərimdə yaş inildər,
Bir iyid oğlan ucundan,
Şeş atanda, beş inildər.

Telli Nigar məlul durar,
Əl qoynunda boynun burar,
Mujganın sinəmə vurar,
Göz oxşayar, qaş inildər.

Könlümü namərdlər yıxsa,
Polad qolçaq qolum sıxsa,
Misri qılınc qından çıxsa,
Leş sərilər, baş inildər.

Coşdu dəli könül, coşdu,
Mövc verdi, kəllədən aşdı,
Bir meşəyə ki, od düşdü,
Quru yanar, yaş inildər.

Koroğluyam, sözüm çoxdu,
Sözlərim peykanlı oxdu,
Hansı iyidin sonu yoxdu,
Ocaq sönər, daş inildər.

Elə ki, Koroğlu sözünü tamam elədi, Aşıq Cünun dedi:

– Ay qoç Koroğlu, elə buna görə məlulsan? Buna nə var ki? Sənin mənim kimi aşığın var. Dünya mənim ayağımın altında sini kimidi. Gedərəm, hər yanı gəzərəm, axtararam, bir Rüstəm kimi iyid, Yusif kimi gözəl oğlan taparam, gəlib sənə xəbər verrəm, gətirib özünə oğul eləyərsən.

Aşıq Cününun bu məsləhətinə Koroğlu, dəlilər, xanımlar, hamısı razı oldu. Telli Nigar dedi:

– Ay aşıq Cünun, nə vaxt bir belə iş eləsən mənim, Koroğlunun, dəlilərin hörməti sənin üstündən əksik olmaz.

Bu söz Nigarın ağzından çıxan kimi aşıq Cünun sazını götürdü. Koroğluynan, dəlilərnən, xanımlarnan əltəmən olub yola düşdü. Dağ aşdı, dərə keçdi, neçə-neçə oymaqlar, neçə-neçə şəhərlər gəzdi, dövran açdı, məclislər qurdu, çox oğlanlar gördü, çox iyidlər nişanladı, amma qoç Koroğluya, alagöz Nigara layiq olan Rüstəm kimi iyid, Yusif kimi gözəl oğlan görmədi. Hər yerdən, hər torpaqdan keçib getdi, axşam üstə Təkə-Türkmanda bir obaya çıxdı. Gördü obanın çoban-çoluqları, cavanları sürülərini, naxırlarını yollardan, döşlərdən töküb qabaqlarında obaya haylayırlar. Onlar aşıq Cününu görcək başına yığışıb dedilər:

– Aşıq, nə yaxşı oldu, səni tapdıq. Bu gecə bizim obada toy məclisi var.

Aşıq Cünun yaxasını qırağa çəkib getmək istədisə də, Türkman iyidləri əl çəkmədilər, onu özləri ilə apardılar.

Axşam toy məclisi quruldu. Toy yiyəsi dövlətli bir adamdı. Təkə-Türkmanın adlı-sanlı iyidləri, ağsaqqal, qarasaqqalları, cahal-cuhulları, qız-gəlinləri hamısı məmə yeyəndən pəpə deyənə toya yığılmışdılar. Yemək-içməkdən sonra aşıq Cününu ortaya çıxartdılar. Soruşdular ki, ay aşıq, haradan gəlirsən, haraya gedirsən? Kimin aşığısan?

Aşıq Cünun dedi:

– Qoç Koroğlunun aşığıyam. Çənlibeldən gəlib Ərzuruma gedirdim.

İyidlərdən birisi Koroğlu adını eşidib dedi:

– Ay aşıq, Koroğlunu çox vurub tutan, iyid deyirlər. Bir onun şücaətindən, iyitliklərindən de, qulaq asaq.

Aşıq Cünun sazı sinəsinə basıb, görək nə dedi:

İyidlər oylağı o Çənlibeldə
Daşdan qala quran qoç Koroğludu.
Kinli paşalara meydan oxuyan,
Çox köhlənnər yoran qoç Koroğludu.

Düşmanın üstünü quş tək aldıran,
Aslanlar dişindən ovlar saldıran,
Xaqanlar başına şeşpər çaldıran,
Qulac qollar buran qoç Koroğludu.

Dağları, daşları duman bürüsə,
Qılınclar pas atıb qında çürüsə,
Misir, İstanbul, Şam, tamam yerisə,
Tək qabaqda duran qoç Koroğludu.

Qayada tor qurub tərlanlar tutan,
Yüz yağını birdən qol-qola çatan,
Ərəbat döşünə sərdarlar qatan,
Ər bağırlar yaran qoç Koroğludu.

Cünun, əyləşiblər ərlər qarşında,
Alaylar, başlanar tər savaşında,
Yeddi min yeddi yüz dəli başında,
Şahlar üstə varan qoç Koroğludu.

Aşıq Cünun sözünü qurtarar-qurtarmaz toy adamları ona əl çaldılar, afərin dedilər. Bol nəmər yığdılar. Aşıq Cünun yığılan nəmərləri yiyələrinə qaytarıb dedi:

– Qoç Koroğlunun malı, dövləti çoxdu. Mən belə qəpik-quruşlara tamah salıb Koroğlunun adını batırmaram. Mən nəmər, pul yığan aşıqlardan deyiləm.

Dedilər:

– Elə isə oxu, könlümüzü aç, dərdimizi, qəmimizi dağıt.

Aşıq Cünun sazını götürüb istədi ki, yenə Koroğludan oxusun, bu zaman özünə qürrələnənlərdən biri ayağa durub dedi:

– Ay aşıq, Koroğludan oxuduğun yetər, indi də bizim iyidlərdən oxu.

Aşıq Cünun dedi:

– Aşıq gördüyünü çağırar. Mən Koroğlunu görmüşəm, ondan oxuyuram. Buraya təzə gəlmişəm, sizin iyidləri görməmişəm, onlardan

necə oxuyum? Məclisdə siz söyləyən adlı-sanlı iyid varsa, qalxsın, görüm, özünə layiq tərifini eləyim.

Bu söz aşıq Cünunun ağzından çıxan kimi hər yandan:

– Qəssəboğlu Eyvaz ayağa qalxsın, aşıq onun iyidliyinə baxıb tərif söyləsin – dedilər.

Eyvaz ayağa qalxdı. Aşıq Cünun baxdı ki, vallah bu bir oğlandı ki, iyidlikdə Rüstəmzal, gözəllikdə Yusif onun əlinə su tökməyə yaramaz. Ürəyində dedi, ay gidi dünya, axtardığımı tapmışam. Elə Koroğlu, telli Nigara layiq oğlandı ki var. Aşıq Cünun coşa gəlib aldı, görək nə dedi:

Məclis başında durubsan,
Neçə iyidlər yorubsan,
Qaşlarını nə qurubsan,
Bürcə bənzər boyun, Eyvaz!

Gözəllər pişvaza gələr,
Doğan ana qədrin bilər,
Alnın açıq, üzün gülər,
Nə şirindi suyun, Eyvaz!

Sən Yusifi-Kənansanmı?
Paşasanmı, sultansanmı?
Mələksənmi, insansanmı?
Kimə çatar soyun, Eyvaz?!

Çatmaz gücünə nər sənin,
Adın dildə əzbər sənin,
Koroğlu kimi ər sənin,
Axır olur oyun, Eyvaz!

Aşıq Cünun sənə heyran,
Eləmə könlümü viran,
Çənlibeldə qoyub nişan
Bir tutaydım toyun, Eyvaz!

Hər yandan kişilər, oğlanlar, qızlar, gəlinlər əl çaldılar. Aşıq Cünunu dönə-dönə alqışladılar. Sağ ol, sağ olun üstündən yağırdı. Aşıq Cünun genə də coşdu, başladı, görək nə dedi:

Çənlibel başında əsrəmiş bir nər,
Eyvaz, gələr alar Koroğlu səni
Yıxar qayaları, atar dağları,
Kəməndinə salar Koroğlu səni.

Eyvaz Aşıq Cünunun Koroğlu ilə onu qoxutmasını görüb aldı cavabında görək nə dedi:

İyidlikdə vardı eldə adımız
Aşıq, bizə Təkə-Türkman deyərlər!
Hara varsaq qabağımız qayıtmaz
Aşıq, bizə Təkə-Türkman deyərlər!

Aşıq Cünun:

Dinib danışdığı davadı, dovdu,
Söndürən ruzgardı, yandıran qovdu.
Aləmi bürüyən sönməz alovdu,
Alovlara qalar Koroğlu səni!

Eyvaz:

Düşman gözün oyun-oyun oyaram,
Mənsur kimi dərisini soyaram.
Koroğlunu qızıl qana boyaram,
Aşıq, bizə Təkə-Türkman deyərlər.

Aşıq Cünun:

Dava günü qulac qolu qayıtmaz,
Nərəsindən gecə iyidlər yatmaz.
Yerdə olsan, göydə olsan, unutmaz,
Arar, axır bular Koroğlu səni.

Eyvaz:

Köhlən minib çıxar olsam yoluma,
Kim yapışar rikabıma, qoluma?
Koroğlu sağıma, Həsən soluma,
Aşıq, bizə Təkə-Türkman deyərlər!

Aşıq Cünun:

Dağların başında yel kimin əsər,
Bir qılınca yetmiş yeddi baş kəsər,
Tərlan gəmişdirib Çənlidə küsər,
Gələr qıya, çalar Koroğlu səni.

Eyvaz:

Türkmanların say-seçməsin yığaram,
Bulud olub Çənlibelə yağaram,
Koroğlunu özüm tutub boğaram,
Aşıq, bizə Təkə-Türkman deyərlər!

Aşıq Cünun:

Cünun Koroğluya bir şirin nökər,
Düşmanın üstünə göydən od tökər,
Şığıyıb Qıratın tərkinə çəkər,
Əziz-xələf qılar Koroğlu səni!

Eyvaz:

Hayqırıb meydanda açsam qol-qanat,
Qarı düşman qabağımda olar mat,
Eyvazı qorxutmaz Koroğlu, Qırat,
Aşıq, bizə Təkə-Türkman deyərlər.

Aşıq Cünun istədi ki, hərbə-zorba ilə, söz güləşdirmə ilə Eyvazı qorxudub özü ilə Çənlibelə aparsın. Bir də Koroğlunu Çənlibeldən buraya gətirib götür qoya, zəhmətə salmasın. Gördü yox, bu o deyilənlərdən deyil, hər belə zarafatlarnan qorxası canavar deyil. Bir az da artıq danışsa çömçəsini alıb başına çalar. Aşıq Cünun gizlicə Eyvazın əsil-soyunu, yer yurdunu yaxşıca öyrəndi. Toyun sabahı günü yolu əlinə alıb Çənlibel sənsən getdi, gecə gündüzə saldı, yolun damarını kəsib hər yerdən keçdi, gəldi bir sabah ertəsi Çənlibelə çatdı. Koroğlu, dəlilər, xanımlar onu görüb başına yığışdılar. Görüşəndən sonra yetmiş yeddi yerdən dedilər:

– Ay aşıq Cünun, haraları, gəzdin, nə gördün, nə eşitdin? Niyə belə gec gəldin?

Onların cavabında aşıq Cünun sazını götürüb görək nə dedi:

Vardım şəhərə, obaya,
Keçdi zimistan, yaz gördüm.
Uğradım çölə, səhraya,
Bulaq üstə yarpız gördüm.

Dən-dən oldu dağlarda qar,
Bağlar gətirdi heyva, nar.
Dolandı qış, gəldi bahar,
Göllərdə ördək, qaz gördüm.

Dolandım neçə oymağı,
Keçdim düzü, aşdım dağı,
Hələb qəsri, Bağdad bağı,
Döşənmiş payandaz gördüm.

Gedəndə mənə oldu tuş
Qars, Qağızman, İstanbul, Muş,
Çanaqqala, Sarıqamış
İgidlərin şahbaz gördüm.

Alacalardan aşanda,
Ərzurumu dolaşanda,
Qənimlərtək savaşanda
Gözü qanlı xırsız gördüm.

Əyri qılıncı belində,
Tərifi mərdlər dilində,
O Təkə-Türkman elində,
Qassaboğlu Eyvaz gördüm.

Laçın kimi göydə süzür,
Namərdlər bağrını əzir,
Məclisində sağı gəzir,
Ortada söhbət, saz gördüm.

Aşıq Cünun, de üz barı,
Dolandım dünyanı yarı,
Qoç Koroğlunu, Nigarı,
Eyvaz tək əri az gördüm.

Aşıq Cünuna cavabında Koroğlu üzünü başındakı xanlara, bəylərə, paşalara qan udduran, tacirlərə tük saldıran iyid dəlilərə tutub, aldı görək nə dedi:

Yığılın dəlilər, məclis başına,
Verin şirin badə, cana nuş olsun!
Vurun nərdtaxtanı, gəlib oynayaq,
Atın ağ zərləri, şeşi-beş olsun!

Bir xələt biçərəm Eyvaz boyundan,
İncimərəm xasyətindən, xoyundan,
Kəsin tunclulardan, qırın qoyundan,
Yeyin dəlilərim, keflər xoş olsun!

Uca dağlar başın almasın duman,
Koroğlu könlünə gəlməsin guman,
Verrəm o iyidə beş yüz min tümən
Qansırqada gələn qannı baş olsun!..

Dəli Mehtər Qıratı ifçin yəhərləyib onun barabarına gətirdi. Koroğlu xanımlarla, dəlilərlə görüşdü, halallaşdı. Qıratı minmək istəyəndə Nigar irəli yeriyib dedi:

– Ay Koroğlu, Təkə-Türkman kimi qorxulu, uzaq səfərə gedirsən, qoy dəlilərdən bir neçəsi yanında getsin, demək olmaz, birdən dava-zad olar, sənin üçün yalqız yaxşı keçməz.

Koroğlu dedi:

– Nigar xanım, sən Çənlibeldən, dəlilərdən yaxşı muğayat ol, məndən qorxma. Qırat ki, altımdadı mənə zaval yoxdu, haradan olsa, vurub, yarıb salamat çıxacam. Ürəyini sıxma, bir neçə günə Eyvazı gətirib çatdıraram sənə.

Koroğlu Qıratın ziltəngini bərkitdi. Bir əlini yalmanına atıb belinə sıçradı. Dəlilər, xanımlar Koroğlunun elə Qırata sıçramağın gördülər. Qırat yel kimi əsdi, quş kimi uçdu, gədikləri keçdi, bellər aşdı, yoxuşlar çıxdı, enişlər endi, yerin damarını kəsib neçə gündən sonra Təkə-Türkmanın yaxınlığına çatdı. Koroğlu uzun yol gəlmişdi, həm acımışdı, həm də yorulmuşdu. İstədi ki, düşüb atı dincəltsin, özü də bir az yeməkdən-zaddan tapsın yesin. O yan bu yana göz gəzdirirdi, bir də gördü ki, yoldan bir az aralı bir çoban qoyun otarır. Düşüb Qıratı otlamağa ötürdü, özü çobanın yanına gəlib dedi:

– Çoban qardaş, atalar deyiblər ki, acdın çobana, yoruldun sarbana. Çörəkdən zaddan nəyin var?

Çoban dedi:

– Süd boldu, ancaq çörək bir az qonağa layiq deyil, dünəndən qalıb quruyub.

Koroğlu dedi:

– Bəri ver görüm, ziyan yoxdu. Bu çölün düzündə nə quru, nə yumşaq?

Çoban canlı, qüvvətli yekə bir adam idi. Çanaxı da batman yarım süd tuturdu. Amma çoban özü də çanaqdan qalan deyildi, yekə canlı bir adamdı. Qərəz, çoban çanağı əlinə alıb bir neçə qoyunu sağdı, elə ki, çanaq süd ilə doldu, gətirdi qoydu Koroğlunun qabağına. Çörək də gətirib dedi:

– Qonaq qardaş, gərək məni bağışlayasan. Çörək çox qurudu. Heç bilməyirəm necə yeyəcəksən.

Çobanın cavabında Koroğlu dedi:

– Fikir eləmə, gətir bəri. Elə acam ki, daşdan yumşaq hər nə olsa yeyəcəyəm.

Koroğlu quru çörəkləri doğrayıb südün içinə tökdü, çanaq ilə ağızbaağız süd doğramacı eyləyib əlinə də bir qaşıq alıb doğramacın üstünə düşdü. Doğramacı qaşıqlayıb bir göz yumub-açan vaxta qara bığların altından keçirtdi. Ona kimi Qırat da otlayıb doydu.

Koroğlu öz-özünə fikir eləyib dedi: Mən Türkmana bu paltarla getsəm yəqin ki, tanıyarlar. Yaxşısı budu ki, paltarımı çobannan dəyişdirim. Bir az götür-qoydan sonra paltarını çoban ilə dəyişdi. Onunla əltəmən oldu. Sıçrayıb Qırata mindi, gəlib Təkə-Türkmana çıxdı. Gəzdi, dolandı, Eyvazın yerini elədi. Bildi ki, bəs Eyvaz atası qəssab Alı ilə sürüdən qoyun almağa gedib. Qıratı sürüb gəldi gördü doğrudan da Eyvazgil sürülərdən qoyun seçirlər. Tez atdan düşüb onlara yanaşdı. Soruşdu ki:

– Qardaş, qoyunun biri neçəyədi?

Qəssab Alı dedi:

– Beş manatdı.

Koroğlu yüz erkək seçdirdi. On beş manatdan pulunu verdi. Qəssab Alı gördü ki, qoyunun birinə beş manat yerinə on beş manat verir. Qaldı mat-məhəttəl ki, bu niyə belə eliyir.

Koroğlunun nə qoyun gözünə girirdi, nə pulun artıq verilməsi. Gözü Eyvazın üzündə idi. Quş kəkliyi alan kimi gözü Eyvazı almışdı. Eyvaz da bunu duymuşdu. Qaş-göz ilə atasını işdən xəbərdar eləmək istəyirdi. Ancaq atası mətləbi işarədən anlamırdı. Belə olanda aldı görək Eyvaz nə dedi:

– Qədəm qoyar hərdən-hərdən yerişlər,
Bu qılıqda çodar olmaz, hay olmaz,
Beş-beş deyər, on beş-on beş bağışlar,
Bu qılıqda çodar olmaz, hay olmaz.

Qəssab Alı dedi:

– Bala, çodar olmayıb nə olacaq? Görünür bunların yerində qoyun bahadı.

Eyvaz atasının cavabında aldı sözünün o biri bəndini:

Mərd iyidlər kimi yolları basan,
Tülək tərlan kimi bərələr pusan,
Bu ya Koroğludu, ya Dəli Həsən,
Bu qılıqda çodar olmaz, hay olmaz.

Cünun gəldi Çənlibelin elindən,
Eyvaz bülbül oldu uçdu gülündən,
Bu söz çıxıb telli Nigar dilindən,
Bu qılıqda çodar olmaz, hay olmaz.

Qəssab Alı yavaşca oğluna dedi:

– Sən sarsaqlamısan. Bura nə aşıqlıq, şairlik yeridi? Sonra ürküdərsən almaz, qoy alverimizi eləyək.

Koroğlu dedi:

– Qəssab əmi, adam qat bu qoyunları mənnən köməkli bələni aşırsın, qayıtsın.

Qəssab Eyvazı çağırıb dedi:

– Yeri, qonağa kömək elə, qoyunları bələdən aşır.

Eyvaz Koroğlu ilə bərabər qoyunları hayladı. Bələdən aşırdı. Elə ki, bələdən aşdılar, Koroğlu bir dala baxdı, gördü, tay qəssab Alı onları görə bilməz, qoyunları buraxdı, quş kimi sıçradı Qıratın belinə mindi, aldı görək nə dedi:

Qardı Çənlibelin başı,
Varaq, a qəssabın oğlu!
Gəl gedək düşmana qarşı,
Duraq, a qəssabın oğlu!

Çox oldum davada, doyda,
İyid görmədim sən boyda.
Əl ver, burda sənnən soyda
Vuraq, a qəssabın oğlu!

Əcəli qoydum börkümə
Büründüm çodar kürkümə.
Gəl min Qıratın tərkinə,
Varaq, a qəssabın oğlu!

Çoxdu Koroğlunun yaşı,
Nə qovğalar çəkib başı,
Əl ver, sənnən dağı daşı
Yaraq, a qəssabın oğlu!..

Koroğlu Qırata acı bir qamçı çəkdi. Qıratın burnunun deşiklərindən alov çıxdı. Yüyəni gəmirib ley kimi qanatlandı. Çənlibelə tərəf baş almaq istəyəndə Koroğlu qırğı kimi Eyvazın üstünə şığıdı. Əlini atıb onun kəmərindən tutdu, ancaq nə qədər qoluna zor verdisə, onu yerindən tərpədə bilmədi ki, bilmədi. Dəli Koroğlu acıqlandı, qızdı bir dəli nərə çəkdi, Eyvaz titrəyib yerə yıxıldı. Bu dəfə əlini atdı, quş kimi Eyvazı götürüb Qıratın tərkinə qoydu, Çənlibel deyib yollandı.

Qəssab Alı gördü xeyli keçdi, amma Eyvaz gəlmədi. Bir yeldən yeyin, sudan iti gedən Türkman atı vardı. Tez onu çəkdirdi, yəhərlətdi. Koroğlunun dalınca sürdü. Türkman atı boğanağa düşmüşdü. İlan kimi ağzını açıb, quyruğunu dik tutub dördnala çapırdı. Koroğlu bir də dönüb gördü vallah qəssab Alı budu elə gəlir ki, tay nə deyim. Koroğlu yavaşca Qıratı əylədi. Qəssab Alı gəldi ona çatdı. Götürdü görək nə dedi:

– Əcəm oğlu, dəli çodar,
Verməsəm Eyvazı sənə!
Eyvazsız qəlbim qan udar,
Vermərəm Eyvazı sənə!

Eyvazdı iyidlər gözü,
Əllisi, altmışı, yüzü,
Burax gəlsin, eşit sözü,
Verməzəm Eyvazı sənə!

Sinəmə çəkmisən dağı,
Yol al burdan, qanlı yağı,
Bu gözümün odlu çağı
Verməzəm Eyvazı sənə!

Küllü məxluqat yığıla,
Çətindi sövdam dağıla,
Kim qıyar Eyvaz oğula?
Verməzəm Eyvazı sənə!

Qəssab Alı qılınc çalar,
Düşmandan qisasın alar,
Başın gedər, leşin qalar,
Verməzəm Eyvazı sənə!

Koroğlu qəssab Alının cavabında aldı görək nə dedi:

Canım qəssab, gözüm qəssab,
Qoy aparım mən Eyvazı!
Yerə salma sözüm qəssab,
Qoy aparım mən Eyvazı!

Eyvaz deyib Nigar ağlar,
Köysünü çal-çarpaz dağlar.
Aparmasam qara bağlar,
Qoy aparım mən Eyvazı!

Eyvazın qaradı qaşı,
Dəlilərin olar başı,
Tutma mənlə tər savaşı
Qoy aparım mən Eyvazı!

Tük tökər məndən paşalar,
Xotkarlar çəkər haşalar
Türkmana ərlər baş alar,
Qoy aparım mən Eyvazı!

Koroğluyam, mən çaparam,
Qiyamət olub qoparam,
Razı olma zornan aparam,
Qoy aparım mən Eyvazı!

Koroğlu sözlə dediyi kimi dillə dedi:

– Mən xotkarlara, paşalara qan udduran, yollar kəsən, alaylar basan qoç Koroğluyam. Mənim övladım yoxdu, gəldim Eyvazı aparım, özümə oğul eyləyim, yeddi min, yeddi yüz yetmiş yeddi dəliyə sərdar tikim. Gəl məni dəlilərin, xanımların yanında xəcalət eləmə. Eyvazı əlimdən alma. Məndən sənə xeyir dəyər. Eyvaz da istədiyi vaxt sənin yanına gələr.

Qəssab gördü ki, Koroğlu güc, xoş Eyvazı aparacaqdı, öz-özünə dedi:

– Genə xoşnan versəm yaxşı olar. Belə aparsa oğul yenə elə mənimdi. Amma zorla aparsa nə olar? Çox fikir-xəyaldan sonra dedi:

– Koroğlu, namına qıyıb Eyvazı sənin əlindən almıram. Apar get, amma gözün üstündə olsun.

Koroğluynan Eyvaz qəssab Alı ilə görüşüb ayrıldılar. Qəssab Alı Təkə-Türkmana, Koroğlu ilə Eyvaz Çənlibelə yola düşdülər.

Koroğlu ilə Eyvaz Çənlibelə tərəf getməkdə olsun, sənə kimdən xəbər verim, Ərəb Reyhandan. Ərəb Reyhan Türkmanın varlılarından biri idi. Pəhləvanlığı da var idi. Deyirlər ki, Ərəb Reyhan başında yüz atlı ova çıxmışdı. Ov eyləyib geri qayıdırdı ki, birdən Koroğluya rast gəldi. Koroğlunun Çənlibeldən gəlib Türkman elindən Eyvazı aparmasını qəbul eləyə bilmədi. Elə bil başına göydən bir daş düşdü. Hücum eləyib başının adamları ilə Koroğlunun yolunu kəsdi.

Bəli, Koroğlu baxdı ki, düşman gəlir. O, qorxmadısa da, ancaq təkliyə darıxdı. Çəndibel, dəlilər Koroğlunun yadına düşdü. Bu dar vaxtda ölümündən qorxmayan, düşmana baş əyməyən, qənimlərə qan udduran iyid, mərd dəlilərini yanında görmək istədi.

Elə bu fikirdə idi bir də baxdı ki, budu qaqqıldaşa-qaqqıldaşa göynən bir dəstə durna keçir. Ürəyi cuşa gəlib aldı görək nə dedi:

Göydən gedən beş dunralar,
Vətəndən xəbərin varmı?
Bir-birindən xoş durnalar
Vətəndən xəbərin varmı?

Kim çıxardar olmaz oyun,
Üstünə götürməz deyin,
Bir qılınca yeddi boyun,
Kəsəndən xəbərin varmı?

Koroğlu olmaz heç xəstə
Yağı istər girə qəsdə,
Yel təki düşmanın üstə,
Əsəndən xəbərin varmı?

Koroğlu fikirləşib öz-özünə dedi. Mən göylə gedən bu qatar durnanın başçısını vursam, onda düşmanı da basa biləcəyəm. Bu mənim üçün bir sınaq olsun. Bunu deyib kamanını çilləyə mindirdi, qatar durnanın başçısını nişan aldı. Ox yayından çıxan kimi durnanın başçısının ürəyinin başından keçdi. Başçı durna fırlana-fırlana göydən gəldi, Qıratın ayağının altına düşdü. Koroğlu bundan şad oldu. Fal yaxşı gəlmişdi. Qıratdan düşdü, başçı durnanın telindən bir neçəsini üzüb Eyvazın papağına taxdı. Sonra yenə Qırata minib Eyvazı da tərkinə alıb yola düzəldi.

Ərəb Reyhan Koroğlunun yolunu kəsmişdi. Koroğlunun ağzı düşmüşdü qorxunc bir uçuruma. Uçurumun dörd bir yanı elə sıldırım qayalıq, daşlıq idi ki, quş quşluğu ilə keçə bilməzdi. Koroğlu bir uçuruma baxdı, bir tərkindəki Eyvaza baxdı, bir də onu dəfələrlə ölümdən, mühasirədən xanların, paşaların çəngindən qurtaran Qırata baxdı, aldı görək nə dedi:

Arxam qarı düşman, qabağım uçrum,
Apar Çənlibelə məni, Qıratım!
Sənə sığınmışam, qurtar bu dardan,
Apar Çənlibelə məni, Qıratım!

Olur Çənlibelin söhbəti, sazı,
Gəlir gumrah keçir baharı, yazı,
Almışam tərkimə iyid Eyvazı,
Apar Çənlibelə məni, Qıratım!

Koroğlu əməyi getməsin zaya,
Gərək qan udduram bəyə, paşaya,
Sıçrayıb quş kimi atıl o taya,
Apar Çənlibelə məni, Qıratım!

Koroğlu Qıratı cövlana gətirdi, səsləndi. Qırat dörd ayağını yığıb özünü yığışdırdı, qızıl quş kimi sıçradı, uçurumun o tayına düşdü. Qırat elə sıçradı ki, Koroğlunun başında papağı da tərpənmədi. Ərəb Reyhan buna tamaşa eləyirdi. O elə fikir eləyirdi ki, Qırat bu uçurumdan sıçraya bilməyəcək. Başındakı yüz atlı ilə hücum eləyib Koroğlunu tutacaq, özünün də qollarını bağlayıb Türkmana aparacaq. Qırat ki, uçurumu elə sıçradı, Ərəb Reyhan bundan hesabını apardı. Qarnına sancı düşdü. Ancaq bunu başındakı atlılara bildirmədi. Bir nərə çəkib yüz atlı ilə dolama yoldan keçib Koroğlunun üstünə gəldi. Koroğlu dönüb geri baxdı, gördü Ərəb Reyhan başındakı atlılarla onun dalınca gəlir. Koroğlu Qıratın başını çəkdi, geri döndü Ərəb Reyhanın yanına qayıtdı, aldı görək nə dedi:

Yağı düşmanın hərbəsi
Qaçırtmaz meydannan məni.
Qorxaq müxənnət zərbəsi
Qaçırtmaz meydannan məni.

Girrəm meydana ər kimi,
Durram qabaqda nər kimi,
Düşman boylanar xər kimi,
Qaçırtmaz meydannan məni.

Hərdən bərədə yataram,
Ortada şeşpər ataram,
Paşanı diri tutaram,
Qaçırtmaz meydannan məni.

Aləmə bəlli hünərim,
Çənlibeldə dəlilərim,
Mərd iyidə peşkəş sərim
Qaçırtmaz meydannan məni.

Koroğluyam, budu düzü,
Comərdin sərt olar üzü.
Müxənnətin tənə sözü
Qaçırtmaz meydannan məni!

Koroğlu sazla dediyi kimi sözlə də dedi:

– Ərəb Reyhan, mən paşalara, bəylərə, xanlara qan udduran Koroğluyam. Mən sənin kimi adamlardan qorxmaram. Ancaq sənin bu adamlarına yazığım gəlir. Onları nahaq yerə qırdırıb qanlarına bais olma. Mənimlə dava etmək istəyirsən buyur, bu meydan, bu şeytan. Mərd igid davada başının adamını qırdırmaz.

Koroğlu bu sözlərdən sonra genə də özünü saxlaya bilməyib üç telli sazı döşünə basdı. Qıratı cövlana gətirib dedi:

Mərdsənsə gəl, Ərəb Reyhan
Savaşaq indi sənnən mən!
Gör gücümü eylə haşa,
Savaşaq indi sənnən mən!

Götürrəm əlimə nizə,
Mərdlər əhsən desin bizə,
Duraq meydanda üz-üzə
Savaşaq indi sənnən mən!

Demə mənə bu hədyanın,
Yəqin bil ki, allam canın,
Qılıncla tökərəm qanın,
Savaşaq indi sənnən mən!

Gərək dost düşmanım seçəm,
Çətin olar qorxam, qaçam,
İstərəm ki, meydan açam,
Savaşaq indi sənnən mən!

Koroğluyam, durmuşam mərd,
Yaman ürəyə düşsün dərd,
İyidsənsə, ol meydangərd,
Savaşaq indi sənnən mən!

Bəli, dava başlandı. Əvvəlcə olar elə at üstündə meydana girdilər. Bir-birinə nizə atdılar, qılınc vurdular, nə qədər hiylə işlətdilərsə, bir kaş aşmadı.

Koroğlu gördü yox, Ərəb Reyhan elə balaca canavar deyil, beləliklə bir şey çıxmayacaq. Atdan düşüb, qollarını çırmadı. Paltarlarının ətəklərini belinə sancıb meydanı dolanmağa başladı. Bəli, Ərəb Reyhan da atdan düşdü. Hər ikisi piyada olub güləşməyə başladılar. Çox

güləşdilər, bir-birini kotan kimi yerdə sürüb, meydanı qaraltdılar. Genə də bir murad hasil olmadı.

Axırda dəli Koroğlu elə bir nərə çəkdi ki, bütün dağlar, daşlar səsə gəldi. Ərəb Reyhanın adamları içinə qırğı girmiş toyuq cücələri kimi pərən-pərənə düşüb hamısı qaçıb dağıldı. Ərəb Reyhanın qulaqları batdı. Koroğlu onu başına qaldırıb yerə vurdu, sinəsinə çöküb xəncərini boğazına dayadı. Ərəb Reyhan bir dəfə də olsun nə dinmədi, nə ağlamadı, nə də aman istəmədi. Koroğlu xəncəri yerinə qoyub ayağa durdu.

Deyirlər ki, Koroğlu çox mərd imiş. Ağlamayan, yalvarmayan düşmanı öldürməzmiş. Ərəb Reyhanı da mərdliyinə görə öldürmədi, bağışladı. Ərəb Reyhan min ənvai-müsibət ilə ayağa durdu. Qolu, qıçı əzilmiş, haytıya-haytıya bir təhər ki, atına minib Türkmana tərəf yola düşdü. Qoç Koroğlu da Eyvazı tərkinə alıb Çənlibelə yol başladı.

Nigar xanım çoxdandı ki, Koroğlunun yolunu gözləyirdi. Vədəsindən çox keçmişdi, Koroğlu hələ gəlib çıxmamışdı. Bir gün yenə Nigar bir hündür təpədə durub yollara baxırdı. Bir də gördü nə, yollarda, toz-dumana, duman toza qarışdı, diqqət eləyib gördü Koroğlu Qıratın üstündə, tərkində də Eyvaz budu gəlir. Nigar xanım təpədən yenib dəlilərin yanına qaçdı, aldı görək nə dedi:

At belində qoç dəlilər,
Eyvazı pişvaz eləyin
Bir-birindən xoş dəlilər,
Eyvazı pişvaz eləyin.

Eyvazım bənzər laçına,
Tovuzlar heyran saçına,
Vermərəm Çinə, Maçına,
Eyvazı pişvaz eləyin.

Dolun libasa, yarağa,
Atlılar getsin sorağa,
Qoymaram gözdən irağa,
Eyvazı pişvaz eləyin.

Koroğlu oxunu qurub,
Sevib, seçib, tərlan vurub,
Qıratın tərkində durub,
Eyvazı pişvaz eləyin.

Külli məxluqat yığılı,
Paylayın qəndi, noğulu,
Koroğlunun qoç oğulu,
Eyvazı pişvaz eləyin.

Qoç dəlilər, açın qanat,
Düzəldin məclis, toy, büsat,
Götürün libas, qılınc, at,
Eyvazı pişvaz eləyin.

Ordu basan, qala yıxan,
Pəncəsində pələng sıxan,
Qəniminə qarşı çıxan,
Eyvazı pişvaz eləyin.

Xoş danışan, şirin gülən,
Məclis aparmağın bilən,
Dəlilərə sərdar gələn,
Eyvazı pişvaz eləyin.

Atı gətirər cövlana,
Ox atar namərd düşmana,
Nigar da Eyvaza ana,
Eyvazı pişvaz eləyin.

Nigar xanımın sözü ilə yeddi min yeddi yüz yetmiş yeddi dəli at belinə doldu. At, qılınc, xələt götürüb Koroğlu ilə Eyvazı pişvaz elədilər.

Görüşdülər, danışdılar, şadlıq məclisi quruldu. Qoyunlar kəsildi, ətlər doğrandı, kabablar yeyildi, içkilər içildi. Güldülər, oynadılar, oxudular, damaxlar duruldu, keflər açıldı. Nigar Eyvazın üzündən öpdü, köynəyinin yaxasından keçirdib özünə oğul elədi.

# Dəmirçioğlunun Çənlibelə gəlməyi

Koroğlu bir gün Qıratı nallatmağa aparmışdı. Gəzib-gəzib axırda bazarın lap qurtaracağında kamil bir nalbənd tapdı. Atdan düşdü, nalbəndə salam verib Qıratı onun qabağına çəkdi. Nalbənd tez ayağa durub nalları Koroğlunun qabağına tökdü ki, hansını bəyənirsən özün seç. Koroğlu nalbəndi yaxşı kişi görüb onunla zarafat eləmək istədi. Nalları bir-bir götürüb əlində bircə dəfə sıxmaqla əzişdirib nalbəndə qaytarırdı ki:

– Canım, bunlar ki, dəmir parçasıdı, nal gəti.

Nalbənd heç bir söz deməyib təzədən Qıratın ayağını ölçüb dörd dənə yaxşı ifçin nal kəsib Qıratı nallamağa başladı. Nalbəndin Qırata gücü çatmırdı. Koroğlu özü qollarını yuxarı çırmadı. Qıratın sağ əlini yerdən götürdü. Belə-belə atın əllərini nalladılar. Nalbənd dal ayaqlarına gələndə Qırat yenidən bədnallıq elədi. Koroğlu nə qədər elədi Qıratın ayağını saxlaya bilmədi ki, bilmədi.

Bunlar burada əlləşməkdə olsunlar, sənə kimdən xəbər verim, nalbəndin oğlundan. Nalbəndin bir yeniyetmə növrəstə cavan oğlu var idi. Adına xırdalığında uşaqlar Dəmirçioğlu demişdilər deyin elə böyümüşdü də hamı Dəmirçi deyib çağırırdı.

Dəmirçioğlu iyirmi-iyirmi iki yaşlarında idi, amma sən gəl ki, zalım oğlu illə, ayla yox, günlə, saatla böyümüşdü. Elə iyid, ağıllı, kamallı oğlan idi ki, gəl görəsən. İgidlikdə, gücdə Rüstəm Zala bac verməzdi. Bir baxan istəyirdi, bir də baxsın.

Koroğlu Qıratı nalbəndin qabağına çəkəndə Dəmirçioğlu dükanın içində idi. O, Koroğlunu tanımadı. Amma müştərini güclü, qüvvətli görüb axırını gözləyirdi ki, görsün o nə eləyəcək. Koroğlu nalları əzib yerə atanda istədi ki, çıxıb onun həddini göstərsin, sonra lənət şeytana deyib gözlədi ki, görək axırı nə eliyəcək.

Elə ki, Dəmirçioğlu gördü ki, Koroğlu atın qıçını saxlaya bilmir, yavaşca damdan çıxdı, kirimiş gəlib Qıratın dal ayaqlarının ikisini də yerdən götürdü. At ha çapaladı, dal ayaqlarını Dəmirçioğlunun əlindən qurtara bilmədi. Axırda yorulub durdu. Dəmirçioğlu bir altdan yuxarı Koroğluya baxıb dedi:

– İki-iki adam bir atın əlində aciz qalıblar. Ata, gəl nalla.

Koroğlu bir oğlana baxdı, bir Qırata baxdı. Heç bir söz demədi. Amma lap mat-məhəttəl qalmışdı. Qərəz, nalbənd Qıratın dal ayaqlarını

da nallayıb qurtardı. Koroğlu əlini cibinə salıb pul çıxartdı. Dəmirçioğlu pulları alıb mum kimi əzib Koroğlunun özünə qaytardı ki:

– Verirsən əməlli pul ver, bu qırıq əzik-üzükləri niyə mənə verirsən.

Koroğlu alıb pula baxdı, gördü doğrudan da elədi. Cibindən bir qədər də pul çıxardı ona verdi. Dəmirçioğlu bu dəfə pulları iki baş barmağı arasında sürtüb sikkələrini pozdu. Koroğlunun üstünə tullayıb dedi:

– Mənə qəlp pul lazım deyil. Al saxla özünə.

Koroğlu məsələni anladı. Bildi ki, hərif meydan oxuyur. Heç bir söz deməyib bu dəfə pulu nalbəndin özünə verdi.

Koroğlu Qıratı minib getdi. Amma fikir onu götürmüşdü. Bilmirdi necə eləsin ki, Dəmirçioğlunu Çənlibelə gətirib dəlilərin içinə qatsın. Elə bu fikir-xiyal ilə gəlib Çənlibelə çatdı. Dəlilər onun qabağına çıxdılar. Amma baxdılar ki, Koroğlunun kefi üstündə deyil. Elə bil ki, dünyanın bütün dərdi-qəmi ona qalıb. Nə qədər soruşdular, Koroğlu heç bir söz demədi. Bu burada qalsın, sənə deyim Dəmirçioğlundan.

Koroğlu atını sürüb gedəndən sonra nalbənd oğluna dedi:

– Ay oğul, sən neylədin? Dinc oturduğumuz yerdə başımıza iş açdın.

Dəmirçioğlu:

– Ay ata, mən neylədim? Başına iş açdım. O sənin nallarını qırdı, mən də onun pullarını. Rahat oturaydı da. Bu adam uşaq-zad deyil ki, gəlib özünü göstərir.

Nalbənd dedi:

– Ay bala, heç bilirsən o kimdi? O paşalara, bəylərə qan udduran Çənlibelli qoç Koroğludu!

Dəmirçioğlu dedi:

– Ay ata, bunu niyə mənə əzəldən demədin ki, onu qatlayıb dizimin altına alaydım. Ax, onun Koroğluluğunu necə ona bildirərdim.

Nalbənd oğlunu ha danladı ki, bala belə fikirlərdən daşın. O, qoç Koroğludu. Sən onunla bacara bilməzsən. Başa gəlmədi. Axırda atasından oğurlanıb bir kotan zəncirini də götürüb bel bağı əvəzinə belinə bağlayıb Çənlibelə yola düşdü. Özünə söz vermişdi ki, gərək lap onun Qıratını götürüb gələm. Qoy bundan sonra beş özündən deyəndə bir də məndən desin. Koroğlu, Koroğlu, mən də deyirəm ki, görəsən necə şeydi. Ona elə bir düdəmeyi-hindi gəlim ki, əlləzinəni əzbərdən oxusun. Qərəz, bu fikir-xiyal ilə Dəmirçioğlu gecələrin birisində gəlib Çənlibelə çatdı. Bu tərəfdən də Koroğlu yemir, içmir, dinmir, danışmırdı. Elə Çənlibelin yenəcəyində yolun ağzında oturub gözlərini zil-

ləyirdi yola. Onun ürəyinə dammışdı ki, Dəmirçioğlu gələcək. Deyirdi əyər o doğrudan da iyid olsa gərək gələ.

Elə ki, Dəmirçioğlu gəlib çatdı, Qırat olan töyləni axtarırdı ki, birdən Koroğluya rast gəldi.

Gecə çox qaranlıq idi deyin Dəmirçioğlu onu tanımadı. Qabaqca heç Koroğlu da onu tanıya bilmədi. Tez durub qabağını kəsdi ki:

– Kimsən, gecə vaxtı burada nə gəzirsən?

Dəmirçioğlu dedi:

– Bəs sən kimsən?

Koroğlu səsindən onu tanıdı, ancaq özünü tanıtmamaq üçün səsini qısıb dedi:

– Mən oğruyam.

Dəmirçioğlu dedi:

– Elə mən də oğruyam. Gəlmişəm Koroğlunun Qıratını aparam. Bir neçə gün bundan əvvəl Koroğlu atını nallatmağa gəlmişdi. Yaxşı əlimə keçmişdi hayıf ki, tanımamışam. Əlimdən can qurtarıb gedib. Sonra bilmişəm ki, Koroğlu imiş. Ancaq bu dəfə əlimdən salamat qurtara bilməyəcək.

Koroğlu Dəmirçioğlunun gücünü, iyidliyini sınamaq üçün onu töylənin qapısına apardı. Dəmirçioğlu töylənin qapısını qıfıllı görüb damın üstünə çıxdı. Dəmirçioğlu bir su içim saatda, Koroğlu da onun dalınca töylənin belini dəlib yekə bir yer açdılar. Sonra Dəmirçioğlu belindəki zənciri Koroğluya verib dedi:

– Gəl içəri gir, bu zənciri Qıratın döşünün altından salıb bağla, bir ucunu da mənə ver.

Koroğlu töyləyə düşdü. Zənciri Qıratın döşünün altından keçirib bağladı. Koroğlu gördü Qırat elə ayağı buxovlu-buxovlu qalxır göyə. Koroğlu qışqırdı ki:

– Əyə, dayan, a zalım oğlu, hələ bağlayıb qurtarmamışam.

Koroğlu qəsdən zəncirin ucunu Dürata da bağladı. Dəmirçioğlu güc vercək Dürat Qıratla qarışıq qalxdı. Koroğlu gördü yox, bu kərgadan kimi bir şeydi. Zənciri daşa bağlasa, lap Çənlibeli göyə çəkər. Qışqırdı ki:

– Ayə dayan!

Qərəz, Koroğlu zənciri bağladı Qırata, özü də yapışdı atın ayağından. Bir vaxt gözünü açıb gördü damdadı. Atın ayağından buxovu qırıb atdı, sonra Koroğluya dedi:

– İndi gəl min tərkimə gedək.

Bəli, onlar Qırata minib düşdülər yola. Koroğlu yol uzunu öz-özünə fikir eləyirdi ki, əyər mən birdən qucaqlayıb bunu tutsam, qollarını bağlamağa gücüm çatmayacaq. Qılıncla da ki, vursam öləcək. Qalmışdı məhəttəl ki, necə eləsin. Çox götür-qoydan sonra axırda bu qərara gəldi ki, Dəmirçioğluna bir əmud vursun, yıxılanda tutub qollarını bağlasın. Bu xiyal ilə onun təpəsindən bir əmud yendirdi. Dəmirçioğlu geri dönüb dedi:

– Bura bax, bir də belə erkək zarafat eləmə.

Koroğlu heç bir söz demədi. Bir qədər də getmişdilər. Bir də Koroğlu dedi:

– Aşna, bura bax, şər deməsən, xeyir gəlməz, indi işdi birdən Koroğlu Qıratın aparıldığını bilib dalımızca gəldi, onda nə eliyərik?

Dəmirçioğlu dedi:

– Nə olar gələndə? Dünənnən gəlsin, bu gün də iki gün olsun.

Koroğlu dedi:

– Bəs sən ondan heç qorxmayırsan?

Dəmirçioğlu dedi:

– Mən onun nə qılıncından, nə qalxanından, nə əmudundan qorxmuram. Amma deyirlər dava eliyəndə onun bir nərə çəkməyi var. Onu da eşitmişəm, amma deyirlər çox dəli nərədi. Qorxsam, qorxsam bəlkə bircə o nərəsindən qorxam.

Bir az gedəndən sonra Koroğlu ağızını onun qulağına yapışdırıb bir bərk nərə çəkdi. Dəmirçioğlu o saat özündən gedib düz Qıratın ayağı altına düşdü. Koroğlu fürsəti əldən verməyib tez atdan düşdü, onun qollarını öz zənciri ilə daldan möhkəm-möhkəm bağladı. Dəmirçioğlu özünə gələndə qollarını bağlı görüb dedi:

– Əyə, olmaya elə sən Koroğlusan?

Koroğlu dedi:

– Bəli özüyəm ki, var.

Dəmirçioğlu dedi:

– Doğrudan da Koroğlusan. Əhsən sənin nərənə. O ad sənə halaldı. Qollarımı aç gedək. Bu gündən sonra səninlə dost oldum.

Koroğlu dedi:

– Yox, aşna, keçəl suya getməz. Üz vurma, qollarını aça bilməyəcəyəm. Dur, elə belə gedək.

Dəmirçioğlu bir də dedi:

– Əyə, kişisən, aç qollarımı, deyirəm səninlə dostam.

Koroğlu qulaq asmadı.

Dəmirçioğlu işi belə görəndə dedi:

– Əyə, mən kişiyəm. Söz verdim elədi. Sən deyirsən ki, bəs sən açmayanda mən özüm aça bilməyəcəyəm. Aha...

Dəmirçioğlu bircə dəfə güc verən kimi zəncir parça-parça oldu. Bir ucu dəydi Koroğlunun başına. Bayax ha yıxılıb özündən getdi.

Dəmirçioğlu su-zad səpib onu özünə gətirdi. Sonra dedi:

– Koroğlu, mənə etibar eləyib qollarımı açmadın. Amma mənim sözüm sözdü. Səndən ayrılmaram. Haraya gedirsən gedək.

Koroğlu ilə Dəmirçioğlu təzədən Qırata tərkləşib Çənlibelə gəldilər. Dəlilər, xanımlar yığıldılar. İndi bildilər ki, Koroğlu bu günlərdə niyə burnu aşağı imiş. Məclis quruldu. Nigar xanım Dəmirçioğlunu beli, başı açıq görüb soruşdu:

– Yaxşı, bəs belin niyə belə açıqdı?

Dəmirçioğlu dedi:

– Bircə toqqam var idi. Koroğlu qollarımı bağlamışdı. Hirslənib dartdım qırıldı.

Koroğlu zəncir əhvalatını danışdı. Hamı onun gücünə və qüvvəsinə əhsən dedi. Nigar xanım ona sataşmaq məqsədi ilə bir dəvə gönü göstərib dedi:

– Götür, bir zolaq kəs, bağla belinə.

Dəlilərdən birisi zarafat üçün bir enli zolaq dəvə gönü kəsib ona verdi. Dəmirçioğlu bağladı belinə. Yerə oturanda gön düz ortadan qırıldı.

Koroğlunun kefi elə idi ki, az qalırdı aya dırmaşsın. Belə bir iyidin Çənlibelə gəlib dəlilərə qoşulması onu çox sevindirirdi.

Dəmirçioğlu da sözünün üstündə durdu. Dəlilərlə dostlaşıb Koroğlunun arxası oldu.

# Koroğlunun Ərzurum səfəri

Günlərin bir günü Koroğlunun aşığı Cünun Ərzuruma gəlmişdi. Cəfər paşanın məclisində oxuyurdu. Söhbət arasında Cəfər paşa dedi:

– Ay aşıq, sən söylədin ki, Çənlibellisən. Yəqin ki, başında yeddi min yeddi yüz yetmiş yeddi dəlisi olan Koroğlunu görübsən, tanıyırsan. Bir ondan oxu görək.

Aşıq Cünun Cəfər paşanın cavabında sazı sinəsinə basıb, aldı görək nə dedi:

Qıratın üstündə, ərlər yanında,
Dağları, daşları, gəzər Koroğlu.
Hərdən acıqlanıb, nərə çəkəndə
Yağılar bağrını əzər Koroğlu.

Meydana girəndə hünər eyləyər,
Leş qalar bir yanda, kəllə söyləyər,
Yüz sar gəlsə, bir tərlana neyləyər
Laçın tək havada süzər Koroğlu.

Mərd meydandan qaçmayıbdı yaşında,
Dəlilərin cəm görmüşəm başında,
Düşməni sındırar tər savaşında,
Cünun deyər şirə bənzər Koroğlu.

Aşıq Cününun qoç Koroğlunu tərifləməsi, onun iyidliyindən, mərdliyindən oxuması Cəfər paşaya xoş gəlmədi. Ancaq o, məclisdəki qonaqlardan keçib aşıq Cününa bir söz demədi. Aşıq Cünun Cəfər paşanın məclisində oxumaqda olsun, sizə Telli xanımdan danışım.

Cəfər paşanın Telli xanım adlı gözəl bir qızı var idi. O, atasının məclisində aşıq oxuduğunu bilən kimi Cəfər paşanın yanına adam göndərib aşıq Cününun gəlib onun məclisində də oxumasına izn istədi. Cəfər paşa izn verdi. Aşıq Cünun qalxıb Telli xanımın məclisinə gəldi. Telli xanımın yanında qırx incəbel qız əyləşmişdi. Telli xanım aşıq Cününu görüb dedi:

– Ay aşıq, haralısan? Adın nədi?

Aşıq Cünun dedi:

– Ay xanım, Çənlibelliyəm. Adım aşıq Cünundu.

Telli xanım Çənlibelin adını eşitmişdi. Koroğlunun, onun Qıratının tərifi qulağına çatmışdı. Ona görə də Cününa üz tutub:

– Ay aşıq Cünun, Çənlibel nə cür yerdi ki, onun atı dəli, iyidi dəlidi! Aşığı da dəlidi?

Aşıq Cünun dedi:

– Ay xanım, elə mənim ata-anam qoyduğu ad Cünundu.

Telli xanım dedi:

– Çənlibeldə qoç Koroğlunu tanıyırsanmı?

Aşıq Cünun dedi:

– Çox yaxşı tanıyıram.

Telli xanım dedi:

– Elə isə Koroğludan bir az oxu, qulaq asaq.

Aşıq Cünun dedi:

– Ay Telli xanım, sinəmə üç xana söz gəlib, izin ver əzəl onu söyləyim, sonra da iyidlikdə mərd, dava günü comərd dəlilərin başı, qəhrəmanlar qardaşı Koroğludan oxuyum.

Telli xanım dedi:

– Aşıq, izindi, oxu.

Telli xanımın cavabında aldı aşıq Cünun görək nə dedi:

Bu günkü məclisdə bir gözəl gördüm,
Gözəllər səfində sana yaraşır.
Geyinib sallanan gözəllər çoxdu,
Tərlan kimi süzmək ona yaraşır.

Tutini bənd eylər şirin dilləri,
Şümşad barmaqları, nazik əlləri,
Güləbatın kimi qara telləri,
Töküləndə dal gərdənə yaraşır.

Qənim üstə nərə çəkib hovlamaq,
Ərəbat döşünə qatıb qovlamaq,
Sənin kimi bir ceyranı ovlamaq
Cünun deyər, qoç oğlana yaraşır.

Telli xanım aşıq Cünunun "Səni ovlamaq da bir qoç oğlana yaraşır" deməklə Koroğluya işarə etdiyini bilib, dedi:

– Ay aşıq Cünun, o oğlan kimdi ki, gəlib məni ovlasın?

Telli xanımın cavabında aldı aşıq Cünun görək nə dedi:

Əyləşibdi Çənlibelin elində,
Deyil işlərində naşı Koroğlu.
Misri qılınc həmayıldı belində
Geyər hər vaxt al-qumaşı Koroğlu.

Bir hay desə, ağır tüplər basılar,
Qançırğadan qanlı başlar asılar,
Nər iyidə yetmiş quzu kəsilər,
Verər aşı, ağ lavaşı Koroğlu.

Bir cidası vardı, başı qoşa pər,
Meydana girəndə əsrəmiş bir nər,
Paşalar titrəyər, şahlar tük tökər,
Yetmiş yeddi dəli başı Koroğlu.

Aşıq Cünun bu məclisdə qalmasa,
Şirin canın eşq oduna salmasa,
Telli xanım kimi gözəl almasa,
Çəkər, yıxar dağı-daşı Koroğlu.

Telli xanım aşıq Cünundan Koroğlunun tərifini eşitdi, əzəl ona xələt verdi, sonra əlinə qələm alıb Koroğluya belə bir namə yazdı: "Koroğlu, sənin iyidlik tərifini eşitdim. Gəlib məni aparsan bu hünər sənə halal olsun, apara bilməsən kişiliyi yerə qoy, başına yaylıq ört".

Aşıq Cünun naməni götürüb Çənlibelə yol aldı. O zaman Çənlibelə çatdı ki, Koroğlu kef məclisi qurmuşdu. Aşıq Cünun Telli xanımın naməsini Koroğluya verdi. Əhvalatı dil cavabı nağıl elədi.

Dəlilərin hamısı kef məclisində, Koroğlunun yanında idilər. Koroğlu dəliləri başsız qoyub Ərzuruma Telli xanımı gətirməyə gedə bilmədi. Keyf üstü idi. Bir badə şərab doldurub əlinə aldı. Üzünü dəlilərə tutub dedi:

– Kim Koroğlunun xatirini istəyir, alsın bu şərabı içsin, getsin Ərzurumdan Cəfər paşanın qızı Telli xanımı gətirsin.

Dəlilərdən səs çıxmadı. Koroğlu əlində şərab üçüncü dəfə təklif eləyəndə Dəmirçioğlu irəli yeridi, Koroğlunun əlindən şərabı alıb içdi.

Aldı Dəmirçioğlu:

Götürüb belimə qılınc bağlayıb,
İzn versən Ərzuruma gedərəm,
Yağı düşmən qəzəbindən qorxmaram,
İzn versən, Ərzuruma gedərəm.

Axtararam düşmanları seçərəm,
Başlarını yarpız kimi biçərəm,
Mərd yolunda başdan, candan keçərəm,
İzn versən, Ərzuruma gedərəm.

Dəmirçioğlu, axıtsalar qanımı,
Qoç iyidə qurban dedim canımı,
Alıb gətirərəm Telli xanımı
İzn versən, Ərzuruma gedərəm.

Dəmirçioğlu sözünü sazınan dediyi kimi dilinən də dedi: Dəmirçioğlu nə qədər ki, Koroğlunun yanında idi, hələ bir dəfə də olsun uzaq səfərə çıxmamışdı. Bərkə-boşa düşməmişdi. Dəlilər dedilər:

– Ay Koroğlu, Dəmirçioğlu dava görməyib, bərkə-boşa düşməyib, xamdı. Onu uzaq səfərə, Telli xanımı gətirməyə göndərirsən?

Koroğlu başındakı dəlilərə Dəmirçioğlunun hünərli, güclü bir iyid olduğunu bildirmək istədi. Koroğlu bir alma götürdü. Almanın üst tərəfinə bir üzük taxdı. Dəmirçioğlunun papağını götürdü, almanı onun başına qoydu. Almanı Dəmirçioğlunun başına elə qoymuşdu ki, orda üzüyün halqası görünürdü.

Koroğlu Qıratı yəhərləyib mindi, əlinə yay-ox aldı. Qıratı qızılquş kimi cövlana gətirdi. Yay-oxu çilləyə mindirdi. Bir-birinin dalınca qırx ox atdı. Yaydan çıxan oxların hamısı üzüyün halqasından keçdi. Heç biri xata eləmədi. Yayınmadı. Koroğlu oxları atanda Dəmirçioğlu nə yerindən qımıldanmadı, nə rəngi qaçdı, nə gözləri qırpındı. Canından qorxmayan qoç iyit kimi yerində mərdanə durdu. Bir yana tərpənmədi. Koroğlu bundan çox şad oldu. Könlü havalandı, ürəyi coşdu, aldı görək nə dedi:

Dəlilər içində bəlli iyidsən,
Gördüm sınayanda mərdanə səni.
Şəst ilə dayandın meydan içində,
Bənzətdim alıcı tərlana səni.

Çənlibel dediyin dağlar damanı,
Müxənnəslər gəlsə çəkər amanı
Başında nişanə aldım almanı,
Qorxutmadı hədəf, nişana səni.

Qırpınmadı gözün, qaçmadı rəngin,
Aləmə yayılar savaşın, cəngin,
Allam xəracını Hindin, Firəngin,
Göndərrəm İrana, Turana səni.

Çənlibel başında məclis qurulsun,
Xanların, bəylərin boynu vurulsun.
Gəl əyləş mey içək, keflər durulsun,
Koroğlu çağırır dövrana səni.

Koroğlu söznən dediyi kimi dilnən də dedi:

– Məni istəyən Dəmirçioğluna xələt versin.

Dəlilər, xanımlar Dəmirçioğluna xələt verdilər. Dəmirçioğlu Koroğlunun sınağından yaxşı çıxdığından dəlilər onun mərdliyinə, iyidliyinə heyran oldular.

Koroğlu dedi:

– Oğul, izindir, get yaraqlan.

Dəmirçioğlu yeddi qılınc, yeddi qalxan, yeddi cida, yeddi gürz, yeddi toppuz götürdü. Koroğlunun yanına qayıtdı. Koroğlu gördü Dəmirçioğlu o qədər yarağ götürübdü ki, altında tərpənə bilmir. Aldı görək nə dedi:

Dəmirçioğlu Ərzuruma varanda,
Ərzurum dediyin gölə nisbətdi.
Çox yaraq götürmək başa bəladı.
Qılınc həmayıldı, belə nisbətdi.

Söyləyim sözlərim, eylə diləzbər,
Şirin nəsihətim qıl sinədəftər.
İyidə lazımdı, gürz, qalxan, şeşpər,
Cida bir buynuzlu kələ nisbətdi.

Koroğlu tək düşmənləri səsləmək,
Hay deyəndə yağı üstə qəsd demək.
Arpa verib candan betər bəsləmək,
Ərəbat dediyin yelə nisbətdi.

Dəmirçioğlu elə bilirdi ki, iyidin yarağı nə qədər çox olsa, bir o qədər yaxşıdı. Koroğlunun bu sözündən sonra Dəmirçioğlu yaraqların hərəsindən birini götürdü. Koroğlu ona bu dəfə dedi:

– Oğlum, atların hansını minmək istəyirsən, get min.

Dəmirçioğlu getdi tövlədən Ərəbatı çəkdi, yəhərlədi mindi, Koroğlunun qabağına çıxanda Ərəbata bir qamçı vurdu. Koroğlu Dəmirçioğlunun atı vurmağın görəndə götürdü görək nə dedi:

Səhərdən meydan başına
Ərəbat çarxaçı gərək.
Ərəbatın nədir suçu?
Bir iyid minici gərək.

İyidin iyid dəstinə,
Girəndə abdal postuna,
Yoldaş yoldaşın üstünə
Dar gündə dönücü gərək.

Koroğluyam, sözüm oxdu,
Paşalardan qorxum yoxdu,
Bu dünyada iyid çoxdu,
İyiddə nər gücü gərək.

Dəmirçioğlu Koroğlu ilə, dəlilər ilə salamatlaşıb yola düşdü. Bir az getmişdi birdən atının başını çəkdi, geri qayıtdı. Koroğlu gördü Dəmirçioğlu gəlir. O belə fikir elədi ki, Dəmirçioğlu qorxub qayıdıb. Dedi:

– Oğul, niyə qayıtdın?

Dəmirçioğlu dedi:

– Ərzurum böyük şəhərdi. Bəlkə getdim Telli xanımı tapa bilmədim, gücüm çatıb gətirə bilmədim, bu haqda mənə tapşırığın nədi?

Dəmirçioğlunun cavabında aldı Koroğlu, görək nə dedi:

Ərzurumun bazarına varanda,
Məqamda düşmanı atmağın gərək.
Gördün ki, mətləbin başa varmadı
Ərəbat yalına yatmağın gərək.

İyid gərək meydan aça, düz dura,
Düşmən qabağında bığını bura,
Ayaqların üzəngiyə bərk vura,
Şeşpəri-şeşpərə çatmağın gərək.

İyid olan neylər əllini, yüzü?
Namərdin davada dörd olar gözü.
Budu Koroğlunun, oğul, bir sözü
O Telli xanımı tapmağın gərək.

Dəmirçioğlu Koroğludan ayrılıb Ərəbatı sürüb Ərzuruma tərəf yol başladı. Hər yerdən keçib gəldi Ərzurumun dağlarına çatdı. Özü yorğun, atı da ac idi. Düşdü atı ota buraxdı, özü də bir bulağın başında dirsəkləndi. Bu dirsəklənməkdə Dəmirçioğlunu yuxu apardı. Bir də qalxanda gördü ki, hər yanı duman bürüyüb, Ərəbatı da yoxdu. Götürdü görək nə dedi:

Ərəbat getdi əlimnən,
Ərəbatı mən istərəm!
Ayrı düşmüşəm elimnən
Ərəbatı mən istərəm!

Bənnasız hörgü hörülməz,
Təbibsiz xəstə dirilməz,
Baxıram heç yan görünməz
Ərəbatı mən istərəm!

Dəmirçioğlunun bu vaxtı,
İyidəm istərəm baxtı,
Ətrafımda düşman çoxdu,
Ərəbatı mən istərəm!

Dəmirçioğlu gəzdi, Ərəbatı dümandan, çisgindən tapa bilmədi. Aldı yenə görək nə dedi:

Dünyada heç iyid yoxsul olmasın,
Yoxsulluq iyidə yaman ad olu.
Hər kəsin ki, varı-dövləti olsa,
Ləzzət çəkər, dahanında dad olu.

Varlı, kasıb bu dünyadan keçərlər,
Yaxşını, yamanı arar, seçərlər,
Varın olsa gəlib yeyər, içərlər,
Yoxsul olsan qohum, qardaş yad olu.

Dəmirçioğlu ha oxuyar arada,
Artdı dərdim oldu həddən ziyada,
Yaxşı at minənlər qalsa piyada –
Daş düşər başına, ömrü bad olu.

Dəmirçioğlu Ərzurum dağlarında Ərəbatı axtaran zaman bir naxırçıya rast gəldi. Götürdü, görək, naxırçıdan Ərəbatı necə xəbər aldı:

Başına döndüyüm naxırçı qardaş,
Mənim Ərəbatım gördünmü ola?
Mərd iyidin atı candan əzizdi,
Mənim Ərəbatım gördünmü ola?

Naxırçı:

Başına döndüyüm mərd, iyid oğlan,
Sənin Ərəbatın mən dağda gördüm.
Qoç iyidlər qalmasınlar piyada,
Sənin Ərəbatın mən dağda gördüm.

Dəmirçioğlu:

Dumandı, çisgindi günün qarası,
Gözümə görünmür dağlar arası,
İyidin atıdı, ciyərparası,
Mənim Ərəbatım gördünmü ola?

Naxırçı:

Adın nədi sənin, hardan gəlirsən?
Comərdlərin könül pasın silirsən,
Cəzib Ərəbatı tapa bilirsən,
Sənin Ərəbatın mən dağda gördüm.

Dəmirçioğlu:

Dəmirçioğlu dolanıbdı elləri,
Məskən eləyibdi çənlibelləri,
Arada işləyər düşman felləri,
Mənim Ərəbatım gördünmü ola?

Naxırçı:

Mərd igid, könlünə gəlməsin güman,
Düşmanlar əlindən çəkərlər aman,
Ayazıyar ətraf, çəkilər duman,
Sənin Ərəbatın mən dağda gördüm.

Naxırçı Ərəbatı Dəmirçioğluna nişan verdi, getdi. Bir az keçdi, yel qalxdı, dağlar başından duman çəkildi. Ətraf ayazıdı, hər yan göründü. Dəmirçioğlu Ərəbatı tapıb mindi, az getdi, çox getdi, axşam çağı özünü Ərzuruma yetirdi, bir qoca qarıya rast oldu. Dedi:

– Ay qarı nənə, qəribəm, məni bir gecəliyə qəbul eləyərsənmi?

Qarı dedi:

– Bizlər qonağı çox sevərik, niyə eləmirəm.

Dəmirçioğlu düşdü, atı töyləyə çəkdi. Özü də qarının evinə gəldi. Qarı nənə Dəmirçioğluna çörək gətirdi. Yeməkdən sonra qarı dedi:

– Oğul, buraya niyə gəlibsən?

Dəmirçioğlu dedi:

– Ay nənə, Cəfər paşanın qızı Telli xanımı aparmağa gəlmişəm. Söylə onu necə görə billəm?

Qarı dedi:

– Ay oğul, o qız çox aşıqpərəst qızdı. İmarətinin qabağı da pəhlivan meydanıdı. Sabah bir saz götür, o meydana çıx, çal oxu, onda Telli xanım küləfirəngiyə çıxar, görərsən.

Dəmirçioğlu gecə qarının evində yatdı. Sabah açıldı. Atını qarının töyləsində qoydu. Özü aşıq paltarı geydi, altından yaraq bağlayıb çiyninə üstdən bir saz keçirib özünü pəhlivan meydanına saldı. Pəhlivan meydanında Cəfər paşa başının adamları ilə əyləşmişdi.

Cəfər paşanın bir Qara pəhlivanı var idi. Paşanın yanında qalırdı. Güclü, heyvərə bir pəhlivan idi. Qara pəhlivan Dəmirçioğlunu güləşən pəhlivan bildi. Elə düşündü ki, başqa torpaqdan onunla güləşməyə gəlib. Ortaya çıxdı. Dəmirçioğlunu meydanına çağırdı. Dəmirçioğlu Qara pəhlivanın meydanına girdi. Aldı görək nə dedi:

Nərə çəkib mən meydana girəndə,
Varmı meydanıma gələ pəhlivan?
Tutub kəmərindən çalanda yerə,
Mənim zərbi-dəstim bilə pəhlivan?

Mənəm şiri-nər tək meydanda gəzən,
Xışm ilə düşmanın bağrını əzən,
Tülək tərlan kimi havada süzən,
Sonra yaxan keçər ələ, pəhlivan!..

Dəmirçioğluyam yarağa dolaram,
Ac qurd kimi düşmən üstə ularam,
Qılınc çəksəm, leş-leş üstə qalaram,
Döndərrəm al qanı selə, pəhlivan!

Qara pəhlivan Dəmirçioğlunun bu sözündən acıqlandı. Ona hücum elədi. Dəmirçioğlu Qara pəhlivana aman vermədi. Götürüb yerə vurdu, basıb bir qolunu da qırdı, dedi:

– Səni öldürməyirəm, buraxıram get. Cəfər paşaya söylə ki, pəhlivanını yıxdığım üçün mənə bir kisə qızıl göndərsin. Qara pəhlivan yerindən qalxdı. Cəfər paşanın yanına gəldi.

Cəfər paşa dedi:

– Qara pəhlivan, nə oldu? O sənə nə elədi ki, belə bikefsən?

Qara pəhlivan qırılmış qolunu Cəfər paşaya göstərib dedi:

– Bax belə elədi, basıb qolumu qırdı. Hələ öldürürdü, əlindən bir təhər qurtardım. Məni yıxdığı üçün üstəlik bir kisə qızıl da istəyir.

O vaxtın adətinə görə bir pəhlivan bir pəhlivanı yıxanda oranın böyüyündən xərac alardı. Cəfər paşa mətləbi anladı, başındakı adamların yanında biabır olmamaq üçün üzə vurmadı, dedi:

– Aparın ona bir kisə qızıl verin, özünü də mənim yanıma gətirin.

Paşanın adamları apardılar Dəmirçioğluna bir kisə qızıl verdilər. Dəmirçioğlu qızılı götürüb Cəfər paşanın yanına gəldi.

Cəfər paşa onun çiynində olan sazı görüb dedi:

– Sənin aşıqlığın da varmış?! Gəl oxu, qulaq asaq. Kefimiz açılsın.

Aldı Dəmirçioğlu görək nə dedi:

Qalxıb Çənlibeldən düşmüşəm yola,
Ərzurumun bazarına gəlmişəm.
Əcəl köynəyini geyib əynimə,
Cəng-cidalın güzarına gəlmişəm.

Əyləşmişdim orda, söhbəti keçdi,
Qalxdı könül quşu, dolu mey içdi,
Telli xanım, namən gəldi yetişdi,
Bir gözəlin ilqarına gəlmişəm.

Dəmirçioğlu, yalan gəlməz dilimə,
Müxənnət yapışar çətin əlimə,
Misri qılınc bağlamışam belimə,
Tərlanların tavarına gəlmişəm.

Dəmirçioğlunun səsinə Telli xanım küləfirəngiyə çıxdı. Gördü bir oğlan saz çalıb oxuyur. Telli xanım Koroğluya namə göndərmişdi. Fikirləşdi ki, yəqin naməm çatıb. Koroğlu məni aparmağa gəlibdi. Telli xanım qarabaşlarından birini yanına çağırıb dedi:

– Ay qız, get o aşığa deyinən sabah mən bağa gəzməyə çıxacağam, mənim Gülşən bağıma gəlsin.

Telli xanımın tapşırığını alan Dəmirçioğlu mətləbi anladı. Qayıdıb qarının evinə getdi. Elə ki, sabah açıldı Dəmirçioğlu qalxıb Ərəbatı mindi, birbaş Telli xanımın Gülşən bağına sürdü. Baxdı ki, Telli xanım qarabaşları ilə Gülşən bağındadı. Atı ona yaxınlaşdırdı, əlini atıb Telli xanımı Ərəbatın tərkinə çəkdi. Bayax ha bağdan çıxdı. O tərəfdən qarabaşlar özlərini Cəfər paşaya yetirdilər, dedilər o dünənki pəhlivan aşıq qızın Telli xanımı qaçırtdı. Cəfər paşa hökm elədi qoşun atlanıb Dəmirçioğlunun dalından düşdü. O tərəfdən Dəmirçioğlu Telli xanım da tərkində Ərəbatı sürüb Ərzurum şəhərindən aralanmışdı. Baxdı gördü dalınca qoşun gəlir, atın başını çəkdi, dayandı, başladı dincəlməyə. Telli xanım nə qədər yalvardı ki, bu yerdə əylənmə, sür atını gedək. İndi qoşun gəlib çatar, məni də səni də öldürürlər. Gördü yox, Dəmirçioğlu getmək istəmir. Axırda götürdü görək nə dedi:

Osmanlı qoşunu gəlir qurd kimi,
Var get, əcəm oğlu, qalma bu yerdə!
Başın gedər, gövdən qalar yurd kimi,
Var get, əcəm oğlu, qalma bu yerdə.

Dəmsirçioğlu ona cavabında dedi:

Osmanlı qoşunu gəlsə qurd kimi,
Ölər əcəm oğlu, qaçmaz bu yerdən!
Başım getsə, gövdəm qalsa yurd kimi
Ölər əcəm oğlu, getməz bu yerdən!

Telli xanım:

Qoşun gəlib, indi səni tutarlar,
Qollarını dal gərdəndə çatarlar,

Qul deyibən Həbəşidə satarlar,
Qaç get, əcəm oğlu, qalma bu yerdə.

Dəmirçioğlu:

Qoşun da gəlibən məni tutsalar,
Qollarımı dal gərdəndə çatsalar,
Qul deyibən Həbəşidə satsalar,
Ölər əcəm oğlu, qaçmaz bu yerdən.

Telli xanım:

Telli xanım ərzin sənə eyləsin,
Dili tutmur beş kəlməni söyləsin.
Bircə iyid min qoşuna neyləsin?
Qaç get, əcəm oğlu, qalma bu yerdə.

Dəmirçioğlu:

Dəmirçioğlu dərdin kimə söyləsin?
Şirin canın sənə qurban eyləsin.
Yüz min tülkü bir aslana neyləsin?
Ölər əcəm oğlu, qaçmaz bu yerdən.

Söz tamam oldu. Dəmirçioğlu söznən dediyi kimi dilinən də dedi:

– Telli xanım, mən səni belə dalaşsız-davasız Çənlibelə aparsam Koroğlu deyəcək oğurlayıb gətiribsən, bu – iyidlikdən deyil, gərək qayıdam qoşunla dava eləyəm, səni elə aparam.

Bu tərəfdən qoşun gəlib yetişdi. Dəmirçioğlu baxdı ki, yolun qırağında bir qalaça var. Telli xanımı gətirib haman qalaçada qoydu, qalaçanın ağzını da bir daş ilə möhkəmlədib özü qılıncı çəkdi qoşuna cumdu. Deyirlər ki, Dəmirçioğlu Cəfər paşanın qoşunu ilə düz üç gün, üç gecə vuruşdu. Çox adam öldürdü. Qoşunu əldən-ayaqdan saldı. Cəfər paşa özü də qoşunun içində idi. Gördü ki, bu yolla onu öldürə bilməyəcəkdi. Əmr elədi kəmənd atanlar gəldilər. Hər tərəfdən kəmənd atıb axır ki, Dəmirçioğlunu tutdular. Telli xanımı da qalaçadan çıxardıb şəhərə gətirdilər.

Cəfər paşa eləydi ki, acığından qudurmuş itə dönüb zəncir gəmirirdi. Əmr eləyib Dəmirçioğlunu Pəhlivan meydanında zəncirlətmişdi. Gündə bir cəllad bıçağı enində ayaq tərəfindən soydurub yerinə saman təpdirirdi.

Dəmirçioğlu burda qalsın, gəlin sizə Çənlibeldə Koroğludan xəbər verim. Koroğlu bir gecə yatmışdı, yuxusunda gördü ki, bir dişi laxlayıb, ağzı qan ilə doldu. Səksənib yuxudan ayıldı. Elə bir dəli nərə çəkdi ki, bütün dəlilər yuxudan qalxdılar. Koroğlu dəliləri yanına çağırdı, görək onlara nə dedi:

At belinə, dəlilərim,
Sizə qurban can, yerisin!..
Tutulubdu Dəmirçioğlu,
İyid, pəhlivan yerisin!..

Yağılar çəksin amanı,
Gözüm görməsin yamanı,
Leş-leşə verək düşmanı,
Axsın, qızıl qan yerisin!..

Qoç Koroğlu gələr coşa,
Polad qalxan tutar başa,
İyidlər dursun savaşa,
Qıraq sultan, xan yerisin!..

Dəlilər işi belə görəndə yaraxlanıb atlandılar. Koroğlu özü də Misri qılıncını belinə bağladı, qalxan asdı, nizə götürdü, sıçrayıb tərlan quş kimi Qıratın belinə qondu. Çənlibeldən ildırım kimi endilər. Üz tutub Ərzurum sənsən getdilər. Dağları, daşları üz elədilər, dərələri, təpələri düz elədilər. Özlərini Ərzuruma yetirdilər.

Koroğlu yenə də düşmanı yoxlamaq üçün aşıq paltarını geyinib, dəliləri Ərzurumun dağlarında qoyub özü tək şəhərə girdi. Gəzə-gəzə gəlib çıxdı meydana. Gördü Cəfər paşa başının adamları ilə buradadı.Cəfər paşa onu görcək yanına çağırtdırıb dedi:

– Aşıq, Koroğlunun bir dəlisini tutdurub dərisini soydururam. Deyirlər o dəli çox iyiddi, bir ondan oxu qulaq asaq.

Koroğlu belə baxanda gördü ki, Pəhlivan meydanının bir tərəfində Dəmirçioğlunu zəncirə bağlayıblar. Cəlladlar ayaq tərəfindən soyub dərisinə saman təpirlər. Cəfər paşa onun yanına gedib soruşdu:

– Hə dəli, necəsən, inciyirsən? Qorxursanmı?

Dəmirçioğlu paşanın cavabında dedi:

– Qoç Koroğlunun dəlisi heç qəm çəkib qorxarmı?

Koroğlu Dəmirçioğlunun bu sözünü eşidib aldı görək nə dedi:

Dəmirçioğlu, dəlilərim
Qisasını alar indi.
Sultana, paşaya, xana
Misri qılınc çalar indi.

Olum mən sənin qurbanın,
Mərd iyidsən qıydın canın,
Comərd dəlilər düşmanın
Yanar oda qalar indi.

Uymaz yağılar felinə,
Gərək Koroğlu bilinə,
Qızıb Ərzurum elinə,
Bir vəlvələ salar indi.

Koroğlu gördü Dəmirçioğlunun yarasından qan axır, taqətdən düşüb. Məlul-məlul baxır, aldı əl üstü görək nə dedi:

Məlul-məlul nə baxırsan,
Dəmirçioğlu, Dəmirçioğlu?!
Canım odlara yaxırsan,
Dəmirçioğlu, Dəmirçioğlu?!

Dost dostdan aralı gərək,
Qovğaya varalı gərək,
İyidlər yaralı gərək,
Dəmirçioğlu, Dəmirçioğlu!..

Qoç Koroğlu eylər savaş,
Kəsər, tökər çox qanlı baş,
Telli xanım sənə peşkaş,
Dəmirçioğlu, Dəmirçioğlu!..

Koroğlu üzünü Dəmirçioğluna tutub oxuyurdu. Cəfər paşa dedi:

– Aşıq, onun indi boynunu vurduracağam, onda baxarsan, oxu. Deyirlər Koroğlu nərə çəkəndə nərəsindən dağ-daş titrəyir. Koroğlu kimi nərə çəkə bilərsənmi?

Koroğlu dedi:

– Çox yaxşı nərə çəkə bilərəm.

Aldı görək nə dedi:

Qul deyərlər qulun boynun burarlar,
Qullar qabağında gedən tirəm mən.
Hesablıya dağ da olsam əyilləm,
Bədhesaba yaman kinligirəm mən.

Qırram qoşununu xaki-pay kimi,
Bir qılınc vuraram Əmiray kimi.
Mən coşmuşam boz bulanıq çay kimi,
İnanma ki, neçə ilə sönəm mən.

Koroğlu da yatıb-yatıb oyanmış,
Misri qılınc qızıl qana boyanmış,
Mən poladam, dəmirçidə dayanmış,
Şüşəyəmmi əl dəyəndə sınam mən?

Koroğlunun nərəsinə dəlilər dağlardan tökülüb hər yandan qoşunu qırmağa başladılar. Koroğlu Cəfər paşanı yerə vurub sinəsinə çökdü. Misri qılıncı çəkib başını kəsmək istəyəndə Telli xanım özünü atasının üstünə saldı, başından yaylığını açıb Koroğlunun ayağının altına atıb dedi:

– Koroğlu, iyid basdığın kəsməz. Bu dəfə atamı mənə bağışla.

Koroğlu Cəfər paşanın sinəsinin üstündən qalxdı. Dedi:

– Get, səni Telli xanıma bağışladım. Ancaq bir də qabaqlaşsaq əlimdən can qurtara bilməyəcəksən.

Cəfər paşanın qoşunu qırılan qırıldı, qırılmayanları qaçıb dağıldı. Koroğlu davadan əl çəkib Telli xanımı, Dəmirçioğlunu götürüb Çənlibelə yola düşdı.

Koroğlu ilə Eyvaz dəlilərin qabağında gedirdi. Yolun çoxunu getmişdilər, azı qalmışdı. Çənlibelə yaxınlaşmışdılar. Bir də Koroğlu üzünü Eyvaza tutub dedi:

– Eyvaz, get gör Dəmirçioğlunun yarası necədi, sağalırmı?

Eyvaz Dəmirçioğlunun yanına gəldi. Gördü yarasından qan o qədər axıb ki, rəngi ağappaq ağarıb, elə zəifləyib ki, dili yoxdu danışa. Nəfəsi zorla gedib-gəlir. Koroğlunun yanına qayıdıb dedi:

– Dəmirçioğlunun yarası çoxdu, sağalası deyil, bunu bu halda Çənlibelə niyə aparırsan? Gəl buralarda bir yerdə qoyaq, rahat ölsün.

Eyvazın cavabında aldı Koroğlu görək nə dedi:

Binadan gözəl olmayan
Telin qədrini nə bilər?
Göydə uçan boz sərçələr
Gülün qədrini nə bilər.

Kəl qoşub kotan əkməyən,
Nanın süfrəyə tökməyən,
Arının qəhrin çəkməyən
Balın qədrini nə bilər.

Utan, Eyvaz xan, bir utan,
Dağların damənin tutan,
Namərdliklə başa çatan,
Elin qədrini nə bilər.

Koroğlu saz ilə dediyi kimi söz ilə də dedi:

– Eyvaz, mən dəlilərin hərəsini bir yerdə atıb getsəm, onda başımda adam qalmaz. Dəmirçioğlunu Çənlibelə aparacağam. Həkim tapacağam. Yarasına dərman qoyub yağlayacağam. Əgər sağalsa bir yaxşı toy eyləyib Telli xanımı ona verəcəyəm. Sağalmayıb ölsə, onda da Çənlibeldə basdıracağam.

Eyvaz səhvini başa düşüb dinmədi. Gəlib Çənlibelə çatdılar. Nigar xanım qabağa çıxdı. Dəmirçioğlunu yaralı, rəngi qaçmış görəndə özünü saxlaya bilməyib ağladı. Nigarı ağlar görən Koroğlu aldı görək nə dedi:

Ağlama alagöz Nigar!
Dəmirçioğlu sağalacaq.
Bağrıma basma köz, Nigar!..
Dəmirçioğlu sağalacaq.

Çənlibeldi mənə pənah,
Köksün ötürüb çəkmə ah,
Tapdıracam həkim, cərrah,
Dəmirçioğlu sağalacaq.

Koroğlu heç əyməz boyun,
Tutacam Telliynən toyun.
Kəsəcəm tuncu, qoç, qoyun,
Dəmirçioğlu sağalacaq.

Koroğlu bir həkim tapdırıb gətirtdi.

Dedi:

– Həkim, Dəmirçioğlunun yarasına yaxşı məlhəm eylə sağalsın. Sənə xələt verəcəyəm. Yaxşı baxmasan, Dəmirçioğlu sağalmasa yəqin bil ki, səni onun yerinə öldürəcəyəm.

Həkim bilirdi ki, Koroğlunun sözü sözdür. Canı dilnən Dəmirçioğlunun yarasına əlindən gələn qədər yaxşı dava-dərman eləməyə başladı. Bir qədər keçdi, Dəmirçioğlu sappasağ olub ayağa qalxdı. Koroğlu həkimə xələt verib yola saldı.

Koroğlu Çənlibeldə gözəl bir məclis düzəltdirib bir yaxşı toy qurdurub, Telli xanımı Dəmirçioğluna verdi.

# Durna teli

Eyvaz Çənlibelə gələndən bəri telli Nigarın ürəyi yerinə gəlmişdi. Tay ürəyində heç bir dərdi yox idi. Qoç Koroğlu kimi ər bir yanında, Eyvaz kimi oğul bir yanında, bəylərə, paşalara qan udduran dəlilər də ki, gözünün qabağında. Kef, ləzzət, damaq biridi ki, o da Nigardaydı. Hərdən Çənlibelin laləli, nərgizli ətəklərinə baxıb öz-özünə deyirdi: "Görəsən bütün arvadların arasında heç mənim kimi xoşbaxtı varmı?".

Koroğlunun damağı ondan da çağ idi. O, həm özünə oğul gətirmişdi, həm də arxa, kömək gətirmişdi. Eyvaz çox çəkmədi ki, canlara dəyən iyid bir oğlan oldu. Dəlilərin hamısı bu iyidliyə görə ona hörmət eləyirdilər. Hamının gözündə əvvəl Koroğlu idi, sonra Nigar, sonra da Eyvaz.

Deyirlər ki, Koroğlu boş vaxtları həmişə dəlilərlə məşq eləyib təlim keçərdi. At minmək, nizə atmaq, qılınc vurmaq, qalxan tutmaq, ox atmaq onların peşəsi idi. Heç elə gün olmazdı ki, dəlilər içində təzə-təzə adamlar onlara qoşulmasın. Onlar da bu təlimdən öyrənirdilər.

Ustad belə deyir ki, yenə bir gün dəlilər Çənlibeldə bölük-bölük olub məşq eləyirdilər. Eyvaz da yaraqlı-yasaqlı bir dəstə ilə atlanıb dava məşqinə çıxmışdı. Dəlilər məşq eləyə-eləyə Koroğluya sarı at çapırdılar. Eyvaz Ərəbatın üstündə dəlilərin qabağınca gəlirdi. Koroğlunun onun başına taxdığı durna teli də papağında idi. Koroğlu Eyvazı belə görəndə ürəyi telləndi, qolları açıldı, üzünü Nigar xanıma tutub, aldı görək nə dedi:

Nigar xanım, sənə deyim,
Bu gələn Eyvaz, bu gələn.
Dili dodağıyı yeyim,
Bu gələn Eyvaz, bu gələn.

Eyvazım on beş yaşında,
Qüdrət qələmi qaşında,
Durna teli var başında,
Bu gələn Eyvaz, bu gələn.

Meydanda iyidlər mərdi,
Qabaqda ər oğlu ərdi,
Dava günü qızmış nərdi,
Bu gələn Eyvaz, bu gələn.

Misri qılınc dəstindədi,
Ərəbatın üstündədi,
Şirin canın qəsdindədi,
Bu gələn Eyvaz, bu gələn.

Cəmi dəlilərin xası,
Meydanda var mərd davası,
Koroğlunun tək balası,
Bu gələn Eyvaz, bu gələn.

Nigar xanım dedi:

– Koroğlu, doğrudan da durna teli Eyvazı yaxşı tutur. Durna teli dəliləri belə tutanda gör bizi necə tutar. Göndər dəliləri getsinlər bizə də durna teli gətirsinlər.

Koroğlu hələ Nigar xanıma cavab verməmişdi ki, Eyvaz dəlilərlə gəlib yetişdi. Nigarın Koroğluya dediyi sözləri eşidib, dedi:

– Durna teli nədi ki, ondan ötəri anamın qəlbini sındırırsan? İzn ver gedib Bağdatdan ona durna teli gətirim.

Koroğlu dinməmiş Dəmirçioğlu yerindən dedi:

– Ay Koroğlu, Eyvaz tək getməsin, izn ver mən də onunla gedim.

Bəlli Əhməd dedi izn ver, mən də gedim.

Çoxdan idi ki, dəlilər səfərə çıxmamışdılar. Bu burdan dedi, mən də getmək istəyirəm, o ordan dedi, izn ver mən də gedim. Koroğlu bilmədi ki, hansına cavab versin, hansını durna telinə göndərsin. Hələ Koroğlu özü də durna telinə getmək istəyirdi. Nigar xanım Koroğlunun dəliləri başsız qoyub getməyinə razı olmayıb dedi:

– Yox, özün qal, gözün dəlilərin üstündə olsun. Qoy durna telinə Eyvazgil getsinlər.

Koroğlu Eyvaza izn verdi. Yol uzaq olduğundan tapşırdı ki, Qıratı minsin. Eyvaz Misri qılınc bağladı, qalxan taxdı. Qıratı çəkib yəhərlədi, tərlan kimi qalxıb atın üstünə əyləşdi. Dəmirçioğlu ilə Bəlli Əhməd də dava libası geyindilər, atlandılar, üçü də birlikdə yola düşdülər.

Koroğlu dəlilərə uzaq səfərə gedəndə özləri ilə içgi götürməyə izn verməzdi. Amma Dəmirçioğlu ondan xəlvət tuluqları şərabla doldurub götürmüşdü. Dəlilər atlarını sürüb yola düşdülər. De günə bir mənzil, teyyi-mənazil at sürdülər, yol yordular, dərə keçdilər, düz getdilər, dağ aşdılar, mənzil keçdilər axırda gəlib Bağdad elinə çatdılar. Atları bağlara otlamağa ötürüb özləri calandılar durnaların canına. Durnaları qırdılar, tellərini bir yerə üst-üstə yığdılar, ətlərini də ocaq qalayıb

kabab çəkdilər. Ola durna ətinin kababı, qara üzümün şərabı, özü də harda-harda Bağdadın gül-gülü çağıran sərin bağlarında. Çeşmələr elə axırdı ki, elə bil göz yaşıdır.

Belə səfalı bir yerdə üç nəfər Çənlibel dəlisi, durna kababı, şərab da ki, elə bil ceyran qanıdı...

Qərəz yedilər, içdilər, gözləri dumanlandı, yavaş-yavaş məst olub üçü də başlarını yerə qoydular, yat ki, yatasan.

Bunlar burada məst-bihuş yatmaqda olsunlar, sənə kimdən deyim, Bağdad paşası Aslan paşadan.

Bu tərəfdən Bağdad paşası Aslan paşaya xəbər verdilər ki, üç nəfər atlı gəlib atlarını bağa buraxıb, özləri də bütün durnaları qırıb çatıblar. Aslan paşa hökm elədi ki, bu saat özlərini də, atlarını da tutub mənim yanıma gətirin.

Qoşuna əmr olundu, bağın dörd tərəfini gəzdilər. Qırat düşmənin yaxınlaşdığını görüb bərk kişnədi. Dəmirçioğlu ilə Bəlli Əhməd Qıratın səsinə yuxudan ayıldılar. Gördülər ki, bağda otun, ağacın sanı var, qoşunun sanı yoxdu. Dəmirçioğlu istədi ki, dava başlasın, Bəlli Əhməd razı olmadı ki, Eyvaz özündə deyil, biz dava başlasaq burdan uzaqlaşarıq, Eyvaz ələ keçər. Dəmirçioğlu gördü qoşun yaxınlaşır, amma Eyvaz yuxudan oyanmır ki, oyanmır. Axırda aldı, görək nə dedi:

Qoşun gəlib dört yanımızı aldılar,
Belə nə yatmısan, ayıl, Eyvaz xan!..
Hər tərəfdən mansıraya saldılar,
Axırda olarıq zayıl, Eyvaz xan!..

Qəbul qılma müxənnətin sözünü,
Sənə ərz eləyəm sözün düzünü,
Dur, göstər yağıya dönməz üzünü,
Gün kimi aləmə yayıl, Eyvaz xan!..

İnsafdırmı Bəlli Əhməd tutula,
Qulac qolu dal gərdəndə çatıla,
Dəmirçioğlu qul adına satıla,
Koroğlu dəlisi sayıl, Eyvaz xan!..

Sazın səsinə, Dəmirçioğlunun səsinə Eyvaz yuxudan ayıldı. Yüyürdülər ki, özlərini atlara yetirsinlər. Baxdılar ki, atlar tutulub. Halı belə görəndə hər üçü qızmış nər kimi nərə çəkib özlərini vurdular dəryayi-ləşkərə, sağa vurdular, sola vurdular, nə qədər qırdılarsa nə

qoşunun dalı kəsilirdi, nə də ki, bir yol tapıb bir tərəfə çıxa bilmirdilər. Axırda qoşun onları bir-birlərindən ayrı salıb, təklədi. Aralığa salıb üçünü də tutdular, qollarını bağlayıb, atları ilə birlikdə Aslan paşanın yanına gətirdilər. Aslan paşa hökm elədi ki, özlərini zindana salıb, atlarını da bazara çəkib satsınlar. Sonralar kimin hayfı varsa gəlsin, alsın.

Aslan paşanın adamları dəliləri zindana salıb atlarını da bazara apardılar. Bunlar burada qalsınlar, sənə Koroğlunun dostu bəzirgandan xəbər verim.

Koroğlunun bir bəzirgan dostu var idi. Neçə illər Koroğlu ilə dostluq işlətmişdi. İndi mallarını satmaq üçün Bağdada gəlmişdi. Bir də eşitdi ki, car çəkirlər ki, Koroğlunu tutublar. Tez bir təhər özünü zindana saldı, gördü yox, tutulanlar Koroğlunun dəliləridi. Eyvaz bəzirganı görcək tanıdı, bir təhər onu başa saldı ki, bəs Qıratı bazara çəkib satacaqlar, get çalış, satın al. Koroğluya xəbər ver!

Bəzirgan oradan çıxıb birbaş bazara gəldi. Gördü budu atları satırlar. Bəzirgan Qıratı satan dəllala yanaşıb dedi:

– Əyə, bu şılxoruna neçə verim?

Dəllal dedi:

– Gözlərini sil bir yaxşı-yaxşı bax. Şılxor nədi? Buna Koroğlunun Qıratı deyərlər.

Bəzirgan dedi:

– Əyə, başına at təpməyib ki, Qırat nədi? Bu yabı niyə Qırat olur?

Dəllal hirslənib "yabı nədi, ədə, tərlandı! Tərlan gör nə çəkir?!." – deyib atı hərəkətə gətirdi ki, camaat baxsın.

Gözünə dönüm Qırat gözünün birini yumdu, quyruğunu qısdı, özünü vurdu şılxorluğa.

Bəzirgan dedi:

– Ha gördün. Yaman çəkir, ədə, ay yelbeyin.

Qoç Koroğlunun Qıratını paşalar minə bilmirdi. Qorxudan bir pəhlivan onun yanına gedə bilməzdi. İndi Qırat elə ölü olmuşdu ki, gəl görəsən...

Bazar adamları tökülüb ata baxdılar. Gördülər bir gözü kor, qısıq, yeriyəndə də azca topallayan bir atdı.

Hamısı bəzirganın sözünü təsdiqlədi. Qərəz, bəzirgan dəllalı aldadıb Qıratı ucuz qiymətə alıb mənzilinə gətirdi. Atı bir yana bağlayıb qabağına yem-zad tökdü. Şəyirdini göndərib bazardan bir batman qır, bir top da bez aldırdı. Elə ki, qır da, bez də hazır oldu bəzirgan qabaqca

o ki, var bezi qırladı. Sonra bu qırla bezi Qırata möhkəm-möhkəm sarıyıb özü də mindi. Qır bəzirganı elə tutdu ki, kəndir-qayış kimi. Elə ki, bəzirgan arxayınlaşdı ki, tay atdan yıxılmayacaq, yüyənini buraxdı. Qırat götürüldü, nə götürüldü. Elə bil ki, Çənlibeldə bala qoyub gəlmişdi. Vallah bir gedirdi, bir gedirdi ki, ildırım deyim sənə yalandı. Amma kimdən deyim sənə bəzirgandan. Yazıq bəzirganda bəzirganlıq qalmamışdı. Köhnə bəzirganda elə bircə quru nəfəs qalmışdı. Bayax ha özündən getmişdi. Qırat nə qədər yol getdi bəzirgan bilmədi. Bir vaxt bir də at bərkdən kişnədi. Bəzirgan gözlərini açıb gördü Çənlibeldədi.

Dəlilər Qıratın səsini eşidib tökülüb gəldilər. Baxdılar vallah Qırat budu ilan vurmuş kimi elə gəlir ki, az qalır dırnaqları çatlaya. Amma ki, təkdi. Eyvaz da üstündə yoxdu. At bir az da yaxınlaşanda diqqət verib gördülər at sahibsizdi. Amma deyəsən üstündə nədirsə bir yaman şey qaralır. Hamı fikir dəryasına cumdu ki, görəsən bu nə sirdi.

Bunlar elə bu fikirdə Qırat gəlib düz Koroğlunun qabağında dayandı, üzünü gəldiyi tərəfə tutub elə bir nərə çəkib kişnədi ki, dağ-daş lərzəyə gəldi. Sonra dönüb Koroğluya baxdı, ayaqlarını yerə döyməyə başladı. Koroğlu vəfalı atının boynunu qucaqlayıb üzündən, gözündən öpdü. Baxıb gördülər ki, Qıratın üçtündə bir adam var. Amma özündən gedib. Bunu açıb atdan düşürdülər. Başına su-zad töküb özünə gətirdilər. Baxdılar ki, bəzirgandı. Koroğlu onu görcək tanıdı, soruşdu ki:

– Bəzirgan, Eyvaz hanı, yoldaşları harada qalıb ki, sən Qıratı götürüb gəlibsən?

Bəzirgan dedi: – Koroğlu! Eyvazı, Dəmirçioğlunu, Bəlli Əhmədi Aslan paşa tutub zindana salıb. Bu günlərdə dara çəkdirəcək. Durma, tez özünü onlara yetir.

Koroğlu bəzirgandan bu sözü eşidib üzünü dəlilərə tutdu, aldı, görək nə dedi:

Xəbər verin dəlilərim oyansın,
Tutulubdu bir Eyvazım əldədi!
Misri qılınc qızıl qana boyansın,
Tutulubdu bir Eyvazım, əldədi!

Yatmışdım aşkara gördüm duşumu,
Əzəlindən mən bilirdim işimi,
Çəkin, yəhərləyin çərləmişimi,
Tutulubdu bir Eyvazım, əldədi!

Düşmənlərim tamaşaya durarlar,
Şad oluban keyf məclisi qurarlar,
Koroğlu getməsə yəqin qırarlar
Tutulubdu bir sərdarım, əldədi!

Dəlilər tələsik yaraqlandılar, atlarını yəhərlədilər. Koroğlu Misri qılıncı belinə bağladı. Qalxan asdı, əmud götürdü, üstündən də bir saz keçirib Qırata mindi. Dəlilər də başında Bağdada tərəf yola düşdü. Hər yerdən keçib gəldilər Bağdadın kənarına yetişdilər. Şəhərə girməyə az qalmışdı ki, bir qoca biçinçiyə rast gəldilər. Gördülər qoca taxıl biçir. Amma gözündən dolu kimi yaş tökür. Koroğlu yaxınlaşıb soruşdu:

– Ay qoca niyə ağlayırsan?

Qoca dedi:

– Neyləyirsən, səndən ki mənim dərdimə dərman olmayacaq, çıx yolunla get.

Qoca sözünü nə qədər yayındırdısa Koroğlu əl çəkmədi. Axırda qoca soruşdu:

– İndi ki, əl çəkmirsən, qabaqca de görüm Koroğluynan dostsan, düşmən?

Koroğlu dedi: – Dost olarıq. Nə var ki, onu niyə xəbər aldın?

Qoca dedi:

– Koroğlunun üç dəlisi gəlib buraya çıxıbdı. Bu gün Bağdadda onları dar ağacından asacaqlar. Üç cavan iyid oğlanlardı. Elədilər ki, şəkil kimi, elə doğrusu onların halına ağlayıram.

Koroğlu qocanı belə mərd, namuslu görüb dəlilərə hökm elədi ki, qılıncları çəkib qocanın taxılını biçsinlər. Dəlilər qılıncları çəkib taxıla doluşanda qocanın gözləri alacalandı. İki əlini dizinə vurub öz-özünə dedi:

– Vay evi yıxılan canım! Yəqin bu kələ-kötür oğlu kələ-kötür paşanın adamlarından imiş. Bu saat taxılı vel-veran eləyib, məni də öldürəcəklər.

Amma diqqət eləyib baxdı ki, balam bunlar taxılı biçirlər. Qoca qaldı mat-məhəttəl ki, görəsən bunlar kimdilər. Bu belə fikirlərdə olsun, dəlilər taxılı biçib dərz-dərz bağlayıb bir tərəfə yığdılar. Elə ki, hazır oldu Koroğlu üzünü qoca biçinçiyə tutub dedi:

– Qoç Koroğlu elə mənəm ki, varam. İndi Aslan paşanın başına göydən od tökəcəyəm. Xəzinəsini dağıdıb paylayacağam. Bir xurcun götürüb xəzinənin qapısında olarsan.

Qoca sevindiyindən bilmirdi ki, nə eləsin. Axırda bir təhər ki, özünü cəmləyib dedi:

– Bala, şəhərə belə girmə. Aslan paşa xəbər tutar, siz yetişənə qədər dəliləri azdırar, qoy başındakı dəlilər dört bir dört bir olub adamlara qarışsınlar, şəhərə elə girsinlər.

Biçinçi qocanın sözü Koroğlunun xoşuna gəldi. Ancaq hələ şəhərə çox qalırdı. Bir az da getmişdilər bir də gördülər ki, budu qabaqdan bir atlı tələsik atını sürüb çölə tərəf gedir. Dəli Həsən ata bir məhməz vurub özünü çatdırdı atlıya. Baxdı ki, bu atlı əynində çuxa, ayağında başmaq, qanovuz arxalığın üstündən də belində tirmə şal olan enlikürək, qarnı yoğun bir kişidi. Atın tərkində bir xurcun, xurcunun bir gözündə çörək, bir gözündə bir sərnic qatıq var idi. Özü də deyəsən kişi çox tələsirdi.

Dəli Həsən dedi:

– A kişi, bir dayan görüm, belə haraya gedirsən?

Kişi cavab verdi ki:

– Çöldə biçinçilərimiz var, onlara çörək aparıram. Nə sözün var, tez ol de tələsirəm. Gərək tez qayıdam şəhərə.

Dəli Həsən dedi:

– Yaxşı, şəhərdə nə var ki belə? Xeyir ola.

Kişi dedi:

– Aslan paşa bu gün Koroğlunun üç dəlisini asdıracaq. Böyük şadyanalıq olacaq. İndi tələsirəm ki, tez o şadyanalığa çata biləm.

Dəli Həsən kişidən elə bu sözü eşitcək əlini atıb kişinin xırtdəyindən tutub dik atın üstündən götürdü. Elə eləcə gətirdi Koroğlunun hüzuruna. Koroğlu baxdı ki, kişi çoxdan cəhənnəmə vasil olub.

Soruşdu ki:

– Bunu niyə boğdun?

Dəli Həsən əhvalatı danışdı. Koroğlu baxdı ki, demək bu gün Eyvazgili doğrudan da asacaqlar. Ürəyi qəzəblə dolub aldı, görək nə dedi:

Uca-uca dağ başında
Yaz bir yana, qış bir yana.
Titrəşir ağzım içində,
Dil bir yana, diş bir yana.

Nə edək, dəlilər, edək!
Düşmənin bağrını didək!

Xan Eyvaza kömək edək!
Dörd bir yana, beş bir yana.

Hər nə oldu mənə oldu,
Qaynadı paymanam doldu,
Gördün ki, düşmən güc gəldi,
Qov bir yana, qaç bir yana.

Koroğlunun yox əlacı,
Misirdən gəlir xəracı,
Çəkəndə Misri qılıncı,
Leş bir yana, baş bir yana.

Koroğlu dəliləri dörd bir-beş bir elədi. Dedi:

– Camaata qarışın, şəhərə girin. Amma ta ki, mən əllərimi bığıma çəkməmiş, davaya başlamayın.

Koroğlu bunu deyib özü tək başına çiynində də saz şəhərə girdi. Bu burada qalsın, sənə kimdən deyim, Aslan paşadan.

Aslan paşa dar ağacı qurdurmuşdu. Dəliləri də dar ağacının yanına gətirtmişdi. Cəllad qabaqca Eyvazı dar ağacına gətirdi. Qollarını çırmalayıb ipi hazırlamağa başladı. Dəmirçioğlu işi belə görəndə gözlərini yaş tutdu, aldı, görək nə dedi:

Hanı mənim qoç Koroğlum,
Gələ girə bu meydana!
Çəkəndə Misri qılıncı,
Qəbzəsi qana boyana!

Qırat bir burdan atıla,
Müxənnət, ölkən çapıla!
Koroğlu burda tapıla,
Hərəniz qaça bir yana!

Dəmirçioğlunu dindir,
Suçunu boynuna mindir,
Biz iki dəlini öldür,
Gəl, sən qıyma Eyvaz xana!

Dəmirçioğlu sözünü tamam eləyəndə Koroğlu gözləri qızmış özünü meydana saldı. Aslan paşa da meydanda idi. Koroğlunun çiynində saz görüb dedi:

– Əyə, aşıqsanmı?

Koroğlu dedi: – Aşığam.

Aslan paşa dedi:

– Onda Koroğlunun dəlilərini asdırmaqdan qabaq bir oxu, kefimiz açılsın.

Koroğlunun başında gələn dəlilər adamların arasında idi. Dava başlamaq üçün Koroğlunun işarəsin gözləyirdilər. Hamısı elə idilər ki, dodaqlarını gəmirib, bığlarını çeynəyirdilər. Koroğlu dəlilərə baxıb götürdü, görək nə dedi:

Dəlilərim, bu gün dava günüdü,
Müxənnəs ölkəsi talanmaq gərək!
Qoç iyidlər yarasından bəllənər,
Şərbət tək qanını yalanmaq gərək!

Mərd iyidlər nərə çəksin davada,
Şahin kimi şikar tutsun yuvada,
Misri qılınc cövlan vursun havada,
Bağırsaq cəmdəyə dolanmaq gərək!

Koroğlu içəndə düşmən qanını,
Mərd meydanda nərəsindən tanını,
Qırın vəzirini, tutun xanını,
Leş-leşin üstünə qalanmaq gərək!

Aslan paşa dedi:

– Ay aşıq, sən elə ölüb öldürməkdən deyirsən. Bu nədi? Niyə qışqırırsan? Bir az alçaqdan oxusana!

Koroğlu Aslan paşanın cavabında dedi:

– Qulas as, oxuyum.

Acığından qan Koroğlunun beyninə vurmuşdu, gözləri qıpqırmızı qızarmışdı. Dar ayağında dayanan Eyvaza baxıb aldı görək nə dedi:

Canım paşa, gözüm paşa,
Paşa qoy, gəlsin Eyvazı!
Budu sana sözüm paşa,
Paşa, qoy gəlsin Eyvazı!

Göydən ildırım tökdürrəm,
Yurdunda bostan əkdirrəm,
Torpağın dağa çəkdirrəm,
Paşa, qoy gəlsin Eyvazı!

Əyləşib paşalar, bəylər,
Sinəmdən baş verib millər,
Koroğlu iltimaz eylər,
Paşa, qoy gəlsin Eyvazı!

Koroğlu oxumağında olsun, paşa da qulaq asmağında, sənə kimdən xəbər verim, Giziroğlu Mustafa bəydən. Bağdad tərəfindən Giziroğlu Mustafa bəy adında bir iyid var idi. Giziroğlunun başında da qırx atlısı var idi. Özü də Koroğlu ilə düşmən idi. Atalar deyiblər ki, iki qoçun kəlləsi bir qazanda qaynamaz. O iyid, bu iyid. Giziroğlu Mustafa bəy çoxdan idi ki, başının atlılarıyla bərabər o dağ sənin, bu dərə mənim Koroğlunu axtarırdı. Onunla dava eləmək istəyirdi. Birdən xəbər çıxdı ki, bəs Aslan paşa Koroğlunun üç dəlisini tutub özlərini də bu gün asdıracaq. Bu iş Giziroğluna xoş gəlmədi. Bir hay vurub dəstəsini başına yığıb dedi:

– Aslan paşa Koroğlunun üç dəlisini tutub, bu gün dara çəkdirəcək. Mən Koroğluynan düşmənəm. Bu öz yerində, amma Aslan paşanın bu namərdliyinə yol verə bilmənəm. Gedək onları qurtaraq.

Giziroğlu bilmirdi ki, Koroğlu özü də Bağdada gəlib. Dəstəsini götürüb şəhərə gəldi, gəlib meydandan bir az aralı dayandılar. Baxdı ki, Koroğlu aşıq paltarında məclisdədi. Dayanıb baxmağa başladı. Bu, burada qalsın sənə kimdən deyim sədrəzəmdən. Aslan paşanın sədrəzəmi Koroğludan şübhələnmişdi. Ağzını Aslan paşanın qulağına yapışdırıb dedi:

– Paşam sağ olsun, bu adam ya Koroğludu, ya da ki... elə Koroğludu ki, var.

Aslan paşa heç ona baxmayıb dedi:

– Əşi, sən də... Koroğlu burada nə qayırır. Qoymazsan oxusun.

Giziroğlu Mustafa bəy baxdı ki, gün keçir, amma Koroğlu elə məclisdə gəzib oxuyur. Fikirləşdi ki, bəlkə Koroğlunun dəliləri hələ gəlib çıxmayıb, tək dava eləməkdən qorxur. Gün yubadır. Qoy burada olmağımı ona bildirim.

Giziroğlu Mustafa bəy şeşpərini əlinə aldı, nişan edib atdı. Şeşpər gəlib məclisin yanındakı məscidin gümbəzinə dəydi. Paşa dik ayağa qalxıb çığırdı ki:

– O nədi? Onu kim atdı?

Koroğlu baxdı ki, sədrəzəm əkilmək istəyir. Tez sazı döşünə basıb paşaya dedi:

– Paşa qulaq as!

Laf eyləmə, Aslan paşa,
Sədrəzəm qaçdı sandım.
Havadakı humay quşlar
Yuvasından uçdu sandım.

Meydanda iyidlik satdı,
Gəlmədi, günü yubatdı,
Giziroğlu şeşpər atdı,
Şeşpər yerə keçdi sandım.

Koroğluyam, bilməm nədən,
Qara bağrım oldu zədən,
Eyvazdımı dara gedən?
Yaralarım deşdi sandım.

Elə ki, Koroğlu sözünü deyib qurtardı, bir dəlilərə baxıb dedi:

Hoydu, dəlilərim hoydu,
Yeriyin meydan üstünə!
Havadakı şahin kimi,
Tökülün al qan üstünə!

Qoyun bədöylər kişnəsin,
Misri qılınclar işləsin,
Kimi tənab qılınclasın,
Kiminiz düşman üstünə!

Koroğlu çəkər haşını,
Bəylər elər tamaşanı,
Mən özüm Aslan paşanı,
Hərəniz bir xan üstünə.

Koroğlu oxuya-oxuya əlini bığına çəkdi. Dəlilər hər tərəfdən əli qılınclı töküldülər. Dava başlandı. Ara qızışmışdı, hər dəli birinin üstünə yeridi. Koroğlu Aslan paşanın üstünə hücum elədi. Dəlilər də qoşunun üstünə töküldülər. Koroğlu Misri qılıncı çəkib Aslan paşanın boynunu vurub yerə saldı. Dəlilər tənabları qılıncladılar. Eyvazın, Dəmirçioğ-lunun, Bəlli Əhmədin qollarını açdılar. Dəmirçioğlu dar ağacının birini

çıxartdı, əlinə alıb özünü düşmən qoşununa vurdu. Xan Eyvazla Bəlli Əhməd də qoşuna cumdular. Dava bir qızışdı, bir qızışdı ki, ruzigarın gözü belə dava görməmişdi.

İyidlər vuruşdu, qorxaqlar qaçdı. Mərdlə namərd seçildi, mərd oğul bəsləyən anaların başı ucaldı, namərd bəsləyən analar yerə girdi. Davanın şirin yerində Giziroğlu Mustafa bəy öz dəstəsi ilə gəlib çatdı. İki tərəfdən Aslan paşanın qoşununu araya aldılar. Qoşundan qırılan qırıldı, qaçan qaçdı, dağıldı.

Düşmən basılandan sonra Giziroğlu başında dəstəsi geri qayıtdı. Bu tərəfdən Koroğlu özünü paşanın xəzinəsinə yetirdi. Bir təpik vurdu, xəzinənin qapısı taybatay açıldı. Koroğlu bir də baxdı ki, biçinçi qoca əlində bir xurcun kəsdirib xəzinənin qapısını.

Koroğlu dedi:

– Qoca, gir xəzinədən xurcununu doldur apar.

Tay qocanın halını soruşma. Özünü xəzinənin içinə salıb xurcununu xırcım-xırcım doldurub düzəldi yola.

Elə ki, dava qurtardı, hamısı birlikdə kefləri saz, damaqları çağ atlanıb Çardaxlı Çənlibelə yola düşdülər. Koroğlu bilirdi ki, Giziroğlu Mustafa bəy elə belə çıxıb getməyəcək. Hökman onun yolunu kəsəcək, onunla vuruşacaq, özü də dəlilərin yanında. Çünki bilirdi ki, Giziroğlu mərd adamdı. O ancaq Koroğlunun özü ilə haqq-hesab kəsmək istəyir. Yoxsa əslində onunla düşmənçiliyi yoxdu. Odu ki, qəsdən dəlilərindən geriyə qalmışdı. Qıratı bir çay qırağı ilə yavaş-yavaş sürürdü. O tərəfdən də Giziroğlu Mustafa bəy doğrudan da Koroğlunun yolunu kəsmişdi. Koroğlu gəlib onun yanına çatmağa az qalmışdı. Qırat kişnəyib götürüldü.

Giziroğlu Mustafa bəy Alapaçanı onun dalına saldı. Qırat Alapaçanın səsini eşitcək yerindəcə dayandı. Koroğlu dönüb Giziroğlunu yanında gördü. Koroğlu həmhuş eləyib əl açana qədər Giziroğlu onun başından bir əmud elə vurdu ki, Koroğlu atdan birbaş yaxındakı çaya yıxıldı. Giziroğlu sıçrayıb yenə də onun başının üstünü aldı. Koroğlu çaydan çıxdı. Giziroğluna əl verdi. Sonra atını minib dinməz-söyləməz yoluna davam elədi. Bir az gedib dəlilərə çatdı. Amma bu işi yolda dəlilərə açmadı. Atları sürüb gəldilər Çənlibelə çatdılar. Koroğlu Qıratdan, dəlilər də öz atlarından töküldülər. İçki məclisi quruldu. Dəlilər oturub kefə başladılar. Bunlar kefdə olsunlar, sənə kimdən

deyim, Giziroğlundan. Giziroğlu elə ki, öz adamlarının yanına qayıtdı, hamısı dedilər ki, Koroğludan qorxub qaçıbsan. Giziroğlu nə qədər dedi ki, qorxmamışam, vuruşduq. Ancaq nə o məni basa bildi, nə də mən onu. Dəstə inanmadı. Axırda Giziroğlu hrslənib dedi:

– İnanmayırsınız gedək Çənlibeldə bir də vuruşaq. Özünüz görün.

Hamısı birlikdə Çənlibelə gəldilər. Amma Giziroğlunun fikri bu idi ki, Koroğlu ilə vuruşanda elə eləsin heç birisi basılıb xar olmasın. Bəli, elə ki gəlib Çənlibelə çatdılar, baxdılar ki, məclis qurulub. Dəlilər, xanımlar, Koroğlu özü hamı kefə məşğuldu, Giziroğlu öz adamlarına dedi:

– Bu kefi pozmaq namərdlikdi. Gəlin gözləyək, qurtarsınlar, sonra.

Hamı razılaşdı. Bir tərəfdə durub gözləməyə başladılar.

Nigar xanım Eyvazı sağ yanında əyləşdirmişdi. Bilmirdi ki, oğlunu ölümdən qurtardığına görə Koroğluya necə razılıq eləsin. Baxıb-baxıb dedi:

– Ay Koroğlu, sən ki, belə iyidliklər göstərirsən, görən bu dünyada sənin kimi iyid tapılarmı?

Koroğlu bir fikirləşdi, aldı, görək nə dedi:

Analar oğul doğubdu,
Giziroğlu Mustafa bəy.
Bu dünyaya tək gəlibdi,
Giziroğlu Mustafa bəy.

Nizəsinin ucu qanlı,
Dəliləri dəmir donlu,
Bir igiddi adlı-sanlı
Giziroğlu Mustafa bəy.

Bir atı var Alapaça,
Aman vermir Qırat qaça,
Nizəsinin ucu haça,
Giziroğlu Mustafa bəy.

Bir atadan kaş olaydıq,
Bir-birindən xoş olaydıq,
Doğmaca qardaş olaydıq,
Giziroğlu Mustafa bəy.

Hay geyəndə haya basar,
Huy deyəndə huya basar,
Koroğlunu çaya basar,
Giziroğlu Mustafa bəy.

Giziroğlu Mustafa bəy Koroğludan bu sözü eşidib başının adamları ilə onun yanına gəldi.

Dedi:

– Koroğlu, sən doğrudan da Koroğlusan. Mərd iyidsən, bu gündən sonra arada olan düşmənçiliyi atdım, səninlə qardaş oldum. Başımdakı dəstəmlə sənin dəlilərinə qarışdım. Əl ver, düşməninlə düşmən, dostunla dostam.

Koroğlu ilə Giziroğlu bir-birlərinə əl verdilər. O gündən dost oldular.

# Koroğlunun Rum səfəri

Aşıq Cünun gəzə-gəzə gəlib Rum elinə çatdı. Küçələri gəzirdi, birdən-birə küləfirəngidə bir gözəl gördü.

Aşıq gözü ilə buna bir nəzər salıb baxdı ki, vallah qız nə qız. Gözlər qara, qaşlar kaman, dişlər mirvari, dodaqları yaqutun kənarı kimi. Tellər qara, xallar qara, gözlər elədi, elədi ki, dərd əhlinə gəl-gəl deyir. Cünunun ağlı başına vurub dayanıb ona tamaşa eləmyə başladı. Bu qız kim ola, kim ola, Rum paşasının qızı Məhbub xanım.

Məhbub xanım baxdı ki, çiynində sazı olan bir aşıq küçədə durub ona baxır. Qırx incəbel qızlardan birinə Aşıq Cünunu göstərib dedi:

– Get, o aşağı buraya çağır.

Qarabaş getdi. Aşıq Cünun baxdı imarətin qapısından bir qız çıxdı, budu ona tərəf gəlir. Aşıq Cünun qabaqca qorxdu. Elə əkilmək istəyirdi, qız gəlib çatdı ki:

– Aşıq, Rum paşasının qızı Məhbub xanım səni çağırır.

Aşıq Cünun gördü yox bu, qəzəbdən deyil, deyəsən iş var. Qarabaşla Məhbub xanımın yanına gəldi.

Məhbub xanım aşığa yer göstərdi, elə ki, aşıq Cünun əyləşdi, qız soruşdu:

– Aşıq, kimsən? Haradan gəlibsən? Hara gedirsən? Sizin yerlər necə yerdi? Mənə bir qədər söhbət elə.

Aldı aşıq Cünun, görək nə dedi:

Mərd oylağı Çənlibeldi,
Məhbub xanım, bizim yerlər,
Dəliləri durna telli
Məhbub xanım, bizim yerlər.

Dağları var alçaq-uca,
Əylər qəflə, tacir, xoca,
Tutulub hasarlı burca,
Məhbub xanım, bizim yerlər.

Eyvazbalı ordu basan,
Bəlli Əhməd bərə pusan,
Dəmirçioğlu Dəli Həsən
Məhbub xanım, bizim yerlər.

Dəliləri qoşa-qoşa,
Düşman görsə çəkər haşa,
Bata bilməz sultan, paşa,
Məhbub xanım, bizim yerlər.

Gülü, nərgizi bitəndə,
Tuti qumrular ötəndə,
Cünun çənliyə yetəndə,
Məhbub xanım, bizim yerlər.

Aşıq Cünun sözünü tamam elədi. Məhbub xanım dedi:

– Aşıq, sizin bu yerin bir yiyəsi varmı? Dəlilərin sərkərdəsi kimdi?

Aşıq Cünun dedi:

– Xanım, qulaq as deyim.

Aldı, aşıq Cünun:

Nərə çəkib düşman üstə gedəndə,
Meydanda göstərir hünər Koroğlu!
Qulaş qolun gərib şeşpər atanda
Vurar dağı-daşı dələr Koroğlu!

Bilmək olmaz onun fitnə-felini,
Namərd qoya bilməz yerə belini,
Yön çevirsə yıxar şahlar evini,
Qoymaz ölkənizdə mələr Koroğlu!

Düşər hərdən paşalarla davası,
Kəsilməz savaşı, cəngi, qovqası,
Cünun deyər Çənlibelin ağası,
Yeddi min dəliyə sərkər Koroğlu!

Söz tamama yetişdi. Məhbub xanım dedi:

– Aşıq Cünun, sən ki, Koroğlunu bu qədər təriflədin, əyər iyid isə gəlsin məni də Çənlibelə aparsın.

Aşıq Cünuna da elə bu lazım idi. Ayağa durub, görüşüb məclisdən çıxdı. Ağamı allah saxlasın, birbaş Çənlibel deyib yol gedib, gəlib axırda Çənlibelə yetişdi.

Koroğlu ayağa durdu, aşığın qabağına çıxdı, gətirib öz yanında əyləşdirdi. Aşıq yedi, içdi, elə ki, toqqanın altını bərkitdi, Koroğlu soruşdu:

– Aşıq Cünun, Çənlibeldən çoxdan çıxıbsan. De görək nə gördün, nə eşitdin?

Aşıq Cünun dedi:

– Koroğlu, bu dəfə gördüyümü dil ilə desəm dilimi yandırar. Qoy saz ilə deyim.

Aşıq Cünun üç telli sazı döşünə basıb başladı:

Gedərkən çıxdı qarşıma,
Məhbub xanım, Məhbub xanım.
Sevdasın saldı başıma,
Məhbub xanım, Məhbub xanım.

Gözü göyçək, qaşı qələm,
Olmaz belə şirin kəlam,
Çəkər həsrətini aləm
Məhbub xanım, Məhbub xanım.

Duruşu bənzər tərlana,
Gözəl doğub, gözəl ana,
Töküb tellərin gərdana,
Məhbub xanım, Məhbub xanım.

Dəli könül talaşında,
Can qovrulu ataşında,
Qırx incə qız var başında,
Məhbub xanım, Məhbub xanım.

Aşıq Cünun çəkər nazı,
Ürək açar xoş avazı,
Rum elində paşa qızı,
Məhbub xanım, Məhbub xanım.

Aşıq Cünun sazla dediyi kimi sözlə də əhvalatı nağıl eləyib dedi ki, Məhbub xanım dedi: – “Əgər kişidirsə gəlib məni də Çənlibelə aparsın” – Nigar xanım bu sözü eşitcək Koroğluya dedi:

– O ki buraya gəlmək istəyir, gətirməmək namərdlik olar. Bir də ki, Rum gözəllərini çox tərifləyirlər. Hökman gərək gedib Məhbub xanımı gətirəsiniz.

Koroğlu Qıratı çəkdirdi, yəhərlətdirdi, qılınc-qalxan götürdü, çiyninə də saz keçirtdi. Atlanmaq istəyəndə dəlilər:

– Bizi də özünnən apar, – dedilər.

Koroğlu razı olmadı. Xanımlarla, dəlilərlə halallaşıb Qıratı mindi. Tək-tənha Ruma tərəf getməyə başladı. Alçaqlar keçdi, ucalar aşdı, yel oldu əsdi, mənzillər kəsdi axırda gəlib Rum elinə çatdı.

Koroğlu Qıratın üstündə, çiynində saz gedirdi, işə bax ki, Məhbub xanım da yenə küləfirəngidən baxırdı. Koroğlunu aşıq hesab eləyib qarabaşını göndərib yanına çağırtdırdı. Koroğlu gəldi, düşdü Qıratı bir yanda bağlayıb içəri girdi. Məhbub xanım hörmətlə ona yer göstərdi. Özü də qırx incəbel qızla yanında əyləşib dedi:

– Aşıq, gəlişin hardandı? Bir qədər söhbət elə, qulaq asaq.

Aldı Koroğlu, görək nə dedi:

Qırata sarılıb düşmüşəm yola,
Urum deyib Çənlibeldən gəlirəm.
Gümüş qolçaqları bağlayıb qola
Polad geyib Çənlibeldən gəlirəm.

Dolanıb dağları gəzmişəm əzəl,
Hayvalı bağlarım görməyib xəzəl,
Bu Rum ölkəsində bir türfə gözəl,
Seçib sevib, Çənlibeldən gəlirəm.

Məhbub xanım "Çənlibeldən gəlirəm" deməsindən bildi ki, bu Koroğludu. Dedi:

– Belə deməkdə yerin var. Söylə görək Rum elində sevdiyin gözəlin adı nədi? Kimin qızıdı?

Məhbub xanım belə deməkdə Koroğluya işarə eləyib bu işi yanındakı qızlardan gizlətmək istəyirdi. Ancaq Koroğlu işarəyə baxan deyildi. Onunku mərd-mərdanə idi. Dedi:

Koroğlunun dəlilərdi imdadı,
Qılınc çəkdi, hasil ola muradı.
Rumlu paşa qızı, Məhbubdu adı,
Məhbub deyib, Çənlibeldən gəlirəm.

Söz tamam oldu. Məhbub xanımın əmisi qızı Şirin xanım da qızların içində idi. Özü də əmisi qızının xatirini çox istəyirdi. Baxdı ki, bu sözdən qızların arasına çaxna-vaxna düşüb, odu ki, tez dedi:

– Ay qızlar, aşığın qaydasıdı, yar-yar deyər, dilbər deyər, Məhbub söyləyər. Məhbub istəkli deməkdi. Yoxsa fikrinizə ayrı şey gəlməsin. Qərəz, Şirin xanım qızları sağ saldı. Bir az keçdi, elə ki, qızlar durub çıxıb getdilər, Koroğlu yeyib, içib başını atıb yatdı. Bu yatmaqla Koroğlu düz sabaha kimi bir yanı üstə yatdı. Dünya – aləmdən xəbəri olmadı. Elə ki, səhər açıldı, durdu, yenə yedi, içdi, geyinib çıxmaq istəyəndə Məhbub xanım dedi:

– Koroğlu, belə haraya getmək istəyirsən?

Koroğlu cavab verdi ki, şəhəri gəzmək istəyirəm, tez qayıdacağam. Sən də hazırlaş, gəlim gedək.

Məhbub xanım dedi:

– Yaraqsız, yasaqsız getmə. Atam buraya gəlməyini bilər, səni tutdurar.

Koroğlu dedi:

– Mən heç kəsdən qorxub gizlənən deyiləm.

Məhbub xanım çox dedi, Koroğlu az eşitdi. Axırda onun sözünə baxmayıb şəhərə çıxdı.

Rum əhli Koroğlunun tamaşasına yığışmışdı. Hamı onun təhər-töhürünə, boy-buxununa baxıb mat qalmışdı. Axırda söz gedib paşaya çatıb ki, bəs Ruma bir adam gəlib təhər-töhüründən heç bizim yerin adamlarına oxşamır.

Paşa üç nəfər göndərdi ki, gedin mənim yanıma gətirin. Paşanın adamları Koroğlunun yanına gəldilər ki, paşa səni çağırır.

Koroğlu dedi:

– Mən paşa-maşa tanımıram. İşi varsa özü gəlsin, mənim yanıma.

Paşanın adamları Koroğlunu güclə aparmaq istədilər. Koroğlu bir dedi əl çəkin məndən, iki dedi əl çəkin məndən, gördü yox, olmayacaq, bunlar elə ora-burasını çəkişdirirlər. Axırda hirslənib onların üstünə düşdü. Elə bir-iki dəfə əl tovlayan kimi gələnlərdən ikisi mitil kimi yerə düşüb cəhənnəmə vasil oldu. Biri bir təhər aradan çıxıb özünü paşaya yetirib əhvalatı ona nağıl elədi.

Paşa bu dəfə 15 adam göndərib, dedi:

– Gedin, onun ya dirisini gətirin, ya ölüsünü.

Koroğlu bir də baxdı ki, on beş nəfər yasaqlı adam siyirmə qılıncla ətrafı tutdular. Koroğlu baxdı ki, tay ayrı əlac yoxdu. Qılıncı çəkib düşdü bunların üstünə. Gələnlərdən ikicəsi salamat qalıb təngənəfəs özlərini paşanın yanına saldılar. Paşa acıqlanıb iki yüz yaraqlı-yasaqlı adamla

Koroğluya hücum elədi. Koroğlu qılınc çəkib onların qabağına çıxdı. Xeyli vuruşdu, çox adam öldürdü. Paşanın adamları davam eləyə bilməyib qaçmağa üz qoydular. Paşa gördü yox, buna yüz, iki yüz qoşun kar salan deyil. Əmr elədi, bütün qoşun yeridi. Koroğlu şiri-nər kimi meydana girib gün batana kimi onlardan qırdı. Amma piyadalıq ona üz vermişdi. Vuruşa-vuruşa özünə yol açıb özünü Qırata çatdırmaq istəyirdi.

Bu burada mərdanə qılınc vurmaqda olsun, sənə kimdən deyim paşadan. Paşa gördü, beləliklə Koroğlu bu qoşunu qırıb qurtaracaq. Rum əhlinə hökm elədi, Koroğlunun yolunun ağzında bir quyu qazıb üstünü də örtsünlər. Koroğlu qılınc vura-vura qoşunu dağıdıb yol aça-aça Qırata tərəf gedəndə birdən-birə quyuya düşdü. Qoşun hər yandan tökülüb onun qollarını bağlayıb paşanın yanına gətirdilər. O saat paşa hökm elədi ki, Koroğlunun boynunu vursunlar. Vəzir irəliyə yeriyib dedi:

– Paşa sağ olsun, buna qoç Koroğlu deyərlər. Bunun Çənlibeldə yeddi min yeddi yüz yetmiş yeddi dəlisi var. Yeriyib Rum elini dağıdarlar. Koroğlunu hələlik zindana saldır. Görək başımıza nə gəlir.

Paşa vəzirin məsləhətinə razı olub Koroğlunu zindana saldırdı.

Koroğlu zindanda qalmaqda olsun, sənə Çənlibeldə dəlilərdən xəbər verim. Dəlilər çox gözlədilər Koroğlu qayıtmadı. Bildilər ki, dara düşüb. Çox fikirləşəndən sonra dalısınca adam göndərəsi oldular. Belə deyirlər ki, bir uzaq səfərə getmək lazım olanda özünə umudu gələn dəlilər öz aralarında püşk atardılar. Püşk hər kimə düşsə, o səfərə haman dəli gedərdi.

Bu dəfə də püşk atdılar. Püşk Əhmədnən Dəli Həsənə düşdü. Bəlli Əhməd çəkdi Ağcaquzunu yəhərlədi, Dəli Həsən də Düratı mindi, hər ikisi yaraxlandı, altdan-üstdən qurşanıb Ruma yola düşdülər. Aşırımlar aşdılar, keçirimlər keçdilər, özlərini Ruma yetirdilər. Dəlilər Ruma çatanda gecə idi. Hamı yatmışdı. At üstündə şəhərdə dolanırdılar. Bir də gördülər ki, bir yerdə bir xeyli yaraqlı adam keşik çəkir. Bəlli Əhməd soruşdu:

– Gecə vaxtı burda nə eləyirsiniz?

Keşikçilərdən biri dedi:

– Çənlibelli Koroğlu burada dustaqdı. Ona keşik çəkirik.

Dəli Həsən bu sözü eşidən kimi qılıncını çəkib, döşəndi bunlara. Keşikçilər davam gətirə bilməyib qaçıb dağıldılar. Dəlilər atdan düşüb özlərini zindana saldılar. Gördülər Koroğlu dardadı. Bəlli Əhməd götürdü görək nə dedi:

Dara düşübsən Koroğlu,
Yetişdik, budu yetişdik.
Hara düşübsən Koroğlu,
Yetişdik, budu yetişdik.

Aldı Koroğlu:

Yaxşı yetişdiz dadıma,
Bəlli Əhməd, Dəli Həsən.
Bəlkə çatam muradıma,
Bəlli Əhməd, Dəli Həsən!

Dəli Həsən:

Ağcaquzum şuqutmağa,
Düşman qanın axıtmağa,
Bu zindanı dağımağa,
Yetişdik budu yetişdik

Koroğlu:

Peymanamdı dolha-dolda,
Halqa zəncir bağlı qolda,
Məhbub, Şirin gözü yolda,
Bəlli Əhməd, Dəli Həsən!

Bəlli Əhməd:

Misri qılınclar toyladıq,
Dərin dəryalar boyladıq,
Keşikçiləri qoyladıq,
Yetişdik, budu yetişdik.

Koroğlu:

Koroğlu qaynayıb coşa,
Şeşpəri getməyə boşa,
Qaça qabağından paşa,
Bəlli Əhməd, Dəli Həsən!

Dəlilər Koroğlunun qollarını açıb, zindandan çıxartdılar. Koroğlu dedi:

– Gedək, Qıratı tapmaq lazımdı.

Deyirlər Koroğlu zindana düşəndə Məhbub xanımla Şirin xanım onun qılıncını, qalxanını gizlədib, Qıratı da ot-ələf verib saxlayırdılar.

Koroğlu dəlilər ilə Məhbub xanımın yanına gəldilər. Koroğlu Məhbub xanımı görəndə aldı, görək nə dedi:

Yolum düşüb Çənlibelə,
Məhbub xanım, Şirin xanım.
Geyin gedək bizim elə
Məhbub xanım, Şirin xanım,

Aldı Məhbub xanım:

De görək, bu nə səfərdi,
Ay Koroğlu, ay Koroğlu,
Paşa bundan bixəbərdi,
Bay Koroğlu, bay Koroğlu...

Koroğlu:

Qızıb çəkərəm haşanı,
İndi qılın tamaşanı,
Bir muy saymaram paşanı,
Məhbub xanım, Şirin xanım!

Aldı Şirin xanım:

Düşman səndən qisas alar,
Meydan açıb, qılınc çalar,
Axan qanlar axır olar,
Çay Koroğlu, çay Koroğlu.

Koroğlu:

Koroğlu mayıl saçına,
Gözəlliyin şux tacına.
Qarğalar neylər laçına,
Məhbub xanım, Şirin xanım!

Məhbub xanım:

Gözəllər qadanı ala,
Eşqin dəryasına dala,
Qorxuram əməyin ola,
Zay Koroğlu, zay Koroğlu!

Koroğlu ayağa qalxdı. Qılınc bağladı, qalxanını keçirdi. Qıratın belinə qalxdı. Dəlilər də atlandılar.

Koroğlu üzünü dəlilərə tutub dedi:

– Bu yolda iyidlik, mərdlik göstərmisiniz. Məhbub xanımı, Bəlli Əhməd, sənə, Şirin xanımı da, Dəli Həsən, sənə verirəm. Götürün gedək.

Bəlli Əhməd Məhbub xanımı Ağcaquzunun tərkinə, Dəli Həsən də Şirin xanımı Düratın tərkinə çəkib yola düşdülər. O tərəfdən keşikçilərdən salamat qurtaranlar özlərini paşaya yetirdilər, dedilər:

– Çənlibeldən iki atlı gəlmişdi. Koroğlunu da zindandan çıxartdılar.

Paşa hökm elədi. Qoşun gecə gözü atlandılar yola düşdülər. Koroğlu gördü qoşun yetişir, aldı görək nə dedi:

Misri qılınc alın ələ,
Siz o yandan, mən bu yandan,
Al qanı döndərək selə,
Siz o yandan, mən bu yandan.

Paşanın qəddini bükək,
Başlar kəsib yerə tökək,
Müxənnətə qılınc çəkək,
Siz o yandan, mən bu yandan.

Dönüm mərd iyid başına,
Gəldiz Koroğlu xoşuna,
Qan udduraq bu qoşuna,
Siz o yandan, mən bu yandan.

Söz tamam oldu. Üç nəfər özlərini qoşuna vurdular. Gecə vaxtı Koroğlu bir yandan, Bəlli Əhməd bir yandan, Dəli Həsən də bir yandan qoşunu qırmağa başladılar. Koroğlu hərdən nərə çəkib qılınc vuranda qoşun əhli qorxusundan ağacda yarpaq əsən kimi əsirdi. Axırda dəlilər qoşunu yarıb aradan çıxdılar. Məhbub xanım Bəlli Əhmədin, Şirin xanım da Dəli Həsənin tərkində üz Çardaxlı Çənlibelə qoydular.

# KOROĞLUYNAN BOLU BƏY

Xotkar bütün paşalara hökm eləmişdi ki, Koroğlunu ya öldürsünlər, ya diri tutub onun yanına göndərsinlər. Paşalar bu işdən yaman əl-ayağa düşmüşdülər. Camal paşanın da canını qorxu almışdı. Bir gün, beş gün fikir, xəyal, axırda bu gün qoşun sərkərdələrini başına yığıb məsələdən onları hali elədi. Koroğlunu tutmaq adı gələndə bütün sərkərdələr başlarını aşağıya saldılar. Camal paşa gördü yox, belə olmayacaq. Axırda əlacsız qalıb dedi:

– Kim gedib dəli Koroğlunun başını, ya da özünü gətirsə qızım Dünya xanımı ona verəcəm.

Sərkərdələrin içində Bolu bəy adlı birisi var idi. Bolu bəy çoxdan idi ki, Camal paşanın qızı Dünya xanımı almaq fikrində idi. Ancaq nə qədər xərc qoymuşdu, pul tökmüşdüsə də, qızın ürəyini ələ gətirə bilməmişdi. İndi işıq yeri görüb fürsəti fota verməyib yerindən qalxıb dedi:

– Mən gedib Koroğlunu tutub gətirərəm. Ancaq bu şərtlə ki, əzəl əhdinizə əməl eləyəsiniz. Sonra da Qəcəralını mənə yoldaş verəsiniz.

Qəcəralı Ərzincanda məşhur pəhləvanlardan idi.

Paşa razılaşdı.

– Qəcəralı!

Qəcəralı ayağa qalxıb dedi:

– Mən gedərəm, amma gərək mehtər Murtuzu da bizə qoşasınız.

Mehtər Murtuz yeddi il Koroğluya mehtərlik eləmişdi. Ona görə də Koroğlunu yaxşı tanıyırdı.

Bəli, Camal paşa bütün şərtlərə razı oldu. Bolu bəy Qəcəralı ilə Mehtər Murtuzu götürüb, başında da çoxlu qoşun, Çənlibelə yola düşdü. Bunlar getməkdə olsunlar, sizə kimdən xəbər verim, Koroğlunun dostu ərzincanlı bir tacirdən. Tacir bu əhvalatı eşidən kimi bir at mindi, kəsə bir yol ilə Bolu bəydən qabaq özünü Çənlibelə yetirdi. Elə ki, tacir Koroğlunu əhvalatdan xəbərdar eləyib geri döndü, Koroğlu dəliləri yığıb dedi:

– Paşalar, bəylər, xanlar mənim əlimdən zara gəlib, mənim qorxumdan gecələr evlərində yata bilmirlər. Heç inanmıram ki, Bolu bəy mənim üstümə gəlsin.

Dəlilərin içindən İsabalı yerindən qalxıb dedi:

– Koroğlu, nə qədər iyid olsan ehtiyatı əldən qoyma, ehtiyat ki var iyidin bəzəyidi. İzn ver yaraqlanaq, yasaqlanaq, düşmənin qabağına çıxaq.

Koroğlu razı olmadı. Məclis qurdurdu, dəlilər ilə yeyib-içib kefə başladı. O tərəfdən Bolu bəy başında qoşun gecə-gündüz at sürüb gəlib Çənlibelə yetişdi.

Mehtər Murtuz Koroğlunun Yağı qoruğunu görən kimi tanıdı. Dedi:

– Bolu bəy, bu qoruq Koroğlunun Yağı qoruğudu. Bura Koroğlunun oylağıdı. Bura Çənlibelin ətəyidi. Məni öldürsən də buradan o yana gedəsi deyiləm. Qorxuram, Koroğlu dədəmə od vurar.

Bolu bəy bir az fikirləşib əmr elədi ki, atdan düşsünlər. Bolu bəy, Qəcəralı, Mehtər Murtuz, qoşun əhli hamısı düşüb, atları Koroğlunun Yağı qoruğuna buraxdılar, özləri də bir tərəfdə oturub dincəlməyə başladılar.

Səhər tezdən idi. Koroğlu yasaqsız-yaraqsız Qoşabulağın altındakı qayanın yanına çıxmışdı. Bir də baxdı ki, bir bölük yəhərli-yüyənli at Yağı qoruğunu başına götürüb. Koroğlu elə oradan tay heç kəsə xəbərzad verməmiş Yağı qoruğuna yüyürdü. Qoruğa enəndə birdən-birə Bolu bəylə üz-üzə çıxdı. Bolu bəy Koroğlunun təhər-töhürünə baxıb dedi:

– Kimsən, burada nə gəzirsən?

Koroğlu dedi:

– Mən qoruqçuyam.

Bolu bəy dedi:

– Kimin qoruqçususan?

Dedi:

– Koroğlunun qoruqçusuyam. Qoruqda at gördüm, gəldim ki, çıxardım sizə rast oldum.

Bu sözdə Mehtər Murtuz gəlib çatdı. Mehtər Murtuz Koroğlunu görən kimi tanıdı. Dalı-dalı çəkilib Koroğlunun geri yanına keçdi. Oradan Bolu bəyə göz vurdu ki, evin yıxılsın. Yalan deyir, qoruqçu, zad nədi, Koroğlunun özüdü.

Bolu bəy hökm elədi, qoşun birdən tökülüb Koroğlunu tutdular. Koroğlunun nə atı, nə yanında bir yarağı-yasağı yoxdu. Baxdı ki, yox işlər şuluqdu. O, burada Koroğlu olduğunu boynuna alsa, səssiz-sədasız başını kəsəcəklər. Deyirlər ki, Koroğlu nə qədər iyid, mərd idisə, bir o qədər də əyyar idi. Yeri gələndə özünü başqa qılığa salıb düşməni aldadırdı. Bir də belə bir xasiyyəti var idi ki, düşmən əlinə düşəndə ölsə də, Koroğlu olduğunu boynuna almazdı ki, özünün, dəlilərin, Çənlibelin adı batmasın. Odu ki, indi də Bolu bəy onu nə qədər döydüsə

Koroğlu olduğunu boynuna almadı ki, almadı. Yaxında bir göl var idi, axırda Bolu bəy Koroğlunu o gölə saldırdı ki, bəlkə Koroğlu olduğunu boynuna ala. O yenə də Koroğlu olduğunu boynuna almadı. Axırda Bolu bəy şübhəyə düşdü ki, bəlkə elə doğrudan da bu, Koroğlu deyil.

Bolu bəy düşdü fikrə ki, uzaq yerdən gəlmişik. Bunu aparrıq Koroğlu olmaz, paşanın yanında yalançı çıxıb biabır olarıq. Axırda üzünü ona tutub dedi:

– Gəl sən xoşluqla boynuna al ki, Koroğlusan. Yoxsa bu saat səni öldürrəm.

Belə deyəndə aldı Koroğlu görək nə dedi:

Bolu, nahaq gəl, eyləmə yamanlıq,
İnan Bolu, mən Koroğlu deyiləm.
İnnən belə yaxşılığın günüdü,
İnan Bolu, mən Koroğlu deyiləm.

Koroğlu bir iyid, əsli, zatı var,
Həm namusu, arı, həm qeyrəti var,
Dəmir cilov altda Ərəbatı var,
İnan Bolu, mən Koroğlu deyiləm.

Gəl sənə söyləyim ay Qəcəralı,
Hələ eşitməyib qoç İsabalı,
Gəlsə bu qoşuna verməz məcalı,
İnan Bolu, mən Koroğlu deyiləm.

Koroğlu deyiləm, yırtma yaxanı,
Ciyərimi eşq oduna yaxanı,
İyidin olmazmı qılınc, qalxanı,
İnan Bolu, mən Koroğlu deyiləm.

Koroğlu dediyin bir bəl-bəllidi,
Çənlibeldə dövran quran dəlidi,
Öz adım Rövşəndi, atam Alıdı,
İnan Bolu, mən Koroğlu deyiləm.

Bolu bəy Mehtər Murtuzu yanına çağırıb dedi:

– Sən deyirdin bəs bu Koroğludu, bu ki, Koroğlu deyilmiş.

Qəcəralı bir tərəfdən Murtuzun üstünə düşdü ki, sən bizi aldadırsan. Murtuz dedi:

– Əyər Koroğlu bir isə, siz axtardığınız da o isə, Koroğlu budu.

Bolu bəy ağzından köpük daşlana-daşlana əmr elədi ki, qoşun atlanıb yola düşsün. Koroğlu gördü ki, yox, bunu aparacaqlar. Başını qaldırıb dedi:

– İndi sən məni aparıb paşaya verəcəksən ki, guya mən Koroğluyam, sən də məni tutubsan?

Bolu bəy:

– Bəs necə?

Koroğlu gülüb dedi:

– Yaxşı sənin ağlın yoxdu, bu adamın sözünə inanırsan. Paşanın da ağlı yoxdu, ya mənim dilim yoxdu ki, onu başa salım. Niyə paşa kordu ki, mən yaraqsız-yasaqsız bir adamam. Qoç Koroğlunu belə asanlıqla tutmaq olmaz? Hamısını açıb paşaya deyib səndən şikayət eliyəcəyəm.

Bolu bəy qaldı məhəttəl ki, bunların hansına inansın. Axırda Koroğlunun sözlərinə inanıb əmr eləyib onun əllərini açdırdı. Sonra üzünü ona tutub dedi:

– Deyirlər dəli Koroğlu çox mərddir, heç bir şeyi gizlədən deyil. İndi olan oldu, keçən keçdi. Əllərin də açıqdı. İndi düzünü de görək sən kimsən? Bu boy, heç qoruqçu boy-buxununa oxşamır.

Koroğlu dedi:

– İndi ki, belə adam kimi soruşursan, bəli, mən Koroğluyam.

Bolu bəy ayağa qalxmaq istəyəndə Koroğlu dedi:

– Dayan, sən tay məni tuta bilməzsən. Ancaq de görüm məni niyə aparırsan?

Bolu bəy dedi:

– Ərzincanlı Camal paşa əhd eləyib ki, hər kim Koroğlunu tutub onun yanına aparsa, öz qızını o adama versin. İndi mən səni aparıram ki, Camal paşanın qızı Dünya xanımı alım.

Koroğlu dedi:

– Mən Koroğluyam. Özüm də dediyimi eləyənəm. İndi ki, sən o qıza aşiqsən, qoy gedim yarağımı götürüm, atımı minim gəlim, apar məni paşaya təhvil ver, qızı al.

Koroğlu özünü Çənlibelə yetirdi. Qılınc qurşadı, qalxan götürdü, əmud asdı, nə dəlilərə, nə xanımlara bir söz deməyib, Qıratı minib birbaşa Bolu bəyin yanına gəldi. Elə ki, yetişdi dedi:

– Bolu bəy, mən verdiyim vədəyə doğru çıxıb gəlmişəm.

Ancaq səninlə bir şərtim var. Sən məni tutmuşdun. İndi də ki, mən səninlə gedirəm. Sonra elə bu sənin qulağında qalar. Elə bilərsən ki, guya doğrudan da məni tuta bilərsən.

Gəl qabaqca səninlə bir vuruşaq, dava eləyək. Sonra haraya desən gedək. Özü də sinəmə üç xana söz gəlib, onu deyim sonra dava eləyək.

Aldı Koroğlu, görək nə dedi:

Əli beldə durub əmr eylərdin
Koroğlunu tutan günlər necoldu?
Hərdən-hərdən asıb kəsin söylərdin,
Koroğlunu tutan günlər necoldu?

Deyirdin zamana gedəcək belə,
Uymuşdun şeytana, fitnəyə, felə,
Hərdən hökm eləyib basırdın gölə,
Koroğlunu tutan günlər necoldu?

Çənlibeldə dövran quran dəliyəm,
Hədyan sözə çox çətindi əyiləm,
Yeddi min dəlinin kəltə kəliyəm,
Koroğlunu tutan günlər necoldu?

Koroğluyam, müxənnətə uymaram,
Qısasımı qiyamətə qoymaram,
Düşmənin qanından içsəm doymaram,
Koroğlunu tutan günlər necoldu?

Koroğlu acıqlanmışdı. Elə acıqlanmışdı, elə coşmuşdu ki, bilmirdi Bolu bəyə nə desin. Ondan hayıfını necə alsın. Yenə də götürdü görək nə dedi:

Hay-hay deyib qənim üstə varanda,
Kəllə gərək bu meydanda qalansın.
Mərd iyidlər qovğa günü düşəndə
Şərbət deyə öz qanına yalansın.

Qaldırram meydanın göyə tozunu,
Çıxardaram yamanların gözünü,
Gərək görəm Dünya xanım üzünü,
Ömür təzələnsin, can cilvələnsin.

Koroğluyam, gədikləri busaram,
Qancırqadan qanlı başlar asaram,
Bolu bəy, sənə bir qılınc basaram,
Bağırsağın cəmdəyinə dolansın.

Koroğlu sözünü tamam eləyib Qıratı cövlana gətirdi. Misri qılıncı çəkib qoşuna cumdu. Qoşun əhli ha eləyib əl-ayaq açana kimi Koroğlu sağdan vurdu, soldan çıxdı, soldan vurdu, sağdan çıxdı. Qoşunu qatım-qatım qatlayıb əldən saldı. Düşmən dağılıb qaçmağa başladı. Koroğlu Qıratı dallarından salıb özünü Qəcəralıya yetirdi, bir əmud vurub onu atdan yerə saldı. Bir də baxdı ki, Bolu bəy aranı şuluq görüb əkilmək istəyir. Tez özünü ona yetirib, itələyib atdan saldı, düşüb dizinin altına aldı. Götürdü görək nə dedi:

Qollarını bağladaram,
Bolu, mən sənin, mən sənin!
Anacığın ağladaram,
Bolu, mən sənin, mən sənin!

Gözlərinə kül qoyaram,
Ovucuna pul qoyaram,
Nişanlını dul qoyaram,
Bolu, mən sənin, mən sənin!

Mərd iyidlərin gözüyəm,
Dəlilərin əziziyəm,
Bəbir oğlunun özüyəm,
Bolu, mən sənin, mən sənin!

Qızıb sinənə çökərəm,
Əlif qəddini bükərəm,
Üstünə alov tökərəm,
Bolu, mən sənin, mən sənin!

Koroğluyam, iş bitirrəm,
Səni dünyadan itirrəm,
Başın bədəndən götürrəm,
Bolu, mən sənin, mən sənin!

Koroğlu sözünü tamam eləyib Bolu bəyin sinəsinin üstündən durdu, dedi:

– İndi mən sənin ixtiyarındayam. Paşanın yanına necə istəyirsən, elə apar.

Bolu bəy güclə ufuldaya-ufuldaya yerindən qalxdı. Adamları ilə bir təhər köməkləşib Qıratın üstündə Koroğlunun qollarını geri yanında möhkəm bağladılar. Götürüb yola düşdülər.

Ərzincan dağlarını aşıb şəhərə yaxınlaşdılar. Bolu bəy fikir eyləyib öz-özünə dedi. Koroğlunu belə sağ-salamat Camal paşanın yanına aparsam, mənim onu dalaşsız-davasız tutub gətirməyimə inanmayacaq, paşanı inandırmaq üçün gəl onu yarala. Yavaşca göz-göz vurub Koroğlunun geri yanına keçib birdən onun başına bir qılınc vurdu. Qolları bağlı Koroğlunu qan götürdü. Odu ki, tutduğu işdən peşiman oldu. Bolu bəyi öldürmədiyinə heyifsiləndi. Ancaq iş-işdən keçmişdi. Bu dar zamanında Çardaxlı Çənlibel, dəlilər, Nigar xanım yadına düşdü. Aldı görək nə dedi:

Qarşı yatan qarlı dağlar,
Dağlar, səndə qarım qaldı!
Əlim yetməz, ünüm çatmaz,
Dal budaqda narım qaldı!

Məni tutdu Bolu bəylər,
Ağır zəncir boynum əylər,
Hamı bir-birindən yeylər,
İyid dəlilərim qaldı!

Məni tutdu qəm əcəli,
Öldürər verməz macalı,
Hayıf qırmadım Qəcəri
Sinəmdə dağlarım qaldı!

Canım Qırat, gözüm Qırat!
Səni minən alar murad,
Ağcaquzu, bir də Dürat
Bağlı bədöylərim qaldı!

Yaxşıdı iyidin varı,
Namusu, qeyrəti, arı.
Nigar qoç Koroğlu yarı,
Nigar kimi yarım qaldı!

Gəlib yetişdilər Ərzincana. Bolu bəy Koroğlunu birbaş apardı Camal paşanın yanına. Təbil vuruldu, bütün aləm imarətin qabağına yığıldı. Camal paşanın qızı qara gözlü, şirin sözlü, alma yanaqlı, yaqut dodaqlı Dünya xanım qulluqçusunu çağırıb nə səs-küy olduğunu soruşdu. Qulluqçu gözlərini süzə-süzə dedi:

– Xanım, sənə qurban olum, tay bundan artıq nə olacaq? Bolu bəy qoç Koroğlunu tutub qolu bağlı paşanın hüzuruna gətirib. İnşəallah bir neçə günə kimi toyundu.

Bu sözü eşidən kimi dünya-aləm Dünya xanımın gözlərində qaraldı. Dünya xanımın Bolu bəydən zəndeyi-zəhləsi gedirdi. Deyirdi ki, iti görüm, pişiyi görüm, onun mürdəşir yumuş üzünü görməyim. İndi birdən Koroğlunun tutulduğunu eşitdi, ürəyi elə sıxıldı, elə sıxıldı ki, bilmədi nə eləsin. Ancaq qızlar başa düşməsinlər deyə durub yeddi qələmlə özünə zinət verdi.

Qırx incəbel qızını da yanına alıb Koroğluya tamaşa eləməyə getdi.

Bəli, Camal paşaya xəbər çatdı ki, bəs qızın Dünya xanım izn istəyir. Camal paşa rusxat verdi, məclisin bir tərəfində bir pərdə çəkildi. Dünya xanım öz qırx incəbel qızı da başında gəlib pərdənin dalında əyləşdi. Qolları bağlı, başı yaralı Koroğlunu da Camal paşanın qabağında saxlamışdılar. Dünya xanım baxdı ki, vallah bu bir iyid oğlandı ki, Bolu nədi heç min nəfər Bolu kimi adam olsa onu tuta bilməz. Öz-özünə dedi: – “Aşna, bu heç belə deyil ki, belə olsun. Bu Bolu girən kol deyil. Bolunun mən dabbaxda gönünü tanıyıram. Burada yəqin bir fırıldaq var”. Amma tay bir söz deməyib yerindəcə oturdu ki, görsün işin axırı necə olacaq. Amma Bolu bəyin kefi o necə deyərlər, lap itə hürürdü. Bir yellənə-yellənə gəlib dolanırdı ki, ətəkləri göz çıxardırdı.

Camal paşa düşmüşdü fikir dəryasına ki, nə eləsin. Bilmirdi Koroğlunun özünü xotkarın hüzuruna göndərsin, ya öldürüb başını göndərsin. Çox fikir, xəyaldan sonra bu qərara gəldi ki, hələlik Koroğlunu zindana salıb xotkara namə göndərib onu işdən xəbərdar eləsin.

Koroğlunu gətirib Dünya xanımın imarətinin qabağında bir quyu var idi, saldılar oraya.

Bəli, elə ki, Koroğlunu quyuya saldılar. Bolu bəy Camal paşanın yanına gedib zəmin-ədəb öpəndən sonra dedi:

– Paşa sağ olsun! Qoç Koroğlunu diri-diri tutub gətirdim. Xotkarın yanında sənin üzünü ağ, başını uca elədim. İndi “ələhdi minəlvəfa”, verdiyin vədəyə əməl elə!

Paşa dedi:

– Bolu bəy, sözüm sözdü, qızım Dünya xanım sənindi. Ancaq qoy görək qasid xotkardan nə xəbər gətirir. Sonra toy tədarükünə başlayarıq. Sənə elə bir toy eləyəcəyəm ki, ruzigarın gözü belə toy görməmiş olsun.

Bolu bəy Camal paşanın sözündən arxayınlayıb toy tədarükündə olsun, sənə kimdən xəbər verim, Dünya xanımdan. Dünya xanım axır Bolu bəyi istəmirdi, hər nə qədər eləyirdisə, ürəyi ona yapışmırdı ki, yapışmırdı. Onu görəndə elə bil gözünə tikan batırdı. O elə güman eləmişdi ki, qoç Koroğlu onu öldürər. Yaxası onun əlindən qurtarar. İndi də ki, vurdu, belə oldu. Deyir sən saydığını say, gör fələk nə sayır. Kimin ağlına gələ bilərdi ki, Bolu bəy gedib Koroğlunu tutub gətirəcək. Odu ki, yazıq qız dizlərini qucaqlayıb qəm dəryasına qərq olmuşdu.

Çox fikir-xəyaldan sonra gördü ki, onun bircə nicat yolu var. O da odu ki, Koroğlu xilas olsun. Çünki Dünya xanım yəqin-əlyəqin bilirdi ki, burada bir hiylə var. Əyər qoç Koroğlu xilas olsa bu heyfi Boluda qoymayacaq. Onda da ki, Dünya xanımın canı Bolu bəyin mürdəşir yumuş üzündən qurtarar.

Bəli, Dünya xanım bu fikirlə o qədər gözlədi ki, qaranlıq düşdü. Dünya xanım yavaşca ayağa durdu, başdan geyinib ayaqdan qıfıllandı, ayaqdan geyinib başdan qıfıllandı. İmarətdən çıxıb özünü verdi quyunun başına. Koroğlu qalmışdı quyuda.

Dünya xanım bir ip salladı ki, bəs bağla belinə çəkim, səni çıxardım. Koroğlu elə ki, ip sallayanın Dünya xanım olduğunu bildi, gülüb dedi:

– Ay Dünya xanım, səndə o güc, hünər hardaydı ki, məni çəkib buradan çıxarda biləsən.

Qərəz, uzun baş ağrısı olmasın, Dünya xanım bir az yeməkdən, içməkdən ipə bağlayıb quyuya salladı. Özü də soruşdu ki:

– Bəs bir adamın varmı ki, dalınca gələ?

Koroğlu dedi:

– Dünya xanım, mənim dalımca gəlsə ya Eyvaz gələr, ya Dəmirçioğlu, ya Dəli Həsən, ya da ki İsabalı.

Dünya xanım oradan yavaşca qayıdıb evə gəldi. Sabahısı mehtəri yanına çağırıb, ovcuna bir çəngə qızıl basıb tapşırdı ki, Qıratdan yaxşı muğayat olsun. Beləliklə, mehtər Qıratdan, Dünya xanım özü də ki, Koroğludan muğayat olmağa başladılar.

Bunlar burada qalmaqlarında olsunlar, sənə Çənlibeldə dəlilərdən xəbər verim. Dəlilər bir gün gözlədilər Koroğlu gəlmədi, iki gün gözlədilər Koroğlu gəlmədi. Üçüncü günü bir yerdə yığıldılar ki, görən bu haraya getdi.

İsabalı dedi:

– Tacirin sözü gerçək imiş. Yəqin Bolu bəy gəldi, Koroğlunu tutub Ərzincana apardı.

İsabalı bunu söyləyib ayağa qalxdı. Üzünü dəlilərə tutub dedi:

– Bugün bir iyid istərəm,
Varsam, vara mənim ilə.
Qərib qürbət yad ölkədə
Qalsam, qala mənim ilə.

Koroğlunun yox əlacı,
Misirdən alır xəracı,
Düşmənə əyri qılıncı
Çalsam, çala mənim ilə.

İsabalı, ver öyüdü,
Körpə ikən əy söyüdü,
Koroğlu kimi iyidi
Bulsam, bula mənim ilə.

Dəlilər dedilər:

– Biz onun dalınca gedən deyilik. Qoy harada qalır, qalsın. Özü yaxşı bilir ki, paşaların, bəylərin hamısı ona yağıdı. Bir fürsət axtarırlar ki, tutsunlar. Yanına yoldaş götürməmiş, gedəcəyi yerin səmtini, sorağını deməmiş niyə çıxıb gedir!?

Dəlilər acıq eləmişdilər. İsabalı gördü ki, dəlilər acıq eləyiblər, tay bir söz deməyib, özü ayağa qalxdı. Yaraqlanıb, çəkdi Düratı yəhərlədi. Mindi, tək-tənha Koroğlunu axtarmağa getdi. Gecəni gündüzə qatdı, gündüzü gecəyə, o necə deyərlər, az getdi, üz getdi, dərə təpə düz getdi, axır gəlib Ərzincana yetişdi.

İsabalı şəhərə çatanda səhər tezdən idi, hələ dükanlar bağlı idi. Göz gəzdirdi, gördü meydanın aşağı tərəfində bir əllaf dükanını yenicə açır. Baxdı ki, dükanda çoxlu arpa çuvalları var, heç nırxını xəbər almamış çuvalın bir böyüyünü götürüb Düratın qabağına qoydu.

Dükançı dedi:

– Ay qoçaq, çəkdirib qədərini bilməmiş, pulunu verməmiş arpanı atına niyə yedirirsən?

İsabalı dedi:

– Qədərini bilmək nədi? Pul nədi? Mən indiyə kimi arpaya pul verməmişəm, indimi verəcəyəm?

Dükançı gördü yox, bu pul-zad verən deyil. Çuvalın bir qulpundan yapışıb atın qabağından çəkmək istədi. İsabalı dedi:

– Arpanı götürmə, at damağ olar.

Dükançı əl çəkmədi. Axırda İsabalı ona bir sillə hərlədi, dükançının ayağı başından aşdı. Qalxmaq istəyəndə bir sillə də elə vurdu ki, dükançının səsi xırp kəsildi, özündən gedib düşdüyü yerdə qaldı. İsabalı ayağını onun sinəsinə qoyub istədi çəksin cücə boğazı kimi boğazını üzüb atsın, ona kimi dükanını yenicə açmış dükançılar töküldülər, yalvar-yapış eləyib dükançını onun əlindən aldılar.

Dünya xanım çoxdan yol gözləyirdi.

İsabalını görüb təhr-töhründən yəqin elədi ki, bu Koroğlunun dəlilərindədi, dedi:

– Ey oğlan, kimsən? Hardan gəlib hara gedirsən? Kimi axtarırsan?

Dünya xanımın cavabında aldı İsabalı görək nə dedi:

Nə xan gördüm burada, nə də bir paşa,
Verə Koroğludan mənə bir xəbər.
Yağı düşmənləri bağladım daşa,
Verə Koroğludan mənə bir xəbər.

Ac qurd mənəm, qənim üstə ularam,
Müxənnəti öz qanına bularam,
Qılınc çəkib ölkəsini talaram,
Verə Koroğludan mənə bir xəbər.

Olan yoxdu mənim dərdimdən halı,
Heç başımdan getməz onun xəyalı,
Koroğluya qurban qoç İsabalı,
Verə Koroğludan mənə bir xəbər.

Dünya xanım dedi:

– Sən axtaran Koroğlu buradadı. Mən çoxdandı ki, səni gözləyirəm. Düş atını tövləyə çək, özün də içəriyə gəl.

İsabalı gördü Dünya xanım doğrudan da tərifli gözəldi. Heç keçiləsi deyil. Düşdü, atını tövləyə çəkdi, gördü Qırat da bu tövlədə bağlanıbdı. Koroğlu tərəfdən ürəyi bir az arxayınlaşdı. Qayıtdı Dünya xanımın

yanına gəldi. Dünya xanım yemək, içmək gətirdi. İsabalı yedi, içdi, başını Dünya xanımın dizi üstünə qoyub yatdı. O tərəfdən İsabalının vurduğu dükançı özünə gəldi. Qalxdı birbaş getdi Camal paşanın yanına ki, bəs Koroğlunun buraya bir dəlisi gəlib çıxıb, dükanı-bazarı dağıtdı az qalmışdı ki, məni də öldürə, qaçıb əlindən qurtardım.

Camal paşa hökm elədi. Qoşun atlanıb yolları, bəndləri, bərələri kəsdi. Dünya xanım işdən xəbər tutdu. İstədi İsabalını işdən hali eləsin. Baxdı ki, İsabalı çox ağır yatıb, belə şeylərlə oyanası deyil. Onda aldı, görək nə dedi:

Yağı düşmən dörd bir yanı alıbdı,
Oyan əcəm oğlu, dur get bu yerdən!
Sənin dərdin bu canımda qalıbdı,
Oyan əcəm oğlu, dur get bu yerdən!

Dünya xanımın səsinə İsabalı yuxudan oyanıb gördü qız ağlayır, aldı görək Dünya xanımın cavabında nə dedi:

Ağlama, ağlama, ay Dünya xanım,
Ölər əcəm oğlu, getməz bu yerdən!
Sənə qurban olsun bu şirin canım,
Ölər əcəm oğlu, getməz bu yerdən!

Dünya xanım:

Hay-hay deyib gədiklərə yatandı,
Comərd düşmənləri atdan atandı,
Bolu bəydi, Koroğlunu tutandı,
Oyan əcəm oğlu, dur get bu yerdən!

İsabalı:

Hay-hay deyib tövlələrdə yatandı,
Hansı düşmənləri atdan atandı?
Koroğlunu al dil ilə tutandı,
Ölər əcəm oğlu, getməz bu yerdən!

Dünya xanım:

Çoxdu aralıqda mənim yamanım,
Sənnən ayrı göyə çıxar amanım,
Sənə qurban olsun bu Dünya xanım,
Oyan əcəm oğlu, dur get bu yerdən!

İsabalı:

İyid gərək qürbət eldə yaslana,
Çətin Misri qılınc qında paslana,
Min tülkü neyləyər bir ac aslana?
Ölər əcəm oğlu, getməz bu yerdən!

Sözləri tamama yetişdi. İsabalı Dünya xanıma ürək verib dedi:
– Dur gedək, Koroğlunun saxlandığı yeri mənə göstər.
İsabalı Dünya xanımla Koroğlu olan quyunun başına gəldi. Hələ quyuya çatmamışdılar ki, İsabalı gördü bir oxumaq səsi gəlir. Huşkuşla qulaq verib, gördü Koroğlu quyudan bu səsləri oxuyur:

Uca dağların başından
Yolum ay mədət, ay mədət!..
Yaman yerdə tutdu məni
Ölüm, ay mədət, ay mədət!..

Belimdə yoxdu qılıncım,
Müxənnətə çatmır gücüm,
Nə yorğan var, nə də cecim,
Zülüm, ay mədət, ay mədət!..

Hanı nizəm, hanı atım?
Kəsildi şanı-şövkətim,
Çənlibel kimi sərhəddim,
Elim, ay mədət, ay mədət!

Sinəm odlandı köz kimi,
Miskin olarmı biz kimi?
Dada yetə Eyvaz kimi
Dəlim, ay mədət, ay mədət!..

Altıma döşərdim xalı,
Yoxdu mənim kimi dəli,
Bu günümdə İsabalı
Gəlimi, ay mədət, ay mədət!..

İsabalı dedi:
– Koroğlu, qəm çəkmə, yetişdim.

İsabalı kəməndini açdı, quyuya salladı. Koroğlu kəməndin ucunu belinə bağlayıb tərpətdi. İsabalı ilə Dünya xanım çəkdilər, Koroğlunu quyudan çıxartdılar. Koroğlu İsabalı ilə qolboyun oldu, görüşüb, öpüşdü.

İsabalı dedi:

– Koroğlu, öpüşmək vaxtı deyil, qoşun hər yanı kəsib, tez ol görək nə eləyirik.

Koroğlu ilə İsabalı özlərini atlara yetirdilər. Koroğlunun qılıncını, qalxanını gətirib verəndə Koroğlu dedi:

– Dünya xanım, səni burda qoyub getməyəcəyik. Hazırlaş, qiymətdə ağır, çəkidə yüngül nəyin var götür, bizinən gedək.

Dünya xanım mehtərə dörd at yəhərlədib çəkdirdi. Nə ki qiymətli şeyləri vardı, xurcunnara doldurub atların üçünə yüklədilər. Atın birinə də Dünya xanım özü mindi.

Koroğlu baxdı ki, hər tərəf kəsilib, aldı görək nə dedi:

Misri qılınc, ləzgi qəmə
Mən səni tər saxlamışam,
Dolaşma cübbə-coşana
Düşmənə var saxlamışam!

Comərdlərə yaxınaram,
Xəndək oxdan saxınaram,
Min igidə təpinərəm,
Canda hünər saxlamışam!

Dolandım qürbət ellərdə,
Tərifim gəzdi dillərdə,
Çardaxlı Çənlibellərdə,
Əsrəmiş nər saxlamışam!

Qoç Koroğlu elər xəta,
İndi sən bax bu busata,
Canım qurban Ərəbata,
Oynar, kişnər saxlamışam!

Koroğlunun nərəsini eşidəndə qoşun əhlinin canına lərzə düşdü. Koroğlu bir yandan, İsabalı bir yandan, düşmənə hücum elədilər. Bir vurhavur oldu ki, ruzigarın gözü hələ belə vurhavur görməmişdi. Düşmən davam gətirə bilməyib qaçmağa üz qoydu. Axır ki, Koroğlu,

İsabalı, yanlarında da Dünya xanım Ərzincandan çıxıb, Çənlibelə tərəf yol başladılar. Bir qədər getmişdilər ki, bir də Koroğlu gördü dallarınca bir bölük atlı gəlir. Koroğlu dedi:

– İsabalı siz gedin, mən qayıdım bunların cavabını verim.

Bunu deyib Koroğlu geri döndü. Bir dəli nərə çəkib özünü qoşuna vurdu. Qıratı sürüb əlində Misri qılınc onların canına düşdü. O ki, qırmalı idi qırdı. Üstəlik bir dəstə atlını da əsir eləyib Qıratın qabağına qatdı. Gəlib İsabalıgilə çatdı. Baxdı Mehtər Murtuz da bu atlıların içindədi. Onu İsabalıya göstərib dedi:

– Bələdçilik eləyib məni tutduran bu idi.

İsabalı istədi ordaca Murtuzun işini tamam eləsin. Koroğlu qoymadı, dedi:

– Əliboş gedərik. Bunları Çənlibelə töhfə aparaq.

Əsirlər də qabaqlarında gəlib Çənlibelə yaxınlaşdılar. Elə ki, dağlar Koroğlunun gözünə göründü, aldı görək nə dedi:

Bir zamanlar səfa sürüb gəzərdim,
Onda səndin mənim qardaşım, dağlar!
Nə zaman ki, yağı düşman gələndə
Səndə çox olurdu savaşım, dağlar!

Taladım şahları, hələ az dedim,
Türfə gözəllərə işvə, naz dedim,
Neçə tacir, tüccar səndə gizlədim,
Açmadın sirrimi, sirdaşım, dağlar!

Koroğluyam, gəzdiyimi tapırdım,
Qayalar başında qala yapırdım,
Ağ süfrədən əmlik quzu qapırdım,
Yeyib qurtlar ilə ulaşım, dağlar!

Koroğlu sözünü tamam elədi.

O tərəfdən dəlilər Koroğlunun gec gəldiyini görüb dalınca gəlirdilər ki, birdən yolda qabaqlaşdılar. Görüşüb öpüşdülər, bərabər Çənlibelə qayıtdılar. Yol yorğunluqları çıxdı. Bir yaxşı məclis qurub toy elədilər. Dünya xanımı İsabalıya verdilər.

# Həmzənin Qıratı aparması

Bolu bəyin başına gələn iş bütün paşaları, xanları, bəyləri qorxuya salmışdı. Ta elə ki, gecələr yata bilmirdilər. Qoç Koroğlunun adı gələndə qorxudan siçan deşiyi axtarırdılar ki, gizlənsinlər.

Xotkar özü də qorxuya düşmüşdü. Odu ki, yenə bütün paşalara namə göndərmişdi ki, kim Koroğlunu tutsa, ya öldürsə onu dünya malından qani eyləyəcək, özünü də böyük mənsəbə çatdıracaq.

Toqatlı Mahmud paşa xotkarın bu naməsini alıb oxuyandan sonra, bir məclis qurdurdu, vəzirləri, vəkilləri, bəyləri, xanları, tacirləri o məclisə çağırtdı. Adamlar cəm olanda Mahmud paşa üzünü onlara tutub dedi:

– Koroğlu getdikcə günü-gündən tuğyan eləyir. Belə getsə çox çəkməz ki, bizi də Camal paşanın gününə salıb yerimizdə turp əkəcək. Sizi buraya cəm eləməkdə məqsədim budu ki, deyin görək necə eləyək ki, bu bəlanı başımızdan dəf eləyək.

Vəzirlər, vəkillər dedilər:

– Paşa sağ olsun, Koroğlunun nə ki hünəri var, hamısı Qıratdadı. Gərək Qıratı ələ keçirək.

Paşa dedi:

– Qıratı ondan necə almaq olar?

Vəzir dedi:

– Nəmər, pul, mal versəniz bəlkə özünə umudu gələnlərdən biri gedib Koroğlunun Qıratını gətirə bilə.

Mahmud paşa dedi:

– Mənim yurduma, yuvama sahib olan, gözümün ağı, qarası bir qızım var. Hər kim gedib Çənlibeldən Koroğlunun Qıratını gətirsə, qızım Dona xatunu ona verib, özünü də dünya malından qəni edərəm.

Mahmud paşa bunu deyib, bir cam şərab doldurub əlinə aldı, üzünü məclisdəkilərə tutub ucadan bir də dedi:

– Kimin özünə gümanı gəlir ayağa dursun, alsın bu şərabı içsin, getsin Koroğlunun Qıratını gətirsin.

Məclis əhli hamısı başını aşağı tikdi. Cıqqırtısını çıxardan olmadı. Mahmud paşa bir də dedi. Yenə səs çıxardan olmadı. Məclisin alt tərəfində Həmzə adlı sayılmayan, urvat olunmayan bir keçəl oturmuşdu. Ayağa qalxıb dedi:

– Paşa sağ olsun, əyər razı olub vədənizə doğru çıxsanız, mən gedərəm, Koroğlunun Qıratını gətirərəm.

Keçəl Həmzə bu sözü deyəndə məclisdəki adamlar çaxnaşıb bir-birinə dəydilər. Hamı keçəldəki bu cürətə mat-məhəttəl qaldı. Mahmud paşanın qızı Dona xatun pəncərənin ağzında durub buna qulaq asırdı. Gülüb özü-özünə dedi:

– Mən ölüm, qoç Koroğlunun Qıratını gətirənə bir bax. Gedib başının keçəlinin dərdini çəkmir, gör nə qələtlər eləyir.

– Mahmud paşa sözünü bir də təkrar elədi. Yenə də keçəl Həmzədən savayı gedirəm deyən olmadı. Mahmud paşa axırda çarəsiz qalıb razı oldu. Keçəl Həmzə irəli yeridi, aldı şərabı içdi, dedi:

Mahmud paşa, mənə bir ay vədə ver. Koroğlunun Qıratını gətirə bilmədim, heç, gətirə bildim, onda sözümüz sözdü.

Mahmud paşa dedi:

– Get, gətirə bilsən Dona xatun sənindi.

Keçəl Həmzə ordan çıxıb, evlərinə gəldi. Bir parça çörək götürüb bir dəsmal ilə belinə bağlayıb yola düşdü. Pay-piyada, günə bir mənzil neçə gündən sonra xəbər ala-ala gəlib Çənlibelə çıxdı.

Keçəl Həmzə gəlməkdə olsun, sənə kimdən xəbər verim, Koroğludan.

Koroğlu bir qayanın başında durub yola baxırdı. Gördü ki, bir adam budu üz qoyub Çənlibelə gəlir. O qədər gözlədi ki, keçəl Həmzə gəldi, yetişdi. Koroğlu qayadan enib, onu qabaqladı ki:

– Oğul, nəçisən? Haradan gəlib, haraya gelirsən?

Keçəl Həmzə dedi:

– İlxıçıyam. Paşanın atına gedirdim. Yeddi il ona at otardım, axırda haqqımı da verməyib, qapısından qovaladı. İndi Çənlibeldə səni deyib gəlmişəm. Əl mənim, ətək sənin, gərək məni dolandırasan.

Koroğlu keçəl Həmzəni götürüb Çənlibelə gəldi. Dəlilər Həmzəni görüb dedilər:

– Ay Koroğlu, bunu haradan tapıb gətirdin! Keçəllər fəndgir olurlar. Bunun gözləri üçtəpə sağsağanının gözləri kimi qayır-qayır qaynayır. Heç əməlli adama oxşamır. Rədd elə, getsin.

Xanımlar da dəlilərin sözlərini təsdiqlədilər.

Koroğlu xanımları, dəliləri bir təhər sakit eləyib, dedi:

– Görürsünüz yazığın birisidi. Sizə nə eləyəcək. Qoyun süfrəmizin qırıq-quruğundan yeyib, qapıda, bacada dolansın.

Keçəl Həmzə qırıx-quruxdan yeyib, qapı-bacanı süpürürdü. Xanımlar, dəlilər nəyə buyururdularsa gedirdi. Getdiyi işi də yaxşı yarıdırdı. Belə zirəkliyinə görə dəlilərin, xanımların yanında keçəl Həmzənin hörməti artdı.

Koroğlu keçəl Həmzənin diribaşlığını görüb, onun adını dəyişdirib Kaloğlan qoydu.

Günlərin bir günü Koroğlu keçəl Həmzəni yanına çağırıb soruşdu:

– Kaloğlan, ata muğayat ola bilərsənmi?

Keçəl Həmzə dedi:

– Əlimdən gələr, yaxşı baxa bilərəm.

Töylədə bir yük yabısı var idi. O qədər yükləmişdilər ki, sümükləri çıxmışdı. Koroğlu ona baxmağı keçəl Həmzəyə tapşırdı. Keçəl Həmzə yabıya muğayat olmağa başladı.

Axşam tumarlayır, səhər tumarlayır, yabıya bir can yandırırdı ki, gəl görəsən.

Dəlilərin gözlərini oğurlayıb, töylədəki o biri atların otundan, arpasından götürüb yabının qabağına tökürdü. Yabı elə kökəlmişdi ki, dərisinə sığmırdı. Bir gün Koroğlu töyləyə atların yanına gəlmişdi. Yabıya baxıb mat-məhəttəl qaldı, dedi:

– Ay Kaloğlan, sən ata yaxşı muğayat olurmuşsan. İndi ki, belə ata baxmaq əlindən gəlirdi, niyə məndən gizlədirdin? Afərin sənə!

Keçəl Həmzə çox hörmətə minmişdi. Hansı işə buyururdular yarıdırdı, hansı ata muğayat olmağı tapşırırdılar, beş gündə dərisinə sığmaz eləyirdi. Axırda Koroğlu Dürata bağmağı keçəl Həmzəyə tapşırdı. Bu işə xanımlar, dəlilər razı olmadılarsa da, Koroğlu onlara qulaq asmadı. Keçəl Həmzə bir neçə gün Dürata çox yaxşı baxdı. Elə ki, bir neçə gün keçdi, atın arpasını xırpadan kəsdi. Dürat başladı arıqlamağa.

Koroğlu işi belə görüb bir gün Həmzədən soruşdu:

– Ay Kaloğlan, bu at niyə belə günü-gündən dala gedir? Olmaya yaxşı baxmırsan?

Keçəl Həmzə dedi:

– Mən əlimdən gələni eləyirəm, amma at gecə-gündüz içəridə başından axura bağlı, ayaxları da buxovlu. Eşik üzü görmür, çox güman ki, ondan sınıxdır.

Qırat ilə Dürat bir töylədə bağlanırdı. Atların ikisinin də ayağında buxov var idi. Özləri də ayrı-ayrı açarlarla açılırdı. Koroğlu çıxartdı Düratın açarını keçəl Həmzəyə verdi. Xanımlar, dəlilər bunu eşidib dedilər:

– Ay Koroğlu, sən nə eləyirsən? Tanımadığın, bilmədiyin bir adama etibar eləyib Düratın buxov açarını verirsən?

Koroğlu yenə də xanımları, dəliləri sakit elədi ki, qorxmayın, heç zad olmaz. Keçəl Həmzə bir neçə gündə Düratı dərisinə sığmaz elədi.

Keçəl Həmzə buraya gələni az qalmışdı ki, bir ay olsun. Onun Mahmud paşaya verdiyi vədə tamam olurdu. Keçəl Həmzə gecələrin birində ayağa qalxıb öz-özünə dedi: – Mən bir il də burada qalsam Koroğlu Qıratın nə mehtərliyini, nə də buxovunun açarını mənə verməyəcək. Toqat şəhərində nə tanıyırlar ki, Qırat hansıdı, Dürat hansıdı. Elə bunu aparım, paşanı aldadım, qızı alım, beş gün bu dünyada kef çəkim.

Keçəl Həmzə bunu deyib, gecə xəlvətcə Düratı mindi. Asta qaçan namərddi, birbaş qaçdı. Sabah açıldı, mehtərlər yerlərindən qalxıb, atlara arpa-saman vermək üçün töyləyə gəldilər. Gördülər ki, nə Dürat var, nə də keçəl Həmzə. Başı lovlu Koroğlunun yanına gəlib dedilər:

– Nə Dürat var, nə də keçəl Həmzə.

Dəlilər çaxnaşıb bir-birinə dəydilər. Xanımlar da bir yandan düşdülər Koroğlunun üstünə, başladılar onu məzəmmətləməyə. Taxsırkar olduğundan Koroğlu nə dəlilərin, nə də xanımların töhmətinə dinmədi. Kiriyib qaldı. Amma dəlilər sakit olmayıb deyirdilər:

– Biz sənə demədikmi, tanımadığın adama etibar eləyib atı tapşırma. İyidin atını apardılar ya arvadını, ikisi də namusdan sayılır. Bizim qorxumuzdan quş quşluğu ilə Çardaxlı Çənlibelin həndəvərinə gələ bilmir. Qoç Koroğlunun, Çənlibelin, dəlilərin adı gələndə paşalar, bəylər tir-tir titrəyir. Bir keçəl gədənin birisi gəlib buradan at aparsın. İndi bu xəbər ətrafa yayılacaq, düşmənlər üstümüzə ayaq alacaq. Özün öz əlinlə elə iş elədin ki, aləm yığılsaydı, eləyə bilməzdi. İndi de görüm Düratı haradan tapacaqsan, necə gətirəcəksən?

Koroğlu dedi:

– Dürat gedib, Qırat durur, minib gedib tapıb gətirərəm. Az məni məzəmmət eləyin.

Koroğlunun hirsi tutanda yanına gedib onu dindirmək olmazdı. Deyirlər ki, belə vaxtlarda bir üzü üstə, iki-üç gün yatardı, acığı soyuyardı. İndi də ki, Koroğlunun hirsindən, qəzəbindən tay danışma, gözləri qanla dolmuşdu. Acığından az qalırdı dəmir gəmirsin. Necə ki, üzü üstə düşdü düz iki gün-iki gecə ac-susuz yatdı. Üçüncü gün yuxudan ayılıb, Eyvazı səsləyib tapşırdı ki, bir ayrılıq məclisi qursun.

Eyvaz məclis qurdu. Təkcə Koroğluya yeddi batman düyünün plovunu, yeddi qoyun şaqqası, yeddi tuluq şərab hazırlatdı. Yedilər, içdilər, Koroğlu bığlarını eşdi, qulaqlarının dalında burdu. Altdan geyinib üstdən qıfıllandı, üstdən geyinib altdan qıfıllandı, axırıncı badəni bığlarının altından ötürüb ayağa qalxdı. Qıratı ifçin yəhərləyib, qabağına çəkdilər. Xanımlarla, dəlilərlə halallaşıb sıçradı Qıratın belinə mindi. Düratın üç günd getdiyi yolu Qırat bir gündə gedirdi. Koroğlunun elə bircə Qırata mindiyi göründü. At elə bil ki, quş kimi qanad açdı. Dağları, daşları düz elədi, ildırım kimi çaxıb gözdən itdi. Qıratın nallarından qığılcım qalxırdı. Yolu başına götürmüşdü. Elə gedirdi ki, elə bil bir ox idi kamandan qurtarmışdı, süzürdü.

Koroğlu getməkdə olsun, o tərəfdən keçəl Həmzə də üç gün, üç gecə idi ki, canının qorxusundan bir yerdə düşüb dincəlməyib at sürürdü. Yolun üstündə Qırx dəyirmanlar deyilən bir yer var idi. Oraya çatmağa az qalmışdı ki, Həmzə dönüb geri baxdı ki, yolda toz-dumana qarışıb, duman toza. Bir də diqqət eləyəndə gördü budu Koroğlu Qıratın üstündə elə gəlir, elə gəlir ki, ley kimi. Keçəl Həmzənin tüpürcəyi ağzında qurudu. Ha udqundu gördü yox, ağzının suyunu uda bilmir. Çünki öz işini bilirdi. Bilirdi ki, Koroğlu yetişən kimi onunkunu ona verəcək. Düratı qamçılayıb, özünü tez qırx dəyirmanların qapısına saldı. Atdan düşdü, atı dəyirmanın qapısındakı dirəyə bağlayıb tələsik çağırdı:

– Ay dəyirmançı, bir tez eşiyə çıx!

Dəyirmançı tez eşiyə çıxıb soruşdu:

– Qardaş, nə istəyirsən?

Həmzə dedi:

– Bax o yol ilə gələn qoç Koroğludu, Çənlibeldən gəlir. İlxısına qotur düşüb, dəyirmançı beyni axtarır ki, atlarını qoturdan qurtarsın. Tez başına çara tap. Yetişsə ömrünü tamam eləyəcək.

Dəyirmançı dili tutar-tutmaz dedi:

– Ay qadan alım, bəs mən nə eləyim? Onun əlindən necə qurtarım?

Həmzə dedi:

– Soyun paltarını mənə ver, mən geyim, mənim də paltarımı sən gey, get dəyirmanın donuzluğunda gizlən. Mən Koroğlunun ağzını yana sala bilsəm salmışam, yox sala bilməsəm onda qoy məni öldürsün, sən yazıqsan.

Dəyirmançı tez paltarını çıxardı, ona verdi, Həmzə də paltarını dəyirmançıya verdi. Dəyirmançı qaçıb donuzluğa girdi. Həmzə dəyirmançının

paltarını geyinib dəyirmanın içinə girdi. Özünü guppadan unluğun içinə salıb üzünü-gözünü o ki var una buladı, un kürəyini də əlinə alıb, unluğun qabağında dayandı. O tərəfdən Koroğlu özünü alıcı quş kimi dəyirmanın qapısına yetirib çığırıb dedi:

– Ay dəyirmançı, tez gəl bu atı tut!

Keçəl Həmzə dəiyrmançı paltarında qapıya çıxıb dedi:

– Nə buyurursan?

Koroğlu dedi:

– İndicə mənim qabağımca buraya gələn atlı necə oldu?

Keçəl Həmzə dedi:

– Odu, içəridə dəyirmanın donuzluğuna girib gizlənib.

Koroğlu tez atdan düşdü. Qıratı Həmzənin yedəyinə verib özü dəyirmana girdi. Ağzını donuzluğa tutub dedi:

– Əyə, ay keçəl, belə çıx!

Dəyirmançı daha da qorxub dedi:

– Haraya çıxım? Mənim sənin ilxının qoturuna dərman olası beynim yoxdu. Ölsəm də çıxmaram.

Koroğlu dedi:

– Əyə, ay keçəl, qotur nədi, beyin nədi, belə çıx səninlə işim çoxdu.

Koroğlu gördü ki, dəyirmançı öz xoşuna donuzluqdan çıxmaq istəmir, irəli yeridi. Dəyirmançı qorxub çəkildi. Koroğlu bir az da irəli yeridi. Dəyirmançı yenə də o tərəfə çəkildi. Birdən dəyirmançının başı dəyirmanın pərinə keçdi. Pər yazıq dəyirmançını bircə dəqiqədə öldürdü. Koroğlu irəli yeriyib gördü ki, keçəl Həmzə nə gəzir, ölən dəyirmançıdı.

Keçəl Həmzə Çənlibeldə Dürata baxdığı zaman Qıratın da yan-yörəsinə hərlənib özünə mehriban eləmişdi. Bir də Qıratın belə bir xasiyyəti var idi ki, Koroğlu onun yüyənini kimə tapşırsaydı, ona üzəngi verərdi. Odu ki, Koroğlunun başı içəridə dəyirmançıya məşğul olanda keçəl Həmzə Qıratı mindi. Koroğlu dəyirmandan çıxıb baxdı ki, keçəl Həmzə Qıratın belində, özü də dəyirmandan bir az aralı durub hərdən bir də atı qamçı ilə vurub incidir. Koroğlu indi başa düşdü ki, keçəl Həmzə onu aldadıb. Bir qəzəbləndi, Misri qılıncı çəkib hücum eləmək istədi. Ancaq baxdı ki, bundan bir fayda olmayacaq. Bilmədi ki, nə eləsin. Bir də baxdı ki, insafsız həm də Qırata elə bir qamçı vurdu ki, az qaldı od çıxsın. Ürəyi yanıb aldı, görək nə dedi:

Canım Həmzə, gözüm Həmzə!..
Həmzə, incitmə Qıratı!..
Budu sənə sözüm Həmzə,
Həmzə, incitmə Qıratı!..

Qıratdı mənim dirəyim,
Əriyər, qalmaz ürəyim.
Sən olasan duz çörəyim,
Həmzə, incitmə Qıratı!..

Eşidər paşalar, bəylər,
Şadlıq xəbərini söylər,
Koroğlu iltimas eylər,
Həmzə, incitmə Qıratı!

Keçəl Həmzə dedi:

– Koroğlu, elə adın var imiş. Bir ay süfrənin qırıq-quruğundan yedim, indi onu da dilinə gətirdin, başıma çaldın. Özün karvanlar soyursan, mal-dövlət alırsan, indi bir at nədi ki, ondan ötəri bu qədər yalvarır, yaxarır, yanıb hayıfsılanırsan?

Koroğlu dedi:

– Mən ondan ötəri hayıfsılanmıram. Ona yanıram ki, sən Qıratı aparıb saxlayan, minən deyilsən. Gəl atı özümə sat. Bunu eləməsən əylən, onda Qıratın qiymətini deyim, allanıb ucuz satma!

Aldı Koroğlu:

Əylən, deyim Qıratın qiymətini,
Səksən min sərkərdə mala da vermə!
Səksən min ağ tüklü qəmər öyəcə,
Səksən min xəzinə pula da vermə!

Səksən min ilxıya, səksən min ata,
Səksən min mahaldan gələn barata,
Səksən min kotana, səksən min cütə,
Səksən min kotanlı kala da vermə!

Koroğlu dövlətin endirsin düzə,
Say götür hamısın səksən min yüzə.
Səksən min gəlinə, səksən min qıza,
Səksən min ərgənə, dula da vermə!

Keçəl Həmzə dedi:

– Koroğlu, arxayın ol, qiymətinə sataram.

Koroğlu gördü keçəl Həmzə Qıratı verməyəcək, dedi:

– Barı qulaq as deyim, atı necə saxlamaq lazımdı. Aldı əlüstü, görək nə dedi:

Həmzə, atı yaxşı saxla,
At iyidin qardaşıdı.
Gündə muğayat ol yoxla,
At iyidin qardaşıdı.

Yaz olanda dağa yollat,
Yay olanda ifçin nallat,
Qış olanda məxmər çullat,
At iyidin qardaşıdı.

Atı sevib bəslə körpə,
Hayqıranda çıxsın sarpa.
Hər yeyəndə qırx tas arpa,
At iyidin qardaşıdı.

Uzaq-uzaq yollarınan,
Belə ipək çullarınan,
Hoqqa yarım nallarınan,
At iyidin qardaşıdı.

Məclis qurdum çoxlarınan,
Dava etdim oxlarınan,
Qara polad mıxlarınan,
At iyidin qardaşıdı.

Sərin-sərin yu suyunan,
Quyruğu bağlı muyunan,
Qoç Koroğlu çox öyünən
At iyidin qardaşıdı.

Keçəl Həmzə dedi:

– Koroğlu, nə zaman Qıratın dalınca Toqata gəlsəm özüm üzəngini basıb səni mindirəcəyəm. Amma indi heç üz vurma, atı verməyəcəyəm. Gərək aparıb Mahmud paşaya verib, Dona xatunu alam.

Keçəl Həmzə bunu deyib, Qıratı səyirtdi, gözdən itdi. Koroğlu Düratı qaytarmağa gəlmişdi, Qıratı da əlindən verdi. Ona bu hamısından ağır gəldi, dəyirmanın qapısında yerə oturdu, aldı görək nə dedi:

Çünki oldun dəyirmançı
Çağır gəlsin dən Koroğlu!
Verdin Qırı, aldın Dürü,
Döy başına, yan Koroğlu!

Qırat əldən getdi, barı,
Canda qaldı intizarı.
Üyüd arpa, buğda, darı,
Al şahadın sən, Koroğlu!

Uca dağlarda döşlətdin,
Ağır alaylar boşlatdın,
Yüz il lotuluq işlətdin,
Axır oldun xam, Koroğlu!

Özün allatdırdın büyün,
Sinəmə çəkildi düyün,
Gedin dəlilərə deyin,
İşə düşdüm mən Koroğlu!

Koroğlunun özü ac idi, atı da arpasız. Axşam düşdüyündən dəyirmana gələn də olmadı. Koroğlu ac-susuz yatdı. Elə ki, sabah açıldı bir də baxdı ki, budu bir kişi qabağında iki yüklü öküz gəlir. Kişi gəlib yetişdi. Bir Koroğluya baxdı, bir paltar-maltarına, şəst-bəstinə baxıb dedi:

– A qardaş, hanı dəyirmançı?

Koroğlu dedi:

– Dəyirmançı yoxdu, indi dəyirmanda mən dururam.

Koroğlu özü öküzlərin üstündən çuvalları düşürdü, dəyirmana apardı, sonra kişidən soruşdu:

– Qardaş, bunların içində heç arpa varmı? Mənim atım arpasızdı, qorxuram damağ ola, bir az ona arpa verim yesin.

Kişi dedi:

– Çuvalların ikisi arpadı, ikisi buğda.

Arpa çuvalları yarımçıq idilər. Koroğlu bağlamaları bir-birinə boşaltdı, bir çuval elədi, Düratın qabağına qoydu. Kişi istədi Koroğluya mane olsun, Koroğlu gözünü elə bərəltdi ki, kişi qorxudan çıqqırını da

çəkə bilmədi, çəkilib bir tərəfdə durdu. Gördü yox, bu o dəyirmançılardan deyil, bir az da o yan, bu yan eləsə çəkib cərcənəyini ayıracaq. Koroğlu özü də yaman ac idi. Dürat arpasını yeyənə qədər buğda çuvallarını töküb üyütdü. Unluğa da su buraxıb xamır qayırdı. Çəkib dəyirmanın bir tərəfini sökdü, pərdilərdən ocaq çatdı, xamırı çörək bişirdi. Öküzün də birini kəsdi, soydu, cəmdəyinin yarısını kabab çəkdi, yarı çiy, yarı bişmiş yeyib toqqanın altını bərkitdi, sonra durub Düratı minib, üzünü Çənlibelə çevirdi.

Bir də baxdılar ki, budu Koroğlu gəlir. Gəlir amma necə gəlir... Hamı başını aşağı saldı. Nə bir salam, nə bir sabah. Heç keyfin, halın da soruşmadılar.

Koroğlu atdan düşdü. Eyvaz onun qabağına çıxdı, aldı görək nə dedi:

Təzə sövdəyər olubsan,
Sövdan da mübarək olsun!
Alış-veriş öyrənibsən,
Sövdan da mübarək olsun!

Niyə girdin dəyirmana,
Bizi qoydun yana-yana,
Atı verdin Kaloğlana,
Sövdan da mübarək olsun!

Sən Eyvazı qoydun xəstə,
Get comərddən mətləb istə,
De bir neçə verdin üstə?
Sövdan da mübarək olsun!

Koroğlu neçə-neçə səfərlərə getmişdi, amma heç olmamışdı ki, qayıdanda dəlilər belə eləsinlər. Amma bu dəfə xanımlar onun üzünə baxmırdı, dəlilər salam vermirdi. Axırda Koroğlu aldı, görək nə dedi:

Keçər dövran belə qalmaz,
Şad ol könül, nə məlulsan?
Dəlilərim salam verməz,
Şad ol könül, nə məlulsan?

Geydiyim iyid kürküdü,
Dünya Süleyman mülküdü,
Dövlət ki var əl çirkidi,
Şad ol könül, nə məlulsan?

Koroğluyam deyim sənə,
Od tutub alışdı sinə.
Aşıqlığım bəsdi mənə,
Şad ol könül, nə məlulsan?

Bu sözdən dəlilər incidilər ki, çox yaxşı iş görübsən hələ danışırsan da ki, "aşıqlığım bəsdi". İndi ki belə oldu, indi ki sən bizi heçə sayırsan, onda biz də çıxıb gedirik.

Koroğlu çox qəzəbli idi. Bir tərəfdən Qırat əldən getmişdi, bir tərəfdən də Həmzə kimi keçəlin biri onu aldatmışdı. Öz dərdi özünə bəs deyildi, indi də dəlilər belə deyirdilər. Elə ki, dəlilər dedilər biz də çıxıb gedirik, Koroğlu qəzəbinin gücündən özünü saxlaya bilməyib birdən qayıtdı ki:

– Əşi gedin də, nə eləyim gedirsiniz!

Bu söz dəliləri götürdü. Tay onların qabağını saxlamaq çətin iş idi. Hamısı vəlvələyə düşdü. Hamı getmək üçün hazırlaşmağa başladı. Nigar işdən xəbər tutub dəlilərin qabağını kəsdi, onları geri qaytardı. Nigarın dəlilər arasında o qədər hörməti var idi ki, onun bir sözünü iki eləməzdilər. Hamı qayıdıb oturdu. Nigar da onların arasında oturub üzünü də o yana çevirdi. Koroğlu baxdı ki, Nigar da ondan üz çevirdi. Bu, Koroğluya hamısından bərk yer elədi. Sazı döşünə basıb görək Nigar xanıma nə dedi:

Ala gözlü Nigar xanım,
Üzün məndən niyə döndü?
Sənə qurban şirin canım,
Üzün məndən niyə döndü?

Qoyun otlar quzu ilə,
Ayağının tozu ilə.
Müxənnətin sözü ilə
Üzün məndən niyə döndü?

İyidin yatmasın baxtı,
Yana çevrilməsin taxtı,
Koroğlunun məlul vaxtı,
Üzün məndən niyə döndü?

Nigar heç bir söz deməyib sazı Koroğlunun əlindən aldı. Səmərqənd kağızı kimi ağ sinəsi üstünə basıb dedi:

Binadan gözəl olmayan
Telin qədrini nə bilər?
Çöldə gəzən boz sərçələr,
Gülün qədrini nə bilər?

Kal qoşub kotan əkməyən,
Nanın süfrəyə tökməyən,
Arının qəhrin çəkməyən
Balın qədrini nə bilər?

Utan, qoç Koroğlu, utan!
Dağların damənin tutan!
Sənin kimi başa çatan
Elin qədrini nə bilər?

Nigar sazla dediyi kimi sözlə də dedi:

– Sən ki dəlilərə belə söz dedin, daha mənim də səninlə işim yoxdu.

Deyirlər ki, Koroğlu heç bir söz deməyib düz durub getdi. Üç gün, üç gecə tamam ac, susuz ağzı aşağı düşüb yatdı. Bir də yuxusunda gördü ki, Toqatdadı. Qırat da altında. Diksinib qalxdı. Baxdı ki, Eyvaz başının üstündə oturub ağlayır. Koroğlunun ürəyi alışdı, sazın götürüb dedi:

Eyvaz, məndən nə istərsən
Candımı, başdımı, nədi?
Axıdırsan ala gözdən
Qandımı, yaşdımı, nədi?

Məclisdə dolanmır sağın,
Sinəm üstdən getməz dağın,
Tökülübdü qaş-qabağın,
Boranmı, qışdımı, nədi?

Dayan, Qoç Koroğlu, dayan!..
Sözlərini elə bəyan.
Yatıbsan qəflətdən oyan,
Gördüyün duşdumu, nədi?

Eyvaz qalxdı, genə bir məclis qurdu. Xanımlar, dəlilər hamısı Koroğlunun başına yığışdılar. Yedilər, içdilər, kefləri kökəldi, damaqlar çağaldı, inciklik yaddan çıxdı, əvvəlki kimi şirin dost, mehriban yoldaş oldular. Bu zaman Koroğlu sazı sinəsinə basdı aldı görək nə dedi:

Allahı çağırıb düşərəm yola,
Bu dərdi sinəmdə qala qoymaram.
Qıratım həsrətlə yolum gözləyir,
Düşmənin əlində qala qoymaram.

Ah çəkərəm hərdən köysüm ötürrəm,
Yola düşüb mətləbimi bitirrəm,
Ya ölərəm, ya Qıratı gətirrəm,
Ayı dolansa da, ilə qoymaram.

Koroğluyam, qoç oğluyam, qoçam mən,
Çətindi ki, mərd meydandan qaçam mən,
Havada dövr edən tərlan quşam mən,
Sarlar şikarımı ala qoymaram.

Koroğlu altdan geyindi, başdan qıfıllandı, başdan geyindi, ayaqdan qıfıllandı, Misri qılıncı bağladı, qalxan asdı, əmud götürdü, dava libasının üstündən, bir kürk geyindi, çiyninə də bir saz keçirdi, tək başına payı-piyada Toqata tərəf yola düşdü. Az getdi, çox dayandı, çox getdi az dayandı, gecəni gündüzə qatdı, gündüzü gecəyə qatdı, özünü Toqat şəhərinə yetirdi. Baxdı ki, hava qaranlıqlaşır. Bir qarının qapısını döyüb dedi:

– Ay qarı nənə, bu gecəliyə məni qonaq eləyərsənmi?

Qarı dedi:

– Niyə eləmirəm.

Koroğlu qarıya bir qədər pul verib dedi:

– Elə isə al, mənə yemək hazırla.

Qarı pulu çox görüb soruşdu:

– Pulun qalanını neyləyim?

Koroğlu dedi:

– Qalanı nədi, hamısına al.

Qarı soruşdu:

– Tək başına bu qədər şeyi neyniyirsən?

Koroğlu gülüb dedi:

– Qonağım var, on adamlıq xörək bişir.

Koroğlu içəri girib, oturdu. Qarı tez ayağa durub bazara üz qoydu. Yağdan, düyüdən, ətdən alıb gətirib on adamlıq xörək hazırladı.

Elə ki, xörək hazır oldu, qarı gəldi ki:

– Yaxşı, xörək hazırdı, sənin də yoldaşların gəlmədi, nə eləyək?

Koroğlu dedi:

– Onlar tay gəlməyəcək. Çək, gətir buraya.

– Elə hamısını?

– Elə hamısını.

Qarı əvvəlcə inanmadı. Sonra gördü yox balam bu elə deyəsən ciddi danışır. Fikirləşdi ki, yaxşı çəkib apararam. Bu tay əjdaha-zad deyil ki, bir qarını var da, yediyini yeyər, qalanı da qalar. Bu elə mənim on beş günümə bəsdi.

Qərəz, qarı ortalığa yekə bir mis məcməyi qoyub plovu çəkdi. Məcməyi təpə kimi qalandı. Yazıq qarı nə qədər hıqqandı, məcməyini yerdən götürə bilmədi. Koroğlu işi belə görüb durub gəldi, məcməyini özü götürüb evə gətirdi. Plovu ortalığa qoydu, qollarını çırmayıb əyləşdi. Qarı fikirləşdi ki, mənim oturub bununla bir yerdə yeməyim yaxşı deyil. O yeyər, doyar, onsuz da qalanı mənə qalacaq. Koroğlu qarını çağırdı ki:

– Qarı nənə, gəl.

Qarı dedi:

– Sən ye, mən ac deyiləm.

Koroğlu dedi:

– Nə yemisən ki, ac deyilsən? Gəl, sonra peşiman olarsan.

Qarı naz edib dedi:

– Yox, sən ye. Mən plovun iyisi ilə doymuşam.

Koroğlu bir də dedi:

– Qarı nənə gəl, bax sonra peşiman olarsan ha...

Koroğlu ilişdi plova, birinci tikədə plovun ürəyi üzüldü. İkinci, üçüncü, qarı gördü bu bir-iki tikə də vursa, məcməyidə bir şey qalmayacaq, düşdü qarın ağrısına ki, plovdan şişəcəyəm. Ancaq tay bir dəfə yemirəm demişdi, düşmüşdü boynuna deyin yaxınlaşa da bilmirdi. Elə bu fikirdəydi, Koroğlu bir də dedi:

– Qarı nənə, gəl... peşman olarsan.

Qarı elə bu sözə bənd idi. Tez çökdü məcməyinin başına. Qərəz yedilər, içdilər. Koroğlu bir düzəldi, pələ bığlarını eşdi, qarı ortalığı yığışdırdı, əyləşib söhbətə başladılar.

Qarı soruşdu:

– Ay qonaq, de görüm sən kimsən? Haradan gəlib, haraya gedirsən?

Koroğlu dedi:

– Qarı nənə, mən aşıqam. Çənlibeldənəm, bəs sizin şəhərdə nə var, nə yox?

Qarı soruşdu:

– Oğul, yaxşı vaxtında gəlib çıxıbsan. Keçəl Həmzə Koroğlunun Qıratını gətirəndən sonra paşa ona bəylik verib. Bu gün paşa qızını da ona verib toy eləyir. İndi toydu, aşıq axtarırlar. Sabah gedər oxuyar, bolluca nəmər yığarsan.

Koroğlu dedi:

– Ay nənə, indi Həmzənin gətirdiyi Qıratı harada saxlayırlar?

Qarı nənə:

– Mahmud paşanın töyləsində. Amma ay qonaq, bir də mənə nənə desən səndən inciyərəm. Mən qoca ha deyiləm. Dişlərimi nuzla töküb.

Koroğlu o gecə qarının evində qaldı, sabah qalxıb keçəl Həmzənin toyuna gedəndə dedi:

– Ay qarı, mən gedirəm, bəlkə buraya qayıda bilmədim, görüşə bilmədik, sənə bir neçə kəlmə sözüm var, onu deyim barı ürəyimdə qalmasın.

Aldı Koroğlu dedi:

Bir qarıya qonaq oldum,
Nə yaman camxanası var.
Dövlətini xəbər aldım,
Bir inək, bir danası var.

Qarı gəlir bizə yavuq,
Əl-ayağın tutub soyuq,
Çeşdəliyə bir cüt toyuq,
Axşama qayğanağı var.

Qarı deyəndə tozlanır,
Gəlin deyəndə nazlanır,
Qabaqda qarpız gizlənir,
Dalında topxanası var.

Koroğlunun hədyan işi,
Qovğadan açılmır başı,
Düşüb otuz iki dişi,
Bir kötük nişanası var.

Koroğlu sözünü qurtarıb qarıya bir az da pul verdi, saz da çiynində gəlib, Mahmud paşanın imarətinə çatdı. Baxdı ki, bir toydu, bir toydu

ki, gəl görəsən. Otaq paşa, bəy, xan, tacirlərlə doludu. Eşitdilər ki, aşıq gəlib, hamı sevindi... Koroğlunu çəkib məclisə apardılar. Baxdılar ki, bu aşıq heç onlar görən aşıqlardan deyil. Boyu uca, kürəkləri enli, süksünü kal süksünü kimi, boynunun əti kirdin-kirdin, bığları burulub keçirilib qulaqlarının dalına. Süründən-sifətindən zəhm tökülür. Qorxudan üzünə baxmaq olmur. Məclisdəki paşalardan biri dedi:

– Aşıq, hara aşığısan?

Koroğlu dedi:

– Çənlibel aşığıyam.

Paşa dedi:

– Qoç Koroğlunu tanıyırsanmı?

Koroğlu dedi:

– Yaxşı tanıyıram. Bir neçə il onun yanında aşıq olmuşam.

Toqatın paşası Mahmud paşa dedi:

– Bu gün dəli Koroğlunun Qıratını gətirən Həmzə bəyin toyudu. Qıratı gətirdiyinə görə bəylik alıb. Dona xatunu da ona vermişəm. İndi sən də bu toyda bir az dəli Koroğludan oxu, qulaq asaq.

Koroğlu Qıratın adını eşitcək elə bil ki, ürəyinin başına od düşdü. Sazı sinəsinə basıb, aldı görək nə dedi:

Canım Qırat, gözüm Qırat?!
Yarəb, Qırat dururmu ola?!
Mahmud paşa mehtərləri,
Otun, suyun verirmi ola?!

Qırata xələt biçəndə,
Üstündə badə içəndə,
Şeşpər yalmandan keçəndə
Sərxoş-sərxoş yerirmi ola?!

Qoç Koroğlu, hanı, hanı?
Dostunla düşmanın tanı!
Qırat ilə Eyvaz xanı,
Bir də gözüm görürmü ola?!

Mahmud paşa dedi:

– Aşıq, dəli Koroğlunu çox hünərli deyirlər. İndi de görüm Koroğlu iyiddi, ya mən?

Koroğlu dedi:

– Paşa, onun iyidliyi, mərdliyi dillərdə əzbər olub, aləmə yayılıb, hamı eşidib, mən də bilirəm. Amma səni indi görürəm. İzin ver, iyidliyin nişanını səndən xəbər alım, bilim, sonra deyim.

Götürdü Koroğlu, görək nə dedi:

Uca-uca dağ başında,
Yel kimi əsdiyin varmı?
Əlli, altmış atlı ilə
Bir ordu basdığın varmı?

Namərd sirrini biləndə,
Müxənnət üzə gələndə,
Yağı düşman güc gələndə,
Meydandan qaçdığın varmı?

Qızıb gəzəndə meydanı,
Qıraram sultanı, xanı,
Ovuc-ovuc düşman qanı,
Doldurub içdiyin varmı?

Ərin qüvvəti qolumda,
Dəlilər sağı-solumda,
Eyvaz tək oğul yolunda,
Canından keçdiyin varmı?

Koroğlunun yox insafı,
Dava günü olmaz lafı,
Misri qılınc, dəmir qapı,
Endirib kəsdiyin varmı?

Məclisdəki paşalardan biri dedi:

– Aşıq, yaxşı oxuyursan, amma elə bərk bağırırsan ki, səsin az qalır qulaqlarımızı dəlsin. Sözünü bir az alçaqdan de. Bir də sən Mahmud paşadan iyidliyin nişanəsini xəbər aldın, heç özün demədin görək iyidin nişanı nədi. Söylə görək sizin yerin iyidləri necə olur?

Aldı Koroğlu:

Bizim elin dəliləri
Girər meydana mərd olu.
Ölüncə meydandan qaçmaz,
Girəndə meydangərd olu.

Sarp qayalarda yurd olmaz,
Müxənnətə söz dərd olmaz,
Çaqqal əniyi qurd olmaz,
Yenə qurd oğlu qurd olu.

Dəlilərim fovcu-fovcu,
At minib düşman qovucu,
Belində Misri qılıncı,
Koroğlu kimi mərd olu.

Mahmud paşa dedi:

– Aşıq, sən dedin ki, Dəli Koroğlunu tanıyırsan, onun Qıratını da görübsən. Heç atın xasiyyətindən, nişanından bilirsənmi? Bir az de, qulaq asaq.

Aldı Koroğlu:

Paşa, sənə nişan verim Qıratı,
Əbrişin ipəkdən yalı gərəkdi.
Bir mina boyunlu, uca sağrılı,
Bir yarım hoqqadan nalı gərəkdi.

Bir alma dırnaqlı, hündür boyunlu,
Meydana girəndə yüz min oyunlu,
Dəyirman mədəli, ac qurd yeyimli,
Ortası qoluna dolu gərəkdi.

Qaranlıq gecədə yol çaşırmayan,
Düşmən qabağında ər düşürməyən,
Üstündə əl-ayaq yığşırılmayan,
Koroğlunun atı dəli gərəkdi.

Mahmud paşa dedi:

– Aparın aşığı yedirib, içirin.

Saqi Koroğlunu şərab olan otağa apardı. Qabağına bir qab şərab qoydu. Koroğlu qabı bir xortumda boşaldıb dedi:

– Belə şey mənim ağzımı da islatmaz. Verirsən ver əməlli-başlı içək, vermirsən gedək özümüzə gün ağlayaq.

Otaqda üç tuluq yarım şərab var idi. Saqi Koroğlunu orada qoyub iri qab gətirməyə getdi. Saqi çıxcaq Koroğlu özünü verdi tuluqların yanına. Bir, iki, üç, bir hovurdu üç tuluq yarım şərabı içib, boş tuluqları

bir tərəfə tullayıb, oradan keçdi aşxanaya. Aşbaz bir sini aş çəkib qoydu Koroğlunun qabağına. Gözünə dönüm Koroğlu, iki şapalaqda bir sini aşı qara bığının altından ötürüb dedi:

– Aşbaz qardaş, bu mənim bir küncümdə qaldı, aş ver oturduğuma görə doyunca yeyim.

Aşbaz bir yekə sini də çəkib aşı Koroğlunun qabağına qoydu, Koroğlu onu da aşırdı. Bir də istəyəndə aşbaz dedi:

– Ay balam, haramı deyilsən ki, iki sini aşla doymadın?

Koroğlu dedi:

– Yeddi batman düyünün aşı, yeddi qoyunun yarı şaqqası, mənim bir dəfəmin xörəyidi. Belə şeylər mənim harama çatacaq?

Aşbaz istədi ki, Koroğlunu aşxanadan çıxartsın. Koroğlu bir əli ilə aşbazın boğazından tutub, belindən iki qatlayıb boş qazanlardan birinin içinə soxdu, ağzına da bir sini çevirib üstündə oturdu. Yavaşca qollarını çırmaladı, aş qazanlarını qabağına çəkib bir oturumda yeddisini aşırdı. Elə ki, qurtardı, pələ bığlarını eşdi, qulaqlarının dalından keçirdi, girdi məclisə, məclisdəkilər dedilər:

– Aşıq, yedin doydun, indi oxu, qulaq asaq.

Aldı Koroğlu görək nə dedi:

Muradbəyli derlər bizə,
Meydanda mərdlik işləni.
Qoç iyiddən oğul törər,
Düşman gözündə beşləni.

Uca dağlarda duraram,
Çəkib bəzirgan vuraram,
Gündə üç içki quraram,
Yüz min tümənlər xərcləni.

Hay deyəndə haylarım var,
Hoy deyəndə hoylarım var,
Qurdlarım var, aylarım var,
Hay vursam şəhrin boşlanı.

Paşalar Koroğlunu tanımamışdılar. Onlar elə bilirdi ki, bu doğrudan da aşıqdı.

Keçəl Həmzə Çənlibeldən Qıratı gətirəndən bəri at neçə mehtəri tələf eləmişdi. Heç kəs atın yanına gedə bilmirdi. Mahmud paşa baxdı ki, bu aşıq deyəsən Qıratı yaxşı tanıyır. Ondan soruşdu:

– Aşıq, budu neçə müddətdi ki, Qıratı gətirtdirmişəm, amma vərəm dəymiş heç kəsə əl verməyir. Sən onu ipə-sapa öyrədə bilərsənmi?

Koroğlu bunu eşitcək az qaldı ruhu bədənindən uçsun. Tez dedi:

– Bəli.

Mahmud paşa əmr elədi, Koroğlunu Qıratın yanına saldılar.

Qırat Koroğlunu görən kimi tanıdı. Bərkdən kişnədi. Koroğlunun könlü açıldı. Ürəyi coşub tel-tel oldu. Aldı görək nə dedi:

Çənlibeldən səni deyib gəlmişəm,
Alma gözlüm, qız birçəklim Qırat, gəl!
Dəmir libas, polad geyib gəlmişəm,
Alma gözlüm, qız birçəklim Qırat, gəl!

Əzəldən biləydim sənin halını,
Əşrəfidən kəsdirərdim nalını,
Yüz gözələ toxudardım çulunu,
Alma gözlüm, qız birçəklim Qırat, gəl!

Qabaqda qalırmı arpan səhərə?
Üzəngilər nə yaraşar yəhərə...
Dəlilər salmışdı məni qəhərə,
Alma gözlüm, qız birçəklim Qırat, gəl!

Bir atım var atım-atım atılır,
Qulaqları qarğı kimi çatılır,
Ucuzluqda min tümənə satılır,
Alma gözlüm, qız birçəklim Qırat, gəl!

Mərd iyidlər belə baxmaz atına,
Sənsiz getmək olmaz el baratına,
And verirəm Koroğlu qıryatına,
Alma gözlüm, qız birçəklim Qırat, gəl!

Qırat Koroğlunun səsini eşidəndə elə kişnədi ki, yer titrədi. Koroğlu irəli yeriyib qollarını doladı Qıratın boynuna. Üzündən-gözündən öpüb, yalını-yalmanını tumarladı, ifçin yəhərləyib töylədən çıxartdı. Keçəl Həmzə töylənin qapısında hazır durmuşdu. İrəli gəlib Qıratın üzəngisini basdı, dedi:

– Koroğlu, mən dəyirmandakı vədəmi yerinə yetirdim.

Koroğlu Qıratı minəndən sonra əynindəki kürkü çıxartdı, Misri qılıncının dəstəsindən yapışdı. Tay paşalardan, xanımlardan, bəylərdən soruşma. Hamı bir-birinə dəydi.

Aldı Koroğlu görək nə dedi:

Mindim Qıratın belinə,
Kaş ki, düşman yüz olaydı.
Çəkəndə Misri qılıncı,
Dərə, təpə düz olaydı.

Atı mindim gəzdirməyə,
Düşman bağrın əzdirməyə,
Dona çayı üzdürməyə,
Qırat bir qəvvas olaydı.

Verin yeddi illik xarcı,
Paşalar gətirsin bacı.
Koroğlu çəkib qılıncı,
Düşmən üzbəüz olaydı.

Mahmud paşa hökm elədi, qoşun yerbəyerdən atlanıb Koroğlunun üstünə yeridi. Koroğlu Mahmud paşanın belə hökm verməyini görəndə, aldı görək nə dedi:

Laf eyləmə, dəli paşa,
Ağır-ağır ellərim var,
Bir tamaşa eyləyəsən,
Qılınc çalan qollarım var.

Uca dağlardan daşlanı,
Ağır alaylar boşlanı,
Gəlsələr dava başlanı,
İyid-iyid dəllərim var.

Mən anadan mərd olmuşam,
O Çənlibeldən gəlmişəm,
Koroğluyam, at minmişəm,
Yüz min belə fellərim var.

Koroğlu qoşuna hücum eləyib, mərdanə qılınc vurmağa başladı. Düşmən çox idi, Koroğlu tək. Yalqızlıq Koroğluya əl verdi. Aldı görək nə dedi:

Ay həzərat, ay camaat,
Heç iyid yalqız olmasın!
Ətim yeyib, qanım içən,
Namərdə möhtac olmasın!

Haşa a bəylər, haşadan,
Qorxmaram xandan, paşadan,
Əsrəyib çıxsa meşədən,
Aslan da yalqız olmasın!

Koroğlunun daş qalası,
Ərşə çəkildi nalası,
Ördək ilə qaz balası,
Göllərdə yalqız olmasın!

Qoşun Koroğlunu aralığa almışdı. Qızğın dava idi. Koroğlu əmud vurur, cida oynadır, şeşpər atırdı. Hansı yana üz çevirirdi düşmanı qatım-qatım qatlayırdı. Baş kəsirdi, qol qırırdı, qanı su kimi axıdırdı. Qırat da işi ilə, çəçiyi ilə qoşunu didib tökürdü. Koroğlu Qıratın hünərini görüb, aldı əl üstü:

Ceyrana bənzər qaçışın,
Addımla, qurban qoluna!
Tərlana bənzər uçuşun,
Əl çatmaz ipək yalına!..

Kəsdirrəm gümüşdən yəhər,
Tumarlaram axşam, səhər,
Götür burdan qaç bir təhər
Sikkə vurdurram nalına!

Koroğluyam, güman belə,
Deməyinən gəlməz dilə,
Məni çıxart Çənlibelə,
Qotaz düzdürrəm çuluna!

Qoç Koroğlunun dəli nərəsi düşmanı qorxutmuşdu. Hamının əli davadan soyumuşdu. Koroğlu sağdan vurdu, soldan çıxdı, soldan vurdu, sağdan çıxdı, düşmanı şil-küt eləyib bir tərəfdən özünə yol açıb qoşunun arasından çıxdı.

Mahmud paşa yolları tənablarla neçə yerdən kəsdirmişdi ki, bəlkə Koroğlu keçib gedə bilməsin, tutsunlar. Qırat tənabların yeddisini bir eləyib sıçrayırdı.

Koroğlu hər yerdən keçib Çənlibelə yol başladı. Az getdi, çox getdi, bir də gördü Çənlibel tərəfdən göyün üzü ilə ötüşə-ötüşə bir qatar durna gəlir. Çənlibel Koroğlunun yadına düşdü.

Aldı, görək nə dedi:

Göynən gedən beş durnalar,
Bizim ellər yerindəmi?
Bir-birindən xoş durnalar,
Bizim ellər yerindəmi?

Söhbət olurdu sazınan,
Ördək olurdu qazınan,
Necə incəbel qızınan,
Tuti dillər yerindəmi?

Sevib, seçib bəyəndiyim,
Sədasından oyandığım,
Arxasında dayandığım,
Çənlibellər yerindəmi?

Bəzirgana sataşdığım,
Qumaşına bulaşdığım,
Dönüb boynundan aşdığım,
Çənlibellər yerindəmi?

Hərdən işvə-qəmzə satan,
Mənimlə ixtilat qatan,
Gələndə atbaşı tutan,
Şux gözəllər yerindəmi?

Çalxalanıb döyündüyüm,
Arxa vurub söyündüyüm,
Qovğa günü öyündüyüm,
Nər dəlilər yerindəmi?

Koroğlu heç deməz yalan,
Toqata salmışam talan,
Cümlə dəlilər, Eyvaz xan,
İyid ərlər yerindəmi?

Koroğlu uzaq yolları keçib gəldi Çənlibelə yetişdi. Qırat Çənlibelə çatanda elə kişnədi ki, dağlar, dərələr dilə gəldi. Dəlilər tökülüb qabağa gəldilər. Qıratı tutdular. Koroğlunun Qıratı tapıb sağ-salamat gəlməyinə hamı sevindi. Şadlıq məclisi qurdular, yedilər, içdilər, keflər kökəldi. Koroğlunun kefi saz, damağı çağ idi. Badəni badənin dalınca qara bığlarının altından ötürürdü. Nigar xanım dəlilərə göz basıb Koroğluya dedi:

– Koroğlu, iyidliyinə sözüm yoxdu, amma belə sifətdən çox qarasan ey...

Koroğlu sazını sinəsinə basıb, aldı görək Nigar xanıma necə cavab verdi:

Mənə qara deyən gözəl,
Qaşların qara deyilmi?
Tökülübdü dal gərdənə,
Saçların qara deyilmi?

Hökm ilə oturub durma,
Müjganın sinəmə vurma,
Ala gözə siyah sürmə,
Çəkibsən qara deyilmi?

Koroğlu verdi salamı,
Dolandı cümlə aləmi,
Qüdrətin göhər kalamı,
Yazısı qara deyilmi?

Hamı gülüşdü. Nigar Koroğlunun bu hazır cavabına şad oldu. Məclis təzədən qızışdı...

# Koroğluynan Ərəb Reyhan

Koroğlunun Ərzincandan sağ-salamat qayıdıb gəlməyi Çənlibeldə toy-bayram oldu. Elə bil ki, dəlilərin ürəkləri yerinə gəldi. Əhvalatı, necə ki, Aşıq Cünun gəlib xəbər gətirmişdi, Koroğluya danışdılar.

Koroğlu soruşdu:

– Bəs Aşıq Cünun hanı? Heç gözümə dəymir.

Nigar dedi:

– Aşıq Cününu yenə də Toqata göndərmişik ki, Hasan paşanın işlərindən bizi xəbərdar eləsin.

Koroğlu getdi fikrə. Dedi:

– Gərək onu Qarsa göndərəydiniz. Mən Hasan paşanın qeyrətinə bələdəm. O da zərbi-dəstimi görüb. O bizim üstümüzə gələ bilməz. Amma Reyhan igid adamdı. Özünün də məndə hayfı var.

Koroğlu Ərzincandan gəlib Çənlibelə çatanda qaranlıq qovuşurdu. İndi də oturub o qədər söhbət elədilər ki, lap gecə gecədən keçdi. Axırda Dəli Həsən məclisi dağıtdı ki:

– Day bəsdi. Durun hərə öz yerinə! Koroğlu yorğundu, dincini alsın.

Dəlilər durub dağıldılar. Koroğlu da başının altını dik eləyib yatdı. Elə ki, səhər açıldı, hələ heç gün çırtlamamışdan Koroğlu yerindən durdu. Uşaqları yanına alıb Çənlibelin bütün bəndərgahlarını gözdən keçirtdi. Baxdı ki, vallah, dəlilər bəndərgahları elə tutublar, elə pusqular düzəldiblər, elə səngərlər basıblar ki, Hasan paşa nədi, lap xotkar özü də bütün dünyanı yığıb Çənlibelə töksə, yenə də bir adam bu yerlərdən keçə bilməz. Elə ki, Koroğlu bəndərgahların hamısını gəzib qurtardı, deməlisini dedi, tapşırılmasını tapşırdı, ondan Dəli Mehtəri çağırıb dedi:

– Mənim aşıq paltarımı gətir!

Dəlilər soruşdular:

– Neynirsən aşıq paltarını?

Koroğlu dedi:

– Qarsa gedəcəyəm. Gərək gedib Ərəb Reyhandan xəbər biləm.

Dəlilər nə qədər elədilər ki, sən getmə, həm səfərdən təzə gəlibsən, həm də bu saat Çənlibeli başsız qoymaq olmaz. Olmadı ki, olmadı. Aşıq paltarını geyindi, bir də bir at minib Qarsa tərəf yola düşdü. Az getmişdi

bilmirəm, çox getmişdi bimirəm, elə təzəcə Alacalar dağının ətəklərinə çatırdı ki, bir də gördü, budu, Qars tərəfdən bir atlı gəlir. Diqqət eləyib baxdı ki, bu bir cavan oğlandı, necə deyərlər, hələ bığ yeri təzəcə tərləyir. Ürəyində öz-özünə fikirləşib dedi: "Lap yaxşı oldu. Bunu dayandırım, bir əhval-pürsən olum, görüm Qarsda nə var, nə yox". Çağırdı ki:

– Ayə, bir dayan görüm, hardan gəlirsən?

Oğlan atın başını çəkdi ki:

– Qarsdan gəlirəm.

Koroğlu soruşdu:

– Səfərin haradı?

Oğlan dedi:

– Çənlibelə gedirəm.

Koroğlu dedi:

– Çənlibeldə nə işin var?

Oğlan duruxdu. Bir az fikirləşib sonra dedi:

– Elə-belə gedirəm. Koroğlu ilə bir az işim var.

Koroğlu gördü ki, oğlan sözlü adama oxşayır. Dedi:

– Yaxşı, sənin Koroğlu ilə nə salam-sabahın? Bəyəm tanıyırsan?

Oğlan lovğalana-lovğalana dedi:

– Tanıyırsan nədi? Kişi ilə haqq-salamımız var. Mən elə həftədə, on beş də bir gedərəm onun yanına.

Koroğlu baxdı ki, gədə bir az özündən deyəndi, amma ki, deyəsən pis oğlan deyil. Özü də hökmən sözlü adamdı. "Hərçi bada-bad" deyib, birdən qayıtdı ki:

– Koroğlu mənəm. De görüm nə sözün var?

Koroğlu baxdı ki, oğlan onun sözünə inanmır. Aşıq paltarının yaxasını balaca açdı. Elə ki, altdan yaraq-yasaq göründü, oğlan dedi:

– Can Koroğlu, məni bağışla! Yalandan dedim ki, səninlə dostam. Ancaq qəsdən elə deyirdim.

Koroğlu dedi:

– Eybi yoxdu. De görüm, mənə nə sözün var idi?

Oğlan dedi:

– Can Koroğlu, məni Qars paşasının qızı Hürü xanım sənin yanına göndərib. Bil və agah ol! Budu, neçə müddətdi türkmanlı Ərəb Reyhan gəlib əyləşib Qarsda. Qoşun irahlayıb ki, Çənlibelin üstünə gələ. Qars paşası da ona söz verib ki, əgər Çənlibeli ala bilsə, qızı Hürü xanımı

ona verəcək. İndi Hürü xanım məni göndərib sənin yanına ki, əhvalatdan səni xəbərdar eləyəm.

Koroğlu başladı əhval tutmağa. Ordan soruşdu, burdan soruşdu, baxdı ki, oğlan heç bir şey bilmir. Eşitdiyi o imiş ki, onu da deyib. Koroğlu getdi fikrə ki, nə eləsin. Geri qayıtsın, ya irəli getsin. Fikrində çox götür-qoy eləyəndən sonra oğlandan soruşdu:

– Yaxşı, bir mənə de görüm, Qarsda sənin evin-zadın varmı?

Oğlan dedi:

– Var, neynirsən?

Koroğlu dedi:

– İşdi, indi birdən mən Qarsa getməli olsam, məni bir-iki gecə evində saxlaya bilərsənmi?

Oğlan dedi:

– Koroğlu, o nə sözdü deyirsən? Niyə, mən qaraçı deyiləm ki, evim olmasın. Dövlətindən evim də var, qabağında qulluq eləməyə bir qoca, günü keçmiş anam da var. Hamısı, elə mən özüm də üstəlik qurbandı sənə.

Koroğlu dedi:

– Onda sür atını, gedək!

Oğlan sevindiyindən bilmədi ki, nə eləsin. Bayaq ha atı vurub düşdü qabağa. Oğlan qabaqda, Koroğlu dalda at sürüb axşama bir az qalmış özlərini yetirdilər Qarsa. Oğlan məscidin yanında atını saxladı ki:

– Düş! Evim burdadı.

Koroğlu dedi:

– Yox, sən hələ qabaqca məni apar Hürü xanımın yanına. Gərək əvvəl-əvvəl öyrənəm görəm nə var, nə yox. Bəlkə iş elə oldu ki, heç qala bilmədim.

Oğlan dedi:

– Yaxşı, nə deyirəm. İxtiyar sahibisən. Onda sən, bax, elə bu küçə ilə yeri, mən atları bağlayım tövləyə gəlim.

Koroğlu atdan düşdü. Atı oğlana verib küçə ilə getməyə başladı. İndi Koroğlu getməkdə olsun, oğlan atları çəkdi tövləyə, bağladı, yemlədi, ondan çıxdı anasının yanına ki:

– Tez ol, tədarük gör, qonağım var. Mən də gedirəm bazara şey-mey almağa.

Anası soruşdu:

– Bala, qonağın kimdi?

Oğlan dedi:

– Day heç kimə deyib eləməyəsən hə, Koroğludu, tez ol.

Bunu deyib oğlan düzəldi Koroğlunun dalıncan. İndi o getməkdə olsun, biz görək Koroğlu nə elədi.

Koroğlu küçə ilə gələ-gələ gəlib çıxdı bir imarətin qabağına. Baxdı ki, pəncərədə bir qız durub, bir qız durub ki, o necə deyərlər, yemə, içmə xətti-xalına, gül camalına tamaşa elə. Özün öldürsə olar on dörd, on beş yaşı. Amma elə boylu-buxunlu, şəstli-bəstli bir qızdı ki, elə bil sərv ağacıdı, qalxıb. Qaşlar qara, gözlər qara, tellər qara, xallar qara, o necə deyərlər, aya deyir sən çıxma, mən çıxacağam, günə deyir sən çıxma, mən çıxacağam. Ola belə bir gözəl, ola Koroğlu. Ürək coşdu, könül həvalandı, sazı göşünə basıb dedi:

Başına döndüyüm gül üzlü xanım,
Xanım, hansı bəxtəvərin yarısan?!
Görcək səni yara oldu ciyarım,
Bir de, hansı bəxtəvərin yarısan?!

Siyah saçlar dal gərdənə düzülü,
Qara gözlər xumarlanıb süzülü,
Elə baxma, indi canım üzülü,
Xanım, hansı bəxtəvərin yarısan?!

Koroğlu haq deyib, haqdan dərs alıb,
Tər məmənə külək dəyib hovlanıb,
Qara gözlər şux yanaqdan can alıb,
Yoxsa ay qız, bala qonmuş arısan?!

Koroğlu oxumağında olsun, sənə kimdən deyim, haman bu qızdan. Bu qız kim ola, Qars paşasının qızı Hürü xanım.

Hürü xanım Koroğlunu aşıq bildi. Bir tərəfdən də ki, Koroğlu başladı qaşdan, gözdən deməyə, Hürü xanım rübəndi saldı üzünə. Qara elə bil laləli, nərgizli dağ başına qara duman çökdü. Koroğlu ürəyi ipək rübənd qırmızı yanaqları elə qucaqladı, elə qucaqladı ki, belə şeyə tab eləyə bilər? Odu ha sazı basdı döşünə. Dedi:

Oğrun-oğrun tül altından baxan yar,
Qaldır rübəndini, görüm gül üzün!..
Aşıqları eşq oduna yaxan yar,
Qaldır rübəndini, görüm gül üzün!..

Vurulmuşam sarmaşıqlı bağına,
Bostanına, şamamalı tağına,
Apar məni yar deyib otağına,
Qaldır rübəndini, görüm gül üzün!..

Koroğluyam, mən sözümdən dönmərəm,
Səməndərəm, alışmışam, sönmərəm,
Səndən qeyri huri görsəm sevmərəm,
Qaldır rübəndini, görüm gül üzün!..

Elə bu dəmdə oğlan gəlib yetişdi. Baxdı ki, bəli, Koroğlu ilə Hürü xanım tapışıblar. Ürəyində çox sevindi ki, elə yaxşı oldu. Day mən dayanmayıb gedərəm bazara. Yoxsa axşamdı. Bazar bağlanar. Bir şey tapa bilmərəm, Koroğlunun yanında xəcalət olaram. Day nə bilsin ki, bunlar heç bir-birisini tanımırlar. Nə Hürü xanım Koroğlunu tanıyır, nə də Koroğlu Hürünü. Elə ki, oğlan gəlib çatdı, əvvəl-əvvəl əlin döşünə qoyub kamal-ədəblə Hürü xanıma salam verdi. Ondan gülə-gülə Koroğluya işarə elədi. Yanı ki, necə gördün bu qoç oğlanı? Gedib lap özünü gətirdim. Koroğlu soruşdu:

– Ayə, bu qız kim ola?

Oğlan dedi:

– Hürü xanımdı da... Paşanın qızı. Bəs siz hələ bir-birinizi tanımırsız?

Bu sözdə Hürü xanım da tələsik pəncərədən çəkilib çıxdı eyvana. Elə ağzını açıb danışmaq isətyirdi ki, bir də gördülər, budu, Ərəb Reyhanla paşa atlı bu tərəfə gəlirlər. Qız elə bircə bunu deyə bildi ki:

– Atamgil gəlirlər, tez çəkilin!

Hürü xanım sözünü deyib evə girdi, oğlan da Koroğlunu götürüb tez aradan çıxdı. Elə ki, gəlib yetişdilər məscidin qabağına, oğlan dedi:

– Can Koroğlu, indi paşagil şəhərdədirlər. Day sənə çöldə qalmaq olmaz. Sən zəhmət çək gir evdə otur. Mən də bazara dəyib qayıdaram, gecəni yatarıq, səhər görək nə eləyirik.

Koroğlu razı oldu. Oğlan Koroğlunu gətirdi evə. Oğlanın anası qabağa çıxdı. Xoşgəldin elədi. Yer düzəltdi. Elə ki, Koroğlu əyləşdi, oğlan dedi:

– İndi mənə rüsxət ver, bir bazara dəyim, gəlim.

Bunu, deyib, oğlan evdən çıxdı. İndi Koroğlu evdə rahatlanmaqda olsun, sənə kimdən deyim, oğlandan.

Oğlan bazara çatanda dükanlar bağlanmaq üzrə idi. O, qabaqcan özünü verdi bir baqqal dükanına ki:

– Əmi, başına dönüm, tez ol, mənə iki batman düyü ver! Qonağım var.

Düyünü baqqaldan alıb, tökdü torbaya. Dalına alıb özünü yetirdi qəssaba. Gördü yaxşı ət var, amma yaman da basabasdı. Başladı adamları o yan-bu yana itələyib özünə yol açmağa. Ona bir yumruq, buna bir dürtmə, axırda adamlardan biri hirsləndi ki:

– Nə olub. Qaçaqaç deyil ki? Dayan da!..

Oğlan dedi:

– Dayana bilmirəm. Alınası şeylərim var. Dükan-bazar bağlanır. Qonağım var.

Dedilər:

– Nə olsun? Sənin qonağın göydən-zaddan gəlməyib ki...

Adamlar çox dedilər, oğlan az eşitdi, elə deyişə-deyişə özünü saldı dükana. Camaat gördü yox, bu, həyasızlığa salıb almaq istəyir. Qəssaba dedilər ki, ona ət verməsin. Qəssabın da tərs damarı tutdu. Oğlan nə qədər elədisə, dedi:

– Olmaz ki, olmaz. Gərək bu adamın hamısı qurtara, sonra sənə ət verəm.

Oğlanın əlacı kəsilib axırda qəssabın qulağına dedi:

– Evin yıxılsın, bilsən ki, mənim qonağım kimdi, heç belə eləməzsən.

Qəssab da bir dübbənin, adam ələ salanın biri idi. Soruşdu ki:

– Kimdi qonağın? De bu saat səni yola salım. Yoxsa Ərəb Reyhandı? Ya paşadı?

Oğlan dedi:

– Yox, onlar deyil. Day heç kəs bilməsin, qonağım qoç Koroğludu.

Qəssab şaqqıldadı. Dedi:

– Camaat, bunun qonağı Koroğlu imiş.

Hamı gülüşdü. Qəssab gülə-gülə dedi:

– Bu saat səni yola salacağam. De görüm, nə qədər istəyirsən? Bir girvənkə, ya altı misqal?

Oğlan dedi:

– Bir girvənkə nədi? Sənə ağzımda söz deyirəm. Bir batman ət çək!

Gördülər yox, oğlan deyəsən zarafat eləmir. Dalında da düyü-zad var. Qərəz, qəssab oğlanın ətini verib, yola saldı.

Camaat arasına söz düşdü ki, bəs Koroğlu gəlib Qarsa. Özü də filankəsin evində qonaqdı. De inanan, inanmayan başladı danışmağa. Atalar deyiblər, bir sirr ki, otuz iki dişin arasından çıxdı, day onu saxlamaq olmaz. Bir anda bütün ətrafa səs yayıldı. Xəbərdən-xəbərə, xəbərdən-xəbərə, söz axırda gəlib çatdı Ərəb Reyhanla paşanın qulağına.

Paşa xəbəri eşitcək durdu ayağa ki:

– Qoşun götürüb, gedək Koroğlunu tutaq!

Ərəb Reyhan dedi:

– Yox. Buna Koroğlu deyərlər. Elə belə onu tutmaq çətin işdi. Bütün qoşunu qırıb tələf eləyər, özü də aradan çıxar.

Paşa dedi:

– Bəs nə eləyək?

Ərəb Reyhan dedi:

– Sən heç özünü onda qoyma. Elə bil ki, biz heç bu sözü eşitməmişik. Qoy qaranlıq düşsün. Elə ki, hamı yatdı. Gecənin bir yarısı qoşun götürüb, elə yorğan-döşəyinin içində tutarıq. Ayrı heç bir əlacı yoxdu.

Ondan Ərəb Reyhan əmr elədi şəhərin ətrafını citəmə qoşun tutdu. Özlərinə də tapşırdı ki, səhərə qədər nə kənardan şəhərə adam qoysunlar, nə də şəhərdən kənara. Elə ki, tədbirlərini görüb qurtardılar, ondan oturub başladılar gözləmyə. O qədər gözlədilər ki, oldu gecənin yarısı. Ondan durub qoşun götürüb töküldülər evin üstünə. Koroğlu, heç bir şeydən xəbəri yox, şirin yuxuda, bir də beş-altı adam töküldü üstünə. Sərasimə yerindən qalxıb onu o yana, bunu bu yana, baxdı ki, ev doludu adamla. Hamısı da yaraqlı-yasaqlı. Ətrafına baxıb, gördü nə qılıncı yerində deyil, nə oxu. De güç verdi yumruğa, birini, ikisini, beşini onunu; gördü yox, olmayacaq. Dartıb birinin əlindən qılıncını alıb döşəndi otaqdakıların canına. Axırda ki bir təhər özünə yol açıb evdən çıxdı.

Baxdı ki, həyət doludu. Yolu hər tərəfdən tutublar. Qaranlıq, özü də ki, nabələd. Ağzı düşdü bir tərəfə. Nə qədər getdi, necə getdi bilmədi, bir də onu gördü ki, qabağına balaca bir qapı gəldi. Qoşun da daldan gəlir. Day əlacı kəsildi, açıb qapını girdi içəriyə. Sən demə, bura minarəyə çıxmaq üçün yol imiş. Day haraya çatacaq? Qoşun da elə bil ki, bilirmiş. O saat kəsdilər qapının ağzını. Koroğlu elə onu bildi ki, qapını çəkdi. Tez əl atıb minarənin pilləkənlərindən bir-iki böyük sal qoparıb saldı qapının dalına. Ondan day orada dayanmayıb, birbaşa qalxdı minarənin təpəsinə ki, görsün nə var, nə yox? Xəbər çatdı Ərəb Reyhana ki, bəs Koroğlu çıxdı minarəyə. Ərəb Reyhan o saat əmr

eylədi. Minarənin dörd ətrafını qoşun bürüdü. Koroğlu minarədə, qoşun yerdə başladılar səhəri gözləməyə.

İndi bunlar gözləməkdə olsunlar, sənə kimdən xəbər verim, bizim oğlandan, yəni evin sahibindən. Elə ki, qoşun doldu həyətə, oğlan məsələni başa düşdü. Bildi ki, paşalar xəbər tutublar. Özünü itirməyib durdu, qaranlıqda özünü adamların arasına vurub çıxdı küçəyə. De asta qaçan namərddi. Birbaş özünü saldı Hürü xanımın yanına. Hürü xanım da oyaqdı. Hürü xanım onu görcək soruşdu:

– Nə var? Bu nə qoşunkeşlikdi? Yoxsa Koroğludan xəbər tutublar?

Oğlan əhvalatı danışdı. Hürü xanım dedi:

– Yaxşı eyləyibsən ki, qaçıbsan. Yoxsa sən də ələ keçərdin.

Sonra oğlana dedi:

– Yaxşı, düzünü de görüm, Koroğlunun burada olmağını bir adamazada deməyibsən ki?

Oğlan bir getdi fikirə. İndi başa düşdü ki, bu işlər hamısı onun öz taqsırıdı. Əhvalatı, necə ki, olmuşdu, qəssaba necə demişdi, qəssab camaata necə demişdi, hamısını danışdı.

Hürü xanım heç bir söz demədi. Dinməz-söyləməz başını saldı aşağıya. Oğlan baxdı ki, vallah, Hürü xanım elə hirslənib ki, o necə deyərlər, bıçaq vursan qanı çıxmaz.

Durdu ayağa ki:

– Mən də gedirəm. Qoy məni də tutsunlar, ikimizi də bir yerdə assınlar. Mən bu namussuzluğu götürə bilmərəm ki, mənim ucumdan o kişi tutulsun, mən sağ qalam.

Hürü xanım dedi:

– Yaxşı getdin, səni də tutdular. Bundan Koroğluya nə mənfəət olacaq?

Oğlan dedi:

– Bəs nə eləyim?

Hürü xanım dedi:

– Get, gözlə. Elə ki, səhər açıldı, şəhərin kənarından qoşunu götürdülər, bir dənə yüyrək at minib, özünü yetir Çənlibelə. Əhvalatı xəbər ver.

Söz oğlanın beyninə batdı. Oradan özünü verdi şəhərin kənarına. Bir yerdə gizlənib, o qədər gözlədi ki, şəhər darvazaları açıldı. Bir dənə at minib özün vurdu yola. İndi oğlan getməyində olsun, sənə deyim Koroğludan.

Elə ki, hava yavaş-yavaş başladı bozarmağa, Koroğlu gördü bir uca minarənin başındadı, qoşun da dörd bir tərəfi tutub. Qaldı məəttəl ki, nə eləsin. Aşağı düşsün? Nə yarağı, var, nə atı. Burada qalsın, nə vaxtacan qalsın? Ürəyi qübar elədi. Dəlilər yadına düşdü. Dedi:

Misri qılınc əldə təng olanlarım,
Qoçaq igidlərim yanımda gərək!
Kəsilə kəllələr, boş qala leşlər,
Dal xançallar düşman qanında gərək!

Alıb piyaləni içən sağıdan,
Qoxmayın hər yetən qanlı yağıdan,
Hoy deyəndə ağır tüplər dağıdan
Xan Eyvazım bu gün yanımda gərək!

At süzüb özünü mənə yetirən,
Koroğluya yüz min qulluq bitirən,
Səksək putu bir əlində götürən
Dəmirçioğlu bu gün yanımda gərək!

Qollarına dəmir polad taxdıran,
Düşmanları girvələrdən baxdıran,
Su yerinə qızıl qanlar axdıran,
Dəli Həsən bu gün yanımda gərək!

Koroğlu çağırır genə Səfəri,
Yox imiş dünyanın sonu, səməri,
Qıraram dəstəni, vurram nəfəri,
Ərənlərin piri yanımda gərək!

Koroğlu oxuduqca səhər də yavaş-yavaş açılırdı. Axırda hər tərəf işıqlandı. Sis, duman çəkilib getdi. Koroğlu minarənin başından Çənlibelə tərəf baxdı. Amma hərci elədi, Çənlibeli görə bilmədi. Dağlar, elə bil ki, qəsdən aranı kəsmişdi. Koroğlu dedi:

Göydən bir cüt sona endi,
Aylı dağın arasına.
Yar ki yardan küsər oldu
Ağlar, sızlar, çarası nə?

Qızıl almanı dişləsin,
Ətrafını gümüşləsin,
Yol düşsün, karvan işləsin
Nigar yarın obasına.

Koroğluya olan oldu,
Qaynadı peymanam doldu,
Dəlilərim məndən oldu,
Dağlar düşdü arasına.

Elə ki, səhər açıldı, gün çıxıb dağlara yayıldı, uzaqdan, dağların başının üstündən Çənlibel dağlarının qarlı başları göründü. Bu, Koroğlunu qubarlandırdı:

Uzaq-uzaq dağ başında
Tala-tala qar görünür.
Nə dəlilər, nə Çənlibel,
Nə alagöz yar görünür.

Ətrafım tir, kaman, oxdu,
Dəlilər yanımda yoxdu,
Mən yalğızam, düşman çoxdu,
Qaçmaq mənə az görünür.

Divanə könlüm şad olmaz,
Laçın könlüm ovsun almaz,
Baxıram, Eyvaz görünməz,
Dünya mənə dar görünür.

Bu sinəm yaralı düşdü,
Dağların maralı düşdü,
Yar məndən aralı düşdü,
Tərlan uçmaz, sar görünür.

Koroğlunun məlul çağı,
Durulmaz keyfi, damağı.
Bar gətirib gürcü bağı,
Dal budaqda nar görünür.

Ərəb Reyhan Koroğlunun belə dərdli-dərdli oxumağını eşidib çox şad oldu. Paşanı da götürüb, gəldi minarənin ayağına. Çağırıb dedi:

– Koroğlu, sabahın xeyir olsun! Allah heç kəsin borcunu heç kəsdə qoymaz. Yaxşı yerdə düşübsən əlimə.

Koroğlu dedi:

– Ərəb Reyhan, sənin mənimlə xüsusi haqq-hesabın var. Day bu qoşunu-zadı niyə yığıbsan bura? Yol ver düşüm, vuruşaq. Ya sənə verən Allah, ya mənə.

Ərəb Reyhan dedi:

– Yox, Koroğlu! Bu da olmadı keçən səfərki. Mən indi səni sağ-salamat oradan düşürtsəm hamı mənə axmaq deyər.

Koroğlu dedi:

– Bəs fikrin nədi?

Ərəb Reyhan dedi:

– Fikrim odu ki, gərək özün təslim olasan, çıxıb orada qollarını bağlayalar, sonra düşürdələr aşağıya.

Koroğlu dedi:

– Yaxşı, təslimən. Çıx, bağla qollarımı.

Ərəb Reyhan dedi:

– Yox, mən yox. Mən oraya çıxmaram.

Koroğlu dedi:

– Yaxşı, buyursun, kim çıxır, çıxsın.

Ərəb Reyhan baxdı ki, bü doğrudan da axmaq fikirdi. Heç kəs qorxudan oraya çıxmaz. Əmr elədi kamandarlar gəldilər. Koroğlu baxdı ki, Ərəb Reyhan onu oxa basmaq istəyir. Dedi:

– Ayə, mən səni bir ağıllı adam bilirdim. Amma sən lap sarsaqsanmış. Yaxşı, mən minarənin içinə girəndən sonra ox mənə nə eləyəcək?

Ərəb Reyhan gördü yox, bu da axmaq fikirdi, Koroğlu doğru deyir. Dedi:

– Yaxşı, eybi yoxdu. Ox da atmarıq. Elə sən otur orada, biz də dayanaq burada. Axırda acından, susuzundan ölərsən, leşinə sahib olarıq.

Koroğlu baxdı ki, bu çox pis tədbirdi. Əgər doğrudan belə eləsələr, acından, suzundan öləcək. Getdi fikrə ki, nə eləsin. Çox götür-qoydan sonra gördü ki, qorxutmaqdan başqa çarəsi yoxdu. Dedi:

– Yaxşı, sən məni o qədər axmaq hesab eləyirsən ki, mən tək-tənha durub gələm buraya. Mənim adamım indi Çənlibelə çatıb. Çox çəkməz ki, yeddi min yeddi yüz yetmiş yeddi dəli alar Qarsın üstünü. Görüm onda nə eləyəcəksiz.

Bu sözdən paşa da, Ərəb Reyhan da düşdülər qorxuya. Paşa elə bil yatmışdı, ayıldı. Çağırdı ki:

– Əyə, bir baxın görün o qarının oğlu haramzada haradadı? O heç mənim gözümə dəymədi. Bəlkə elə onu göndərib xəbərə.

Düşdülər ora oğlan, bura oğlan, oğlan hayanda idi? Tapa bilmədilər ki, tapa bilmədilər. Məsələ lap aydın oldu. Paşa tutdu Ərəb Reyhanın yaxasından ki:

– Tez ol, nə eləyirsən, elə! Dəlilər şəhərə dolsa, daşı daş üstə qoymazlar.

Ərəb Reyhan əmr elədi, külüngçülər, qazmaçılar gəldilər, hökm elədi ki, bu saat başlayın minarənin dibini qazımağa. Onda ya özü qorxudan təslim olar, ya da ki, minarəylə bir yerdə yıxılıb ölər. O, öləndən sonra dəlilərlə danışmaq asandı.

Külüngçülər başladılar minarənin dibini qazımağa. Koroğlu gördü ki, yox, iş şuluxlaşdı. Fikirləşdi ki, eybi yoxdu. Qoy qazısınlar. Elə ki, gördüm minarə doğrudan da yıxılır, düşüb duraram lap aşağıda, qapının yanında. Görək ondan sonra kim peşiman olacaq. Əgər buradan salamat çıxaram, mən bilərəm neyləyrəm.

Bəli, külüngçülər qazımaqda olsunlar, Koroğlu da gözləməkdə eşit, indi sənə kimdən deyim, oğlandan.

Oğlan atı elə sürmüşdü ki, Çənlibelin ətəyinə çatanda, at yıxılıb çatladı. Dəlilər pusqudan çıxıb, onu tutdular, birbaş Çənlibelə gətirdilər. Dəli Həsən soruşdu:

– Kimsən? Haradan gəlirsən?

Oğlan bütün əhvalatı başdan-ayağa danışdı. Özü də başladı yalvarmağa ki:

– Tez olun. Yoxsa Koroğlunu öldürərlər.

Dəlilər Nigar xanımdan soruşdular:

– Nigar xanım, söz sənindi. De görək, necə eləyək?

Nigar xanım dedi:

– Bu saat Çənlibeli başsız qoymaq olmaz. Mən deyirəm belə eləyək. Dəli Həsən min dəli ilə öz yerində qalsın. Dəmirçioğlu da min dəli ilə öz yerində. Qalan dəliləri Eyvaz götürüb Koroğlunun dalınca getsin.

Ondan üzün Dəli Həsənə tutub soruşdu:

– Sən nə deyirsən?

Dəli Həsən də, Dəmirçioğlu da, Eyvaz da hamısı Nigar xanımın fikrini bəyəndi. O saat dəlilər atlandı. Bizim oğlana da bir at verdilər, mindi, düşdü qabağa. De sürhasür, sürhasür, gəlib yetişdilər Qarsın ətrafına. Eyvaz dedi:

– Biz əgər belə şəhərə girsək, Koroğluya xətər yetirərlər.

Hökm elədi, dəlilərdən yeddi yüz nəfəri ayrıldı. Hər yüzü verdi bir dəstəbaşıya. Yüz nəfər də özü götürdü. Qalan dəlilərə tapşırdı ki, şəhəri mühasirəyə alıb gözləsinlər. Dava qızışanda hər tərəfdən dolsunlar.

Yeddi yüz dəli, altı dəstəbaşı, bir də oğlan dördəmə, siyirməqılınc atları sürdülər şəhərə. Keşikçiləri qoymadılar ki, nəfəs alsınlar. Keçib girdilər şəhərin içinə. Hər dəstə başladı bir küçə ilə getməyə. Eyvaz özü də oğlanı götürüb, yüz nəfər dəli ilə düşdü küçələrin birinə. Bu küçə hansı küçə ola, hansı küçə ola, haman o küçə ola ki, Koroğlu gedib Hürü xanıma rast gəlmişdi. Elə bir az at sürmüşdülər ki, Hürü xanımın imarəti göründü. Oğlan baxdı ki, Hürü xanım durub pəncərədə yola baxır. Tez ata bir taziyanə çəkib özünü yetirdi onun bərabərinə ki:

– Hürü xanım, muştuluğumu ver! Xan Eyvazın özünü dəlilərlə gətirmişəm. Bu saat Ərəb Reyhana bir toy tutsunlar ki...

Hürü xanım belə baxanda gördü budu, siyirməqılınc bir dəstə atlı gəlir ki, hərəsi min cana dəyər. Amma qabaqlarında bir oğlan gəlir, bir oğlan gəlir ki, elə bil on dörd gecəlik aydı. Bildi ki, bu xan Eyvazdı, Hürü xanım Eyvazın tərifini çox eşitmişdi. Amma özünü heç görməmişdi. Baxdı ki, vallah, bu bir oğlandı, bir oğlandı Yusif-zad nədi bunun yanında. Bir ürəkdən min ürəyə vuruldu Eyvaza. Qara saçlardan üç tel ayırıb, basdı turunc məmələrin üstünə. Dedi:

De, sən handa, bura handa,
Adı bəlli xan Eyvazım?!
Misri qılınc durmaz qında,
Adı bəlli xan Eyvazım!

Coşar dəli könül, coşar,
Coşuban həddindən aşar,
Xan tərpənər, qoşun qaçar,
Adı bəlli xan Eyvazım!

Bəlkə gəlmisən sorağa,
Daşın atılar irağa,
Hürü aparsın otağa,
Adı bəlli xan Eyvazım!

Söz tamama yetişdi. Aldı Eyvaz onun cavabında dedi:

Uzaq ellərdən gəlmişəm,
Dindirmə, məni dindirmə!
Yarı mənzildə qalmışam,
Dindirmə, məni dindirmə!

Mən bülbüləm, gülüm alam,
O dərddən saralıb, solam,
Bir ağası itmiş qulam,
Dindirmə, məni dindirmə!

Seçərəm sultanı, xanı,
Axıdaram qızıl qanı,
Eyvaz, qoç Koroğlu hanı?
Dindirmə, məni dindirmə!

İndi eşit Koroğludan. Külüngçülər minarənin dibini o qədər qazmışdırlar ki, minarə az qalırdı yıxılsın. Koroğlu işi belə görüb, düşüb lap aşağıda kəsmişdi minarənin qapısını. Elə bu dəmdə bir də qulağına bir səs gəldi. Diqqətlə qulaq verib gördü oxuyan Eyvazdı. Hər şey yaddan çıxdı. Nə qorxu qaldı, nə hürkü. Dik çıxdı minarənin başına. Sevindiyindən bir dəli nərə çəkib dedi:

Şükür olsun bir Allaha,
Bu gələn Eyvaz səsidi.
Məni yadına salıbdı,
Bu gələn Eyvaz səsidi.

Girər meydana xan kimi,
Dolar gözləri qan kimi,
Bir alıcı tərlan kimi,
Bu gələn Eyvaz səsidi.

İndi bağladar qolunu,
Qırar sağını, solunu,
Yada salıb Koroğlunu,
Bu gələn Eyvaz səsidi.

Koroğlu hələ sözünü tamam eləməmişdi ki, şəhərdə vurhavur qopdu. Ərəb Reyhan belə baxanda gördü vallah, budu, bir dəstə siyirməqılınc atlı elə gəlir, elə gəlir ki, elə bil bir dəstə tərlandı ördəyə, qaza gəlir. Tez keçdi meydanın bu biri tərəfinə ki, qoşun böyüklərini çağırsın. Baxdı ki, bir belə dəstə də bu tərəfdən gəlir. Belə dönəndə gördü budu, bir dəstə atlı da bu biri küçədə, olar bir üç yüz-dörd yüz əskəri qatıb qabağına qarqa-quzğun kimi qova-qova gətirir. Ərəb Reyhan özünü itirdi. Bilmədi nə eləsin. Elə bu dəmdə Qars paşasının qoşun böyüyü özünü yetirdi ki:

– Nə durubsunuz? Dəlilər şəhərə ətdən divar çəkiblər. Başınızın çarəsini eləyin.

Ərəb Reyhan dedi:

– Görürəm. Qoy gəlsinlər. Sən qoşunu hazır saxla! Elə ki, onlar gəlib buraya doldular, sən dallarını kəs!

Qoşun böyüyü dedi:

– Nə dallarını kəs? Bunlar nədi ki? Beş-altı min dəli şəhərin ətrafını tutub. Bunlar elçilərdi belə gəlirlər.

Ərəb Reyhan baxdı ki, bir su içim saatda dəlilər meydanın ətrafını aldılar.

Bu dəmdə bir dəli nərə səsi gəldi. Ərəb Reyhan döndü ki, budu bir dəstə gəlir, qabaqlarında da Eyvaz.

Eyvaz Ərəb Reyhanı görcək tanıdı. Dedi:

– Ya budu ki, bu saat Koroğlunu ver, ya budu ki, bir hay vurub şəhərin torpağını torba ilə daşıtdıracağam.

Ərəb Reyhan da igid adam idi. Yeridi qabağa dedi:

– Eyvaz, Koroğlu bax, odu minarədə.

Eyvaz belə baxanda Koroğlunu gördü. Ərəb Reyhan dedi:

– İndi bura bax!

Bunu deyib Ərəb Reyhan minarənin dibinə işarə elədi. Eyvaz baxdı ki, minarə elə handa-handadı yıxılsın. İki yüzəcən külünglü adam da hazır dayanıb əmr gözləyir. Ərəb Reyhan dedi:

– Koroğlu mənim əlimdədi. Bircə dəfə işarə eləsəm minarə gedəcək. İndi sən gəlmisən onu qurtarmağa. Yaxşısı, budu ki, nə sənin qoşunun qırılsın, nə də mənim. Gəl bu meydanda ikimiz vuruşaq, sən məni öldürdün, Koroğlu da sənin, hər şey də sənin. Nə eləyərsən özün bilərsən, yox, mən səni öldürdüm, genə də nə eləyərəm özüm bilərəm.

Eyvaz bir Ərəb Reyhana baxdı, bir dönüb Koroğluya baxdı, bir də belə dönəndə baxdı ki, Hürü xanım gəlib meydanın bir tərəfində dayanıb bunlara baxır. Elə bil dünya-aləm Eyvazın başına fırlandı. Bir dəli nərə çəkib meydanı dolanmağa başladı. Koroğlu da minarədən baxırdı. Gördü yox, deyəsən Eyvaz vuruşmaq istəyir. Koroğlu Ərəb Reyhanın gücünə bələd idi. Bilidi ki, Eyvaz onun öhdəsindən gələ bilməyəcək. Odu ki, qışqırıb dedi:

– Eyvaz, məbada meydana girəsən. Əgər igiddi, qoy mənnən vuruşsun.

Gördü yox, Eyvaz heç eşitmir. Dedi:

– Ayə, minarənin yıxılacağından mənə ziyan yoxdu. Qorxma, qoy uçursunlar.

Eyvaz hara, söz eşitmək hara? Elə idi, elə idi ki, dönmüşdü bir aslan balasına, zəncir gəmirirdi. Bir dəfə meydanı gərdiş eləyib üzünü tutdu Ərəb Reyhana. Dedi:

Mərdsən, gəl meydana, paşa!
Savaşaq indi sənnən mən.
Gör gücümü, eylə haşa,
Savaşaq indi sənnən mən.

Götürrəm əlimə nizə,
Mərdlər əhsən desin bizə,
Duraq meydanda üz-üzə,
Savaşaq indi sənnən mən.

Demə mənə bu hədyanın,
Yəqin bil ki, allam canın,
Qılıncla tökərəm qanın,
Savaşaq indi sənnən mən.

Gərək dost, düşmanın seçəm,
Çətin olar qorxam qaçam,
İstərəm ki, meydan açam,
Savaşaq indi sənnən mən.

Mən Eyvazam, durmuşam mərd,
Yaman ürəyə ollam dərd,
İgidsənsə ol meydangərd,
Savaşaq indi sənnən mən.

Eyvaz sözünü tamam eləyib atı vurdu, Ərəb Reyhan da öz atını cövlana gətirdi. Koroğlu gördü day ayrı əlac yoxdu, bir dəli nərə çəkib dedi:

Eyvazım minəndə Dürat belinə,
Gərək göydə quşlar qanad saxlasın,
Dava günü hər kim düşsə əlinə,
Qabağında diz çökübən ağlasın.

Şığıyıb düşmana qəddini bükər,
Girəndə şəhərə bürc-barı sökər,
Paşalar başında acı turp əkər,
İgid gərək zərbəsini haxlasın.

Mərd böyüyüb mərd ağası, mərd xanı,
Tutacaq şöhrəti cümlə-cahanı,
Gəzəcək Misiri, Şamı, Osmanı,
İgid gərək qabağında tablasın.

Qərəz, Ərəb Reyhanla Eyvaz başladılar davaya. Şeşpərdən, gürzdən murad hasil olmadı, əl elədilər qılınca. Qılınclar sındı, töküldü, əl elədilər nizəyə, nizədən də kar çıxmayanda atdan düşüb başladılar küştüyə. İlan kimi sarmaşdılar bir-birinə. Kotan kimi başladılar meydanın torpağını sökməyə. Eyvaz cavan, bərkə-boşa düşməmiş adam, Ərəb Reyhan min ilin pəhləvanı. Day, o necə deyərlər, pəhlivanlıq elminin bir dəlmə-deşiyi yox idi ki, Ərəb Reyhan oraya baş vurmamış ola. Neçə-neçə adlı pəhlivanlar basmışdı. O necə deyərlər, ad çıxartmışdı. Girələyib Eyvazın çiyin damarlarını saldı cənginə. Eyvazın gözləri başladı qaralmağa. Elə bil ki, dünya, aləm durdu başına hərlənməyə. Koroğlu baxdı ki, Eyvaz gedir. Ürəyi tablamadı. Elə bir nərə çəkdi ki, dağ-daş titrədi, dedi:

Canım Eyvaz, gözüm Eyvaz,
Bir bəri dön, bax bu yana!
Amandı qoç dəlilərim
Qoyma dönsün qəlbi qana!

Ondan üzünü meydanda duran Hürü xanıma tərəf tutub dedi:

Dayanıbdı o, xan kimi,
Baxır sənə sultan kimi,
Qalx, alıcı tərlan kimi
Təzədən gir bu meydana!

Qılıncın ağzı zağlıdı,
Dostunun yolu bağlıdı,
Koroğlu qəlbi dağlıdı,
Qoyma batsın çən-dumana!

Elə bil ki, Koroğlunun sözlərindən Eyvaza qüvvət gəldi. Bir güc verib Ərəb Reyhanın əlindən qurtardı. Dəlilərin əhsən səsi göyə ucaldı. Eyvaz bir dəfə meydanı hərlənib dedi:

Koroğlu buyurub buyruğu,
Gərək mən sənin, mən sənin.
Çəkib qopardam boynunu
Gərək mən sənin, mən sənin.

Bir ac qurdam, gəldim bura,
Əyri qılınc boynun vura,
Gözaltını alam sora
Gərək mən sənin, mən sənin.

Eyvazam, gərək yetirəm,
Hürüyə qulluq bitirəm,
Adın dünyadan itirəm
Gərək mən sənin, mən sənin.

Sözünü qurtarıb qızmış nər kimi özünü atdı Ərəb Reyhanın üstünə. Elə birinci həmlədə Ərəb Reyhanı vurub sərdi yerə. Day aman verməyib düşdü üstünə. Bu dəfə də Eyvaz Ərəb Reyhanın çiyin damarlarını keçirtdi barmaqlarına. Ərəb Reyhanın ağzı başladı köpüklənməyə, Koroğlu işi belə görəndə dedi:

Yaxşı yerdə axşamladın,
Ərəb oğlu, Ərəb oğlu.
Boynuna kəfən doladın,
Ərəb oğlu, Ərəb oğlu.

Döyül bir də bac verəsi,
İndi alar can kirəsi,
Sənsən yer-yurdun birəsi,
Ərəb oğlu, Ərəb oğlu.

Tanı Koroğlu soyunu,
Gör cida təki boyunu,
Açdı başına oyunu,
Ərəb oğlu, Ərəb oğlu!

Eyvaz birdən Ərəb Reyhanın çiyinlərini buraxıb yapışdı bel kəmərindən. Bir "ya mədəd!" – deyib dik qaldırdı göyə, vurub yerə, çökdü sinəsinə.

Meydan qarışdı bir-birinə. "Əhsən, əhsən!" səsindən qulaq tutuldu. Koroğlu minarədən üzün Ərəb Reyhana tutub dedi:

Uca dağların başında
Duman olu, çiskin olu.
Qar yağıban girdə bağlar
Acı yellər əskin olu.

Bir igidin zatı olsa,
Qolunun qüvvəti olsa,
Meydan görmüş atı olsa,
Zülfüqarı kəskin olu.

İgidə yoldaş olmasa,
Bir qoşuna baş olmasa,
Hu deyib savaş olmasa,
Ağır leşkər basqın olu.

Alıcı quşlar əllərdə
Ovlağı olar göllərdə,
Qərib igid, yad ellərdə
Dinə bilməz, miskin olu.

Ögünmə quzum, ögünmə,
Daşlar alıban dökünmə,
Hu deyib meydana girmə,
Əl var əldən üstün olu.

Bunu deyib, Koroğlu işarə elədi. Eyvaz xəncəri çəkib dayadı Ərəb Reyhanın boğazına. Onda döndü Koroğluya tərəf ki, görsün onun fikri nədi. Koroğlu dedi:

– Eyvaz, mən bir dəfə onu mərdliklə basıb, mərdliklə də buraxmışdım. Amma o bunun əvəzində mənə namərdlik elədi. Namərdi də gərək bu dünyada yaşamasın.

Eyvaza elə bu söz bəs idi. Bayaq ha xəncəri çəkib, başı leşdən elədi, leşi başdan.

O saat dəlilər minarənin qapısını açdılar. Koroğlu çıxdı bayıra. Ərəb Reyhanın qoşunu sərkərdələrini ölmüş görüb təslim oldular. Dəlilər hamısı doldular şəhərə.

Paşanı nə qədər axtardılar, tapa bilmədilər. O necə deyərlər, oldu bir parça yağlı əppək, çəkildi göyə. Koroğlu dedi:

– Eybi yoxdu. Bu da bir cür igidlikdi. Bu cür adamların igidliyi ondu. Doqquzu qaçmaqdı, biri heç gözə görünməmək. Day axtarmayın!

Qərəz, dəlilər atları mindilər. Hamı hazırlandı. Koroğlu hay vurdu ki, yola düşsünlər. Dəstə hərəkətə gəldi. Koroğlu baxdı ki, Eyvaz hələ heç ata minməyib, heç deyəsən minmək fikrində də deyil. Soruşdu ki:

– Eyvaz, nə gözləyirsən? Niyə minmirsən?

Eyvaz cavab vermədi. Koroğlu bir də soruşdu. Eyvaz yenə də cavab vermədi. Koroğlu üçüncü dəfə soruşanda Eyvaz sazı götürdü. Gözlərini dolandırıb bir dəfə ətrafa baxdı, dedi:

Uca dağların başında,
Ala-dəmgil qar görünür.
Mənim bu dəli könlümə
Bir alagöz yar görünür.

Göründü dostumun kəndi,
Əməydim ləbindən qəndi,
Açıldı köksünün bəndi,
Qoynunda cüt nar görünür.

Koroğlu dönüb Eyvazın baxdığı tərəfə baxanda nə gördü? Gördü Hürü xanım qulaş saçları töküb gərdəninə, boynunu qoyub çiyninə, elə baxır, elə baxır ki, elə bil bir dənə yaralı ceyrandı. Koroğlu məsələni başa düşdü. Elə bu fikirdə idi ki, nə eləsin.

Eyvaz aldı sözün o biri xanəsini, dedi:

Mən Eyvazam, dözəmmərəm,
Al geyinib bəzənmərəm,
Çənlibeldə gəzənmərəm,
Dünya mənə dar görünür.

Məsələ Koroğlu üçün aydın oldu. Day fikirləşməyə yer qalmadı. Ata bir qırmanc vurdu, Hürünün yanına çatanda əlini uzadıb dik götürdü,

qoydu tərkinə, düzəldi yola. Eyvaz da qalxıb atı mindi, düşdü Koroğlunun dalına.

Qərəz, dəstə şəhərdən çıxıb Çənlibelə tərəf yola düzəldi. Bir az getmişdilər, bir də baxdılar ki, oğlan, tərkində də bir nəfər gedir. Koroğlu çatıb soruşdu:

– Dostum, sən hara?

Oğlan dedi:

– Çənlibelə. Day bundan sonra mən Qarsda duruş gətirə bilmərəm.

Koroğlu dedi:

– Bəs o tərkindəki kimdi?

Oğlan dedi:

– Anamdı. Elə yerli-dibli birdəfəlik köçürəm.

Bəli, orda uzun-uzun yol ilə, burda müxtəsər dil ilə, dəstə gəlib Çənlibelə çatdı.

Day pişvaz, nə pişvaz. Görüş, nə görüş... Koroğlu hökm elədi Hürü xanımın ayağının altında yeddi yüz yetmiş yeddi qurban kəsdilər. Koroğlu dedi:

– Gərək Eyvaza elə bir toy eləyəm ki, ruzigarın közü belə toy görməmiş ola.

Dəlilər dedi:

– Koroğlu, indi toy vaxtı deyil.

Koroğlu dedi:

– Elə əsl toy vaxtı indidi. Hasan paşa istəyirdi ki, Bolu bəyin, bir də Ərəb Reyhanın əli ilə iş düzəltsin. Bolu bəyi darmadağın eləyib, nişanlısı Dünya xanımı gətirmişəm. Ərəb Reyhanı da cəhənnəmə vasil eləyib, Hürü xanımı gətirmişəm. İnşallah Toqatı da dağıdıb Hasan paşanın özünü Çənlibelə gətirəcəyəm.

Məclis quruldu, toy başlandı. Koroğlu baxdı ki, Eyvaz məclisdə yoxdu. Soruşdu:

– Hanı Eyvaz?

Dəli Həsən dedi:

– Axır adət var. Sən onun atasısan. Sən rüsxət verməsən, o gəlməz.

Koroğlu sazı basdı döşünə, dedi:

Çağırın Eyvazı, gəlsin məclisə,
Verin şirin badə, cana nuş olsun!
Qurun nərtaxtanı, gəlin oynayaq,
Atın ağ zərləri şeşi beş olsun!

Bir xələt biçərəm Eyvaz boyundan,
İncimərəm xasiyyəti-xoyundan,
Kəsin tunculardan, qırın qoyundan,
Yeyin dəlilərim, keyflər xoş olsun!

Uca dağlar başın almasın duman,
Koroğlu könlünə gəlməsin güman,
Verrəm o igidə beş yüz min tümən,
Qançırqada gələn qanlı baş olsun!

Dəli Həsən ilə Dəmirçioğlu Eyvazı gətirdilər məclisə, Koroğlu bir Eyvaza baxdı, boy-buxununa, şəsti-bəstinə nəzər saldı. Paltar, geyim, yaraq-yasaq, durna teli də başında.

Koroğlunun ürəyi atlandı. Sazı basdı döşünə, dedi:

Geyinib əlvan sərasər,
Yaşıl üstdən allar Eyvaz.
Qanlı qəmzən gündə eylər
Hay demədən qanlar, Eyvaz!

Hüsnün aydan aldı bacı,
Gün üstə qoydu xəracı,
Şəkər təlxdi, nabat acı,
Ləblərindi ballar, Eyvaz!

Koroğluyam, mən də varam,
Olmaz qənimə yalvaram,
Caharguşə cümlə alam,
Sənə qurban mallar, Eyvaz!

Söz tamama yetdi. Koroğlu Eyvaza yer göstərdi. Elə bu dəmdə xəbər gəldi ki, Nigar xanım izn istəyir, Hürü xanımı məclisə gətirsin. Koroğlu izn verdi. Xanımlar Hürü xanımı gətirdilər məclisə, Koroğlu baxdı ki, Hürü xanım heç Eyvazdan geri qalan deyil. Nigar xanım Hürünü bir geyindirib, kecindirmişdi, bir ziynət vermişdi ki, gəl görəsən.

Hürü xanım Koroğlunu görəndə utandı, gəlinlik tellərini yığışdırdı. Koroğlu ayağa durub, sazı götürdü, özü dövran açıb məclisə girdi, dedi:

Hürü, Allahı sevirsən,
Qoy tökülsün şux tellərin!

Gəl saxlama dal gərdəndə,
Qoy tökülsün şux tellərin!

Sən bir yaşılbaş sonasan,
Baissən min bir qana sən.
Nə ola sözüm anasan,
Qoy tökülsün şux tellərin!

Koroğlunun dirliyilə,
Dəlilərin birliyilə,
Xan Eyvazın ərliyilə,
Qoy tökülsün şux tellərin!

Deyirlər ki, Eyvazın toyu düz qırx gün, qırx gecə çəkdi. Həsən paşa Ərəb Reyhanın qırxını verən gün, Eyvaz da Hürü xanımla murad verib, murad aldı.

# Koroğluynan Aypara

Koroğlu oturub mağarada dəlilərdən küsmüşdü. Bu tərəfdən də Eyvazı gözləyirdi ki, Eyvaz gələ. Eyvaz gəlib çıxmadı. Koroğlu çox darıxıb durub gəldi Qıratın yanına, sazını kök eləyib görək nə dedi:

Qurban olum qara telə,
Eyvazı yolladım gələ,
Al yanağı döndü gülə,
Qoçum Eyvazım gəlmədi.

Havalarda uçan dunra,
Qanadları burma-burma,
Həm dəf çaldım, həm də zurna,
Qoçum Eyvazım gəlmədi.

Göy üzündə vardı ulduz,
Hər dəlimə aldım bir qız,
İstər gəlin, istərsə qız
Qoçum Eyvazım gəlmədi.

Gedibən halallaşmadı,
Dedim getmə, barışmadı,
Qoç içinə qarışmadı,
Qoçum Eyvazım gəlmədi.

Gedin deyin o cavana,
Gül çiçəyi qıydı cana,
Nöş gəlmədin sən bu yana,
Qoçum Eyvazım gəlmədi.

Qoçum, Eyvaz, qoçum, Eyvaz,
Getdin, könül oldu nasaz,
Divandasan mənə sən yaz,
Qoçum Eyvazım gəlmədi.

Koroğlu ağlayırdı. Elə bu dəmdə Eyvaz özün Koroğluya yetirdi. Koroğlu qolunu saldı Eyvazın boynuna, öpüşdülər. Səhəri gün Koroğlu Qıratı Eyvaza tapşırıb aşıq paltarı geydi, sazını qoltuğuna vurub çıxıb getdi.

Koroğlu bir neçə mənzil yol gedib, gəlib çatdı İstanbul şəhərinə. İndi gəlin xəbəri İstanbul paşasının qızı Aypara xanımnan verim. Aypara xanım əmisi oğlu Osmana adaxlı idi.

Aypara bilirdi ki, atası Xəlil paşaynan Koroğlunun arası yoxdu. Aypara xanım eşitmişdi ki, Koroğlu çox şücaətli adamdı. Pis məqamda olsa da düşmənə boyun əyən deyil. O, çox tələsirdi ki, Koroğlunu görə.

Bir gün Aypara eyvanda gəzinirdi, bu dəmdə Koroğlu aşıq paltarında gəlib eyvanın qabağından keçdi. Aypara xanım gördü ki, eyvanın qabağından keçən oğlan çox gözəl, möhkəm adama oxşayır.

Ayparanın qulluqçusu dedi:

– Xanım, bu Koroğludu!

Aypara xanım dedi:

– Koroğlu atamın qorxusunnan bu tərəflərə gəlib çıxmaz.

Qulluqçusuynan xanımın sözü çəp düşdü.

Aypara xanım dedi:

– İndi ki belədi, get çağır onu, görək kimdi?

Qulluqçunun adı Sənəmdi. Aşağı düşüb Koroğlunu çağırdı. Koroğlu gəlib dayandı eyvanın qabağında, gördü ki, iki qız yan-yana durub, bir-birindən gözəl.

Aypara xanım xəbər aldı ki, kimsən?

Koroğlu sazını sinəsinə basıb dedi:

Birisinin ayağında məsti var,
Birisinin can almağa qəsti var,
Koroğlunun bu yerlərdə əsri var,
Koroğluyam, gəldim mən bac almağa.

Sənəm Aypara xanıma dedi:

– Gördün Koroğludu!

Aypara xanım saçın saz eləyib görək nə dedi:

Koroğlu gəzdirir qolunda laçın,
Sədası gələndə düşmənnər, qaçın,
Görməmişəm doqquz hörük mən saçın
Hanı Qıratın, gəldin bac almağa!

Koroğlu:

Koroğlu küsəndə meydan eliyir,
Buraxıb Qıratın sazın köklüyür,
Dəliləri Çənlibeldə bəsliyir,
Koroğluyam, gəldim mən bac almağa!

Aypara xanım dedi:

– Sən Koroğlu deyilsən. Əgər Koroğlusansa de görüm onun ən yaxın dəliləri kimlərdi?

Cavabında Koroğlu dedi:

Bir dəlim vardı ki, adıdı Eyvaz,
Sağında, solunda düşməni saymaz.
Uzağa getsə də o mənsiz durmaz,
Koroğluyam, gəldim mən bac almağa.

Aypara xanım Eyvazın adını eşidib yəqin etdi ki, Koroğludu. Bu tərəfdən də Koroğlu hörüyünü Ayparaya görsətdi. Aypara xanım Koroğlunu tanıyıb, əmisi oğlu Osmanın məhəbbətini ürəyindən çıxartdı. Bir könüldən min könülə vurulub özünü ona nişan verdi:

Adımdı Aypara, nəslim duduman,
Yaşıl çimən, axar sular, şux orman,
Atam Xəlil paşa, adaxlım Osman
Hayıfsan, ay oğlan, görəllər səni.

Koroğlu:

Adındı Aypara, nəslin duduman,
Ay qız, sənin adaxlındı Osman,
Mən gəlmişəm alım burda qana-qan,
Verib mənə nişan dəlilər səni.

Aypara:

Dəlilərin nolur burda olaydı,
El-obanı çalıb-çapıb soyaydı,
Ayparaynan baş yastığa qoyaydı,
Heyifsən, ay oğlan görərlər səni.

Koroğlu bir az da irəli gəlib Aypara xanımı təpədən dırnağa kimi süzdü, sazı döşünə basıb görək nə dedi:

Mən gedəndə burda tikdirdim qala,
Koroğlu dönübdü bu bürcü ala,
Koroğlu boynuna qulac qol sala,
Nişan verib mənə dəlilər səni.

Koroğlu sözünü tamam elədi. Eyvana çıxıb Aypara xanımla qol-qola verib girdilər otağa. Koroğlu burda bir neçə gün qalıb Ayparaynan keyf çəkməkdə olsun, sizə deyim Sənəmdən.

Sənəmin də gözü Koroğluya düşmüşdü. Bir gün girəvə tapıb təklikdə Koroğluya dedi:

– Gəl baş yastıq olaq.

Koroğlu iki barmağıynan Sənəmin ağzından bir sillə vurdu. Sənəmin ağzı, burnu qanla doldu. Sənəm gəlib bulağa əl-üzünü yudu, tez özünü yetirdi Osmanın yanına. Çatcağın ona dedi:

– Bəylik taxtın yıxılıb; anan qara geysin, nə durmusan. Aypara Koroğluya aşiq olub. Bu saat onun yanındadı.

Osmanın əhvalı dəyişdi. O, bir tərəfdən qorxuya düşdü, o biri tərəfdən də qeyrət hissi onu boğdu. Osman at minib, qoşun götürüb Koroğlunun üstünə yeridi.

İndi eşit Ayparaynan Koroğludan.

Koroğluynan Aypara xanım oturmuşdular eyvanda. Çay içib söhbət eləyirdilər. Birdən Koroğlunun gözü sataşdı yola, gördü ki, Osman atdılarnan ona sarı gəlir. Tez sazı döşünə basıb dedi:

Düşdü üzüyümün qaşı,
Olmamışdım mən heç naşı.
Sağ buraxdım qarabaşı,
Çənlibeldə Eyvaz qaldı.

Bu sözdən Aypara bir şey başa düşmədi.

Xəbər aldı ki: – Nə olub?

Koroğlu dedi:

Nə təmizdi üzü ayın,
Yoxdu Rum elində tayın,
Sənəm çıxdı bizə xayın,
Dörd yanımı düşmən aldı.

Aypara bu sözü eşidən kimi Koroğlu baxan tərəfə baxıb gördü ki, Osman qoşunnan gəlir. Üzün tutub Koroğluya dedi:

– Doğrudu, gəlirlər. Amma məəttəl qalmışam ki, Sənəm bizi nə üçün satıb.

Koroğlu Sənəmnən olan əhvalatı Ayparaya danışdı.

Aypara dedi:

– İndi ki, məni bu qədər sevib vəfalı çıxıbsan, gəl mən səni davasız-şavasız buradan qurtarım.

Koroğlu dedi:

– Mən gərək meydanda cövlan vuram. Osmana qan ağladam.

Aypara xanım yalvarıb qoymadı. Durub gəldilər evə. Aypara xanım Koroğluya bir dəst arvad paltarı geyindirib bu biri qapıdan yola saldı. Koroğlu arvad paltarında çıxıb yolun bir tərəfində gizlənməkdə olsun, sizə deyim Osmandan. Osmangil bu tərəfdən gəlib çatdılar Ayparanın eyvanının qabağına. Eyvanı dövrəyə alıb dayanmışdılar ki, Koroğlu səsinin nazik yerinə salıb qışqıra-qışqıra atılıb üz qoydu Osmanın qoşununa sarı.

Osman xəbər aldı ki, ay qarı, nə üçün qışqırırsan?

Koroğlu dedi:

– Necə qışqırmayım, Koroğlunun yeddi min yeddi yüz yetmiş yeddi dəlisi Xəlil paşanın evini alt-üst elədilər.

Koroğlu bunu deyib gözdən itdi, dərəyə çəkilib əlini belinə qoyub dayandı. Osman əmr verdi ki, qoşun əmisinə köməyə qayıtsın. Qoşun qayıdanda əl atıb atdarın birinin cilovuna, çəkdi dərəyə. Atdını boğub atını aldı. Qılıncını bağlayıb belinə, gözlədi. Bu tərəfdən qoşun gözdən itib getdi. O biri tərəfdən də tək qalan Osman özünü yetirdi Ayparanın qapısına. Qapını döydü. Aypara xanım qapını açmadı. Bu dəmdə Koroğlu Osmana özünü yetirdi. Osmanın qolun bağlayıb atdı bir yana. Aypara xanım eyvandan baxırdı. Bunu görüb Koroğluya dedi:

– At quyuya!

Koroğlu Osmanı yernən sürüyə-sürüyə götürüb saldı dərin bir quyuya. Ağzına da bir dəyirman daşı çevirib çıxıb getdi Ayparanın yanına. Oturub keyfə başladılar.

Dəlilər Koroğlunun yadından çıxmışdı. Koroğlu ikinci gün Ayparanı götürüb keçdi başqa bir yerə. Xəlil paşa işdən xəbərdar olub Koroğlunun dalısıncan adam saldı. Bu tərəfdən də Sənəm Koroğlunun dalısıncan gəzirdi. Koroğluynan Ayparanı tapa bilmədilər. Xəlil paşanın ovqatı təlx olub elan verdirdi ki, kim Koroğlunun yerini desə bir kisə qızıl verəcəyəm.

Koroğlu dəlilərdən düz bir ildi ki, ayrılmışdı. Ayparadan bir oğlu olmuşdu.

Dəlilər çox gözlədilər. Doqquz ay başa çatandan sonra Eyvaz dedi:

– Dəlilər, gərək gedək Koroğlunun dalısıycan. Çünki Koroğlu bizdən çox ayrı düşsəydi bir ay düşərdi. Amma doqquz aydı ki, ondan xəbər yoxdu. Gəlin üç aylıq yolu bir aya başa vurub gedək Koroğlunun dalısıycan. Dəlilər razı olub Qıratı da özləriynən götürüb getdilər.

Dəlilər oba-oba, şəhər-şəhər gəzib Koroğlunu axtarırdılar.

Dəlilər gəzməkdə olsun, xəbər verək Xəlil paşadan. Xəlil paşa elan verdirmişdi ki, kim Koroğlunun yerini bilib desə bir kisə qızıl verəcək.

Sənəm Koroğlunun əlindən yanıqlıydı. Özlüyündə and içdi ki, harda olsa Koroğlunu tapacam. Düşüb oba-oba onu gəzdi.

İndi xəbər verək Koroğludan.

Koroğluda bir xasiyyət vardı, həmişə işi bərkə düşəndə, ya pis yuxu görəndə çıxıb hündür bir yerdə namaz qılardı. Koroğlu dəliləri yuxuda görüb, əhvalı bir az dəyişmişdi. Qalaçanın təpəsinə çıxıb namaz qılırdı. Sənəm də el-obanı gəzib gəlib çıxmışdı bura. Birdən gördü ki, ucadan səs gəlir. Sənəm yeridi irəli, gəlib yetişdi qalaçaya, baxıb diqqət etdi ki, Koroğlu burdadı. Ayparanın da qucağında uşaq eyvanda gəzişir. Tez özünü Xəlil paşaya yetirib dedi:

– Koroğlunun yerini tapmışam. Qızın Aypara xanım da onun yanındadı.

Xəlil paşa əmr verdi ki, qoşun hazır olsun. Qoşun hazır oldu. Sənəm qoşunu birbaş götürüb çıxartdı Koroğlu olan yerə. Sənəm qoşuna sərkərdəlik edib qoşunu dağın döşündə gizlətdi. Gecədən xeyli keçmişdi ki, Sənəm qoşunu götürüb gəldi Koroğlunun qalaçasına. Sənəm kəmənd atıb düşdü həyətə. Qapını açıb qoşunu çəkdi içəri. Eyvana çıxıb gördü ki, Koroğlu Aypara xanımnan yatıb. Uşağı da qoyublar özlərindən bir az aralı. Əmr verib tez Koroğlunun, Ayparanın əl-ayağını bağlatdı. Bir vədə Koroğlu uşağın səsinə ayılıb gördü ki, düşmən dört tərəfi alıb. Burda bir qapa qapdı ki, gəl görəsən.

Koroğlu bir uşağa, bir də Ayparaya baxıb dedi:

Dərələrdə ucalıbdı bol qamış,
Qamışı qırmağa gəlibdi camış,
Biz yatmışıq, Sənəm çoxdan oyaqmış,
Oyan, qollarımı Sənəm bağladı.

Aypara xanım səs ayıldı. Amma yuxuluydu. Oturub yerinin içində baxırdı, bilmirdi ki, nə olub. İstədi gözlərini ova ki, yuxusu qaçsın, gördü qolları bağladı. Koroğlu alıb dübarə dedi:

Düşman gəlib dörd tərəfim haxladı,
Koroğlunun ürəyini dağladı.
Bu məclisdə Koroğludu ağladı,
Ayıl, qollarımı Sənəm bağladı.

Koroğlu dartınıb qollarını açdı, oğlunun qoluna bir bazu bənd bağladı.

Sənəm Aypara xanımı, Koroğlunu, bir də uşağı götürüb qatdı qoşunun qabağına. Üz qoydular Xəlil paşanın imarətinə sarı. Sənəmgil yolda Koroğlunun uşağını bir daşın dibinə qoyub çıxıb getdilər.

Xəlil paşaya xəbər çatdı ki, Koroğlu tutulubdu. Paşa əmr elədi ki, Koroğlunu aparıb salsınlar quyuya. Qızı Ayparanı da zindana saldırdı. Koroğlunu gətirib bir dərin quyuya saldılar.

Sizə xəbər verək bir qarıdan. Yaxınlarda bir qarı özünə ev tikmişdi, həyətində toyuq-cücə saxlamaqla məşğul olurdu. Qarının bir iti var idi. İt təzəcə doğmuşdu. İt bir gün bir çaqqal səsi eşidir, çıxıb üz qoyur səsə tərəf. Gəlib bir daşın dibində ay yarımlıq bir oğlan uşağı tapır. İtin uşağa yazığı gəlir. İstəyir onu aparsın, görür ki, uşaq acdı. Başlayır uşağa süd verməyə. Bir neçə gün it bu uşağı burda öz südü ilə saxlayır. Qarı itdən şəklənir. Bir gün itin dalısıncan düşüb gəlib çıxır həmin daşın dibinə. Görür ki, daşın dibində bələkli bir uşaq var, it onu əmizdirir. Qarı tez uşağı götürüb evinə gəlir. Başlayır uşağı saxlamağa.

Sizə deyək Koroğlunun dəlilərindən. Dəlilər gəlib çatmışdılar İstanbula. Qıratda bir xasiyyət vardı ki, Koroğlu hansı dəlikli daşda olsaydı iynən gəlib onu tapardı. Eyvaz Qıratı buraxmışdı qabağa. Qırat gəlib özünü yetirdi Aypara xanımın eyvanına. Buranı dolanıb iylədi. Sonra özünü yetirdi bir quyunun ağzına. Ayaqlarını döydü yerə. Eyvaz bildi ki, Koroğlu burdadı. Səs verdi. Koroğlu səsdən bildi ki, dəliləridi, dedi:

– Kəmənd atın.

Dəlilər kəmənd atıb Koroğlunu quyudan çıxartdılar. Aldı, Koroğlu:

Dəlilərlə barışanda Koroğlu,
Yedirdər onlara nabatnan noğlu,
Səhərsi kəsdirər yüz əlli toğlu,
Ayparam qalıbdı düşmən əlində.

Səməndin qolunda qızıl bazubənd,
Xəlil paşa bürcdən asılsın gərək.
Qıymayın əldə qala bir aylıq Səmənd,
Ayparam qalıbdı düşmən əlində.

Hindidən Rumatək salaram soraq,
Dəlilərim olur Qırat tək qovraq,
Yıxıban Xəlili bu eldən qovaq
Ayparam qalıbdı düşmən əlində.

Koroğlu sözünü tamam elədi. Qıratı çəkib ayaq qoydu üzəngiyə, dəlilərə dedi:

– Gəlin dalımcan.

Onlar atlarını sürüb yetirdilər şəhərə. Xəlil paşanın nə ki qoşunu vardı, hamısını qırıb-çatdılar başa. Koroğlu Xəlil paşanı öz əliynən öldürüb əmr verdi ki, Səməndi tapsınlar. Özü də Ayparanı axtarmağa getdi.

Koroğlu Ayparanı tapdı. Onlar bir-birinə sarıldı. Koroğlu Səməndi xəbər aldı.

Aypara xanım ağladı. Koroğlu bildi ki, Səmənd yox olub, çox heyifsiləndi. Dəlilər axtardılar, Sənəmi də tapa bilmədilər.

Koroğlu dəlilərini yığıb şadlıq məclisi qurdu. Dəlilərnən bir yerdə üç gün, üç gecə keyf çəkdilər. Siz də burda kefdə, damaqda olun.

# Koroğlunun Bayazid səfəri

Əhməd adlı bir tacirbaşı vardı. Əhməd tacirbaşı həm çox dövlətli idi, həmi də iyid idi.

Deyirlər ki, Əhməd tacirə ata-anası uşaqlıqdan yaxşı muğayat olmuşdu. Böyüyənə kimi onu həmişə kilim üstə gəzdirmişdilər. Əhmədin ayağı heç vaxt quru yerə dəyməmişdi. Odu ki, Əhmədin gözü yeddi ağacdan-yeddi ağaca hər nə qaraltı olsa seçərdi.

Əhməd tacirin başında qırx yaraxlı tacir vardı. Həmişə karvan eləyib al-qumaşdan yük bağlayıb böyük-böyük şəhərlərə, mahallara səfər eliyərdilər. Yolları da çox vaxt Çənlibelin yanından keçirdi. Amma sən onu de ki, Koroğlu, dəliləri nə qədər əlləşirdilər, Əhməd tacirbaşını tuta bilmirdilər ki, bilmirdilər. Neçə kərə dəlilər Eyvaz, Dəmirçioğlu, Halaypozan, Tüpdağıdan Əhməd tacirbaşının qabağını kəsmişdilərsə də, onu tuta bilməmişdilər. Zalımın cin gözü yeddi ağaclıqdan baxıb bunları görüb, karvanı özgə yoldan aparmışdı.

Bu iş Koroğluya çox ağır gəlirdi. Bəyləri, paşaları dizə çökdürən Koroğlu bir tacirin əlində harasan qalmışdı. Deyirlər bir gün Koroğlu eşitdi ki, Əhməd tacirbaşı yenə gəlib Çənlibelin yanından keçib gedib, dəlilər onu tuta bilməyiblər. Cin vurdu başına. Çağırdı dəliləri, başladı onları məzəmmət eləməyə ki, yaxşı, bir taciri ki, biz tuta bilmirik, tay nə qoç Koroğlu – Qoç Koroğlu deyib dünyanı səs-küyə basmışıq.

Deyirlər Koroğlu dəliləri məzəmmət eliyəndə dəlilər üzə durub dedilər:

– Ay Koroğlu, biz necə eləyək? Zalım oğlu Əhməd tacir bir qızılquşa dönüb. Bərələri gəzirik, yolları bağlayırıq, yeddi ağaclıqdan bizi görür, yenə qaçıb gedir. Tuta bilirsən özün tut da!

Deyirlər Koroğlu dəlilərin bu sözünün qabağında heç bir söz demədi, gözlədi. Öyrəndi ki, tacir Əhməd bu yaxınlarda gəlib yenə də Çənlibeldən keçəcək. Yavaşca bir hündür qayanın başına çıxıb yolları gözləməyə başladı.

Bəli, o necə deyərlər, bu burada gözləməkdə olsun, sənə kimdən deyim, Əhməd tacirbaşıdan. Əhməd tacirbaşı öz yaraqlı-yasaqlı adamları ilə gəlirdi. Gəlib, gəlib elə ki, Çənlibelin yeddi ağaclığına çatdılar. Əhməd tacirbaşı çin gözlərini dolandırıb qayanın başından Koroğlunun qaraltısını gördü. O saat karvana əmr elədi ki, əylənsinlər. Karvan əyləndi. Ancaq bu dəfə, o necə deyərlər, daş qayaya rast gəlmişdi.

Koroğlu da Koroğluydu. Əhmədə-zada belə işlərdə bac verən deyildi. Elə ki, gördü karvan dayandı, yapıncısını göyə atdı, bir sərnic qatığı da onun dalınca tulladı. Özü də yatdı yerə.

Əhməd tacirbaşı baxdı ki, qayanın başından bir qara şey uçdu, dalısınca da bir zil düşdü. Yoldaşlarına dedi:

– Bir şey yoxdu. Yüklənin, sürün gedək. Qaraquş idi. Qayanın başına qonmuşdu, zil atdı, uçdu getdi.

Karvan təzədən hərəkətə gəldi. Koroğlu o qədər gözlədi ki, karvan qayanın yanına çatdı. Koroğlu qayanın başından enib Qıratı mindi, qızılquş kimi karvanbaşının üstünü aldı. Karvan əhli çaxnaşıb, bir-birlərinə dəydilər. Onları belə görən qoç Koroğlu aldı görək nə dedi:

Ağır alaylar döşlərəm,
Tök malını, get, bəzirgan!
Çox belə fellər işlərəm,
Tök malını, get, bəzirgan!

Əlimdən gələrsən cana,
Misri qılınc sığmır qına,
Çəksəm boyanarsan qana,
Tök malını, get, bəzirgan!

Sənsən Əhməd tacirbaşı,
Tökdürrəm didəndən yaşı,
Başlamamış tər savaşı,
Tök malını, get, bəzirgan!

Qaya başında duraram,
Ərlər boynunu buraram,
Sənə bir əmud vuraram,
Tök malını, get, bəzirgan!

Koroğluyam, bir ac qurdam,
Çənlibeldə ağır yurdam,
Qan çıxardar indi gordam,
Tök malını, get, bəzirgan!

Tacirlər xoşluğnan mallarını vermək istəmədilər. Koroğlu bunu görüb Misri qılıncını çəkdi, tacirlərə hücum elədi. Əhməd tacirbaşı

hökm elədi, tacirlər də qılınclarını çəkib Koroğluya tərəf yeridilər. Əhməd tacirbaşı qılıncını alıb Koroğlunun yolunu kəsdi. Dava başlandı, ara qarışdı. Koroğlu ilk əldə özünü Əhməd tacirbaşıya yetirdi. Ancaq onu öldürmək istəmirdi. Qorxudub diri tutmuq fikrindəydi. Elə ki, yaxınlaşdı, kəlləsindən elə bir əmud vurdu ki, Əhməd tacirbaşı bayax ha, özündən gedib yerə yıxıldı. Koroğlu ondan keçdi, Qıratı cövlana gətirdi, sola sürdü, sağa sürdü. Qırat acıqlandı. Koroğlu qızdı. Koroğlu əmudu, şeşpəri, qılıncı işə saldı. Qırat dişi ilə, dal ayaqları ilə tacirlərdə sağ yer qoymadı.

Tacirlər Koroğlunun zərbəsinə davam gətirə bilməyib axırda təslim oldular. Koroğlu tacirbaşı Əhmədi bir ata çatdırdı, qalan tacirləri də dəvəli, qatırlı, al-qumaşlı qabağına qatıb, Qıratın döşündə Çardaxlı Çənlibelə çıxartdı. Nigar xanım, Eyvaz, Dəmirçioğlu, bütün dəlilər tacirlərin başına yığışdılar. Koroğlu tacirlərin mallarını bölüşdürdü, dəlilərə, xanımlara payladı. Tacirlərin biri ağlaya-ağlaya Əhməd tacirə dedi:

– Əhməd tacirbaşı, nə cür oldu ki, sən yeddi ağaclıqdan Koroğlunu görmədin?

Əhməd tacirbaşı dedi:

– Kor olsun mənim anam. Uşaq vaxtı bir gün məni ayaqyalın kilimin üstündə gəzdirmişdi. O olmasaydı yapıncı ilə qaraquşu seçərdim.

Koroğlu dəlilərin, xanımların arasında oturub yeməkdə, içməkdə idi.

Deyirlər Koroğlu çox qonaqcıl imiş. Təslim olanlara çox hörmət eləyərmiş. Elə ki, yedi, içdi, damağı duruldu, keyfi bulutda gəzməyə başladı, ayağa durdu, dəliləri yanına alıb tacirlərin yanına gəldi. Üzünü onlara tutub dedi:

– Düşman günü düşman, dost günü dost! İndi siz mənim qonağımsınız. Buyurun, hər nə istəsəniz hazır elədim.

Əhməd tacirbaşı fikrə getdi. Öz-özünə dedi:

– İnnən sonra mənim mal-dövlətimi, al-qumaşımı Koroğlu geri qaytarmayacaq, gəl onun əvəzini çıxmaq üçün elə bir qonaqlıq istə ki, o buralarda tapılmasın, uzaq yerlərdə olsun!

Üzünə hiylə niqabı çəkib Koroğluya:

– Əyər bizə yaxşı qonaqlıq vermək istəyirsənsə, Bayazid paşası Xəlil paşanın yaxşı əl ceyranları var, onlardan gətirib bizə ceyran kababı ver.

Koroğlu dedi:

– Baş üstə. Sizə ceyran kababı vermək mənə borc olsun!

Koroğlu səfər tədarükünü görmək istəyəndə Eyvaz irəli durub dedi:

– Qoç Koroğlu, izin ver qonaqlara ceyran gətirməyə mən gedim.

Koroğlu nə qədər elədi ki, yox, sən getmə, olmadı. Eyvazın qulağına girmədi ki, girmədi.

Axırda Koroğlu gördü ki, Eyvaz inciyəcək, əlacsız qalıb:

– Yaxşı, Ərəbatı min, Halaypozanı, Toxmaqvuranı da özünə yoldaş götür, get, ancaq tez qayıt.

Eyvaz yaraxlandı. Ərəbatı mindi, Halaypozanı, Toxmaqvuranı da yanına alıb getmək istəyəndə, Nigar xanım, dəlilər töküldülər hamısı yerbəyerdən dedilər:

– Bunları Bayazid kimi ağır səfərə niyə göndərirsən? Gedərlər, bir iş olar, tutularlar, dava düşər, başlarına bir iş gələr.

Koroğlu dedi:

– Koroğlu sözünnən dönməz, onlar getməsə, özüm gedəcəyəm. Gördülər Koroğlunu sözünnən döndərmək olmayacaq, bunlar da razı oldular. Koroğlu üzünü Eyvaza tutub, dedi:

Ərəbatı yaxşı saxla,
Daşdı Bayazid yolları.
Yollar ayrıcını yoxla,
Beşdi Bayazid yolları.

Halaypozan sənə nökər,
Toxmaqvuran qəhrin çəkər,
Ərəbat nal, mıxın tökər,
Daşdı Bayazid yolları,

Bayazid xoş mənzərədi,
Tülək, tərlana bərədi,
Qayadı, dağdı, dərədi,
Qışdı Bayazid yolları.

İstərəm ər bağrı yaran,
Qanlı meydanlarda duran,
Duman, çovğun, soyuq, boran,
Qışdı Bayazid yolları.

Koroğluyam hour-hour,
Açma qanlı yaram sour,
Ordu qırdım beş yüz kour,
Leşdi Bayazid yolları.

Xan Eyvaz, Halaypozan, Toxmaqvuran Koroğluynan, dəlilərnən əl verib ayrıldılar. Bayazidə tərəf yola düşdülər. Atlar qanad açdılar, dağ keçdilər, dərə keçdilər, hər yerdən keçib gəldilər, bir axşam Bayazidə çatdılar.

Bunlar çatmaqda olsun, sənə deyim Xəlil paşadan. Xəlil paşanın bir bağı var idi ki, quş quşluğu ilə səkə bilməzdi bu bağda. Paşa əl ceyranlarını saxladırdı. Eyvaz yoldaşları ilə bərabər atını sürüb bağa girdi. Atlardan düşdülər. Əl ceyranlarını qırıb yüklərini tutdular. Elə ki, yükləri hazır oldu, Eyvaz dedi:

– Yorulmuşuq, gəlin bir az dincələk, sonra gedərik.

Hərəsi bir yanda uzandı. Eyvazı o saat yuxu apardı, amma yoldaşları yatmayıb keşik çəkirdilər. Sabaha yaxın bağban bağı yoxlamağa gəldi. Gördü bağda bir salamat ağac qalmayıb, atlar basıb qırıb. Qaldı məhəttəl ki, bu nədi? Bu atlar kimindi? Bu tərəfə baxanda gördü əl ceyranları da leş-leşə verilib. Baxdı ki, yox, bu elə belə deyil. Deysən bağa adam girib. O tərəf, bu tərəfi gəzib bir də gördü ki, bir ağacın dibində üç nəfər Rustam Zal kimi iyid var, amma bunların ikisi oyaqdı, biri yatıb. Bağban dəliləri görən kimi dəlilər də bağbanı gördülər. Halaypozan istədi ki, bağbanı tutsun, bağban durub qaçdı. Bu zaman Halaypozan özünü Eyvaza yetirib görək nə dedi:

Qoşun çəkib dörd yanımız alarlar,
Bu xabi qəflətdən ayıl, Eyvaz xan!
Bizi tutub o zindana salarlar,
İyid olmaz buna qayıl, Eyvaz xan!

Sənə ərz eyləyim sözün düzünü,
Qəbul etmə müxənnətin sözünü,
Göstər camalını, qəmər üzünü,
Gün kimi aləmə yayıl, Eyvaz xan!

İnsafdımı Halaypozan tutula,
Qulac qollar dal gərdəndə qatıla,
Qul adına Bayaziddə satıla,
Dəlilər sərdarı sayıl, Eyvaz xan!

Bağban işi belə görəndə yavaşca gəlib bağın qapısından çıxıb götürüldü, Halaypozan şaqqıltıya dönüb qapıya tərəf baxanda gördü bağbandı. İstədi durub tutsun, bağban bayax ha gözdən itdi. Halaypozan bir də Eyvazı səslədi ki:

– Eyvaz, Xəlil paşanın bağbanı bizi gördü, xəbərə qaçdı. İndi qoşun yeriyər, bizi tutarlar. Durun qaçaq.

Eyvaz dedi:

– Buradan davasız getsək bizim Bayazidə gəlməyimizə heç kim inanmaz. Bir də vuruşmamış qaçsaq öz adımızı, Koroğlunun adını batırarıq. Deyərlər Koroğlunun üç dəlisi gəlib Xəlil paşanın bağında ceyran oğurlayıb qaçıblar. Qoyun gözləyək, qoşun gəlsin vuruşaq. İyidlik göstərək, Koroğlunun yanına üzüağ gedək.

Halaypozan, Toxmaqvuran ha elədilər ki, getsinlər, Eyvaz razı olmadı. Axırda onlar da durub qoşunun gəlməyini gözlədilər.

O tərəfdən bağban, o necə deyəllər, bir əlində imanı, bir əlində tumanı, özünü Xəlil paşaya yetirib əhvalatı başdan-ayağa ona söylədi. Xəlil paşa hökm elədi, qoşun atlanıb bağın dörd tərəfini kəsdi. Eyvaz, Halaypozan, Toxmaqvuran öz atlarını mindilər, qılınclarını çəkib Xəlil paşanın qoşununa cumdular. Dava başladı, ara qarışdı. Koroğlunun dəliləri şir kimi qızdılar. Qoşunu qatım-qatım qatladılar. Ancaq nə qədər hər tərəfdən hücum etdilərsə dəlilərə bata bilmədilər.

Dəlilər şir kimi dava eləməkdə olsunlar, bu tayda qoşun böyükləri qalmışdılar mat-məhəttəl. Nə qədər qoşun var idi hamısını tökmüşdülər ora. Amma gəl ki, qoşun hamısı bu üççə dəlinin əlində aciz qalmışdı. Onları tuta bilmirdilər ki, bilmirdilər. Eyvaz bir tərəfdən, Halaypozan bir tərəfdən, Toxmaqvuran da bir tərəfdən qoşunu qırıb çıxmışdılar başa. Axırda qoşun böyükləri məsləhətləşib belə bir fikrə gəldilər ki, bunlara bir şey eləmək olmayacaq, bunların atlarını vuraq ki, piyada qalsınlar, bəlkə onda tuta bilək.

Qoşun böyüklərinin əmrinə görə yay-oxları işə salıb dəlilərin atlarını vurdular. Elə ki, dəlilər piyada qaldılar, qoşun bir tərəfdən hücum eləyib onları arakəsməyə salıb təklədilər. Dəlilər yenə də davadan əl çəkmədilər.

Hərəsi bir dəstəni qabağına salmışdı, qırırdı. Tay bir-birlərindən xəbərləri yox idi. Eyvaz bir ağır dəstənin arasında vuruşurdu. Qoşunu pencər kimi biçib yerə tökürdü. Çalışırdı ki, özünü yoldaşlarına yetirsin. O, şirin davaya məşğul ikən ayağı ilişib yıxıldı, qoşun onun üstünü aldı. Tutub qollarını bağladılar. Halaypozanla Toxmaqvuran elə ki,

dəlilərin sərdarı Eyvazı tutulmuş gördülər, əlləri boşaldı, istər-istəməz təslim oldular. Xəlil paşa dəlilərin bazburutuna baxıb mat qalmışdı. Üzünü onlara tutub dedi:

– Deyin görüm kimsiniz? Nə cürətlə mənim ceyranlarımı qırdınız?

Xəlil paşanın cavabında Eyvaz dedi:

– Biz Koroğlunun dəlilərindənik.

Xəlil paşa onların Koroğlu dəliləri olduğunu bilcək hökm elədi, dəlilərin boyunlarını vursunlar. Vəzir, vəkil torpağa düşüb dedilər:

– Paşa sağ olsun, bunların boyunlarını vurmaq asandı, amma Koroğlunun cavabını vermək çətindi. Ona şahlara, xotkarlara qan udduran, bəylərə, paşalara tük saldıran, tacirləri soyan, yolları kəsən, bərələr pusan qoç Koroğlu deyərlər. Heç kəsdə qisasını qoymaz. Bizim bunları öldürməyimizi bilsə, dəliləri töküb, hamımızı qırar. Sən bizim sözümüzü eşit, bunları hələlik zindana saldır. Dəlilərin tutulmasını Koroğlu bilsə dallarınca gələcək. Bacarırsan onda Koroğlunun özünü tutdur, öldür. Canımız qurtarsın. Xotkar da sənə böyük ənamlar versin. Sonra bunları qırdırmaq asandır.

Xəlil paşa, vəzir, vəkilin tədbirinə razı olub hökm elədi, dəliləri zindana salsınlar. Eyvazın da, yoldaşlarının da ayaqlarına kündə, boyunlarına zəncir vurub zindana saldılar. Ağzına qıfıl vurdular, yüz yaraqlı adam da onlara keşikçi qoydular. Bunlar burada qalsın, görək Koroğlu nə elədi.

Eyvazın verdiyi vədədən çox keçmişdi. Onların Bayazitdə tutulması barədə Çənlibeldə söz gəzirdi. Dəlilər, xanımlar, bir-birlərinə dəymişdilər. Nigar xanım Koroğlunu od qoyub odlayırdı. Koroğlunun dərisinə isti keçmirdi. Nigar xanımı sakit eləyib, deyirdi:

– Ay Nigar xanım, uzaq səfərin işini bilmək olmaz. Bir az da gözləyək, gəlib çıxarlar. Amma Nigarı sakit eləmək mümkün olmurdu. Səsi balasını itirmiş maral kimi Çənlibeli başına götürmüşdü.

Deyirlər ki, yenə də bir gecə Nigar xanım Eyvazın fikrilə yatmışdı. Yuxuda gördü ki, Eyvaz qan dəryasında üzür. Dik qalxdı. Ox dəymiş ceyran kimi yatağından sıçrayıb özünü Koroğlunun üstünə saldı, sazı döşünə basıb, dedi:

Verdiyin vədədən keçdi,
Gəlmədi Eyvaz, gəlmədi!
Yağılar qanını içdi,
Gəlmədi Eyvaz, gəlmədi!

Çənlibelin obasında,
Könlüm xan Eyvaz yasında,
Çalxanır qan dəryasında,
Gəlmədi Eyvaz, gəlmədi!

Düşmüşdün boğaz loyuna,
Yollandın ceyran oyuna,
Qurbanam Eyvaz boyuna,
Gəlmədi Eyvaz, gəlmədi!

Sərdar ölsə, ələm yatar,
Muxənnət məqsədə çatar,
Çənlibelim yasa batar,
Gəlmədi Eyvaz, gəlmədi!

Eyvazı yolladın Şama,
Qılıncınnan qanlar dama,
Vədə vermişdi axşama,
Gəlmədi Eyvaz, gəlmədi!

Bayazid qırağı sazdı,
Çöllərində ördək, qazdı,
Düşman çoxdu, onlar azdı,
Gəlmədi Eyvaz, gəlmədi!

Eyvaza bəslədim güllər,
Ötüşməz şeyda bülbüllər,
Ay Nigar, başına küllər,
Gəlmədi Eyvaz, gəlmədi!

Nigarın ala gözlərindən axan yaş Koroğlunu coşdurdu. Sazı götürüb görək onun cavabında nə dedi:

Ürəyimi eləyib qan
Ağlama, Nigar, ağlama!
Olum gözlərinə qurban,
Ağlama, Nigar, ağlama!

İyid olan cəfa çəkər,
Dost yolunda qanın tökər,
Ağlamağın bağrım sökər,
Ağlama, Nigar, ağlama!

Qəmli könül dəmə gəlməz,
Dərdi olan ağlar, gülməz,
Qorxaqlar ər qədrin bilməz,
Ağlama, Nigar, ağlama!

Dəlilərim gələr coşa,
Muxənnət eylər tamaşa,
Qan qusacaq Xəlil paşa,
Ağlama, Nigar, ağlama!

Meydanda nərə çəkərəm,
Göydən od-alov tökərəm,
Evlər dağıdar, sökərəm,
Ağlama, Nigar, ağlama!

Qızıb coşmamışam hələ,
Cidaynan qumaş ölçülə,
Əsir gələr Çənlibelə,
Ağlama, Nigar, ağlama!

Koroğluyam, əl götürrəm,
Mən Bayazidə yetirrəm,
Eyvazı alar, gətirrəm,
Ağlama, Nigar, ağlama!

Koroğlu hökm elədi yeddi min yeddi yüz yetmiş yeddi dəli atlandı. Özü də Qıratın belinə qalxdı. Çənlibelə göz gəzdirdi. Mehtərləri qəmgin gördü. Nigarı boynu çiynində, gözü yaşlı duran gördü.

Əhməd tacirbaşını, yoldaşı tacirləri elədiklərindən peşiman gördü. Koroğlu özü də çox məyus oldu. Buna baxıb dəlilər də bikef oldular.

Nigar xanım ömründə birinci dəfə idi ki, Koroğlunu, səfərə çıxanda belə qəmgin görürdü.

Koroğlunun yanına gəldi, onu sakit elədi, dəlilərə ürək verdi. Özü Koroğluya, dəlilərə şərab payladı. Hamı içdi, keflər duruldu.

Koroğlu durub lazımınca geyindi, üstdən aşıq paltarı geyib, çiyninə də saz keçirtdi. Elə ki, hamı hazır oldu, Koroğlu üzün dəlilərə tutub dedi:

– Mən qabaqca gedim, siz dalca gəlin. Şəhərdə sizi gözləyəcəyəm. Şəhərə çatanda atları bir qıraxda saxlayın, piyada şəhərə dolun, özünüzü tanıtmayın, özü də mən xəbər eləməmiş dava başlamayın.

Dəlilər Koroğlunu elə bircə bunu deyən gördülər. Koroğlu Qıratın üstündə bir boğanaq oldu, gözdən itdi. Bilmədilər hayana getdi.

Dəlilər onun dalınca atlarını sürüb yola düşdülər. Koroğlu hər yerdən keçib bir sabah ertəsi özünü Bayazidə yetirdi. Qıratı bir yanda bağlayıb özü aşıq libasında şəhərə getdi.

Bu tərəfdən dəlilər də gəlib çatdılar, atlarını bir yanda qoyub, şəhərə doldular.

Koroğlu gəzə-gəzə gəlib bir yerə çıxdı. Gördü yüzə qədər yaraqlı adam bir damın qapısında keşik çəkir. Keşikçilər onu görcək aşıq bilib soruşdular.

– A kişi, aşıqsanmı?

Koroğlu dedi:

– Aşığam, bir məclis axtarıram ki, bir az oxuyam, xərclik yığam.

Keşikçilərdən biri dedi:

– Yaxşı gəlibsən. Bu gün Xəlil paşanın bacısı Nərgiz xanımın toyudu, get oxu, yaxşı xeyrin olar.

Koroğlu dedi:

– Bəs siz burada nə eliyirsiniz?

Keşikçi dedi:

– Koroğlunun üç dəlisi burda dustaqdı, onlara keşik çəkirik.

Koroğlu bir istədi əl qılınca atıb keşikçiləri qırsın, dəliləri azad eləsin, sonra bu fikrindən daşındı. Keçib Xəlil paşanın bacısının toyuna gəldi.

Xəlil paşa Koroğlunu görüb dedi:

– Ay aşıq, dəli Koroğludan nə bilirsən bir az oxu qulaq asaq.

Paşanın cavabında aldı Koroğlu, görək nə dedi:

– Eyvaz deyib Çənlibeldən gəlmişəm,
İndi burda məhşər quraram, paşa!
Dəlilərim tutduğunu bilmişəm,
Gedər zindanını qıraram, paşa!

Coşub oxuyaram dövran içində,
Görərsən özünü al-qan içində,
Şir kimi qızaram meydan içində,
Hayqırıb bağrını yararam, paşa!

İndi mən eylərəm yaman halını,
Yıxaram qalanı, cah-calalını,
Soyaram, aparram dövlət, malını,
Taxtına od-alov vuraram, paşa!

Bir nərə çəkərəm dəlilər yerir,
Günün qabağında cəsədin çürür,
Duman tək yurdunu, yuvanı vurur,
Tamam dağı, daşı sararam, paşa!

Koroğlu qayıtmaz, xərac almağa,
Cida işlətməsə, qılınc çalmasa,
Bu gün Eyvaz xanı ələ salmasa,
Dişlərini bir-bir qıraram, paşa!

Xəlil paşa dedi:

– Bu necə aşıqdı? Ağzından qan iyi gəlir.Ölləm-öldürrəm deyir.

Vəzirə əmr elədi ki:

– Qovun bunu getsin!

Vəzir dedi:

– Paşa sağ olsun, aşığı qovmaq olmaz, gedər bizi özgə yerlərdə pisləyər, biyabır eləyər. Sən dedin Koroğludan oxu, o da Koroğludan oxudu. Koroğlunun sözləri asmaqdan, kəsməkdəndi də!

Xəlil paşa dedi:

– Yaxşı, oxusun.

Koroğlunun dalınca dəlilər də məclisdə adamların arasına doluşdular. Koroğlu qızmışdı, gözü ayağının altını görmürdü. Bir də göz gəzdirdi, dəliləri məclisdə gördü. Aldı görək nə dedi:

Xəbər olsun Bayazidin elinə,
Aparram Eyvazı, qala qoymaram!
Deyin sultanlara köç eləməsin,
Bu qisası Rüstəm Zala qoymaram!

Bilmirəm baharam, yoxsa ki, qışam,
Qorx o zamandan ki, qaynayam, coşam,
Qırılmaz qayayam, tərpənməz daşam,
Fərhad külüyünü çala qoymaram!

Aladı gözləri, qaşları yağı,
Nigar olub xan Eyvazın dustağı,
Çənlibeldi Koroğlunun oylağı,
Şah da gələ Çənlibelə qoymaram!

Dəlilər Koroğlunun nərəsini eşidib, qılınclarını çəkdilər, paşaya, vəzirə, vəkilə, qoşun böyüklərinə hücum elədilər. Qoşun xəbər tutub yeridi. Koroğlu halı belə görüb aşıq paltarını atdı, Misri qılıncı çəkib özünü Xəlil paşaya yetirdi. Xəlil paşa əl qılıncda, Koroğluya hücum elədi. Koroğlu bir həmlədə Xəlil paşanın qılıncını əlindən alıb, kənara atdı. Boğazından tutub ayağının altına saldı. Başını kəsmək istəyəndə Xəlil paşanın bacısı Nərgiz xanım özünü yetirdi, yalvarıb dedi:

– Koroğlu, qardaşımı mənə bağışla!

Koroğlu Xəlil paşanı bacısına bağışladı. Xəlil paşa qoşunu ilə Koroğluya təslim oldu. Koroğlu davadan əl çəkib, özünü zindana yetirdi. Bir güc verib zindanın qapısını qırdı. İçəri girib dəliləri zəncirlərdən azad elədi. Xəlil paşa qorxudan Koroğluya yeddi ilin bac-xəracını verdi.

Koroğlu əlavə Xəlil paşadan üç yəhərli, yüyənli at alıb Eyvaza, Halaypozana, Toxmaqvurana verdi. Hökm elədi dəlilər atlandılar. Çardaqlı Çənlibelə yola düşdülər. Hər yerdən keçdilər, gəldilər sağ-salamat Çənlibelə çatdılar. Atlardan düşdülər. Yenə keyf məclisi qurdular. Qoyun kəsib kabab çəkdilər. Yedilər, içdilər, damağları duruldu, keyflər çağaldı. Koroğlu sazı sinəsinə basıb aldı görək nə dedi:

Məclis qurduram həmişə,
İşrətim, damağım ola,
Əmliklər çəkdirəm şişə,
Bir ağır yığnağım ola.

Çənlibeldə köçüm, qonum,
Atlasdan biçdirəm donum,
Ortadan qalxmaya xonum,
Gündə yüz qonağım ola.

Vuram xotkar, tutam paşa,
Xanlar məndən çəkə haşa,
Bu dövranım vara başa,
Sönməyən sırağım ola.

Eyvaz imdadıma çata,
Dəli Həsən şeşpər ata,
Sıçrayam, minəm Qırata,
Bəlli Əhməd dayağım ola.

Şir qanı ola qanımda,
Qorxu olmaya canımda,
Dəlilər ola yanımda,
Qırram yüz min yağım ola.

Düşmən qanın içəm doyam,
Müxənnət gözlərin oyam,
Çəkəm bəzirganlar soyam,
Tacirlər dustağım ola.

Koroğluyam, savaşımda,
Qılınc yarası başımda,
Nigar əyləşə qarşımda,
Keçən cavan çağım ola.

# Qulun qaçması

Eşit quldan!

Elə ki, qul Koroğlunun qorxusundan yolu dəyişdirdi, dayanmayıb, birbaş atı sürdü Ələmqulu xanın yanına.

Ələmqulu xan varlı-karlı, dövlətli xan idi. Kəndləri, bağları, sürüləri, ilxıları, naxırları, o necə deyərlər, bircə donuzu əskik idi. Dövləti yer batırırdı. Deyərlər ki, hərə bir şeyin bazı olar. Bu Ələmqulu xanın da bir xasiyyətini sənə deyim ki, yaman atbaz idi. Bunun bir ilxısı vardı ki, dünyada olan atların hər rəngindən, hər yaşarından bu ilxıda bir cüt var idi: bir erkək, bir dişi.

Elə ki, qul gəlib çıxdı bura, Ələmqulu xana xəbər verdilər ki, bəs bir qara qul gəlib, amma altında bir at var, bir at var ki, ruzikarın gözü belə at görməyib. Özü də səni görmək istəyir.

Xan hökm elədi. Qulu atı ilə bərabər çəkdilər onun hüzuruna. Ələmqulu xan baxdı ki, doğrudan da at, nə at?.. At deyil, bir bəzəkli gəlindi. Özü də yerlə, göylə oynayır. Ələmqulu xanın gözü düşdü Ərəbata. Üzünü qula tutub soruşdu:

– De görüm, kimsən? Nə karasan? Hardan gəlib, hara gedirsən?

Qul dedi:

– Xan sağ olsun, mən Əhməd tacirbaşının quluyam. Qafın anrı üzünə xırıda getmişdik. Qayıdan baş quldurlar düşdülər üstümüzə. Mal-dövləti aldılar. Karvan əhlinin də hamısını əsir eləyib apardılar. Bircə bu atın sayəsində mən canımı qurtarıb qaçdım. İndi mən gərək bu xəbəri Toqatda Hasan paşaya çatdıram. Ancaq qorxudan gedə bilmirəm. Quldurlar mənim qaçmağımı görüb dalımcan at saldılar. İndi, yəqin ki, bütün bəndləri, yolları kəsiblər.

Ələmqulu xan getdi fikrə. Dedi:

– Yaxşı, əgər mən bu xəbəri Hasan paşaya çatdırsam, mənə nə verərsən?

Qul dedi:

– Xan sağ olsun, mən bir qul adamam. Mənim nəyim var ki, sənə də nə verim? Dari-dünyada bir bu canımdı ki, o da öz ixtiyarımda deyil. Amma ki, sən bu xəbəri Hasan paşaya çatdırıb, Əhməd tacirbaşını ölümdən qurtarsan, o, səni dünya malından qəni elər. Hasan paşanın da yanında hörmət sahibi olarsan.

Ələmqulu xan dedi:

– Mənə dünya malı lazım deyil. Mən bu xəbəri Hasan paşaya çatdırram. Amma bir şərtlə.

Qul dedi:

– Bu canım qurban olsun sənə, xan, o şərt nə şərtdi?

Ələmqulu xan dedi:

– Şərt budu ki, gərək bu atı satasan mənə. Özün də ta ağan qurtarıncan mənə qonaqsan. Gedəndə də sənə ilxıdan ürəyin istəyən bir at verərəm.

Qul dedi:

– At da sənə qurbandı, mənim canım da. Ancaq adam göndəriləndə mənim də o adama tapşırılası sözüm var.

Ələmqulu xan dedi:

– Yaxşı.

O saat əmr olundu, qasid hazırlandı. Namə yazıb verdilər qasidə. Üstəlik bir namə də qul yazdırıb verdi ona ki, bəs: "Hasan xan, Əhməd tacirbaşı Koroğlunun üç dəlisini ceyran əti adı ilə aldadıb göndərib Bayazid yazısına. Tez qoşun yeridib onları tutasan".

Bəli, elə ki, namələr hazır oldu, qasid bir yüyrək at minib düşdü yola.

İndi qasid şəhərdən çıxmaqda olsun, qul da Ələmqulu xanın yanında qalmaqda, sənə deyim Dəmirçioğlugildən.

Dəmirçioğlu, Gürcüoğlu Məmməd, bir də Tanrıtanımaz səhər təzəcə açılanda çatdılar haman yol ayrıcına. Xoşbaxtlıqdan o gecə də yaman şeh düşmüşdü. Baxdılar ki, at ləpirləri ayrıldı. Ləpirin biri gedir Bayazidə tərəf. Amma o biri ayrılıb düşüb ikinci yola. Dəlilər bildilər ki, Bayazidə tərəf gedən ləpir Qıratındı, ikinci yola gedən Ərəbatın. Onlar da atların başını döndərib düşdülər haman yola. Gəlhagəl, gəlhagəl, gəlib çatdılar Ələmqulu xanın kövşəninə. Elə şəhərə tərəf gedirdilər, bir də baxdılar ki, budu, bir atlı çaparaq gəlir. Dəmirçioğlu dedi:

– Dayanın, bu atlı şəhərdən gəlir. Qoy gəlsin, bəlkə bundan bir şey öyrəndik.

Dayanıb başladılar gözləməyə. Atlı gəlib çatdı. Sən demə, bu, Hasan paşanın yanına gedən qasiddi. Tanrıtanımaz ata bir qırmanc göstərib, aldı qasidin başının üstünü. Dedi:

– Ayə, dayan görüm kimsən? Haradan gəlib, haraya gedirsən?

Qasid dedi:

– Ələmqulu xanın qasidiyəm, Toqata gedirəm. Hasan paşaya namə aparıram.

Tanrıtanımaz soruşdu:

– Nə namə?

Qasid dedi:

– Əhməd tacirbaşını quldurlar soyublar. Mallarını alıb, özünü də əsir eləyiblər. İndi onun xəbərini aparıram Hasan paşaya.

Elə bu sözdə Dəmirçioğlu çatdı. Dedi:

– Ələmqulu xan bu işi haradan bilib?

Qasid dedi:

– Əhməd tacirbaşının qulu xəbər gətirib. Altında da bir yaxşı at var idi, bağışladı Ələmqulu xana. O da əvəzində ona söz verdi ki, xəbəri Hasan paşaya çatdırsın.

Tanrıtanımaz dedi:

– Naməni bəri ver görüm!

Qasid dedi:

– Niyə verim?

Qasid elə bunu deməyini gördü. Bayaq Tanrıtanımaz tutdu qasidin xirtdəyindən ki:

– Ayə, necə yanı niyə verim?

Qasidin gözləri çıxdı kəlləsinə. Dəmirçioğlu bir təhər ki, qasidi onun əlindən alıb buraxdı. Elə ki, qasidin ağlı başına gəldi, Dəmirçi-oğlu ona dedi:

– Əhməd tacirbaşını quldurlar tutmayıb. Əhməd tacirbaşını tutan Koroğludu. O qul hər nə deyibsə, hamısını yalan deyib, o at da ki, o, xana bağışlayıb, o da Koroğlunun atıdı. İndi buradan birbaş qayıdarsan Ələmqulu xanın yanına. Ona deyərsən ki, Koroğlunun üç dəlisi gəlib, qulu da, atı da istəyirlər.

Qasid birbaş qayıtdı Ələmqulu xanın yanına. Ələmqulu xan əhva-latdan xəbərdar olcaq, hökm elədi qoşun yeridi. Dəmirçioğlu baxdı ki, qulun əvəzinə, budu qoşun gəlir...

Başa düşdü ki, Ələmqulu xanın fikri özgədi. Üzün yoldaşlarına tutub dedi:

Dağlara düşüb alaça,
Payızdımı, yazdımı ola?
Deyəsən qurd-quş hərlənir,
Qarğadımı, qazdımı ola?

Üstümüzə gəlir qənim,
Gəldiyini sizə deyim.
Yarı sizin, yarı mənim,
Söhbətdimi, sazdımı ola?

Dəlilər baxdılar ki, qoşun gəlir. Sən demə Dəmirçioğlu qoşunu qarğaya, qaza oxşadırmış. Gürcüoğlu Məmməd dedi:

– Dəmirçioğlu, orasını çox düz deyirsən ki, "söhbətdimi, sazdımı ola". Çoxdandı ki, dava eləməmişik. Bu dava bizim üçün elə söhbət-saz kimi bir şey olacaq. Amma yarı özünə götürüb, yarı bizə verməkdə yaxşı eləmirsən. Bu, yoldaşlıq olmadı. Sən bizim ikimizi bir adam, özünü də bir adam hesab eləyirsən. İndi ki, belə oldu, mən gedirəm.

Dəmirçioğlu gördü ki, söz Gürcüoğlu Məmmədə dəyib.

Aldı, sözün üçüncü xanəsini dedi:

Qarşımızda şikar gördüm,
Gizlin deyil, aşkar gördüm.
Hər nə ki var, sənə verdim,
Yoxsa payın azdımı ola?

Elə bu sözdə qoşun gəlib çatdı. Tanrıtanımazla Gürcüoğlu Məmməd qılıncları çəkdilər ki, dava başlasınlar. Dəmirçioğlu qoymadı, dedi:

– Dayanın! Qoy görək hələ bunun fikri nədi? Biz ondan öz atımızı istəyirik. O bizdən nə istəyir ki, belə qoşun gətirib.

Atını sürüb gəldi qoşunun qabağına. Aldı, görək Ələmqulu xana nə dedi:

Gəl sənə söyləyim, Ələmqulu xan!
And verirəm, bu gün döyüş olmasın!
Kükrəyib aslan tək axıdaram qan,
And verirəm, bu gün döyüş olmasın!

Çəkərik qılıncı, kəsərik yolu,
Bizik dəlilərdə üç dəli-dolu,
Hələ gəlməyibdi o qoç Koroğlu
And verirəm, bu gün döyüş olmasın!

Mərd igidlər müxənnətdən sapılsın,
Qarı düşmən dərələrə təpilsin,
Gərək Koroğlunun atı tapılsın,
And verirəm, bu gün döyüş olmasın.

Ələmqulu xan elə bildi ki, Dəmirçioğlu belə deməkdə qoşundan qorxur. Hay vurdu ki:

– Tutun, qollarını bağlayın! Atlarını da əllərindən alın!

Qoşun yeridi dəlilərin üstünə. Misri qılınclar çəkildi. Dəmirçioğlu üzünü yoldaşlarına tutub dedi:

Misri qılınc alın ələ,
Siz o yandan, mən bu yandan!..
Al qanı döndərək selə
Siz o yandan, mən bu yandan!..

Düşmanın qəddini bükək,
Başlar kəsib, yerə tökək,
Xan qoruğunda turp əkək
Siz o yandan, mən bu yandan!..

Haydı düşmanın tuşuna,
Qan udduraq bu qoşuna,
Gələk Koroğlu xoşuna,
Siz o yandan, mən bu yandan!..

Söz tamam oldu. Dəlilər ac qurd kimi özlərini vurdular Ələmqulu xanın qoşununa. Axşam qaş qaralanacan bu qoşuna bir vay verdilər ki, dünyanı Ələmqulu xanın başına dar elədilər. Xan dava başlamağına peşiman oldu. Ancaq day iş o yerdən keçmişdi. Axşam üstü xan hökm elədi. Qoşun qayıdıb şəhərə doldu. Qapıları da bərk-bərk bağladılar. Onlar oturub səhəri gözləməkdə olsunlar, eşit dəlilərdən!

Dəlilər dedilər: "Beləliklə biz nə atı, nə də qulu ala bilməyəcəyik. İndi şəhərə də girsək onları tapmaq olmayacaq. Bəs biz nə eləyək ki, bu özü atı da versin, qulu da versin".

Tanrıtanımaz dedi:

– O məndə.

Soruşdular:

– Necə?

Dedi:

– Biz səhər gələndə Ələmqulu xanın ilxısı, bax, o dərənin içində idi. Gəlin gedək ilxıçıları tutaq. Əl-ayaqlarını bağlayaq. Özünə də sifariş göndərək ki, ya atı, qulu ver, ya da ki ilxını aparırıq. Onda canının dərdindən gətirib verər.

Tanrıtanımazın tədbiri dəlilərin beyninə batdı. Durub atları minib, özlərini verdilər haman dərəyə. Baxdılar ki, ilxı doğrudan da dərədədi. Hay demədən düşdülər ilxıçıların üstünə. İlxıçılar qısqını bərk görüb təslim oldular. Dəmirçioğlu onlara dedi:

– Bu saat gedərsiz xanınızın yanına. Deyərsiniz ki, ya qulu da, atı da versin, ya budu ki, bütün ilxını haylayıb aparacağıq.

İlxıçılar özlərini yetirdilər Ələmqulu xanın yanına ki:

– Taxtın tarac olsun, yəhərin qanla dolsun, nə oturmusan? Bəs hal-hekayət belə. Koroğlunun dəliləri bu saat əyləşiblər dərənin gədiyində, özləri də belə deyirlər:

Ələmqulu xan soruşdu:

– Ədə, bir əməlli-başlı danışın görüm, hansı dərədə?

İlxıçıbaşı dedi:

– Belə daşlı dərədə ey... daşlı dərədə. Başının çarəsini tap!

Ələmqulu xan getdi fikrə. Handan-gecdən dedi:

– Bəli, onlar ki girdilər daşlı dərəyə, bir il də orada qalsalar nə biz onlara bata bilərik, nə də ilxını onlardan ala bilərik.

İndi sənə deyim daşlı dərədən, gör necə dərə idi.

Daşlı dərənin girəcəyi dar bir gədik idi. İki adam güclə girə bilərdi. Çıxacağı da beləcə dar idi. Özü də çıxacağına iri bir daş düşüb yolu elə kəsmişdi ki, kim dərəyə girsəydi, gərək yenə də qayıdıb girəcəkdən geri çıxaydı. Odu ki, adına Daşlı dərə deyirdilər. İndi ilxı dərənin içində idi. Dəlilər də kəsmişdilər haman o dar gədiyi. Odu ki, Ələmqulu xan bu sözü ilxıçılardan eşitcək əl-ayağı yerdən-göydən üzüldü. Döndü qoşun böyüklərinə ki:

– Tədbir! Deyin görək nə təhər eləyək?

Heç kəs bir məsləhət verə bilmədi. İş belə olanda Ələmqulu xan hökm elədi ki:

– Qızım Ruqiyə xanıma deyin, gəlsin mənim hüzuruma!

Xəbər getdi Ruqiyə xanıma. Ruqiyə xanım durub gəldi Ələmqulu xanın məclisinə.

Ruqiyə xanım ki, var idi, Ələmqulu xanın bircə qızı idi. Dari-dünyada bu qızdan başqa zürriyyəti olmamışdı. Odu ki, Ələmqulu xan əlindən gələni Ruqiyə xanım üçün eləmişdi. Day elm qalmamışdı, kitab qalmamışdı ki, onu oxutmamış olsun. Qız özü də çox fəhmli-fərasətli idi. Bütün elmləri əzbər eləyib, açarını qoymuşdu cibinə. Ələmqulu xan həmişə çətin işə düşəndə Ruqiyə xanımı məsləhətə çağırardı. İndi də ona görə çağırmışdı.

Qərəz, Ruqiyə xanım gəldi atasının yanına. Ələmqulu xan əhvalatı necə ki, olmuşdu ona danışıb məsləhət istədi. Ruqiyə xanım bir az fikrində götür-qoy eləyib dedi:

– Ata! Bu gələn hələ Koroğlunun üç dəlisidi. Sabah, birisi gün Koroğlu görsə ki, dəlilər gəlmədi, durub özü də gələcək. Sən bir fikir elə gör, onda nə olacaq.

Ələmqulu xan dedi:

– Yaxşı, bəs necə eləyək?

Ruqiyə xanım dedi:

– Necə eləyəcəksən? Gərək qulu da, atı da verəsən. Onlar ki, sənə bir pislik eləmirdilər. Elə genə də eləmirlər. Öz atlarını, bir də düşmənlərini istəyirlər.

Ələmqulu xan dedi:

– Qızım, iş o yerdən keçib. Əgər dünən elə qasidi göndərəndə versəydim, sən deyən düz idi. Ancaq indi versəm, bütün xanların, paşaların içində bihörmət olub gedərik. Hər yerdə deyərlər ki, Ələmqulu xan üç adamın əlində aciz qalıb təslim olub.

Ruqiyə xanım dedi:

– Sən niyə elə eləyirsən ki? Götür onlara bir namə yaz! Yaz ki, bəs mən bilməmişəm ki, siz Koroğlunun dəlilərisiniz. Mən çoxdan Koroğlu ilə dost olmağa fürsət axtarırdım. Naməni lap elə mən özüm götürüb vəzir-vəkil ilə gedim onların yanına. Gətirim onları evə. Bir neçə gün qonaq saxla. Hörmət elə. Atı da, qulu da ver, getsinlər. Eşidənlər də desinlər ki, Ələmqulu xan Koroğlunun dostudu. Ondan sonra qorxudan bir xan, bir paşa sənin həndəvərindən keçə bilməz.

Məclisdəkilərin hamısı Ruqiyə xanımın məsləhətinə afərin dedi. Tez namə yazıldı. Ruqiyə xanım vəzir-vəkil, ağsaqqal-qarasaqqalları da yanına alıb, Daşlı dərəyə tərəf yol başladı. Dəlilər bir də baxdılar ki, budu bir dəstə adam gəlir, qabaqlarında da bir qız. Heç birinin də yaraq-yasağı yoxdu. Dəmirçioğlu dedi:

– Afərin sənə, Tanrıtanımaz! Tədbirin yaman baş tutdu. Ələmqulu xan barışığa gəlir.

O qədər gözlədilər ki, dəstə gəlib yaxınlaşdı. Baxdılar ki, vallah, bu qız elə bir qızdı ki, şam kimi şölə verir, çıraq kimi işıq salır. Elə bil ki, zalımın qızı büllurdan yaranıb. Gürcüoğlu Məmməd dedi:

– Dəmirçioğlu, Koroğluya məndən salam yetirərsən. Deyərsən ki, Gürcüoğlu Məmməd oldu eşq dəlisi! Day ondan Koroğlu dəlisi çıxmaz. Məndən ümidini üzsün. Mən dönüb oluram Məcnun. Boynuma

bir zəncir bağlayacağam, ucunu da verəcəyəm bu qızın əlinə. Hara çəkir, özü bilər.

Dəmirçioğlu macal tapmadı ki, Gürcüoğlu Məmmədin cavabını versin. Ələmqulu xanın adamları gəlib çatdılar. Ruqiyə xanım salam verdi. Dəmirçioğlu ədəblə onun salamını alıb, əleyk dedi. Ruqiyə xanım Ələmqulu xanın naməsini verdi. Dəlilər oxuyub namədən hali olcaq Gürcüoğlu Məmməd dedi:

– Gedək!

Dəmirçioğlu dedi:

– Sən dayan!

Sonra üzünü Ruqiyə xanıma tutub dedi:

– Biz xanın məclisinə gedirik. Ancaq şərtimiz var.

Ruqiyə xanım soruşdu:

– Şərtiniz nədi?

Dəmirçioğlu dedi:

– Şərtimiz budu ki, qulu da, atı da gətirib buradaca verəsiniz bizə. Bizlərdən birimiz onları gərək tez aparıb Koroğluya çatdıra. İkimiz gələrik xanın hüzuruna.

Ruqiyə xanım dedi:

– Baş üstə! Siz gözləyin! Biz yarım saata gələrik.

Bunu deyib, Ruqiyə xanım adamları da götürüb geri qayıtdı. Elə ki, onlar gedib gözdən itdilər, dəlilər başladılar məşvərətə.

Dəmirçioğlu dəlilərdən soruşdu:

– Deyin görüm, məsləhətiniz nədi?

Tanrıtanımaz dedi:

– Mənim məsləhətim budu: o qədər gözləyək ki, at ilə qulu gətirsinlər. Elə ki, gətirdilər, ikisini də götürək. Birbaş çıxıb gedək. Bizim Ələmqulu xanın yanında nə işimiz var? Sonra ortalıqda hiylə-miylə olar. Xan tayfasına bel bağlamaq olmaz.

Gürcüoğlu dedi:

– Yox, Tanrıtanımaz, hər nə desən de, bunu demə. Biz gərək xanın yanına gedək. Getməsək heç olmaz.

Dəmirçioğlu dedi:

– Tanrıtanımaz, Gürcüoğlu ayrı fikirlə deyir. Amma ki, biz xanın yanına getməliyik. Yoxsa sən deyən kimi eləsək, elə biz də olarıq xanların, paşaların tayı. Day ondan sonra heç kəs bizim sözümüzə inanmaz. Bir də deyərlər ki, Koroğlu dəliləri qorxdular. Lap hiylə də olsa, biz gərək gedək. Amma ki, işimizi də möhkəm tutaq.

Dəlilər soruşdular:
– Necə?
Dəmirçioğlu dedi:
– Belə ki, bizim birimiz gərək atla qulu götürüb Çənlibelə aparaq. Koroğluya çatdıraq ki, işdi hiylə-zad olsa, atla qul əldən getməsin. İndi deyin görüm, Çənlibelə hansınız gedəcəksiniz?
Gürcüoğlu Məmməd üzünü Tanrıtanımaza tutub dedi:
– Tanrıtanımaz, sən özün bilirsən ki, mən dost yolunda candan keçərəm. Amma bu yerdə gərək sən mənə kömək eləyəsən. O necə deyirlər, ölmüşəm, yerdən götür. Mən gərək o xanın məclisinə gedəm. O qıza heç olmasa bir doyunca baxam. Mən ölüm, sözümü yerə salma!
Tanrıtanımaz dedi:
– Sən niyə ölürsən? Qurban olsun sənə at da, qul da, Ələmqulu xanın özü də. Hələ desən, lap Ələmqulu xanın...
Gürcüoğlu Məmməd tez onun sözünü kəsdi ki:
– Amandı elə söz demə!
Dəlilər gülüşdülər. Bu dəmdə bir də gördülər ki, dəstə gəlir. Ərəbatı da gətirirlər, qulu da.
Tanrıtanımaz dedi:
– Eybi yoxdu. Siz gedin Ələmqulu xanın yanında keyf eləyin. Mən də bu keyfin əvəzini yolda quldan çıxacağam.
Dəmirçioğlu dedi:
– Ancaq biz Ələmqulu xanın yanında bircə gün qalacağıq. Sabah axşam Çənlibeldə olacağıq. Olduq, olduq. Olmadıq, onda bilin ki, o necə deyərlər, başımız əlimizdə deyil. Koroğluya elə beləcə deyərsən. Sonrasını özü bilər. Hər necə ki, eləmək lazımdı, özü elər.
Bəli, dəstə gəlib çatdı. Ruqiyə xanım atı da, qulu da Dəmirçioğluna verib dedi:
– Əl-əhdi minəl-vəfa. Biz öz vədimizi yerinə yetirdik. Siz də öz sözünüzün ağası olun.
Dəmirçioğlu dedi:
– Bizə Koroğlu dəlisi deyərlər, xanım! Bizdə xilaf söz olmaz.
Ondan Dəmirçioğlu götürüb qulu mindirdi Tanrıtanımazın atına. Ayaqlarını da atın qarnının altında möhkəm-möhkəm bağladı. Qul başladı yalvarmağa ki:
– Bir qələtdi eləmişəm.
Dəmirçioğlu dedi:

– Bizə heç zad demə! Hər nə ki sözün var, Çənlibeldə Koroğluya deyərsən.

Elə ki, qulun işi düzəldi, ondan Tanrıtanımaz da Ərəbata minib onu saldı qabağına. Elə yol başlamaq istəyəndə Dəmirçioğlu dedi:

– Ayə, Tanrıtanımaz, sən Tanrısız, Allahsız bir adamsan. Yolda acıqın tutar, ona bir şey-zad eləyərsən ha... Bax, Çənlibelə salamat apar çıxart!

Tanrıtanımaz dedi:

– Tanrını da tanımasam, Koroğlunu tanıyıram. Elə şey eləmərəm.

Bunu deyib, Tanrıtanımaz ata dəydi. Qul da qabağında Çənlibelə tərəf yola başladı. Dəmirçioğlu o qədər gözlədi ki, onlar gedib gözdən itdilər. Ondan üzünü Ruqiyə xanıma tutub dedi:

– Xanım, indi biz sizin qulluğunuzda hazırıq. Haraya deyirsən gedək!

Ruqiyə xanım dedi:

– Qulluq sahibi olasınız! Buyurun!

Ruqiyə xanım düşdü qabağa. Dəmirçioğlu sağ tərəfində, Gürcüoğlu Məmməd sol tərəfində, qalan adamlar da onların dalınca şəhərə tərəf yol başladılar. Bəli, şəhər qapıları taybatay açıldı. Qoşun çıxdı istiqbala. Qurbanlar yıxıldı yerə, cahi-cəlal ilə gəlib çatdılar xanlar qapısına. Ələmqulu xan özü yerindən durub onları pişvaz elədi. Əllərindən tutub məclisə gətirdi. Birini sağ tərəfində oturtdu, birini də sol tərəfində. Vəzir, vəkil, hamı yerli-yerində əyləşdi, sonra məclisin yuxarı tərəfində bir ipək pərdə asdılar. Ruqiyə xanım da öz başının qızları ilə gəlib bu pərdənin dalında qərar tutdu. Ələmqulu xan başladı söhbətə. Bir az oradan danışdı, bir az buradan danışdı, axırı mətləb üstə gəlib dəlilərdən üzrxahlıq elədi.

Amma məclisdə nə danışıldısa Gürcüoğlu Məmməd heç birini eşitmədi. Gözləri elə zillənib qalmışdı pərdənin dalında. Dəmirçioğlu hətta bir-iki dəfə onu dümsüklədi də, bir şey çıxmadı.

Elə ki, xan üzrxahlığını elədi, yemək-içmək başlandı. Saqi girdi məclisə. Ələmqulu xan dəlilərə burada bir qonaqlıq verdi, bir qonaqlıq verdi ki, nə deyim. Yedilər, içdilər, çalğıçılar çaldı, oxuyanlar oxudu, gecədən də bir pas keçmiş məclis dağıldı. Hamı yatdı. Amma sən gəl ki, ilan vuran yatdı, amma nə Dəmirçioğlunun gözünə yuxu getdi, nə də Gürcüoğlu Məmmədin. Səhəri beləcə açdılar. Dan yeri söküləndə Dəmirçioğlu qalxdı ki:

– Dur! Getmək lazımdı.
Gürcüoğlu dedi:
– Dəmirçioğlu, ölümə desən bu saat gedərəm. Amma ki, Ruqiyə xanımı aparmamış buradan gedəsi deyiləm.
Dəmirçioğlu dedi:
– Ayə, dəli olma, axmaq olma, biz qızı necə apara bilərik? Buna aləm nə deyər? Koroğlu nə deyər? Biz kişi ilə dost olmuşuq, çörək kəsmişik.
Gürcüoğlu dedi:
– Bəs necə eləyək?
Dəmirçioğlu dedi:
– Heç zad. Necə eyləyəcəyik. Gedərik, mən əhvalatı Koroğluya deyərəm, elçi göndərərik, alarıq.
Gürcüoğlu dedi:
– Onda bir gün də qalaq. Heç olmazsa bircə dəfə də, pərdə dalından da olsa, onu görüm, sonra gedək.
Dəmirçioğlu nə qədər elədisə bir şey çıxmadı. Gürcüoğlunu yola gətirə bilmədi. Axırda çar-naçar qaldı.
İndi bunlar burada qalmaqda olsunlar, eşit Çənlibeldən.
Tanrıtanımaz sağ-salamat Çənlibelə gəlib atı da, qulu da Koroğluya verdi. Qul düşdü Koroğlunun ayaqlarına. Koroğlu heç ona tərəf baxmadı da. Dəli Həsənə işarə elədi ki:
– Apar, sal ağasının yanına. Qoy uşaqlar da gəlsinlər, sonra onların işinə baxacağam.
Qulu da Əhməd tacirbaşının yanına salıb, başladılar Dəmirçioğlugili gözləməyə. Gündüzü gözlədilər, gecəni gözlədilər, sabahı da axşamacan gözlədilər, dəlilər gəlib çıxmadı. İş belə olanda Koroğlu acıqlandı. Hay vurdu, bir Dəli Mehtərdən, bir də xanımlardan başqa Çənlibeldə nə qədər dəli var idi, hamısı atlandı. Gecə ilə yeddi min yeddi yüz yetmiş yeddi dəli duman kimi Ələmqulu xanın şəhərini araya aldı. Elə ki, səflər düzəldi, dəstələr hərə öz yerini tutdu, Koroğlu Tanrıtanımazı çağırdı ki:
– De görüm, nə məsləhət görürsən? Gecə ikən şəhərə girək, ya səhəri gözləyək?
Tanrıtanımaz dedi:
– Koroğlu, biz yaxşı eləyib gəlmişik. Ehtiyat ki, var yaxşı şeydi. Amma ki, mənim ürəyim çox sakitdi. Dəlilərin başında heç bir şey

yoxdu. Yəqin elə Gürcüoğlunun şuxluğu tutub. Qızın yanından ayrıla bilmir. Dəmirçioğlu da ona görə dayanıb qalıb. Hər halda səhəri gözləmək yaxşıdı. Sonra xəcalətli olarıq.

Dəlilər Tanrıtanımazın fikrini bəyəndilər, o qədər gəzdilər ki, səhər açıldı. Şəhər əhli duran-duran baxdı ki, şəhərin ətrafı tutulub. Camaatı vahimə aldı. Töküldülər xanlıq qapısına. Ələmqulu xan durub gördü ki, bəli, necə deyirlər elədi. Şəhərin ətrafı elə tutulub, elə tutulub ki, elə bil ətdən divar çəkilib. Tez vəziri çağırıb göndərdi ki, bilsin-görsün bu nə olan işdi. Vəzir gəlib çatanda gördü nə... Gələn Koroğludu... Koroğlu vəziri görcək dedi:

Qarı düşmən, fənd-felini bilirəm,
Dəlilərim bu şəhərdə qalıbdı.
Saat yarım sizə möhlət verirəm,
Dəlilərim bu şəhərdə qalıbdı.

Şəhərin yerində kotan əkərəm,
Zər-zibasın Çənlibelə çəkərəm,
Misri qılınc çəkib al qan tökərəm,
Dəlilərim bu şəhərdə qalıbdı.

Koroğlu fərmanı mərdi-mərdana,
Dəlilərim yerikləyir al qana,
Qataram şəhərdə tozu dumana,
Dəlilərim bu şəhərdə qalıbdı.

Vəzir başı lovlu qayıdıb əhvalatı Ələmqulu xana danışdı. Ələmqulu xan Ruqiyə xanımı çağırdı. Ruqiyə xanım dedi:

– Qorxma! Mən bu saat işi yoluna qoyaram. Oradan birbaş gəldi Dəmirçioğlugilin otağına. Dəlilər də işdən bixəbər hazırlaşırdılar ki, yola çıxsınlar. Ruqiyə xanım aldı görək nə dedi:

Dərdiz alım, qoç qardaşlar,
Bir umudum sizə gəlir...
Çox çətin olubdu işlər,
Bir umudum sizə gəlir...

Kəsiblər dörd bir yanımı,
Dağıdarlar xanımanımı,
Axıdarlar al qanımı,
Bir umudum sizə gəlir...

Şad ürəyim olubdu qan,
Könlüm olubdu pərişan,
Ruqiyə xanım sizə qurban,
Bir umudum sizə gəlir...

Dəlilər soruşdular:

– Nə olub?

Ruqiyə xanım hal-əhvalatı danışdı. Dəmirçioğlu dedi:

– Sən heç qorxma, Ruqiyə xanım. Bu saat biz özümüz gedərik onun yanına.

Bunu deyib, ikisi də bayıra çıxdı. Atları minib, birbaş Koroğlunun yanına gəldilər, Koroğlu elə ki, dəliləri sağ-salamat gördü, arxayınladı, onları məzəmmət eləməyə başladı. Dedi:

Barakallah, səd mərhəba!..
Tez gələn beləmi əyləni?
Yaxşı yaradız qulluğa,
Tez gələn beləmi əyləni?

Fikrinizə nə qoyubsuz?
Qeyri yollara uyubsuz,
Görünür məndən doyubsuz,
Doymayan beləmi əyləni?

Demə dünya gedər belə,
Uymayın fitnəyə-felə,
Koroğlunu gətdiz dilə,
Tez gələn beləmi əyləni?

Dəlilər ikisi də başlarını saldılar aşağıya. Dəmirçioğlu dedi:

– Koroğlu, biz taqsırkarıq. Hər nə eləsən ixtiyarsan.

Bunu deyib Dəmirçioğlu qılıncını çıxardıb iki əlinin üstündə Koroğlunun qabağına qoydu, özü də diz çökdü. Koroğlu onun qolundan yapışıb qaldırdı. Sonra soruşdu:

– De görüm, əsl müqəssir kimdi? Sənsən, ya Gürcüoğlu?

Dəmirçioğlu dedi:

– Elə ikimizin də taqsırımız birdi. Bir-birindən nə əskikdi, nə artıq.

Koroğlu nə qədər elədi ki, Dəmirçioğlu işin əslini desin, demədi. Elə bircə bunu dedi ki:

– İkimizin də taqsırımız birdi.

Koroğlu işi bilirdi. Bilirdi ki, Dəmirçioğlu Gürcüoğlu Məmmədə görə gecikib. Amma onu da bilirdi ki, Dəmirçioğlu ölüm də olsa, yoldaşı pis ayaqda tək buraxmaz, namərdlik eləyib yoldaşı ələ verməz. Odu ki, onu bir də sınamaq üçün belə qısnayırdı. Elə ki, gördü Dəmirçioğlu sözündən dönmədi, yoldaşın sirrini açmadı, dedi:

– Mərhəba! Mən səni qəsdən sınayırdım. Sağ ol! Sonra dönüb Gürcüoğlundan soruşdu:

– Hə... nə var, nə yox, Gürcüoğlu? Deyəsən Ələmqulu xanın qızı çox xoşuna gəlib.

Gürcüoğlu başını aşağı saldı. Elə bunlar bu sözdə idilər, Ələmqulu xan öz vəzir-vəkili ilə gəlib çatdı. De əl verdilər, görüşdülər, Ələmqulu xan dedi:

– Qoç Koroğlu, mən səninlə dost olmaq istəyirəm. Bütün dəlilərinlə mənə qonaqsan.

Koroğlu nə qədər boyun qaçırmaq istədisə olmadı. Axırda Ruqiyə xanım irəli yeriyib dedi:

– Qoç Koroğlu, sən buradan elə beləcə çıxıb getsən atamı bütün dünyada bədnam elərsən. Kişi dostluq üçün uzanan əli kəsməz.

Koroğlu Ruqiyə xanımın sözündən keçə bilmədi. Ancaq şəhərə də girmədi. Hökm elədi, şəhərin kənarında çadırlar quruldu. Üç gün, üç gecə yemək, içmək oldu. Ələmqulu xan Koroğluya bir qonaqlıq verdi ki, hələ ruzigarın gözü belə qonaqlıq görməmişdi. Elə ki, üç gün tamam oldu, Koroğlu Ələmqulu xanı çağırıb dedi.

– Xan, elədiyin hörmətə görə çox sağ ol! Ancaq mənim səndən bir təvəqqəm var.

Xan dedi:

– Təvəqqə nədi? Sən əmr elə, mən yerinə yetirim.

Koroğlu dedi:

– Yox. Bu elə bir şeydi ki, əmrlə olmaz. Belə iş ancaq təvəqqədən aşar.

Xan dedi:

– Buyur!

Koroğlu sazı basdı döşünə dedi:

Qulluğuna bircə kəlmə sözüm var,
Mənim bu sözümdən incimə, ay xan!
O sözlər bu yerin sözü döysə də,
Sən Allah, o sözdən incimə, ay xan.

Xan dedi:

– Əşi, incimək nədi? Sən lap əhd eləsən mənim başımı istəyəcəksən, o da ki sənə qurbandı. Sözünü de!

Koroğlu dedi:

Lazımdı araya elçi salaydım,
Neçə minnətçiylə dilçi salaydım,
Qayda budu, gedib, bir də gələydim,
Mənim bu işimdən incimə, ay xan!

Xan məsələni başa düşdü. Ancaq gözlədi ki, görsün sözün axırı nə olur. Koroğlu aldı sözün o biri xanəsini dedi:

Koroğlunun sözün yazma qələtə,
Hesab etmə qanmaza, nabələdə,
Ruqiyə xanımı gəl ver Məmmədə,
Sən gəl bu sövdadan incimə, ay xan!

İncimək nədi? Xan Allahdan belə bir qohumluq axtarırdı. O saat molla, qazı çağırıldı. Ruqiyə xanımın kəbini kəsildi Gürcüoğlu Məmmədə. Toy təzədən başlandı. Üç günün üstünə bir dörd gün də gəldilər, oldu yeddi gün, yeddi gecə. Yeddi günün tamamında istədilər gəlini tapşırsınlar bəyə. Koroğlu razı olmadı. Dedi:

– Çənlibeldə dəlilərin də, xanımların da anası Nigardı. Mən gərək aparıb bir toy da orada eləyəm.

Dəlilər atlandı. Ruqiyə xanımı da götürüb Çənlibelə gəldilər. Xanımlar işdən xəbərdar oldular. Nigar Ruqiyə xanıma xoşgəldin elədi. Toy təzədən başlandı. Sazlar səs-səsə verdi, saqi məclisə girdi. Koroğlu belə baxdı Nigarı sağ yanında gördü, belə baxdı Eyvazı sol yanında gördü, qabağa baxdı yeddi min yeddi yüz yetmiş yeddi dəlini qabağında gördü. Ürəyi atlandı, qəlbi coşdu, üçtelli sazı sinəsinə basdı, dedi:

Məclis qurduram həmişə,
İşrətim, damağım ola!..
Əmliklər çəkdirəm şişə,
Bir ağır yığnağım ola!..

Çənlibeldə köçüm, qonum,
Atlasdan biçilər donum,

Ortadan qalxmaya xonum,
Gündə yüz qonağım ola!..

Vuram xotkar, tutam paşa,
Xanlar məndən çəkə haşa,
Bu dövranım vara başa,
Sönməyən çırağım ola!..

Eyvaz imdadıma çata,
Dəmirçioğlu şeşpər ata,
Sıçrayıb minəm Qırata,
Bəlli Əhməd dayağım ola!..

Şir qanı ola qanımda,
Qorxu olmaya canımda,
Dəlilər olsa yanımda,
Qırram yüz min yağım ola!..

Düşmən qanın içəm, doyam,
Müxənnət gözlərin oyam,
Çəkəm bəzirganlar soyam,
Tacirlər dustağım ola!..

Koroğluyam savaşımda,
İgid dəlilər başımda,
Nigar əyləşə qarşımda,
Keçən cavan çağım ola!..

# Ağcaquzu

Bəli, qulluğunuza hardan xavar verem, keçmiş əyyamnan, sabiqəl dövrannan-ustatdar qovmünnən.

Koroğlunun çox cavan vaxtıydı. O ki, Hasan paşa atasının gözdərini oydurdu, sora başlarına nələr gəldi, o hamıya bəllidi...

Deyəllər Qoşabulağın üstündə Həzrət Əli bir nurəni qoja sifətində gəlif, sağ əlini qoç Koroğlunun kürəyinə vurdu, ona iyitdik badəsi içirtdi. Dedi:

– Koroğlu, mənim sözümə inan, sən Koroğlusan, heç vaxt, heç kimə məğlub olmuyajaqsan!.

Bu sözü deyif də qeyb oldu.

Koroğlu özdüyündə inanar-inanmaz özündə bir gözəllik, bir qüvvə hiss eləməyə başladı. Anjax atasının qisasını bu qaniçən xotkarlardan, paşalardan almax niyyəti heç başınnan çıxmerdı. Əmbə bu qisası ala bilmerdi, güjü çatmerdi, tək iydi. Koroğlu həmeşə atı sürərdi İstanbulun kanarına, şəhərə tamaşa eliyərdi, hayıfsınıf geri dönərdi.

Günnərin bir günü Koroğlu belə fikrə gəldi ki, gedem bir az dolanem, iyiddiyin səmtini, sorağını öyrənem, pəhlivannığı, vuruf-tutmağı, qoçaxlığı mənimsəyim, sonra dönüf genə geri gəlləm.

Bu fikirnən Koroğlu Düratı da yedəyinə alıf, atasının kasıf bir dostu varıydı, birbaş olara gəldi. Düratı həmən qoja kişiyə amanat eliyif yola düşdü.

Koroğlu Qıratı sürha-sür gəlif, birbaş Təkə-Türkmana çıxdı. Gördü kü, bir meydandı sulanıf, iki cavan oğlan bir tərəfdə, bir qarımış pəhlivan bir tərəfdə cəng eliyirlər. Anjax bu ölüm-dirim cəngi döy, yıxım-qaldırım cəngidi. Bu qarımış pəhlivan bu cavan pəhlivanın birinnən tutaşeir, nə qəddər eliyir, cavan pəhlivanın arxasını yerə gətirə bilmer. Bu birinnən qurtaranda o birinə, o birinnən qurtaranda bu birinə... Koroğlu bu cavan pəhlivannara o qədərə meyl elədi ki, dedi: "İlahi, doğrudan da sən buları iyit yaradıfsan".

Bu cavan pəhlivannarnan yaxınnıx eliyif, bunnardan hal-əhval eliyəndə bildi kin, bunnar Təkə-Türkmanın xanı Süleyman xanın oğlannarıdı. Koroğlu Süleyman xanın oğlannarınnan dostux işdətdi. Oğlannarın səvəvinə xannığa əyaq aşdı.

Koroğlu bir gün xannıxda Süleyman xanın qızı Bilqeysi gördü. Bilqeyisə çox meyil saldı, doğrusu, Bilqeysi sevdi. Fikirləşdi: "İlahi, mən nə təhəri eliyim bu Bilqeysi ələ keçirem".

Aradan qarılarnan, qızdarnan söhbət eleyif Bilqeys xanımın konlunu aldı. Bilqeys xanımın konlunu alanan sora Süleyman xana elçi göndərdi. Süleyman xan qəti cavaf verdi ki, bu, heç düzələn iş döylü. Dedi:

– Siz nə bilersiniz o haranın yol azanıdı, əsli bilinmer, nəsli bilinmer, dərənin avarasına mən qız verməərəm.

Koroğlu xeyli fikirrəşənnən sonra özü bir yol tapıf, Bilqeys xanımnan görüşdü. Dərddəşdilər, danışdılar, sözü bir yerə qoyuf qaçmax qərarına gəldilər. Bir müddət gözdədilər, aranı xəlvət eliyif vədələşdilər. Gejənin bir aləmi Koroğlu Bilqeys xanımı Qıratın tərkinə alıf, Təkə-Türkmanı tərk elədi. Gəlha-gəl, günə bir mənzil, teyyi-mənazil, gəlif Qoşabulağın üstünə atasının qəbri önündə atı saxladı. Bir qədər atasının qəvrini ziyarat elədi. Qəvri ziyarat eliyənnən sora, gənə də Bilqeys xanımı tərkinə alıf İstanbula endi.

İstanbulun ətrafında yazda, yayda camahat binələrə çıxerdı. Bu binələrin birində gizdin bir yerdə bir mağara varıydı. Həmən bu mağarada Koroğlu başdadı məskən salmağa. Aylar, günnər dolaşdı, Koroğlunun qadını Bilqeys hamilə oldu.

Bu tək mağarada Bilqeys ilk günnər çox darıxerdı. Nolajax, xan sarayında, süd gölündə çimən, qu tükünnən balış qoyan, atlas yorğan-döşəkdə naz-qəmzəynən firavan gün görmüş bir qızı birdən-birə mağarıya öyrətmək olardımı? Əmbə Koroğluya olan məhəbbəti Bilqeysi bir qədər təskin eləsə də, gənə darıxerdi. Koroğlu baxıf gördü ki, doğrudan da bu qızı burda, bu qayalar arasında belə tək qoymax olmaz, başına hava gələr. Oydu ku, binələrin birində bir nuranı qarı nənə varıydı, adına Əsmər qarı deyərdilər. Koroğlu başına gələni Əsmər qarıya danışdı. Əsmər qarı həmən günnən Koroğluyu da, Bilqeysi də oğulluğa, qızdığa götürdü. Tez-tez Bilqeysə baş çəkməyə gəldi. Koroğlu axçadan, paradan qarıya vererdi ki, süddən, qatıxdan, yağdan-qaymaxdan alıf gətirsin, qoymasın Bilqeys korrux çəkməyə. Beləjə günnər bir-birini əvəz eliyirdi... Bir gün Bilqeys yükünü yerə qoydu, bir gözəl oğlan doğdu.

Atalar çox yaxşı deyif "çuğul nə ölüf, nə də öləjək, biri öldümü, beşi onun yerinə pitəjək". Həyat belədi, gedişat belədi. Bu gün namərdin beşini öldürsən, savax anası o beşin əvəzinə on beşini gənə doğajax.

Koroğluynan Bilqeysin mağarada belə gizli daldalanmaxlarını, bir çuğul aparıf İstanbulda Hasan paşaya xavar verdi.

Dedi:
– Öyün yıxılsın, Hasan paşa, bə sən nə təhəri Hasan paşasankı, Koroğlu sənin torpağında at çaper, sənin binələrində gizdəner?
Hasan paşıya qavaxlar da bu həndəvərdə Koroğlunun at çafdığını demişdilər. Bir neçə dəfə atdı dəstələr göndərmişdi ki, Koroğluyu tutudursun, əmbə bir murad hasıl eliyə bilməmişdi. Koroğlunun üstünə gələnnərin kiminin başı, kiminin qolu, kiminin qılçası kəsildi, qalannar öldü, qaçannar can qurtardı. Bata bilmədilər qoç Koroğluya. Cəfər paşaynan Hasan paşa belə qarala gəldilər ki, Koroğluyu aradan götürməkdən ötrü böyük bir qoşun çəksinnər.
Koroğlunun üstünə böyük bir qoşun çəkdilər. Koroğlu nə qədər vuruşdu, neçə başdar kəsdi, neçə anaları ağlar qoydu, olmadı. Gördü ki, əl çəkmellər, yerdə qalannara yazığı gəldi, özü qaçıf bir yerdə daldalandı.
Döyüş dayandı, Koroğlunun yerini bilən olmadı. Qoşun başçıları ölənnəri, yaralananları da götürüf geri çəkildilər.
Günnərin bir günü Hasan paşa tezdən nizami qoşun çəkif Koroğlunun üstünə gəlmişdi. Bilqeys gəldi dedi:
– Ya Koroğlu, axı belə olmaz, qoşun dörd yanımızı kəsif.
Koroğlu dedi:
– Bilqeys xanım, sən heç niyaran qalma, mən ağamın əlinnən cam dolu badə içmişəm, mana heç şey olası döylü. Əvvəlcən sinəmə bir neçə kəlmə söz gəlif, onu deyim, sonra düşmənə güjümü göstərərəm.
Koroğlu bunu deyif, bir "Keşişoğlu" qaydasınnan görək nə dedi, sizdərə can sağlığı.

Xotkar üstümüzə cari buyurdu,
Döyüşərəm, dönmərəm, edərəm cəngi.
Ac qarınqay kimi doyursa məni
Mən qəbul etmərəm bu namı-nəngi.

Hasan paşa o tərəfdən nərə çəkif dedi:
– Ayə, yetimin biri, sənin atayın başına gətirdiyimi sənin başına gətirəjəm, sən mənim bu qoşunumu az şil-küt elə.
Aldı Koroğlu:

Əlli nədi, altmış nədi, yüz nədi,
Mən bilmənəm hərzə-hərzə söz nədi,
Qabağımda dərə, təpə, düz nədi,
Mənəm əsil kirvələrin pələngi.

Hasan paşa dedi: – "Aya, a Koroğlu, a korun oğlu, sən korun oğlusan, sən nəyə arxalanersan, kimə güvənersən ki?! Mənim qoşunumu niyə belə qırersan?

Koroğlu dedi:

– Qulaq as, gör kimə arxalaneram.

Koroğlu:

Koroğlu der, xub yetişdim mən cana,
Mən sərimi top eylərəm çovqana,
Varıban gedərəm Təkə-Türkmana,
Ollam Əli qullarının yekrəngi –

– deyif, əlini uzatdı qılıncın dəstəyinə, bir dəli nərə çəkdi, yer-göy titrədi, qoşunu pencər kimi biçməyə başladı. Koroğlu gördü ki, bir yannan qırdıxcan qoşun bir yannan daha da arter, fikirrəşdi ki, burdan qaçıf başını qurtarmax lazımdı. Qoşunun seyrək yerinnən bir səmt tapıf, sağa-sola qılınc çala-çala mağaranın ağzına gəlif, Bilqeys xanımı harayladı. Bilqeys xanım eşiyə çıxdı. Koroğlu onun qolunnan tutuf, alıcı quş kimi atın tərkinə qoymağınnan tərpənməyi bir oldu.

Qoşun Koroğlunun dalınnan əl çəkmerdi. Ona qılınc, əmud çatan döyüldü, yolama çatan döyüldü. Geri yannan başladılar Koroğluyu oxa tutmağa. Oxun biri bir namərdin əlinnən şığıyıf Bilqeys xanımın kürəyinin ortasınnan sancıldı. Bilqeys xanım "of-of" deyif çığıranatana, Qırat üz qoydu Çənlibelin başına tərəf. Gəldilər çatdılar Qoşabulağın üstünə. Alı kişinin qavrının yanında Koroğlu atdan endi, Bilqeys xanımı ehtiyatnan atdan endirdi. Gördü, qız can verer. Koroğlu baxdı gördü qızdan o qədər qan axıf ki, dodaxları çart-çart oluf. Oydu ku, Qoşabulağın suyunnan bir oyuc Bilqeys xanıma içirtdi. Bilqeys yumulmuş gözdərini axırıncı dəfə açdı. Sevgili Koroğlusuna axırıncı dəfə həsrətnən baxıf:

– Oğlumuz amanatı – deyif, gözdərini təzdən yumdu.

Koroğlu Bilqeys xanımı atasının yanında dəfn elədi, ağladı, sızdadı, üz qoydu mağaraya tərəf. Gəldi mağaraya çatdı, hər yeri ələk-vələk elədi, uşağı tapa bilmədi, döndü bir də baxdı, heç bir şey hasil olmadı.

Koroğlu hirsinnən heç Əsmər qarıya da baş çəkmədi. Fikirrəşdi ki, gedif qoja qarının dərdini daha da artırmıyım. Oydu ki, üz qoydu korpeşiman Çənlibelə tərəf. Qoşabulağa çatdı, gəldi göz yaşını yüdü.

Gəlif atasıynan Bilqeys xanımın qavırları arasına uzanıf, təzdən ağlamağa başdadı. Bir müddətdən sonra gözünə yuxu getdi.

Koroğlu burda yatmaxda olsun, eşit Əsmər qarıdan. Əsmər qarı gördü ki, Koroğlu Bilqeysi də tərkinə alıf qaçdı, əmbə uşax qucaxlarında döyülü. Gözdədi, ara sakitdəşənnən sonra mağarıya gəldi gördü ki, bir canavar uşağı əmizdirir. Qarı bir az xəlvətə çəkilif gözdədi, canavar çıxıf getdi. Oydu ku, uşağı bələyinə püküf, sağına-soluna baxa-baxa öz komasına gətirdi. Uşağın bələyini aşdı, uşax Koroğlunun qolçağındaydı. Uşağı yüdü, təmizdədi, quruladı. Qoyun südü pişirif uşağı yedizdirdi. Beləjə bu münvalnan bu uşağı qoyun südünnən böyütməyə başdadı. Günü günnən uşax böyüməyə başdadı, atalar der: "cideyi çuvalda gizdətmək olmaz". Qonum-qonşu bildi kin, Əsmər qarının öyündə bir körpə var. Hərə bir yannan Əsmər qarıdan soruşordu:

– Ay qarı, bu uşax kimindi, hanı onun ata-anası?

Əsmər qarı hərəsinə bir cavaf vererdi. Derdi nəvəmdi, gətirif yanımda saxlayıram.

Derdilər:

– Ağbirçək qarısan, axı niyə yalan danışersan? Sənin ki, öyladın yoxdu, niyə dersən nəvəmdi?

Qarı bir gün hirsdəndi, hamıyı söydü biyavır elədi. Dedi:

– Belə heç kimim yoxdu, gedif İstanbuldan pulnan alıf gətirmişəm, özümə oğul eləmişəm, dərdi sizəmi qalıf?!

Bəli, bu xavar getdi Hasan paşaya çatdı ki, bəs deməzsənmi, filan qarıda bir tappa uşax var. Hasan Paşa Əsmər qarıyı yanına çağırtdırdı, dedi:

– Qarı, sən o uşağı mana satmalısan!

Qarı dedi:

– Paşa sağ olsun, sənin əmrin mana Allahın əmrinnən də üstündü. Əmbə mana da yazığın gəlsin, mən istəyirəm onu böyüdüm, gələcəkdə mana da bir sahıf çıxan, qəvrimi ziyarət eliyən olsun.

Hasan paşa dedi:

– Qarı, sən heç şeyin fikrini çəkmə, sənin bu dünyalığıyın da, o dünyalığıyın da xarcı mənim boynuma.

Bunu deyif, Hasan paşa xəznadarı çağırtdırdı, qarıya bir kisə qızıl verif yola saldı. Qarı komasına gəlif Koroğlunun bazubəndini uşağın qoluna bağlayıf, üzünnən-gözünnən öpdü. Hasan paşanın adamlarınnan uşağı da götürüf saraya gəldilər.

Qarı dedi:

– Paşam sağ olsun, özün görərsən ki, qocalıf əldən tüşmüşəm. Günnərimi sayeram, mümkünsə onun qoluna taxdığım o bazubəndə heç kim toxunmasın, qoy körpə balama mənnən yediyar qalsın.

Hasan paşa Əsmər qarının sözünü yerə salmadı. Paşa dedi:

– Qarı, bə bu uşağın adı nədi, nə qoymuşdun onun adını?

Əsmər qarı, yazıx-yazıx dedi:

– Paşam sağ olsun, onu qoyun südünnən bəsləmişəm, onçun da adını Ağcaquzu çağırerdım. İndi bunnan sora özünüz bilərsiniz.

Hasan paşanın qarıya yazığı gəldi. Dedi:

– Qarı, sən nə ad qoyufsan, biz o adnan da çağırajayıx balamızı.

Bunu deyif qarıya gənə də axçadan, qızıldan verdilər, yola saldılar. Ağcaquzuyu da dayələrə tafşırdılar. Bu münvalnan Koroğlu balası Hasan paşanın sarayında böyüməyə başdadı.

# Pərzad xanımın Çənlibelə gəlməyi

Bəli, əzizlərim, sizə hardan xavar verəjəm, Ağcaquzudan. O vaxt kı Əsmər qarı Ağcaquzuyu Hasan paşıya təhvil verdi, həmən günnən körpöyü dayalara tafşırdılar. Dayalar ədəf-ərkannan buna qulluq eliyir, təmizdiyinə, yiməyinə, içməyinə fikir verer, nejə lazımdı. Bir söznən, xidmətində durordular. Vaxt gəldi, vədə yetişdi, camahatın uşağı aynan, ilnən böyüyəndə Ağcaquzu sahatnan, günnən, həfteynən böyüyürdü.

Uşax gəlif yeddi yaşına çatmışdı, əmbə on beş, on altı yaşdılardan seçilmerdi. Hasan paşa uşağın belə böyüməsinnən çox xoşhal olmuşdu. Gejə-gündüz gözünü onun üstünnən çəkmerdi. Neçə müəllim tutmuşdu, onun savadını artırerdı, neçə müəllimi Ağcaquzuya qılınc oynatmax, at çapbax, güləş tutmax, suda üzmək, oddan tullanmax dərsdəri vererdilər. Bu elə bir uşağıydı ki, zehni Aflatun kimi kəserdi, ağlı-kamalı, qəddi-qaməti bir özgə alamiydi. At çapanda atın belində min bir fənd iştədər, qılınc oynadanda qılıncınnan qığılcım çaxar, küşdü tutanda pəhlivanlarnan dizini yerə gətirər, kotan əkdirərdi onnara. Belə bir oğlanıydı Ağcaquzu.

Ağcaquzu gəlif on beş yaşına yetişmişdi. Səsinin dəyişən, üzünün bozaran vaxtıydı. Bir gün mədrəsədən dərsdən gələn vaxt, qızdar mədrəsəsinin qavağınnan keçəndə gözü ala gözlü, qələm qaşdı, uzun saşdı bir qıza sataşdı. Bir neçə gün bu qızın dərdinnən divanə kimi gəzdi. Nəsə hərriyif-fırrıyıf bir xəlvət yerdə qızın qarşısını kəsdi. Ürəyinin döyüntüsünü ona bildirdi.

Qız dedi:

– Ağcaquzu, mən sənin əmin Cəfər paşanın qızı Pərzad xanımam. Sən heç qəm eləmə, əmi qızıynan, əmoğlunun kəbini göydə kəsilif. Arxayın ola bilərsən ki, mən səninəm. Əmbə bir məsləhət eləmək istiyirəm sana. Eşitmişəm sən hər bir elmnən savadın, bacarığın var, igidliyini, pəhlivanlığını da hamı söylüyür. Bircə çatışmayan cəhətin odu ku, çadukarrığı bilmersən. Adam gərək hər şeydən xavardar olsun, bir də gördün o da lazım oldu, nə bilmək olar?!

Ağcaquzu dedi:

– Əmi qızı, cadukarrıx nə olan şeydi ki, onu belə tərifliyirsən?

Pərzad dedi:

– Əmoğlu, mənim elmim ondadı ki, mən cadının gücüynən çöpü qələmə, siçanı toyuğa, adamı tülküyə, qızı göyərçinə çöyürə bilerəm. İstiyirəm, sən də belə şeyləri öyrənəsən.

Qızın dedikləri Ağcaquzuya çox xoş gəldi, dedi:

– Əmi qızı, bə mənə buları kim öyrədə bilər?

Pərzad dedi:

– Mənim mollam belə şeylərdə çox mahirdi, əmimə de, səni ona tafşırsın, dalısınnan işin yoxdu.

Ağcaquzu Hasan paşanın hüzuruna gəldi, ədəfnan salam verdi. Dedi:

– Bava, sənnən bir tavaqqım var, mümkünsə, məni də Pərzad xanım oxuyan məktəbə göndər.

Bavası dedi:

– Əziz balam, mən səni elm örgənməyə, sərkərdə olmağa layıx məktəbə qoymuşam, bu gün-sabah mən dünyadan köçənnən sonra yerimdə sən qalajaxsan, bu boyda müəllimlər ki, sana dərs dedilər, fənd öyrətdilər, olar sana bəs eləmədimi, gedif də cadugünnük örgənmək istiyirsən?

Ağcaquzu dedi:

– Bava, Pərzad deyir ki, adam gərək hər şeydən agah olsun. Mən də istiyirəm, hər şeyi bilim.

Hasan paşa irazılıx verdi, dedi:

– Məsləhət sənindi, mənim balam. Günü savaxdan gedərsən həmən məktəbə.

Bəli, savax açıldı, üstünüzə xeyirri savaxlar açılsın, əzizdərim, Ağcaquzu söyünə-söyünə gəlif Pərzadı tafdı, bavasının irazılığını bildirdi. Pərzad da bu işə çox söyündü, həmən günnən Ağcaquzu cadukərrik dərsi keçməyə başdadı.

Pərzad dərsdə Ağcaquzuya fikir vererdi, baxıf gördü kün, bu heç cadukərriyə mayna qoymor (fikir vermer), fikri-zikri at çapbaxda, qılınc oynatmaxdadı.

Bir gün Pərzad Ağcaquzuya üz tutdu, dedi:

– Ağcaquzu, mən səni özümnən çox istiyirəm, həyatda sənnən yaxınım yoxdu. Görerəm ki, sən bu cadukarrığa heç ürəknən girişmersən.

Ağcaquzu dedi:

– Yox, Pərzad, əmi qızı, səhvin var.

Pərzad dedi:

– Onda gəl öyrəndiklərimizi sınaxdan çıxartmaqdan ötəri atdarımızı minək, şəhərdən çıxaq.

Ağcaquzu dedi:

– Çıxax, sən deyən olsun!

Atdandılar, şəhərdən çıxıf bir meşənin ortasına çatdılar, göyənək, mənzərəli bir guşədə atdan tüşdülər. Bu arada Pərzad bir dua oxuyuf, alaqanat bir quşa döndü, uçdu getdi, qondu bir ağacın başına.

Həmən sehirdən birini də Ağcaquzu oxudu, bu da uçuf qondu onun yanına. Qız ağacdan enif, bu dəfə bir ayrı livasa tüşdü.

Ağcaquzu da eynən həmən livasa tüşdü. Pərzad bu dəfə doyşan livasına tüşdü. Ağcaquzu bir qurd oluf doyşanın qavağını kəsdi. Pərzad bir sehr oxudu, pələng livasına girdi. Bu yerdə Ağcaquzu əciz qaldı. Pərzad baxdı, gördü kü, Ağcaquzu onnan bajarmadı, dedi:

– Əmoğlu, mənim cadukarrığım sənnən üstün oldu. Bu günnən sora sənnən mənimki tutmaz. Mən bu günnən uluyuf vəhşilərə qoşuloram. Əgər məni öz sehrinnən əvvəlki halıma gətirə bilsən, səninəm, yox, bajarmasan məni də görmüyəjəssən.

Pərzad bunu deyif, uluya-uluya heyvannara qoşuluf gözdən itdi.

Ağcaquzu kor-peşman şəhərə qayıtdı. Öz saraylarına çatar-çatmaz əmisi Cəfər paşa onnan Pərzad xanımı xavar aldı.

Ağcaquzu başına gələn əhvalatı nejə kin biz demişdik, eləjə də əmisinə nağıl elədi.

Cəfər paşa iki əlli başına döydü kün, "qız əlimnən getdi".

Cəfər paşa çox götür-qoy elədi ki, bu qızı kim qaytarsın, kim adam livasına salsın. Bu yannan da xavar çıxdı kı, bəs deməzsənmi, uşaxlara cadıkün dərsi öyrədən molla da dünyəsini dəyişif. Başqa yerlərdə də belə caduynan məşğul olan yoxuydu.

Ağcaquzu bu işdən çox məyus oldu, başını götürüf eyvanın xəlvət bir guşəsində yuxuya getdi. Yuxuda baxıf gördü kü, kimsə bunu oyadır. Gözünü açanda gördü alçax boylu, enni kürəhli, nurani bir adamdı kı, vallahi gözünnən, üzünnən nur qalxır. Ağcaquzu başını yuxarı qaldırdı, bu nurru sifətə baxdı. Kişi dedi:

– Salamməleyküm, oğul! Oğul, sən nə fikirnən yatmışdın?

Ağcaquzu dedi:

– Bava, Pərzad xanımın fikrinnən yatmışdım ki, bizi niyə bu günə qoydu?!

– Oğul, onu bil, yazıya pozu yoxdu, ilahi nə yazıf, onu görməliyik. Ona görə də, al bu piyaləni nuş elə.

Ağcaquzu piyaleyi aldı, nuş elədi.

– Oğul, mən bu sağ əlimi sənin kürəyinə çəkif, qırx günnüyünə öz qüvvəmi sana vererəm. Qırx gün sənin güjünə Allahdan başqa heç kəs üstün gəlif, səni yenə bilməz. Bu qırx gün ərzində gedif qoç Koroğluyu taparsan, o Koroğludan başqa sənin Pərzad xanımını sana çatdıran olmuyajax. İnşallah, murazına çatarsan, – deyif, həmən adam gözdən itdi.

Ağcaquzu atasının hüzuruna gəldi, dedi:

– Mehriban ata, mana ixtiyar ver, gedem Pərzad xanımı axtarıf, tapem.

Hasan paşa dedi:

– Oğul, sən onu tapıf gətirə bilməzsən, çünkü o tilsimdədi, sənin də o tilsimə güjün çatmaz.

Ağcaquzu dedi:

– O kun icaza vermersən, onda mənnən sana oğul oldu yoxdu. Mən bu günnən getdim Pərzad xanımı axtarmağa.

Ata dedi:

– Oğul, bil kin, mən sana ixtiyar vermerəm.

Ağcaquzu dedi:

– Mehriban ata, sənin sərvətinnən mənim payıma nə tüşərsə verginən, özümnən aparıf gedem, pulnan da, qızılnan da olsa, mən onu alıf-tapıf gətirəjəm.

Atası dedi:

– Yox!

Ağcaquzu gənə də sözünnən dönmədi.

Axırda Hasan paşa baxdı gördü, bu, inadınnan dönəsi şey döylü – irazılıx verdi. Xəznədarı yanına çağırdı. Yeddi dəvə yükü var-dövlət, qızıl, gümüş dolduruf, Ağcaquzuyu yola saldılar.

Ağcaquzu İstanbuldan üz tutdu Koroğlu deyən soraxlaşmağa. Orda Koroğlu, burda Koroğlu, bunu salpadılar Çənlibelə. Ağcaquzu üz qoydu Çənlibelə.

Ağcaquzu yol gəlməkdə olsun, sizə deyem qoç Koroğludan. Koroğlunun haylı-haraylı vaxtıydı. Dəliləri hamısı başında cəmiydi. Ağalardan, paşalardan, bəzirganlardan, dəfələrnən Hasan paşanın, Cəfər paşanın özünnən baci-xarac almışdı, Çənlibelə çəkilmişdi.

Günnərin bir günü Qoç Koroğlu Cəfər paşanın sərraf Zərgülaf adında bir tacirini talan eliyif, onu qan içində Çənlibelə gətirif çıxartmışdı. Niyar xanım atası Cəfər paşanın tacirini bu kökdə görüf, ürəyi çox qubarrandı.

Dedi:

– A Koroğlu, bu mənim bavamın ən yaxşı taciridi. Sənin insafın yoxuydumu, bunu bu günə salıfsan?! Varını-dövlətini alıfsan, özünü niyə bu hala salıfsan?

Koroğlu dedi:

– Nejə yanı, mən iyidəm, qavağımnan iki dillənəni mən üç dəfə yumruxnan vuraram.

Niyar dedi:

– Ay Koroğlu, özü türk olan, türkə bu divanı tutmaz, sən nə qansız adamıymışsan?

Koroğlu dedi:

– Onun paşası mənim atamın gözdərini oyduruf, mən nə təhəri onun tacirinnən hayıfımı almıyım?

Niyar xanım dedi:

– Atayın gözdərini Cəfər paşa çıxartdırıf, get hesavını da onnan çək, güjün yazıx-yuzuxlara nə yaxşı çater? Allah hası Allahdı, bu tacirin hayfını səndə qoysun. Səni ağam Əliyə tafşıreram, qoy sənin hesavını o özü çəksin.

Koroğlu qımışdı, dedi:

– Bu güjü-qüvvəti mana Əli özü verif, özü də bilər, sən onun işinə qarışma.

Niyar xanım dedi:

– Nə olar, bu mənim arzumdu, səni ona irast gələsən, sənin bir dərsini versin.

Koroğlu Niyarnan bu söhbətdən sonra Ağqayıya səmt gəldi kin, görsün yolda-izdə gəlif gedən varmı? Ağqayıya yaxınnaşanda gördü kün, yolnan bir karvan gəler. Xeyli gözdədi, karvan laf yaxınnaşdı. Koroğlu dedi:

– Bir gedem görəm bu, nə karvandı?

Qıratın ciloyunu yığışdırıf, alıcı quş kimi yəhərin üstünə sıçradı, ayaq üzəngiyə, diz qavırğaya üz qoydu karvana tərəf. Gördü, karvanın qavağında bir cavan oğlandı, enni kürəhli, uca boylu, gözəl-göyçək, elə bilginən ağalığın hələ kalıdı, bığlarını həjəmət kürəsi kimi arxaya ötürüf.

Koroğlu dedi:

– Ay oğul, sən kimsən, hardan gəlersən?

– Əfəndim, mən çox uzaxdan gəlerəm. İstanbuldan gəlerəm.

– O kün, İstanbuldan gəlersən, zəhmət çək atdan en, kəcaveyi yavaş-yavaş o gördüyün Çənlibelə qaldırginən.

– A kişi, nəyə görə kəcaveyi ora qaldırem, dədənə borcummu var?

Koroğlu bir dəli nərə çəkdi.

Ağcaquzu dedi:

– Əyə, uşax-zad ha qorxutmursan, nəyə bağırersan, bura bağırmax yeridimi?

Koroğlu baxdı ki, oğlan çox çətin qayadı, dedi:

– Gəl əvvəl bunu bir saznan qandır.

Götürdü görək nə dedi:

İstanbuldan şikar düşdü əlimə,
Ver malını, qurtar canın, çəkil get!
Bulayaram səni qızıl qanına
Ver malını, qurtar canın çəkil get!

– Ay qardaş, sən buranın qoruxçususan, qoçususan, yoxsa nəyisən, mən malımı sana niyə verif gederam? O ku söz dedin, sözünə cavaf aleynan, gör mən nə derəm:

İki iyid bir-birinnən üzdəşir,
Baş getməmiş malım sana vermərəm!
Qılınc vurram, yaraların sızlaşır,
Baş getməmiş malım sana vermərəm!

Bu cavanın belə cavaf verməsi, Koroğlunun başınnan elə bil bir qazan qaynar su tökdü. Öz-özünə dedi:

– Bu kimə cavaf qaytarer, bu kimnən danışer, bu, nə danışer, bu, nə danışer?

Koroğlu hirsdəndi, bir oyan, bir bu yana baxdı, beyqafil zəhmnən Ağcaquzunun başına bir topbuz endirdi. Ağcaquzu topbuzun qavağına qalxan tutdu. Topbuz qalxana dəyən kimi toz duman dörd tərəfi bürüdü. Toz yeri-göyü bürüyən kimi, Koroğlu dedi:

– Vay, bu cavanı nahax badbaxt elədim.

Toz aralanan kimi Koroğlu baxdı ki, oğlan dimdik qavağında duruf. Koroğlu baxdı gördü bunun heç rəngi də qaçmıyıf, gözdər od

tutuf yaner, Koroğluyu heç adam yerinə də saymer. Oğlanın belə təpəri Koroğluyu qorxuya saldı, dedi:

– Gəl buna çatdır ki, ay zalım oğlu, qavağındakı tək döylü, onun dalında yeddi min yeddi yüz yetmiş yeddi dəli var. Odu ku, götürdü sazını, görək nə dedi:

İndi dəlilərim gələr qurd kimi,
İki gözün birdən olar dörd kimi,
Başın gedər, leşin qalar yurd kimi,
Ver malını, qurtar canın, çəkil get!

Ağcaquzu gözdərinin altınnan baxıf gördü kü, qoruxcuyu yaman qeyzə gətirif. Aldı dedi:

– A kişi, qulax as:

İgid gərək qürbət eldə atdana,
Qılınc vurram bu yer dönər bostana,
Yüz tülkü neyləyər bir ac asdana,
Baş getməmiş malım sənə verməərəm!

Koroğlu qeyzə gəldi, dedi:

– Əyə, bu nə daneşer, gəl buna qandır deynən, əyə, zalım oğlu, mən Koroğluyam axı! Aldı görək Koroğlu nə dedi:

Koroğluyam, bu yerlərdə gəzərəm,
Uzaxdan, uzağa şikar süzərəm,
Dardıf bədəninnən başın üzərəm,
Ver malını, qurtar canın, çəkil get!

Ağcaquzu dedi:

– Əyə, bu səyaxlıyır deyəsən, Koroğlunun adından məni tora salmaxdı fikri. Bunun qavağınnan qorxmaq kişilikdən döylü.

Aldı Ağcaquzu:

Ağcaquzuyam, hər yetənə enmərəm,
Müxənnətnən danışmaram, dinmərəm,
Mən heç səni ayax tozu sanmaram,
Baş getməmiş malım sana vermərəm,

Ağcaquzu elə ki dedi: "Mən heç səni ayax tozu sanmaram", – bu söz Koroğluya yaman əsər elədi, istədi qılınca, əmuda əl atsın. Sonra

əl saxladı, dedi, Allahın işini bilmək olmaz, deyəsən, burda nəsə var. Əl saxladı. Dedi, qoy bunu bir yaxşı sınayım.

Dedi:

– Oğul, sən Koroğlu adı eşidifsənmi?

Ağcaquzu dedi:

– Eşitmişəm! Koroğlunun adını eşidəndə göydə mələklər səyrişir.

Koroğlu dedi:

– Oğul, o ku Koroğlu adı eşidifsən, bə niyə belə cavaf verersən? Axı qarşında dayanan həmən Koroğlu mənəm.

Ağcaquzu dedi:

– Mən inanmeram sənin Koroğlu olmağına. Sən Koroğlu olmağını nəynən sübut eliyə bilərsən?

Koroğlu dedi:

– O ki inanmersan, qulaq as, gör Koroğlu bavan sana nə der:

İki ləkə bir məclisə gələndə,
O məclisin halı pərişan olar.
İki iyid bir məclisə girəndə
Bəzənər otaxlar alışan olar.

... Odasına
Odun gəti odasına
Namərdin başı batsın,
Özü nədi, odası nə?!

Ağcaquzu dedi:

– Bəyim, bəyim, ləkə özünü bilirsən, iyit məni?! Çünkü sən yetirən kimi, mənnən topbuz davasına gəldin, zorrux işlətdin. Sən özün Koroğlu olduğunu deseydin, mən də sənin qarşında layaxsız sözdər işdətməzdim.

Koroğlu dedi:

– Oğul, gör hələ bir nələr eşidəjəksən.

Aldı görək Koroğlu nə dedi:

Mərd iyidlər dolu badələr içər,
Dost yolunda şirin canından keçər,
Müxənnətlər dava günündə qaçar,
Kolların dalında pəhlivan olar.

... Təmiz ada
Dərya saxlar təmiz ada,
Yüz yerdən ləkə yaxsan,
Yaxılmaz təmiz ada.

Ağcaquzu dedi:

– Eyvallah, eyvallah, indi bildim, sən Koroğlusan. Deməli, sən mərtikinnən bu karvanı mənim əlimnən alıf aparmax istiyirdin, başıma da topbuz vurordun. Demerdinmi, bu, uşaxdı qorxar, büdüryər.

Koroğlu dedi:

– Qulax as, gör nə deyirəm.

Aldı Koroğlu:

Koroğluyam haşa çəkmərəm mərddən,
Müxənnət iş əysiy olmaz nəmərddən.
Bir keçi canını qurtarsa qurddan,
Baxar buynuzuna kərkadan olar.

... Arxa sarı
Bel götür arxa sarı
Mərd igiddən dost tut,
Özünə arxa sarı.

Söz tamama yetdi. Koroğlu dedi:

– Oğul, olma sən canını mənnən qurtarmış sayersan. Doğrudan, mən Koroğluyam.

Ağcaquzu dedi:

– Sən Koroğlusansa, onda məni mənzilinə apar, əyər Koroğlu olmağını tasdıq eləməsən, mən dəvənin üstünnən tüşən döyləm. Özü də sənin kimi yüzü gələ, mana güj gələ bilməz, mənnən badi-xərac ala bilməz.

Koroğlu dedi:

– Oğlu, görerəm, kiməsə sən arxeyinsan, onu hələ başa tüşə bilmerəm. Sür karvanını arxamca gedək.

Ağcaquzu Koroğlunun arxasıncan Çənlibelə sarı qalxdılar. Çənlibelə çatan kimi Niyar xanım həmeşəki kimi Koroğlunun qarşısına çıxdı. Baxdı gördü, Koroğlu özünnən bir oğlan gətirer, ilahi, bu cüssədə, bu gözəllikdə iyid bəlkə də heç Çənlibeldə də yoxdu. Elə bil

qüdrət qələminnən yaranıf zalım oğlu. Dəvənin üstündə ağayana əyləşif, gözdər qayır-qayır qaynayır.

Niyar xanım Koroğluya baxıf dedi:

– Koroğlu, bu kimdi?

Koroğlu dedi:

– Sənin əmin oğludu, Hasan paşanın oğludu.

Niyar xanım dedi:

– Elə şey olmaz.

Koroğlu dedi:

– Özüdü ki, var. İndi tafşır tamam otaxlar bəzənsin, dəlilər hamısı cəm olsun. Dəlilər tamam cəm oldular, yığıldılar.

Ağcaquzu gördü kü, bu doğrudan da Koroğludu. Dəvədən endi, dedi:

– Ağa Koroğlu, bu yeddi dəvə yükü var-dövlət sənin, dəvələr sənin, ancax mən vacif bir iş üçün sənin əyağına gəlmişəm.

Ağcaquzu Pərzad xanım haqqında olan söhbəti Koroğluya nəql elədi. Koroğlu dedi:

– Oğul, qoy bu sirr qarnında qalsın, Niyar bilməsin, heç kəsə heç şey demə. Mən indi dəlilərdən bir neçəsini çağırajam. Görək kim mənnən gedər. Üç günün içərisində sənin Pərzadını gətirdim gətirdim, gətirmədim mən Koroğluluğumu üstümnən götürəjəm.

Koroğlu götürdü görək dəliləri nejə çağırdı:

De, atdansın qoçaxlarım,
Başı cannan keçən gəlsin.
Eyvaz xana canım qurvan,
Mərd əlinnən içən gəlsin.

Eyvaz xan badeyi başına çəkif Koroğlunun arxasına addadı, dedi:

– Ağa Koroğlu, noluf, mən həmeşə sənnən var deyləmmi, elə söz danışersan? Dəlilərin hamısının gözdəri açılıf, qulaxları şeşlədi; ayə, görən burda nə var?

Onatan Koroğlu aldı görək nə dedi:

Livasın polad geyənnər,
Donnuğun mənnən yeyənnər,
Adına dəli deyənlər,
Şirin cana qıyan gəlsin

– deyəndə, Bəlli Əhmədnən, Halaypozan da Koroğluya tərəf addadı.
Götürdü Koroğlu görək nə dedi:

Gəzək dağları-daşdarı,
Sovluyax sər qılışdarı,
Koroğlunun qardaşdarı,
Yağı bağrı piçən gəlsin.

Xan Eyvaz, Bəlli Əhməd, Halaypozan – üçü də Koroğlunun arxasında dayandılar. Dedilər:

– Koroğlu, nə olar-olsun, hara desən getməyə haxırıx.

Koroğlu dedi:

– Əziz dəlilərim, mən istəsəm əmr verrəm, bütün dəlilər arxamca gələr. Əmbə bu əmr döylü, bu bir tilsim qırmaxdı. Ona da dörd nəfər kifayət eliyər.

Koroğlu Niyara sarı dönüf dedi:

– Niyar xanım, mən gələnəcən Dəmirçioğlu, Dəli Həsən burda başçı olar, bu mənnən gələn bu iyid də sərkərdə olar. O nə əmr versə, onun əmrinə əməl eləyərsiniz.

Koroğlu bunnarı deyif, atdara suvar oldular. Dörd nəfər dəli yola düşüf Ağqayıya çatanda, Eyvaz xan dedi:

– Ağa Koroğlu, başına qurvan olam, bir onca dayğalığına anam Niyar xanıma sözüm var.

Koroğlu dedi:

– Oğul, buyur.

Eyvaz xan alıcı quş kimi atını çapıf gəldi dayandı Niyar xanımın hüzurunda, dedi:

– Aneyi-mehriban, sən Koroğlunun ürəyinin təmizdiyinə baxma. Nə qədər olmasa, Ağcaquzu düşman oğludu, onu gözdən qoyma, bizi aldada bilər.

Niyar xanım dedi:

– Bala, bala, bu dərsi bavan Koroğlu mana gecə keçif. Arxeyınca çıxın gedin, heç şeyin fikrini çəkmiyin.

Eyvaz xan Niyar xanımın bu sözünnən sonra bir qədər arxeyınnıx tafdı. Çaparax gəlif Ağqayada yoldaşlarına çatdı. “Ya Allah” – deyif yola düzəldilər. Az getdilər, çox getdilər, o dağa çatdılar kı, Ağcaquzu o dağı salıx vermişdi. Pərzad xanım hası dağa çıxmışdı, asdannara

qarışıf hası səmtə getmişdi, gəlif həmən yerə çıxdılar. Dağın ətəyinnən atdarı başdadılar dağ yuxarı sürməyə.

Sizə kimnən xəvər verem, Pərzad xanımnan. Pərzad xanım gördü kü, dörd atdı gəler. Əmbə burya heç bəni insan əyağı dəymeyif. Dedi, gəl bunnarı yoxlamaxdan ötrü, bəni-insan oluf-olmadıxlarını bilməkdən ötrü bir iş aç. Oydu ku, bir sehr elədi. Dağın döşündə bir bağ-bostan əmələ gəldi, gəl görəsən. Qarpız, yemiş, gül-çiçək gəl ki görəsən!

Koroğlu baxdı gördü kü, aya, bayax sıldırım olan qayaların yerində qarpız-yemiş pitif, qımışdı, güldü, dedi:

– Bizə atılan oxa bax.

Bu vaxtı Eyvaz, Bəlli Əhməd atdan sıçraşdılar, cumdular bostana. Hası qarpızı kəsdilər dümappağ, hası yemişi kəsdilər zəhrimar, zəkkum, ağıza vurulası döylü.

Koroğlu dedi:

– Oğul, oğul, atdanın, siz bilin ki, biz buraya caduya tüşməyə gəlməmişik, cadu pozmağa gəlmişik. Mənnən ayrı tüşmüyün, mənnən ayrı tüşsəniz, özünüzü güdaza verərsiniz.

Bostanı yarıf keçən vaxtı Pərzad xanım başa tüşdü kü, bunnar insandılar, bunun dalınnan gəlellər. Pərzad bir heyvətdi şir donuna girif, qayanın üstündə oturdu. Koroğlu başa tüştü kü, həmən şir donunda qayanın başında oturan Pərzad xanımdı. Çünkü heyvan olan yaraxlı-yasaxlı adamları görüf belə hərəkət eləməzdi. Belə məqamda vəhşi heyvan ya gərək adama hüjum çəksin, ya da qorxuf qaçsın. Əmbə bu, şəstnən sinəsini də bunlara tutuf tamaşa eliyirdi. Koroğlu gördü, heç bir əlac yoxdu, nə oxnan atılasıdı, nə də tora salınasıdı. Qayanın başına da kim çıxa bilər, özü də tilsimli qayadı, odu ku, götürdü gücü saz-sözə çatdı, görək nə dedi:

Uca dağların başında,
Mən bir asdana uğradım.
Yedim içdim, dövran sürdüm,
Bağa-bostana uğradım.

Pərzad xanım tez silkindi. Aslan livasınnan çıxdı. Elə bil Məleykə kimi anırdan bəri boylandı. Bəri boylananda dağlar-daşdar bu gözəlliyə afərin dedi. Bu vaxt Pərzad xanımın yaxasını yel qaldırdı, nar məmələr göründü. Məmələr görünəndə Koroğlu dedi:

– Əyə, bu zalım qızı nə qayırdığıdı.

Götürdü görək nə dedi:

Bəridən gəl, gözəl, bəridən,
Ürəyimin yağın əridən,
Silkindi, çıxdı dəridən
Məməli məstana uğradım.

Bu söz Pərzad xanımın xoşuna gəlmədi. Dedi:

– Əyə, ağlına gələni söyləmə.

Koroğlu dedi:

– Mənim ağlım başımdadı, sən ağlını başına yığ, üst-başına fikir ver.

Pərzad xanım əyilif yaxasına baxanda gördü, düz deyir, əynindəki paltarın yaxası təmiz açıxdı. Tez səhvini başa tüştü, xəjələtinnən ayrı livaya keçdi. Koroğlu götürdü sözün davamını, görək nə dedi:

Koroğlunun vardı adı,
Hey gəlir dadı-fəryadı,
Görməmişəm böylə cadı,
Firəngistana uğradım.

Koroğlu gördü kü, Pərzad xanım livasını dəyişdi, ancax anırdan bəri bunnara yaxın gəldi.

Qız dedi:

– Qəhrəman oğlan, sənin fikrin dağlara, daşlara.

Koroğlu dedi:

– Xeyir, igid gözəl gördü coşmalıdı, coşmasa, o, heç iyit döylü.

Götürdü görək daha nə dedi:

Uca dağların başında,
Ləbli-ləbli qar görünər.
Mənim bu xəcil könlümə,
Ala gözlü yar görünər.

Pərzad xanım dedi:

– Oğlan, bəyax mən sana dedim dilini çıldırratma, sözüyün əvvəlini-axırını bil. Bu dağın kəlləsində sənin könlün nə yar istiyir? Okun yar xiyalına tüşüfsən, onda gərək sən bu yerdən salamat qayıtmayasan. Ağlını başına topla, gör bir mən nə deyirəm, sən nə eşidirsən.

Aldı Pərzad xanım:

Bağlar içində pencərəm,
Bu otağımda bar görünər.
İndi səni mən sancaram,
Ətrafın şahmar görünər.

– deyif, elə bir sehir oxudu ku, bütün dört yanı ilan bürüdü. Hər tərəfdən ilannar üstərinə hücum çəkdi. Dəlilər bir-birinə qısılıf, əlləri qılıncın qəbzəsində titim-titim titrədilər. Koroğlu özünü itirmədi, dedi:

– Xanım, xanım, qulaq as:

Bilmədim yarın fəndini,
Əmeydim ləbin qəndini.
Açeydım göysün bəndini,
Ağ sinəndə nar görünər.

Qız dəli olmadımı, ildıza çıxdı. Bir sehir oxudu, yer yarıldı, dəlilər də, Koroğlu da yerin arasında sıxılan vaxtı, Pərzad xanım dedi:

– Əyə, zalım oğlu zalım, qulax as, mənim qoynumda sənin nə işin var.

Zəmbur çəkər bal olanda,
Halın yaman hal olanda,
Dayan, dilin lal olanda,
Gözdərində tor görünər.

Koroğluyu dəlilərnən baravar torpax sıxmağa başladı. Hər tərəf-dən də bir neçə şahmar başı çıxıf, onnara tərəf uzanmışdı. Koroğlu mətəl qaldı, dedi:

– Ayə, bu zalım qızının cadısı nə təhər cadıdı? Gəl buna deynən ki, yekə kişi qızısan, belə işdərinnən əl çək, adam ol, adamlara qarış. Məcbur eləmə ki, əlimi qılınca aparem, səni parça-parça eliyim. Mənim qılıncım elə-belə qılışdardan döylü, mənim qılıncıma Həzrət Əlinin əli dəyif. Bu qılıncın qavağında cadu nədi, piti nədi, şahmar nədi, sən nəsən. Gəl məni məcbur eləmə.

Aldı Koroğlu:

Qələm alıb yazammaram,
Bu qəbrə mən dözəmmərəm,
Gen dünyada gəzəmmərəm,
Dünya mana dar görünər.

Pərzad xanım dedi:

– Əyər gənə ağlına yar-mar sözü salsan, vallah, səni onnan da pis günə salajam.

Aldı Pərzad xanım:

Pərzad deyir, tanı məni,
Tərk etmişəm xanımanı,
Şahmar ollam, çallam səni,
Dünya sana mar görünər.

Koroğlu gördü kü, qız dediyinnən dönmüyəjək, dedi:

– Ay qız, adam balasısan, məni höysələdən çıxartma, and olsun Allaha, əlimi Misri qılınca atsam, səni iki yerə parçalıyajam, tez ol, bu torpağı arala, uşaxları sıxıf-üzmə.

Pərzad xanım baxıf gördü kü, daha sınax bəs eliyər, bir sehir oxudu, dəlilər torpax məngənəsinnən azad oldular. Əmbə yazıxlar qorxudan uçum-uçum uçunordular. Bir-birinin üzünə baxanda gördülər ki, vallah, tufar gəji kimi dümağ ağarıflar. Koroğlu dəliləri bu halda görüf əl atdı Misri qılıncın dəstəyinə, nə fikirrəşdisə fikrinnən daşındı, dedi:

– Pərzad xanım, sən yerin yeddi qatına da girsən, quş oluf göyə də uçsan, əlimnən yaxa qurtara bilməzsən, yaxşısı budu, gəl meydana, qoşul bizə, çıxax gedək.

Pərzad gənə də bir sehir oxudu, ceyran livasına girif dedi:

– Çox atım-atım dersən, indi mən qaçem, sənin atın mənim dalımca çatsın, görem nejə çater.

Koroğlu dedi:

– Sən hələ Qırata bələd döyülsən, səni Qıratın dırnaxlarında tafdıyaram, qaç.

Koroğlu bir qədər ceyrana mənzil verdi, sonra da öz-özünü məzəmmətdədi ki, əyə, mən indi bunun dalınnan at salsam, ona qılınc çalsam, hamı məni qınıyajax, deyəjəklər ki, Koroğlu bir qıza baş qoşdu, onu qanına qaltan elədi. Bu fikirnən arxa səmtə baxdı, baxanda gördü Çənlibel güzgü kimi görüner, konlu qubarrandı, götürdü görək nə dedi:

Yönü bəri duran dağlar,
Ellər səni bəzər bir gün.
Güllü, bənəfşəli bağlar,
Yarım səndə gəzər bir gün.

Geri baxanda gördü, bəyax ceyran livasında qaçan Pərzad xanım, indi insan livasında yaxınnaşıf ona qulax aser. Koroğlunun gözdəri yaşardı. Dedi, əyə, hancara olmasa, insan öyladıdı, onun da ürəyi, diləyi var, biznən tərs gətirməyinə baxma. Koroğlu götürdü sözünün o biri xanasını:

Hər iyiddə olmaz hünər,
Od olmasa, ojax sönər.
Dövlətdidən dövlət dönər,
Ağlı başdan təzər bir gün.

Baxıf gördü kü, bayax qaçan bu dəfə laf yaxın gəldi. Özü də insan livasındadı. Gözdəri də yaşarıf, Koroğluya boylaner.

Aldı Koroğlu:

Koroğlu Çənlibellərdə,
Qalmışam fitnə-fellərdə,
Mən ölsəm qürbət ellərdə,
Kim qəbrimi qazar bir gün.

Pərzad xanım yaxınnaşıf dedi:

– Doğrusunu de, görəm sən kimsən?

Koroğlu dedi:

– Xanım, mən Koroğluyam.

Pərzad xanım dedi:

– Əgər sən Koroğlusansa, bu veranxana düzdərdə nə gəzersən?

– Ay Pərzad xanım, dərdsiz aşıx ağladığını heç görüfsənmi, axı mənim dərdim var, mən buraya onçun gəlmişəm.

– Düzünü de, görək sən niyə gəlifsən?

Burda götürüf görək Koroğlu nə dedi, siz sağ olsun:

Mən qoç Koroğluyam çıxdım qalannan,
Ərzəmi götürdüm divana gəldim.
Xotkarın oğlunnan peyman eylədim,
Fikrimi zay etdim, imana gəldim.

Pərzad xanım qulaxlarını şeşlətdi, dedi:

– Ayə, bu nə xotkar oğludu der, bu nə danışer?

Pərzad gözünü Koroğlunun üzünə zillədi. Əmbə Koroğlu gözünü çöyürüf Eyvazınan Halaypozanın üzünə baxanda gördü vallah, bir qız görəndə oynaxlıyan oğlannar, indi elə bilginən ki, don vuruf donuzdurufdu, heç ürəkləri üstə gəlmer, matdarı-qutdarı quruyufdu. Bəlli Əhmət də qılıncını yerə qoyuf, mat-mat boylanerdi.

Aldı Koroğlu:

Bu dağların zirvəsinə varanda,
Qılınc çəkif, düşmən bağrın yaranda,
Samur qırağında məclis quranda,
Mey içdim, məst oldum, məstana gəldim.

Pərzad dedi:

– Ay kişi, düz danış, düz de. Nəyə gəlifsən, məqsədin nədi? Məqsədini düzən desən, inşallah mən də ona əlac eliyəm.

Aldı Koroğlu:

Koroğluyam öz canımnan küsərəm
Bir yel oluf, bu dağlarda əsərəm.
Getməsən də bil, başını kəsərəm,
Səni aparmağa mərdana gəldim.

Söz tamam oldu. Pərzad xanım dedi:

– O ku məni aparajasan, söylə görəm kimə aparajasan?

Koroğlu gördü kü, Pərzad xanımın əhvalı özündə döylü. Bayaxkı cadı-pitidən də əsər-əlamət yoxdu, dedi:

– Qulax as gör kimə aparajam:

Ovçu olan ovun izlər,
Dur varax bizim ellərə.
Ağcaquzu yolun gözlər,
Dur varax bizim ellərə.

Pərzad xanım Ağcaquzu adını eşidif cin atına minmədimi.

Dedi:

– Əyə, zalım oğlu, məni aparersan bir iyidə apar, Ağcaquzu nə iyitdi ki, sən onnan ötrü mənim dalımca gəlifsən.

Koroğlu dedi:

– Xanım, xatrına dəyməsin. Qulax as, qulax as, gör bir nə deyirəm:

Gözəl xanım, olma naşı,
Nə gəzersən dağı, daşı.
Ağcaquzu qoşun başı,
Dur varax bizim ellərə.

Pərzad xanım dedi:

– Hası qoşunun başıdı, o, bir cadıyı axıra kimi öyrənif başa çıxa bilmədi.

Koroğlu o sahat işi başa tüşdü. Dedi, qulax as:

Sona tərk etməz gölünü,
Xoryada vermə telini.
Koroğlunun gözəl gəlni,
Dur varax Çənlibellərə.

Söz tamam olan kimi Koroğlu dedi:

– Qızım, dur gedək, biz sənsiz qayıdası döyülük.

Pərzad xanım dedi:

– Koroğlu, o ku sən məni özünə gəlin kimi aparersan, onda gedərəm, əmbə onu bil ki, Ağcaquzu sən deyən kimi iyid olmasa, onda zəhər içif özümü tələf eliyəjəm, sən də günaha batajasan.

Koroğlu dedi:

– Pərzad xanım, mana qoç Koroğlu deyəllər, mən səni zornan da aparardım. Əmbə özüm bilerəm ki, sən zor işdədiləsi qız döyülsən, hər şey sənin ürəyinnən olajax. Bu günnən mən sənin qaynatanam.

Eyvaz atdan endi, Pərzad onun atına mindi. Üzü dağ aşağı yol başdadılar. Eyvaz atın yüyəninnən yapışıf, özü payı-piyada gedəsi oldu.

Gəlhagəl, günə bir mənzil, teyimənazil, ustad dili yüyrəy olar, gəlif Ağqayanın yanına çatanda Koroğlu dedi:

– A bala, Eyvaz, Bəlli Əhməd, siz Yağı qoruğunnan gedin, Pərzad xanıma gül-çiçəkdən çələng düzəldin, atdarınızı da gözəl-göyçək bəziyin. Mən burdan kesəsinə gedif, bu sahat dəlilərin hamısını görüşünüzə göndərəjəm. Gərək Pərzad xanım elə qarşılansın ki, heç bavası Cəfər paşanın imaratında da elə qarşılanmasın.

Dəlilər "baş üstə" deyif, Pərzad xanımı da götürüf, Yağı qoruğunnan getməkdə olsun. Koroğlu Qıratı tərpədən vaxtı ağ cığırın ağzında gördü kü, bir göy dəmir atdı, üstündə də bir enni kürəkli, alçax boylu, qırmızı gözdü bir kişidi. Ağ qayıya doğru boylaner. Bunu görən kimi

Qırat tərpənməzcə dayandı. Koroğlu gördü kü, ayə, Qırat yerinnən tərpənmer. Ata mahmız çəkdi, at gənə getmədi. Koroğlu dəli olmadımı:

– Ayə, vayıs oğlu vayıs, yolu niyə kəsifsən? – dedi – Görörsən at getmer.

Atdı yuvaş-yuvaş başını Koroğluya hərriyif, zəhmnən tərs-tərs ona baxdı, dedi:

– Məyər dədəyin yoludu? Anırdan getsən olmormu, baldırın qırılajaxmı?

Koroğluyu elə biliynən ildırım vurdu. Dəli oldu, götürüf burda nə dedi, biz deyək, siz şad olun:

Tatsan, kürtsən, nə millətsən,
En atınnan, əcəm oğlu.
Gözdərinnən mazaratsan,
En atınnan, əcəm oğlu.

Atın üstündəki dedi:

– Əyə, ağlını başına yığ, atımnan niyə tüşərəm, var yolunnan çıx get, nə qədər ki, əl-ayağım sana toxunmuyuf, əl çək mənnən.

Koroğluyu təzədən od götürdü. Aldı görək nə dedi:

Asdan kəsifdi qarşını,
Axıdajam göz yaşını,
İndi üzəjəm başını,
En atınnan, əcəm oğlu.

Atdı qımışdı. Bu qımışanda Koroğlu daha da cinnəndi.

Dedi:

– Əyə, deyəsən bu tufanı dağılmış məni tanımer, gəl adını buna nişan ver, qoy canına vəlvələ tüşsün.

Götürdü görək nə deyir:

Qoç Koroğlu mənəm, mənəm,
Çətin dediyimnən dönəm.
Əlimnən şikar vermərém,
En atınnan, əcəm oğlu.

– Ayə, qoç Koroğluymuşsan, bağışla tanımadım, elə bildim buranın qoruxçusu zadısan, onçun sana ajıxlandım. Nə demək istiyirsən, ay qoç Koroğlu?

Koroğlu dedi:

– Atdan tüş, get atın ciloyunu da mənim üzəngimə bağla, özünü də qavağıma qatıf Çənlibelə aparajam. Bu gün mənim yaxşı günümdü, Pərzad xanımın toyunda qulluq eliyərsən.

Atdı dedi:

– Yox, atdan düşməyim olmuyajax. Atdan o vaxt tüşərəm ki, sənin atın mənim atımı ötə.

Koroğlu dedi:

– Baş üstə, sürək!

Atdı dedi:

– Kimin atı ötsə, geridə qalan ötənin qavağına tüşsün getsin.

Koroğlu bu şərtə irazılıx verdi. Axı indiyətən Qıratı ötən olmuyufdu!

Həmən atdı dedi:

– A Koroğlu, harıynan sürək, xətrin harıynan istiyir?

Koroğlu dedi:

– Bax bu qaratikənnığı, çınqıllığı görörsənmi, ordan qırdıramasına öyannan belə hərrənək, belə gələk.

– Hardan dersən sürək!

Nolajax, Koroğlu Qırata bir qırmaş vurdu, iki qırmaş vurdu, at yerinnən tərpənmədi.

Əmbə bu biri bir göz qırpımında həmən yerrərdən keçif, Ağqa-yanın da o üzünnən hərrənif, ildırım kimi dala qayıtdı. At atın yanına gələndə Qırat təzədən yerinə pərçim oldu, getmədi. Koroğlu mətəl qaldı, dedi:

– Ay canım, bu atı mən əlimə keçirsəm, Türk nədi, İran nədi, Ərəb nədi, pütün dünya mənim ayağımın altında qalmıyajaxmı? Odu ku, gənə də qarşısındakına üz tutdu:

– Əyə, iyid, atdan en!

Dedi:

– Niyə, mənim atım sənin atını addadı axı. İndi sənin atın mənimdi.

Koroğlu hirsdəndi, atdan tüşüf kişinin üstünə gəldi, dedi:

– Tüş atdan güləşək, kim yıxsa at onundu.

Atdı dedi:

– Mənim başım üstə!

"Mənim başım üstə" – deyif anırdan bəri iyid də gəldi, Koroğlu da gəldi. Koroğluda bir yaxşı xəsyət varıydı, həməşə güştü tutanda biləyini çirmiyif "ya Əli, sənnən mədəd" – deyərdi. Burda da gənə dedi:

– "Ya Əli sənnən mədəd".

Koroğlu irəli cumana kimi, o birisi əl on arşın qavağa uzandı, Koroğlunun qurşağından yapışıf elə tulavızdadı kı, Koroğlu gedif Ağqayanın başına tüşdü. Koroğlu indi başa tüşdü kü, Niyar xanımın qarğışına tuş oluf. Dodaxlar partdıyıf, irəngi-bənzi qaçıf, dünyəsi dəyişif. Koroğlu bu qayadan sürünə-sürünə gəldi, baş əydi:

– "Allahum məsəlla əla Mühəmmədən və ali Mühəmməd" – deyif, Həzrət Əlinin üzünə baxdı. Bu vaxt Əlinin gözündə bir damla yaş giləndi. O da salavat çöyürdü, dedi.

– Koroğlu, Qoşabulağın üstündə atanı dəfn eliyən vaxtı mənim adımı çağırmışdın, sənin kürəyinə mən əl çəkmişdim. Demişdim, kürəyin yerə gəlməz, qılıncın da qılıncıma dəymişdi. Bax get, bir kəsi incitmə, haqqın yolunnan heç vaxt çıxma. Onu da bil ki, indi toyuna tələsdiyin Ağcaquzu da Hasan paşanın yox, sənin doğma balandı, onu da sənin yanına mən göndərmişəm, o həmən oğlandı kı, mağarada qoyuf qaçmışdın. Onun sağ biləyində sənin bilərziyin də var, baxarsan tanıyarsan.

Bunu deyif Həzrət Əli Düldülə suvar oldu, bir göz qırpımında qeyb oldu.

Koroğlu tutduğu işdən peşman oldu, bir tərəfdən də söyündü kü, Həzrət Əliynən bu şəkildə də olsa, görüşdü, həm də Ağcaquzunun onun oğlu olmasına çox söyündü. Koroğlu fikirri-fikirri Qıratın belində havaxt gəlif Çənlibelə çatdığını bilmədi, onda baxdı, at dayandı. Niyar xanım Koroğlunu belə, bu şəkildə, bu halda görüf ürəyi qubar elədi. Götürüf görək nə dedi:

Niyə məlulu-müşkülsən,
Hanı Eyvaz, xan Koroğlu?
Göz yaşım ümmana döndü,
Bağrım oldu qan, Koroğlu.

Koroğlu baxdı kı, hələ Eyvazgil gəlif çıxmıyıf. Niyar xanım da ahı-vayda, ahı-zardadı, anrı-bəri boylandı. Koroğlunun heç ağlı üstünə gəlmerdi. Niyar xanım aldı görək:

İrəngin dönüf löyünnən,
Sinəm dağlıdı düyünnən,
Qurban kəsəllər qoyunnan,
Sana qurvan mən, Koroğlu.

Koroğlu yana baxanda gördü kü, budu Eyvazdı, Bəlli Əhmətdi, Tanrıtanımazdı, bir də Pərzad xanımdı gəldilər, ənbə Koroğlu özündə-

sözündə döylü, gözünün ujunnan Niyar xanıma işara elədi ki, uşaxlar gəler.

Aldı Niyar xanım:

Tərlansan kəklik ovunda,
Niyarın gözəl boyunda
Pərzad xanımın toyunda,
Sürək bir döyran, Koroğlu.

Söz tamama yetdi. Koroğlu gənə də özündə döylü. Dəlilər üç bir, beş bir buların başına cəmləndilər. Bütün dəlilər üç dəliynən Pərzad xanımı qarşılamağa getdi. Əmbə Koroğlunun belə pərt olmağı, dodaxlarının partlaması heç kimi açmadı. Oyur-oyur oynuyan, barmaxlarının üstündə süzən, Qıratın belində çapan Koroğludan əsər-əlamət qalmamışdı. Məclis yığılıf, hamı sövüner, təkcə Koroğlunun irəngi yerinə gəlmer. Eyvaz yaxına gəlif dedi:

– Baba, söylə görem niyə eliyersən, bəlkə dərdini mana deyəsən. Burdan-bura sana nə üz verdi ki, biz bilmədik? Axı, beşimiz də Ağ qayıya çatana kimi kefi kök, damağı çağ gəldik. Bizdən ayrılannan sonra sana nə üz verdi ki, bu günə tüşüfsən?

Koroğlu Eyvaza heç fikir vermədi. Gözünün qulağınnan şərab tuluğuna baxdı. Bir şərab tuluğu gətirdilər. Koroğlu tuluğu başına qaldırıf bir xeyli içdi. Eyvaz gördü kün, tulux boşaler, dedi:

– Ay ağa, biz bilerik ki, sən kef əhlisən, hamısını içəjəsən, əmbə bir de görəm başına nə iş gəlif?

Koroğlu dedi:

– Eyvaz, mənim sazımı gəti.

Koroğlunun dili indi-indi açılerdı. Gənə Ağ qayıya tərəf boylandı.

Dəlilər dedi:

– Ayə, bu Ağqayada bunun nəyi qalıf, indi kimi gözdüyür, görəsən?

Sazı gətirdilər, Koroğlu götürdü görək dərdinə müqabil nə dedi:

Niyar xanım, bir ərəbə tuş oldum,
Ağlımı əlimnən aldı da getdi.
Qurumuş dilimnən hədyan söylədim,
Məni Ağqayaya çaldı da getdi.

– Əyə, zalım oğlu, sən nə danışersən?

Eyvaz dəli oldu, gözü kəlləsinə çıxdı. Elə bir dəli nərə çəkdi ki, dağ-daş titrədi.

– Ağa, kimdi o, elə bu sahat bu yeddi min yeddi yüz yetmiş yeddi dəliyi onun üstünə tökəjəm.

Koroğlu dedi:

– Ay oğul, ay oğul, hələ dayan gör bir nə derəm:

Yüz min dəlinin də yetişməz gücü,
Məğrubdan-məşruqa vermer o bacı.
Mardan qamçısı var, zəhərdən acı
Oynatdı əlində güldü də getdi.

– A kişi, o kimdi de görüm o nə kərədi ki, Eyvazın qılıncının altınnan qaçsın?

Koroğlu dedi, qulaq as:

Koroğluyam, budu sözümün sağı,
Onun hökmündəndi Köysər bulağı,
Adı Həzrət Əli – dinin dayağı,
Düldülünə suvar oldu da getdi.

Söz tamam oldu. Hamı üzünə salavat çöyürdü. Hamı: "Allah, sana şükür", – dedi. Qurvannar kəsildi, nəzirlər çıxdı. Koroğluynan Niyar xanım Ağcaquzuynan Pərzad xanımı yannarına çağırıf xeyir-dua verdilər. Qoç Koroğlu dedi:

– Camahat, bu cavannarın toy günündə istiyirəm, bir şey də hamınıza əyan olsun, bilin və agah olun, Ağcaquzu mənim belimnən gələn doğmaca balamdı, inanmersınız, onun qolunda mənim bazübəndim olmalıdı, baxın.

Koroğlu əlini uzadıf Ağcaquzunun sağ biləyini çirmələdi, öz bilərziyini tanıdı. Bu işdən Ağcaquzu özü də çaş-baş qaldı. Koroğlu əhvalatı dəlilərə nağl elədi. Ağcaquzunun nejə itkin düşdüyünü söylədi. Bu işdə Həzrət Əlinin köməyin də hamıya çatdırdı.

Niyar xanım yaxına gəlif, hər iki cavanı öpüf bağrına basdı. Dedi:
– Ay Koroğlu, indi belə çıxer ki, sən oğlunnan bajanaxsan, eləmi? Pərzad mənim doğma bajım, Ağcaquzu sənin oğlun.

Koroğlu Ağcaquzuyu da, Pərzad xanımı da bağrına basdı. Öyəclər kəsildi, şülənnər pişdi, bir toy elədilər ki, dünyanın gözü belə toy görməmişdi. Bu günnən Çənlibeldə bir cavan ailə də artdı. Deyillər bu iki cavan uzun ömür sürdü, xoşbəxt yaşadılar.

# Mahru xanımın Çənlibelə gəlməyi

Bəli, bu dəfə söhbəti sizə Çardaqlı Çənlibeldən açım. Çən-çiskin avazımışdı. Çardaqlı Çənlibel gül-çiçəyə qərq olmuşdu. Vallahi behişt də onun yanında yalan idi. Bir tərəfdən gülün-çiçəyin ətiri, o biri tərəfdən bülbüllərin cəh-cəhi adamı məst edirdi. Bu, o vaxt idi ki, Koroğlu ilə Giziroğlu Mustafa bəy Hasan paşanın qırx min qoşununu Toqat keçidində qanına qəltan etmişdi.

Giziroğlu Mustafa bəy Gizir qalasına dönəndən sonra qoşun sərkərdələrindən Şamlı bəy, Bəbir Alı, Şərxata Mədəd, Dəli Çovdar, Şir Vəli, Sanlı Səməd, Sırt Yusif, Qurd Cəlil, Cinli Mehdi, Adıbəlli, Aşıq Kəngərlə məsləhət-məşvərət edib, Gizir qalasında çəkidə yüngül, vəzində ağır nə vardısa yüklətdi qəflə-qatıra. Yeddi yüz yetmiş yeddi dəlisi ilə üz qoydu Çardaqlı Çənlibelə.

Ustadların söz-sovuna görə, Koroğlunun, Nigar xanımın, cəmi Çənlibel dəlilərinin Giziroğlu Mustafa bəyin dəliləri ilə gəlişindən kef-damaqları çağ idi. Koroğlunun əmri ilə o günü Çardaqlı Çənlibeldə yeddi yüz yetmiş yeddi tuncu, öyəc, erkəc boynu buruldu. Çənlibeldə bir vur çatdasın idi, göz istəyirdi tamaşasına. Şərab içən kim, şərab süzən kim...

Bəli, Giziroğlunun gəlişi şərəfinə qırx gün Çənlibeldə məclis quruldu. Məclisin qırxıncı günü hamı baxdı Koroğlunun üzünə. Koroğlu belə işlərdə çox arif idi. Anladı ki, dəlilər ondan söz istəyir. Koroğlu yanındakı Bulğurlu sazı götürüb əvvəl-əvvəl zil-bəm elədi. Mindirdi sineyi-sandığa, dedi:

– Hey dəlilərim! Ulularımız söz söyləməzdən əvvəl, söyləyəcəyi fikri yüz ölçüb bir biçiblər, sinəmə bir neçə xanə söz gəlib. Deməyi məndən, eşitməyi sizdən.

Bəli, Koroğlu bayaqdı Bulğurlu saza tərsə-ovand tazana vurdu. “Çoban bayatı” üstündə elə bir dəli nərə çəkdi ki, yer-göydə ənşər-mənşər qopdu:

Söz igidin sərindən,
Dostluq olar dərindən.
İki qardaş bir olsa
Dağ oynadar yerindən.

Dağları gəzən mənəm,
Paşalar əzən mənəm,
Giziroğlu əl verdi,
Əhdimi pozammanam.

Gün dolanar, ay olar,
Dost-dostuna tay olar.
İki qüvvə bir olsa,
Paşalara vay olar.

Dəlilərim bac alar,
Dava günü öc alar,
İgid sözü bir olsa,
Xotkarlardan tac alar.

Soyum sərt, kürdü mənim,
Suyum bərk, Kürdü mənim,
Qoy eşitsin paşalar,
Arxam çox gurdu mənim.

Söz tamaşa yetişdi. Koroğlu sazla dediyini, sözlə də dedi. Sonra üzünü tutdu cəmi dəlilərə, dedi:

– Hey dəlilərim! Biz yeddi min yeddi yüz yetmiş yeddi dəli idik. İndi Giziroğlu Mustafa bəyin 777 dəlisi də oldu bizim canbir qardaşımız, – deyib bayaqdı Misri qılıncı çıxardı qınından. Giziroğlu Mustafa bəy də bir himə bənd imiş kimi Giziri qılıncı çıxardı qınından. Hər ikisi şəhadət barmağını yaralayıb qanını sıxdılar bir-birinə.

O tərəfdən də Şamlı bəylə Dəli Həsən, Qurd Cəlillə Dəmirçioğlu, Bəbir Alayla Eyvaz xan, Şir Vəliylə Koroğlunun qoç balası Həsən bəy, Sanlı Səmədlə Bəlli Əhməd, Yağıqıranla Tüpdağıdan, Sırt Yusiflə İsabalı, Şərxata Mədədlə Gürcüoğlu, Dəli Çovdarla Dəli Mehdər, Cinli Mehdiylə Halaypozan, Aşıq Kəngərlə Aşıq Cünun da yaraladılar şəhadət barmaqlarını, qatdılar bir-birinə qanlarını. Əlqərəz, can qardaşlığı Çənlibeldə oldu qan qardaşlığı.

Nigar xanım əlində iki piyalə durdu Koroğlu ilə Giziroğlu Mustafa bəyin qənşərində. Cəmi Çənlibel xanımları da dayandılar əllərində piyalə qan qardaşlarının qarşısında. Yox olsun yoxsulluq, Çənlibeldə yemək-içməkmi yox idi. Dəlilər yedilər, içdilər, damaqlar oldu çağ.

Bəli, Koroğlu gecədən xeyli keçmiş üz tutdu məclisə, dedi:

– Can dəlilərim! Bilin və agah olun. Bu gündən sonra xotkarların, paşaların, xan-xavanların, paşa-sultanların gözünə yuxu getməyəcək. İndi gərək biz bəndi-bərələri, keçidləri, suvadları, karvan yollarını göz bəbəyi kimi qoruyaq. Odu ki, hər bir sərkərin dəliləri ilə ərazisi bəlli-başlı olmalıdı. Dəmirçioğlu, Qurd Cəlil, Həsən bəy, Sanlı Səməd, Yağıqıran dəlilərilə Şamlı keçidini – Qanıxlı bərəsini, Sırt Yusif, İsabalı, Cinli Mehdi, Şərxata Mədəd dəlilərilə Yağı qoruğunu, Eyvaz xan, Dəli Çovdar, Halaypozan, Tüpdağıdan, Bəbir Alı dəliləriylə Dardaş keçidini, Şamlı bəy, Dəli Həsən, Adıbəlli, Qorxuqanmaz, Gürcüoğlu dəliləriylə Sınaq keçidini, Giziroğlu Mustafa bəy, Dəli Mehdər, Aşıq Kəngər, Aşıq Cünun mənimlə Çardaqlı Çənlibeli quşdan ayıq, qurddan sayıq qorumalıyıq. Yığışma işarəmiz mənim nərəm, yaxud Giziroğlunun Haça şeşbəridi.

Əlqərəz, Koroğlu tapşıracağını tapşırmaqda, deyəcəyini deməkdə olsun, indi alın xəbəri İstanbulda xotkar Muraddan. Xotkar Muradın qulağı ala-çula çalmışdı ki, aman-zaman bircə bacısı Mahru xanım Giziroğlu Mustafa bəyə könül verib, bir fürsət axtarır İstanbuldan yayınmağa. O idi ki, xotkarın kürkünə bərk birə düşmüşdü. Yuxusu çəkilmişdi ərşi-əlaya. Köpmüş dana kimi tıs-tıs tısqırırdı. Bu tərəfdən də Koroğlu ilə Mustafa bəyin dəlilərinin Çardaqlı Çənlibeldə qan qardaşlığı qır saqqız olub yapışmışdı Xotkarın kəlləsinə. Çox götür-qoydan sonra xotkar qərara gəldi ki, məmləkətin paşalarına, sultanlarına, pəhlivanlarına fərman yazsın.

Əlqərəz, Cəfər paşaya, Ərəb Reyhana, Hasan paşaya, Əhməd paşaya, Qara paşaya, Davud paşaya, Səlim paşaya, Hüseyn paşaya, Bürcü paşaya, Abdal paşaya, Bolu bəyə, Qədir paşaya, Ayaz paşaya, Nəzər paşaya belə bir fərman yazdı: "Möhtərəm paşalar! Sizin hər birinizin şan-şərəfini Alosmanda yeddi qatar dəvə karvanı çəkə bilməz. Aslanlar zəhminizdən bəri-biyabanda tük tökür. Xəzinəmizin birillik gəliri yeddi arxadan dolananızı yağ içində böyrək kimi saxlar. Bir mehdər gədəsi ilə gizir gədəsi kəsib doqqazınızın çənəsini. Alosmanda xotkar, paşa, sultan qızı qalmadı. Odu, hamısı çən-çiskinlidə yolkəsənlərlə, başkəsənlərlə baş qoyublar bir yastığa. Ya gərək başımıza papaq qoyaq, ya da İstanbul örpəyi. Biz birləşib bu gədələrin əhdini kəsməsək, onda onlar bizim başımızı kəsəcək. Ya biz ad-sanla yaşa-

malıyıq, ya da ağzımıza yaşmaq almalıyıq. Qırx gündən sonra ramazandı. Qoşunu səfərbər edin. İnşallah bu ramazanda əlimizə yolkəsənlərin qanından həna yaxarıq. Kim Koroğlunun başını gətirsə, bacım Mahru xanım baş yoldaşıdı, Çənlibelə yürüş on beş gündən sonra.

Hörmətlə Xotkar Murad".

Xotkar fərmanı möhürləyib müşəmbələdi, verdi çaparlara. Çaparlar üz qoydular Toqata, Ərzuruma, Qarsa, Ruma, Ərzincana, Hələbə, Bağdada, Taxtı Süleymana, Ağ şəhərə, Vana, Diyarbəkirə, Üsküdara.

Əlqərəz, ağalar yaxşı deyib ki, sirrli söz quyuda da qalmaz. Onu da deyək ki, xotkarın son günlər vurnuxmasından Mahru xanımın gözü su içmirdi. Nə isə xotkarın bir ilməsi vardı. Şam süfrəsində Mahru xanım qəsdən çeçədi, dedi:

– Tacidarım! Dün gecə yuxumda gördüm ki, tacı-taxtın şəfəq saçır.

Xotkar dedi:

– Yuxun çin olsun, gözümün nuru! İnşallah, bu ramazanda mehdər oğlunun, gizir gədəsinin qanından əlinə həna yaxarsan. Elə o günü də sənin baxtın İstanbulda nur saçar. İnşallah onda sənə bir toy edərəm, səsi Qaf dağını titrədər.

Bəli, nağılçılar sözünü qısa, köhlən mənzilini kəsə edər. Mahru xanım xotkarın sözlərindən anşırdı ki, qardaşı bu neçə gündə niyə narahatmış. Mahru xanım orasını da anladı ki, bu günlərdə xotkar Çardaqlı Çənlibelə qoşun çəkmək istəyir. Mahru xanımı od götürdü. İlan-çayan çalan yatdı, o yatmadı. Gecə səhərəcən aranı dağa, dağı arana daşıdı. Kirpik çalmadan açdı sabahın gözünü. Üzünüzə uğurlu sabahlar açılsın. Mahru xanımın dayəsi içəri girəndə gözlərinə inanmadı, dedi:

– Ömrümün butası, canımın yarısı! Olmasın azar, bu nə halətdi düşmüsən? Gözlərinə qan sızıb?!

Mahru xanım dedi:

– Aman dayə! Əl mənim, ətək sənin, dərdimə bir əlac.

Mələk dayə dedi:

– Bıy, başıma xeyir, bala! Sənin dərdin gəlsin dayənə. Bəyəm ölmüşəm, itmişəm. Bu saat Alosmanın loğmanlarını tökərəm buraya.

Mahru xanım baxdı ki, dayəsi mətləbi almadı, dedi:

– Can dayə! Mənim dərdimin əlacı loğmanlıq deyil. Bu bir sirrdi girib bağrıma. Sirr də ki, sirli qalmalıdı. Mələk dayə ömür görmüş, dünya

yormuşdu. Çox sirrlərin üstündən su içib yola salmışdı. Mahru xanımın dediyindən anladı ki, bu sirr cavanlıq, xanlıq, sultanlıq sirridi, dedi:

– Ömrüm-ömrünə calansın! Hələ sənin nə yaşındı. Sirr adamı saraldıb sapa, incildib ipə döndərər. Hər düyünün bir ilməyi, hər sirrin bir işartısı var. Sən sirrini de, dayən sirr dağarcığıdı. Sirrini mənə də deməyib, bə kimə deyəcəksən, canım sadağa.

Mahru xanım dedi:

– Canım, gözüm, şirin-şəkər sözüm dayə! Mənə elə adam tap ki, başını islatsın burda, Çənlibeldə otursun dəllək qarşısında.

Əlqərəz, çox götür-qoydan sonra Mələk dayə dedi:

– Qızım, sənin bu müşkül dərdinin əlacı ancaq Xoca Yaqubdadı. Bir namə yaz, verərəm Xocaya. Hesabında Xoca Yaqub bu günlərdə qayıtmalıdı Təbrizə.

Mahru xanım dedi:

– Can dayə! Bu sirri tək göydə ulu Tanrı, yerdə sən bilməlisən. Mahru xanım qələm, kağız götürüb ürəyindəkilərini, xotkardan eşitdiklərini üşələdi sətirlərə, müşəmbələyib verdi dayəsi Mələyə.

Bəli, Mələk dayə naməni Xoca Yaquba aparmaqda olsun, alın xəbəri Xoca Yaqubun kimliyindən.

Ustadların söz-sovuna görə, Xoca Yaqub Təbrizdəndi. İyirmi ildən artıq idi ki, Təbriz, Dərbənd, Şirvan, Naxçıvan, Gəncə, Tiflis, Toqat, İstanbul, Hələb, Misir, Şam, Bağdad bazarlarında tacir-tüccarlıq edib, ad alıb surfa salmışdı. Xoca Yaqub Koroğlu ilə bərk dost olduğundan Gəncə, Tiflis, Alosman bazarlarına mal çıxarmaq sarıdan beli bərk idi. Amma Şərul, Dərələz, Çuxur oba, Ağrı, Qars karvan yolu sarıdan ehtiyat edirdi. Bu karvan yolunun bəndi-bərəsini Giziroğlu Mustafa bəy kəsmişdi. Quş uçsa qanad, qatır keçsə dırnaq salardı. İllaha da Şamlı bəylə Cinli Mehdinin əlindən tacir-tüccar, xan-xavan, bəzirganlar gəlmişdilər cana. Elə ki, düşdün Cinli Mehdinin əlinə, tök mətahını, qurtar canını.

Əlqərəz, Xoca Yaqub bu dəfə İstanbula karvan qaldıranda oğlu Pənah qırsaqqız olub əl çəkmədi yaxasından, dedi:

– Ateyi-mehriban! Bu səfərə mən də səninlə gedəcəm.

Xoca Yaqub dünyagörmüş, çox səfərlər yorub yola salmışdı. Bilirdi ki, Pənah hələ yenicə özünü bozardıb. Bərkə-boşa düşməyib. Xasiyyəti də tünddür. Dedi:

– Can-ciyərim! Bu dəfə yol uzaq, səfər ağırdı. İnşallah Gəncəyə gedəndə səni mütləq apararam.

Bəli, Xoca Yaqub dedi, yalvar-yaxar etdi. Amma Pənah dediyindən dönmədi ki, dönmədi. Dedi:

– Ateyi-mehriban! Sən məndən qızırğalanma. Mən uşaq deyiləm. Adıma nahaqdan “Qara Pələng” demirlər. Bu dəfə karvanı qaçaq-quçaqdan, haramilərdən özüm keçirəcəyəm. Koroğludu, Giziroğludu nədi, görərlər ki, analar necə oğullar doğub?!

Xoca Yaqub baxdı ki, ey dili-qafil, oğlunun damarlarında qan qaynayır. Çox havalıdı. Elə hey qan-qan deyir. Dedi:

– Oğul, bala! Sinəmə bir neçə xanə söz gəlib. Deyim, anlayarsan, çox yaxşı, anlamazsan öz işindi:

Gözlərimin nuru oğlum,
Yaşın hara, qan-qan hara?
Koroğlu igid dəlidi,
Başın hara, qan-qan hara?

İyidləri sanlı-sanlı,
Hər birisi dəliqanlı,
Əyinləri dəmir donlu,
Huşun hara, qan-qan hara?

Ağqayadan nərə çəkər,
Bəzirganlar malın tökər,
Çox igidlər, dizə çökər,
Yaşın hara, qan-qan hara?

Həsəni fənddi, feilli,
Dəmirçisi dəvə kinli,
Nizələri haça dilli,
Tutun hara, qan-qan hara?

Yaqub Koroğluya qardaş,
Dar günümdə olub sirdaş.
Nərə çəksə, salar təlaş,
Başın hara, qan-qan hara?

Söz tamama yetişdi. Xoca Yaqub dedi:

– Canım oğul! Səni cavanlıq qanın coşdurur. Ticarətdə də sənin səriştən yox. Oğul, səfər uzun, sənsə naşı. Gəl bu dəfə ətəyindən tök daşı.

Kimə söz deyirsən?! Ay Qara Pələng başa düşdü ha?! Əlqərəz, Xoca Yaqub nə qədər yalvar-yaxar etdi, Qara pələng dediyindən dönmədi. Axırda Xoca Yaqub çarı-naçar verdi razılıq.

Ata, oğul ya mədəd səndən – deyib, karvanı qaldırdı səfərə. Günə bir mənzil, tey mənzil, az gedib çox gedib az qatdılar gecəni gündüzə. Qırdılar yolun damarını. Xoca Yaqub ramazana qədər istəyirdi ki, özünü yetirsin Təbrizə.

Əlqərəz, Xoca Yaqub çatdı İstanbula, çarvadar bazarında karvanı karvansarada rahladı. Öyrəndi bazarın məzəndəsini. Başladı matahını xırıda. Hərdəm bir də deyərdi:

– Ayə, Qara Pələng! Mollanınkı azardı, tacirinki bazar.

Bazarın şirin yerində Mələk dayə kəsdi Xoca Yaqubun yanını.

Dedi:

– Xoca dədə! Mal-mətahın bazarlı olsun.

Xoca Yaqub dedi:

– İman yiyəsi olasan, a Mələk qarı. Yaxşı Təbriz xalı-xalçam var. Şal, alqumaşım var.

– Xoca lələ! Mənə nə xalın, nə şalın lazımdı. Bəri dur, bir qulaq as, sözüm var.

Əlqərəz, dayə Xoca Yaquba nə dedi, nə demədi onu özü bilər. Amma, Mahru xanımın müşəmbəli məktubunu verdi ona, ovcuna da əl xərcliyi basıb dedi:

– Xoca lələ! Göydə ulu Tanrı, yerdə sən. Bu əl xərcliyinə bir at al, sal özünü Çənlibelə.

Xoca baxdı ki, pis yerdə axşamladı. Bazarda mətahı çox, Qara Pələngin də belə işlərdə səriştəsi yox. Öz-özünə dedi:

– Allahdan xeyirmiş. Nə olar-olar. Qoy bazarlığım qurban olsun Koroğlunun ad-sanına:

Əlqərəz, oğlunu çağırıb dedi:

– Oğlum! Mal-mətah amanatı. Dəyər-dəyməzinə necə gəldi xırıd elə. Mənim dəyəsi yerim var. Oğlum, səni Sarı sərbanla Dardaşda gözdəyəcəyəm.

Xoca Yaqub Sarı sərbana tapşıracagını da tapşırdı. Verdi özünü baş meydanda at bazarına. Bir at alıb, ya mədəd səndən deyib, üz qoydu Çardaqlı Çənlibelə. Dağlar aşdı, dərələr keçdi. Kəsdi qırdırmasına yolun hənrini. Günə bir mənzil, teyi-mənzil təngnəfəs özünü yetirdi Sınaq keçidinə. Dəli Həsən baxdı ki, bu dəfə Xoca Yaqub xeyir-

xəbərlə gəlməyib. Tutdu atın cilovunu, Xoca Yaqub nə handan-nə hana özünü toxdadıb dedi:

– Ayə, ömrü budanmış! Yetir məni Qoç Koroğluya.

Əlqərəz, Dəli Həsən, Xoca Yaqub başı lovlu üz qoydular Çardaxlı Çənlibelə. Kəsdilər yolun əhədini. Malsağını özlərini yetirdilər Yağı qoruğuna. Bu o vaxt idi ki, Koroğlu Giziroğlu ilə Ağqayadan durbinlə karvan yollarına baxırdılar. Giziroğlu dedi:

– Can Koroğlu! Bax, iki atlı ley kimi Yağı qoruğunu haqlayır.

Koroğlu təfərinclə baxanda nə görsə yaxşıdı, gördü ki, gələnlər Xoca Yaqubla Dəli Həsəndi. Dedi:

Can sirdaşım Gizir oğlu,
Bu gələn Xoca Yaqubdu.
Dəlilərə dostdu sadiq,
Bu gələn Xoca Yaqubdu.

Özü tacir, can qardaşım,
İlqarı düz, sirr yoldaşım,
Qurbandı dostuma başım,
Bu gələn Xoca Yaqubdu.

Xoca gəlməz boş-boşuna,
Soğan doğranıb aşına.
Kim toxunub qardaşıma?
Bu gələn Xoca Yaqubdu.

Mərddi, basmaz duz-çörəyi,
Var arada dost diləyi,
Təmizdi, safdı ürəyi,
Bu gələn Xoca Qaqubdu.

Xoca Əziz, xoca başı,
Dəlilərin sirr qardaşı.
Tüccarlıqda deyil naşı,
Bu gələn Xoca Yaqubdu.

Tacirlikdə adı vardı,
Dostluğunun dadı vardı.
Kişilikdə zatı vardı,
Bu gələn Xoca Yaqubdu.

Koroğlunun vardı sözü,
Dostluğunda ağdı üzü.
Yada salıb yenə bizi,
Bu gələn Xoca Yaqubdu.

Söz tamama yetişdi. Koroğlu dedi:

– Can Giziroğlu! Nəsə Alosmandan bəd xəbər var. Xoca alış-verişini buraxıb, başı lovlu gəlməz. Koroğlu bayaqdı Ağqayada bir dəli nərə çəkdi. Çənlibel dəliləri bənd-bərələrdən axışıb gəldilər. Durdular əmrə müntəzir. Dəli Mehdər tutdu Xoca Yaqubun atının cilovunu. Nigar xanım cəmi xanımlarla irəli yeriyib Xoca Yaquba xoş gəldin dedi. Koroğlu baxdı ki, Xoca Yaqubda hey qalmayıb, dedi:

– Canım Xoca, gözüm Xoca! Ölüsən o dünyadan, dirisən bu dünyadan mənə bir xəbər.

Xoca Yaqub dedi:

– Can Koroğlu! Məndə hey qalmayıb, xotkar Muradın bacısı Mahru xanımın naməsi patavamdadır.

Əlqərəz, Aşıq Cünun açdı patavanın sarığını, çıxardı müşəmbəli naməni verdi qoç Koroğluya.

Koroğlu müşəmbəni açdı, gördü namə Giziroğlu Mustafa bəyədi.

Dedi:

– Can Giziroğlu! Bu dəfə namə sənədi. Deyəsən Mahru xiffət çəkir.

Giziroğlu naməni oxudu. Gözləri döndü qan çanağına. Koroğlu dözməyib dedi:

– Ayə, Giziroğlu! Rəngin niyə avazıdı. Oxu görək xotkar qızı nə yazıb?

Giziroğlu dedi:

– Can Koroğlu! Naməni oxumazdan əvvəl sinəmə bir neçə xana söz gəlib. İcazə ver onu sazla deyim.

Koroğlu dedi:

– Ayə, Giziroğlu! Sən elə həmişə izindəsən.

Sözə bənd imiş kimi, Giziroğlu Mustafa bəy Aşıq Kəngərdən sazı alıb bəmini bəm, zilini zil etdi. Aldı görək halına binən nə dedi, tərəfindən biz deyək, siz şad olun:

Məndən xəbər soran qardaş,
Namə xotkar qızındandı.
Xotkar qurub bizə kələk,
Namə xotkar qızındandı.

Namə verib dolaylara,
Əmir edib alaylara,
Kilid vurub saraylara,
Namə xotkar qızındandı.

Giziroğlu ölər, dönməz,
Atəşlərə yanar, sönməz,
Xotkar, paşa nədi, bilməz,
Namə xotkar qızındandı.

Bəli, söz tamama yetişdi. Giziroğlu sazla dediyini, sözlə də dedi. Dübarə sazı basdı sineyi-sandığa. Götürdü görək Mahru xanım Giziroğluna nə yazıb. Tərəfindən ərz eləyək qulluğunuza. Sizə könül şadlığı.

Şan-şərəfim əcəm oğlu,
Xotkar bu gün fərman verdi.
Sənə yesir şirin canım,
Xotkar bu gün fərman verdi.

Yığıb dəli halayları
Çoxdu nizam alayları.
İşə salıb qolayları
Xotkar bu gün fərman verdi.

Susayıbdı qanınıza,
Yaxıb ləkə sanımıza,
Qoşun gəlir yanınıza
Xotkar bu gün fərman verdi.

Ramazana vaxt eləyib,
Paşalara saxt eləyib,
Hücumçün vaxt girələyib,
Xotkar bu gün fərman verdi.

Qiymət qoyub başınıza,
Hökүm verib hamınıza.
Ölüm yazıb canınıza,
Xotkar bu gün fərman verdi.

Mahru da sənə sadağa,
Kimə gedim dərdə dada,
Sənsiz ömrüm gedər bada,
Xotkar bu gün fərman verdi.

Söz tamama yetişdi. Giziroğlu Mustafa bəy məktubun dil-cavabını da oxudu, bə bilməyəsənmi, xotkar Murad Ramazan bayramına qədər saysız-hesabsız qoşunla üstümüzə gəlir.

Bəli, dəlilər başladılar zəncir gəmirməyə. Koroğlu baxdı ki, dəlilərin halı özündə deyil. Bıçaq vursan qan çıxmaz. Bir himə bənddilər. Bu tərəfdən də elə bil Giziroğlunun sir-sifətini boran vurmuşdu. Hirsindən, hikkəsindən üst dodağı göy, alt dodağı yer süpürürdü. Koroğlu dedi:

– Qoç dəlilərim! Sinəmə bir neçə xanə söz gəlib. Onu da deyim. Sonra başlarıq məsləhət-məşvərətə.

Götürdü görək Qoç Koroğlu nə dedi. Ərz eləyək tərəfindən qulluğunuza:

Hərzə-hədyan nədi, qoç dəlilərim,
İndi ağıllı bir məsləhət gərək.
Kəsək gədikləri, bənd-bərələri,
İndi ağıllı bir məsləhət gərək.

Tutaq keçidləri, suvadaqları,
Dolay aşrımları, ovalıqları,
Düşmən hiyləsini, hər soraqları –
İndi ağıllı bir məsləhət gərək.

Koroğlu heç vaxt olmayıb naşı,
Döyüşdə unutmaz yarı-yoldaşı,
Tutmağa düşmənlə cəngi-savaşı,
İndi ağıllı bir məsləhət gərək.
Söz tamama yetişdi.

Giziroğlu Mustafa bəy dedi:

– Can Koroğlu! Belə görürəm hamı dəlilər zəncir gəmirir. Xotkar Murad bicdi. Hücuma keçməmişdən əvvəl planını yüz ölçüb, bir biçir. Düşmənini gözləmədiyi yerdən yaxalayır. Köhnə hiyləgərdi. Bilir ki, Qars, Ağrı, Çuxuroba yolu kəsə, ağıla gəlməzdi. Qoşunun gərdiş etməsi üçün şərait əlverişlidi. Əsas qüvvəni bu səmtə yönəldəcək. Bizi çəkiyə çəkmək üçün qoşununun az qismini Yasdıqar səmitdən Ayqır keçidinə yönəldəcək. Alosman şəhərlərində az qüvvə saxlayacaq. Biz əsas qüvvəmizi Ağrı keçidinə toplamalı, bir qismini isə Ayqır keçidində pusquda qoymalıyıq. Say-sambal dəlilərdən yeddi yüz yetmiş

yeddisini Sınaq keçidindən Alosmana yeritməliyik. Düşməni yaxalayıb yurdunda turp əkməli, xəzinəsini qənimət gətirməliyik.

Koroğlu dedi:

– Giziroğlunun döyüş nəqşi qəbul edilsin. Dəmirçioğlu, Eyvaz xan, Şamlı bəy, Cinli Mehdi, Həsən bəy dəlilərilə Ağrı keçidinə, Dəli Həsən, Sırt Yusif, İsabalı, Dəli Əhməd, Adıbəlli, Halaypozan dəlilərilə Sınaq keçidindən İstanbula hərəkət etməli, qalan dəlilər mənimlə Çənlibelin müdafiəsində qalır.

Söz Koroğlunun ağzından çıxar-çıxmaz Çənli xanımları doldurdu piyalələri. Dəlilər piyalələri nuş etdilər. Bayaqdı qızıl quş kimi Giziroğlu Alapaçanın, Bəlli Əhməd Sürdatın, Adıbəlli Qaragözün, Halaypozan Sarınərin, Dəmirçioğlu Ərəbatın, Eyvaz xan Düratın, Şamlı bəy Bozqarın, Cinli Mehdi Qarasənilin, Həsən bəy Aşqardorun, Dəli Həsən Haçadilin, Sırt Yusif Köhlənşirin, İsabalı Qəmərdayın, Dəli Çovdar Əltərpənməzin bir göz qırpımında qondular yəhərin qaşına. Məşq meydanında bir dəfə gərdiş edib, ya mədəd səndən deyib, elə bir dəli nərə çəkdilər ki, Çənlibeldə ənşər-mənşər ərəsəti qopdu.

Əlqərəz, hərə üz qoydu öz yolu ilə bəlli-başlı bəndi bərəsinə. Bəli, dəlilər yolunu dəstələməkdə olsun, indi alın xəbəri İstanbulda Qara Pələngdən. Qara Pələng alış-verişdən yorğun-arğın karvansaraya qayıtdı. Tacir tüccarlardan eşitdiyi söz-sov başladı qəlbini ac qurd kimi gəmirməyə. Ha çalışdı ki, gözünün acısını alsın, bacarmadı. Dözməyib sərbanbaşı Sarıdan soruşdu:

– Ağeyi Sarı! Sən dünyagörmüş, çox ölkələr dolaşmış adamsan. Ağlın nə kəsir, Koroğlu bu qədər Alosman qoşununa dov gələ bilərmi?

Sarı sərban dedi:

– Oğlum! Hərçəndi bu işlər bir qədər müşküldü. Amma, oğul! Koroğlu da bir Koroğludu. İmanım Allaha, deyirlər Köroğlunun özü də, dəliləri də qurd südü əmib. Elə ki, Koroğlu nərə çəkir, dəliləri olur qızmış şiripələng. Düşürlər ac qurd kimi qənimlərinin canına. Biçirlər yağıların başını ura yerinin kəliyi kimi. Ay oğul! Bir qoşunun ki, ola başçısı Sırt, Qurd, Dəli, Dəmirçi, Şir, Şərxata, Yağıqıran, Qorxuqammaz, Geridönməz, Tüpdağıdan, Halaypozan, daha nə bilim ay bala, saymaqla tükənəndilərmi. Hərə bir söz deyir. Qanmırlar, qandırmırlar. Kimi istəyirlər qaldırırlar, kimi istəsələr cızdağını çıxarıb yandırırlar. Bazar bilmirlər, sövda görməyiblər. Amma, oğul, paylarını qazancın duruca yerindən bölüb götürürlər. Görənlər deyir, sifətlərindən zəhrimar

yağır. Hər biri yeddi boyun kəlin zəncirini qırır. Boy-buxunları da dama dirəndi. Kimə təpinirlər, gözlərini ağardırlar, kişilikdən kəsilir. Amma, oğul, adam gərək insafını da yandırmasın. Kişilər kasıb-kusub adamlarıdı. Onlarınkı şahlar, xotkarlar, xan-xəvanlar, paşalar, sultanlar, malını yeməz tacir-tüccarlarladı. Dağıdırlar var-hallarını, paylayırlar əlsiz-ayaqsızlara.

Söhbət bura çatanda Qara Pələng dedi:

– Ağeyi Sarı, and verirəm imanına, atamla kəsdiyin duz-çörəyə. Mətahın olub qalanını sat dəyər-dəyməzinə, qafla qatırı apar atam deyən yerə. Mən getdim. Məndən tacir olmaz. Sənin dediyin o Koroğlu elə deyəsən mənim adamımdı.

Əlqərəz, səhər xoruzun ilk banındaca Qara Pələng Sarı sərbanla halal-hümmət edib, atının cilovunu boşladı Çənlibel səmtinə. Atalar yaxşı deyib, kor kimdi nabələd. Qara Pələng dağ deməyib, dərə deməyib başladı hər yerdə yolu qırdırmasına dəstələməyə. Qatdı gecələri gündüzə. Tökdü atın nal-mıxını. Gördü iş fırıxdı, at taşaxorlayıb. Şər qarışanda özünü yetirdi bir dağ kəndinə. Oldu bir qocanın qonağı.

Qoca dünyanı yorub boğazından keçirmiş adam idi. Baxdı ki, qonağı sir-sifətdən uşaq olsa da, hələ Tanrı törpüsü dəyməyib. İştahası da ac qurd kimi. Şam süfrəsindən sonra qoca soruşdu:

– Oğlum! Qonaq Allah qonağıdı. Hansı qohumlardansan? Gəlişin hardan, gedişin hara? Bir az buralar məxşuşluqdu.

Qara Pələng dedi:

– Babacan! Mən Təbrizli Xoca Yaqubun oğluyam. İstanbuldan gəlib, Çənlibelə gedirəm. Yolda atımın nal-mıxı tökülüb. Taşaxorlayıb. İndi qalmışam xanaxan.

Qoca baxdı ki, qonağı hert-mert qanmır. Bir az açıq-saçıq danışır. Dedi:

– Oğlum, at məndə. Atını qoyarsan burada. Minərsən mənim Alagöz ürgəmi. Səni dar-damanda qoymaz. Amma oğlum, bil və agah ol! Koroğludu, Giziroğludu, Çardaqlı Çənlibeldi onların adını çəkmə. Dünən buralarda başlarında qotazlı fəs, əyinlərində qırmızı şalvardan çox görüblər. Onlar da Çənlibelin səmt-suatını soruşurlarmış. Ehtiyat igidin yaraşığıdı, bala.

Qara Pələng dedi:

– Babacan, sən dünyagörmüş adamsan. Adam bir dəfə dünyaya gəlir, onu da gərək kişi kimi yaşaya! Çaqqaldan çaqqal, qurddan qurd

olar. Sən mənə Qoç Koroğlunun, Çənlibelin səmt-suatını salğa ver. Mən sənin o genbalaqlı fəsi qotazlılarından nəsitmirəm.

Qoca dedi:

– Uğurun xeyir, bala! Sən Alagözün cilovunu boşla. O səni düz Çardaqlı Çənlibelə aparar. Alagözün qardaşını keçən il Cinli Mehliyə vermişəm, iyini duyar.

Qara Pələng dedi:

– Babacan! Cinli Mehli kimdi?

Qoca dedi:

– Oğlum! Cinli Mehlini Şərul, Dərələz, Çuxuroba basarağında tanımayan küllü kavurdu. Onun min bir feli, bir o qədər də qeylü-qalı var. Giziroğlu Mustafa bəyin sağ əlidi. Nə bilim, ay bala! İndi də deyirlər ki, qoşulub Çənlibeldə Koroğluya. Onun oyunlarından Tanrı-taala da baş açmaz. Amma, oğul, kişinin dini-məshəbi ayrı da olsa, Allah adamıdı. Dinə gəlsin. Onun işi hampalarla, varlılarla, paşa-puşalarladı. Kasıb-kusub əli tutandı.

Oğlum! Sənə bir namə verəcəm. Çatdırarsan o Cinli Mehliyə. Elə orada da yaxından dostlaşarsınız – deyib, qoca qələm-kağız götürüb yazdı:

"Mehdi ağa! Bil və agah ol, bu tərəflərdə havalar məxşuşdu. Qırmızı tuman, gen balaqlılar yerə-göyə zəncir salıb sizi axtarır. Quşdan ayıq, qurddan sayıq olun. Alosman qoşunları Ağrı keçidinə tərəf daşdanır. Dostun Hinir Vəli".

Qoca məktubu qatlayıb verdi Qara Pələngə. Dilcavabında dedi ki, namə əmanəti. Ələ keçsə hər ikimizin qulaqları gərinəcək, ağzımızın qıyası soyulacaq. Dərimizə saman təpinib camaata görk ediləcək.

Əlqərəz, obaşdan Qara Pələng boşladı Alagözün cilovunu. Sanna-sunna yollarla qırdı yolun damarını. Ertəsi gün yaxar-yatmaz çatdı bir qoruğa. Özünü verdi sərin bir bulağın başına. Su içib, əl-üzünü yudu. Alagözü yançidar edib, bulağın başındakı ağacın kölgəsində dirsəkləndi. Getdi qara div yuxusuna.

Bəli, nə qədər yatmışdı, onu Qara Pələngin özü bilərdi. Ayılanda gördü ki, möhkəm-möhkəm kəl zəncirilə sarınıb ağaca. Qəhr boğdu. Atasının, Sarı sərbanın, qocanın, Koroğlunun dara düşəndə çəkdiyi nərə düşdü yadına. O idi ki, qovşuruldu, güc verdi, elə bir nərə çəkdi ki, yeddi böyük kəl zənciri pul-pul olub səpələndi dörd bir yana. Koroğlu, Şir Vəli, Sanlı Səməd, Bəbir Alı, Şərxata Mədəd, Yağıqıran aralıqdan baxıb tamaşa edirdilər.

Koroğlu irəli gəlib dedi:

– Əhsən səni doğan ananın südünə!

Qara Pələng qeyzlənib dedi:

– Atam yerində kişisən! Ağır deyərdim. Mənlə zarafatın var, kişi kimi gir meydana. Bir qəbiristanlıq boynu yoğunla bir uşağın üstünə düşüb yuxuda əl-ayağını ağaca sarımaq namərdlikdi. Kişisən işi mərdi-mərdanə gör.

Koroğlu baxdı ki, yox, bu qanıb-qandırmır. Ortalığa meydan söhbəti salır. Öz-özünə dedi:

– Gəl bunu sına. Uşaq olasan, pəsinməyib diri-diri danışasan.

Dedi:

– Ayə Bəbir! Gör bu ağzı qatıqlı nə deyir.

Bəli, Bəbir Alı girdi meydana. Qara Pələng bir göz qırpımında Bəbir Alını basmarlayıb saldı dizinin altına.

Əlqərəz, Şərxata Mədədi, Yağıqıranı, Şir Vəlini, Sanlı Səmədi qalaqladı yan-yana. Koroğlu baxdı ki, iş şuluqdu, özünü sındırmadı, dedi:

– Oğlum! Sinəmə bir-iki yarpaq söz gəldi. Deyim bəlkə karına gəldi.

Aldı Koroğlu:

Sədd afərin, oğul, sənə,
Bu boyda zor olmaz-olmaz.
Verrəm müjdə dəlilərə,
Bu boyda zor olmaz-olmaz.

Aldı Qara Pələng:

Rişxənd eyləmə babacan,
İgiddə zor olar-olar.
Vermə müjdə dəlilərə,
İgiddə zor olar-olar.

Aldı Koroğlu:

Poladdan möhkəmdi canın,
Bilinməyir adın-sanın,
Züryətisən hansı xanın,
Bu boyda zor olmaz-olmaz.

Aldı Qara Pələng:

Mərdlərə qurbandı canım,
Bəl-bəllidi adım-sanım,
Düşməniyəm hər bir xanın
İgiddə zor olar-olar.

Aldı Koroğlu:

Gəl girmə nərilə cəngə,
Çəkərəm səni məhəngə,
Güc çatmaz qoca nəhəngə,
Bu boyda zor olmaz-olmaz.

Aldı Qara Pələng:

Qara Pələng girər cəngə,
Çəkər sən nəri məhəngə.
Bir sırtdır qoca nəhəngə,
İgiddə zor olar-olar.

Söz tamama yetişdi. Koroğlu gördü ki, bu uşağın boynu qoltuq görməyib. İnsafı, kişinin oğlundan yaxşı dəli olar. Uşağı sındırmamaq üçün əl verdi.

Qara Pələng elə bildi ki, rəqibi onunla sınanmaq istəyir. Bayaqdı yapışdı Koroğlunun əlindən, elə sıxdı ki, barmaqlar girdi bir-birinin içinə. Koroğlu gördü bu xına o xınadan deyil. Uşağın əlləri dəmirçi məngənəsi kimidi. Bayaqdı bir dəli nərə çəkdi. Qara Pələngin qulaqları güyüldədi. Qolları boşaldı, düşdü üzü üstə yerə. Bu ilmi ölübsən, bildirmi. Dəlilər qamarladılar Qara Pələngi. Üzünə su səpən kim, sinəsini, kürəyini ovan kim.

Əlqərəz, nə handan, nə hana Qara Pələng gəldi özünə. Qara Pələng indi anladı ki, bu, Koroğlunun dəli nərəsidi. Dedi:

– Baba Koroğlu! Bağışla günahımı, səni anşırammamışam.

Sonra da papağının astarında gizlətdiyi Hinir Vəlinin naməsini verdi Koroğluya.

Bəli, Koroğlu namənin məzmunu ilə tanış olub dedi:

– Oğlum, bəs sən kimsən?

Qara Pələng dedi:

– Baba Koroğlu! Əsil adım Pənahdı. Tay-tuşlarım adımı zarafatla Qara Pələng çağırırlar. Təbrizli Xoca Yaqubun oğluyam.

Koroğlu Xoca Yaqubun adını eşidər-eşitməz basdı Qara Pələngi bağrına, dedi:

– Halal olsun qardaşım Xocanın çörəyi sənə! Oğul, bəs belə haradan gəlib, hara gedirsən?

Qara Pələng başına gələnləri Koroğluya nağıl etdi. Koroğlu mindi cin atına dedi:

– Ayə Dəli Mehdər! Çək Ayqırı meydana.

Əlqərəz, Şir Vəli, Bəbir Alı, Şərxata Mədəd, Yağıqıran, Sanlı Səməd, Qara Pələng də Koroğlu kimi oldular atlarına suvar. Üz qoydular Dardaş səmtindən Ağrı keçidinə. İki ötər, üçüncü gün özlərini yetirdilər Ağrı kəndinə. Gördülər ki, leş bir tərəfdə, baş bir tərəfdə. Əsil ərəsət meydanıdı. Alosman qoşunlarının sağ cinahında Dəmirçioğlu əl eyləyib yeddi boyun kəl zəncirinə. Hər hərləyəndə on-on beşini lehrə vurur. Şamlı bəy, Eyvaz xan özünü vurub qoşunun ortasına, göz istəyir tamaşasına. Həsən bəylə, Cinli Mehdi dəstələyib qoşunun sol cinahını. Şir Vəli, Sanlı Səməd özlərini yetirdi Dəmirçioğluna. Bəbir Alı, Yağıqıran, Dəli Mehdər özlərini yetirdilər Şamlı bəylə, Eyvaz xana, Şərxata Mədədlə Qara Pələng də vurdular özlərini sol cinaha. Başladılar Aolsman qoşunlarını pencər kimi biçməyə.

Koroğlu baxdı ki, gün yaxır, amma Osmanlı qoşunu bir ucadan hey sel kimi axır. Özünü saxlaya bilmədi. Bayaqdı bir dəli nərə çəkdi. Vurdu özünü qoşuna. Koroğlunun dəli nərəsindən Ağrı dağında Nuh əyyamından qalmış qar uçqunu yeridi üzü aşağı. Bir tərəfdən qar uçqununun uğultusu, bir tərəfdən qoç Koroğlunun nərəsinin küyültüsü Alosman qoşununu saldı pərən-pərən. Əldən çıxan yer axtardı başını daldalamağa.

Əlqərəz, Koroğlu dəliləri ilə Ağrı keçidində Alosman qoşunlarını pərən-pərən salıb qovmaqda olsunlar. İndi də alın xəbəri Ayqır keçidində Dəli Həsən, Sırt Yusif, İsabalı, Dəli Çovdardan.

Dəli Həsən dürbünü götürüb süzdü dağları, dərələri, keçidləri. Gördü ki, Alosman qoşunları Ayqır keçidinə sel kimi axışır. Ürəyi qubar elədi, hərlədi sazı sineyi-sandığa:

Çox gəzmişəm oylaqların,
Var ol səni, Maymaq dağı.
Vüqarımı sən veribsən,
Var ol səni, Maymaq dağı.

Qoyun-quzu mələr səndə,
Çox gəzmişəm çiskin, çəndə,
Evladınam sənə mən də,
Var ol səni, Maymaq dağı.

Qoşun gəlib bağrın əzir,
Oğul-qızın necə dözür,
Düşmən baxıb ağzın büzür,
Var ol səni, Maymaq dağı.

Çox qalmışam səndə qonaq,
Gəl eyləmə məni qınaq,
Ağır dedim sənə bayaq –
Var ol səni, Maymaq dağı.

Dağlar mənim damanımdı,
Hər gədiyin amanımdı.
İndi savaş zamanımdı,
Var ol səni, Maymaq dağı.

Dəli Çovdar, İsabalı,
Sırt Yusifin qeylü-qalı.
Çəkib başın çox zavalı,
Var ol səni, Maymaq dağı.

Dəli Həsən nərə çəkər,
Düşmən indi zəhər içər,
Çoxları başından keçər,
Var ol səni, Maymaq dağı.

Bəli, söz tamama yetişdi, Dəli Həsən bayaqdı bir nərə çəkdi. Əks-sədası dağlardan gəldi. Sırt Yusif kəsdi qoşunun sol cinahını. Dəli Çovdar, Dəli Həsən dəlilərilə dayandılar. Alosman qoşunları ilə üz-üzə, İsabalı dəliləriylə tutdu sol cinahı Ərəsət meydanı başladı, nə başladı. Yağı görsə, yazığı gələrdi. Çox belə döyüşlərdə İsabalı fənd işlətmişdi. Bu dəfə də fürsəti fövtə vermədi. Dəlilərin bir qismini qoydu sağ cinahda. Bir qismini götürüb keçdi düşmənin arxasına. Oba-oymağın əli yaba, dəhrə, balta tutanı qoşuldu İsabalıya. Dəli Həsən, Dəli Çovdar, Sırt Yusif qoşunun önündən, İsabalı camaatla qoşunun arxasından düşdülər qoşunun canına. Dar ilkindidə Dəli Həsənin qılıncı dayandı İsabalının qılıncına. Alosman qoşununun öləni öldü,

qalanı keçdi Dəli Həsənin qılıncının altından. Baxdı ki, Bolu bəy çömələn dəymiş toyuq kimi bürüşüb, Sırt Yusif dedi:

– Can Dəli Həsən! Bu namərdi tapşır mənə. O, mənim atama nə dağı çəkibsə, mən də ona o dağı çəkəcəm.

– Dəli Həsən dedi:

– İzindədi.

Bayaqdı Sırt Yusif hərlədi sazını, basdı bağrına. Götürdü görək nə dedi. Tərəfindən ərz eləyək qulluğunuza:

Unutmadım dəvə kimi,
Bolu, mən sənin, mən sənin.
Alaram o şirin canın,
Bolu, mən sənin, mən sənin.

Gizri qılıncım çəkərəm,
Bağrın başını sökərəm,
Tutub qulağın kəsərəm,
Bolu, mən sənin, mən sənin.

Neçələrin atdım oda,
Neçələri getdi goda.
Tökərəm qanın burada,
Bolu, mən sənin, mən sənin.

Ərəsət meydanı quraram,
Bürc-barını uçuraram.
Dana tək boynun buraram,
Bolu, mən sənin, mən sənin.

Ağlar qoydun cavan çağı,
İçirtdin Yusifə ağı,
Çəkərəm sinənə dağı,
Bolu, mən sənin, mən sənin.

Bəli, söz tamam oldu. Sırt Yusif sazla dediyini sözlə də dedi.

Bəli, Sırt Yusif kəsdi Bolu bəyin bir qulağını, soydu ağzının qiyasını, dedi:

– Bolu bəy! Ağa kərəmsiz, qul xətasız olmaz. Tökdüyündü çıxdı qarşına.

Əlqərəz, Dəli Həsən dəlilərlə soluğunu dərməkdə olsun, indi alın xəbəri Giziroğlu Mustafa bəydən. Ustadlar buyurur ki, Giziroğlu qəni-

minin üstünə gedəndə min bir feli-fəndi varmış. Giziroğlu Mustafa bəy, Bəlli Əhməd bir neçə at mənzili qalmış özlərini verdilər çoban yataqlarına. Üç-dörd sürünü alıb qatdılar qabaqlarına. Dəlilər dəyişdi libaslarını, oldular əsl çodar. Bir qədər məsləhət məşvərətdən sonra əl-ayaq yığışırılanda dəstə-dəstə doluşdular İstanbul bazarlarına. Verdilər özlərini karvansaralara. Gözlədilər Giziroğlunun haça şeşbərinin işığını.

Əlqərəz, Giziroğlu dəlilərilə İstanbul bazarlarında ramazanlıq qurbanlığı satmaqda olsunlar, alın xəbəri xotkar Muradın bacısı Mahru xanımdan. Giziroğlu Mustafa bəylə Mahru xanımın əhd-peyman günü başa çatmaq üzrə idi. Mahru xanımın gözləri yollarda, qulağı səsdə idi.

Bəli, Mələk dayə də ətəyini çırmayıb düşmüşdü İstanbul bazarlarının canına. Çarvadar bazarına çatanda gördü ki, qəssab dükanının qənşərində bir oğlan durub, vallahi elə bil Allah taala xoş saatda çəkib qələmini onun boy-buxununa, hüsnü camalına. Yemə, içmə tamaşa et xətti-xalına. Qarı baxdı ki, qəssablar, çodarlar elə hey ondan məsləhət alır. Mələk qarı fürsəti fövtə vermədi. Yaxınlaşdı cavana, dedi:

– Oğlum! Qurbanlığınız bazarlı olsun.

Giziroğlu dedi:

– İman yiyəsi ol, ana!

Giziroğlu arif adam idi. Baxdı ki, qarı sözlü-sovlu adama oxşayır. Dedi:

– Keçək karvansarada mənim küməmə. Uşaqlar indi sənə ramazanlıq üçün ətin yaxşı yerindən gətirərlər.

Əlqərəz, Mələk dayə ilə Giziroğlu getdilər karvansaraya. Oradan, buradan keçdilər çənə söhbətinə.

Mələk dayə dedi:

– Pay-puşnuz çox olsun, ay oğul! Bayramınız üzünüzə xoşbəxtlik gətirsin. Muraz mətləbinizə çatasınız. Amma oğlum, incimə! Boy buxununuzdan, əliaçıqlığınızdan heç İstanbul əhlinə oxşamırsınız?

Giziroğlu dedi:

– Elədi, ana! Biz Qaf adamlarıyıq. Çarvadar babayıq, indi ramazanlıqdır. Bazarımız da pis deyil.

Mələk dayə baxdı ki, söz mətləb üstə gəldi.

Dedi:

– Can bala! Allah taalanın sizə rəhmi gəlsin. Sizə nə var. Bu gün burada, sabah Qafdasınız. Yazıq bizim balaların halına. Alosmanda başı papaqlı qalmayıb. Xotkar hamısını göndərib bacısı Mahru xanımın

ucbatından Qaf ölkəsində Koroğlu ilə Giziroğlunun qırğınına. Yazıq bacımı da salıb dörd divar arasına. Xotkar Murad fərman verib ki, Koroğlunun başını gətirən Alosmanın, Giziroğlunun başını gətirən isə Mahru xanımın sahibidi. Ay oğul, bə deyirlər, onların minbir hoqqası var. Amma oğul, bu gün Giziroğlunun Mahru xanıma verdiyi vaxt, vədə tamam olur. Yazıq qız dörd divar arasında hörümçəkdən can diləyir. Xotkar qızın ağ gününü büküb göy əskiyə. Nə gələn var, nə də gedən.

Giziroğlu baxdı ki, qarı onu yamanca qaralayıb. Qarını sınamaq üçün dedi:

– İmanına qurban! Xotkar bacısını quş sənməz qala divarı arasında saxlayır. Buna Giziroğlunun hoqqası neyləsin? O biri tərəfdən də xotkarın qoşunları kəsib bəndi-bərələri.

Mələk dayə gözünü qıyıb təfərrinclə müsahibinə baxdı, dedi:

– Heyif zəndimə, oğul! O quş sənməz sarayı üç cüt bir tək qoca-qoltaq gözətçi, bir də Qara Pəhləvan gözləyir. Vallahi, yaşımın bu ixtiyar vaxtında mən gecənin oğlan çağında keşikçiləri yuxuya verib, xotkar qızını basardım atın tərkinə. Üz qoyardım dağların pənahına. Nə çoxdu Tanrının sığınacağı. Sonrası Allah kərimdi.

Giziroğlu baxdı ki, daha mıs-mısdan keçib. Dedi:

– İmanına qurban, nənəcan! Zəndin səni aldatmayıb. Uzun söhbət dananı qurda yedirər. Sənə bir namə yazacam, verərsən Mahru xanıma. Özün də onunla gözləyərsən gecənin oğlan çağını. Giziroğlu qələm-kağız götürdü. Görək Mahru xanıma nə yazdı, tərəfindən ərz eyləyək qulluğunuza:

Qibləgahım Mahru xanım,
Şükür gəldim, ha gəldim.
Verdiyim ilqar-imana,
Şükür gəldim, ha gəldim.

Qaynayıb, coşub peymanım,
Qurban sənə şirin-canım,
Sən mənim şöhrətim-şanım,
Şükür, gəldim, ha gəldim.

Giziroğlu, yandı, yandı,
İlqar verib nə zamandı,
Vədəmiz bu gün tamamdı,
Şükür, gəldim, ha gəldim.

Bəli, Giziroğlu Mustafa bəy naməni müşəmbələyib verdi Mələk dayəyə. Deyəcəyini, tapşıracağını da dilcavabı dedi:

– İmanına qurban, nənə! Mahru xanıma deyərsən, gecədən xeyli keçmiş gözləsin mənim şeşbərimin işığını. Mələk dayə naməni alıb öpdü, qoydu gözü üstə, dedi:

– Oğul, xeyir-duanız məndən, uğurunuz Tanrı-taaladan.

Əlqərəz, Giziroğlu, Bəlli Əhməd, Adıbəlli, Halaypozan hücumdan qabaq planını bir də götür-qoy etdilər. Hər kəs dəliləriylə nə iş görəcəyinin tapşırığını alıb, gözlədilər Giziroğlunun haça şeşbərinin işığını.

Bəli, gecənin oğlan çağında Giziroğlunun işarəsini görən dəlilər ac qurd kimi bayaqdı Xotkarın keşikçilərini etdilər cəhənnəmə vasil. Aldılar xotkarla Qara Pəhləvanın başının üstünü. Alt paltarında hər ikisini çəkdilər Giziroğlunun qabağına. Söz Giziroğlunun sinəsində tüğyan etdi. Götürdü görək Giziroğlu Mustafa bəy xotkara nə dedi. Tərəfimizdən ərz eləyək qulluğunuza:

Fərman verib hay salıbsan.
Xotkar Murad, xotkar Murad!
Çox evlərə vay salıbsan,
Xotkar Murad, xotkar Murad!

Hayqırıb qılınc çəkərəm,
Burcu-barını sökərəm,
Yurdunda bostan əkərəm,
Xotkar Murad, xotkar Murad!

Sallam Alosmana talan,
Dilimə gətirməm yalan,
Ağlar qalar elin-oban,
Xotkar Murad, xotkar Murad!

Döyüşümüz ağır olar,
Qoyub qaçan fağır olar,
Boynun buran sağır olar,
Xotkar Murad, xotkar Murad!

Soyuma sən gəda dedin,
Atıb böhtan əda dedin,
Çənlibelə səda dedin,
Xotkar Murad, xotkar Murad!

Məmləkətin qana dönər,
Taxtı-tacın yana dönər,
Keçən günün sana dönər,
Xotkar Murad, xotkar Murad!

Dəlilərə hay vuraram,
Vərəsini tay vuraram,
İndi sənə toy quraram,
Xotkar Murad, xotkar Murad!

Mərd ərənlər eli güdər,
Arsız namərd əli güdər,
Paşaların səndən betər,
Xotkar Murad, xotkar Murad!

Qurdoğluyam, bilir hamı,
Əsil soymu sən də tanı.
Allam səndən şirin canı,
Xotkar Murad, xotkar Murad!

Giziroğlu, gəzər yorğun,
El-obana salar qırğın.
Sönüb sənin şam-çırağın,
Xotkar Murad, xotkar Murad!

Söz tamam oldu. Mahru xanım baxdı ki, Giziroğlunun gözləri dönüb qan çanağına, dəlilər də çeynəyir bığının ucunu. Mətləbi anladı. İşi görən Mələk dayə açdı örpəyini, atdı Giziroğlunun ayaqlarına.

Adıbəlli arif adam idi. Örpəyi yerdən götürüb verdi Mələk dayəyə, dedi:

– Can Giziroğlu! Bu tülküləri bağışla Mələk nənənin ağ birçəyinə, at zindana.

Bəli, Halaypozan himə bənd imiş kimi qandalladı xotkarla Qara Pəhləvanın əl-ayağını. Açdılar zindanı. Zindandakıları etdilər azad. Qapadılar zindanı xotkarla Qara Pəhləvanın üzünə. Dəlilər bayaqdı Bəlli Əhmədin işarəsilə yüklədilər xəzinəni qəflə-qatıra.

Əlqərəz, Giziroğlu Mahru xanımı, Mələk dayəni, qəflə-qatırı tapşırdı Halaypozanla Adıbəlliyə, saldı yola Çənlibelə.

Giziroğlu, Bəlli Əhməd dəlilərlə qaldılar səhərə. Xotkarın xəzinəsinin olub-qalanını payladılar əlsiz-ayaqsızlara. Giziroğlu Mustafa bəy bir namə də yazıb qoydu xəzinəyə:

– Xotkar Murad! Özü yıxılan ağlamaz. Sən fərman vermişdin ki, kim mənim qanlı başımı sənə gətirsə, bacın Mahru xanım onundu. Mən fərmanına əməl etdim. Mahru xanım üçün öz ayağım, öz başımla hüzuruna gəldim. Fərmanına görə indi bacın mənim halalımdı. Fərmanına görə kim başımı gətirsə, xəzinənin yarısı onun ənamında idi. İndi mən xəzinədən payıma düşən ənamı halallıqla götürdüm. Fərmanına görə başım üçün ramazanlıqda əlsiz-ayaqsızlara əl tutmağı vəd vermişdin. İndi mən fərmanına əməl edib xəzinənin olan-qalanını xeyrətlik üçün payladım əlsiz-ayaqsızlara. Səni, Qara Pəhləvanı cəhənnəmə vasil eləmədim, bağışladım Mələk dayənin, Mahru xanımın, Çənlibel dəlilərinin hörmətinə. Əgər azıb, bir də yolumun üstünə çıxsan kəsəcəm qulaqlarını, soyacam ağzının qıyını.

Əlqərəz, Giziroğlu məktubu yazıb qoydu xəzinəyə, Bəlli Əhməd dəlilərlə üz qoydu Çardaqlı Çənlibelə.

Bəli, nağılçılar dili mübarək, köhlən mənzildə yüyürək olar. Ustadlar deyir ki, qəflə-qatır Çardaqlı Çənlibelə çatanda Koroğlu qan qardaşının gəlişi münasibətilə yeddi min yeddi yüz yetmiş yeddi tuncunu, əbrişim öyəci, erkəci kəsdi Giziroğlu Mustafa bəylə Mahru xanımın mübarək qədəmlərinə, Nigar xanım əlindəki şərbəti verdi təzə bəylə gəlinə. Dilədi onlara xeyir-dua. Cəmi Çənlibel xanımları da durdular əllərində şirin-şərbət dəlilərin pişvazında.

Ustadların söz-sovuna görə, Koroğlu Çənlibeldə Giziroğlu Mustafa bəylə Mahru xanıma qırx gün, qırx gecə bir toy elədi ki, hələ ruzgarın gözü cümlə-cahanda belə toy görməmişdi.

Aşıq Cünunla Aşıq Kəngər sazlarını zil-bəm elədilər. Götürdülər görək Koroğlu ilə Nigar xanımın dilindən duvaqqapma üzərində Giziroğlu Mustafa bəylə Mahru xanımın şəninə nə dedilər. Tərəflərindən ərz eyləyək qulluğunuza, sizə könül şadlığı.

Aldı Aşıq Cünun:

Giziroğlu, Mahru xanım,
Nigar verdi xeyir-dua.
Çənlinin şöhrəti-şanı,
Nigar verdi xeyir-dua.

Aldı Aşıq Kəngər:

Dəlilərin qan-qardaşı,
İgidlərin yar-yoldaşı,
Çənlibelin o sirdaşı,
Koroğludan xeyir-dua.

Aşıq Cünun:

Cümlə dəlilər anası,
Uğurludu iltiması,
Siz Nigarın cüt balası,
Nigar verdi xeyir-dua.

Aşıq Kəngər:

Hər birimiz oğulluyuq,
Şirin-şəkər noğulluyuq.
Xeyir-şərdə biz quluyuq,
Koroğludan xeyir-dua.

Aşıq Cünun:

Cünun deyər coşa-coşa,
Boy buxununuz bir tamaşa,
Qarıyasız sizi qoşa,
Nigar verdi xeyir-dua.

Aşıq Kəngər:

Aşıq Kəngər məhəbbətlə,
İlqar dilər sədaqətlə,
Ömür sürün təravətlə,
Koroğludan xeyir-dua.

# Koroğluynan Bəylər

Koroğlu bir gün dəlilərinə deyir:
– Dəlilərim, mənim səfərim var.
Dəlilər deyir:
– Hara gedirsən?
Koroğlu deyir:
– Nə işinizə, budu bu xəncəri də asıram divardan, hərgah xəncərin ucundan qan damsa məni ölmüş bilin.

Koroğlu Qıratını minib bir neçə mənzil yol gedəndən sonra gəlib çatdı bir çəməngaha. Gördü burda bir bağ var gəl görəsən. Dünyada hər cür ağacdan olan bu laləzar bağda gül bülbülü, bülbül gülü çağırır. Bənövşələr açıb, ağaclar yarpaqlanıb.

Koroğlu bu bağı dolana-dolana diqqətnən tamaşa eləyirdi. Bir də gördü bağın içində ceyran misallı bir qız sallana-sallana yüz naz-qəmzə ilə bağı seyr edir. Qız nə qız. Qaşlar qara, gözlər qara, baldan şirin ləbləri, sinəsi Şahdağının qarı kimi ağ, məmələri köynəyin altınnan şamama kimi baş veribdi.

Koroğlu qızda bu gözəlliyi görən kimi çaşıb qaldı, özü-özünə dedi: "Ey dili qafil, dünyada belə də gözəl varmış". Bunun üstən alıb sinə-sazın görək nə dedi:

Açılıb bağında lalə, nərgizlər,
Qönçəsin iyləyib, gülün dərərlər,
Alıb onu ipək üstə sərəllər,
Gözəl qız, gəl mənə, mən alım səni.

Koroğlu belə deyəndə qızın gözləri xumarlandı, qıyqacı Koroğuya baxdı. Qız belə baxanda Koroğlu sözünə davam etdi:

Qurban olum qara gözün məstinə,
Nə durubsan bu canımın qəstinə,
Əlim vurum tər məmənin üstünə,
Gözəl qız, gəl mənə, mən alım səni.

Koroğlu der: gəzmə ahı-zarınan,
Gül-bülbülü oynatma sən xarınan,
Qonuşginən mənim təkin yarınan
Gözəl qız, gəl mənə, mən alım səni.

Koroğlu özünü nişan verən kimi qız Koroğlunu tanıdı. Bu da var ki, Cəlil paşanın qızı Dinməz xanım öz qardaşı oğlu Bəylərə nişanlı idi. Dinməz xanım həm də Koroğlunun Cəlil paşaynan arasının yoxluğunu eşitmişdi. Bunu da bilirdi ki, dəfələrnən Koroğlu Bəyləri özünə dəli aparmaq istəyib, amma gücü çatmayıb.

Dinməz xanım Koroğlunu görən kimi tanıyıb, bir sehr-cadu oxuyub, Koroğlunu saldı tilsimə, əl-ayağını bağlayıb, tez atasına xəbər göndərdi ki, bəs durmasın gəlsin.

Cəlil paşa adam göndərib, Koroğlunu tutub saldırdı zindana.

Koroğlu zindanda qalmaqda olsun, al xəbəri Dəli Həsənnən.

Dəli Həsən gecə-gündüz yatmayıb Koroğlunun yolunu gözləyirdi, bir də gördü ki, xəncərin ucundan qan damır, tez dəliləri çağırıb dedi:

– Amandı, dəlilər, Koroğlu zindandadı, gərək tez dadına yetişək.

Dəlilər heç biri yerindən tərpənməyəndə, Dəli Həsən bir də səsləndi.

Bu belə deyəndə Eyvaz dedi:

– Haçana kimi biz Koroğlunu ölümdən qurtaraq, canı çıxsın tək getməsin.

Eyvaz belə deyəndə Dəli Həsən Ərəbatı minib, bina qoydu yol getməyə. Neçə mənzil yol gedib, gəlib çatdı bir şəhərin kənarına, gördü bir qarı yerdən çöp yığır.

Dəli Həsən xəbər aldı:

– Qarı nənə yerdən yığdığın nədi?

Qarı dedi:

– Qadovu alsın qarı, çör-çöp yığıram.

Dəli Həsən dedi:

– Qarı nənə çör nədi, çöp nədi?

Qarı dedi:

– Çör yerə uzanan, çöp də dik dayanandı.

Dəli Həsən dedi:

– Qarı nənə nə oxuyursan?

Qarı dedi:

– Ay oğul, açıl başımnan.

Dəli Həsən dedi:

– Sən de, mən sənin dərdinə əlac eləyim.

Qarı:

– Ay oğul, Koroğlu deyilən bir nəfəri Cəlil paşa tutub salıb zindana. Sabah boynu vurulacaq, onunçun ah-zar edirəm.

Dəli Həsən bunu eşidən kimi:

– Nə dedin, qarı nənə? O zindanı mənə göstər.

Qarı zindanı Dəli Həsənə göstərdi. Dəli Həsən zindana tərəf getməkdə olsun, sənə Koroğludan deyim.

Koroğlu zindanda oturub dəlilərinin yolunu gözləyir, ah-nalə içində onları harayına çağırırdı. Dəli Həsən də bu tərəfdən gəlib çatdı zindana. Zindanın dal tərəfindən dama çıxıb, Koroğlunu görmək istədi. Gördü Koroğlu sazı əlinə alıb dəlilərini haraya çağırmaqdadı.

Dəli Həsən dinməyib Koroğlunun sözlərinə qulaq asmaqda olsun, görək Koroğlu nə dedi:

Koroğluyam, salınmışam zindana,
Bütün dəlilərim yanımda gərək.
Sorağım düşübdü bu gün hər yana,
Bütün dəlilərim yanımda gərək.

Gömgöy çəmənlərdə otlayır quzu,
Qara zindan qoymur görüm ulduzu.
Çağırram imdada iyid Murtuzu,
Dəmirçioğlu bu gün yanımda gərək.

Axıtdılar bəylər, xanlar qanımı,
Zindan üzgün etdi şirin canımı,
Apara bilmədim Dinməz xanımı,
Eyvaz balam bu gün yanımda gərək.

Koroğlu belə deyəndə Dəli Həsən dedi:

– Ey dad, ardıycan gələn mən, heç mənim adımı çəkmir.

Dəli Həsən acıq eyləyib getmək istəyirdi ki, Koroğlu sözünə davam etdi:

Mərd iyidlər, mərd olarlar davaya,
Mərdin başı düşər qala-qovğaya,
Xəbər çatsın Çənlidəki halaya,
Halaypozan qoçum, yanımda gərək.

Qıratıma daha yetə bilmədim,
Şirin canı ona qıya bilmədim,
Dinməz təki yara çata bilmədim,
Dəli Həsən bu gün yanımda gərək.

Koroğlu sözün tamam elədi.

Dəli Həsən atılıb damdan yerə düşdü. Özünü zindançının üstünə atıb onu öldürdü. Zindanın qapısını qırıb Koroğlunu zindandan çıxartdı.

Koroğlu zindandan çıxıb, tez özün yeritdi Dinməz xanıma. Dinməz xanım eyvanda dayanmışdı. Koroğlunu görən kimi bir cadu oxuyub onu saldı tilsimə.

Koroğlu baxıb gördü ki, yeriyə bilmir. Əl atıb sazına Dinməz xanıma dedi:

Uca dağların başında,
Ləpə-ləpə qar görünür,
Mənim bu sınıq könlümə,
Qara gözlü yar görünür.

Dinməz xanım heç dillənməz,
Tamam tarı-mar görünür,
Pəri, sənnən heç əylənməz
Dünya başa dar görünür.

Uca-uca qarlı dağlar,
Könlüm intizar görünür.
Açılmaz heç güllü bağlar,
Dinməz xanım xar görünür.

Dəli Həsən baxıb gördü ki, Koroğlu canından ötrü yalvarır. Öz-özünə dedi: "İyit də bir qaşıq qannan ötrü yalvararmı?"

Koroğlu dedi:

Uca-uca dağ başından,
Yenib gəldim, gözəl yarım.
Vurulmuşam yay qaşından
Əsib gəldim, gözəl yarım!

Qara qaşın yaydı sənin,
Gül camalın aydı sənin,
İşin ahnan vaydı sənin,
Əsir düşdüm, gözəl yarım!

Koroğlu yarı dinməzdi,
Dinməz xanım lap dinməzdi,
Yarım gülüb danışmazdı,
Əsir düşdüm, gözəl yarım.

Dinməz xanım işi belə görəndə, Koroğlunu tilsimnən çıxartdı. Bu tərəfdən də Dəli Həsən Dinməz xanımı götürüb qaçdı.

İndi sənə xəbəri Bəylərdən verim.

Bəylərə xəbər getdi ki, Koroğlu Dinməz xanımı götürüb qaçdı. Bəylər qılınc bağlayıb, yüyürüb çatdı Koroğluya.

Koroğlu gördü Bəylər gəlir, tez sarı kürkünü çəkib əyninə, uzun bığlarını sallayıb, üz-gözünü torpağa sürtdü, belini qoz eləyib oturdu yerdə.

Bəylər gəlib çatdı Koroğlunun yanına, onu tanımadı. Bəylər keçib getmək istəyirdi ki, Koroğlu özünü silkələyib bir nərə çəkdi, Bəylər nərəni eşidən kimi dala baxdı. Bəylər gördü ki, bu, Koroğlu deyil, yenə getdi. Bir neçə qədəm getmişdi, Koroğlu yenə bir nərə çəkdi. Bəylər dala dönüb yapışdı Koroğludan, istədi onun başını kəsə, Koroğlu aldı, görək nə dedi:

İstəyirsən sən alasan canımı,
Bəylər bəyi, qoç Koroğlu deyiləm,
Keçib gedən gördüm Dinməz xanımı,
Bəylər bəyi, qoç Koroğlu deyiləm.

Bəylər dedi:

– Koroğlusan. Kəsəcəyəm başını.

Koroğlu dedi:

– İzn ver, birin də deyim.

Koroğlu:

Salmaginən bu işi gəl əngələ,
Bəylər bəyi, qoç Koroğlu deyiləm,
Nə çıxıbsan mənlə qılınc-xəncələ,
Bəylər bəyi, qoç Koroğlu deyiləm.

Adam odu, şirin dilnən dindirən,
Bəylər bəyi, qoç Koroğlu deyiləm,
Gəl sən olma mən yazığı öldürən,
Bəylər bəyir, qoç Koroğlu deyiləm.

Bəylər Koroğlunu buraxdı. Koroğlu qaçıb çıxdı bir dağın başına. Tez soyunub paltarını dəyişdi. Elə bir nərə çəkdi ki, Bəylər qorxub geri döndü, gördü ki, Koroğludu.

Koroğlu Bəylərə dedi:
– Bəylər, gəl mənə dəli ol, Dinməz xanımı sənə verim.
Bəylər dedi:
– Olmaram. Gəl döyüşək.
Belə deyəndə Koroğlu sazı alıb, görək Bəylərə necə hərbə-zorba gəldi.

Koroğluyam, heç vaxt qorxmaram hərbdən,
Hərifsənsə əgər, bu meydana gəl.
Əvvəl xəncəlnən, sora cənginən,
Hərifsənsə əgər, bu meydana gəl.

Aldı Bəylər:

Nə çıxıban ucalarda durmusan,
İyidsənsə enib bu meydana gəl.
Yazıq-yazıq sən boynunu burubsan,
İyidsənsə enib bu meydana gəl.

Koroğlu:

Dov edibən neçələrin dindirrəm,
Düşmənləri şad eliyib güldürrəm,
Enib para-para səni öldürrəm,
Hərifsənsə əgər, bu meydana gəl.

Aldı Bəylər:

Arzu-kamı qoyma şirin canımda,
Öldürməyə cuş eləyib qanımda
Dəlilərin yığılıb durub yanımda,
Hərif isən durub tək meydana gəl!

Koroğlu:

Bəylər bəyi, mənə dəli olginən,
Dinməz xanım yenə qoy sənin olsun.
Qəbul elə mənə dəli olginən,
Toy eləyim Dinməz qoy sənin olsun.

Bilirsənmi qoç Koroğlu zorunnan,
Azmaginən haqqın doğru yolunnan,
Müjdə verim sənə dinməz toyunnan,
Sən dəli ol, Dinməz qoy sənin olsun.

Koroğlu der qismət haqqı yazımdı
Tozlu meydan, taci-taxtım, tacımdı,
Bunu bil ki, Dinməz mənim bacımdı,
Sən dəli ol, Dinməz qoy sənin olsun.

Koroğlu sözün tamamladı. Bəylər baxıb gördü ki, dəlilər də gəlib yetişdi, razı olmasa Dinməz xanım əlinnən çıxacaq. Əlacı kəsilib razı oldu.

Koroğlu Bəyləri qatdı dəlilərinə. Çənlibeldə yeddi gün, yeddi gecə toy elədi, Dinməz xanımı verdi Bəylərə.

# Koroğlunun Ballıca səfəri

Çənlibelin qarlı uca dağları, sıldırım qayaları ağ buludların bağrını deşirdi. Dağlar arasında yerləşən Çənlibel Koroğlunun məskəni idi. Yaz ağzı üstündən qar əksik olmayan təpələrin başında buludlar oynar, şimşəklər çaxar, göy guruldar, Çənlibel leysan yağışının altında öz daşlarını, yamaclarını yuyardı. Bir azca keçməmiş buludlar çəkilər, günəş çıxardı. Bircə saat bundan qabaq qucağında qara buludlar oynaşan Çənlibel dəyişib başqa bir aləm alardı. Uğuldaşıb biri-birisi ilə savaşan təpələr barışardı. Aralarında uzanan qarı nənə cecimi buraya başqa bir gözəllik verərdi. Kəkliklər qaqqıldaşar, bildirçinlər qıy vurar, bülbüllər Koroğlunun səsinə səs verərdi. Sıldırımların bağrından qaynayan bulaqların töküldüyü ətəklərdə gül-gülü, bülbül-bülbülü çağırar, ləpələr bənövşələrə göz vurardı. Bura Koroğlu qoruğu idi. Koroğlunun ipə-sapa yatmayan özü kimi dəli atları burada otlardılar.

Yaz ağzı idi. Koroğlu bir az rahatlansın deyə, Düratı da ilxıya qatdırmışdı. Dürat ilxıdakı xam dəli ayqırlarla çəçikləşir, vuruşur, yola getmirdi ki, getmirdi. Bir gün, beş gün axırda ayqırlar cana doyub, günlərin birində Düratnan küştüyə qalxdılar. Qıratdan başqa Düratın qabağına hansı at çıxa bilərdi ki! Dişi ilə onları qızıl al qana bulayıb ilxıynan bərabər qabağına qatdı. Dürat ilxını Çənlibeldən aşağı töküb qovlamağa başladı. İlxı dağlar aşdı, düzlər keçdi, yamaclar dırmaşdı, yenişlər yendi, axırda gəlib ballıcalı Qara xanın biçənəyinə doldu.

Qara xan Koroğlu ilə düşmən idi. Öz adamlarına tapşırmışdı ki, Koroğlunun atı, malı onun torpağına keçsə haylayıb damlasınlar. Qaraxanın adamları Koroğlunun ilxısını qoruqda görüb haylayıb apardılar. Koroğlu Çənlibeldə oturmuşdu. Bir də ilxıcı başı alovlu gəldi ki, bəs ilxı yoxdu.

Koroğlunun ilxısı itsin gör nə olar?.. Dəli Koroğlu coşdu, gözləri oynamağa başladı. Bir dəli nərə çəkdi. Bütün Çənlibel titrədi. Dağlar, daşlar, mağaralar səs-səsə verdi. Bütün dəlilər tökülüb gəldilər. Aldı Koroğlu görək nə dedi:

Hoydu dəlilərim, hoydu oğullar,
Hardasa Düratım tapılsın gərək!
Aman çəksin yağılarım əlimdən,
Müxənnət obası çapılsın gərək!

Durub mərd meydanda göstərrəm hünər,
Qənimlər nərəmdən elərlər həzər.
Qıraram, sağ-sola vuraram şeşpər,
Qoşun qayalara səpilsin gərək!

Qoç iyid yalıyar özü öz qanın,
Koroğlu, hər yana işlər fərmanın,
İndi bəy, paşanın, xotkarın, xanın
Dərisinə saman təpilsin gərək!

Dəlilərdən bir parası Koroğluya ürək verməyə, onu yoşutmağa başladılar ki, ay Koroğlu, çox fikir eləmə, atlar tapılar, itməz. Qorxudan kim sənin ilxına gözünün ucu ilə baxa bilər. Bir də ki, tapılmayanda da, qoy tapılmasın. Dünyada atmı yoxdu. Bəylərin, paşaların bütün atlarını gətirərik. Dürat itibsə, Qırat durur. Niyə bikef olursan?

Dəlilər Koroğluya nə qədər ürək verdilərsə də, Koroğluya əsər eləmədi. Acığından dodaqlarını gəmirib bığlarını çeynəyirdi.

Nigar xanım gördü Koroğlunun acığı soyuyan acıq deyil. Getdikcə şir kimi qızışır. Axırda qolunu boynuna doluyub dedi:

– Ay Koroğlu, hirslənəndə özündən çıxarsan. Acıqlanıb dodağını gəmirməkdən nə çıxar? Atları tapmaq lazımdı. İndi tədbirin nədi onu de. Nigarın sözlərindən sonra Koroğlu deyəsən bir az yumşaldı. Onun cavabında görək nə dedi:

İndi bir mərd dəli gərək,
Tapsın mənim Düratımı.
Alsın düşmanın əlindən,
Minib gəlsin kür atımı.

Kişnəyib meydanda gəzən,
Hərdən sağa-sola süzən,
Düşmanın başını üzən,
Bir əsrəmiş nər atımı.

Koroğluyam, yol güdərəm,
Düşman bağrını didərəm,
Atlanıb özüm gedərəm,
Çəkin mənim Qıratımı!

Koroğlu belə deyəndə Tanrıtanımaz irəli yeriyib dedi:

– Qoç Koroğlu, izin ver atları axtarmağa mən gedim.

Koroğlu Tanrıtanımaza izn verib dedi:

– Tək getmə, dəlilərdən yanına al.

Tanrıtanımaz beş dəliynən atlanıb ilxını axtarmağa getdi. Bütün Çənlibeli ayaqdan saldılar. Dağı, daşı bir-birinə vurdular. İlxıdan bir əsər tapmadılar ki, tapmadılar. Dünya Koroğlunun gözündə qaralırdı. Dəlilər hər nə qədər dəlil, nəsihət eləyirdilərsə, heç birisi qulağına girmirdi. Deyilən sözlərin heç birisini eşitmirdi. Nigar gördü yox, Koroğlu özünü, sözünü bilmir, dərd onu elə alıb ki, dünya gözündə deyil. Yenə də irəli yeriyib qolunu onun boynuna saldı. Koroğlu elə bildi ki, yuxudan ayıldı. Dönüb Nigara baxdı. Aldı görək nə dedi:

Nigar, Düratın itməyi,
Yandırır məni, yandırır.
Əməyim zaya getməyi,
Yandırır məni, yandırır.

Alnımdakı qalın qatlar,
Düşmən görsə bağrı çatlar,
Candan əziz yaxşı atlar,
Yandırır məni, yandırır.

Sinəmin düyünü, dağı,
Müxənnət meydan açmağı,
Koroğluya sataşmağı
Yandırır məni, yandırır.

Koroğlu burada qalsın, sənə kimdən deyim, Qara xanın nökərlərindən. Elə ki, Qara xan ilxını tutdu, başladı hər gün özündən deməyə ki, əyər Koroğlu məndən qorxmasaydı, atların dalıncan gələrdi. Bunun bu hərəkəti nökərlərə acıq gəldi. Axırda nökərlərdən birisi bu qərara gəldi ki, gedib əhvalatı Koroğluya xəbər versin. Nökər gecəynən çarıxlarını bərkidib, ağacını əlinə alıb, düşdü yolun ağına. Az getdi, çox getdi gəlib Çənlibelə yetişdi. Əhvalatı Koroğluya danışdı.

Koroğlu diqqətlə qulaq asdı. Elə ki, Qaraxanın nökəri bütün əhvalatı danışıb qurtardı, Koroğlu əmr elədi, onun qollarını bağlayıb üstünə də gözətçi qoydular ki, qaçmasın.

Nökər mat-məhəttəl qalmışdı ki, onun əllərini niyə bağlayırlar.

Tanrıtanımaz nökəri belə görəndə onun qulağına dedi:

– Özünü itirmə. Bu dəli Koroğlunun xasiyyətidi. Ta o gedib gələnəcən sən burada qalacaqsan. Əyər sözlərin düz çıxdı, ürəyini sıxma,

sənə elə bir əvəz verəcək ki, qiyamətəcən yadından çıxmayacaq. Yox əgər yalan oldu, onda tay özün bil gör nə olar.

Koroğlu çoxdan idi səfərə çıxmamışdı. Qırat tövlədə yernən-göynən əlləşir, Misri qılınc hökm eləyirdi ki, qınını parçalasın. Koroğlu bir nərə çəkib sazı döşünə basdı, görək nə dedi:

At belində mərd dəlilər,
Ballıcaya səfərim var!
Dava günü qurd dəlilər,
Ballıcaya səfərim var!

Hünər elər qoç oğlu qoç,
Qorxar, keçməz yanınnan köç.
Alın ələ Misri qılınc,
Ballıcaya səfərim var!

Hədyan sözə bəli deməm,
Müxənnət malını yeməm,
Qoy düşman bilsin mən kiməm,
Ballıcaya səfərim var!

Şeşpərim susayar qana,
Düşmannarım gələr cana,
Qan uddurram Qara xana,
Ballıcaya səfərim var!

Koroğluyam, budu sözüm,
Müşkül işə necə dözüm,
Heç qovğadan doymaz gözüm,
Ballıcaya səfərim var!

Koroğlu quş kimi tullanıb Qıratın belinə mindi. At bir dəfə fınxırıb, iki dal ayaqları üstə qalxıb, dəstənin qabağına düşdü. Dəstə Ballıcaya üz qoydu. Dağları, daşları düz elədilər. İldırım kimi at sürüb bir gecədə Ballıcaya çatdılar. Koroğlu dəliləri şəhərin kənarında qoyub, özü ilxıcı paltarı geyinib, altdan Misri qılınc bağladı. Şəhərə girdi. Gəzə-gəzə, dolana-dolana, axırda gəlib Qara xanın yanına yetişdi.

Qara xan bir də başını qaldırıb gördü ki, qabağında bir oğlan dayanıb, elə bir Rüstəm Zaldı. Amma paltarından deyəsən ilxıçıya oxşayır. Bir diqqətlə onu ayaqdan başa süzüb soruşdu:

– Söylə görüm kimsən? Haradan gəlmisən?

Koroğlu dedi:

– Mən Koroğlunun ilxıçısıyam, Çənlibeldən gəlirəm.

Qara xan dedi:

– Elə bazburutundan oxşayırsan, səni özümə ilxıçı eləyərəm. Koroğlunun ilxısını gətirmişəm, onları otararsan.

Koroğlu gördü nökər doğru deyirmiş. Ancaq heç bir söz deməyib gözlədi. Qara xan bığlarını burub dedi:

– De görüm Koroğlu ilə mən necəyəm? Omu iyiddi, yoxsa mən?

Qara xanın cavabında aldı Koroğlu görək nə dedi:

Meydana girəndə pələng pəncəli,
Dağıdar elini gəlsə, Qara xan!
Qıratın üstündə qılınc oynadar,
Lal elər dilini gəlsə, Qara xan!..

Mənəm deyib yekə danışma belə,
Görməmisən zərbi dəstini hələ,
Qaldırar başına, qırar gürz ilə
Yəqin bil belini, gəlsə, Qara xan!..

Talar dövlətini, alar malını,
Dağıdar pulunu, yaşıl, alını,
Yıxar evin, yaman elər halını
Sovdurar külünü gəlsə, Qara xan!..

Çətin qoç Koroğlu qorxa, üşünə,
Yetər yağıların yeddi, beşinə,
Hayqıranda qatar Qırat döşünə,
Bağlayar qolunu gəlsə, Qara xan!..

Koroğlunun bu sözündən Qara xanın acığı tutdu, dedi:

– Sənə dedim məni təriflə, səni özümə ilxıçılığa götürüm, daha demədim ki, Koroğlunu mənim üstümə çək.

Qara xan Koroğlunun belə diri danışmağından qorxuya düşmüşdü. Fikirləşdi aşna, bu elə ölləm, öldürrəmdən deyir. İlxıçı belə olmaz. Bu yəqin ya Koroğlu özüdü, ya da ki, onun dəlilərindən biridi. Qara xan havanı bulud görüb əkilmək istədi.

Koroğlu aman verməyib onu yaxaladı. İlxıçı paltarını soyunub kənara atdı. Bir nərə çəkdi ki, Qara xanın qulaqları batdı. Qara xan işi belə

görüb adamları köməyə çağırdı. O tərəfdən də dəlilər Koroğlunun nərəsini eşidib siyirmə qılınc hər yandan töküldülər. Ara qarışdı. Dava başladı. Davanın şirin yerində Koroğlu özünü Qara xana yetirdi. Misri qılınc havada parıldayıb, ildırım yerə soxulan kimi Qara xanın təpəsində gözdən itdi. Qara xanın adamları xanlarını ölmüş görüb davam gətirə bilmədi. Qırılan qırıldı, qalan qaçdı, dağıldı. Dəlilər qiymətdən ağır, vəzndən yüngül şeylərini götürdülər. Düratla bərabər ilxını da qabaqlarına qatıb Çənlibelə yola düşdülər. Dağı aşıb, düzü keçib gəldilər Çənlibelə çatdılar. Nigar xanım qabağa çıxıb, Qıratın başını tutdu. Koroğlu atdan düşdü. Tez əmr elədi Qara xanın nökərini gətirdilər. Ona bir at, bir də bir qılınc bağışlayıb, dəlilərin içinə qatdı.

Məclis quruldu, keyflər duruldu. Saqi dolandı, ruh təzələndi. Nigar əlində badə Koroğlunun yanına gəldi, dedi:

– Ay Koroğlu, bilirəm sən səfərdən davasız-şavasız qayıtmazsan. De görüm Ballıca səfərin necə keçdi? Kimlə qabaqlaşdın. Kimlə dalaşdın.

Koroğlu badəni alıb içdi, üçtelli sazını döşünə basıb dedi:

Nə süzürsən ala gözü,
Sana deyim, telli Nigar.
Məclisimin şirin sözü,
Sana deyim, telli Nigar.

Ballıcada açdım meydan,
Müxənnət dilədi aman,
Qabağımdan qaçdı düşman
Yana deyim, telli Nigar.

Qoç dəlilərim dalaşda,
Ər ürəkləri talaşda,
Çəkdim qılınc tər savaşda
Xana, deyim, telli Nigar.

Nərəm davada, qızmış nər,
Dünyaya göstərdim hünər,
Boyandı əlimdə şeşpər,
Qana, deyim, telli Nigar.

Müxənnətin üzü gülməz,
Namərd dostun qədrin bilməz,
Koroğlu hünəri gəlməz
Sana deyim, telli Nigar.

# Koroğlunun Dərbənd səfəri

Dəmirqapı Dərbənddə bir Ərəb paşa var idi. Ərəb paşanın Möminə adlı bir gözəl qızı var idi. Möminə xanım Koroğlunun adını, iyidlik tərifini eşitmişdisə də, ancaq üzünü görməmişdi. Deyirdi görəsən bu paşaları, bəyləri zara gətirən, karvanlar vuran, tacirlər soyan Koroğlu necə iyiddi? Möminə xanım görməzə-bilməzə Koroğluya aşıq olmuşdu. Möminə xanım bir gün Koroğluya belə bir namə yazdı:

Başına döndüyüm ay qoç Koroğlu,
Əyər iyid isən gəl apar məni.
Həsrətindən yoxdu səbrim, qərarım,
İncidir sərasər ahı-zar məni.

Çənlibel üstündə əsrəmiş nərsən,
Düşmən qabağında dayanan ərsən,
Tamam dəlilərə iyit sərkərsən,
Axtarsan, taparsan düz ilqar məni.

Dəmirqapı Dərbənd əcəb tamaşa,
Batıb gözəlləri ala, qumaşa,
Adım Möminədi, atam Ərəb paşa,
İstərəm, özünə elə yar məni.

Möminə xanım naməni tamam elədi. Atasının İsa adlı bir nökəri var idi. Qarabaşını göndərib nökər İsanı yanına çağırtdı. Naməni nökərə verdi, dedi:

– Bu naməni apar, Çənlibeldə qoç Koroğluya ver.

İsa naməni götürüb yola düşdü. Gecə-gündüzə salıb özünü Çənlibelə yetirdi. Möminənin naməsini Koroğluya verdi, qayıtdı.

Koroğlu namənin məzmunundan halı oldu. O saat Qıratı yəhərlətdi. Dəlilər, xanımlar dedilər:

– Ay Koroğlu, haraya səfərin var?

Koroğlu dedi:

– Dəmirqapı Dərbənddə Ərəb paşanın qızı Möminə xanım boynuma deyin salıb, gərək gedəm onu gətirəm.

Dəlilər dedilər, onda qoy biz də sənlə gedək. Koroğlu razı olmadı. Özü tək atlanıb Dəmirqapı Dərbəndə yola düşdü. Hər yerdən keçib gəldi Dərbəndə çatdı. Koroğlu Qırat da yedəyində bazarda gəzinirdi.

Camaat ona, atına baxıb mat qaldılar. Ərəb paşaya xəbər apardılar ki, Dərbəndə bir adam gəlib, nə özü bizim yerin adamlarına bənzəyir, nə atı bizim atlara. Ərəb paşa Koroğlunu yanına çağırtdırdı. Ərəb paşa Koroğlunu görməmişdi, onu tanımırdı, ancaq adını eşitmişdi. Koroğluya dedi:

– Haralısan, nəçisən?

Koroğlu dedi:

– Mən aşıqam, izin olsa sazla deyərəm.

Aldı Koroğlu:

Ərəb paşa, sənə bir ərz eləyim,
Yerim xəbər alsan, Muradbəyliyəm.
Yağı düşmən mənnən qovğa başlasa,
Əyri qılınc əldə düşmən qovlaram.

Bağ bəsləyib qızıl gülün dərməsən,
Dərib, dərib yaylaq üstə sərməsən,
Mətləbə gəlmişəm, mətləb verməsən
Sığal verib Misri qılınc tovlaram.

Çənlibeldən bu diyara gəlmişəm,
Yazdığınız o ilqara gəlmişəm.
Koroğluyam, nazlı yara gəlmişəm,
Gərək gözəlləri seçib boylayam.

Söz tamam oldu. Ərəb paşa Koroğlunu tanıdı, nə mətləbə gəldiyini də bildi. Vəzirini yanına çağırdı, dedi:

– Vəzir, Koroğlu qızım Mömінəni istəyir, bu barədə fikrin nədi?

Vəzir dedi:

– Paşa sağ olsun, Çənlibeldən buraya gəlib, gərək verəsən, verməsən zorla aparıb hamımızı da qırar. Bir qızdan ötəri bu qədər qana bais olmaq, mahalı talatmaq olmaz. Yaxşısı budu ki, qızını ver, özünü də qoşuna sərkərdə elə.

Ərəb paşa vəzirinin məsləhətinə razı oldu. Toy eləyib, qızı Mömінəni Koroğluya verdi. Koroğlu burada xeyli qalası oldu. Ərəb paşanın xahişinə görə döl üçün Qıratı ilxıya qatdılar. Qırat bir vaxt ilxının içində oldu. Ancaq ondan kəhərnişan bir madyan döl tutdu, balaya qaldı.

Bu tərəfdən Koroğlu bir müddət Mömінənin yanında qaldı. Günlərin bir günü Çənlibel, dəlilər yadına düşdü. Mömінəyə dedi:

– Mən gedirəm, Çənlibel yeyəsizdi, dəlilər yolumu gözləyir, al bu bazubəndi saxla, qızım olsa onnan dolanar, oğlum olsa qoluna bağla, gələr məni tapar.

Koroğlu bazubəndi Möminəyə verdi, onnan halallaşdı. Qıratı, gətirtdi, yəhərlədi mindi, Çənlibelə yola düşdü. Koroğlu çoxdan idi ki, dəlilərdən, xanımlardan ayrılmışdı, könlü onları çox istəyirdi. Qıratı yeldən yeyin, sudan iti sürürdü. Qırat dağları, dərələri aşdı, yolları, yamacları keçdi, Koroğlunu Çənlibelə yetirdi. Koroğlu dəlilərlə görüşdü, öpüşdü, hallarını soruşdu. Nigar xanım gördü Koroğlu boş gəlib, dedi:

– Ay Koroğlu, Möminəni niyə gətirmədin?

Aldı Koroğlu:

Canım Nigar, gözüm Nigar,
Ağlar qaldı yar, nə deyim?
Sənə qurban özüm Nigar,
Könlümdə ah-zar, nə deyim?

Ayrılanda candan oldum,
Mən dindən, imandan oldum.
Həm huri-qilmandan oldum,
Dünya mənə dar, nə deyim?

Koroğluyam məlul oldum,
Qürbət eldə zəlil oldum,
Möminəyə dəlil oldum,
Tərlan olmaz sar, nə deyim.

Bunlar burada qalsınlar, sənə Dərbənddə Möminədən xəbər verim. Doqquz ay, doqquz gün, doqquz saat tamam oldu. Möminənin Koroğludan bir oğlu dünyaya gəldi. Uşağın adını Həsən bəy qoydular. Həsən bəy böyüdü, on səkkiz yaşına çatdı. Oğlanın boyu buxunu, sür-süfəti, xoy-xasiyyəti eynən Koroğluya oxşayırdı. Gözləri oyur-oyur oynayırdı, heç dinc durmaqla işi yox idi. Bunu döyürdü, onu söyürdü, hamını əlindən zara gətirmişdi. Bu dinc durmamağının üstündə əllə-mayaq olduğu üçün hamı ona Kürdoğlu deyirdi. Ərəb paşa bir neçə dəfə onu yanına çağırıb öyüd, nəsihət verdi, başa gəlmədi. O yenə özü bildiyini elədi. Bir gün oynadığı yerdə sözü çəpləşdi, bir keçəli bərk döydü. Ağzının-burnunun qanını bir-birinə qatdı. Keçəl onun əlindən qurtarıb bir yana çəkildi, dedi:

– Mən sənə nə eləmişəm, məni niyə döyürsən, ay atasından xəbərsiz. Sənin atan yoxdu, kim bilir anan kimdən qazanıb.

Bu söz Kürdoğluna ox dəyən kimi dəydi, dağdan ağır gəldi. Kürdoğlu oradan birbaşa anasının yanına yüyürdü, dedi:

– Ana, mənim atam kimdi?

Möminə xanım Koroğlunun oğlu olduğunu demək istəmədi. Gözünün ağı-qarası bir oğlu idi. Yanından buraxmamaq üçün dedi:

– Oğul, sənin atan yoxdu.

Kürdoğlu dedi:

– Ana, de görüm, mənim atam kimdi? Doğrusunu deməsən səni də, özümü de öldürərəm.

Axırda Möminənin əlacı kəsilib dedi:

– Oğul, sənin atan xanlara, bəylərə qan udduran, Çənlibeldə oylağı olan sərkər qoç Koroğludu.

Kürdoğlu dedi:

– Bə indiyə kimi atam olmağını niyə məndən gizlətmişdin?

Möminə dedi:

– Qorxurdum gedib tapa bilməyəsən, düşmən əlinə düşəsən.

Kürdoğlu atasının yanına gedəsi oldu. Anasından rüsxət istədi. Anası əzəl istədi rüsxət verməsin, gördü durası deyil, gedəcək. Axırda əlacsız qalıb rüsxət verib dedi:

– Get babandan da rüsxət al.

Kürdoğlu oradan babasının yanına gəlib dedi:

– Baba, mənə rüsxət ver, Çənlibelə, atam Koroğlunun yanına gedirəm.

Ərəb paşa dedi:

– Oğul, sən hara, Çənlibel hara, gedib atanı tapa bilməzsən, paşalar, xanlar hamısı Koroğluya düşməndi, tutarlar səni öldürərlər. Getmə, qal, yaşım keçib qocalmışam, mənim yerimdə paşa ol.

Kürdoğlu razı olmadı. Ərəb paşa gördü ki, Kürdoğlu qalmayacaq. Axırda rüsxət verdi, dedi:

– Xəzinədən pul götür, ilxıdan özün bəyənən bir at tut, min elə get.

Kürdoğlu getdi xəzinədən pul götürdü, ilxının içinə gəldi, hansı atı tutdu mindi, davam gətirə bilməyib beli qırıldı. Qıratdan maya tutmuş kəhərnişan madyanın bir balası olmuşdu. Böyümüşdü, ilxının içində idi. O zamandan bu zamana heç kimə tutulmurdu. Kürdoğlu kəmənd atdı, həmin atı tutdu. Gətirdi güclə yəhəri belinə basıb mindi. Sürdü

Dərbənd bazarına çıxdı. Qılıncı yox idi. Fətəli adlı bir ustanın yanına gəldi. Atdan düşdü, qılınc istədi. Fətəli ona bir neçə qılınc göstərdi. Kürdoğlu qılıncları əlinə aldı, bir-bir basdı qırdı, o yana atdı. Usta gördü, bu heç hır-zır qanmır, dedi:

– Ay oğul, mən bir kasıb adamam, bir böyük külfəti bununla dolandırıram, niyə qılıncları qırdın, tökdün, mənim uşaxlarımı ac qoydun, bəs sən nə istəyirsən, sənə necə qılınc lazımdı?

Kürdoğlu əzəl çıxartdı qırdığı qılıncların pulun verdi, sonra üzünü ustaya tutub, görək nə dedi:

Canım usta, mənə bir qılınc qayır,
Nə uzun, nə gödək bir qərar ola.
Dəstəsi şirmayı, özü qoşa noy,
Vuranda ürəkdən xəbərdar ola.

Xorasan poladın yaxşısından seç,
Yaxşısı olmasa yamanından keç,
Hər nəyə vuranda dayanmaya heç,
Ya fil, ya kərkədən, ya da kəl ola.

İraqdı mənzilim, uzaqdı ara,
Suyu çox sərt ola, irəngi qara,
Yarı cılxa polad, yarı nalpara,
Qara əqrəb kimi zəhrimar ola.

Həsən bəy kamandar, ötürməz ovu,
Kimdi bu dünyada babamın babı?
Qayıtmaya ağzı, iti qılovu
Hər nəyə dəyəndə tarimar ola.

Usta mətləbi anladı. Kürdoğluna necə qılınc lazımdı bildi. O saat Xorasan poladının yaxşısından seçib bir qılınc qayırdı, dedi:

– Al, bu sən istəyən qılıncdı.

Kürdoğlu qılıncı götürdü, belinə bağladı, ustanın haqqını verdi. Atını mindi, Ərəb paşanın yanına gəldi, dedi:

– Baba, ilxıdan bu atı tutdum, xoşuna gəlirmi?

Ərəb paşa gördü Kürdoğlu tutduğu at Koroğlunun Qıratının balasıdı, dedi:

– Oğlu, çox yaxşı atdı, yaxşı yol.

Kürdoğlu babası ilə halallaşıb anasının yanına gəldi. Aldı görək nə dedi:

Canım ana, gözüm ana,
Rüsxət ver, mən gedər oldum.
Sənə qurban özüm ana,
Rüsxət ver, mən gedər oldum.

Möminə xanım:

Canım oğul, gözüm oğul,
Allaha tapşırdım səni.
Sənə qurban özüm, oğul,
Allaha tapşırdım səni.

Kürdoğlu:

Nəsihətlərin tutaram,
Qanın qanlara qataram,
Gedib atama çataram,
Rüsxət ver, mən gedər oldum.

Möminə xanım:

Koroğludu atan zatı,
Çənlibeldə var busatı,
Bazubənddi amanatı,
Allaha tapşırdım səni.

Kürdoğlu:

Şirin sözüm zülal elə,
Qara qaşın hilal elə,
Ana, südün halal elə,
Rüsxət ver, mən gedər oldum.

Möminə xanım:

Möminəyəm, sözüm zülal
Gözüm göyçək, qaşım hilal,
Südüm olsun sənə halal,
Allaha tapşırdım səni.

Sözləri tamama yetişdi. Möminə xanım Koroğlunun ona vermiş olduğu bazubəndi gətirib oğlunun qoluna bağladı, dedi:

– Yollarda olmaya-bilməyə deyəsən, mən Koroğlunun oğluyam. Atanın düşməni çoxdu, səni öldürərlər. Məni gözü yollarda qoyma.

Kürdoğlu anası ilə də halallaşıb Çənlibelə tərəf yol başladı. Kürdoğlu üç gün-üç gecə at sürüb gəldi Əhməd paşanın şəhərinə yetişdi. Əhməd paşanın adamları Kürdoğlunu görüb paşanın yanına apardılar.

Paşa Kürdoğlunun atına, özünə baxıb dedi:

– Nəçisən, hardan gəlib haraya gedirsən?

Aldı Kürdoğlu:

Əhməd paşa, mənim yolum
Dağıstandan gələr oldu.
Vardı qılınc vuran qolum,
Dərd bağrımı dələr oldu,

Qalxanım tutaram başa,
Əlimdən çəkərsən haşa,
Dağıstanda Ərəb paşa
Namərd mərdə gülər oldu.

Həsən bəyəm, gəlləm dilə,
Misir qılınc allam ələ,
Güzarımdı Çənlibelə,
Ərəb atım bilər oldu.

Söz tamama yetişdi. Əhməd paşa adamlarına dedi:

– Bu nə dilli-dilli danışır. Tutun, qoymayın getsin.

Paşanın adamları Kürdoğlunu tutmaq istədilər. Kürdoğlu qılıncını çəkib onların hərəsini bir yana qovaladı, atını sürüb aradan çıxdı, Çənlibelə tərəf üz qoydu. Bir dağın başında iki bəzirgana rast gəldi. Gördü bəzirganların yaxşı şeyləri var. Kürdoğlu bəzirganların nə ki, malları var idi, əllərindən aldı, özlərini boş yola saldı. Bəzirganlar qaçıb yaxındakı şəhərin paşası Cəfər paşaya şikayət elədilər. Cəfər paşa başında adamları atlandı. Kürdoğlunun qabağını kəsdi, dedi:

– Bəzirganları niyə soydun, kimsən, haraya gedirsən?

Aldı Kürdoğlu:

– Gəl sənə söyləyim, ay Cəfər paşa,
Yön çevirib Çənlibelə gedirəm.
Düşmənlər əlimdən çəkərlər haşa,
Yön çevirib Çənlibelə gedirəm.

At oynadıb Çənlibelə çataram,
Aslan kimi dərələrdə yataram,
Kəmənd atıb indi səni tutaram,
Yön çevirib Çənlibelə gedirəm.

Anamın yolunda qolu bağlıyam,
Atamdan ayrıyam sinə dağlıyam.
Adım Həsən, Koroğlunun oğluyam,
Yön çevirib Çənlibelə gedirəm.

Paşa hökm elədi, başındakı atlılar Kürdoğlunu tutsunlar. Atlılar Kürdoğluna hücum elədilər. Kürdoğlu əl qılınca eləyib atlılara cumuldu. Atlılar davam gətirə bilməyib hərəsi bir tərəfə qaçdı.

Kürdoğlu davadan əl çəkib yoluna davam elədi. İki gün, iki gecə at sürdü, yolda bir qocaya rast gəldi. Götürdü görək qocadan nə xəbər aldı:

– Qoca baba, mən dolanım başına,
Söylə Koroğludan mənə bir xəbər!
Görən Çənlibeldə qururmu dövran?
Söylə Koroğludan mənə bir xəbər!

Qəvvas kimi dəryalara dalaram,
Müxənnət yurduna talan salaram.
Yağı düşmənlərdən qısas alaram,
Söylə Koroğludan mənə bir xəbər!

Həsən bəy də iyid, cavan yaşında,
Öldürər namərdi mərd savaşında,
Çənlibeldə dəliləri başında,
Söylə Koroğludan mənə bir xəbər!

Söz tamam oldu. Qoca dedi:

– Oğul, Çənlibelə yaxınlaşıbsan, bir az at sürsən, yetişərsən.

Kürdoğlu oradan keçdi, atını sürüb yol getməyə başladı. Gün əyilən zaman gəldi Çənlibelə yetişdi. Kürdoğlu yol gəlib yorulmuşdu. Düşdü atını qoruğa buraxdı, özü də dirsəkləndi.

Dəlilərdən bir neçəsi, Eyvaz, Dəmiçrioğlu, İsabalı at belində məşq eləyirdilər. Qoruqda bir atlı adam gördülər. Eyvaz dedi:

– Siz burada durun, mən gedim, görüm o adam kimdi.

Eyvaz atını səyirdib Kürdoğlunun yanına gəldi, dedi:

– Ay adam, kimsən, nə hünərlə atını bu qoruğa buraxıbsan?

Kürdoğlu dinməz-söyləməz yerindən qalxdı. Çəkib Eyvazı atdan saldı. Qollarını bağladı, yerə yıxdı. Yoldaşları gözlədilər, gördülər Eyvaz gəlmədi, onun dalısınca Dəmirçioğlu gəldi, Eyvazı qolu bağlı görüb, Kürdoğluna hücum elədi. Kürdoğlu macal verməyib çəkdi, onu da atdan saldı, qollarını daldan bağladı, Eyvazın yanına uzandırdı. İsabalı gözlədi, gördü Eyvaz ilə Dəmirçioğlu qayıtmadılar. Bu dəfə o da atını səyirdib gəldi, yoldaşlarını qolu bağlı gördü. Kürdoğlunun üstünə yönəldi. Kürdoğlu onu da atdan saldı, qollarını bağladı. Eyvaz ilə Dəmirçioğlunun yanına yıxdı.

Dəlilər uzaqdan bunu gördülər, qaçıb Koroğlunun yanına getdilər, əhvalatı ona söylədilər. Koroğlu qılınc bağladı, qalxan asdı, əmud götürdü, Kürdoğlunun yanına gəldi. Dəlilər Koroğluya göz elədilər ki, olmaya-bilməyə əl qaldırarsan, adını deyəsən, özünü nişan verəsən. Hamımızı qırdırarsan. Koroğlu Kürdoğluna yaxınlaşıb dedi:

– Oğul, hardan gəlib hara gedirsən?

Kürdoğlu dedi:

– Dağıstandan gəlib Çənlibelə gedirəm.

Koroğlu dedi:

– Onda burda nə gəzirsən?

Kürdoğlu dedi:

– Bə, bura Çənlibel deyilmi?

Koroğlu dedi:

– Yox, bura Çənlibel deyil, buradan Çənlibelə bir mənzil yoldu.

Kürdoğlu elə bildi ki, yolda rast olduğu qoca ona yalan satıb alladıb, Çənlibeli düz nişan verməyib.

Aldı görək nə dedi:

Dağıstandan çıxdım bahar fəslində,
Gəzə-gəzə bu diyara yetişdim,
Bac vermədim, düşmənlərdən bac aldım,
Çoxun saldım ahı-zara, yetişdim.

Anamdan ayrıldım, mən gəldim belə
Düşmənin qanını döndərdim selə,
Gəzə-gəzə gəldim bu Çənlibelə.
Çəksələr də məni dara, yetişdim.

Həsən bəyəm, hər yaraya dözərəm,
Qılınc əldə, qalxan beldə gəzərəm,
Dəlilərin mən yan-yana düzərəm,
Sən olarsan günü qara, yetişdim.

Söz tamam oldu. Koroğlu gördü bu, xoşluqla dəliləri buraxmayacaq. Acıqlandı, Misri qılıncı çəkib Kürdoğluna hücum elədi. Kürdoğlu ilə vuruşdular. Qılıncdan murad hasil olmadı, əl əmuda atdılar. Əmuddan da bir kar aşmadı. Bir-birinin belinə əl atdılar, tutaşdılar, bir xeyli güləşdilər, yoruldular, bir-birilərinə zor eləyə bilmədilər, aralandılar, hərəsi bir yanda oturdu. Yorğunluqlarını aldılar. Qalxıb yenidən tutaşdılar. Kürdoğlu bu dəfə zor verib Koroğlunun dizlərini yerə gətirdi, bir də zor verib kürəyini yerə gətirdi, sinəsinə çöküb dedi:

– Söylə görüm, qoca, sən kimsən?

Koroğlu dedi:

– Başımı kəssən də əzəl sən kim olduğunu deməsən, mən kim olduğumu demərəm.

Kürdoğlu Koroğlunun sinəsindən qalxdı. Onu buraxıb dedi:

– Gəl, özünü boş yerə incitmə, kim olduğunu nişan ver.

Aldı Koroğlu görək nə dedi:

Koroğlu:

Neyləyirsən məndən ad xəbər alıb –
Düşmən qanın yerə calayan mənəm!
Qoşunlar talayıb, tüplər dağıdan,
Düşmanı üst-üstə qalayan mənəm!

Kürdoğlu:

Qeyzə gəlib hərdən nərə vuranda,
Dəlilər qol-qola bağlayan mənəm!
Qılınc çəkib mərd meydana varanda,
Sinələr çal-çarpaz dağlayan mənəm!

Koroğlu:

İyid olan heç ayrılmaz elindən,
Tərlan olan sona verməz gölündən.
Şahlar zara gəlib comərd əlindən
Leş-leşin üstünə qalayan mənəm!

Kürdoğlu:

Qaçırtdım qovğada meydandan paşa,
Qovub tacirləri doldurdum daşa,
Axırda əlimdən çəkərsən haşa,
Başı-baş üstünə tığlayan mənəm!

Koroğlu:

Koroğlu deyiləm, ona misalam,
Həm Rüstəmi-Zalam, həm də Salsalam,
Neçə xotkarları taxtından salan,
Qənimlər üstündə ulayan mənəm!

Kürdoğlu:

Həsən bəyəm, mərd meydanda qalaram,
Qənimlər başına qılınc çalaram,
Yağı düşmənlərdən qısas alaram,
Seçibən gövhəri saxlayan mənəm!

Söz tamam oldu. Bir də tutaşdılar. Yenə Kürdoğlu Koroğlunu yıxdı, dedi:

– Bu ikincidi, bir də yıxsam öldürəcəyəm.

Bunlar burada qalsınlar, sənə Nigar xanımdan xəbər verim. Dəlilərdən biri qaçıb Nigar xanıma xəbər apardı ki, bir atlı gəlib çıxıb Dəmirçioğlunu, Eyvazı, İsabalını tutub qollarını bağlayıb, Koroğlunu da iki dəfə yıxıb, bir də yıxsa öldürəcək.

Nigar xanım tələsik özünü oraya yetirdi. Gördü Koroğlu ilə Kürdoğlu üçüncü dəfədi tutaşıblar. Nigar nə qədər elədi onları bir-birindən aralasın, Koroğlu aralanmadı, dedi:

– Davanı tamam eləyək.

Koroğlu ilə Kürdoğlu xeyli güləşdilər. Axırda Koroğlu bir dəli nərə çəkdi, Kürdoğlunu götürdü yerə vurdu. Sinəsinə çökdü, Misri qılıncı çəkdi ki, başını kəssin. Nigar xanım qoymadı. İrəli yeriyib əlindən aldı. Koroğlu dedi:

– Oğul, səni öldürmədim buraxdım. Lənət şeytana de, özünü nişan ver.

Götürdü Kürdoğlu görək nə dedi:

Anadan olanda comərd olmuşam,
Şirin ləhcəliyəm xoş nişanlıyam.
Meydanda düşmənə qanlar ağladan
Biləyi qüvvətli, gözü qanlıyam.

Cavankən özümü çöllərə saldım,
Qəm məni çulğadı, dəryaya daldım,
Hər yerdə namərddən qisasım aldım,
Mərdlər arasında adlı, sanlıyam.

Bir dərd bilən yoxdu dərdim çağlıyam,
Dost yolunda mən də qolu bağlıyam,
Həsən bəyəm, Koroğlunun oğluyam,
Yerim xəbər alsan Dağıstanlıyam.

Söz tamam oldu. Koroğlu dedi:

– Yalan söyləyirsən, məni aldatmaq istəyirsən, sən Koroğlunun oğlusansa, qolunda bazubənd olmalıdı.

Kürdoğlu qolundakı bazubəndi açdı, Koroğluya göstərdi. Koroğlu gördü özü verdiyi bazubənddi. Aldı görək nə dedi:

Başına mən dönüm, gül üzlü oğul,
Koroğlu deyilən iyid mənəm, mən!
Dəli paşaları taxtından salan,
Koroğlu deyilən iyid mənəm, mən!

Müxənnət olubdu qabağımda xar,
Xotkara yurdunu eyləmişəm dar,
Söylə Möminədən nə xəbərin var?
Koroğlu deyilən iyid mənəm, mən!

Sədafərin qaynağına, coşuna,
Yağı düşmən gələ bilməz tuşuna,
Koroğluyam, oğul, dönüm başına
Koroğlu deyilən iyid mənəm, mən!

Söz tamam oldu. Ata-oğul bir-birlərini tanıdılar. Qucaqlaşdılar, görüşüb öpüşdülər. Dəlilərin qollarını açıb Çənlibelə gəldilər. Çənlibeldə gün keçirməyə, ömür sürməyə başladılar.

# Zərnişan xanımın Çənlibelə gəlməyi

Bəli, ustad dili mübarək olar. İndi sizə hardan xəbər verim, kimdən xəbər verim, Çardaxlı Çənlibeldə Qoç Koroğludan. Koroğlunun kefi kök, damağı çağ idi. Oğulları Eyvazla Həsən sağ-solunda qoluna qüvvət, dizinə taqət, gözünə işıq idi. Həsən Dağıstandan gələndən sonra elə bil Çənlibelin ziynəti birə-beş artmışdı. Həsən məşqləri ən çox Dəmirçioğlu ilə edirdi. Həsənin at minməsi, yəhərdə şahin kimi oturması, nizə oynatması, qalxan tutması, qılınc vurması, güşt tutması, toppuz endirməsi Koroğlunu qürrələndirirdi. Koroğlu Nigar xanımla məşqə baxırdı.

Məşqdən sonra Eyvazla Həsən Nigar xanımın yanına gəldilər. Əvvəl-əvvəl analarına baş əydilər, sonra atalarının qarşısında əmrə müntəzir dayandılar. Koroğlu arif adam idi. Dərhal işi başa düşdü, Nigar xanımın üzünə baxdı. Nigar xanım Koroğlunun qəm dəryasına qərq olduğunu görüb, gözünü ətrafına gəzdirdi. Cəmi Çənlibel dəliləri onları elə qomarlamışdı ki, elə bil hamı Nigar xanımdan bir "hə" cavabı gözləyirdi. Nigar xanım əlini-əlinə vurdu. Dəlilərin nərəsindən yer-göy lərzəyə düşdü. Çənlibeldə bir məclis quruldu ki, ruzigarın gözü hələ belə şadyanalıq görməmişdi. Piyalələr abı-kövsərlə doldu. Eyvazla Həsən nuş etdilər. Dəli Mehtər Düratı, Ərəbatı meydana gətirdi. Eyvazla Həsən altdan geyinib üstdən, üstdən geyinib altdan qıfıllandılar. Eyvaz Dürün, Həsən Ərəbatın qantarğasını bərkitdi. Bir göz qırpımında ayaqlarını üzəngiyə qoyub, qırğı kimi yəhərə əyləşdilər. Məclisin dövrəsində gərdiş edib, Koroğlu ilə Nigar xanımdan halallıq dilədilər. Nigar xanım oğullarının səfərinə bir söz deməsə də, yaz buludu kimi dolmuşdu. İrəli yeridi, halallıq edib, izindi – dedi. Düratla Ərəbat Nigar xanımın sözünə bənd imiş kimi şahə qalxdılar, Dağıstana yön aldılar.

Ustadlar dili yüyrək olar, demişlər. Səfərin üçüncü günü şənlik çıraqlarını öləzidən vaxtında cüt qardaşlar Ağqayanın qartalı kimi Dəmirqapı Dərbənddə Ərəb paşanın həyətində atdan endilər. Möminə xanımın oğlu Həsən gedəndən sonra gözlərinin qorasını o qədər sıxmışdı ki, canında can, dizində taqət qalmamışdı. Saralıb sapa, incəlib ipə dönmüşdü. İynənin gözündən saplanardı. Zil qaranlıqda oğlunun səsini tanısa da, həyətdə dayananlardan hansının oğlu olduğunu anşıra bilmədi. Eyvazı bağrına basıb duz kimi yaladı. Dedi:

– Doqquz ay, doqquz gün, doqquz saat, doqquz saniyə əzab əziyyətini çəkdiyim, yüyürüyünün başını kəsdiyim dirəyim-diləyim oğul, adam da anasını gözü yaşlı qoyarmı? Sən gedəndən sonra ixtiyar babanı atanın düşmənləri öldürdülər. Gözlərim səni axtardı, oğul-oğul deməkdən dilim düyün bağladı.

Eyvazla Həsən Möminə xanımın qoluna girib içəri keçdilər. Möminə xanım oğlunu çırağın işığında tanıdı. Ana-bala yaz sarmaşığı kimi bir müddət bir-birinə sarışdı. Göz gərək idi, bu səhnəni oxşayıb tamaşa edəydi.

Gecədən xeyli keçəndən sonra Eyvaz mətləbin üstünə gəldi. Dedi:

– Anacan, ata-anamız səni Çənlibeldə cəmi dəlilərin, xanımların ağbirçəyi görmək istəyir. Özün üçün nə əzizdi xəzinədən götür, ixtiyarındadı.

Söhbət uzandı. Eyvaz durub Düratla Ərəbatı yemlədi. Dan yeri sökülləndə Eyvazla Həsən yataqlarına uzandılar. O yatan üç gün, üç gecə yatdılar. Ayılanda gördülər ki, Möminə xanım elə dəyişib, göz istəyir tamaşa etsin. Bu üç gündə elə bil Möminə xanımın bütün gəncliyini özünə qaytarmışdılar. Rəngi yalaf-yalaf yanır, ay xəcalətindən üzünü bürümüş, gün utandığından buludların arxasına keçmişdi. Zərbaftalı qırçın don Möminə xanıma elə yaraşırdı ki, elə bil cəmi hurilər onun qarşısında hesaba duracaqdı. Eyvazla Həsən toqqanın altını bərkitdilər. Eyvaz dedi:

– Anacan, yolçu yolda gərəkdi. Vədə naxələflik igidə qəbahətdi.

Möminə xanım çəkidə yüngül, vəzndə ağır xəzinədə nə varsa yükünü tutub, qəflə-qatıra yük vurdurdu.

Mal sağını vaxtı qəflə-qatır Ərəb paşanın mənzilindən qalxdı. Həsən uşaqlıq dostu, Dəmirqapı Dərbənddə igidlikdə, səxavətdə ad qazanan yəhər ustası Fətəlini çağırtdı. Dəmirqapı Dərbəndin xanlığını ona həvalə edib, camaatın dolanışığını ona tapşırdı.

Qəflə-qatır Çənlibelə yön aldı. Az getdilər, alçaqlı, ucalı dağlar aşdılar, bir neçə gündən sonra onlar Yağı qoruğuna çatanda gün bir sicim boyu qalxmışdı. Dəlilər Möminə xanımın pişvazına Yağı qoruğunda durdular. Çənlibelə çatanda Möminə xanım gözlərinə inanmadı. Hər yerdə dəlilər, xanımlar qayır-qayır qaynaşırdı. Möminə xanımı hərə bir cür təsəvvür edirdi.

Möminə xanım atdan enəndə qəddi-qaməti, sürahi boyu, məğrur yerişi elə bil Çənlibelə yeni bir ziynət verdi. Çənlibel xanımları

Möminə xanımın gözəlliyindən xəcalət təri tökdülər. Cəmi dəlilərin anası Nigar xanım belə Möminə xanımın gözəlliyindən pozuldu. Ala gözləri ixtiyarsız piyalə kimi doldu. Nigar xanımın yaz buludu kimi dolduğunu görən Koroğlu telli sazın bəmini bəm, zilini zil kökləyib bağrına basıb aldı görək nə dedi:

Gəl sənə söyləyim, ay xotkar qızı,
Ağlama, Nigarım, o da yarımdı.
Dediyin sözlərin çıxdımı yaddan?
Ağlama, Nigarım, o da yarımdı.

İrəli gəl tut əlinlə əlini,
Bülbül olan axtarmazmı gülünü?
Məndən ötrü tərk eylədi elini,
Ağlama, Nigarım, o da yarımdı.

Yaxşı bax sən Koroğlunun zatına,
Qılınc qalxanına, polad qatına,
Bir Eyvaz eşqinə, Həsən xatrına,
Ağlama, Nigarım, o da yarımdı.

Söz tamama yetişdi, Nigar xanım irəli yeridi. Möminə xanıma xoş gəldin deyib, məclisdə Koroğlunun sol tərəfində əyləşdirdi. Möminə xanımın gəlişi şərəfinə Çənlibeldə bir kef məclisi düzəldi ki, indiyə qədər düzələn məclislərin şahı sayıldı. Dəlilər gecədən xeyli keçənədək yedilər, içdilər, keflər duruldu, damaqlar çağ oldu.

Deyirlər, belə şən-şux məclislərdən sonra Koroğlu heç kəsin cürət edib qapısını açmadığı qırxıncı otağa gedərmiş. Bir saat orda tək-tənha oturduqdan sonra çıxarmış. Bu dəfə də Koroğlu həmin otağa girdi. Bir saatdan sonra otaqdan çıxanda Həsən gördü ki, Koroğlu elə haldadı, elə haldadı bıçaq vursan qanı çıxmaz. Gözlər qan çanağı kimi qıp-qırmızı. Həsən çox götür-qoy etdi, heç nə başa düşmədi. O gündən sonra Həsən atasını gözdən qoymadı. Gördü ki, atası son günlərdə həmin otağa tez-tez gedir. Hər dəfə də pəjmürdə halda, gözləri nəmli otaqdan çıxır. Koroğlu bir dəfə də otağa girəndə, Həsən də astaca onun arxasınca içəri girdi. Həsən baxdı ki, atası balaca bir sandıqça açdı, oradan bir qız əksi çıxartdı, bir saat üzünə tamaşa etdi, sonra əksi yenidən yerinə qoymaq istədikdə, Həsən atasının biləyindən yapışdı. Həsən atasının əlindəki qızın əksinə baxdı. Qız nə qız, ay parçası. Elə

bil ki, Allahtala xoş günündə, xoş saatında, xoş dəqiqəsində qələmini bu qızın hüsnünə çəkib. Bir baxan deyir, qoy bir də baxım. Həsənin köhnə yarası qövr elədi. Yadına Əhməd xanın qızı Mehri xanım düşdü. Axı, Mehri də bir qız idi, gözəllikdə bütün hurilər onun sanında durardı. Mehrinin qəddi-qaməti, sürahi boyu, durna kimi can alan ala gözləri, alma kimi qırmızı yanaqları, yüz min işvə ilə yerişi, ceyran kimi məğrur duruşu gözləri önündə canlandı. Mehri xanımın Həsənlə ayrılığından sonra çox xiffət çəkməsi, Həsənin atasından icazə alıb, Əhməd xanın yanına qayıdarkən, qapıdan qalxan cənazəni görməsi, Həsənin yaxa yırtıb, üz cırması, ağ gününün göy əskiyə düyülməsi ürəyinin başını yandırdı. Ürəyi kövrəldi. Gözləri yaz buludu kimi doldu. Atasının halına acıdı.

Dedi:

– Atayi mehriban! Söylə, bu kimdi? Nə üçün hər dəfə bu otağa girib o qızın əksinə baxdıqdan sonra ağlayırsan? Məgər mən ölmüşəm ki, qoç Koroğlu xiffət çəksin? Ya bu sirri mənə açmalısan, ya da anamı da götürüb bu saat Çənlibeli tərk edəcəyəm.

Koroğlu dedi:

– Oğul, gəl daşı ətəyindən tök. Bunu bilməsən yaxşıdı. Elə şeylər var ki, adama dəm gətirər, elə şeylər də var ki, qəm. Bu əksin gətirdiyi dəm deyil, qəmdi. Mən isə səni qəmli yox, dəmli görmək istəyirəm.

Həsən dedi:

– Babacan! Dəm də, qəm də ekizdi. Oğlun başı ya dəmdə, ya qəmdə gərək. Sən onun yerini, yurdunu de, dalısınnan işin yoxdu.

Koroğlu çox dedi, Həsən az eşitdi. Qırsaqqız olub babasının yaxasından yapışdı. Koroğlu gördü Həsən zəli kimi yapışdığından qopan deyil, əl uzadıb divardan Bulğurlu sazını götürdü. Bəmini bəm, zilini zil köklədi. Üzünü oğluna tutub götürdü görək nə dedi:

Başına döndüyüm, gül üzlü oğul,  
Qan ağlar, qan ağlar didələrimiz.  
Yeddi ildi həsrətini çəkirəm,  
Qan ağlar, qan ağlar didələrimiz.

Sənə söylədiyim sözün düzüdü,  
Sinəmdəki məhəbbətin közüdü,  
Ağ şəhərdə Qara paşa qızıdı,  
Qan ağlar, qan ağlar didələrimiz.

İgid odu öz dərdini bildirə,
Düşməni ağladıb, dostu güldürə,
Koroğluyam, bu dərd məni öldürə,
Qan ağlar, qan ağlar didələrimiz.

Söz tamama yetdi. Həsən ağaya qalxdı. Əl-əl üstə babasından söz istəmək üçün xahişə müntəzir dayandı.

Koroğlu işi belə görüb dedi:

– İzindi.

Həsən dedi:

– Ateyi mehriban! Ağ şəhərə özüm gedəcəm. Ya o qızı sənə gətirəcəm, ya da bu başdan keçəcəm.

Koroğlu dedi:

– Oğul, sən məni düz başa düşmədin. Mən əksə baxanda ondan ötrü ağlamıram ki, Qara paşanın qızını sənə analıq gətirə bilmirəm. Ona görə ağlayıram ki, o qızı Çənlibelə gəlin gətirməyin vaxtı çatıb. Səni isə hələ ağır səfərlərdə bərkdən-boşdan çıxarmamışam. Anan Nigarı gətirməyə gedəndə mən artıq Rövşən yox, Koroğlu idim. O vaxt mən anan Nigar üçün İstanbula gedərkən cəmi dəlilər mənimlə getmək istədilər. Mən razı olmadım. İndi, oğul, atdı, arvaddı, papaqdı, kişi üçün qeyrətdi. Səfər ağır, sənsə təcrübəsiz. Onunçün ağlayıram.

Atasından bu sözləri eşidən Həsən dedi:

– Atacan, sinəmə bir xanə söz gəlib, gör nə deyirəm:

İgid gərək atlana,
Atın minə, atlana.
Mərd odu ki, döyüşdə,
Hər yaraya qatlana.

İndi, ateyi-mehriban! Sınaq səndə, qüvvət məndə. Mizan səndə, ağıl məndə. Bu meydan, bu da mən. Necə istəyirsən, elə də imtahana çək.

Koroğlu gördü Həsəndən yaxa qurtara bilməyəcək. Dedi:

– Oğul, mənim də sinəmə bir neçə xana söz gəlib. Qoy onu da deyim, bəlkə başa düşəsən.

Aldı Koroğlu:

Başına döndüyüm, mehriban oğul,
Getmə, oğul, getmə Ağ şəhərə sən.
Təzəcə tapmışam qəndinən-noğul,
Getmə, oğul, getmə Ağ şəhərə sən.

Aldı Həsən:

Başına döndüyüm mehriban ata,
Ata, getməliyəm Ağ şəhərə mən.
Çağırram mövlanı dadıma çata,
Ata, getməliyəm Ağ şəhərə mən.

Aldı Koroğlu:

Ağ şəhərin poladdandı yanısı,
Hərlənsən tapmazsan, birdi qapısı,
Qarauldu böyük-kiçik, hamısı,
Getmə, oğul, getmə Ağ şəhərə sən.

Aldı Həsən:

Gərək Ağ şəhəri oda yandıram,
Hasarlar dağıdıb, qapı sındıram,
Qoşun qırıb, paşasını öldürəm,
Ata, getməliyəm Ağ şəhərə mən.

Aldı Koroğlu:

Koroğluyam niyyətimi yetirdim,
Paşalardan baci-xərac götürdüm,
Yeddi ildə bir əksini gətirdim,
Getmə, oğul, getmə Ağ şəhərə sən.

Aldı Həsən:

Koroğlusan, sən alınmaz qalasan,
Qoymam səni qəmə, yasa dalasan,
Həsən bəyəm, indi məni sına sən,
Ata, getməliyəm Ağ şəhərə mən.

Ata-bala sözlərini tamam eylədi. Koroğlu gördü yox Həsəndən yaxa qurtarmaq çətin işdi. Axır əlacsız qalıb Həsəni Ağ şəhərə yola salmaq üçün ziyafət düzəltdi. Nigar Koroğlunun sağında, Möminə xanım solunda əyləşdi. Koroğlu ayağa qalxdı, dedi:

– Dəlilərim, yeddi ildi Qara paşanın qızı Zərnişan xanımın əksini Çənlibeldə ayrıca otaqda gəlinim deyə saxlayıram. Mən, əksi dostum

mehtərbaşı Abdurrahmanın vasitəsilə əldə edə bilmişdim. İndii isə sizdən nə danım, könlümə oğul toyu düşüb. Məsləhət sizdən, rüsxət məndən.

Dəmirçioğlu dedi:

– Ay Koroğlu, igidi darda, taciri varda sınayarlar.

Eyvaz dedi:

– Onda gərək mən də gedəm. Dədələr demiş: “Qardaş qardaşa tən gərək, tən olmasa gen gərək!”

Bəlli Əhməd dedi:

– Belə olmaz, Həsən bizdən güclü olsa da, hələ bərkə-boşa düşməyib. Burada tək qüvvətli olmaqdan başqa, düşdüyü çətin vəziyyətdən çıxmağı bacaran ağıllı məsləhətçi də gərəkdi. Dəli Həsənin bu işdə hamıdan səriştəsi çoxdu. O, yerin altını da, üstünü də bilir. Tədbir də igidin bir yaraşığıdı.

Nigar xanım dedi:

– Dəlilər! Mən görürəm ki, Koroğlu kimi hamınızın könlünə toy düşüb. Nə olar, mübarəkdi. Amma igid yar sevməyə tək getməlidi. Həsənin məşqi də, aşıq kimi məclis aparması da xoşa gəlir. Oxumağı Aşıq Cünundan da geri qalmazdı. Bir də ki, Həsənin Yağı qoruğundakı zarafatı nə tez yadınızdan çıxdı.

Aşıq Cünun elə bil, Nigar xanımın sözünə bənd imiş. Əlini qulağının dibinə aparıb bir bayatı çəkdi, dedi:

Əziziyəm mərdanə,
Sözüm dedim mərdanə,
Qorxağa oğul deməz
Qoçaq ata, mərd ana.

Nigar xanım düz deyir. Həsən ustad aşıqlardan geri qalmazdı, ləfzi şirindi. Saz heç kəsi dar-damanda qoymayıb. Bəzən onun gördüyü iş bir qoşunun gördüyü işdən ötkün olur.

Koroğlu piyalə doldurdu. Həsən irəli yeriyib piyaləni atasından qəbul etdi. Həsən piyaləni nuş edib qurtarmamış Dəli Mehtər Ərəbatı meydana çəkdi. Həsən əvvəl-əvvəl Qəssab Alıyla, Zərqələm xanımla, sonra Koroğlu, Nigar xanım, anası Möminə xanımla halallaşdı. Ərəbatın belinə qalxanda Koroğlu dedi:

– Oğul! Ağ şəhərə sən bir mal-qara örüşə çıxanda, bir də naxır axşam qayıdanda girə bilərsən. Ağ şəhərdə mehtərbaşı Abdurrahmanı

taparsan. Ancaq onun evinə qonaq düşərsən. O, səni mənim Bulğurlu sazımdan tanıyacaq. Sənə nə desə, ona əməl et. Ağ şəhərdə özünü heç kəsə nişan vermə. Qoy hamı səni aşıq kimi tanısın. Di, uğur olsun!

Həsən Ərəbatı meydanda cövlana gətirib, üz tutdu Ağ şəhərə. Ustad dili yüyrək olar. Həsən günə bir mənzil, tey mənzil yolun damarını qırdı. Ərəbat ağzını nəqqarə kimi açıb yel kimi uçurdu. Dan yeri qızarar-qızarmaz Həsən Ağ şəhərə çatdı. Mal-qara örüşə çıxanda Ağ şəhərin qala qapısından şəhərə girdi. Şəhərdə bir qədər fırlandı. Gördü belə getsə mehtərbaşı Abdurrahmanı çətin tapacaq. Mal meydanının baş tərəfində yerləşən nalbəndin yanına gəldi. Nalbənd dərhal ayağa qalxdı ki, müştərisini dinləsin. Həsən dedi:

– Nalbənd qardaş! Atım bir az azarlayıb. Mehtərbaşı Abdurrahmanı salğa veriblər. Onun evinin yerini deməzsən?

Nalbənd şəyirdini çağırıb dedi:

– A bala, yanşağı mehtərbaşıgilə ötür, özün də tez qayıt.

Həsənlə şəyird bir-iki dolanbac küçə keçib mehtərbaşının evinə çatdılar. Şəyird iri çaxçaxlı qapını göstərib dedi:

– Yanşaq! Bu da mehtərbaşının evi.

Həsən cibindən bir az xırda-quruş çıxarıb şəyirdin ovcuna basdı. Sağ ol deyib, doqqaza yaxınlaşdı. Mehtərbaşı gördü bir atlı doqqazdan içəri girdi, onun bu boyda, bu buxunda dostu, tanışı olmayıb. Yan-yörəsindən yanşaqdan çox Koroğluya oxşayır. İrəli yeridi. Yanşağın salamını aldı. Oğlanın ədəb-ərkanı xoşuna gəldi. Atı talvarın altında rahladı. Yanşağı evə dəvət etdi. Çay-çörək ortaya gəldi, yeyib, içdilər. Mehtərbaşı dedi:

– Baba mehtər! Biz yanşaqlar söhbəti sözlə deyəndə dilimiz od tutub yanır, əgər izin versəydin sözümü sazla deyərdim.

Mehtərbaşı:

– İzindi, yanşaq!

Həsən Bulğurlu sazı köynəkdən çıxardı, sazın bəmini bəm, zilini zil köklədi. Götürdü görək mehtərbaşı Abdurrahmana özünü necə nişan verdi:

Gəl sənə söyləyim, mehriban əmi
Babam məni bu diyara göndərib.
Ahu-fəqanından çox çəkir qəmi,
Babam məni bu diyara göndərib.

Abdurrahman:

Başına döndüyüm ay cavan oğlan,
Baban kimdi, onu mənə deyirsən?
De, niyə ağlayıb çox çəkir fəğan,
Baban kimdi, onu mənə deyirsən?

Həsən:

Paşa, xotkarlardan xərac alıbdı,
İndi görsən saralıban solubdu,
Bu şəhərdə intizarı qalıbdı,
Babam məni bu diyara göndərib.

Abdurrahman:

Tək qoç Koroğludu igid, ad alan,
Paşalar mülkünə talanlar salan,
Bəs o kimdi saralıban həm solan,
Baban kimdi, onu mənə deyirsən?

Həsən baxdı ki, mehtərbaşı deyəsən ya həddindən artıq arif, yaxud da qanacaqdan bir balaca karsaladı. Odu ki, özü-özünə dedi: Gəl buna "Atüstü" üzərində bir Koroğlu bayatısını nərə çək, sonra təxəllüsünü isnad ver. Dedi:

– Mehtərbaşı sənə yazığım gəlir, qulağına bir lopa pambıq tıxa. Yazıqsan. Sonra məni vayqanlı görmə.

Bunu deyib Həsən bir dəli nərə çəkdi. Elə bil göy yarıldı, ildırım çaxdı:

Yerdən dursa Koroğlu,
Torun qursa Koroğlu,
Qan sel kimi tökülər,
Bir qıy vursa Koroğlu.

Yar yolunda mən də qolu bağlıyam,
Ah çəkibən, sinəm üstü dağlıyam.
Adım Həsən, qoç Koroğlu oğluyam,
Babam məni hüzuruna göndərib.

Abdurrahman:

Abdurrahmanam, bil mehtərlik peşəmdi,
Xoş gəlibsən, sənə qurban başımdı,
Koroğlu da əzizim, qardaşımdı,
İndi bildim, baban kimdi deyirsən.

Həsən sazla dediyini sözlə mehtərbaşına dedi. Mehtərbaşı dedi:

– Oğul, səni imtahana çəkmək yersizdi. Onsuz da Koroğlu Bulğurlu sazı ancaq ən əziz adamına verə bilər. Amma oğul, mən bilən onun Həsən adlı oğlu yoxdu. Mən tanıdığım oğlunun adı Eyvazdı.

Həsən dedi:

– Elədi, əmi. Mən Dəmirqapı Dərbəndli Ərəb paşanın qızı Möminə xanımdan olan oğluyam. Adı mənə atam yox, babam veribdi.

– Hə, indi bildim. Amma oğul, nə badə buralarda özünün Koroğlunun oğlu olduğunu, Çənlibeldən gəldiyini ağzından qaçırasan. Qara paşa diri-diri dərinə saman təpər. Mətləbin də mənə aydındı. Zərnişan xanımın əksini biz yeddi ilə çalışıb əldə edə bildik. Niyyətin xoş olsa da, onun özünü əldə etmək çox müşkül işdi.

Həsən dedi:

– Əmican, sən onun yerini, yurdunu mənə salğa ver, qalanında işin yoxdu, özüm düzəldərəm. Mehtərbaşı gördü ki, Həsən çox qırdırmasına gedir. Buna heç Tanrı törpüsü dəyməyib, elə öz dediyini deyir.

Mehtərbaşı dedi:

– Oğul, ağıl-ağıldan süyüşüklü olar. Fatma qarı ilə məsləhətləşək. Belə işlərdə onun səriştəsi çoxdu.

Mehtərbaşı qonşularındakı Fatma qarını çağırtdırdı. Fatma qarı içəri girəndə Həsənin boy-buxunu, xətti-xalı xoşuna gəldi. Ürəyində bərəkallah səni doğana, allah saxlasın – dedi. Qarı qonağa xoş gəldin deyib taxtın bir tərəfində oturdu.

Həsən baxdı ki, Fatma qarı lap Aşıq Cününun dediyi kimidi.

– Qarılar dürlü olur, qarı var iman quran, qarı var ilan vuran, qarı var ipəyi, qarı var köpəyi, qarı var holdurum hop, qarı var koldurum kup, qarı var balağı batdaq, qarı var dabanı çatdaq. Bu qarı çoxbilmişdi. Üz-gözündən zəhər yağsa da ipəyidi, iman qurandı. Dil tapmaq olar.

Mehtərbaşı dedi:

– Qarı nənə, sənə bir işimiz düşüb. Əl bizim, ətək sənin.

Qarı dedi:

– Ə, mehtərbaşı! Mən baytar deyiləm, nalbənd deyiləm. Sənin mənə nə işin düşəcək? Atlarıyın nalı tökülüb nalbənd çağır, saqqo olub, qotur düşüb nə çoxdu Ağ şəhərdə baytar.

Mehtərbaşı gördü qarı mətləbdən uzaqlaşdı. Dedi:

– Fatma qarı, bütün ilxı qurban olsun sənin bir ağ saçına. Bizim dərdimiz at dərdi deyil. Sən Qara paşanın evinə gedib, gəlirsən. Necə edə bilərik Zərnişan xanımı bizim bu cavan oğlanla bir dəfə görüşdürəsən?

Fatma qarı Zərnişanın adını eşitcək, elə bil onu ilan çaldı. Yerindən dik atıldı. Az qaldı qapını qoyub bacadan çıxsın. Həsən qarının qarşısını kəsdi.

– Nənəcən, biz sənə bir şey eləmədik. Sözdü soruşduq. Kömək etsən də, etməsən də öz işindi. Biz sənin ağbirçək imanına pənah gətirdik. Qarı baxdı Zərnişan xanıma layiq bir oğlan varsa da elə budu. Amma özünü sındırmadı, dedi:

– Oğul, sən qonaqsan. Bu gün burdasan, sabah Allah bilir harda, amma mehtərbaşı ağlını itirib. Ağ şəhərdə Zərnişan xanımın adını tutanı diri-diri divara hörürlər. Canına yazığın gəlsin. Nə qədər söz Qara paşaya çatmayıb, pələ-püsəni burdan yığışdır. Hələ bu neçə ildə Zərnişan xanımın üzünü birbaşı papaqlı inni-cinni görməyib. Əgər görməyə cürət edən olubsa, onu baxdığı yerdə qulaqlarından divara mıxlayıblar.

Mehtərbaşı dedi:

– Ay Fatma qarı, biz səndən tədbir dilədik, daha səndən ölüm istəmədik. Rəhmətliyin qızı, biz hələlik ölməyə tələsmirik. Sənə nə olub?

Həsən əl atıb cibindən bir ovuc axça çıxartdı. Qarının ovcuna basdı, dedi:

– Nənə, hələlik əl xərcliyindi. Nəmərin sonra.

Qarı baxdı axçaların hamısı qızıldı. Gözü kəlləsinə çıxdı, dedi:

– Oğul, Zərnişan xanım hər cümədən cüməyə Bülbüllü bağa seyrəngaha çıxır. Mən hər cümə axşamı onun əl-ayağına xına qoymağa gedirəm. Əksin varsa mənə ver. Kim bilər, xına qoyanda çalışaram ki, yerə düşsün. Zərnişan xanım soruşsa deyərəm ki, nəvəmdi. Əgər bir şey öyrənsəm, axşam sənə deyərəm – deyib, qarı xudahafisləşib getdi.

Mehtərbaşı dedi:

– Oğul, Həsən. Fatma qarını yaman yerdə yaxaladın. O, imanından keçər, qızıl axçalardan keçməz. İndi eşit, Qara paşanın bir atı var. Adına Aşqardor deyərlər. O atı ələ gətirə bilməsək heç bir iş görə bilmərik. Hələ cümə gününə var. İndi sən pay-piyada Bülbüllü bağa tərəf get. Yerini-yurdunu manşırla. Elə et ki, heç kəs səndən şübhələnməsin. Yoxsa işlər şuluq olar. Qaş qayırdığımız yerdə, göz tökərik.

Ustad dili yüyrək olar. Aradan bir az keçmişdi ki, Fatma qarı təngənəfəs özünü yetirdi mehtərbaşıgilə. Dil boğaza qoymadı. Elə ütələk danışdı ki, elə bil ağzına kişmişli südlü aş tökmüşdülər. Nə handan, nə hana qarı sözünə ara verdi.

Mehtərbaşı dedi:

– Ay rəhmətliyin qızı, nə olub? Bir insan kimi danışsana.

Qarı dedi:

– Ay oğul, elə Zərnişan xanımın ayağına təzəcə xına qoyurdum ki, əksin tıpp eləyib yerə düşdü. Saymazyana əksi yerdən götürüb, öpüb gözümün üstə qoydum. Sonra əksi qoynuma qoymaq istəyirdim ki, Zərnişan xanım dedi:

– Qarı, ver görüm o nə əksidi?

Dedim:

– Nənən canına fəda olsun, nökərin Həsəndi, nəvəmdi. Buralardan çox-çox uzaqlarda, Qaf tərəflərdə olur. Qoca nənəsini unutmayıb, yada salıb. Əl boyda əksini göndərib. Bu cümə günü qonaq gələcək.

Zərnişan əksə təfərrincə baxdı. Şəkildə qarının sifətinin cizgiləri arasında heç bir oxşarlıq əlaməti görmədi. Dedi:

– Qoca kaftar, nə qədər dərinə saman təpdirməmişəm, bu mürtəd pəzəvəngin kim olduğunu söyləməlisən.

Oğul, istədim ki, xanımın fikrini azdırım, bir şey çıxmadı. Axırda düzünü deməli oldum. Dedim:

– Xanım, Allahdan gizli olmayanı səndən nə gizlədim. Bu bir oğlandı ki, boy-buxununa baxanda papaq düşür. Deyirsən bir də baxım. Allah ondan heç nəyi əsirgəməyib. Kim olduğunu bilmirəm. Mehtərbaşının qonağıdı. Hardansa qərib-qürbət eldən səni deyib gəlib. Yan yörəsindən ona oxşayır.

O kimdi? – deyə Zərnişan xanım boğazımdan yapışdı. Dilim topuq çal-çala Koroğlu deyə bildim. Oğul, Zərnişan xanım mənə bir şillə çəkdi ki, gözümdən od parladı. Dedi:

– İlan vuran qarı, düzünü de, bu işi başqa bir adam da bilirmi?

Dedim:

– Xanım, imansız ölüm, üstümdə su tapılmasın, ocaq qalanmasın, əgər bu sirri bir adam bilirsə.

Dedi:

– Yaxşı, şəkil qalsın. Qonağına da de ki, qoy bu cümə Bülbüllü bağa gəlsin.

İndi oğul, sən oba yatandan sonra Bülbüllü bağa get. Özünə pünhan bir yer seç. Gün şaxıyanda Zərnişan xanım küləfrəngidə olacaq. Qızlar isə öz yerlərinə dincəlməyə gedəcəklər. Fürsəti fövtə verməzsən. Özünü dərhal salarsan küləfrəngə.

Həsən qarıya bir qədər də xərclik verib yola saldı. El-oba şirin yuxuda ikən Həsən qarı dediyi kimi elədi. Gün şaxıyanda Həsən özünü Zərnişanın küləfrəngisinə verdi. Həsən baxdı ki, Zərnişan bir qızdı, Züleyxa onun əlinə su tökməyə yaraşmaz. Qız deyirəm, qızdırma demirəm. Ağız püstə, burun hind fındığı, sinə Səmərqənd kağızı, göz piyalə, mah camalı bərq vurub yanır. Baxdıqca adamın gözünün şoqunu aparır. Diqqəsi minar, əl vurma sınar, bax kənarda dur, mələr-müskün kimi boynunu bur. Həsən şəklə baxdı, qıza baxdı. Zərnişan xanımın gözəlliyi onu oda yaxdı. Gözlər gözlərə sataşdı, ürəklər söz alıb danışdı.

Zərnişan xanım özünü sındırmayıb dedi:

– Ədə, gavur oğlu yanşaq, sən hara, bura hara? Bura quş gəlsə qanad, qatır gəlsə dırnaq salar. Bir qaşıq qanındanmı, yoxsa şirin canındanmı keçibsən? Çoxdandı ki, əyləncəsiz qalmışdıq. İndi əmr edərəm, sabah səni meydanda məhşər ayağına çəkərlər. Vaxtsız özünü bozardan əmlik kimi dərini boğazından çıxararlar. Saman təpib qala qapısından asarlar. Sənin kimi heyvərə yanşaqların bir də Bülbüllü bağa girməsi üçün dərs olar.

Həsən dedi:

– Xanım, bağışla. Mənim dərim o qədər də asan soyulmaz. Dərimə saman təpmək üçün qurd oğlu qurd gərək. İzin ver, sinəmə bir neçə xana söz gəlib onu deyim. Sonra istər öldür, istər dara çəkdir. Baş mənim, fərman sənin.

Zərnişan xanım yanşaqı sınamaq üçün elə qışqırdı ki, səsinə dayəsi gəldi. Zərnişan ehtiyatsızlıq etdiyindən peşiman oldu. Ürəyində öz-özünü danladı. Nə edə bilərdi. İş-işdən keçmişdi. Dedi:

– Bağbanı səslə. Babama xəbər versin. Bu heyvərəni tutsunlar. Həddini ona bildirsinlər.

Dayə baxdı ki, xanım qeyzlənib, dedi:

– Ömür-günümün bəzəyi, tələsmə. Yanşaqdı, bəlkə də bilməyib, heyvərəlik edib. Onsuz da onun əcəli sənin əlindədi. Qoy bir-iki xana söz oxusun. Bəlkə heç yanşaq deyil. Gavurun biridi, pəzəvəngliyinə salıb.

Zərnişan baxdı ki, dayəsi də bu igidin ələ keçməsini istəmir. Ürəyindən olmasa da, könüllü-könüllsüz dedi:

– Heyvərə yanşaq, dayəmə qurban ol. Mən ölümün üçün tələsmirəm. Ölüm qabağı amandasan. Oxu, izindi.

Həsən Bulğurlu sazı aldı sineyi sandığa.

Aldı Həsən:

Gözəllər çıxıbdı seyrəngahına,
Bənzəyir cənnətə bu bağlar indi.
Mən qurbanam gözəllərin şahına,
Bənzəyir cənnətə bu bağlar indi.

Zərnişan xanım siyah saçından üç tel ayırdı, turuncu məmələri üzərində saz edib götürdü görək cavabında nə dedi:

Yanşaq, dəlisənmi, yoxsa divanə?
Düşmüsən ölümün bazarına sən.
Qov kimi canını salıbsan oda,
Dözməzsən bu eşqin azarına sən.

Aldı Həsən:

Yanşaqların peşəsidi söz demək,
Balı qəndi qatıb şirincə yemək,
Yasaqdımı bu yerləri de, gəzmək?
Dönübdü gülşənə bu bağlar indi.

Aldı Zərnişan xanım:

Yanşaqsan, yamanca, amma dillisən,
Mən bilirəm qərib, uzaq ellisən,
Adın nədi, de hansı məkanlısan?
Düşərsən babamın nəzərinə sən.

Aldı Həsən:

Adım Həsən bəydi, şirin dilliyəm,
Qolu qüvvətliyəm, dəliqanlıyam.
Koroğlu nəsliyəm, Çənlibelliyəm,
Düşüb diyarına güzarım indi.

Aldı Zərnişan xanım:

Bu yerlərin söhbətiyəm, sazıyam,
Yüz qız içrə gözəllərin gözüyəm,
Zərnişanam, Qara paşa qızıyam,
Söylə, niyə gəldin güzarıma sən?

Söz tamama yetdi. Zərnişan xanım dedi:

– Həsən, eşitdiyimə görə Koroğlu yeddi ildə əksimi zorla əldə edib. İnşallah, indi də yeddi il sənin yasını tutar. Xotkar qızı əlinə xına qoymaq əvəzinə başına qara bağlar. Cavansan, canına yazığın gəlsin. Nə qədər ki, qanın Qara paşanın əlində qəltan olmayıb, sürük əppəyini götürüb burdan get. Zərnişan xanım bu sözlərinən Həsəni imtahan edirdi, görsün ona yar şirindi, yoxsa can.

Həsən baxdı ki, Zərnişan xanım onu hərbə-zorbası ilə imtahana çəkir. Odu ki, özünün igidliyini ona isnad verərək dedi:

Mərd oğulun nişanəsi
Qanında gərək igidin.
Çəkməyə özgədən minnət,
Canında gərək igidin.

Bir igidin olsa sanı,
Vurar qılınc, tökər qanı,
Gürzü, nizəsi, qalxanı,
Qolunda gərək igidin.

İgid odu ola gücü,
Ala qalaları, bürcü,
Ovxarlı Misri qılıncı,
Belində gərək igidin.

Koroğlunun balasıyam,
Hər sözünü qanasıyam,
Dediyini danasıyam,
Sözü düz gərək igidin.

Mən Həsənəm, Qurdoğluyam,
Düşmənimə dərd oğluyam,
Nəsilcən, bil, Koroğluyam,
Arxası gərək igidin.

Söz tamama yetdi.

Həsən baxdı ki, Zərnişan xanımın dili dediyini ürəyi demir. Öz-özünə dedi: Koroğlu demiş, gəl sən bunun uşaqlığını, cavanlığnı, qocalığını yadına sal, bəlkə ürəyi yumşala.

Aldı Həsən:

Üç yaşından beş yaşına varanda,
Yenicə açılmış gülə bənzərsən.
Beş yaşından on yaşına varanda,
Arıdan saçılmış bala bənzərsən.

Zərnişan xanım özünü saxlaya bilmədi, şaqqanaq çəkdi. Dedi:

– Əyə, gavur oğlu yanşaq. Cümlə gündoğandan günbatan buğa boynu buran, igid pəhləvanlar qolunu qıran ərənlər mənim dərdimdən ölür. Sən də başlamısan mənə üç yaşından, beş yaşından oxumağa. Həsən baxdı ki, mətləbi Zərnişan xanıma çatmadı. Dedi:

– Xanım, sazı, sözü dinlərlər. İlk kəlmədən adama gülməzlər. Hələ gör ustad sonrakı halına nə deyir.

Aldı Həsən:

On dördündə sevda yenər başına,
On beşində cavan girər duşuna,
Çünki yetdin iyirmi dörd yaşına,
Boz-bulanıq axan selə bənzərsən.

Otuzunda kəklik kimi səkərsən,
İgidlik eyləyib qanlar tökərsən,
Qırxında əl haramından çəkərsən,
Sonası ovlanmış gölə bənzərsən.

Əllisində əlif qəddin çəkilər,
Altımışında ön dişlərin tökülər,
Yetmişində qəddin, belin bükülər,
Karvanı kəsilmiş yola bənzərsən.

Səksənində sinir yenər dizinə,
Doxsanında qübar qonar gözünə,
Koroğlu der, çünki yetdin yüzünə,
Uca dağ başında kola bənzərsən.

Söz tamama yetdi. Həsən baxıb gördü ki, dayə ilə Zərnişan xanım bir-birini elə qucaqlayıblar ki, illər-aylar həsrətlisi kimi. Dəm veriblər göz yaşına. Anladı ki, söz yerinə düşdü. Dedi:

– Zərnişan xanım, mən qoç Koroğluya söz vermişəm. Öldü var, döndü yox, vaxt daralır. Sən tədbirini de.

Zərnişan gördü Həsən sözündə bütövdü. Hədə-qorxu yeri deyil. Dedi:

– İndi vaxtdı, ayrılmalıyıq. Axşam üstü dayəm dalınca gələcək. Mehtərbaşı Abdurrahman atamın Aşqardor atının töyləsini yaxşı tanıyır. Atın töylədən çıxarılmasına o tədbir tökər.

Həsən Zərnişan xanımla, dayə ilə halal-hümmət eləyib Bülbüllü bağdakı pünhan yerinə çəkildi. Bir azdan bağ boşaldı. Həsən özünü verdi mehtərbaşının evinə.

Mehtərbaşı dedi:

– Oğul, Həsən. Necə gəldin, oğlansan, ya qız?

Həsən dedi:

– Abdurrahman əmi, oğlanam.

Sonra da o başına gələnlərin hamısını mehtərbaşıya nağıl elədi.

Axşama hazırlıq görüldü. Dayə Həsənə dedi ki, götür çarşovu, Zərnişan xanım bizi sarayda gözləyir.

Şenlik şirin yuxuda ikən tədarük görüldü. Zərnişan da Həsən kimi altdan geyinib, üstdən, üstdən geyinib altdan qıfıllandı, yaraqlandı, yasaqlandı.

Mehtərbaşı Abdurrahman da qala qapısının ağzında Ərəbatla Həsəni gözləyirdi. Həsən mehtərbaşının dediyi kimi Zərnişanı götürüb Aşqardorun tövləsinə yön aldı. Tövləbaşıya bir kisə qızıl verib dedi:

– Tövləbaşı, al bu axçaları, yeddi arxdan dolananına belə bəsdi. Atı tövlədən çıxarana kimi dinmə, danışma.

Tövləbaşı tez kisəni qoynunda gizlətdi. Həsən tövləyə girəndə istədi ağzını açıb qışqırsın. Zərnişan xanım ley kimi onun başının üstünü kəsdi. Əlindəki qamçının dəstəyi ilə kişinin başına elə vurdu ki, yazıq meyid kimi yerə sərildi. Həsən Aşqardoru tövlədən çıxaranda gördü ki, tövləbaşı yerə sərilib. Zərnişan xanımın üzünə baxdı. Zərnişan xanım dedi:

– Belə yaxşıdı, səs-küydən uzaq olarıq.

Həsən Aşqardorun belinə qalxan kimi Zərnişan xanımı tərkinə aldı. Atı qala qapısına tərəf sürmək istədikdə tövləbaşı qışqırdı:

– Qaravul, qaravul...

Səs-küy yayıldı. Qaravullar hər yerdə bəndi bərəni kəsdilər. Zərnişan xanım dedi:

– Həsən, işlər şuluxdu. Əlac Aşqardora qalıb. Ata bir qamçı çək.

Həsən Aşqardora elə bir qamçı çəkdi ki, at yay kimi dartılıb qala qapısının üstündən aşırıldı. Qapı açılıb qoşun çıxanacan mehtərbaşı Ərəbatın üzəngisini basdı. Həsən qırğı kimi Ərəbatın yəhərinin qaşında oturdu. Qoşun Həsənlə Zərnişan xanımın dalınca at saldı. Həsən dedi:

– Zərnişan xanım, deyəsən qoşun bizdən əl çəkməyəcək. Bir də ki, Çənlibeldə dəlilər elə bilər ki, mən oğurluq edib səni qaçırmışam. Sən bir az gözlə, mən qoşunla haqq-hesabı çürüdüm.

Zərnişan xanım dedi:

– Sən Qara paşanı tanımırsan. Onun qoşununun sayı, hesabı yoxdu. Sən tək, onlar çox. Sür, yolçu yolunda gərək.

Həsən dedi:

– Yox, Zərnişan xanım! Bəs eşitməmisən:

Arif olan söz qana,
Söz anlaya, söz qana,
Yüz min tülkü yığılsa,
Neyləyər bir aslana?

Bu sözləri deyəndən sonra Həsən Ərəbatın başını qanırdı. Özünü qoşuna vurdu. Sağdan vurub soldan, soldan vurub sağdan çıxdı. Qoşunu qatdam-qatdam etdi. İşi belə görən Qara paşa meydana at sürdü.

Aldı Qara paşa:

Sənə deyim, əcəm oğlu,
Oğlan, qaytar Aşqardoru.
Qoşun verər sənə yolu,
Oğlan qaytar Aşqardoru.

Aldı Həsən:

Sənə deyim, Qara paşa,
Paşa, vermən Aşqardoru.
Qoşun versə mənə yolu,
Paşa, vermən Aşqardoru.

Aldı Qara paşa:

İgid tutmaz uşaq işin,
Tutub kəsdirərəm başın,
Qurd-quşa yem olar leşin,
Oğlan, qaytar Aşqardoru.

Aldı Həsən:

Aşqardoru gətirmişəm,
Mən mətləbi bitirmişəm.
Zərnişanı götürmüşəm,
Paşa, verməm Aşqardoru.

Qara paşa gördü ki, bu pəhləvanı sözlə başa salmaq çətindi. Fikirləşdi ki, gəl yenilməz pəhləvan Poladı isnad ver. Bəlkə qorxub Aşqardoru, Zərnişan xanımı qaytara.

Aldı Qara paşa:

Əmr versəm Polad gələr,
Anan, bacın ağlar qalar,
Qara paşa bağrın dələr,
Oğlan, qaytar Aşqardoru.

Aldı Həsən:

Hər hadyana baxmaz Həsən,
Poladsan, paşasan, nəsən?
Min iyidə tək mən bəsəm,
Paşa verməm Aşqardoru.

Söz tamama yetdi. Meydan yenidən qızışdı. Bir tərəfdən Həsənlə Ərəbat, o biri tərəfdən də Zərnişan xanım yenidən özlərini qoşuna təpdilər. Qara paşa gördü ki, qoşunun başı bostan kəliyi kimi yerlə yeksan olur.

Paşa əmr verdi ox atanlara:

– Necə olursa-olsun, əcəm oğlunu yaralı tutmalı, Zərnişanla Aşqardoru oxdan gözləməli.

İşi belə görəndə Həsən dedi:

– Zərnişan xanım, ox atanlar namərd olar. Kişilik qeyrəti çatıb əlbəyaxa döyüşə girməzlər. Dəmirçioğlu deyərdi ki, belə hallarda ox məsafəsindən uzaqlaşmalı, düşməni çəkiyə çəkməli. Mən qoşunun sağ cinahını yaracağam. Orada cinahı saxlayan sənin qardaşlarındı. Allah ya onlara verər, ya da mənə. Aşqardoru Ərəbatın dalınca sür.

Həsən qoşunun sağ cinahını yarıb Zərnişanın altı qardaşını qanına qəltan elədi. Qoşunun qomarğasından yenicə çıxmışdılar ki, haçabaş ox Həsənin kürəyindən dəyib döşünün altından çıxdı. Zərnişan Aşqardoru Ərəbata yanladı, Aşqardora acı bir qamçı çəkdi. Atlar bir göz qırpımında yel kimi uçdular. Zərnişangil sıldırımlı bir dağ ətəyinə gəlib çıxdılar. Zərnişan ətrafı axtardı. Böyük bir kaha tapdı. Atları kahaya sürdü. Həsəni uvuqla atdan endirdi. Haçabaş oxun uc hissəsini qılıncla kəsib, sümbəsini kürəyindən dartıb çıxartdı. Həsən od tutub yanırdı. Qan çox itirmişdi. Zərnişan yasəmən saçını yaranın üstünə basıb Həsənin başını dizinin üstünə qoydu. Həsənin bu halına dözməyən Zərnişan yanıqlı bir bayatı çəkdi:

Əziziyəm yar qana,
Yar oxuya, yar qana.
Yaralı bir tərlanam,
Sığınmışam yarğana.

Zərnişan xanımın ürəyi soyumaqdansa, bir az da kükrədi. Aldı görək nə dedi:

Qadir mövlam, səndən kömək dilərəm,
Həsən yaralıdı, dərman istərəm.
Neştər alıb bağrım başın didərəm,
Həsən yaralıdı, dərman istərəm.

Hər müşkül işləri bitirən sənsən,
Dinsizi imana gətirən sənsən,
Həzrəti həsrətə yetirən sənsən,
Həsən yaraılıdı, dərman istərəm.

Qara paşa susayıbdı qanına,
Ox dəyibdi, od düşübdü canına,
Necə gedim Koroğlunun yanına,
Zərnişanam, xuda, dərman istərəm.

Zərnişan dayəsindən eşitmişdi ki, dağlarda bitən kəklik otu ilə sarıçiçəyi əzib, ərgən qız döşündəki maya ilə qarışdırıb ox, nizə, qılınc yarası üstə qoysan, yara tez sağalar. Tez durub ətrafdan bir qalaq kəklik otu, sarıçiçək topladı. Onları daş üzərində əzdi. Üzünü yana çevirib turunc məmələrini büllur köynəyindən çıxartdı. Bir sıxdı heç nə gəlmədi, iki sıxdı döşü ağrıdı, üç sıxdı döşündən qan irin kimi maya çıxdı. Onu əzdiyi otla qarışdırıb Həsənin yarası üstünə məlhəm qoydu. Həsən üç gün, üç gecə yuxuya getdi. Zərnişan xanım baxdı ki, budu göy üzündə bir dəstə durna qatarı havalanıb gedir. Bir qərib-qərib ötən durnalara, bir də başını dizi üstünə qoyduğu yaralı Həsənə baxdı. Ürəyi qubar eylədi. Götürdü öz halını duranlardan Çənlibelə belə ismarladı:

Qatar-qatar uçan durna,
Uçuşuna qurban olum.
Cıqqaların burma-burma,
Cıqqanıza qurban olum.

Namərd mətləbə yetməsin,
Yağı sizi incitməsin,
Avazın qəmgin etməsin,
Avazına qurban olum.

Zərnişan da yarın öyər,
Bağrının başını oyar,
Çənlibelə salam deyər,
Salamına qurban olum.

Söz tamam oldu. Qəhr Zərnişanı boğdu. Ala gözlər bahar buludu kimi sifqarıdı.

Zərnişanla Həsən kahada qalsın. İndi sizə haradan, kimdən xəbər verim, Koroğludan. Koroğlu yatmışdı. Yuxuda gördü ki, Çınqıllı dağdadı. Qançır olub, ağzından laxta-laxta qan gedir. Hövlənək yuxudan oyandı. Elə bir dəli nərə çəkdi ki, elə bil göy gurulladı, ildırım çaxdı. Bir göz qırpımında dəlilər yaraqlı-yasaqlı Koroğunun əmrinə müntəzir dayandılar. Koroğlu sazı sinəsinə basıb dedi:

Nərə çəkdim dəlilərim oyansın,
Yaralıdı, bir Həsənim dardadı.
Qoç dəlilər yan-yörəmdə dayansın,
Yaralıdı, bir Həsənim dardadı.

Sökülsün Ağ şəhərin qalası, bürcü,
Məhv olsun, talansın paşanın tacı,
Qoymayaq paşada gərək bu borcu,
Yaralıdı, bir Həsənim dardadı.

Koroğluyam, mən bilirdim işimi,
Yaxşı yatdım, yaman gördüm duşumu,
Gərək gətirəsiz düşmən başını,
Yaralıdı, bir Həsənim dardadı.

Söz tamama yetdi. Yeddi min, yeddi yüz yetmiş yeddi dəli ata süvar oldu. Koroğlu dedi:

– Eyvaz xan, Bəlli Əhməd, İsabalı, Halaypozan, Tüpdağıdan, Qorxuqanmaz, Kosa Səfər! Qoşunu çəkin Ağ şəhərə. Qara paşanın yurdunda bostan əkin. Var-dövlətinin üçdə birini şəhərin əlsiz-ayaqsızlarına paylayın. Qalanı qənimətimizdi.

Söz Koroğlunun ağzından qurtarar-qurtarmaz dəlilər boğanaq olub Ağ şəhərə tərəf üz qoydular.

Dəmirçioğlu, Dəli Həsən, Dəli Mehtər, Aşıq Cünun dəmir gəmirirdi. Koroğlu baxdı ki, iş belə getsə Çənlibeldə heç kəs qalmaz. Dedi:

– Dəmirçioğlu, bu dəfə Çənlibeli Aşıq Cünunla sənə tapşırıram. Dəli Həsən, Dəli Mehtər mənimlə gedəcəklər.

Koroğlu Çınqıllı dağ deyib Qıratın cilovunu boşaltdı. Qırat yel kimi götürüldü. Günə bir mənzil, tey mənzil Çınqıllı dağa yetişdi. Qırat Ərəbatın hənirtisini duydu. Ayağını yerə döyüb kişnədi. Koroğlu dedi:

– Axtarın ətrafı. Qırat boş-boşuna kişnəməz. Dəlilər Çınqıllı dağı ələk-vələk elədilər. Bir də baxdılar ki, budu sərp qayalıqda Ərəbat, yanında da bir at var ki, göz istəyir tamaşa eləsin. Koroğlu dəlilərlə kahaya endilər. Baxdılar ki, bir qız Həsənin başını alıb dizi üstə, yarasına məlhəm qoyur.

Həsən gördü ki, Koroğludu, yanında da dəlilər, dedi:

– Keç yan tərəfə, babam gəldi.

Zərnişan xanım elə bildi ki, Həsən deyir baban gəldi. Rübəndini üzünə salıb tez Aşqardorun yəhərinə əyləşdi. Gözləri qan çanağı kimi doldu. Siyirtmə qılınc qoşuna tərəf at sürdü, dedi:

Ağ saqqallı atam mənim,
Öldürəcəm baba, səni.
Qoymursan murada çatam,
Öldürəcəm, baba, səni.

Həsən baxdı ki, Zərnişan Koroğlu ilə cəngə girir. Yaralı-yaralı bir təhər dirsəklənib, Bulğurlu sazı dilə gətirdi, dedi:

Sənə deyim mehribanım,
Qız ayıbdı, babam gəlir.
Sənə qurban mənim canım,
Qız, ayıbdı, babam gəlir.

Aldı Zərnişan xanım:

Məni saldın yaman oda,
Altı qardaş verdim bada,
Yaralıdı yar kahada,
Öldürəcəm, baba, səni.

Aldı Həsən:

Fələk mənə qara yazdı,
Xoş günümü necə pozdu,
Oxuduğun nə avazdı,
Qız, ayıbdı, babam gəlir.

Aldı Zərnişan xanım:

Zərnişanam, ollam dəli,
Ölləm, qoymaram irəli,
Daha sənə deməm bəli,
Öldürəcəm, baba, səni.

Zərnişan qızmış aslana dönmüşdü, dəlilər isə artıq kahanı haqlamaqda idilər. Həsən baxdı ki, işlər şuluxdu. Zərnişan ölüb, öldürməkdən danışır. Bir təhər ayağa qalxıb elə bir dəli nərə çəkdi ki, Çınqıllı dağ lərzəyə gəldi.

Aldı Həsən:

Həsən bəydi, Qurdoğludu,
İgidlikdə mərd oğludu,
Bu gələn qoç Koroğludu,
Qız, ayıbdı, babam, gəlir.

Söz tamama yetişdi. Zərnişan xanım anladı ki, gələn onun babası deyil, Həsənin babası Koroğludu. Həya edib Aşqardordan düşdü, bir tərəfə çəkildi, üz bürüdü.

Koroğlu üzünü Dəli Həsənə tutub dedi:

– Ayə, Dəli Həsən, bu qız nə deyir? Mənim ki, qız evladım yoxdu. Bu nə baba, baba salıb?

Həsən irəli yeridi. Qoç Koroğlu və dəlilərlə görüşüb öpüşdü, dedi:

– Ateyi mehriban! Zərnişan xanım səni anışıra bilməmişdi. Elə bilib ki, gələn babası Qara paşadı.

Koroğlu Zərnişan xanımın alnından öpdü. Sonra da dəlilər ilə üz qoydular Çənlibelə tərəf. Yağı qoruğuna yenicə çatmışdılar ki, baxdılar budu, o biri tərəfdən də Eyvaz xan böyük bir karvanla Yağı qoruğuna yaxınlaşır.

Qoşun Çənlibelə çatanda gördülər ki, Dəmirçioğlu bir məclis düzəldib, bir məclis düzəldib, ruzigarın gözü hələ belə bir məclis görməyib.

Yeddi min yeddi yüz yetmiş yeddi dəli xanımlarla məclisdə əyləşdilər. Koroğlu ayağa durub dedi:

– Çənlibel gəlini Zərnişan xanımın gəlişi münasibəti ilə qırx gün, qırx gecə toy vurulsun. Gəlinin ayağına yeddi min yeddi yüz yetmiş yeddi öyəc qurban kəsilsin. Yeddi il əksi saxlanan otaq isə təzə bəylə gəlinə layiq bəzədilsin.

Ustadların söyləməsinə görə Aşıq Cünun bu toyu elə keçirib ki, göz istəyirmiş tamaşa etsin.

# Hasan paşanın Çənlibelə gəlməyi

Qasid qasidin dalına düzülmüşdü. Xotkara gündə bir xəbər gəlib çatırdı. Özü də bir-birindən qara, bir-birindən bəd xəbərlər: Bolu bəyin ölməyi, Ərəb Reyhanın ölməyi. İndi də xəbər gəlib çatmışdı ki, Koroğlunun oğlu tapılıb gəlib. Özü də necə oğul? Elə bir bundan hesabını apar ki, Koroğlunun özünü iki dəfə yıxıb.

Bu xəbəri eşidəndən sonra xotkarın əli lap yerdən-göydən üzüldü. Tez bir qasidi bir namə ilə göndərdi Hasan paşaya ki, "gərək əlində yağ da daşsa, qoyub özünü mənə yetirəsən".

Hasan paşa namədən hali olub qaldı mat-məəttəl ki, necə eləsin? Getsin, necə getsin? Getməsin, necə getməsin. Çox götür-qoydan sonra baxdı ki, getməkdən başqa çarəsi yoxdu. Tədarük görüb, İstanbula yola düşdü.

Xotkar Hasan paşanı görcək, elə birinci sözü bu oldu:

– Hasan paşa, bir mənə de görüm, nəyi gözləyirsən? Gözləyirsən Koroğlu gəlib səni Toqatda, məni də İstanbulda öldürsün?!

Hasan paşa dilini saldı işə. Min yerdən min bəhanə gətirdi. Ancaq heç biri bir quruşa dəymədi. Xotkarın axırıncı sözü bu oldu ki:

– Hasan paşa, bilmirəm. Sənə qırx gün möhlət verirəm. Ya budu ki, gərək Çənlibeli dağıdıb, Koroğlunun başını gətirəsən, ya budu ki, qırx birinci gün sənin özünü dar ağacından asdıracağam.

Hasan paşanın qüdrəti qalmadı ki, bircə kəlmə kəsə. Ordan durub, birbaş gəldi Toqata. Qoşun böyüklərini yığıb başladı hazırlığa. İndi Hasan paşa burada hazırlaşmaqda olsun, sənə deyim aşıq Cünundan.

Aşıq Cünun bütün bu şeylərin hamısını cikindən bikinə kimi əl altından öyrənib, daban aldı Çənlibelə. Əhvalatı, necə ki, biz bilirdik, eləcə Koroğluya danışdı. Koroğlu dedi:

– Eybi yoxdu. Siz öz işinizdə olun! Qoyun gəlsin. Hasan paşa ilə də burada görüşərik.

Bu sözdə Dəli Həsən yeridi qabağa dedi:

– Koroğlu, özünə çox da arxayın olma. Buna Hasan paşa deyərlər. Bu nə Bolu bəyə bənzəməz, nə də Ərəb Reyhana. Qoy biz də hazırlaşaq.

Dəlilər də, xanımlar da hamısı Dəli Həsənin fikrini bəyəndilər. Axırda belə oldu ki, Dəli Həsən dəlilərin üç min say-seçməsini ayırıb, Çənlibelin Toqat baxarındakı bəndərləri tutdu. Başladılar Hasan paşanı gözləməyə.

Bir gün keçdi, beş gün keçdi, on beş gün keçdi, Hasan paşadan xəbər çıxmadı.

Günlərin bir günü səhər tezdən Koroğlu bir də baxdı ki, budu, keşikçi bir adam gətirir. Gəlhagəl, gəlhagəl, Koroğlu baxdı ki, bu adam elçi paltarındadı. Soruşdu:

– Kimsən? Nə istəyirsən?

Elçi ədəb salamını yerinə yetirib dedi:

– Qoç Koroğlu, mən sənin dostun Ələmqulu xanın qasidiyəm. Gəlmişəm sənə xəbər verəm ki, Ələmqulu xan öz başının adamları ilə sənə qonaq gəlir.

Koroğlu dedi:

– Xoş gəlir, səfa gətirir. Hər kim mənə qonaq gəlsə, gözümün üstündə yeri var.

Ondan Dəmirçioğlunu, Eyvazı, bir də Gürcüoğlu Məmmədi çağırdı ki:

– Tez olun, hazırlıq görün! Gərək Ələmqulu xanı elə qarşılayaq ki, Gürcüoğlu Məmmədin, bir də Ruqiyə xanımın başı aşağı olmasın.

Hazırlıq başlandı. Qoyun kəsən kim, ocaq yandıran kim, atını tumarlayan kim, elə oldu ki, elə bil Çənlibel toya hazırlaşır. Koroğlu tez bir adam qaçırtdı Dəli Həsənin yanına ki, bəs əhvalat belədi. Qonaq gəlir. Tez gəlsin. Ondan üzünü tutdu elçiyə ki:

– Yaxşı, xan nə vaxt gələcək?

Elçi dedi:

– Qoç Koroğlu, xan gəlib. Mən onları Çənlibelin üç ağaclığındakı bulağın başında qoyub gəldim. Dedilər ki, biz Koroğlunu burada gözləyəcəyik.

Koroğlu qalxdı ayağa ki:

– Evin yıxılsın, bəs səhərdən niyə bunu mənə demirsən? Kişinin yanında biabır olduq. De görüm, neçə nəfərdirlər?

Koroğlu hay vurdu yeddi yüz dəli atlansın. Özü də Dəli Mehtəri səslədi ki, Qıratı gətirsin. Bəli, dəlilər atlandı. Qırat gəldi. Koroğlu ayağını qoydu üzəngiyə ata minsin, nə fikirləşdi, nə fikirləşmədi, birdən üzünü Bəlli Əhmədə tutub dedi:

– Bəlli Əhməd, mən qayıdınca o elçinin əlinə-ayağına zəncir vurub, göz altında saxlarsan.

Bəlli Əhməd "baş üstə" deyib, o saat bir ağır kotan zəncirini saldı elçinin boynuna. Elçi işi belə görəndə qışqırdı.

– Bu nədi? Mən bu saat gedib xana deyəcəyəm. Qonağın elçisini də zəncirə vurarlar?

Bəlli Əhməd dedi:

– Ayə, narahat olma! Bu bizim qaydamızdı. Elə ki, Koroğlu qayıdıb gəldi, ondan sonra səni lap yuxarı başda oturdacağam.

Elçi başladı dartınıb-çırpınmağa ki:

– Mənə heç bir şey lazım deyil. Bu saat məni buraxın, mən çıxıb gedirəm.

Koroğlu nə fikirləşdi, nə fikirləşmədi, birdən misri qılıncı çəkib cumdu elçinin üstünə, tutdu onun boğazından ki:

– Bu saat de görüm, sən kimsən? Buraya nəyə gəlmisən? Yoxsa başını bədənindən ayıracağam.

Elçi işi belə görəndə düşdü Koroğlunun ayaqlarına ki:

– Amanın bir günüdü, Koroğlu! Bir qələtdi eləmişəm əcdadım ilə. Mənə yazığın gəlsin. Bir sürü külfətim var. Aman ver, deyim.

Koroğlu dedi:

– Amandı de! Amma yalan desən, vay halına!

Elçi dedi:

– Vallah-billah, bircə kəlmə yalan desəm, hər nə bilirsən elə! Necə ki, var, düzünü deyəcəyəm. Amma gərək söz verəsən ki, məni buraxacaqsan.

Dəlilər, xanımlar hamısı mat-məəttəl qaldılar ki, görəsən bu nə sirrdi. Koroğlu dedi:

– Dedim sənə ki, amandasan. Danış!

Elçi başladı ki:

– Can Koroğlu, mən səhərdən hər nə demişəmsə hamısı yalandı. Mən heç bilmirəm ki, Ələmqulu xan kimdi. Məni buraya göndərən toqatlı Hasan paşadı. Budu, on beş min qoşun ilə gəlib sənin üstünə. Bu adla istəyir ki, səni aparıb qabaqca özünü tuta, sonra da Çənlibelə yeriş eləyə.

Koroğlu qayıdıb oturdu, dedi:

– Yaxşı, bəs qoşun hardadı?

Elçi dedi:

– Biz buraya axşam çatmışıq. Gecə ilə qoşunu bəndərgahlarda gizlədib, özü yüz-yüz əlli adamla səni bulaq başında gözləyir.

Koroğlu getdi fikrə. Elə bu dəmdə Dəli Həsənin dalınca gedən adam başı lovlu gəldi ki:

– Hər yeri ələk-vələk elədim. Nə Dəli Həsən var, nə də dəlilər.. Bütün bəndərgahlar da boşdu.

Koroğlu qalxıb tutdu onun boğazından ki:

– Sən nə danışırsan?

Dəli dedi:

– Can Koroğlu, məni niyə öldürürsən? Mən işin olanın sənə deyirəm. İnanmırsan adam göndər, yoxlatdır.

Tez dəlilərdən bir neçəsini göndərdilər. Xəbər gəldi ki, bəs deyilən doğrudu. Nə Dəli Həsən var, nə də ki, dəlilər. Koroğlunun gözləri döndü qan çanağına. Elə oldu ki, day bir adam cürət eləyə bilmədi ağzını açıb bir kəlmə dinə. Nigar xanım işi belə görəndə durub gəldi qabağa. Dedi:

– Koroğlu, belə dayanmaqdan bir şey çıxmaz. Olan olub. İndi bir tədbir görmək lazımdı. De görək, nə eləyək. O necə deyərlər, düşmən kəsib qapının ağzını.

Koroğlu elə bil yatmışdı, oyandı. Durdu ayağa. Amma durdu, nə durdu. Elə qalxdı ki, elə bil Qaf dağı gurultu ilə yerindən oynadı. Elə bircə bunu dedi ki:

– Neynək. Qoy olsun.

Sonra üzün Eyvaza tutdu, dedi:

– Dəlilərdən iki min götürüb kəsərsən bəndərgahları. Onu-bunu bilmirəm. Çənlibelə bir adam buraxsan, başını özüm kəsəcəyəm.

Ondan döndü Dəli Mehtərə, dedi:

– Dəlilərdən yetmiş nəfər götür. Hasan paşanın qabağına gedəcəyik.

Koroğlunun bu sözündən dəlilər qaynamağa başladılar. Koroğlu baxdı ki, dəlilər buna razı deyillər. Amma qorxudan da bir adam cürət eləyə bilmir ki, danışsın, dedi:

– Tez olun! Gərək Hasan paşa başa düşməsin ki, biz onun işdəklərini bilmişik.

Sonra üzünü tutdu Dəmirçioğluya, dedi:

– Qorxmursan ki?

Dəmirçioğlu güldü, dedi:

– Can Koroğlu, sən rüsxət ver, onları kotan zənciri ilə Toqatacan qovlayım. Qorxmaq nədi?

Koroğlu dedi:

– Hazırla zəncirini! Yerdə qalan dəlilərin hamısını götürüb kəsərsən Yağı qoruğunun bəndərini. Elə ki, mən dava başladım, özünü

vurarsan qoşuna. Ya budu gərək hamımız qırılaq, ya budu gərək Çənlibelə düşmən ayağı dəyməyə. Amma dəstənin içinə qorxaq adam buraxma. Araya pərxaşlıq salar.

Qərəz, Koroğlu elə ki, deməlisini dedi, tapşırılmasını tapşırıb qurtardı, atı mindi, Dəli Mehtəri də yetmiş dəli ilə götürüb düzəldi yola.

Çənlibel dəydi bir-birinə. Eyvaz hay vurdu, iki min dəli belə ayrıldı. Dəmirçioğlu hay vurdu, iki min dəli belə ayrıldı. İşi belə görəndə xanımlar da qalxdılar ayağa. Qılınc götürdülər, altdan geyinib üstdən qıfıllandılar. Eyvaza qoşulub bəndərgahlara çıxdılar. İndi hərə öz işində olsun, bir görək Koroğlugil nə elədilər.

Koroğlu dəlilər də yanında gəlib çatdı elçinin dediyi bulağın yanına. Koroğlu elə gedirdi ki, guya heç bir şeydən xəbəri yoxdu. Bulağa bir az qalmış baxdı ki, budu necə elçi demişdi, olar yüz, yüz əlli adam əyləşiblər burada. Elə ki, Koroğlugili gördülər, hamısı qalxdılar ayağa. Koroğlu da gəlib çatdı. Ucadan bir xoş gəldin eləyib soruşdu:

– Bəs hanı xan?

– Koroğlu, xan yoxdu, gələn paşadı. Sənə mən zəhmət vermişəm. Ancaq məni gərək bağışlayasan. Mən qorxdum ki, sən gəlməyəsən, odu ki, sənin dostun Ələmqulu xanın adını verdim.

Koroğlu dedi:

– Gəlmisən, lap yaxşı eləmisən. Qonaq ki var, bizim əzizimizdi, iki gözümüzdü. Buyurun gedək! Hamınıza gözümüz üstə yer var.

Hasan paşa dedi:

– Əziz olasan. Mən elə bilməsəydim, heç Toqatdan durub buraya gəlməzdim. Mən bilirdim ki, sən mərd adamsan. Məni bu qoca vaxtımda başı aşağı eləməzsən.

Koroğlu dedi:

– Allah eləməsin. Başı aşağı düşmənin olsun. Buyurun gedək! Ayə, Dəli Mehtər qonaqlara yol göstər!

Hasan paşa dedi:

– Yox, Koroğlu, gəl elə biz söhbəti indi buradaca eləyək. Eybi yoxdu. Elə getmiş kimi varıq. Vaxt olar, inşallah Çənlibelə də gedərik. Bir də mən Çənlibelə belə getmək istəmirəm. Oraya, Allah qoysa, mən gərək başqa cür gedəm.

Koroğlu hərifin sözlərini başa düşdü. Ürəyində dedi: "Ay sənin o meyidini görüm. Allah qoysa səni Çənlibelə mən öz istədiyim kimi aparacağam".

Koroğlu Hasan paşa ilə danışa-danışa ətrafa nəzər yetirdi. Gördü qoca tülkü qoşunu elə gizlədib ki, bir nəfərinin də başı görsənmir.

Hasan paşa dedi:

– Düş, Koroğlu! Düş, elə söhbətimizi bu bulağın başında eləyək.

Koroğlu bir yoldaşlarına baxdı, başa düşdü ki, heç kəs onun atdan düşməyinə razı deyil. Heç, əslinə baxsan, belə yerdə atdan düşmək ağıllı iş də deyildi. Amma ki, Koroğlu bunu öz qeyrətinə sığışdıra bilmədi. Fikirləşdi ki, əgər atdan düşməsəm, deyərlər qorxdu. Odu ki, elə birdən aşırılıb atdan düşdü, yüyəni Dəli Mehtərə verib, özü Hasan paşanın yanına gəldi. Koroğlu elə cəld atdan düşdü ki, dəlilər heç bir şey eləyə bilmədilər. Durub gözləməyə başladılar.

Bəli, elə ki, Koroğlu ilə Hasan paşa bulağın başında qabaq-qabağa əyləşdilər, Hasan paşa sözə başlayıb dedi:

– Koroğlu, məni xotkar sənin yanına göndərib. Bəsdi bu qədər xotkara düşmən oldun. İstəyirəm xotkarla səni barışdıram. Xotkar deyir, o mənim böyük oğlum, Bürcü Sultan kiçik oğlum. İstəyir, köçüb yanıma gəlsin, istəyir elə Çənlibeldə otursun. İstəyir bütün qoşun sərkərdəliyini ona tapşırım. Sən də day uşaq deyilsən. Bilirsən ki, bu işin axırı yoxdu. Cavanlıq idi, elədin. O necə deyərlər, day həvəsdi, bəsdi. Gəl bu daşı ətəyindən tök. Elə buradan birbaşa mənimlə gedək İstanbula, qurtarsın getsin.

Koroğlu dedi:

– Hasan paşa, adam var, o necə deyərlər, dil işlədər, adam var əl işlədər. Mən indiyə kimi əl işlətmişəm. Odu ki, dildə sənin kimi yağlı-yağlı kəsib doğraya bilməyəcəyəm. Mən sözü bir dəfə deyərəm. Onu da dəyişmərəm. Nə qədər ki, bu dünyada mən varam, xotkar var, mən ona düşmənəm. Siz elə bilməyin ki, mən sizin işlərinizi bilmirəm. Xotkar səni buraya niyə göndərib, sən buraya necə gəlmisən, hamısı mənə bəllidi. Mən Koroğluyam. Məni aldatmaq, tora salmaq olmaz. Əlim, ayağım dəyməmiş qoşununu da götür, çıx burdan get! Mən xotkara da düşmənəm, sənə də.

Bunu deyib, Koroğlu durdu ayağa, Hasan paşa da durdu. Amma Koroğlunun gözü ətrafda idi. Hasan paşa nə elədi, nə cürə xəbər verdisə, Koroğlu bir də baxdı ki, dörd bir ətrafdan qoşun qalxdı ayağa. Yavaş-yavaş başladılar yeriməyə. Koroğlu gördü ki, hə, necə fikirləşmişdisə eləcədi. Hasan paşa onu salıb qoşunun düz ortasına. Özü də qoşun nə qədərdi? Adam elə bil göbələkdi yerdən çıxır. Bir su içim saatda dörd bir tərəf oldu adam.

Koroğlu bir belə baxdı, dedi:

– Hasan paşa, sən deyirdin ki, mən xotkarın böyük oğluyam. Yaxşı, bəs oğulu atanın yanına aparmaq üçün bu qoşun, bu sursat, bu cəbbəxana nəyə lazımdı?

Hasan paşa dedi:

– Koroğlu, sən indi mənim əlimdə əsirsən. Burada on beş min qoşun var. Min canın olsa, biri mənim əlimdən qurtarmayacaq. Gəl nahaq qana bais olma! Öz xoşunla təslim ol!

Koroğlu ətrafına nəzər salıb gördü qoşun getdikcə irəliləyir. Lap üzük qaşı kimi qalıblar arada. Dedi:

– Hasan paşa, özün bilirsən ki, necə dəfələrlə mənim əlimə fürsət düşüb, amma səni öldürməmişəm. Sən elə bilmə ki, mən səndən qorxmuşam, ya öldürə bilməmişəm. Yox, mən səni, bax, bu gün üçün saxlayırdım. İndi ya sənə verən Allah, ya mənə.

Koroğlu bunu deyib istədi ata tərəf getsin. Hasan paşa hökm elədi, başındakı adamlar birdən siyirtməqılınc töküldülər onun üstünə. Dəli Mehtər istədi dəlilərə hay vursun, Koroğlu əl elədi ki:

– Dayan!

Ondan döndü, paşaya dedi:

– Hasan paşa, gəl bu qoşunu qırdırma! Sən də atını min, mən də. Bu meydanda vuruşaq. Ya sən məni öldür, ya mən səni. Bununla da davamız qurtarsın.

Hasan paşa dedi:

– Bunlar hamısı qorxaqlıqdandı. Mən sənin fikrini başa düşürəm. Sən bizi yubatmaq istəyirsən. Ancaq keçmiş ola. Xotkarın fərmanı budu ki, sənin ya başını aparam, ya özünü.

Hasan paşa bunu deyib birdən başının adamlarına hay vurdu ki:

– Tutun, bağlayın qollarını!

Adamlar töküldülər. Koroğlu əlindəki şeşpəri tovlayıb bir sağa hərlədi, bir sola hərlədi, özünə yol açıb çıxdı. Dəli Mehtər Qıratı buraxdı. At bir dəfə fınxırıb dördəmə özünü yetirdi Koroğluya. Koroğlu qızılquş kimi sıçrayıb atın belinə düşdü. Ondan üzün Hasan paşaya tutub dedi:

Mən dəliyə hədyan söyləmə paşa,
Hünərlisən, gəl meydana, əfəndim!
Dağıdar ölkəni, çevirrəm taxtın,
Bularam cəmdəyin qana, əfəndim!

Mən bələdəm sənin cəngi-şəstinə,
Qılınc çəkib girrəm bu gün qəsdinə,
Hayqırıb meydanda gəlsəm üstünə,
Yetirərəm səni cana, əfəndim!

Baş əymərəm xotkar yazan fərmana,
Gələrsən əlimdən axır amana,
Koroğluyam, nərəm çıxar asmana,
Qoşun qaçar dörd bir yana, əfəndim!

Söz tamama yetişdi. Koroğlu bir dəli nərə çəkib özün vurdu qoşuna. Hasan paşa da hay vurdu, qoşun dörd tərəfdən töküldü. Koroğlu üzün Yağı qoruğuna tərəf tutub dedi:

Mərd igidlər dava günü gəlibdi,
At sürüb meydana çıxan gündü bu.
Müxənnətlər tər savaşa varıbdı,
Vuruban atından yıxan gündü bu.

Comərd igid heç qaçarmı meydandan?
Qılınc çəkib hayıf alaq düşmandan,
Qorxaq kəslər boyun əyib pünhandan
Sinilib xəlvətdən baxan gündü bu.

Qoç Koroğlu, qılınc götür dəstinə.
Müxənnət paşalar dolub qəsdinə,
Qarı düşman hücum edib üstünə,
Nizəni gözünə soxan gündü bu.

Dəmirçioğluya elə bir işarə bəs idi. Hay vurdu, dəlilər siyirmə-qılınc töküldü qoşunun üstünə. Hasan paşa işi belə görəndə hay vurdu ki, qoşun o tərəfə yerisin.

Koroğlu dedi:

– Hasan paşa, görürsən ki? Bax, indi sən mənim əlimdəsən. Bir həmlədə səni yerlə yeksan elərəm. Amma ki, dəymirəm. Qoşununa sərkərdəlik elə.

Dava qızışdı. Koroğlu dəliləri davada görəndə ürəyi tellləndi. Dedi:

Dolun at belinə, qoç dəlilərim,
Xotkarı taxtından endirək, hoydu!
Talayaq mülkünü, alaq canını,
Evini başına endirək, hoydu!

Şığıyıb üstünə qəddini bükək,
Gərək Çənlibelə min əsir çəkək!
Paşanın başında gəlin turp əkək!
Şahın çırağını söndürək, hoydu!

Bir hayqırsam, polad qollar boşalar,
Düşmanlar əlimdən çəkər haşalar,
Öldürək xotkarlar, qıraq paşalar,
Meydanı məhşərə döndərək, hoydu.

Qeysəri öldürək, sərdarı tutaq.
Böyüyün, kiçiyin qol-qola çataq,
Ərəb at döşünə cümləsin qataq,
Çənlibelə əsir göndərək hoydu.

Gələr Koroğlunun damaqlı çağı,
Dəlilər məclisdə, xan Eyvaz sağı.
Aladı gözləri, qaşları yağı,
Bulğarlı xanımı dindirək hoydu!

Söz elə təzəcə tamam olmuşdu ki, qoşunun dal tərəfindən nərə səsi gəldi. Koroğlu da, Hasan paşa da hər ikisi geri döndülər. Koroğlu baxdı ki, Dəli Həsən üç min dəli ilə daldan özünü vurdu Hasan paşanın qoşununa. Koroğlu qaldı məəttəl ki, bu necə olan işdi. O əvvəl-əvvəl elə bildi ki, Dəli Həsən Hasan paşanın köməyinə gəlir. Baxdı ki, kömək nədi? Dəli Həsən bir su içim saatda Hasan paşanın qoşununu qatım-qatım qatlayıb, ağnatdı bu tərəfə. Dava qızışdı, nə qızışdı. Dəli Həsən qızğın davada qışqırıb dedi:

– Ayə, Dəmiçrioğlu, vur!.. Qabaq sənin, dal mənim. Görək kim tez qurtaracaq?

Dəmirçioğlu sözü eşitcək, qılıncı atdı yerə. Əl eləyib belindən kotan zəncirini açdı. Dedi:

– Dəli Həsən, mənim dəstəm xırdadı. Görürəm ki, zənciri tovlamasam səndən geri qalacağam. Ya mədəd!

Zənciri başladı hərləməyə. Qabaq kəsildi, dal kəsildi. Ortada da Koroğlu özü. Qoşun başladı sağa, sola yayılmağa.

Eyvaz Hasan paşanın qoşununu belə görəndə qalxdı ayağa. Atı minib bəndərgahlardakı dəlilərə hay vurdu. İki min dəli də Eyvazla sol tərəfdən təpildi qoşuna. Koroğlu işi belə görəndə Qıratı cövlana gətirdi, dedi:

Qıratım kişnəyib girər,
Atılar meydan başına.
Qılınc çəkib dəlilərim,
Od ələr düşman başına.

Yaxşı ər yaxşı at minər,
Ortada göstərər hünər,
Atılanda nizə, şeşpər,
Qaldırar qalxan başına.

Gər girişsəm çalhaçala,
Quş gərəkdi, qanad sala,
Çəkib uçurdaram qala,
Bəy, paşa, sultan başına.

Dava günündə Eyvaz xan
Yüz yağıya verməz aman,
Dolanıb olasan qurban,
Bir elə oğlan başına.

İgiddə olar namus, ar,
Dar gündə görər gücü kar.
Koroğlu, dəlilər, Nigar,
Yığılar dövran başına.

Hasan paşa gördü iş şuluqdu. Belə getsə buradan bir nəfər adam qurtara bilməyəcək. Odu ki, hərci badabad deyib atın başını döndərdi, bir dəstə qoşunla Koroğluya hücum elədi. Koroğlu Misri qılıncı çəkib onları qabaqladı. De bir sağa vurdu, bir sola vurdu, qoşunun ağzını sındırıb qaçağa saldı. Üzün dəlilərə tutub dedi:

Xotkar üstümüzə qoşun göndərdi,
Qırın, dəlilərim, eyləyək cəngi.
Çıxın qarınca tək dolun hər yandan,
Bilin ölkələrin mənəm firəngi.

Əlli nədi, altmış nədi, yüz nədi?
Daldalarda tənə-tənə söz nədi?
Dərə nədi, təpə nədi, düz nədi?
Mənəm gürbələrin şiri, pələngi!

Yaranandan bu meydanda tək mənəm,
Hər ləkə paşaya boyun əymənəm,
Qəsəm olsun, tər savaşdan dönmənəm,
Axır suda sınar suyun səhəngi!

Koroğlu fərmanı mərdi-mərdana,
Can-dil ilə qılınc vurram düşmana.
Baş əymirəm nə sultana, nə xana,
Mənəm igidlərin yeki-irəngi!

Axır ki, qoşun davam gətirə bilməyib təslim oldu. Koroğlu hay vurub davanı dayandırdı. Hasan paşanın özünü də əsirlərin qabağına salıb Çənlibelə gətirdi. Ondan üzün dəlilərə tutub dedi:

– Hanı Dəli Həsən?

Dəli Həsən dəlilərin içindən çıxıb Koroğlunun qabağına gəldi. Yetişəndə qılıncın çıxardı, iki əllərinin üstündə tutub Koroğlunun qabağında diz çökdü. Dedi:

– Qoç Koroğlu, hər şeydən qabaq mənim böyük bir taqsırım var. Gərək ondan keçəsən. Mən sənə xəbər verməmiş bəndərgahları boşaldıb, dəliləri götürüb getmişdim. Amma onu deyim ki, mən qəsdən belə eləmişdim. Hasan paşanın qoşun ilə gəlməyini keşikçilər axşamdan mənə dedilər. Onun qoşunu necə yerbəyer eləməyini, necə pusqu düzəltdiyini mən görmüşdüm. Qorxdum ki, işi sənə xəbər versəm, Çənlibelə səs düşə, düşmən işi bilə, fikrini dəyişə. Odu ki, səssiz-səmirsiz dəstəni götürüb gecə ilə onların dalında pusquya girdim.

Koroğlu dedi:

– Afərin. Mən elə belə də fikirləşirdim. Mən indi sənin bu günkü işinin əvəzini vermək istəyirəm.

Ondan üzün tutdu Hasan paşaya. Dedi:

– Hasan paşa, sən mənim yolumda Mahmud paşanın qızı Dona xatunu keçəl Həmzəyə verdirdin. Camal paşanın qızı Dünya xanımı da Bolu bəyə vermək istəyirdin, ancaq ona qismət olmadı. Eşitdiyimə görə sənin Bulqar xanım adında bir qızın var. Onu gərək Dəli Həsənə verəsən. Götür bu saat bir namə yaz, göndər, Bulqar xanım gəlsin buraya. Qorxma, bizdə bir qayda var, hərə öz istədiyinə gedir. Bəyənər gedər, bəyənməz genə də sənin qızındı. Səninlə birinci şərtim budu.

Hasan paşa dedi:

– De görüm, ikinci şərtin nədi?

Koroğlu dedi:
– Hələ sən naməni yaz, ver, sonra da ikinci şərtimi deyəcəyəm.
Hasan paşa gördü ayrı əlac yoxdu. Kağız götürüb Koroğlunun dediyi kimi yazdı. Koroğlu naməni alıb qoydu cibinə.
Ondan dedi:
– Hasan paşa, indi qulaq as, ikinci şərtimi deyim. Ancaq əslində şərt deyil, mənim əhdimdi. İndi yerinə gəlib.
Koroğlu bunu deyib üzünü tutdu Dəli Mehtərə, dedi:
– Ayə, Dəli Mehtər, Qıratla Düratı buraya çək!
Dəli Mehtər o saat Qıratla Düratı çəkdi ortalığa.
Koroğlu dedi:
– Hasan paşa, mənim atam Alı kişi səni kişi bilib, bu iki atı sənə bağışlamaq istədi. Bu yaxşılığın əvəzində sən bu atların üstündə onun iki gözlərini çıxartdırdın. Odu ki, bu Çənlibelə gələndən mən əhd eləmişəm. İndi əhdim yerinə gəlib. Nə qədər ki, ömrün var, Çənlibeldə qalıb bu iki ata mehtər olacaqsan.
Ustad deyir bir neçə gündən sonra Bulqar xanım Çənlibelə gəldi. Koroğlu onu Dəli Həsənə verib toyunu elədi.

# Mərcan xanımın Çənlibelə gəlməyi

Deyillər Həsən xanın üç oğlu, bir qızı qalmışdı. Böyük oğlunun adı Əhməd, ortancılın adı Hümmət, kiçiyinin adı Mahmud, qızının da adı Mərcan xanımıydı.

Aradan xeyli vaxt keçmişdi. Vaxt o vaxt olmuşdu ki, Mahmud böyüyüb girri bir cavan olmuşdu. O, ağıllılığıynan, qoçaxlığıynan, tədbirriliyinən özgələrdən seçilir, qardaşlarınnan fərqlənirdi.

Mahmud çox yerdə söz salıb öyünürdü ki, Koroğluynan təkbətək meydan açıb kəmər-kəmərə tutaşacam, atamın, paşaların, bəylərin, tacirlərin, sövdəgərlərin qisasını ondan alacam, ya da öz başımı bu yolda verəcəm.

Bu səs-səda xotkara da çatmışdı. Odu ki, hələ görməmişdən ona meyillənmiş, böyük ümid bağlamışdı.

Bayazid paşası Xəlil paşanın ölümündən sonra xotkar Mahmudu yanına çağırıb dedi:

– Mahmud, oğul! Mən belə görürəm ki, atanın kiçik oğlu olsan da, Koroğludan bizim qisasımızı almağa sən layiqsən. O biri qardaşlarından hay olmadı. İndi mən Bayazidin paşalığını tapşıraram sənin əlinə! Əyər Koroğlunu bir təhər eliyib səsini kəssən, mənim sözüm sözdü, sədrəzəmlik çatar sənə...

Mahmud xan əvvəl-əvvəl sevindiyindən özünü itirdi. Haçandan-haçana özünü düzəldib xotkara baş əydi, diz çöküb dedi:

– Qibleyi-aləm, mənim sözüm sözdü, ya başımı bədənnən verəcəm, ya da Koroğlunun səsini kəsəcəm. Ya qol zoruna, ya da hiylə gücünə çox çəkməz ki, məqsədimə çataram.

Mahmud qolunun zoruna, hiyləsinin gücünə güvənməkdə haqlıydı. Bu aralarda onun qoluna yapışan, atının qabağına at sürən, şeşpərindən can qurtaran, əmudunnan yan duran, qılıncına qalxan tutan, küştüsündə arxasını yerə gəlməkdən xilas eliyən, hiylə torunu görə bilən olmamışdı.

Bunnarı çoxdan bilən xotkar Mahmud xanın boy-buxununa qəddi-qamətinə, yar-yaraşığına, ötkəmliyinə, danışığına da vuruldu. Odu ki, onu lap şirnikdirməkdən ötrü gözəlliyiynən aləmə səs salmış bacısı Mərcan xanımı da vəlihədi Əmir xana nişannandırdı.

Amma Mərcan xanım bunu eşidəndə daş atıb başını tutdu, iki ayağını bir başmağa qoydu ki, mən ərə getmirəm. O, nişan paltarının qatını açmadı, üzüyü də barmağına taxmadı.

Bəli, gözləmədiyi günə düşüb birdən-birə paşalığa çatan Mahmud tezdiyinən sədrəzəmliyə yetişmək üçün Koroğlunu bir yannıx eləmək haqqında fikirləşməyə başdadı.

Qoy Mahmud paşa fikirləşməkdə olsun, sizə kimnən deyim, kimnən danışım, Rum paşası Asdan paşanın qardaşı qızı Leyli xanımnan. Leyli xanım əmisi qızı Məhbub xanımın çox isdəkli sirdaşıydı. O, Məhbub xanımın Çənlibelə məktub yazmağının səbəbkarıydı. Leyli xanım iyiddər haqqında çox şirin əhvalatdar, nağıllar danışdığına görə Məhbub xanım onun adını Şirin xanım qoymuşdu. Onlar sözbir eləmişdilər ki, Çənlibelə birlikdə getsinnər. Amma bildiyiniz kimi, iş belə gətirdi ki, Bəlli Əhmədi saldılar quyuya. Xəbər Çənlibelə çatdı. Koroğlu dəliləri göndərdi, gecə ikən onu xilas elədilər. Məhbub xanımı götürdülər, amma Leyli xanım ələ keçmədi, qaldı.

Leyli xanım elə hesab elədi ki, Məhbub xanım onu qəsdən, paxıllığnan qoyub gedib. Odu ki, gəlib əmisinə bir yalan-qurama söylədi, izn istədi ki, qoy bir hiylə düzəldim, ya Koroğlunu, ya da onun dəlilərinnən bir neçəsini salım tora, verim sənin cənginə, al qızının qisasını.

Şükür paşanın ağlına bələdsiniz. O naumutda inandı qızın uydurmalarına, bayaq ha izin verdi. Leyli xanım tələsik götürüb Koroğluya namə yazdı ki, mənim Çənlibeldə gözüm var, əgər igidsənsə, gəl məni apar.

Bu tərəfdən də Məhbub xanım öz arzusuna çatıb Çənlibelə yetişməyinə, Bəlli Əhməd kimi bir iyidə qovuşmağına baxmayaraq, pərişan dolanmağa, qəmli durub oturmağa başladı. Nigar xanım işi belə görəndə, Telli xanıma dedi ki, mənnən utanar, sən Məhbubun dərdini öyrən görək nədi.

Bir gün Telli xanım Məhbub xanımı da götürüb bir dəstə qız-gəlinnən seyrə çıxdı. Onlar gəlib Sayalıbulağın başında məskən elədilər. Qız-gəlin gül-çiçək dərməyə dağılışanda Telli xanım Məhbubdan dərdini soruşdu. Məhbub xanım yanıxlı bir ah çəkdi, söylədi ki:

– Dərdim əmim qızı Leylinin dərdidi. O, mənim canım-ciyərimdi. Şirinim-şəkərimdi. Sözümüz oydu ki, ikimiz də gələk. Amma onu gətirə bilmədik. Qorxuram, qıza xiffətdən xətər yetişə...

Telli xanım əhvalatı Nigar xanıma danışdı. Nigar xanım da bu qərara gəldi ki, dəlilərin, xanımların cəm vaxtında Məhbubun dərdini açsın, Koroğludan izn alıb qızı gətirtdirsin.

Gün o gün oldu ki, Koroğlu böyük bir məclis düzəltdi. Bu məclis kef məclisi yox, tədbir, məsləhət, səfər məclisiydi. Bildiyiniz kimi, axı

Koroğlu Hürü xanımı gətirib Eyvaza toy eyləmişdi. İş bundadı ki, toya Eyvazın atası Qəssab Alı gəlmişdi, amma anası Zərqələm xəstə olduğundan gələ bilməmişdi.

Amma Qəssab Alı toya gələndə Zərqələmə söz vermişdi ki, toydan sonra Koroğludan, Nigar xanımdan izn alıb gəlinimizi də, Eyvazı da gətirəcəm, bir toy burda özümüz eləyərik.

Toy qurtaranda Qəssab Alı məsələni Koroğluya açdı, Koroğludan da, Nigar xanımnan da izn istədi. Amma nə Koroğlu, nə də Nigar xanım belə tələm-tələsik Eyvazın getməyinə razı olmadılar. Qəssab Alıdan xahiş elədilər:

– Sən get, biz özümüz tezliynən uşaqları göndərərik.

Qəssab Alı bir söz demədi, qayıdıb Zərqələmə xəbər verdi ki, uşaqlar tezdiynən gələsidi. Bəli, indi Koroğlu bu məclisi qurmuşdu ki, tədbir töküb məsləhət eləsinnər, görək Eyvazgili nə layıqnan, kimlərnən göndərsinnər Təkə-Türkmana.

Hamı istəyirdi bu səfər ellərə, mahallara səs salan bir səfər olsun. Kim istərdi belə səfərdən qalsın!..

Məclisin şirin yeriydi. Nigar xanım fürsət gözləyirdi Məhbubun dərdini açsın. Bir də dəlilərdən ikisi girdi içəri, yannarında da birisi. Koroğlunu görsətdilər. Bu adam irəli yeridi, Koroğluya bir namə verdi. Koroğlu naməni oxuyub məclisdəkiləri halı elədi. Namənin Leyli xanımnan olduğunu görəndə Nigar xanım Məhbub xanımın dərdini danışdı, özü də bildirdi ki, elə indicə Koroğludan izn istəyəcəkdim, dəlilərdən bir neçəsi gedib o qızı gətirsin.

Özü çağrıldığına görə qoç Koroğlu üz tutdu Dəli Mehtərə:

– Gətir mənim atımı!

Dəli Mehtər bayaq cumdu Qıratı yəhərləməyə.

Eyvaz baxdı Koroğlu özü getmək istəyir, irəli yeriyib xahiş elədi, qoy mən gedim.

Koroğlu Nigar xanımın üzünə baxdı, Nigar xanım dedi:

– Yox, Koroğlu, bu səfərə nə Eyvaz getsin, nə sən. Dəlilərdən bir-ikisi gedib qızı gətirsin. Qoy onlar qasidi də özləriynən götürsünlər. Qasid bələdçilik eləsin, tez qayıda bilsinlər.

Hamının gözü Eyvazdaydı. Baxdılar ki, Eyvaz Hürü xanımın üzünə baxdı, sonra da başını sinəsinə salıb elə qızardı, elə qızardı, oldu qıp-qırmızı pul.

Aşıq Cünun buna tab eləməyib əlini verdi qulağına:

Seli sınar dağların,
Eli sınar dağların,
Eyvazın qəlbi sınsa,
Beli sınar dağların!

Nigar xanımın da ürəyi tab eləmədi. Eyvazın şəstini sındırmağına peşiman olub Koroğluya yalvardı:

– Koroğlu, izn ver, qoy Eyvaz getsin! Burda elə bir çətin iş yoxdu. Qız hazır olacaq, qasid bələdçilik eliyəcək. İnşallah, tezdiynən qayıdıb gələr.

Demə, Eyvazın halı Koroğluya da əsər eliyibmiş. İzn verdi, özü də məsləhət gördü Eyvaz Ərəbatı minsin.

Elə ki, izn verildi, Eyvaz gedib üstdən geyindi, altdan qıfıllandı, altdan geyindi üstdən qıfıllandı, Ərəbatı mindi, qasidi də götürüb düşdü yola.

Elə təzəcə Çənlibelin ətəyinə yenmişdilər, Eyvaz baxdı budu, bu yan Bayazid yoluynan bir atdı Çənlibelə tərəf elə çapır, elə çapır, gəl görəsən. Eyvaz ola!.. Qasidə dedi:

– Sən yavaş-yavaş sür atını, mən görüm kimdi, bu, nəçidi.

Eyvaz Ərəbatı döndərib özünü yetirdi çapara. Çatar-çatmaz – dayan, – deyib bir dəli nərə çəkdi, dağ-daş dilə gəldi. Az qaldı atlının qulaqları bata. Qayıdıb baxanda, gördü ki, budu bir nərin biri kəsib başının üstünü. Əvvəl-əvvəl bərk şaşırdı, sonra bir təhər özünü düzəldib dedi:

– Ayə, balam, niyə bağırırsan, məni qorxudursan?

Eyvaz bir az mülayimləşdi:

– Qardaş, bağırıb nə dedim ki, niyə səni qorxuzum. Yəni deyirəm görək kimsən, kimin adamısan, hayannan gəlib hayana gedirsən?

Yolçu Eyvazın belə mülayim danışmağınnan bir az da qızışdı:

– Hayıf sənin zəndinə! Ay korafəhim! Bəyəm korsan, görmürsən ki, Çənlibelə, qoç Koroğlunun oylağına gedirəm?

Eyvaz baxdı bunda iş var, özünü bir az da acizliyə qoyub yumşaqlıqnan dedi:

– Allah yaxşı yol versin, ay qardaş! Day niyə acığın tutur? Yanı deyirəm görəsən sənin Koroğluynan nə işin, o qaçaq-quldurnan nə alverin ola?!

Yolçu bu dəfə lap özündən çıxdı, day da qızışıb başladı bağırmağa, söyüb söylənməyə ki:

– Ayə, ay zındıq oğlu zındıq! Sən Koroğluya quldur deyirsən? Mənnən qorxmursan? İndi necəsən, qayıdam ayıram bədəninnən başını? Bilmirsən ki, mən qoç Koroğlunun xan Eyvazıyam?!.

Bu yerdə Eyvaz özünü saxlaya bilmədi, gülmək onu tutdu. Gülə-gülə dedi:

– Balam, bəyəm bu boyda da yalan olar? Əyər mən Koroğluyamsa, mənim sən nişanda Eyvazım yoxdu axı! De görüm sən nə zamannan olubsan xan Eyvaz?

Yazıq yolçunun boğazı qurudu, başladı udğunmağa, ürəyində özünü söyməyə ki, gərək mən bunun nərəsini eşidəndə Koroğlu olduğunu biləydim.

Eyvaz onun vəziyyətini görüb təpindi:

– Həə! Di din görək hardan olubsan xan Eyvaz!

"Xan Eyvazın" dili çoxdan tutulmuşdu. Hardaydı dinməyə iqtidarı! Ha udqundu, ha kəkələdi, səsi çıxmadı. Eyvaz baxdı belə getsə, bu heç nə deyə bilməyəcək, qorxusunnan bağrı yarılacaq, dedi:

– Ayə, bəlkə səni qovan, eliyən var, bəlkə mənim yanıma gəlirsən, bəlkə mənnik işin-zadın ola?

Bu sözdən atlının ürəyi bir balaca özünə gəldi, özünü sərdi Eyvazın atının ayaqlarının altına ki:

– Koroğlu! Atam-anam sənə qurban olsun! Amandı, mənə rəhmin gəlsin! Elə sənin yanına gəlirdim.

Eyvaz dedi:

– Noolu, xoş gəlmisən, yaxşı eləmisən...

Eyvaz onun gözünün içinə baxanda gördü gözünü yayındırır, bildi ki, bundan iş əskik deyil. Qəsdən əlini qılıncın qəbzəsinə atıb sıyırdı, başının üstündə elə fırladı ki, qılınc göy gurultusunnan betər səs verdi. Yazığın gözlərində şimşək çaxdı. Elə bildi ki, başı bədəninnən getdi. Bayaq ha huşunu itirdi. Haçannan haçana gözünü açdı, başı yerindədi, başladı ağlamağa, yalvarmağa:

– İyid basdığını kəsməz, amandı Koroğlu! Atalar deyib ki, elçiyə zaval yoxdu. Məni öldürmə, mən Mahmud paşanın qasidiyəm. Sənə namə gətirmişəm...

Eyvaz əl atıb onu qaldırdı, naməni istədi. Qasid əli əsə-əsə naməni çıxardıb verdi Eyvaza. Eyvaz naməni açıb oxudu:

"Koroğlu, mən haman Həsən xanın oğluyam ki, atan Alının gözlərini çıxardıb dünya işığına həsrət qoydu. Sən də haman Alının

oğlusan ki, atamın illərnən yediyi çörəyinə ayaq basıb səni gətirdi onun üstünə. Sən də namərdliynən ondan qisas aldın. İndi hər yanda səni mərd, iyid danışırlar. Əyər doğrudan da iyidliyin, hünərin varsa gəl Bayazidə. Sənnən təkbətək meydan açıb əlbəyaxa olacağam, ya sənə verən Allah, ya mənə".

Eyvaz baxdı özünü yaman dolaşdırıb. Dönüb desə mən Koroğlu deyiləm, apar ver naməni Koroğluya, onda olacaq bunun tayı. İndi də bu güləcək Eyvazın üstünə... yox, elə Koroğluluqda qalıb Bayazidə getsə, bəs Koroğlu? Bəs Rum? Bəs Leyli xanım?.. Fikir Eyvazı götürəndə qasidin canına vəlvələ düşdü, canının hayına qaldı:

– Koroğlu, balalarım ayağının altında qurban qırılsın! Nə yaman fikrə getdin? Bəlkə o namərd oğlu orda sənin qəlbinə toxunan söz yazıb? Allah eləməmiş, bəlkə... Amandı Koroğlu! Mənə qəzəb eləmə! Mənim borcum buyruq bitirməkdi. Neyniyim, bir parça çörək...

Eyvaz fikirdən ayrıldı. Baxdı Koroğlu olmaqdan savayı ayrı yolu yoxdu, dedi:

– Sən qorxma, paşa nalayıq söz yazmayıb. Amma iş budu ki, mən sənnən Bayazidə getməliyəm. Qaytar atını sür, o gedənə bir söz deyim, gəlim.

Qasid sevinmiş atını döndərdi geri. Eyvaz Ərəbatı məhmizlədi Leyli xanımın qasidinin yanına, Leyli xanıma bir namə yazdı:

Namən gəlib bizə çatıb,
Leyli xanım, Leyli xanım!
Namərdəlrin baxtı yatıb,
Leyli xanım, Leyli xanım!

Arzularsan Çənlibeli,
Əsər sərin-sərin yeli,
Yarın olar bir qoç dəli,
Leyli xanım, Leyli xanım!

Gəlib açaram meydanı,
Düşmənlər çəkər amanı,
Səhər gözlə Eyvaz xanı,
Leyli xanım, Leyli xanım!

Eyvaz naməni qasidə verib dilnən də tapşırdı ki, Leyli xanım məni səhər gözləsin.

Elə ki, Eyvaz Leyli xanımın qasidini saldı yola, döndərdi Ərəbatın başını geri, özünü yetirdi Mahmud paşanın qasidinə, oldu Koroğlu, üz tutdu Bayazidə.

Eyvaz gəlməkdə olsun, sən gör Mahmud paşa necə çağırırdı Koroğlunu meydanına! O, xotkarın yanınnan qayıdannan sonra çox fiikrləşdi, çox düşündü, çox daşındı, çox götür-qoy elədi, axırda bu qərara gəldi ki, bir hiylə işlədib Koroğlunu tələyə salmasa, əməl yeməyəcək. Oydu ki, Bayaziddən Çənlibelə gedən yolunun gah sağında, gah solunda bir-birindən bir ağac aralı yeddi quyu qazdırdı, quyuların üstünü çörçöpnən örtdürüb bilinməz elətdirdi, bu yolnan get-gəli kəsdirdi, sonra da haman naməni göndərdi Koroğluya. Fikirləşdi ki, Koroğlu naməni alan kimi gələcək, gələndə də bu quyuların birinə düşəcəkdi.

Paşa qasidi öyrətmişdi ki, quyulara çatanda bir bəhanə ilə dala keçsin, Koroğlu quyuya düşəndə də yandan atını çapıb xəbər eləsin.

Onsuz da Eyvaz atını həmişə qabaqda sürüb yetişdi Bayazidin yeddi ağaclığına. Birinci quyuya çatanda Ərəbat işi duydu sapdı yolun sağına, ikinci quyuya çatanda sapdı soluna. Eyvaz əvvəlcə acıqlandı, sonra özü də şəkkə düşüb atın yüyənini boşladı. Ərəbat quyulardan salamat keçib özünü verdi şəhərə.

De şəhərə hay düşdü ki, Koroğlu gəlir. Evlərdə adammı qalardı! Hamı onu görmək istəyirdi...

Eyvazın yolu Mərcan xanımın imarətinin yanınnan düşmüşdü. O, imarətin yanınnan keçəndə Mərcan xanım da küləfrəngiyə çıxmışdı ki, bəlkə Koroğlunu görə. Qız birdən-birə Eyvazın gözünə sataşdı. Eyvaz elə bildi ki, gün dönüb bu tərəfdən doğdu. Atın başını çəkib gözlərini sildi, heyran-heyran qızın camalına tamaşa eləməyə başladı. Onun gözü qızın gözlərinə calananda, qız bənövşə kimi qoydu başını çiyninə, boynunu büküb anasına həsrət qalmış ceyran balası kimi başdadı məlul-məlul Eyvaza baxmağa. Eyvaz ola, belə baxış ola! Dözərdimi? Misri qılıncı saz eliyib qızdan dərdini xəbər aldı:

Niyə belə məlul-məlul baxırsan,
Çöllərə bir Məcnun salmamısan ki?
Özün sevdiyinnən vaxtı çatmamış
Ayrılıq təblini çalmamısan ki?

Mərcan xanım əllərini köksündə daraqladı, yanıqlı bir ah çəkib, həsrətlə köks ötürdü. Eyvaz vəcdəmi gəldi, bilmirəm, qeyzəmi gəldi, bilmirəm, dedi:

Köks ötürdün, nələr düşdü yadına?
Ürək dözə bilməz bu fəryadına!
Dərdini de, qoy yetişim dadına,
Zalımlar əlində qalmamısan ki?

Ölüncə qılıncın çalar Eyvaz xan,
Səni yağılardan alar Eyvaz xan,
Koroğlu yurduna salar Eyvaz xan –
O yerlərdən soraq almamısan ki?

Ala gözləri dolub qaralmış bahar buluduna dönmüş Mərcan xanım özünü ağlamaqdan saxlaya bilmədiyinnənmi, yoxsa adamların çoxalmağınnanmı bilmirəm, birdən göründüyü kimi birdən də yox oldu. Eyvaz atı tərpətdi...

Bu tərəfdən Mahmud paşa Koroğlunun quyulardan salamat qurtarıb şəhərə girdiyini eşidəndə əvvəlcə bərk qorxuya düşdü, canını əsməcə tutdu, bir təhərriynən özünü toxdadıb əmr verdi ki, qoşun alsın şəhəri mühasirəyə. Özü də seçmə pəhləvanlardan düzəltdiyi dəstəni götürüb çıxdı Koroğlunun qabağına. O, yolda dünənki tapşırığını adamlarına bir də xatırlatdı:

– Elə ki, bütün yaraq-yasaqdan çıxıb əlbəyaxa olduq, mənim işarəmi gözlərsiniz. Elə mən işarə eliyən kimi tökülərsiniz üstünə!..

Eyvaz şəhər meydanına çatanda, baxdı ki, budu Mahmud paşa başının adamlarıynan gəlir. Qürur, qəzəb şiddət elədi, atı səyirdib meydanda bir dəfə cövlana gətirdi, sonra paşanın qarşısında şəstinən durub onu meydana çağırdı:

Mahmud paşa, namə yazdın, çağırdın,
Sür atını di meydana, gəlmişəm!
İki cannan biri bu gün leş olsun,
Üstündə ağlasın ana, gəlmişəm!

Paşanı şübhə götürsə də, diqqətinən qulaq asdı:

Biz comərd oğluyuq, çətin uduzaq,
Qılıncım namərddən keçməz yan, uzaq.
Bir ac qurd balası, bu gün yalquzaq,
Burda dişim batıb qana, gəlmişəm.

El qılıncı qurşamışam belimnən,
El oğluyam, ayrılmaram elimnən,
Neçə paşa qan ağlayıb əlimnən,
Mən nə sayım, özün sana, gəlmişəm!

Koroğlunun quyulardan salamat keçməyi paşanı bərk qorxutsa da, meydana gələnnən baxdı ki, heç Koroğluya deyilən nişanlar bu adamda yoxdu. Odu bir qədər arxayınlaşıb nəfəsini dərdi. Gərnəşib əlini belinə qoydu, məğrur-məğrur Eyvaza tamaşa eləməyə başladı. Bunun kim olduğunu kəsdirməkdən ötəri sözünə diqqət kəsildi. Bu duruş Eyvazın qüruruna toxundu, qeyzini daha da artırdı:

Elə durma, pozacağam halını,
Zəhər edəcəyəm şirin balını.
Elə dağıdacam cah-cəlalını,
Heç qalmasın bir nişana, gəlmişəm!

Dünyanı tutubdu Koroğlu, adı,
Düşmənə zəhərdi əlinin dadı.
Gərək hasil ola mətləb-muradı.
Bac verəsən Eyvaz xana, gəlmişəm!

Söz tamam oldu. Eyvaz Ərəbatı bir də cövlana gətirdi. Sözün son bəndində həm Koroğlunun, həm də Eyvazın adının çəkilməsi paşanın şübhəsini daha da artırdı. Paşa əmr elədi ki, qasidi gətirsinlər. O saat qasidi gətirdilər. Paşa xəbər aldı:

– Kişi, de görüm, bu Koroğludurmu?

– Paşa sağ olsun, Koroğlu olmuyanda, bə kimdi?

– Düz Çənlibelə qədər getdinmi?

– Paşa sağ olsun, bə haraya qədər getdim?

– Onu Çənlibeldəmi tapdın?

– Paşa sağ olsun, bə harda tapdım?

– Naməni Koroğluyamı verdin?

– Paşa sağ olsun, bə kimə verdim?

– Həmən yolnanmı gətirdin onu?

– Paşa sağ olsun, bə haraynan gətirdim?

– Kişi, yaxşı fikirləş!

Qasid başladı hay-həşirə:

– Paşa sağ olsun, bəlkə bəxşiş vermək istəmirsən?! Neynək! Mən bəxşiş almaqdan ha ötəri getməmişəm! Mən paşama borcumu yerinə yetirmişəm, sədaqətimi göstərmişəm! Mən xotkara qulluq eləmişəm. Elə döyül ha, sənin döylətinnən, Çənlibeli tanımayam! Getdim, gördüm çənni, dumannı bir dağdı. Atı sürdüm düz Koroğlunun alaçığının

qabağına. Gördüm, Koroğlu yığıb dəliləri, xanımları başına, dəlilər, xanımlar da deyirəm, bir-iki çulu cırıx, qotur gədə, bir-iki də baldırı açıq, ayaxyalın zənən, heç qapında qul-qaravaş da saxlamazsan. Hə, yığışıb başına, dərdikir...

Eyvaz baxdı ki, paşa şübhələnib, qasid də ağlına gələni çərənniyir, atı yaxına sürdü, qasidin sözünü ağzında qoyub özünü nişan verdi:

Koroğlu deyiləm, paşa, yaxşı bax,
Onun qoç oğluyam, xan Eyvazıyam.
Bir gün qoymaz gözlərinnən irağa,
Məclisinin söhbətiyəm, sazıyam!

Paşanın ürəyinin döyüntüsü azaldı. Eyvaz dedi:

Bu dünyada mən kamımı qoymadım,
Paşaları hey qırdımsa, doymadım.
Tacir-tüccarını az ha soymadım,
Döyüşün tərlanı, bir şahbazıyam.

Düşmənin üstündə ollam qara yel,
Zərbimnən ürəyi sızıldar tel-tel.
Əslim Təkə-Türkman, yerim Çənlibel,
Çənlibelin baharıyam, yazıyam.

Paşanın ürəyi lap yerinə düşdü, qırışığı lap açıldı, gərdənini bir az da çəkdi:

– Bilirəm, bala, bilirəm. Bir-iki dılğır gədəsiniz, dağları da viran qoyursunuz, bağları da. Bu sözə Eyvaz atı bir qədər də yaxına sürüb dedi:

Qartal kimi dağda yuva qurmuşuq,
Xayınların gözlərindən vurmuşuq.
Biz ellərin keşiyində durmuşuq,
O ərlərin bir təkiyəm, azıyam.

Xan Eyvazam, axıdaram qanını,
Qırram sultanını, bəyi, xanını,
Əl atıb qılınca, allam canını,
Nəslin nə var, yer üzündən qazıyam!

Paşa nəfəsini dərib baxdı ki, gözü Eyvazı yeyir, ayaqlarını bir az da aralı qoyub dedi:

– Ayə, Eyvaz, balam, axı mən Koroğluyu meydana çağırmışam. Bəyəm bu, iyidə yaraşan sifətdi ki, özü gəlməyib, bir südəmər uşağı göndərib mənim yanıma? Atalar yaxşı deyib, iyidin adını eşit, üzünü görmə. Balam, bu hansı ağılnan baş saxlayır, hansı hünərnən mənəm deyir?! Nə qorxaxmış bu Koroğlu?

Eyvaz dedi:

– Mahmud paşa! Özün yaxşı bilirsən ki, Koroğlu sənin dədənnən qorxmayıb. Bil ki, özünnən də qorxası deyil. O, paşaların özünə, sözünə, əhdinə, imanına da çox yaxşı bələddi. Məni elə-belə göndərdi ki, həm mən səni sınayım, həm də sən özünü sınaqdan keçirəsən. İkimiz də baxaq, görək sənin Koroğlunu təkbətək meydana çağırmağa cürətin, qeyrətin, haqqın çatırmı?

Paşa özünü sındırmadı:

– Noolu! Baxaq! Heç mən də o sən deyən naşükür bəndələrdən deyiləm ki, əlimə çıxan tikəni ağzıma qoymuyam, yerə tullayam. Di, buyur, en atdan, çıx yaraxdan, gir meydana!..

Eyvaz paşanın namərdliyinə bələd olsa da, atdan enib yaraqdan çıxdı. Paşa da yaraqdan çıxıb, şərti bir də himnən yanındakılara çatdırıb yeridi meydana...

Onlar meydanın ortasında gəldilər kəmər-kəmərə.

Bayaq dedik ki, paşanın gözü Eyvazı yeyirdi. İstəyirdi ki, təkdə, əlbəyaxada doğrudan da, özünü sınasın. Eyvazı bir təhər eliyib Koroğluya ciyərdağı vursun, adını dillərə salsın.

Eyvaz da paşanı saymadığınnan özünü boş qoymuşdu ki, paşa bir az atılıb düşsün. Odu ki, paşa Eyvazı bir neçə dəfə o tərəf-bu tərəfə çəkdi. Bir-iki dəfə özünə güc verdi ki, onu başının üstünə qaldırsın, bacarmasa da ruhdan düşmədi. Bir dəfə də Eyvazı özünə tərəf elə dartdı ki, Eyvazın dizləri yerə gəldi. Elə bu dəmdə onun qulağına bir bayatı səsi yetişdi:

Əzizinəm, qarğalar,
Dağda qara qar qalar.
Laçın sayğısız olsa,
Yeriş çəkər qarğalar!

Elə bil, bu səs Eyvazı yuxudan oyatdı, qoluna qüvvət, dizinə taqət, özünə qüdrət verdi. Paşanın kəmərindən yapışıb bir dəli nərə çəkdi, hop, qaldırdı başının üstünə:

İndi bil, bu gündən, paşa,
Başlanacaq qalın sənin!
Belə səni çalsam daşa
Necə olar halın sənin?

Geyinər poladdan donu,
Koroğlu Qırata qonu,
Yetişər ömrünün sonu,
Yatıbdı yığvalın sənin!

Xotkara qulluq bitirmə,
Ömrünü başa yetirmə,
Çara axtar, vaxt itirmə,
Dağdı qabaq-dalın sənin!

Qoç Koroğlu qəzəblənər,
Başın bədəninnən enər.
Səhər gələr o pir hünər,
Talan olar malın sənin!

Eyvaz səni salar dərdə,
Misri qılınc oynar sərdə.
Dəymişlərin duran yerdə,
Leysan olar kalın sənin!

Söz tamam oldu. Eyvaz istədi ki, paşanı çalsın yerə, paşa himi necə elədisə, adamları tökülüb onun canını xilas elədilər, Eyvazın əl-qolunu sarıdılar.

Paşa özünü düzəltdi, nəfəsini dərib dedi:

– Həəə! İndi gətirin verin xan Eyvazın bac-xəracını, qoyun aparsın! Koroğlunun gözü yoldadı!

Bir yandan paşanın namərdliyi, bir yannan da bu tənəli sözləri Eyvaza əsər elədi, dedi:

Ay ağalar, xoş keçərmi
Ov balasız mələr olsa?
Namərd mərdə əl eləyib
Lovğalanıb gülər olsa?

Seçər yaxşı, bilər yaman,
Namərdlərə verməz aman,
Gələr, burda açar meydan,
Qoç Koroğlu bilər olsa!

Eyvaz tərlandı, sən sarsan,
Gül üstünə qonma, xarsan!
İstanbulu addıyarsan,
O pir hünər gələr olsa!

Eyvazın səsini kimiydi eşidən, kimiydi sözünə fikir verən.

Paşa əmr elədi:

– Aparın! Qaydasınca rahatlayıb salın zindana! Qoy qoç Koroğlusu gəlib xilas eləsin!

Biçarə Eyvaz o zaman huşa gəldi ki, boynunda kündə, qolunda qandal, ayağında qandalaq qaranlıq zindandadı. Gördü bədəninin bütün əzələləri sızıldaşır, hərəsi bir dil oxuyur. Baxdı ki, sağ qolu özünün deyil, ha tərpətdi, tərpədə bilmədi. Oxalanmış qol hardan tərpənsin. De qaranlıq zindanda daldı xəyala: elə bil yatmışdı, yuxudan oyandı, başladı fikirləşməyə ki, ey diliqafil! Bu nə işiydi mən tutdum?! Haraya gedirdim, hayana gəlib çıxdım! İndi məni harada axtaracaqlar, harda tapacaqlar! Koroğlu bu işə nə deyəcək?!. Fikirləşdikcə Çənlibel, qoç Koroğlu, dəlilər, xanımlar, seyrəngahlar, cıdır yerləri, Nigar xanım, Hürü xanım gəlib durdu gözlərinin qabağında, ürəyi bərk qübar elədi, öz-özünə dedi:

Qürbətə atıldı daşım,
Canım, ay mədəd, ay mədəd!
Of! Yaman ağrıyır başım,
Qolum, ağ mədəd, ay mədəd!

Tələ qurdu Mahmud paşa,
Yığvalımı vurdu daşa,
Ömür gəlib yetir başa,
Elim, ay mədəd, ay mədəd!

Bir görəm alagöz yarı,
Anam Nigar, yaram sarı!
Arzulayır havadarı
Dilim ay mədəd, ay mədəd!

Eyvaz olub ixtiyardan,
Müşküldü qurtara dardan,
Çıxar alagözlü yardan
Əlim, ay mədəd, ay mədəd!

Gəlin hələlik Eyvazı qoyaq zindanda öz dərdiynən, görək Mahmud paşa neylədi. Paşa Eyvazı zindana salan kimi xotkara bir namə yazıb göndərdi ki, bəs Koroğlunun xan Eyvazını tutmuşam, nə lazımdı, de, eliyim! Necə lazımdı, fərman ver, yerinə yetirim.

Bu tərəfdən də Mahmud paşadan bir xeyir xəbər almıyan xotkar yaman narahat olmağa başlamışdı. Hər gün dalbadal Koroğlunun vay xəbəri əvəzinə, bir taciri soyduğu, bir xanı öldürdüyü, bir paşanın var-dövlətini talan elədiyi xəbəri gəlirdi. İllahım da Xoy paşasının ölüm xəbəri xotkarı yerinnən oynatmış, varlığını dara çəkmişdi. Odu ki, yenə bütün dil biləni, canı yananını, tədbir tökənini, vəzir-vüzərasını, özünə yaxın olan nə varsa, yığıb başına Koroğludan dad çəkə-çəkə şikayət eləyirdi. Onları gah qorxudurdu ki, bir az da belə getsə, gəlib hamımızı qılıncdan keçirəcək, var-dövlətimizə sahib olacaq, gah da yüksək ənamlar, bəxşişlər vəd eliyirdi ki, kim onu bir yannıq eləsə, ona çatacaq. O, tez-tez sual verir, cavab alır, çarə axtarır, tədbir istəyirdi.

Məclisdə xotkarın qardaşı oğlu, vəlihədi Əmir xan varıydı. Əmir xan qüvvətdə, şücaətdə, boy-buxunda, yap-yaraşıqda, qədd-qamətdə İstanbulda sayılan cavannardan biriydi.

Bəli, məclisin qızğın yerində qapıçı daxil olub Mahmud paşadan adam gəldiyini xəbər verdi. Xotkar tələsik əmr elədi ki, içəri gətirsinlər. Qasidi içəri gətirdilər. O, Mahmud paşanın naməsini verdi xotkara. Xotkar naməni vəzirə oxutdu, məzmunundan halı olanda, qan vurdu beyninə. Qəzəbindən oldu gözdəri bir cüt qan çanağı, əmr elədi vəzirə:

– Götür yaz ki, ay beləş-eləş! Mən Eyvazı neynirəm! Mənə Koroğlu lazımdı! Əyər bu tezdiynən Koroğlunu bir təhərə çəkməsən day Bayaziddə durma!

Vəzir o saat kağızı hazır elədi. Xotkar möhürünü vurub, verdi qasidə. Dilnən də tapşırdı paşaya deynən ki, çatan kimi onun başını kəssin, göndərsin mana! Özü də gözdə-qulaqda olsun. Koroğlu hayanda olsa, Eyvazın dalınca gələcək. Çalışsın onu bir təhərə çəksin! Yoxsa, öz başınnan keçməli olacaq. De durma, tərpən!

Qasid naməni aldı, baş endirib çıxmaq istəyəndə, Əmir xan durub əmisinə təzim elədi, əlini öpüb başladı yalvarmağa:

– İzn ver, qoy mən də gedim Bayazidə. Qoy gedim, Eyvaza sağ-sağ dağ çəkim, başını özüm kəsib gətirim!

Xotkar əvvəl-əvvəl razı olmadı, sonra da fikirrəşdi ki, əli-qolu bağlı adamdı, qoy gedib özü kəssin onun başını, alsın onnan qisasını.

Qoy həm ürəyi soyusun, həm də bir bərkdən-boşdan çıxsın! Qoy Əmirin zabitəsini Mahmud paşa da görsün! Odu ki, izn verdi, dedi:

– Get, çatan kimi işi bitir! Çox yubanma. Tez qayıt. Mahmud paşaya da bir qulaqburması ver, bəlkə Koroğlunu tezliyinən bir təhərə çəkə!

İzn veriləndə, Əmir xan elə bildi bütün dünyayi-aləm oldu onun. Day vaxt itirməyib xubunca geyindi-keçindi, bəzəndi-bərtəndi, yaraqlandı-yasaqlandı, şahlığın seçmə atdarınnan da birini minib qasidi aldı yanına, yol başladı Bayazidə.

Əmir xanın yola düşməyinnən çox keçməmişdi xotkar düşdü partdamıya. Durub dincələ bilmədi. Fikirləşdi ki, ay mənim öyüm yıxılsın! Mən onu niyə göndərdim! Onsuz da Eyvazın başı kəsiləcək. Nə təfavütü varıymış ya Əmir xan kəsə, ya Mahmud paşa?! Bəs uşaq gedər Koroğluyamı rast gələr, Eyvaznan təkbətək meydanamı çıxar! Axı cavannıq eliyib nələr eləməz ki! De xotkar durub dincələ bilmədi, düşündükcə qara fikirlər yığıldı beyninə, od doldu canına, dərd yer aldı ürəyinə. Səbri-qərarı kəsildi, taqəti üzüldü. Yox-yox vəziri çağırdı hüzuruna:

– Vəzir! Mənim ağlım itmişdi, sənə nə olmuşdu?!

– Qibleyi aləm! Allah eləməsin! Nə baş verib?

– Vəzir! Qaytar Əmir xanı! Qoyma gedə Bayazidə.

Vəzirin əl-ayağı yerdən-göydən üzüldü, düşdü xotkarın ayağına ki:

– Qibleyi aləm. Əmir xan atın seçməsini minib, özü də xeyli vaxtdı düşüb yola. Bunnan belə ona kim çata bilər ki!..

– Vəzir! Uşağın başına bir iş gəlsə, yurdunu viran qoyaram.

Vəzirin canın qorxu aldı. Bir təhərnən xotkarı sakitləşdirib məsləhət gördü ki, bir zirək adam göndərsinlər dalınca, çatar, yoldan qaytarar, çatmaz Bayaziddə ləngiməyə qoymaz. Xotkar razılaşdı. Vəzir bir qısa namə də yazdı: “Mahmud paşa! Eyvazın başını kəsdir, tez yola sal! Uşağı ləngitmə!” Xotkar kağızı möhürlədi. Bir zirək adama verib saldılar yola.

Qoy bu qasid də yolunda olsun, biz görək axı Əmir xan niyə belə sevinmiş gedirdi Bayazidə? Görək Eyvaz ona neyləmişdi ki, gedirdi onun başını kəsib qisasını alsın?

Bir dəfə Əmir xanın yolu Qarsa düşmüşdü. Qars paşası Heydər paşanın qızı Hürü xanımı görüb bənd olmuşdu. Xəbər xotkara çatanda,

pis yerin qızı deyil, özümüzünküdü, deyib elçi göndərmişdi, qızın "hə"sini alıb nişan qoymuşdu. Toya hazırraşanda, xəbər çatmışdı ki, bəs Koroğlu Hürü xanımı aparıb Eyvaza toy eləyib.

Bu tərəfdən də axı indi də Mahmud paşanın bacısı, dünya gözəli olan Mərcan xanımı nişanlamışdılar ona. Amma Mərcan xanım Əmir xan deyəni demirdi, ipə-sapa yatmırdı. İndi gedirdi ki, həm Eyvazdan qisasını alsın, həm də gücünü, qüvvətini, hökmünü, ixtiyarını Mərcan xanıma göstərsin ki, bəlkə ürəyinə bir balaca yol eliyə, onu bir balaca meylə gətirə, heç olmasa, bəlkə, bir dəfə də üzünü görə.

Bəli, mənim əzizdərim! Gəlin heç Əmir xanı bu şirin xəyallarınan ayırıb günah eləmiyək. Qoy o olsun öz yolunda, biz bir Çənlibelə qayıdaq, görək neyliyillər Çənlibeldəkilər.

Eyvazın vədə günü keçdi. O biri günü də gözlədilər. Eyvaz gəlib çıxmadı. Hamı başladı narahat olmağa, gözünü yola tikməyə. Elə ki, axşam düşdü araya, Nigar xanımın əlləri qaldı qoynunda, Hürü xanımın gözləri döndü bahar buluduna. Çənlibel dəydi bir-birinə. Gecə yarıdan keçdi, Eyvaz gəlib çıxmadı ki, çıxmadı! Kimin gözünə yuxu gedərdi ki? Hər ayaq səsi, hər at kişnəməsi Nigar xanımı diksindirirdi, Koroğlunun səbrini qılınclayırdı...

Səhər açılmağa az qalmışdı. Nigar xanımı oturduğu yerdə çimir apardı. Elə gözünə təzəcə yuxu getmişdi, yuxuda gördü Eyvaz bir ceyran qovur. Baxdı ceyran qaçıb özünü verdi bir uçuruma dərənin dibinə, Eyvaz ceyranın dalınca dərənin dibinə yenəndə birdən-birə ceyran dönüb oldu bir əjdaha. Qayıtdı Eyvazın üstünə. Elə əjdaha Eyvazı kamına çəkər-çəkməz, Nigar xanım "qoymayın!" – deyib qışqırdı. Diksinib öz səsinə oyandı. Başladı titrəməyə, ağlamağa. Koroğlu işi belə görəndə, yaxına gəlib Nigar xanımın qara tellərinə sığal çəkdi, dərdini soruşdu. Nigar xanım daha da kövrəlib ağlaya-ağlaya dedi:

Sənə deyim, qoç Koroğlu,
Yaman bədhalam, ağlaram!
Huy deyərəm, gedər ərşə,
Çatar ah-nalam, ağlaram!

Əldən uçurdum quşumu,
Şad görmədim tay-tuşumu,
Yatdım, bəd gördüm tuşumu,
Dardadı balam, ağlaram!

Mən Nigaram, zara gəlləm,
Eyvaz deyib dağı dəlləm.
Çox çəkməz, qüssədən ölləm,
İnanma qalam, ağlaram!

Koroğlunun da ürəyi bərk darıxdı, amma özünü toxdadıb Nigar xanıma təsəlli verdi:

Qəm eyləmə, alagöz yar,
Səhər gətirrəm Eyvazı!
Qov, könlünə qoyma qübar,
Sənə yetirrəm Eyvazı!

Eyvazsız alışar sinə,
Könül istəməz ki, dinə,
Çəkərəm Qırat tərkinə,
Sənə yetirrəm Eyvazı!

Xətər dəysə bir telinə,
Talan sallam Rum elinə.
Oturub Qırat belinə,
Səhər gətirrəm Eyvazı!

Qızaram, açaram meydan,
Yağılara uddurram qan,
Bu səhər ağaranda dan,
Gedib gətirrəm Eyvazı!

İnan Koroğlu sözünə,
Həsrətəm Eyvaz üzünə.
Qurban o ala gözünə,
Sənə yetirrəm Eyvazı!

Amma Nigar xanım özünü toxdada bilmədi, ağlıya-ağlıya gördüyü yuxunu Koroğluya danışdı. Elə bil, Koroğlunu ildırım vurdu. Bir dəli nərə çəkdi, bir su içimi saatda yer-göy dilə gəldi, bütün dəlilər, xanımlar, mehtərlər – Çənlibeldə kim vardısa oldu yanında hazır. Koroğlu gözünü dolandırıb hamını yanında görəndə, Dəli Həsəni səslədi:

Dəli Həsən, qalx ayağa dur indi,
Nigar deyir, xan Eyvazım qaldadı.
Çəkin mənim Qıratımı gətirin,
Kömək deyib baxır, gözü yoldadı!

Dəmirçioğlu, sən çəkginən qılıncı,
Qoymayın dağıla əsgərin ucu.
Aslan paşa çox hiyləgər, bilici –
Tutulubdu bir sultanım əldədi.

Hay eləyin, Halaypozan oyansın,
Qılıncın qəbzəsi qana boyansın.
Xan Eyvazım hələ zərbə dayansın,
Kamalı sərdədi, zoru qoldadı!

Talan düşsün Rum elinə bu başdan,
Nişana qalmasın daş üstə daşdan.
Əli çıxıb qoç atadan, qardaşdan,
Xan Eyvazım təkdi, qürbət eldədi!

Namərddə qaydadı, mərdə tor qurar,
Zalımın sənəti qurdurmaqdı dar.
İndi xan Eyvazım sizi arzular –
Haray! Haray! – deyər, ünü dildədi!

Hoydu, dəlilərim, eyləyin savaş,
Hürünün gözündə görürəm qan yaş.
Koroğlu oğul der, Kürdoğlu qardaş,
Nigar bala deyin yaman haldadı!

Koroğlu söznən dediyi kimi, dilnən də əhvalatı danışıb Eyvazın başında bir iş olduğunu bildirdi. Dəli Mehtərə hay vurdu ki, yəhərrə mənim atımı. Dəli Mehtər atı yəhərrəməyə cumdu.

Kürdoğlu işi belə görəndə irəli yeridi, Koroğludan iltimas elədi:

Xan qardaşımın dalınca,
Ata, mən gedim, mən gedim,
Bir damcı qanım qalınca
Ata, mən gedim, mən gedim!

Qardaş qayıtmadı barı,
Canda qaldı intizarı.
Olum Eyvaz havadarı,
Ata, mən gedim, mən gedim.

Qalxan tutum, şeşpər atım,
Düratın yalına yatım,
Qardaşın dadına çatım,
Ata, mən gedim, mən gedim.

Əl atım paşa varına,
Talan salım diyarına,
Çəkim həbəş bazarına,
Ata, mən gedim, mən gedim.

Kürdoğlu qılıncı teylər,
Ağır bəzirgannar əylər.
Qoç oğlun iltimas eylər,
Ata, mən gedim, mən gedim.

Koroğlu baxdı Kürdoğlu yaman haldadı, sözünü döndərə bilmədi, Dəli Həsəni bir də səslədi:

– Atını yəhərrə! Götür Kürdoğlunu! Bu gecə Eyvazı burda istiyirəm! Gecəyarıdan o yana keçsə özüm gəlirəm!

Dəli Həsən vaxt itirmədi. Görməlisini gördü, götürməlisini götürdü, düşdü Kürdoğluynan yola.

Bunlar getməkdə olsun, görək Leyli xanım neylədi. Elə ki, qasid qayıtdı, Asdan paşa Eyvazın səhər gələcəyini bildi, arxayın iş görməyə başladı. O, bir ev hazırlatdı, qapı-bacasını möhkəmlətdirdi, işi tapşırdı Leyli xanıma ki, al eləyib Eyvazı salsın bu evə, od vurub yandırsın.

Amma iş burasında düzəlmişdi ki, Leyli xanım qasidi xəlvətdə danışdırıb onun Çənlibeldə gördüklərini, eşitdiklərini biləndən sonra tutduğuna peşman olmuşdu. Ona təskinlik verən oydu ki, əmisi ona inanıb işi tapşırmışdı özünə. Bu dəfə qız onu götür-qoy eləyirdi ki, Eyvazı necə xilas eləsin, onnan bərabər qaçsın Çənlibelə.

Bəli, Dəli Həsəngil elə gəldilər ki, malın axşam suyunun vaxtında özdərini yetirdilər Ruma. Elə şəhərə girər-girməz, birisi yaxınlaşdı Dəli Həsənə:

– Ağa, Leyli xanım sizi gözdüyür!

Dəli Həsənə bu lazım döyüldümü? Saldı bu adamı qabağına ki, görsət onun yerini! Adam qabağa düşdü, xeyli gedəndən sonra bir evi görsətdi ki, bax, ordadı Leyli xanım.

Dəli Həsəngil özdərini yeritdilər, atdan düşüb girdilər içəri. Elə onların içəri girməyinən qapının şaraqq örtülüb bağlanmağı bir oldu. Baxdılar ki, düşdülər tora. Dəli Həsən səbrli tərpənib işin dalını gözləyirdi, Kürdoğlu dözə bilməyib əl atdı ki, qapını qopartsın, Dəli Həsən qoymadı. Kürdoğlu ondan soruşdu:

– Dəli Həsən, niyə gözə görünmür,
De görüm ha yanda qardaşım mənim?
Eyvazsız bir gün də ömr etmərəm,
Sel olar tökülər göz yaşım mənim!

Hanı ala gözlər qıyıla, süzə,
Şirin kəlməlləri yan-yana düzə.
De görüm hardadı, görünmür gözə,
Dar gündə köməyim, sirdaşım mənim?

Kürdoğluyam, göz açmadım qovğadan,
Şeşpərimdə kəllə, qılıncımda qan.
Heç zaman dönmərəm Eyvaz yolundan,
Bədənnən ayrılsa öz başım mənim!

Demədikmi Leyli xanım tutduğuna peşman olmuşdu. İndi qapının dalında durub öyrənmək istəyirdi ki, görsün bunun biri Eyvazdı, bəs biri kimdi. Amma içəridəki danışıqdan anladı ki, heç biri Eyvaz döyül, onu axtarırlar. Odu ki, qapını açıb girdi içəri, durdu maddım-maddım onların üzünə baxmağa.

Dəli Həsən hirsli-hikkəli dedi:

– Xanım qız, bu nə gizdənpaçdı biznən oynyursan? De görüm, Eyvaz hanı?

Leyli xanım işi bayaqdan anlamışdı, Eyvazın naməsini çıxarıb verdi Dəli Həsənə. Dəli Həsən naməni oxuyub gördü Eyvaz bura gəlməyib, harasa başqa səmtə gedib. Leyli xanım qasidin gördüklərini danışıb onu da uydurdu ki, qasid qayıdanda əmimin əlinə keçib, əmim əhvalatı biləndə, mən yaxşı tərpəndim, dedim işi tapşır özümə, onu bu evə salıb od vurum. İndi gərək sizi bir təhər eləyəm, səhəri gözləyək, görək nə olur. Qız bunları deyib qapını bağladı, getdi. O, təzəcə qapıdan aralanmışdı ki, qapının dalında ayaq səsi eşidildi. Asdan paşa qapının dalından qürrəli-qürrəli, tənəli-tənəli dedi:

– Ayə, Eyvaz! Bala, axı mən o Koroğlunu mərd-comərd eşitmişdim, deyəsən axı deyiləncən yoxuymuş. Bəyəm heç utanıb qızarmadı ki, bir paşa qızının əvəzinə iki gədə oğlunu göndərdi mənim cəngimə? Özü də gədə oğludu da! Bəyəm, nanəcib fikirləşdi ki, səni kimi yüz qarğanın başını bir yalağa kəssəm, mənim ürəyim soyumaz?! Gərək özü gələydi o qorxaq!

Sözdər Kürdoğlunu çəkdi ərşi-fələyə. Genə qapıya əl atmaq istədi, Dəli Həsən aman vermədi, paşaya cavab qaytardı:

– Paşa sağ olsun, ürəyini niyə sıxırsan? Belə tez tov olma. Bil ki, Koroğlu sən deyənnən deyil, nanəcib, qədrnaşünas deyil. O, Məhbub xanımın qədr-qiymətini sənnən yaxşı bilir. Ona görə də özü səhər yeddi min yeddi yüz yetmiş yeddi dəliynən sənin qulluğuna təşrif buyuracaq, qonağın olacaq. Bizi xəbərə göndərib ki, hazırlıq görəsən!..

– Noolu! Nə deyirəm! Qoy gəlsin. İndi ki, siz belə üzüyola, buyruq bitirənsiniz, mən də əziyyət verim, göndərim o dünyaya-cəhənnəmə. Ora da xəbər verin, hazırlıq görsünlər, səhər Koroğlunu da ora göndərəcəyəm...

Paşanın tapdığı bu sözlər ürəyinnən olsa da, ürəyi üstündə durmur, dizləri əsirdi. Odu ki, tələsik əkilib əmr elədi ki, qız evə od vursun.

Aralığa təzəcə sükut çökmüşdü ki, Leyli xanım girdi içəri. Dəli Həsən dinmək istədi, aman vermədi. Onları aparıb gizlətdi, evə od vurdu. Ev yandı.

Asdan paşa bir yandan rahat oldu, sevindi ki, bunun əvəzində xotkardan ənam alacaq, adı dillərdə gəzəcək. O biri tərəfdən də canına düşən üşütmə, ürəyinə də titrətmə salmışdı. Qorxurdu ki, Koroğlu səhər doğrudan da gələr. Odu ki, qoşununu ikiyə böldü, bir hissəsini şəhərdən kənarda pusquda qoydu, bir hissəsini də şəhərdə saxladı ki, Koroğlu gəlsə, iki tərəfdən həmlə eləyib bir iş görsün.

Leyli xanım arxayınlayandan sonra gəldi Dəli Həsəngilin yanına. Fikirləşib səhəri gözdəməli oldular. Xəlvəti yollarda adam qoydular ki, Eyvaz gəlsə, xəbər versin.

Çənlibeldə gecə yarıdan keçəndə Koroğlu duruş gətirə bilməyib hay vurdu, dəlilərin üç mini at belinə qalxdı. Halaypozanı Çənlibeldə qoyub düşdü yola. Gün çeşt yerinə çatmamışdı ki, yetişdi Ruma. Şəhərə yaxınlaşanda fikirləşdi ki, belə getsə, paşa uşaqları qırar. Odu ki, hay vurdu, hamı atdan endi. O istəyirdi ki, dəlilərdən bir neçəsini şəhərə göndərsin, qəfildən, paşanın şəhərdən kənarda pusquda qoyduğu qoşun hücuma keçdi. Hücum elə qəfil oldu ki, az qaldı dəlilər özlərini şaşırsın. Koroğlu işi belə görəndə bir dəli nərə çəkdi:

Düşmən qəfil hücum çəksə,
İgid gözün silsin gərək!
Başı bədəndən getməmiş
Ata minə bilsin gərək!

Dəmirçioğlu keçsin yana,
Əgər canı batsa qana,
Qoymasın qan laxtalana,
Dodağıynan silsin gərək!

Koroğlu sel tək çağlasın,
Kimlərə umud bağlasın,
Ya budu ki, qan ağlasın,
Ya düşmənlər gülsün gərək!

Dəlilər qızıl quş kimi atların belinə qonanda söz hələ tamamlanmamışdı. Onlar özlərini vurdular qoşuna. Amma genə gözlənilmədən şəhər yannan qoşunun həmləsi başdadı. Koroğlu baxdı ki, budu Asdan paşa qoşunun qabağında gəlir. Mühasirəni yadınnan çıxardıb paşaya üz tutdu:

Asdan paşa, tez xəbər ver,
Paşa, xan Eyvazım hanı?
Hayqırram şəhrin talanar,
Paşa, xan Eyvazım hanı?

Dörd gündü gəlib Eyvazım,
Zimistana dönüb yazım.
Mənim tərlanım, şahbazım,
Paşa, xan Eyvazım hanı?

Gəlmir Kürdoğlunun səsi,
Keçib Həsənin vədəsi.
Təzə açan gül dəstəsi,
Paşa, xan Eyvazım hanı?

Paşa gərdənini çəkib dinmək istədi, Koroğlu aman vermədi:

Göydən ildırım tökdürrəm,
Daşın-torpağın çəkdirrəm,
Yurdunda soğan əkdirrəm,
Paşa, xan Eyvazım hanı?

Peymanam dolhadoldadı,
Dəlilər sağı-soldadı,
Nigarın gözü yoldadı,
Paşa, xan Eyvazım hanı?

Eyvaz Çənlibelin gözü,
Sinənə qoyaram közü.
Budu Koroğlunun sözü
Paşa, xan Eyvazım hanı?

Asdan paşa Koroğlunun dəlilərini mansırada görüb lovğa-lovğa qırıldadı:

– Koroğlu, heç tələsmə! Bu saat göndərrəm səni onların yanına.

Söz paşanın ağzında qaldı. Qəfildən Tüpdağıdan özünü qoşuna vurub qırğı sərçəni götürən kimi, onu yəhərdən götürdü. Özünü başsız görən qoşun düşdü pərən-pərənə. Dəlilər onlara bir gəliş gəldilər, bir gəliş gəldilər ki, dilnən demək müşküldü. Qırılan qırıldı, qalan aman istədi, aman aldı. Ara sakitləşəndə Tüpdağıdan paşanı gətirib qoydu Koroğlunun qabağında yerə. Koroğlu soruşdu:

– Namərd, de görüm uşaqlar hanı?

Paşa gördü ölüm ayağıdı, özünü bir azca bərkitdi:

– Heç qışqırma, Koroğlu! Mən sənin əsirinəm. Amma bil, sən bir də o uşaxlar ki, deyirsən, onları görməyəcəksən. Yandırmışam onları...

Hamının üstünə su ələndi. Koroğlunun gözləri qızardı, nəfəsi daraldı, qılınca əl atanda, bıy, bir də gördülər Dəli Həsəngil budu yanlarında da bir qız gəlirlər. Amma Eyvaz yanlarında yoxdu. Asdan paşa işi belə görəndə bir boy kiçildi, başını bulayıb dedi:

– Mənim düşmənim ocağımın qırağındaymış!..

Kimiydi paşanın sözünü eşidən. Koroğlu üzünü Dəli Həsənə tutmuşdu:

Dəli Həsən, tez cavab ver,
Hanı Eyvazım görünmür?
Xar almasın güllərimi,
Baharım, yazım görünmür!

Eyvaz gələli dörd gündü,
Sinəmdə dağdı, düyündü.
Ürəyim çatlayır indi,
Hanı Eyvazım görünmür?

Koroğlu kimnən soruna,
Xanlar bələddi zoruna.
Düşməsin paşa toruna,
Hanı Eyvazım görünmür?

Söz tamam oldu, Dəli Həsən irəli gəlib əhvalatı danışdı, Eyvazın naməsini o da verdi Koroğluya. Qasidi də gətirdilər. Qasid yolda gördüklərini bir də Koroğluya danışdı. Bilindi ki, Eyvaz başqa səmtə gedib. Koroğlunun ürəyi yaman darıxdı. Elə bil ümidi üzülmüşdü, üz tutdu dəlilərə:

Bu gün itirmişəm Eyvaz balamı,
Yazın, Təkəlidən görən olubbu?
Eyvazsız neylərəm dünya malını,
Yazın, Təkəlidən görən olubbu?

Almazdan qılıncdı, poladdan yeyə,
Çeynərəm dəmiri üfürrəm göyə.
Kim sorağın verə, kim yerin deyə,
Yazın, Təkəlidən görən olubbu?

Ah çəkərəm, of demərəm dilimnən,
Bir bülbüləm, ayrılmışam gülümnən.
Bir tərlanım uçub Çənlibelindən,
Yazın, Təkəlidən görən olubbu?

Dinmir, sınıq düşüb sazım, ay haray!
Zimistana dönüb yazım, ay haray!
İtkin düşüb xan Eyvazım, ay haray!
Yazın, Təkəlidən görən olubbu?

Koroğluyam, daha yetişdim cana,
Qızaram şir kimi girrəm meydana.
Elərəm dünyanı verdi-verana,
Yazın, Təkəlidən görən olubbu?

Söz tamam olanda Dəli Həsən qırağa yeridi:

– Koroğlu dayanmaq vaxtı döyül, tədbirini de!

Koroğlu dedi:

– Belə görünür ki, Eyvaz ya Qarsa gedib, ya da Bayazidə. Sən Dəmirçioğluynan bir dəstə götür üz tut Qarsa, mən gedirəm Bayazidə. Əgər Qarsda olmasa tez qayıdın Çənlibelə.

Koroğlu Asdan paşanı, qasidi, bir də Leyli xanımı tapşırdı Tüpdağıdana, bir neçə də dəli verib tapşırdı ki, aparıb Çənlibeldə məni gözlərsən. Dəstələr üz tutdular hərə bir səmtə.

Koroğlunun dəstəsi heç şəhərdən üzülməmişdi, bir atlıynan qabaqlaşdı. Atlı Koroğluya yaxınlaşıb soruşdu:

– Soruşmaq ayıb olmasın, ay qardaş, siz kimsiniz, səfəriniz hayanadı?

Koroğlu baxdı ki, bu sözdü adama oxşayır, özünü nişan verdi. Atlı kövrəldi, ağlamsına-ağlamsına dedi:

– Eyvazdan xəbərin varmı, ay Koroğlu?

– Eyvazı itirmişəm. Xəbər səndədi, tez söylə.

– Eyvazı Bayazid paşası Mahmud paşa salıb zindana, xəbərini göndərib Xotkara. Mən ordan sırağagünnən çıxmışam. Amandı, özünü yetir...

Deyillər Koroğlu bir dəli nərə çəkdi, yeddi ağaclıqda Dəli Həsənnən Dəmirçioğlunun dəstəsi eşidib geri döndü. Koroğlu atın yüyənini boşdadı. Yüyəni boş görən Qırat qanadlandı...

Qırat dönsün qanadlı tərlana, gəlin, biz görək Bayaziddə nələr oldu.

Mahmud paşa xotkara göndərdiyi qasidin yolunu iki gün gözləyə bildi. Amma üçüncü gün gözləməyə təhəri olmadı. Xəbərin üstündən xəbər çatdı ki, bəs Bayazid mahalında nə qədər əli qılınc tutan igid varsa, yığılıb sözbir eləyiblər ki, zindanı dağıdıb Eyvazı qaçırsınlar.

Paşa işini nə qədər sahmannadı, özünü toxtaq saxladısa, day üçüncü gün duruş gətirə bilməyib günorta namazınnan sonra bütün yaxın adamlarını yığıb tədbir istədi.

Yığılanların içində Qoçu Mehdi də varıydı. O, paşanın qeydinə qalanı, canı yananı, dil biləni, tədbir tökəniydi. Qoçu Mehdi tamahda Adəmi, paxıllıqda qurdu, kində dəvəni, hiylədə tülkünü suya susuz aparıb susuz qaytarardı.

Mahmud paşa hərənin tədbirinə bir qulp taxıb axırda Qoçu Mehdinin üzünə baxdı. Qoçu Mehdi dedi:

– Paşa sağ olsun. Bizim xotkardan cavab gözdəməyimiz nahaqdı. Xotkar Eyvazı aparıb ordusuna sərkərdə eləyəsi deyil ha. Ona bunun ölüsü lazımdı. Sənnən ya başını istəyəcək, ya da leşini. Onu sağ saxlamaq zərər gətirər. Lazımdı ki, Eyvazın səsini, nəfəsini kəsib cavab gözləyək. İndi hər yerinnən qalxan gədə Koroğlunun adına iş görmək istəyir.

Paşa dinmək istədi, Qoçu Mehdi qoymadı:

– Bilirəm nə deyəcəksən. On nəfər qoluzorru adam var. Gecə ikən dar ağacını qurum, asım onu. Səhər də xəbər yayım ki, gecə qaçırmış, keşikçilər tutub asıb.

Paşa tədbiri bəyəndi, hamı afərin dedi. On nəfər pəhləvan ayrıldı, Qoçu Mehdi oldu onlara sərdar. Tapşırıldı ki, o nə desə əməl eləsinlər.

Məclis dağılanda, paşa Qoçu Mehdini tək saxlayıb aranı xəlvət eləyəndən sonra dedi:,

– Sənin kamalına əhsən. Mehdi, Allah göydə şahiddi ki, sən mənim ürəyim, dirəyimsən. Mən hər sirrimi, işimi sənə etibar eləyirəm. Bilmiyən bitməz, sən də sağ ol, yaxşı tərpənirsən. Amma bilirsən ki, bu iş başqa işdərə bənzəməz. Burda ehtiyat gərəkdi. Əvvəla, budu ki, o dələduzu eləcə qandallı-zaddı as, qoy xata-matası olmasın...

Qoçu Mehdi dinmək istədi, paşa aman vermədi:

– Sözümü kəsmə. Yaxşı qulaq as! O, gözlərini qıyıb ağzını Qoçu Mehdinin qulağına yaxınlaşdırdı, – Mən sana özgə bir iş də tapşırıram ki, bu iş Eyvazın işinnən çətindi...

Qoçu Mehdi qoqezdənib yaltaqlandı:

– Mən canımı sənin yolunda qoymuşam, paşa.

– Canın sağ olsun! Bu fürsəti əldən vermək olmaz... Gərək bu gecə, sənə sirr verirəm ha! Hə, gərək bu gecə Kankanoğlunu da Eyvaznan bərabər asasan! Səhər də belə xəbər yayarsan ki, gecə zindana basqın eliyif Eyvazı qaçırırmış, keşikçilər ikisini də tutub asıb. Bəlkə ondan canım qurtara, xotkarnansa da qohumluğum baş tuta. Özün görürsən ki, ayağıma çidar olub, mənim amanımı qırıb. Elin zəhminnən də bir bəhanə tapıb aradan götürə bilmirəm. Əsil fürsətdi, başına dönüm, Mehdi! Amma gərək...

Qoçu Mehdi aman verməyib əlini gözünün üstünə qoydu:

– O da bax, bu gözüm üstə! Mənim qibləm! Sən də yaxşı bilirsən ki, nə qədər canımda can var, sənin qulluğundayam. Allah qoysa, səhər ikisini də dar ağacında görərsən. Amma...

İndi də paşa Qoçuya aman vermədi:

– Mənim bütün var-dövlətim sənindi! Allah qoysa, sədrəzəmlik əlimə keçən kimi, Bayazidin paşası sənsən!

Qoçu Mehdi istədi çıxsın, paşa dayandırdı:

– Day bilmirəm, Mehdi! Gərək elə eləyəsən ki, səhərə qədər onun tutulduğunu heç kəs bilməyə. Həm də işini indidən elə qur ki, birdən bir yana gedər, əldən çıxar...

Qoçu Mehdi paşanı lap xatircəm eləyib çıxdı. O, əl altınnan öyrəndi ki, Kankanoğlu bir at minib şəhərdən çıxıb, piyada qayıdıb bir at da minib gedib həmin yolnan. Demədikmi Qoçu şeytana altı yox papış

tikərdi. Bildi ki, nəsə burda var, Kankanoğlu bir də qayıdacaq. Həmin yolda pusqu qurdu.

Axşamtərəfiydi. Günəş dağların dalına can atır, Kankanoğlu da şəhərə tələsirdi. Elə qan-tərin içində, şəhərin girəcəyindəki dərəyə enəndə, qəflətən başına palaz atıb tutdular, əl-ayağını sarıyıb götürdülər!..

Kankanoğlu o zaman gözünü açdı ki, zindanda Eyvazın yanındadı. Əl-ayaq yığışıb şəhər yuxuya gedən kimi Qoçu Mehdi başdadı işə. Dar ağaclarını hazır elədi. Gecə yarıdan keçər-keçməz, adamlarıynan gəldi zindanın yanına. Onlara dedi:

– Bax mənim işim zindanın qapısını açmaq, sizin işiniz də, beş bir-beş bir onları qamarrıyıb elə qandallı-mandallı götürüb asmaqdı. Aman verməyin ha!

Qoçu Mehdinin adamları onun dediyinnən də cəld tərpəndilər, qapı açılan kimi, qorxulu-qorxulu ikisini də götürdülər, asdılar...

Xoruzlar bannaşıb obaşdanı xəbər verəndə Mahmud paşaya xəbər verdilər ki, xotkardan qasid gəlib. Paşa tələsik onu yanına gətirtdirdi. Qasid tələsdiyindən salamı da unutdu, xotkarın əmrini verdi paşaya. Paşa oxudu: “Mahmud, Eyvazın başını kəs, tez göndər gəlsin! İşi ləngitmə!”.

Paşa tez əmr elədi ki, qasidi aparıb rahat eləsinlər. Əl altınnan da tapşırdı ki, məst eləyin, dünyadan xəbəri olmasın.

Qasidi başınnan eləyən kimi, paşa Qoçu Mehdini çağırtdırdı.

– De görüm, neyləmisən?!

Qoçu Mehdi bərkdən şaqqanaq çəkib güldü, uğuna-uğuna dedi:

– Ay canı sağ olmuş! Day nə var neyliyəm! Sağlığına, ikisini də tənablamışam gecə yarıdan! Sən arxayın yat. And olsun o Qurannan əziz başına, ürəyi bir toyux ürəyicən yoxuymuş! Afərin mənim zəhmimə! Elə ki, qapını açdım, zəhmimnən ikisi də birdən “vay dədə!” elədi, huşunu itirdi. Hayıf ki, Eyvaz asılanda da bilmədi ki, analar necə oğullar doğub!..

Mahmud paşa sevindiyinnən onu qucaqladı, basdı bağrına:

– Afərin, a bəxdəvər! İndi iş ayrıdı: bu saat xotkardan adam yetişib. Xotkar əmr eləyib ki, Eyvazın başını kəs göndər. Gör yığvalımız nə dərəcədə kəsərridi ki, qasid indi gəlib. Səhər gəlsəydi, işi biləcəkdi, Xotkarın yanında olardıq bədnam. Mən də məst elətdirmişəm onu. İndi durma, a Bayazidin gələcək paşası. Tez Eyvazı endir, kəs başını, qırmızı bir xonça bəzə, qoy içinə, göndərək Xotkara...

Qoçu Mehdi soruşdu:

– Bəs Kankanoğlunu neyliyim?

– Həəə! Şaddığımnan lap başımı itirmişəm. Heç denən qasiddən bizim Bəhlulu soruşdummu?.. Hə, onu tək dar ağacında qoymaq olmaz. Yendir, baş-gözünü bərk qılıncla, at zindanın yanına. Səhər də xəbər yay ki, zindana basqın eləyib, keşikçilər öldürüb. Paşa gülə-gülə bir gözünü qıydı, – bir keşikçini də qurban elə ona!..

Qoçu Mehdi istədi çıxsın, paşa dayandırdı:

– Eyvazın bədənini as şəhərin alaqapısınnan, qoy bir gözdağı olsun qudurğannara!

Qoçu Mehdi getdi, paşa necə tapşırmışdı, elə də elədi.

Bəli, mənim əzizdərim! Koroğlu Bayazidə o zaman yetirdi ki, Eyvaz olub başsız bədən, asılıb şəhərin alaqapısınnan...

Koroğlu ola, Eyvazı belə görə!.. Dünya çarx oldu dolandı başına. Atdan aşırıldı, meyitin qıçalarını basdı bağrına...

Paşaya xəbər çatdı. Paşa hazır saxladığı qoşunu yeritdi.

Koroğlu o zaman başını qaldırdı ki, Qırat adam kimi döyüşdədi. Baxdı ki, hər tərəf ətdən qat-qat qaladı. O, qızmış nər kimi özünü ata yetirdi. Amma hansı tərəfə yönəldisə, özünə yol aça bilmədi. İşi bərk çətinə düşdü, ürəyi darıxıb telləndi. Eyvazı haraya çağırdı:

İşim yaman dara düşdü,
İmdadıma çat, Eyvazım.
Min Düratı, gəl hayıma,
Yalmanına yat, Eyvazım.

Dörd yanımdı ətdən qala,
Qolum tutmur qılınc çala.
Kürdoğluynan sağa, sola
Şeşpərini at, Eyvazım!

Al Koroğlu sədasını,
Keç dəryalar adasını,
Paşasını, gədasını
Bir-birinə qat, Eyvazım!

Bu dəmdə Dəli Həsənnən Dəmirçioğlu yetişdi. Dəlilərin dəli nərəsi aləmə lərzə saldı. Paşanın qoşunu boğanağın qabağında burum-burum olan çör-çöp kimi bükülüb üz qoydu qaçmağa...

Koroğlu hay vurdu ki, paşanı tutub gətirin! Şəhər əhli ərz elədi ki, paşa çoxdan qaçıb. Koroğlu yaman bəd haldaydı. Dərdinnən, qəminnən, hirsinnən-hikkəsinnən huşu özündə döyüldü. Nərə təpdi ki, şəhərə od vurun. Dəli Həsən şəhərin ağsaqqallarıynan irəli yeridi ki, bəs şəhər əhlinin nədi günahı? Koroğlu yuxudan ayılan kimi olub özünə gəldi. Ağsaqqalların qabağında diz çöküb üzr istədi..

De şəhərin Koroğlunu istəyənləri yeriyib xahiş elədilər ki, meyidi ver, dəfn eliyək. Nə dəlilər razılaşdı, nə də Koroğlu.

İş belə olanda, bir tabut düzəltdilər, qara kəcavə bəzəyib cənazəni verdilər dəlilərin çiyninə. Biçarə dəlilər qəmdən dərya kimi dalğalana-dalğalana üz qoydular Çənlibelə.

Koroğlu bir müddət nə eyləyəcəyini, hayana üz tutacağını kəsdirə bilmədi. Dəli Həsənnən Dəmirçioğlu da qalmışdılar onun yanında. Haçannan haçana Dəli Həsən dedi:

– Koroğlu, day olan olub, keçən keçib. Artıq fikirdən bir kar yoxdu. Paşa da əldən çıxıb. Vaxt itirmə. Sür atını, gedək meyidimizi dəfn eləyək, sonra gəlib paşaynan da, xotkarnan da hesabımızı çəkərik.

Koroğlu dinməzcə, atının başını döndərib üz qoydu Çənlibelə. Qoy bunnar öz dərdiynən getməkdə olsun, gəl sana bir az da Təkə-Türkmannan Eyvazın ata-anasınnan danışım.

Elə ki, Qəssab Alı toydan qayıdıb Eyvazın gələcəyini xəbər verdi, biçarə Zərqələm arvadın gözdəri tikildi yollara...

Amma Eyvaz ləngidi. Hər gün, hər saniyə Zərqələmə bir il kəsildi. Yazıq ana həsrətə tablaşa bimləyib peşə elədi ağlamağı. Qəssab Alı Zərqələmi ha yubatdı ki, bu gün gələr, sabah gələr, əməl yemədi, Zərqələm kirimək bilmədi.

Bir səhər yenə Qəssab Alı mal-heyvanı rahatlayıb evə qayıdanda, qapıya çatmamış, Zərqələmin bayatısı ürəyinə hakim kəsildi:

Dağda ceyran melədi,
Bulud leysan elədi,
Çağırıram, gəlmirsən,
Eyvaz, vəfan belədi?!

Qəssab Alı baxdı ki, belə getsə, arvad yenə yatağa düşəcək. Gəlib təskinlik verdi:

– Ay arvad, axı niyə gözünün yaşını eliyibsən abu-leysan? Adam da sağ-sağ balasını ağlıyarmı? Kim bilsin, başları qarışıb hansı kefə? Bir ikicə gün də səbr elə, görək!

Yazıq ananın səbr eləməyə taqəti qalmışdımı ki? Gördü ki, heç Alının ürəyi onun ürəyi deyəni demir, ağlaya-ağlaya dedi:

Gözüm qalıbdı yollarda,
Bir balamı anaram mən.
Gələcək dedin, gəlmədi,
Od tutaram, yanaram mən.

Qəminnən düşdüm yatağa,
Balam keçmədi sol-sağa,
Dönmüşəm sarı yarpağa,
Uçub yerə qonaram mən!

Baxan yoxdu göz yaşıma,
Həsrət qaldım adaşıma,
Kimim dolansın başıma,
Pərvanasız fənaram mən!

Bülbülü tərk etmiş bağam,
Suyu qurumuş bulağam.
Yağsız yanan bir çırağam,
Külək əsər, sönərəm mən!

Zərqələməm, çox bədhalam,
Dilim söz gətirmir, lalam,
Mənim ki bircədi balam,
Niyə onnan kənaram mən!

Bu ah-nalə Qəssab Alının da ürəyinə od saldı. Baxdı ki, olası iş deyil, dedi:

– İndi ki, belə oldu, canın da bir az yaxşıdı, hazırlaşaq, gedək gəlin görümünə. Bir sən də Çənlibeli gör. Onda da uşaqları gətirib bir toy da burda elərik! – O, atmacadan da qalmadı, – indi Eyvazı qınıyırsan, qorxuram, Çənlibeli görənnən sonra ayağını dirəyəsən ki, getmirəm, qalıram burda!..

Zərqələmin gözünə işıq, dizinə taqət gəldi. Elə bil oldu təzə gəlin.

Bu xəbər yayıldı Təkə-Türkmana. Çənlibelə gəlin görümünə getmək ola, Təkə-Türkman eli ola! De Koroğlunu istəyən hazırraşdı!..

Üççə gündən sonra Qəssab Alı neçə-neçə qırmızı kəcavəsi olan çox böyük bir karvannan yol başladı Çənlibelə.

Karvanı görən belə hesab edərdi ki, Çin padşahı Hind padşahının qızını oğluna gəlin aparır!..

İş belə gətirdi ki, cənazəni gətirən dəstə Çənlibel ətəyinə çatanda Alının karvanı da çatdı...

Dəlilər dayanıb gözləyirdilər ki, Koroğlu gəlib yetişsin, bundan belə özü qabağa düşsün...

Qəssab Alı yaxınnaşanda, baxdı ki, budu, bir dəstə düşərgə salıb, özlərinin də qara kəcavələri var. Tez hay vurdu, karvan dayandı:

– Bunların yanından belə keçmək yaxşı deyil. Dərdlərini bilək, izn alaq, ondan keçək. Bəlkə kömək lazımdı!

Qəssab Alı irəli yeriyib xəbər aldı:

Xəbər alım, ər qardaşdar,
Kəcavəniz qara niyə?!
Qəlbi qəmli, gözü yaşdar,
Düşmüsünüz dara niyə?!

Kim görsə bu dərdə yanı,
Mərdə qurban namərd canı.
Uca dağların tərlanı
Dustaq olub sara niyə?!

Mənə deyin, qoç iyidlər,
Kimnən sizə dəyib xətər?
Həvəsnən bəsdənən güllər
Qismət olub xara niyə?!

Dərdinizi deyin bizə,
Kömək əli verək sizə.
Axı sizin dərdinizə
Tapılmayır çara niyə?!

Qəssab Alı baxdı heç kim dinmir, yerinnən tərpənib cavab vermir. Bildi dərdləri ağırdı. İzn almaq istədi, amma sözü belə çıxdı:

Alı burdan aralıdı,
O xəstəniz haralıdı?
Ölüb, yoxsa yaralıdı,
Ona dəyib yara niyə?!

Dəlilər bayaqdan tanımışdılar onu. Amma kimin nitqi gətirirdi ki, dinə, kimin qədəmi tuturdu ki, irəli yeriyə, cavab verə?!

Elə bu dəmdə Koroğlu yetişdi. Gördü nə! Qəssab Alı! Onun qırmızı kəcavəli karvanı!.. Atdan aşırılıb, Qəssab Alını aldı qollarının arasına... Hər gözünnən bir damcı yaş süzülüb yendi bircə günün içində gözlərinin altında dağ kimi baş qaldırmış alma sümüklərinin üstünə... Deyillər ki, anadan olannan bu günə kimi Koroğlunun gözündə görünən yaş buydu!..

O saat Qəssab Alının ürəyinə damdı ki, iş Eyvazın başındadı. Amma bilmədi ölüb, yoxsa yaralıdı. Baxdı ki, Koroğlu yaman bəd haldadı. Özünü toxdadıb o da qollarını doladı Koroğlunun boynuna. Sonra bir az geri çəkilib xəbər aldı:

Aç söylə sirrini, bilim dərdini,
Cümlə iyidlərin başı, Koroğlu.
Deyillər, gedəndə düşman üstünə,
Qoymaz daş üstündə daşı Koroğlu!

Koroğlu ürəkdən gələn yanıqlı bir ah çəkib Qəssab Alının cavabında dedi:

Xəbər alma, Qəssab Alı, dərdini,
Zəhərnən yeyibdi aşı Koroğlu:
Yüz il paşalara al eyləyibdi,
Axırda olubdu naşı Koroğlu!

Qəssab Alı dedi:

Qoyar dost yolunda başı, canını,
İçər ovçu ilə düşman qanını.
Yıxar paşaların xanimanını,
Bir dəfə oynatsa qaşı Koroğlu!

Koroğlu dedi:

Daha bunnan belə açarmı qalı
Sınıq qanad laçın olmaz havalı.
Baxdı yatıb, üz döndərib yığvalı,
Tökübdü qabağı-qaşı Koroğlu!

Qəssab Alı anladı ki, Koroğlunun dərdi çox böyükdü, amma nədənsə, açıq demir. Odu ki, onun gözdərindəki yaşa işarə elədi, bildi ki, düyün bunnan açılacaq:

Qəssab Alı üz tutubdu dağlara,
Qəsdi var, iyidlər yurduna vara!
İyid qovğa günü alsa, min yara,
Axmaz gözdərinin yaşı, Koroğlu!

Koroğlu yenə bir ah çəkdi. Elə ah çəkdi ki, əgər bu ahın alovu, odu olsaydı, dağlar bir göz qırpımında əriyib suya dönər, dəryayi-ümmanlar da buxara çevrilib göyə çəkilərdi. Yox, əgər bu ah tüstülü olsaydı, dünyanın üzündə bir il göz-gözü görməzdi. O, əllərini sinəsində çarpazdadı, yazıq görkəm aldı, istər-istəməz, yavaş-yavaş dedi:

Sinəmin başınnan kaman qurulsa,
Göz qırpmaram, min bir yara vurulsa.
Hanı amanatım? – deyə sorulsa,
Qan tökər gözünnən yaşı Koroğlu!

Bu yerdə Qəssab Alı nə qədər elədisə, özünü saxlaya bilmədi. Cumdu qara kəcavənin üstünə. Kəcavəni qucaqlayıf dedi:

Ay ağalar, ay qazılar,
Yatan Eyvaz xan olmasın!
Sinəsində dərin yara,
Ürəyində qan olmasın!

Maralsız olmasın çölüm,
Sonasız qalmasın gölüm,
Mana gəlsin gələn ölüm,
Eyvaz yuxudan olmasın!

Yazıq canım düşdü dərdə,
Ahım qalxır pərdə-pərdə,
Qılınc vursun mərd namərdə,
Arada şeytan olmasın!

Xudam buyurmasın fərman,
Dostuma gülməsin düşman.
Xeyir işə gedən karvan
Mənzildə peşman olmasın!

Alı olmaz ahı-zarsız,
Dağ başı qalmasın qarsız!
İyid qalda havadarsız,
İyidsiz meydan olmasın!

Bu yannan da Təkə-Türkmanın iyidləri Qəssab Alının belə ləngidiyini görəndə, yeridilər irəli görsünlər bu nə işdi...

Qəssab Alı hayqırdı ki, qayıdın kəcavələri qara bəzəyin!

Onnar qayıdıb kəcavələri qara bəzəyəndə, yazıq Zərqələm elə bircə dəfə “uuyy” elədi, huşunu itirdi.

Qəssab Alı yazıq ananın bu halına tab gətirməyib qara kəcavəni səslədi, əlini göylərə qaldırdı:

Xudaya, əcəlin mana yetişsin,
Eyvaz təzə bitib, boya gəlibdi!
Bir möcüzə görsət, balam oyansın!
Deyim ki, ərənnər hoya gəlibdi!

Anan həsrət qaldı gül camalına,
Baxa bilməz sənin belə halına!
Əlacı kəsilib, düşüb dalına,
Qalx, Eyvazım! Anan toya gəlibdi!

Qəssab Alı ahu-zarda qalıbdı,
Bala dərdi onu oda salıbdı.
Görəydim, namərdmi tora salıbdı,
Yoxsa mərd qılıncı soya gəlibdi?!

Qəssab Alı sözünü tamam elədi. Özünü toxtatdı. Baxdı ki, Koroğlunun halı hal döyül, başınnan duman qalxır. Onun qolunnan tutdu:

– Koroğlu! Sən dünya görmüş adamsan. Özün bilirsən ki, təqdirə tədbir yoxdu. İşdi, olub keçib. Atalar deyib ki, su sənəyi suda sınar. İyid yaranıb ki, qalda yaralana, davada ölə. Hələ Allahın yazısını pozan olmuyub. Bizimki də belə yazılıbmış. İnsan gərəkdi ki, naşükür olmuya! Şükür xudanın dərgahına! Budu, Kürdoğlu qabağdadı. Qoy indi o olsun ikimizin də oğlumuz. Xiffətnən heç nə hasil eləmək olmaz. Tapşırıq ver! Sür atını qabağa! Aparaq meyidimizi qoyaq haqq öyünə!..

Koroğlu dinməz-söyləməz, sürdü atını qabağa. Qəssab Alı da göstərişdər verib, atını sürdü onun atının yanına...

De çatdı xəbər Çənlibelə!.. Hamı dəydi bir-birinə. Bircə anda qızıl qan ağ buxaqlarda çiçək açdı. Fəryad Çənlibeli yırğalamağa başladı!..

Cənazə yaxınlaşanda, Aşıq Cünun qabağa yeridi, əlini qulağına verdi:

Mən aşığam, ala bax,
Yaşıla bax, ala bax.
Yüz il al işdədən ər
Bu gün düşüb ala, bax!

Mən aşığam, yanana,
Ya nəməkə, ya nana,
Eyvaza ox dəyibdi,
Ağla, qardaş, yan, ana!

Nigar xanım əlləri qoynunda, batmış səsnən deyirdi:

Əzizim Eyvaz hanı?
Xan balam Eyvaz hanı?
Başım yaman ağrıyır,
Çağırın Eyvaz xanı!..

Biçarə Zərqələm huşa gələn kimi olmuşdu. Oturduğu qara kəcavənin içində əllərini qabağa uzadıb yalvarırdı:

Əzizim, amanata,
At verməz aman ata,
Koroğlu, xayın olma,
Verdiyim amanata!

Eləmi, yarı gəlsin,
Sürülər yarı gəlsin,
Qoxusun onnan allam
Balamın yarı gəlsin!

Qəssab Alı baxdı belə getsə, meyidin götürülməsi ləngiyəsidi, yenə Koroğluya üz tutdu:

– Koroğlu! Sana dedim ahu-zar eləməyin faydası yoxdu. Meyidin ləngiməsi yaxşı deyil. Axı ölüm çoxdandı. Tapşırıq ver, qoy meyid götürülsün.

Koroğlu tapşırıqlar verdi. Meyidi götürdülər.

Tabut qəbristannığa yetdi. Elə ki, onu məzara sallamalı oldular, Qəssab Alının ürəyi tab gətirmədi. Özünü saxlaya bilməyib şikayətləndi:

Zalım fələk mənnən düşdü bərəstə,
Meydanda üz-üzə durdu, ay haray!
Namərdlik elədi, alnan apardı,
Qolumda torunu qurdu, ay haray!

Bədbəxtlikdə canım dünyada təkdi,
Gündə mana yedirdiyi kötəkdi.
Oxunu düzəltdi, yayını çəkdi,
Sinəmin başınnan vurdu, ay haray!

Eyvaz, məni yalqız qoyma, amandı,
Axı bala dərdi çəkmək yamandı?
Qəssab Alı köçür, axır zamandı,
Bala dərdi onu yordu, ay haray!

Bu zaman Hürü xanım qəflətən atdı özünü tabutun üstünə, yana-yana dedi:

Heç kim belə insafsızlıq eləməz,
Bəs sən eyləyirsən nədən, ay Eyvaz?
Bu fələk zülmünə, haqq sitəminə
Tab etməz, əriyər bədən, ay Eyvaz!

Fələk şuxluğumu əlimnən aldı,
Ahıma baxmadı, göyə ucaldı.
Pərvaz eyləməmiş torpağa saldı,
Eylədi bağrımı zədən, ay Eyvaz!

Hürünün əlinnən getdi ixtiyar,
Nə vaxtacan ah eyliyər, ağlıyar?
Amandı! Məni də özünnən apar,
Üz döndərib yalqız gedən, ay Eyvaz!

Yazıq qız balaca xəncərini sinəsinə çaxanda tutdular. İncavara yara az oldu.

Koroğlu bu yerdə lap qeyzə gəlib dedi:

Koroğlu bu günnən keçir başınnan,
Bu xəbər hər yerə yazılsın gərək.
Talan düşsün paşaların varına,
Əlləri əllərdən üzülsün gərək!

Yeriyin, iyidlər, meydan başına,
Zəhər qatın siz xotkarın aşına.
Əl uzadın torpağına, daşına,
Onun cahcalalı pozulsun gərək!

Koroğlu ölməyib, yaşayır hələ,
Hoydu, dəlilərim verin əl-ələ,
Eyvazın qatili tez keçsin ələ,
Gözdərinə millər düzülsün gərək!

Koroğlunun səsi dağları, daşları lərzəyə salsa da, olan olmuşdu. Noolasıydı, meyiti tapşırdılar məzara.

İzdiham yavaş-yavaş qəbirstanlıqdan çəkilirdi. Yolda Bəlli Əhməd yanaşdı Dəmirçioğluna:

– Ayə, Dəmirçioğlu, bir sirr mənim qarnımı yırtır axı!..

Dəmirçioğlu qəmli-qəmli baxdı onun üzünə:

– O nə sirrdi elə, Bəlli Əhməd?

Bəlli Əhməd duruxdu. Dəmirçioğlu onun gözdərinin içinə baxanda dedi:

– Acığın tutmaz ki?

– Niyə tutur, de.

Bəlli Əhməd udqundu. Dəmirçioğlu qaşdarını çatdı:

– Oxunu atıb yayını niyə gizdədirsən?

– Vallah, ay qardaş, məni qınama...

Dəmirçioğlunun səbri tükəndi:

– Di, din görüm!

Bəlli Əhməd gözdərini onun gözünə dirədi:

– Belə, biz ki, bu qəbrə tapşırdıq, bu, Eyvaz deyildi!..

Dəmirçioğlunun gözdərinə qaranlıq çökdü. Bir xeyli dinə bilmədi. Gecdən-gec dedi:

– Bu nə sözdü, Əhməd! Ağlın başındadı?!

Bəlli Əhməd onu belə əzaba salmağına, dərdini artırmağına peşman olsa da dedi:

– Vallah, qardaş, nə deyirsən de, bu qəbrə qoyulan Eyvaz deyildi. Yadındamı, durna teli gətirməyə gedəndə Bağdad bağlarında bulağın başında oturmuşduq. Eyvaz qollarını çırmalayıb kabab çəkirdi. Sən dedin ki, Əhməd, görürsənmi, Allah qüdrət qələmini birinci dəfə çəkəndə Eyvaza ziynət verib! Gör o biləyindəki qoşa xal ona nə yaraşıq verir?!

Dəmirçioğlunun qaşları lap çatıldı:

– Noolsun ki?

– Dayan də! Meyit yuyulanda suyu mən tökürdüm, o xallardan bir nişana yoxuydu.

Dəmirçioğlu köks ötürdü:

– Ağzına su al! Koroğlu bu sözü eşitsə bağrı çatdar. El səni daş-qalaq elər. Əvvəla, bu söz gecdi. İkincisi də, sənin fəhminə nə gəlib? Bəyəm baxmadın ki, meyit qapqara yanmışdı? Belə görünür ki, əvvəlcə asıblar, sonra başını kəsiblər. Asılan bədəndə ağ yer qalarmı onda xal bilinə?

Bu sözdər Bəlli Əhmədi susdurdu. Deməyə sözü olmadı...

Deyillər, Çənnibeldə çöp başı qalmadı, hər yeri qara bəzədilər. O gecə səhərəcən dəlilərin zümzüməsinnən, Cünunun bayatısınnan, xanımların ağusunnan, atdarın kişnəməsinnən yer-göy bir-birinə qovuşub ləbbey dedi, təkcə Koroğlunun səsi çıxmadı.

Səhər açıldı. Səhər həmişə üzünüzə xeyirriynnən açılsın. Hamı yığılmışdı Koroğlunun başına. Qəssab Alı da, Aşıq Cünun da tapşırmışdı ki, bəlkə onu dindirə biləsiniz...

Dəli Həsənnən Dəmirçioğlu gördü ki, ehtiyatsızlıq eliyiblər, axşamnan bəri bərə-bəndərgahın hamısı boş qalıb. Düşmən gəlib ayaq almazmı?..

Onlar məsləhətdəşib dəlilərdən bir neçəsini göndərdilər qaravul-xanalara. Tüpdağıdan da Ağqayaya getməli oldu. O, başı sinəsində qəmli-qəmli gedirdi. Bir də o zaman qaldırdı ki, budu, At düzündə yəhərri-yüyənni atdar görünür. Qədəmlərini bərkidib o zaman çatdı ki, bəs budurana bir məlәkdi, hürüdü, pəridi, qılmandı, nədi bilmirəm oturub Eyvazın başını alıb dizinin üstünə, bir div gövdəli pəhləvan da onun üzünə su səpir. Quruyub qaldı yerində. Baxdı ki, ürəyi az qalır ağzınnan çıxa! Allah, bu nə sirr ola! Birdən ağlına gəldi ki, bu yuxudu, Eyvazı yuxuda görür. Baxdı ki, Eyvaz ayrı paltardadı, qolu da sarıqlıdı, yaraq-yasağı da yoxdu. Gözdərini gəzdirdi ki, Ərəbat da atdarın içində yoxdu. Əlyəqin elədi ki, yuxuda görür Eyvazı. İndi qorxusunnan

gözünü qırpmırdı ki, yuxum dəyişər. Eyvaza doyuncan baxmağa çalışırdı. Birdən baxdı ki, Eyvaz yavaş-yavaş gözdərini açdı, başını tərpətdi, qalxmaq istədi, Tüpdağıdanın ürəyi də tərpənib telləndi, öz-özünə dedi:

Ay ağalar, Eyvaz belə,
Sağ olaydı, ayılaydı.
Görünəydi günəş üzü,
Çənlibelə yayılaydı.

Gecə dönəydi gündüzə,
Gözdərim baxaydı gözə,
Başdıyaydı şirin sözə,
Yenə biznən sayılaydı!

Tüpdağıdan həsrət çəkər,
Eyvaza qurban olsun sər.
Beləcə duraydı səhər,
Mənim bağrım oyulaydı!

Səsə Eyvaz durub oturdu. Ayağa qalxmaq istəyəndə pəhləvan zamın oldu. Qalxıb asta-asta yeridi Tüpdağıdana tərəf. Tüpdağıdan kirpiyini qırpdı, gözünü açdı ki, Eyvazdı. Gözlərini silib baxdı ki, Eyvazdı, yeriyir ona sarı. Birdən geri dönüb başdadı qaçmağa...

Bu yanda bir də gördülər ki, Tüpdağıdan "Eyvaz! Eyvaz!" deyə-deyə elə gəlir, elə bil boğanaq gəlir.

O, yetirib özünü atdı Koroğlunun üstünə. Deyillər, Koroğlunun gözündə iki damcı yaş da onda görünüb. Koroğlu belə hesab elədi ki, Tüpdağıdan dəli olub. Tüpdağıdan həsəkliyə-həsəkliyə soruşdu:

– Koroğlu, gecədi, ya gündüz?

Koroğlunun dili açıldı:

– Gündüzdü, oğlum! Özünü toxtat! Bax, hamı yanındadı...

Tüpdağıdan tüpürüyünü uddu:

– Mən At düzünnənmi gəlirəm?

– Bəli, sən At düzünnən gəlirsən...

Tüpdağıdan dikəldi, gözünü dolandırdı dəlilərin üzündə, özünü saxlaya bilmədi, hönkürə-hönkürə dedi:

– Əyəm gündüzdüsə, mən At düzünnən gəlirəmsə, Eyvaz odu At düzündə!

Hamı peşman oldu. Əlyəqin elədilər ki, başına hava gəlib. O baxdı ki, hamı sevinmək əvəzinə peşman oldu, birdən atılıb tərpəndi At düzünə tərəf. Koroğlu hay vurdu ki, qoymayın, özünü daş-qayadan atacaq!..

Dəlilərdən bir neçəsi düşdü onun dalınca.

Aşıq Cünun onların dalınca baxa-baxa əlini verdi qulağına:

Aman Allah! Yoxsa cəlal pozulur,
Koroğlunun baxdı yatır, nədi bu?
Niyə birdən əllər əldən üzülür,
Çənlibelin sonu çatır, nədi bu?

Qabımızdan şərbətimiz çalanır,
Bağrımızda sönməz ocaq qalanır,
Xəzan vurur, güllərimiz talanır,
Gəmimizmi suda batır, nədi bu?

Aşıq Cünun, qəddin yaman bükülür,
Qəm ling salır, könlün evi sökülür,
Yoxsa göydən üstünə od tökülür,
Haqq aşına zəhər qatır, nədi bu?..

Dəlilər ha orda, ha burda, o zaman yetirdilər ki, Eyvaz Tüpdağıdannan soruşur:

Tüpdağıdan, bəyan eylə,
Niyə geyib qara Çənli?
Hanı Koroğlu görünmür,
Nədən alıb yara Çənli?

Tüpdağıdan cavab verdi:

Səni pərişan görmüşəm,
Ürəyim birtəhər olub,
Çənlidən getdiyin gündən
Peşəmiz qəm-qəhər olub.

Aldı Eyvaz:

Nə qəmdi Çənliyə gələn,
Bu dərddi bağrımı dələn.
Söylə görüm kimdi ölən
Haçan düşüb dara Çənli?

Aldı Tüpdağıdan:

Hara getdin bilməmişik,
Hamı sağdı, ölməmişik.
Nə müddətdi gülməmişik,
Yediyimiz zəhər olub!

Eyvaz baxdı ki, günahkar özüdü, xəcalətnən dedi:

Eyvazam alışar canım,
Dərdim çoxdu necə danım.
Ağlamır ki, Nigar xanım,
Gəlməyib ki zara Çənli?

Tüpdağıdan dedi:

Dəlilər sənsiz qalmışdı,
Ahı göyə ucalmışdı.
Çənlini zülmət almışdı
Günəş doğub, səhər olub!

Onlar Eyvazgili araya alıb görüşdülər. Sonra da götürüb üz tutdular Koroğlunun yanına.

Bu tərəfdən hamı baxdı ki, budu, Eyvaz gəlir.

Heç kim gözünə inana bilmirdi. Birdən Bəlli Əhmədin səsi eşidildi:

– Ayə, Dəmirçioğlu, necə bilirsən! Ə, demədimmi bizim məzara tapşırdığımız Eyvaz deyil?..

Eyvaz indi dərk elədi ki, ölən özüdü, günahı da nə dərəcədədi. Koroğlu dilləndi:

– Eyvaz bala! Allahı sevərsən, bizi tez agah elə görək, sən Eyvazsansa, bəs bizim Bayaziddən bura çiynimizdə gətirib dəfn elədiyimiz kimdi?

Eyvaz başını sinəsinə əyib dedi:

– Can Koroğlu, görürsünüz ki, mən Eyvazam. O gətirdiyinizin kim olduğunu, əhvalatın məğzini bu qızdan soruş.

Koroğlu Mərcan xanıma üz tutdu:

– Gözəl balam! De görüm bu nə əhvalatdı?

Mərcan xanım dedi:

– Mərd Koroğlu! Əvvəlcədən mənim bir iltimasım var, deyim, qəbul eləsəniz əhvalatı danışaram, eləməsəniz, biz gedəsiyik, Eyvaz özü danışar.

Koroğlu fikirləşmədən dedi:

– De, xanım balam! Nə iltimasın olsa qəbul elərik!

Mərcan xanım ürəkləndi:

– İltimasım budu ki, gərək Eyvazın günahlarınnan keçəsiniz!

– Qızım, Eyvaz ki, sağdı, onun nə günahı var, keçirəm. Elə bilirəm ki, hamı keçər.

Hamı bir ağızdan ürəkdən dedi ki, keçirik Eyvazın nə günahı olsa! Təkcə Hürü xanım ürəksiz dindi. Onun ürəyi titrədi. Elə bildi ki, Eyvaz bu dünya gözəlini özünə gətirib, iltimas da bu olar...

Mərcan xanım dedi:

– Bu əhvalat aşıqların danışdığı kimi bir dastandı, izn verin, bu oğlan danışsın.

İzn verildi. Kankanoğlu əhvalatı danışası oldu. Onun danışdığı dastanın məzmunu beləydi:

Kankanoğlu dediyimiz həmin oğlanın adı Böyükkişiydi. O, Bayaziddə kankan İrzaqulu deyilən bir kişinin oğluydu. İrzaqulu kankanlıq eliyib külfətini dolandırırdı. Bir gün torpaq uçub onu həlak elədi. Başsız qalan külfəti on iki yaşlı Böyükkişi dolandırmalı oldu. Böyükkişi hansı işdən yapışdı, hansı sənətə yönəldisə, əli gətirmədi. On altı-on yeddi yaşında atasının dostları onu yannarına apardılar. O da ata sənətiynən çörəkpulu qazanmağa başladı...

İyirmi iki-iyirmi üç yaşlarında Böyükkişi bir oğlan oldu ki, bir görən bir də görüm deyirdi. Onun camalına, kamalına çoxları həsəd aparır, çox qızlar-gəlinlər onun xəyalıynan yaşayır, çoxları daldalardan onu oğrun-oğrun, həsrət-həsrət süzür, çoxları onun boy-buxununa baxmaqdan doymurdu...

Bəli, qızlar-gəlinlər Böyükkişinin ağıl-kamalına, boy-buxununa, qədd-qamətinə heyran, həsrət olduğu kimi, paşalar, bəylər, ağalar, xanlar da onun qeyrətinə, qüvvətinə, cəsarətinə, cürətinə əlinin işinə heyran həsrətiydilər.

Böyükkişinin əlinnən sənət qurtarmırdı. Səddi-sorağı mahallarda, ölkələrdə söylənirdi. İndi onu Kankanoğlu deyib axtarırdılar...

Bir dəfə Həsən xanın oğlanları Kankanoğlunu Muradbəyliyə çağırtdırıb iş danışdılar. Kankanoğlu həvəs və səliqəynən işə başladı...

Bir səhər Kankanoğlu öz işində ikən, Həsən xanın qızı Mərcan xanım külafirəngidə göründü. Necə oldusa, Kankanoğlunun gözləri Mərcan xanımın ala gözləriynən calaşdı. Amma qız birdən göründüyü kimi, birdən də gözdən itib yox oldu. Qızın gözündən Kankanoğlunun ürəyinə düşən məhəbbət qığılcımı qorranmağa, sonra da alışmağa başladı..

Əlinə çəkic, külüng alandan bəri bircə dəfə də əl-ayağına vurmayan Kankanoğlu indi çəkici hara endirirdisə əlinə dəydi, ayağını yaraladı...

O, nə qədər özünü cəmlədisə də işləyə bilmədi. Halı getdikcə bədləşdi. Nə qədər özünü danladı, qınadısa ki, mən hara, Həsən xanın qızı hara? Olmadı! Fikirləşdikcə məhəbbət odu şiddət elədi. Axırda işi qoyub şəhərə çıxdı, bazarı dolandı ki, başı qarışa, yadınnan çıxa...

Bir tanış qarı varıydı. Təsadüfən rast gəlmişdi. Bibisinə oxşadığına görə ona qanı qaynamışdı. Hərdən yanına gedər, sovqat aparardı. Qarının da Kankanoğluna çox böyük məhəbbəti, hörməti varıydı.

Kankanoğlu yenə bazarlıq eliyib qarının yanına gəldi. Qarı onu görən kimi soruşdu:

– Ömür-günüm! Bət-bənizin niyə belədi?

– Heç, bibi, bir balaca ağrıyıram.

– Yox, bu balaca ağrımaq deyil! Anangildən xəbər-zad eşitmiyibsən ki?

– Yox elə ağrıyıram.

– Vallah, bu, ağrımaq işi deyil!

– Bə nə işi olar, bibi?

Qarı diqqətnən Kankanoğlunun gözlərinə baxdı:

– Əyəm, evdən arxayınsansa, bu, məhəbbət dərdidi, gözümün nuru! Ya qızdan xəbərsiz eşqə düşübsən, ya da "yox" cavabı alıbsan! Hansıdı, qadan alım?!

– Heç hansı!

– Dərdini məndən gizlətmə, bala, məni də dərdə salarsan!

– Dərdimin dərmanı səndə tapılmaz, bibi, bilsən dərdin daha böyük olar.

– De, bala, bilmək olmaz...

Kankanoğlu yuxalıb əhvalatı danışdı. Qarı dedi:

– Həəə! Qabaxkınnan xəbərsiz vurulmaq yamandı! Durma, bir barmax kağız yaz, ürəyini aç qıza. Bir yol tapıb yetirrəm. Məhəbbətin odu gözdən keçər ürəyə. Əyər onda da alışıbsa, bir tədbir fikirləşərik...

Kankanoğlu naməni yazdı. Qarı alıb dedi:

– Sabah yox, o biri gün bu zaman olarsan burda.

Kankanoğlu bir balaca toxdayıb işə qayıtdı.

Əli işə təzəcə isinmişdi, baxdı yan-yörəsində danışırlar ki, bəs İravan sərdarı Hüseynəli xan Mərcan xanıma elçi göndərib...

Çox keçmədi ki, xannıxda şaddıq başladı. Birisi də Kankanoğlunu muşduluqladı ki, deməzsənmi, Mərcan xanımı nişannadılar Hüseynəli xana...

Kankanoğlu naməsinə rüsvayçı cavab almasın deyə işi yarımçıq qoyub qayıtdı düz Bayazidə...

Məhəbbət odu gün-gündən şiddət eliyib Kankanoğlunu əyməyə, əritməyə başdadı. Yazıq anası, biçarə bacıları ha dolandılar başına ki, dərdindən halı olsunlar, bir çara axdarıb tapsınlar, olmadı...

Aradan bir il keçdi, day Kankanoğlunun əli işdən, gözü nurdan qalmışdı...

Bir gün evdə qəmli-qəmli oturduğu, öz dərdiynən olduğu vaxt birisi girdi içəri. Ona bir namə verib çıxdı. Kankanoğlu fikirli-fikirli naməni açdı ki, yazılıb:

Bir baxışda ixtiyarım
Əllərimnən alan sənsən!
Aparıb səbri-qərarım,
Məni dərdə salan sənsən!

Məni salan qəm bəhrinə,
Verən məhəbbət qəhrinə.
Od vuran könlüm şəhrinə,
Edən talan-talan sənsən!

Kaş olaydın mənim yarım,
Əhdinə düz vəfadarım,
Əldən alıb ixtiyarım,
Sözü çıxan yalan sənsən!

Yaxşı tapmışdım babımı,
Getdin, apardın tabımı,
Hər gün könül rübabımı,
Əl uzadıb çalan sənsən!

Yazıq Mərcan döndü qula,
Gücünən satdılar pula,
Mana yüz göz tikən ola,
Axır yarım olan sənsən!

Kankanoğlu dəli kimi oldu. Özünü atdı çölə, qaçdı ora-bura. Hayandaydı namə gətirən!

Bu bir parça kağız onun bir ildə əlindən getmiş qüvvətini, dizindən getmiş taqətini, gözündən getmiş nurunu birə-beş özünə qaytardı...

Day Kankanoğlu durub dincələ bilmədi. Ac aslan kimi özünü yetirdi Muradbəyliyə. Qarını axtardı. Xəbər verdilər ki, "bir oğlum itib!" – deyə dərdə düşdü, o dərdnən də altı ay bundan qabaq dünyadan köçdü...

Kankanoğlu onu da bilirdi ki, Mərcan xanımın qapısını yalnız dilənçilər aça bilər. Odu ki, özünə bir dəst dilənçi paltarı düzəltdi. Bir tərəfə çəkilib özünü elədi qoca, axsaq bir sayıl. Əlinə qırıq bir əsa alıb axsaya-axsaya çatdı Mərcan xanımın imarətinin qapısına. Ona dəyib dolaşan olmadı. Keçdi içəri. Mərcan xanımın qapısını o zaman açdı ki, budu, Hüseynəli xan oturub nazbalıncın üstündə, Mərcan xanımı da oturdub yanında, ərknən deyir:

– Balam, bu nə inaddı sən eliyirsən?! Niyə irazılıq vermirsən ki, toyumuzu başlıyaq?! Day sən nə vaxtı gözdüyürsən, Mərcanım mənim?!

Mərcan xanım dedi:

– Sana dedim ki, mənnəndisə, mən hələ toya razı deyiləm! Bir il də gözləməlisən!

Hüseynəli xan dedi:

– Ay Allahın bəndəsi! İstəyini mənə de görüm nədi?! Balam, mal deyirsən məndə, pul deyirsən məndə, şan-şöhrət deyirsən məndə. Zor-qüvvət deyirsən, o da məndə. Day sənin özgə istədiyin nədi?!

Mərcan xanım dedi:

– Zorunu, qüvvətini, malını, dövlətini mənə görsətmə! Bu, iyidə yaraşan sifət deyil, Hüseynəli xan! Bunların heç birində mənim gözüm yoxdu. Mənim istəyimə qalsa, gözləyəcəksən, sənin zoruna qalsa, onu siz bilərsiniz!

Hüseynəli xan hələ də elə bilirdi ki, qız naz satır, şıltaqlıq eləyir. Fikirləşdi ki, yəqin meyli nağdı daş-qaşdı. Odu ki, çıxardıb gətirdiyi ən bahalı boyunbağını saldı onun boynuna. Qızın etiraz eləməməsi,

onun qardan ağ, pilədən yumşaq əlləri Hüseynəli xanın şəhvət duyğusunu gücləndirdi, qızın incə biləklərini birdən-birə əlinə keçirib onu öpmək istədi. İş bu yerə çatanda, dilənçi tab eləmədi, dedi:

Ey sevgilim, insaf elə,
Gül üstünə xarı qoyma!
Əhdə vəfaya gəlmişəm,
Pozulan ilqarı qoyma!

Aldanma dövlət-varına,
Getmə əğyar bazarına,
Tülək tərlan şikarına,
Yeriş çəkən sarı qoyma!

Amma nə Mərcan xanım, nə də Hüseynəli xan onun naləsini eşidəcək halda deyildi. Ehtiras Hüseynəli xanı tamam yoldan çıxarmış, ixtiyarını əlindən almışdı. Mərcan xanım da aslan ağzında qalmış quzu kimi cabalayırdı ki, biləklərini onun əlindən çıxartsın. Gül yanağını onun murdar ağzına qurban verməsin. Dilənçi deyirdi:

Məcnunam Leyli dağında,
Dolanıram sorağında,
Gözlərimin qabağında,
Gedən ixtiyarı qoyma!

Səs bu dəfə Mərcan xanıma çatdı. Elə bil, bu səsdən ona ər qüvvəsi yetişdi, pəhləvan zoru gəldi. Bir güc verib biləklərini bu canavarın pəncəsindən qurtardı, özünü dilənçinin üstünə atdı...

Özünü rüsvay görən, gözləri qızmış Hüseynəli xan, Mərcan xanıma da dərs vermək məqsədiynən xəncərini çəkib qaldırdı ki, dilənçinin sinəsindən vursun, dilənçi göydə biləyindən tutub elə sıxdı ki, xəncər əlindən yerə düşdü. İşi belə görən xan aradan çıxmağı qənimət bildi...

İki həsrətli bir müddət dinməz-söyləməz bir-birinin üzünə baxdı. Gecdən-gecə Kankanoğlu dedi:

Həsrətinən ərimişəm,
Səsim batıb, kirimişəm,
Ayağına yerimişəm,
Çəkəm ahu-zarı qoyma!..

Həsən xanın oğlanları Hüseynəli xan da yanlarında girdilər içəri. Onsuz da qan-qan deyən Mahmud xan qılıncını çöldə çəkmişdi. İstədi ki, sayılın başını ayırsın bədənindən, dilənçi üz tutdu Mərcan xanıma:

Yazıq sayıl çəkər ahı,
Sənsən onun qibləgahı!
Sana gətirdim pənahı,
Öldürüllər, barı qoyma!

Mərcan xanım keçdi qardaşının qabağına:

– Nə iş görürsən, ayə?! İndi də mənim atamın ocağına dilənçi qanı tökürsən?! Görmürsən, yazığın biridi? Sayılnan sənin nə işin?!

Mahmud xan hikkəli-hikkəli bağırdı:

– Elə sənin özün də yazıq sayılın tayısan! Ona sığınıb dağ boyda kişini...

Mərcan xanım özünü bir az kövrək, bir az da qəzəbli göstərərək dedi:

– Ayıb olsun Həsən xanın oğlanlarına! Hüseynəli xan da utansın, heç danışmasın! – o, bir az da kövrəldi, – dilənçi olanda nə olar! Məni bu kişinin yanında biyabır eliyirdi...

Mahmud xan dodağını çeynədi. Mərcan xanım sözünə davam elədi:

– Bilirəm, sizin bu həşirinizin hamısı ondan ötəridi ki, mən toya irazılıq verəm. Allah xatirinə, mənim day sözüm yoxdu, gedin, toyunuzun tədarükündə olun!..

Mərcan xanımın bu sözləri dünyayi-ələmi xanların gözündə nura, çırağbana döndərdi, yazıq sayılın gözlərində də cəhənnəm zülmətinə çevirdi...

Mahmud paşa sevinmiş, üzünü tutdu Hüseynəli xana, vəcdnən dedi:

– Hüseynəli xan! Əzizim! Özün yaxşı eşitdin bacımın sözlərini! Di get hazırlığını gör, gəl gəlinini apar! Amma bax burda, bacımın yanında da deyirəm, öyünün böyük xanımı bacımdı ha!..

İndiyəcən günü üstünə verildiyini bilməyən Mərcan xanım ikrah hissiynən üzünü çevirdi. Hüseynəli xan buna əhəmiyyət verməyib əlini gözünün üstünə qoydu:

– Mənim gözüm üstə!

Mahmud xan üzünü tutdu dilənçiyə:

– Qurban olasan mənim bacıma! Qurban olasan atamın bu nahaq qan görməmiş ocağına! Başımız qarışıqdı. Get, toyda gələrsən, sənə çoxlu ənam verərəm!

Dilənçi istədi çıxsın, Mərcan xanım qoymadı:

– Dayan, ay yazıq! O nisyədi. Hələ mənim qapımdan sayıl boş qayıtmayıb.

O, pərdənin dalına keçdi, çox çəkmədi ki, bir parça çörək gətirib qoydu dilənçinin çantasına. Kankanoğlu tez çıxıb verdi özünü bir daldaya. Çörəyi çıxartdı ki, Mərcan xanım boyunbağını, bir neçə qızıl, bir barmaq da kağız qoyub arasına, baxdı kağızda yazıb ki, gec gəldin, mən İravana gedəsi oldum. Səni gözləyəcəyəm, mən ya səninəm, ya qara torpağın! Biilqar, biiman! Kankanoğlu İravana getməyə hazırlaşdı, Hüseynəli xan da toy tədarükünə başladı.

Amma iki gündən sonra toy xəbərinin əvəzinə vay xəbəri yetişdi ki, Hüseynəli xanın toy ağaməti gələndə, Koroğlu Xoydan qayıdırmış, rastlaşıblar, Koroğlu onu dünyadan köçürüb.

Əhvalat belə olmuşdu:

Xoy mahalından Rəhim adlı bir kəndli Koroğluya xəbər çatdıra bilmişdi ki, mahalın hakimi zalım Kəbir xan bir cüt oğlumu şərə salıb tutdurub, yetişməsən, əldən gedəsidilər. Koroğlu belə haydan qalardımı?! Xəbəri eşidən kimi, bir dəstə dəli götürüb üz tutdu Xoya. Koroğlu o zaman özünü yetirdi ki, Rəhim kişinin oğlanları dar ağacının altındadırlar. Kəbir xan heç belə iş gözləməzdi. Doğrudu, Koroğlunun adı, səsi İran xanlarının da, bəylərinin də, lap şahın da yuxusunu ərşə çəkmişdi, day Kəbir xanın ağlına hardan gələrdi ki, o, bu yerdə özünü çatdırar.

Nə başınızı ağrıdım, Koroğlu Kəbir xanın aşına su qatdı. Rəhim kişinin də, çoxlu yoxsulların da vayını toya döndərdi.

Koroğlu geri qayıtmaq istəyəndə, Rəhim kişinin oğlanları Aşıq Cünuna yalvardılar ki, Koroğlu bizi də qatsın dəlilərinin cərgəsinə. Aşıq Cünun Koroğludan iltimas eləyəndə, Koroğlu Rəhim kişinin üzünə baxdı. Rəhim kişi açıq ürəklə dedi:

– Can Koroğlu! Mənim oğullarım özlərini sənin dəlilərinə tay tutullarsa, çörəyim itməyib. Kiçik oğlum Paşa bəsimdi. Qoy bunlar da olsun sənin. Bircə onu arzu eləyirəm ki, toylarında bizi unutmayasan...

Rəhim kişinin mərdanəliyi, oğlanlarının hərəkəti Koroğlunun xoşuna gəldi. Onları da qoşdu dəlilərin cərgəsinə, üz tutdu Çənlibelə.

Dəstə Xoyun ərazisindən çıxıb Səlmasın ətəyinə çatanda bir tacir dəstəsiynən qabaqlaşdı. Tacirbaşı canını qurtarmaq üçün uydurdu ki, Təbrizə gedirəm, hər il orda böyük imam ehsanı verirəm ki, Allah mənə bir övlad əta eləsin.

Tacirbaşı nə biləydi ki, on ildən bəri zülm eliyib yarı ac-yarı tox, çox zaman ayaxyalın dəvə ovsarı çəkdirdiyi, dili qarnında bildiyi Yarməmməd kişi onun yalanını çıxardacaq, üzünə duracaqdı, nə padşahdan qorxacaq, nə zindandan, nə də dar ağacından.

Yarməmməd kişi Koroğlunu tanımışdı. Ona görə də irəli yeridi, salam verib dedi:

– Ay yoxsulların pənahı, elin dirəyi! Bu tacirbaşı hər nə ki ərz elədi, hamısını yalan dedi. Bunun düzdü, züryəti yoxdu, amma züryətdən ötəri bir qara quruş da xərc eləmir. Bunun peşəsi padşaha qulluq eləmək, həm onu dünyanın az tapılan naz-nemətiynən təmin eləmək, həm də ona məmləkətin baş tərpədən iyidlərinnən yalan-gərçək xəbər çatdırıb onları güdaza verməkdi. Məni də ölümə verirdi, and içdirib dar ağacından qurtarıb ki, ömrüm boyu beləcə ayaqyalın ovsar çəkəm. Əgər bunun insafı varsa, niyə mənim halım-günüm budu?

Kişinin halı hamının ürəyinə od saldı, Koroğlunun sinəsinə dağ çəkdi. O, dəli bir nərə çəkib hökm elədi, tacirbaşı ilə Məmmədyarın geyimini dəyişdirtdi. Sonra da tacirbaşının toruna düşənlərin istəyənini xilas eləyib evinə göndərdi. Tacirbaşıya üz tutdu:

– Səni öldürmürəm. Elə bilmə ki, sənə rəhmim gəlir. Yox, səni öldürmürəm ona görə ki, gedib qulluq elədiyin şaha deyəsən ki, bu dəfə onun üçün apardıqlarını paylayacağam bu mahalların yoxsullarına. Qoy onların da ömründə bir dəfə ağızlarına şah yemi dəysin. Bir də deyərsən ki, məmləkətində törətdiyi bu zülmə son qoymasa, Çənlibeldən köçüb Savalanda məskən salacağam!

Tacirbaşı zarıya-zarıya dedi:

– Koroğlu, sənin mərdliyin aləmə bəllidi. Mərdlik elə, atımı, bir neçə günlük də azuqə verdir mənə gedib bir yana çıxım.

Koroğlu güldü:

– Tacirbaşı, bəlkə də mənim mərdliyim aləmə bəllidi, onu yaxşı bilmirəm. Amma onu bilirəm ki, ağlım başımdadı, axmaq deyiləm. Sən gərək bu paltarda, bu kökdə gedib bir yana çıxasan ki, elədiyin zülmün qədərini biləsən. Bir də, qorxma, sən də axmaq döyülsən ki,

bu aralarda tacirbaşı olduğunu bildirib özünü əcəlin əlinə verəsən. Get, sənə yaxşı yol!.. Amma tapşırığımı unutma ha!

Bəli, Koroğlu dediyi kimi də elədi. Padşaha gedəsi nə vardısa yol uzunu paylaya-paylaya üz tutdu Çənlibelə. Dəlilərin kefi qalxmışdı ala buluddan yuxarı. Arazı keçəndən bir gün sonra Koroğlu gözəl bir seyrangaha çatdı. Yönü bu tərəfə gedəndə də bu çəməngahdan keçmişdi, amma dayana bilməmiş, əhd eləmişdi ki, gərək qayıdanda burda bir mənzil eliyib dəlilərə dinclik verəm. O saat hay vurdu, dəstə töküldü çəməngaha, çadırlar quruldu. Koroğlunun göstərişi ilə bir çarhovuzun başında lap iri çadır qurdular ki, burada oturub söhbət edəcək, aşıq Cününa qulaq asacaqdılar.

Dəlilər beş gün idi dincəlirdilər. Onlar məşq zamanları Süleymanı da, Kərimi də bütün sınaqlardan keçirmişdilər. Hər iki qardaş şeşpər şaqqıldatmaqda, nə bilim, bütün dava fəndlərinin hamısında Koroğlunun da, aşıq Cününun da, bütün dəlilərin də ürəyincə imtahan vermişdilər.

Yenə axşam yeməyindən sonra hamı böyük alaçığa yığışmışdı. Halaypozanın xahişi ilə aşıq Cünun təzə igidlərə ləqəb verəcəkdi. Dəlilər yerbəyer olanda Koroğlu aşıq Cününun üzünə baxdı. Aşıq Cünun sazı köynəyindən çıxardı, durub ortaya çıxdı, sazını zilini zil, bəmini bəm elədi, sinəsinə basıb oxudu:

Çox dolandım, dağlar gördüm dünyada,
Çənlibelin uca dağı gözəldi!
Ağqayanın düşmən keçməz keçidi,
Güllü yalın cüt bulağı gözəldi!

Söz dəliləri yerindən oynatdı. Onların alqış səsləri çadırı titrətdi. Koroğlu gördü burnunun ucu göynədi, gözləri yaşardı. Yadına saldı ki, bircə dəfə də burnunun ucu Nigar xanım:

...Hər quş balasıynan gəzər,
Niyə sənin balan yoxdu?

– deyəndə belə göynəyib. Amma özünü o yerə qoymadı, zarafata salıb aşıq Cününu qınadı:

– Nə tez qəribsədin, ay aşıq Cünun, Çənlibeldən ötəri? Bura da səfalı yerdi, dedim dəlilər bir-iki gün dincəlsin! Sən Halaypozanın

xahişini yerinə yetir. Yoxsa ehtiyat eləyirsən ki, tacirbaşı özünü şaha yetirər, xəbər verər, şah dalımızca düşər? Qorxma, tacirbaşının öyüd-nəsihətini yaxşı vermişəm, sən öz işində ol.

Aşıq Cünun bir az da təsirləndi, avazını bir xeyli ucaltdı:

Çəyirtkəyə nəsihətlə kar aşmaz,
Ölmüşləri zəmilərə daraşmaz.
Koroğluya arxayınlıq yaraşmaz,
Dəlilərin qovğa çağı gözəldi!

Söz Koroğlunu bərk tutdu. Yenə sağ əli ilə bir sığal sol bığına, bir sığal da sağ bığına çəkdi, istədi ki, dinsin, baxdı ki, aşıq Cünun düz ayaq pərdədən başlamaqdadı. Dinmədi, Aşıq Cünun sözünü tamam elədi:

Aşıq Cünun, qəmin nəyin qəmidi?
Sözünü de, işrət eylə, dəmidi.
Qıy vuranda Kərim qartal kimidi,
Süleymanın ox atmağı gözəldi!

Yenə "afərin! əhsən!" sədaları çadırı doldurdu. Koroğlunun eyni lap açıldı:

– Sözünün axırını yaxşı gəldin, ay Aşıq Cünun! Yoxsa elə bu sahat yola düşmək əmrini verirdim. Amma...

Koroğlunun sözü ağzında qaldı. Keşikçilərdən biri içəri girdi, irəli yeriyib dedi:

– Koroğlu, xeyli aralıda, günbatan tərəfdə bir böyük karvandı-nədi düşüb...

Koroğlu da onun sözünü yarımçıq qoydu:

– Niyə karvandı-nədi deyirsən, bilmədin ki, nəçidi, nəkaradı?

– Yox, Koroğlu, bunu əssah öyrənə bilmədik. Kilid Qulamın biz günbatan tərəfindəyik. Gördük o tərəfdən zurna-dəf səsi gəlir. Demirəmmi xeyli aralıdı. Yavaş-yavaş gedib yaxınlaşdıq, elə onu əssah eliyə bildik ki, böyük yığıncaqdı. Deyəsən toy dəm-dəsgahdı. Belə məsləhət elədik ki, xəbər verək, necə desəniz, elə də iş görək.

Koroğlu soruşdu:

– Deyirsən toy dəm-dəsgahına oxşayır, hə?

– Bəli, Koroğlu.

Koroğlu üzünü Halaypozana tutdu:

– Bir dəstə götür, çox yaxın düşməyin, dəyib-dolaşmayın. Elə üstlərində göz olun. Tərpənsələr, qoymayın. Gecələməli olsalar, səhərə qədər gözləyin, səhər kim olduqlarını ayrıd elərsiniz.

Tüpdağıdan: – baş üstə, – deyib ayağa qalxdı. İstədiyi iyidlərdən bir neçəsinə işarə elədi, çıxdılar. Koroğlu üzünü tutdu aşıq Cünuna:

– Aşıq Cünun, afərin sənə ki, təzə iyidlərin ləqəbini lap ürəyimcən verdin! Ox Süleyman. Qartal Kərim! Yaraşır! Mübarək olsun!

Hamı bir ağızdan “mübarək olsun” dedi. Koroğlu sözünü davam elədi:

– İş də ki, belə düşdü, arxayın söhbətini elə, səhəri gözləməli olduq.

Bəli, səhər açıldı, həmişə səhər üzünüzə xeyirə açılsın! Halaypozan gördü bu dəm-dəsgah lap böyükdü, özü də arxayınlıqdı, hələ tərpənməknən işləri yoxdu. Bir az da gözlədi, lap işıqlaşdı, hamı qalxıb yuyundu. Gün çırtanda üç nəfər də götürüb yeridi düşərgəyə. Birisi qabaqlarına durdu:

– Kimsiniz, kimi istəyirsiniz?

– Elə bu dəstənin başçısını görmək istəyirik, qardaş.

– Elə bilirsiniz ki, asandı bu dəstənin başçısını görmək?

– Niyə çətindi ki?

– Bilirsiniz bu dəstənin başçısı kimdi?

– Yox, bilmirik. Bilmək istəyirik.

– Elə onçun belə danışırsınız da!

– Yoxsa necə danışardıq ki?

– Yoxsa? Yoxsa diliniz söz tutmazdı!

– Niyə?

– Deyim, onda bilərsən! Bu dəm-dəsgah İrəvan sərdarı Hüseynəli xanındı, bildin?

– Bildim. Bilirsən mən kiməm?

– Kimsən?

– Qoç Koroğlunun dəlisi Halaypo...

Halaypozanın sözü ağzında qaldı. Bu adam Koroğlunun adını eşidən kimi çul təkin sərildi yerə, de bildirmi ölübsən, yoxsa bu ilmi. Ona kimi iki başqası özünü yetirdi. Birisi qıjqırıldı Halaypozanın üstünə:

– Neylədi, ə buna?!

– Heç nə.

– Bə niyə belə oldu bu?

– Onu sən bilərsən. Yəqin üstündə ürəkgetməsi varmış. Biz ondan Hüseynəli xanı soruşduq, o da beləcə sərildi yerə.

– Neynirsiniz siz Hüseynəli xanı?

– Elçiyik, sözümüz var.

– Kimin elçisisiniz?

– Koroğlunun.

– Nə-ə-ə-ə?..

Onu da, yoldaşını da əsməcə tutdu. Amma huşdarı başlarınnan çıxmadı. Eləcə dilləri qıfıllandı, gecdən-gec birinin dili topuq vurmağa başladı:

– Ge-ge-gedək.

Hüseynəli xanın çadırının qapısında üç adam siyirmə qılınc dayanmışdı. Bu gələnin diribaşı birinin qulağına pıçıldayanda əlinnən qılınc düşdü. Məxləs, Hüseynəli xana çatdırdılar ki, üç adam qapıda durub onu görmək istəyir. Özdəri də deyirlər ki, Koroğlunun elçiləriyik. Hüseynəli xanın da canına üşütmə düşdü. Amma özünü bir təhər toxdadıb əmr elədi ki, çöldə qollarını bağlayıb gətirin içəri. Çöldə istədilər ki, bunların qollarını bağlasınlar, Halaypozan birisinə bir şapalaq çəkdi, yazıq yeddi dəfə fırranıb düz iyirmi arşın aralıda cüllandı yerə. Bunu görəndə o birilər əl tərpətmədilər, Halaypozan onları o tərəf bu tərəfə itələyib girdi içəri. Hüseynəli xan udqunub qışqırdı:

– Bu nə ədəbsizlikdi?!

– Ədəbsizlik sizdən baş verdi, xan! Bu da təzə qaydadı ki, elçinin qapıda qollarını bağladıb qəbul eləyəsən?

Hüseynəli xanın ağlı təzə-təzə başına yığıldı. Baxdı ki, yaman yekə qələt eləyib. Amma özünü toxdaq tutub dedi:

– Bu hansı qaydadı ki, hər yetən özünü Koroğlunun elçisi adlandırır.

– İnanmamaqda haqlısan, xan. Amma bu həqiqətdi ki, mən Koroğlunun elçisi yox, dəlilərinnən biri Halaypozanam. Özü də Koroğlunun tapşırığı ilə axşamdan bəri sənin keşiyini çəkmişəm. İndi də bilməliyəm ki, haradan gəlib haraya gedirsən.

Hüseynəli xanın gözləri irildi:

– Doğru deyirsən?

– Bizim dilimizə yalan gəlməz, xan!

– Hardadı indi Koroğlu?

– Qapıya çıxsan, əl qoyub gözünün üstünə baxsan gündoğana, görərsən!

– Doğru deyirsən?

– İnan, xan! Yalan xanlarda, paşalarda olur, bizim kimilərə verirlərmi, bizdə də ola!

Hüseynəli xan başını əllərinin arasına aldı, bir xeyli fikirləşdi, sonra birdən başını qaldırdı:

– Sən niyə mənə xan deyirsən ki?

– Bəs nə deyim, xan?

– Axı mən xan deyiləm!

– Bəs nəsən, xan?

– Mən bir tacir oğluyam. Dədəm məni nişanlandırandan sonra, Allah ölənnərinə rəhmət eləsin!..

– Allah rəhmət eləsin!

– Hə, atam məni nişanlandırandan sonra toyuma hazırlaşanda vəfat elədi. Üç ildi yasını saxlayıram. İndi bu elimnən-günümnən gedirəm gəlinimi gətirməyə...

– Yalanı tərgit, xan. Sən İravan sərdarı Hüseynəli xansan. Mən də Xoy mahalının xanı Kəbir xanın kiçik qardaşıyam. Biz bir dəfə görüşmüşdük axı. Niyə yadından çıxıb? Özüm elə dedim ki, sənin bu dələduz keşikçilərin mənə dəyib toxunmasın.

Hüseynəli xanın gözləri dirildi. Baxdı ki, canının uyuşuğu açılır. Ərklə Halaypozanın sinəsinə bir pəncə vurdu, sevinclə dedi:

– Bəs niyə mənim ürəyimi üzürsən, ay zalım!

– Ürəyin niyə üzülür axı?

– Ə, bilmirsən, Koroğlunun özü bir şey olmasa da adı yaman ağırdı? Eşidəndə adamın ürəyi üzülür? Ə, mənim huşuma bax! Bir fikirləşmirəm ki, axı Koroğlunun buralarda nə azarı ola! Çənlibel hara, buralar hara?.. Həə, de görüm Kəbir xan necədi, özün nə təhərsən? Deyirəm axı, ay Allah, bu mənə tanış gəlir, hardasa görmüşəm bunu!

– Tanıdın indi?

– Bə tanımayanda!..

– Bax belə! Sən necəsən?

Tüpdağıdan belə deyib guya ərklə onun sağ çiyninə yaxın döşünə bir balaca pəncə vurdu. Hüseynəli xan şırp dalı üstə dəydi yerə. Gözlərinə qaranlıq çökdü, elə bildi ki, bir yanını çapdılar. O özünə gələnəcən Halaypozan əlindən tutub qaldırdı. Hüseynəli xan bir az o tərəf bu tərəfə səyələndi, yox-yox bir təhər özünü toxdatdı:

– Ə, səni and verirəm allaha, de görüm kimsən?

– Yalana-yalan oldu, bədələ-bədəl, xan, allaha niyə and verirsən, mən Halaypozanam...

Bu dəmdə qapıdakı dəlilər dözə bilməyib girdilər içəri ki, ay qardaş, ay Halaypozan, niyə belə ləngiyirsən, indicə Koroğlu dalımızcan adam göndərəcək axı!..

Hüseynəli xan baxdı yox, karvanı yaman yerdə axşamladıb. Yenə başını aldı əllərinin arasına, bir xeyli fikirləşəndən sonra birdən qalxdı ayağa:

– Deyirsən Koroğlu bu yaxındadı hə?

– Bəli, xan.

– Gedək onun yanına.

– Gedək.

Hüseynəli xan adamlarına tapşırıqlar verib düşdü Halaypozanın yanına.

Bu tərəfdən də Koroğlu istəyirdi ki, Halaypozanın dalısıncan adam göndərsin, bir də baxdılar, budu, Halaypozan yanında da birisi gəlir. Hüseynəli xan yaxınlaşanda qılıncını açıb saldı boynuna.

Koroğlu öyrənəndə ki, bu İravan sərdarı Hüseynəli xandı, hay vurdu hamı toplaşdı böyük çadıra. Hər kəs öz yerində əyləşəndə Hüseynəli xan elə qılıncı boynunda yeridi Koroğlunun qabağına, diz çöküb dedi:

– Koroğlu, mən İravan sərdarı Hüseynəli xanam. Bu aydındı ki, biz düşmənik. Bu yerdə mənim səndən aman istəməyə haqqım yoxdu. Amma izn ver, utanmazlıq eliyim, səndən aman istəyim!..

– İstə, xan.

– Halaypozan yaxşı gördü. Eşitdiyimə görə axşamdan bəri sənin gözün mənim karvanımda olub. Bilməmiş olmazsan ki, bu karvan toy karvanıdı.

– Öyrənmişəm, xan.

– Gör, mümkündürsə, aman ver, məni muraz üstə qoyma!

– Toy sənindi, xan?

– Bəli, qoç Koroğlu!

– Yalan demirsən ki?

– And olsun bir olan Allaha, yalan demirəm!

Koroğlu Halaypozanın üzünə baxdı. Halaypozan dedi:

– Düz deyir, Koroğlu, öyrənmişəm, toy xanın öz toyudu.

Koroğlu məclisə göz gəzdirdi. Hamının üzündə mərhəmət gördü. Təkcə tacirbaşının paltarını geyinmiş kişini üzündən narahat gördü, istədi onu dindirsin, amma nə fikirləşdisə, ayrı şeyə yozub dindirmədi. Bunu kişi də hiss elədi, ürəyi atlandı, amma Koroğlunun onu belə süzüb dindirməməsi halını bir az da pozdu. Çünki kişinin sözü vardı, amma cürəti çatmırdı dinsin, sözünü desin. Koroğlu hamının üzündən oxudu ki, xana aman vermək olar. O dinmək istəyəndə, xan onu qabaqladı, əvvəlcə istədi desin ki, qəfləmdə dünya malından nəyim varsa götür, məni azad elə, ürəyi gəlmədi, bu fikrini udub dedi:

– Əgər aman vermək mümkün olmasa, qoç Koroğlu, heç qılıncını mənim mundar qanıma bulama, öz qılıncımnan vur boynumu...

Koroğlu ikrah duydu, qaşlarını çatdı:

– Kişisən belə əzilmə, xan! Amandasan.

O, üzünü Halaypozana tutdu:

– Halapozan, apar bunu hardan gətirmisən, qoy orda. Özü də gör tacirin qəfləsində layiqli bir şey varsa, adınızdan qoy xana toypayı olsun.

Elə bil bütün dünya verdin xana. Çadırdan çıxmağa ürəyi tələssə də, özünü ağır göstərməyə çalışdı.

Tacirbaşının paltarını geymiş kişi yenə bir-iki dəfə udqundu, ağzını açmaq istədi, bacarmadı. Ürəyində özünü söydü, danladı ki, vallah, mənim kimi qorxaq yaşamaqdansa yaşamamaq yaxşıdı. Niyə mən dinə bilmirəm axı? Koroğlu məni asmayacaq ha. İravanın sərdarına rəhm eliyən adamdan da adam çəkinərmi? Amma baxdı ki, daha gecdi, Hüseynəli xan çadırın ağzına çatıb. Elə bu dəmdə Hüseynəli xan da fikirləşdi ki, ay evim yıxılsın, niyə belə gedirəm, heç olmasa yalandansa da niyə guruldamıram? Qoy deyim ki, bəlkə sizə bir şey lazımdı. Qoy bir dil-ağız sada eləyim dana! Ona görə də çadırın qapısının ağzında dayandı, geri döndü:

– Koroğlu, sən səxada da məni üstələdin. Sənin ayağından öpməyə özümü layıq bilmirəm, heç olmasa, icazə verərdin, atının dırnağından öprədim, bu eyilikdən bir misqal çıxardım...

Koroğlu gördü xan xərifləyir, dedi:

– Xan, yaxşı olar heç bu təmənnaha düşməyəsən. Bil ki, Qırat dost-düşməni məndən yaxşı tanıyır...

Xan bir də geri dönmək istəyəndə elə bil kişiyə cürət gəldi, dili açıldı, Koroğluya dedi:

– Koroğlu, izn versəydin, mənim xandan bir sualım vardı...

Xan istədi ki, sıpıxsın, Koroğlu onu dayandırdı:

– Xan, zəhmət olmasın, bu kişinin sözü var deyəsən.

Xan dedi:

– Koroğlu, bu kişinin nə sözü olasıdı ki. Sən qanını içməyə hazır olduğun düşməninə aman verirsən. Bilirsən ki, aman verdiyin bu adamın dünya boyda günahlarından keçirsən. Day bu kişinin nə sözü ola?

– Niyə, qoy arzusu qalmasın.

– Nə deyirəm.

Xan kişinin yör-yöndəmindən baxdı ki, bu, Koroğlu dəlisi döyül, tacirdi. Bildi ki, tacirdən xeyirli söz çıxmaz, nədisə paxıllığından bir çuğulluq eləyəcək, onu da Koroğlu vecə qoymayacaq. Amma kişi heç kimin gözləmədiyi bir sualla xana müraciət elədi:

– Xan, mən bilmək istəyirəm görək sən toy eləyib evinə gətirəcəyin qız səni istəyir, ya yox?

Çoxları sualı yersiz hesab elədi. Kimi açıqda, kimi ürəyində kişiyə güldü. Hüseynəli xan bunu sezdi, odu ki, bir az da təmkinlə cavab verdi:

– Əmi, bizim şəriətə görə qız istəməsə, kəbin kəsilməz, kəsilsə də baş tutmaz.

– Ürəkdən deyirsən bu sözü?

– Bəli, ürəkdən!

Kişi Koroğluya tərəf döndü:

– Koroğlu, xan yalan deyir. Onunku muraz deyil, şəhvətdi. Mən bildiyimi deməsəm, günaha bataram. Elə az qalmışdı ki, günahkar olum. Mənim bildiyim də budu ki, bu xan o qızı alsa, özünə övrət eləsə, zülm əli ilə iş görür.

Hamı bir-birinin üzünə baxdı. Koroğlu qaşlarını çatdı:

– Xan, bu sözə cavabın nədi?

– Koroğlu sağ olsun. Mən yaxşı görürəm ki, bu adam sizdən deyil, bizdəndi. Nədisə, bunun mənnən qərəzliyi var, yalan danışır.

Koroğlu dedi:

– Bu şəksizdi ki, bu arada yalan var. Amma yalanın bu kişidəmi, yoxsa səndəmi olduğunu aydınlaşdırmaq müşküldü...

Koroğlu fikir içində üzünü aşıq Cünuna tutdu:

– Aşıq Cünun, bizə kömək elə, çətinə düşmüşük.

Aşıq Cünun irəli çıxdı, üzünü xana tutdu:

– Xan, nişanlın hardandı, kimlərdəndi?

Xan çətinə düşdü, kəkələdi. Kişi dedi:

– Koroğlu, bunun nişanlısı Muradbəylidəndi. Sənin dədənin düşməni olan Həsən xanın qızı Mərcan xanımdı.

Koroğlu soruşdu:

– Xan, aşıq Cününa cavab ver, kişi düzmü deyir?

Kişinin düşmənçiliyi araya atması xanın ümid çırağına yağ saldı, odu ki, dedi:

– Düz deyir, Koroğlu.

Aşıq Cünun dedi:

– Onda burda bir çətinlik yoxdu. Muradbəyli çox da uzaq döyül, adam göndərrik, öyrənər. İşi belə quraq. Xan nişanlısına öz dəstiynən bir namə yazsın ki, filan şəhərdəyəm, gəlirəm, burda kamil bir zərgərə rast gəlmişəm, biləyinin ölçüsünü ver, sənə bir cüt təzə bilərzik bağlatdırım. Naməni xanın inandığı adam bizim də bir adam aparar, hər şey aydın olar.

Bu tədbir xanın ürəyinə od saldı. Koroğlu yenə işi tapşırdı Halaypozana:

– İşi yönünə qoy. Bizdən kim getsə, özünü xanın yaxın adamı kimi göstərsin. Amma tez qayıtsınlar.

Naməni xana yazdırdılar. Halaypozan Koroğlunun tapşırığı ilə xanı öz çadırında göz dustağı elədi. Qəfləsinə gözətçilər qoydu, xanın baş vəziri ilə bir adam göndərəsi olanda Qartal Kərim yalvardı ki, qoy mən gedim. Halaypozan Koroğluya gənəşdi, Koroğlu buna da razılaşdı. Vəzirlə Qartal Kərim atlarına mindilər və nəzərdə tutulduğu vaxtdan tez özlərini çatdırdılar Muradbəyliyə.

De Həsən xanın oğlanları özləriniləlik-giryan elədilər. Vəzir gəlməklərinin məqsədini bildirəndə, belə məsləhət gördülər ki, onlar Mərcan xanımın imarətinə, onun yanına getsinnər. Belə də elədilər. Mərcan xanım qonaqlarını hörmətlə qəbul elədi. Vəziri tanıyırdı, odu ki, vəzirdən xəbər aldı:

– Vəzir, bu oğlan kimdi, xanın nəyidi?

Əvvəldən şərtləşdikləri kimi vəzir Qartal Kərimi Mərcan xanıma təqdim elədi:

– Xanın bacısı oğludu, xanım. Adına Qartal Kərim deyillər. Xanın istəklilərindəndi.

Mərcan xanım Qartal Kərimi bir də başdan ayağa, ayaqdan başa süzdü, gülümsəyib dedi:

– Adam heç inana bilmir ki, bu oğlan Hüseynəli xanın bacısı oğludu. Heç yaraşdıra bilmirəm.

Vəzir biclikdə tülkünü suya susuz aparar, susuz gətirərdi. O saat məsələni anladı, yozdurdu:

– Haqqın var, xanım. Kərim xanın ögey bacısının oğludu, rəiyyət qızından olub, ömrünün çoxunu kənddə keçirib.

Mərcan xanım köks ötürdü:

– Deyirəm axı!.. Hə, qonağa niyə gəlmisən deməzlər. Amma bilirəm ki, siz bir işə gəlmisiniz, eşidirəm, vəzir.

Vəzir qurcalandı, boğazını arıtdı içini çəkdi:

– Gəlməyimizin məqsədini Kərim deyəcək, xanım.

Mərcan xanım Kərimin üzünə baxdı, çalışdı ki, gözləri ilə gözlərini tutsun, Qartal Kərim imkan vermədi, gözünü yerə dikib dedi:

– Dayım namə də yazıb. Dilcavabı da deyim ki, zərgər çox mahir sənətkardı.

O, naməni Mərcan xanıma verdi. Mərcan xanım oxuyub güldü, elə gülə-gülə dedi:

– Kərim, bir mənim gözümə bax görüm!

Kərim bir təhər özünü ələ alıb Mərcan xanımın gözünün içinə baxmağa çalışdı. Mərcan xanım soruşdu:

– Deyirsən, zərgər çox mahirdi hə?

– Mahirdi, xanım.

– Dayını çox istəyirsən, Kərim?

– Bəli, xanım.

– Dayın da səni çox istəyirmi?

– Çox istəməsə, bu işə məni göndərərdimi?

– Olsun. Bircə numut aram olun, namənin cavabını yazım, aparın.

Onlar gözləməli oldular. Mərcan xanım o biri otağa keçdi. Amma cavabın yazılması xeyli ləngidi. Nəhayət, Mərcan xanım cavabı Qartal Kərimə təqdim elədi:

– Qartal qardaş, əminəm ki, naməni yolda oxuyan olmayacaq. Amma əgər doğrudan da sən dayını, dayın da səni çox istəyirsinizsə, orda dayından təvəqqə elə, qoy elə oxusun ki, sən də eşidəsən.

– Baş üstə, xanım! Əminəm ki, dayım mənim belə təvəqqəmi rədd eləməz.

Vəzir çox yaxşı bilirdi ki, Mərcan xanımın naməsindən nə xana, nə də onun adamlarına uğur gətirəsi heç nə olmayacaqdı. Ona görə də

çox fikirləşdi ki, yolda naməni Qartal Kərimin əlindən çıxarsın, amma bacara bilmədi. Həmin günün səhərisi gün çeşt yerinə qalxanda özlərini yetirdilər Koroğluya. Koroğlu yenə hamını yığdı böyük çadıra, xanı da gətirtdi, naməni verdi ona, özünə də tapşırdı ki, cavabı bərkdən oxusun. Xan nə qədər elədisə dili söz tutmadı. Koroğlu baxdı xanda namə oxuyası hal yoxdu, üzünü tutudu aşıq Cünuna:

– Aşıq Cünun, deyəsən, xanın savadı çatmadı, al naməni oxu görək kişinin nişanlısı nə yazır.

Aşıq Cünun naməni aldı, baxanda heyrət elədi:

– Can Koroğlu, qız naməsini şeirnən yazıb. Bu, qoşmadı. İzn ver, saznan oxuyum, günah eləməyək. Axı qoşmanı saznan oxumamaq günahdı.

Koroğlu izn verdi, aşıq Cünun yenə sazının aşıqlarına əl atdı, saz eləyib sinəsinə basdı, oxudu:

Məhəbbət satılmaz dünya malına,
Bir yaxşı fikirləş, xan, ağlın olsun!
Səndəki eşq deyil, uyub şəhvətə
Az belə giryan ol, yan, ağlın olsun!

Leyliyəm, Məcnunum səhra dolaşır,
Əsliyəm, Kərəmim Ərzurum aşır,
Sənə olan kinim qaynayıb daşır,
İçmək istəyirəm qan, ağlın olsun!

Məramım özgədi, olmuram aram,
Gündə göz-göz olub deşilir yaram.
Məzarın olaram, sənin olmaram,
Mərcan bir də deyir, qan, ağlın olsun!

Düşmən qızı olsa da, Koroğlu da, aşıq Cünun da, bütün dəlilər də Mərcan xanımda olan əhdə, ilqara, vəfaya, ağıla, kamala əhsən dedilər.

Koroğlu hay vurub qərar, göstəriş verdi:

– Hüseynəli xanı verirəm Yarməmməd kişinin ixtiyarına. Qoy necə bilir elə də cəza versin. Amma qalan qəflə nə varsa, verin vəzirə, yola salın getsin. Özünüz də yığışın, düşək yola, çox gecikdik, indi Çənlibelin gözü yolda qalıb.

Demə, Yarməmməd kişi Hüseynəli xandan çoxdan yanıqlıymış. Öz bildiyi kimi cəhənnəmə vasil elədi. Koroğlunun dəstəsi günorta yeməyindən sonra üz tutdu Çənlibelə.

Hüseynəli xanın ölümü Mərcan xanımı nə qədər sevindirdisə, toy ağamatının əldən çıxması Mahmud xanı bir o qədər yandırdı...

Aradan çox keçmədi, gün o gün oldu Mahmud xanın taleyi təzədən gətirdi, baxt ulduzu lap yüksəkdən doğdu: xotkar çağırıb Bayazidin paşalığını tapşırdı ona, bacısı Mərcan xanımı da nişanladı vəlihədi Əmir xana.

Amma Mərcan xanım iki ayağını bir başmağa qoydu ki, da mən ərə getmirəm...

Mahmud paşa çox yaxşı bilirdi ki, onun ayağına cidar olan bu qohumluğa xələl gətirən Kankanoğludu. Odu ki, onu bir yanlıq eləməkdən ötrü fürsət gəzirdi.

Eyvaz tutulub zindana salınan günün səhərisi Bayazid ətrafında nə qədər əli qılınc tutan varıydısa, yığılıb zindanı dağıtmaq, Eyvazı xilas eləmək üçün tədbir tökməyə başladılar. Kankanoğlu da bu dəstədəydi. O necə deyəllər, bu işi düzəldən, dəstəyə başçılıq eliyən elə onun özüydü.

Eyvaz tutulanın üçüncü günü Kankanoğlu dəstəni çəkdi bir tərəfə. Dəstə çox böyük olduğundan onu böldü kiçik dəstələrə. Onlara başçılar seçdi. Hansı dəstənin hayandan gələcəyini, kimin nə iş görəcəyini, dönə-dönə tapşırandan sonra, gedib müəyyən olunmuş vaxdı, işarəni gözləməyi tapşırdı. Hamı öz kəm-kəsirini düzəltməyə, vaxdı gözləməyə dağıldı. Kankanoğlu da evə gəlib hazırlıq görməyə başdadı.

Kankanoğlu təzəcə qılıncını silib qınına qoymuşdu. Səlim qapıdan girdi:

– Böyükkişi, Mərcan xanım dedi ki, onnan vacib işim var, özünü yetirsin mənə.

Kankanoğlu istədi ki, getməyə, amma özünü saxlıya bilməyib Səlimnən paltarını dəyişdi.

Kankanoğlu özünü yetirdi Mərcan xanımın qulluğuna. Mərcan xanım onu çəkib apardı düz zirzəmisinə. Qarşısında oturdub gözlərini dirədi gözlərinə, yazıq-yazıq dedi:

– Böyükkişi! De görüm, mana olan məhəbbətindən bir nişana qalıb, ya yox?!

Kankanoğlu hələ vəziyyətdən, məqsəddən baş çıxarmasa da dedi:

– Mərcan xanım! Mənim sənə olan məhəbbətimi soruşursansa, hər gün birə min qat artır! Amma özün bilirsən vəziyyət pisdi. Mən bir lüt

kankan oğluyam, pulum yox, dövlətim yox, şan-şöhrətim yox... Qardaşın da satır səni pula, şöhrətə?..

Mərcan xanım dayana bilmədi:

– Düz danışmırsan, əzizim! Sən öz qiymətini yaxşı bilmirsən. Qardaşım məni şöhrətə satırsa, gərək, ağlı olsa, elə sənə verəydi.

– Görmürsənmi, heç Allah da kasıbın tərəfində deyil! Təzəcə Hüseynəli xandan xilas olmuşduq, Əmir xanı ariz elədi bu yandan! Day bundan belə biz neyliyə bilərik, hansı səmtə üz tutub bir sığınacaq tapa bilərik ki, xotkarın hökmü oraya işləməsin, bizi axdarıb tapmasın, məhəbbətimizi daşa vurmasın?! Gəl daha sən məndən əl çək, get Əmir xana, sən xoşbəxt ol!..

Mərcan xanım dedi:

– Sən doğru danışırsan, Böyükkişi! İndi iş çox pis yerə ilişib, karvanımız yaman yerdə axşamlayıb! Durduqca işlər dolaşıb bu yerə çatdı. Mən bir yer bilirəm ki, oraya xotkarın yox, lap babasının da hökmü işləməz! Oraya qaça bilsək, kamımıza çatar, qorxusuz yaşayarıq!..

– Sən nə danışırsan, Mərcan xanım?! Osmanlı torpağında o necə yerdi ki, xotkarın hökmü oraya işləmiyə, orda rahat yaşamaq ola?! De görüm, o necə yerdi ki, mənim kimiləri orda muradına çata, kamına yetişib xoşbəxt ola?! Görəsən, yer üzündə elə bir bucaq, elə bir torpaq var?!

– Day hələ o yerlərə əl atma, çox uzaqlara gedib özünü yorma. De görüm, qaçmaqnan necəsən?

– O yer məni çox düşündürür axı!

– Dedim çox özünü yorma. Ora çox da uzaq deyil! Amma yolu çox çətindi. Necəsən qaçmağınan?

Sualın təkrar olunmağı Kankanoğlunu aldı:

– Qaçaq deyirsən, qaçaq də!..

Mərcan xanımın qaşları çatıldı:

– Bu necə cavabdı, Böyükkişi?!

Kankanoğlu dilini belə sürüdü ki, Mərcan xanımnan söz ala. Amma baxdı qəlbinə dəydi. Odu ki dedi:

– Mərcan xanım! Mən başımnan, canımnan hazır. Di vaxt qoy, hazırlaş!

– Vaxt?.. Vaxt bu gecə!..

Kankanoğlunun boğazı quruyan kimi oldu. Duruxdu, dillənmək istədi, nə deyəcəyini bilmədi.

Mərcan xanım onun bu halını görüb dedi:

– Bu nə sifətdi, sən düşdün, ey iyidliyi aləmə səs salmış Kankanoğlu?! Mən necə olub ki, indiyəcən sənin belə qorxaq olduğunu bilməmişəm?! Bu hal qorxaqlıqdan çox, dönüklüyə oxşayır. Bəlkə də mənnən döyülsən?! Belədirsə, gedib evində otura bilərsən!..

Qəzəbdənmi, qəhərdənmi, bilmirəm, Mərcan xanımın gözləri dolmuşdu. O, durmaq istəyəndə, Kankanoğlu biləyinnən yapışdı:

– Mərcan! Bilirsən mən heç zaman heç nədən qorxmamışam! Məhəbbətim də ər məhəbbətidi! Mən sevindiyimnən bu haldayam!.. Amma...

– Ay məhəbbətdə ər olan! Bu yolda amma olmaz! Bu gecə qaçmalıyıq! Yoxsa, bir də məni o dünyada görərsən!..

– Ay məhəbbət mələyi! Gərək sevənlər o dünyanı dilə gətirməsinlər axı?!

– Böyükkişi! Sözü uzatdıq. İş o yerdədi ki, biz bu gecə qaçmalıyıq! Dur! Vaxt itirmə!

Kankanoğlunun yenə rəngi dəyişdi:

– Mərcan, axı bu işdə tələsmək xeyir verməz?! Qoy nizam hazırlıq görüm! Heç olmasa, bu gecəliyinə aman ver, səhər axşam olum sənin qulluğunda!

Mərcan xanım ayağa qalxdı:

– Sən ya qorxursan, ya da məndən dönübsən, Kankanoğlu! Sana can sağlığı! Gedə bilərsən!

Kankanoğlu yenə onu biləklədi:

– Bu darıxmağın səbəbini bilim!

– Səbəbi? Məhəbbət!

– Bilməsəm olmaz, Mərcan!

– Gətir soruşma!

– Bilməsəm, çatdar bağrım!

– Səbəb məhəbbətdi, əsl məhəbbət! Leyli məhəbbəti, Əsli məhəbbəti, Şirin məhəbbəti! Bir də Məcnun məhəbbəti, Kərəm məhəbbəti, Fərhad məhəbbəti! Bildin!

– Yaxşı! Bu məhəbbət bu gecə tükənəsidi?!

– Deyəsən əl çəkməyəcəksən axı?

– Əl çəkəsi deyiləm! Səbəbi de!

– Məni səhər göndərirlər İstanbula. Əgər bu gecə qaça bilməsək, zəhər içəcəyəm!..

Elə bil Kankanoğluna zəhərli ox dəydi. Bir qıvrılıb açıldı, dik ayağa durdu:

– Hazır ol! Gecə yarı məni gözlə!

– Gecə yarı niyə?

– Onu soruşma!

– Bilməsəm olmaz.

– Yolda bilərsən.

Mərcan xanım baxdı söz çox uzanır, Kankanoğlu da onun dediyini demir, dedi:

Kankanoğlu, əgər məni sevirsən,
Axşamnan qaçmağa gələsən gərək!
Fərhad kimi külüngünü götürüb
Bisütun dağını dələsən gərək!

Kankanoğlu yenə yalvarmağa başladı:

İltimas eylərəm, ay alagözlüm,
Qoy qalsın vədimiz səhərə, Mərcan!
Nə iş olsa öz yoluna qoyaram,
Çəkərəm hər işi təhərə, Mərcan!

Mərcan xanım dedi:

Qəbul et cananın iltimasını,
Çətindi tutasan mərdin yasını!
Ya siləsən bu könlümün pasını,
Ya mənim yolumda öləsən gərək!

Kankanoğlu baxdı Mərcan xanım onu ölümnən qorxudur, ölümnən sınayır, dedi:

Tərlan kimi qıy vuraram, uçaram,
Dəmirdən sədd olsa, çeynər açaram!
Ya ölləm, ya səni alıb qaçaram,
Quş kimi qonaram yəhərə, Mərcan!

Mərcan xanım genə baltasını kökdən vurdu:

Mən Mərcanam, yaxşı, yaman seçərəm,
Məhəbbət yolunda cannan keçərəm.
Səhərə qalarasa, zəhər içərəm,
Deyirəm, bu başdan biləsən gərək!

Biçarə Kankanoğlu genə ox dəymişə döndü. Köksünü ötürüb istər-istəməz dedi:

Yazıq Kankanoğlu ahuzardadı,
Bir yannan sevgilim intizardadı, –
Bir bəlli iyidin ömrü dardadı,
Öldürəllər, qalsa səhərə, Mərcan!..

Mərcan xanım qaşlarını çatdı:

– Açıq danış görüm, sən nə danışırsan axı?! Nə iyid, nə dar? Kankanoğlu qalmışdı odnan suyun arasında. İndi nə eləsin? Eyvazdanmı – el içindəki adından-sanındanmı, tay-tuş arasındakı hörmətindən, etibarındanmı keçsin, məhəbbətindənmi?! Sirri açsınmı, açmasınmı?.. Axı, Eyvaz Mərcan xanımın atasının qatillərindəndi! Sirri açsa birdən qız işi pozar, qardaşına xəbər verər. Açmasa da mümkün deyil. Yox, yox, dedi:

– Mərcan xanım! Bilirsən ki, qardaşın Eyvaz xanı tutub salıb zindana! Özü də namərdliyinən tutub! Mərdliyinən tutsaydı, dərd yarıydı, işim olmazdı!..

Kankanoğlu duruxdu. Mərcan xanım onu tələsdirdi:

– Sözünün canını de görüm.

Kankanoğlu belə hesab elədi ki, işi pozdu, Mərcan xanımı qəzəbləndirdi. Odu ki, özü də qaşlarını çatıb dedi:

– İndi biz böyük bir dəstə düzəltmişik ki, bu gecə zindanı dağıdıb Eyvazı qaçıraq!.. Əvvəla, əgər sən də məni mən səni sevdiyimin minnən bircəsi qədər sevirsənsə, gecə yarıya qədər mana möhlət ver, onu xilas eliyib, hər hazırlığnan olum yanında! İkincisi də, əgər bu sirri açsan...

Mərcan xanım ona sözünün dalını gətirməyə imkan vermədi, sarıldı boynuna:

– Ay zalım olmamış! Bunu səhərdən deynən dana! Elə mən də səni ona görə çağırmışam! Gərək bu gecə Eyvazı xilas eliyək, onnan bərabər qaçaq Çənlibelə! Mənim dediyim yer bax, o Çənlibeldi!

– Amma mənim tədbirim özgədi: siz düz hərəkət eləmirsiniz. Bilmirsinizmi paşanın zindanı möhkəm, keşikçisi də çoxdu?! Hələ deyəsən, paşa zindana basqın olacağından şəkkə düşüb, keşikçilərini çoxaldıb, ayıq-sayıq durub... Odu ki, sizin tədbiriniz çətin baş tutar, qanı-qadası çox olar. Çox cavan korranar, bəlkə də Eyvazın ölməyinə bayıs olarsınız!

– Amma budu, mənim zirzəmimnən zindana beşcə addım yoldu. Sən bütün yoldaşlarını xəbərdar elə, qoy bu gecəliyə gözləsinlər. Özün də ürəyinə yatan dostlarınnan birini götürüb əl-ayaq çəkiləndə ol yanımda. Lağm ataq, Eyvazı qaçıraq! Nə səs olsun, nə qırğın, nə də qada! Əgər işimiz baş tutmasa, zindan durur, siz durursunuz!..

Kankanoğlu baxdı doğrudan da, bu tədbir onların tədbirinnən çox yaxşıdı, çox asan, qansız-qadasızdı. Bu fürsət göydən düşmə olduğundan razılaşdı. Özü də vaxt itirməyib özünü yetirdi dostlarına. Hamını yığdırdı bir yerə, əhvalatı danışdı. Hamı bu tədbiri bəyəndi. Dəstə başçılarından biri dedi:

– Tədbir çox ağıllı tədbirdi. Qoy bu kankan Mirzəli olsun Kankanoğluna yoldaş. Qalan hamı öz dəstəsiynən hazır olsun döyüşə. O tərəflərdə güdükcü qoyaq. Demək olmaz, birdən burda kələk-mələk, fel-mel olar.

Bəli, əl-ayağ yığışanda, Kankanoğlu hər bir hazırlığıynan oldu Mərcan xanımın qulluğunda. Onsuz da Mərcan xanım hər şeyi hazır eləmişdi. Başladılar işə. Hər iki iyid işə elə girişdi ki, az bir vaxtda lağm yarıdan keçdi. Amma birdən qabaqları çıxdı sal daşa. Altdan vurdular, olmadı, üstdən vurdular, olmadı, əlac daşı deşməyə qaldı. Çox çətinlik çəksələr də, daşı deşdilər...

Səhərə az qalırdı. Eyvaz baxdı qulağına tappıltı gəlir. Qulaq verib gördü, nədisə, zindandı. Belə hesab elədi ki, Çənlibeldən gəlib zindanı dağıdırlar. Ürəyi atlandı, öz-özünə oxudu:

Dəli könül, cövlan elə havalan,
Çənlibeldən haray gəldi yetişdi!
Qədirbilən qoç iyidlər atdandı,
Çənlibeldən haray gəldi yetişdi!

Qansız olmaz Koroğlunun meydanı,
Düşmənin yüz olsa, qurtarmaz canı.
Sökülür paşanın dəmir zindanı,
Çənlibeldən haray gəldi yetişdi!

Uçam o dağlara, qayıdam gələm,
Namərd düşmənimin bağrını dələm!
Yolumu gözdəyir anam Zərqələm,
Çənlibeldən haray gəldi yetişdi!

Yağılara ölüm yazan gəlibdi,
Düşmənnərə qəbir qazan gəlibdi,
Tüpdağıdan, Halaypozan gəlibdi,
Çənlibeldən haray gəldi yetişdi!

Kürdoğlu olubdu Eyvaza qardaş,
Dəli Həsən kəsər, dığırranar baş,
Dəmirçioğlu qoymaz daş üstündə daş,
Çənlibeldən haray gəldi yetişdi!

Söz tamama yetər-yetməz, Kankanoğlu hazır oldu Eyvazın yanında. Cumdu ki, Eyvazın əl-ayağını açsın, Eyvaz dedi:

– De görüm, sən kimsən, nə eləmək istəyirsən?

– Onu soruşma, Eyvaz! Vaxdımız azdı!

– Deməsən olmaz!

– Axı vaxt yoxdu! Səhər açılır! Biz səni xilas eləməyə gəlmişik. Qalanını yolda bilərsən!..

– Yox, gərək kim olduğunuzu, nə məqsədnən məni xilas eləmək istədiyinizi deyəsən!

Kankanoğlu ha elədi, olmadı. Əlacsız qalıb əhvalatı qısaca danışdı. Eyvaz əhvalatdan xəbərdar olanda, minnətdarrıx eliyib dedi:

– Çox sağ olun, əzizlərim! Çox əziyyət çəkibsiniz, cəfanız böyükdü, fədakarlığınızın həddi-hüdudu yoxdu, yaxşılığınız əvəzsizdi! Amma indi bu iş baş tutmaz! İndi qaçmaq olmaz!

– Niyə, Eyvaz?!

– Özün dedin ki, səhər açılır. Budu ey, qulaq ver, xoruzdar bannaşır. Bundan sonra biz heç yana qaçıb çıxa bilmərik. Biz o yana, o qız ki, deyirsən, ona xata toxunar! Hər səhər işıqlaşar-işıqlanmaz, gəlib məni yoxluyullar, çox çəkməz ki, yoxluyub məni görməzlər, lağımı tapıb işi bilələr, bizi tutallar! Ancaq əlac ondadı ki, bu gələn axşamı gözdüyək. Öldüm, borcumu ödədim, qalsam, qaçarıq!..

Kankanoğlu genə çox dirəndi, olmadı. Qayıtdı Mərcan xanımın yanına. Mərcan xanım tələsik soruşdu:

– Səhərdi! Neyləyə bildiniz?

Kankanoğlu əhvalatı danışıb dedi:

– Eyvaz tərslik eliyir!

Mərcan xanım dedi:

– Eyvaz düz deyir. Ona yemək aparın. Özündən də öyrənin görək ayrı bir tədbiri, başqa bir sözü yoxdu ki?! Soruşun görək biz necə eləyək ki, onu yoxlayanda lağımı görən olmasın?

Kankanoğlu yemək götürüb qayıtdı:

– Eyvaz, Mərcan xanım sənin haqlı olduğunu deyir. İndi de görək, neyləyək ki, səni yoxlayanda lağımı görən olmasın? Bir də bəlkə ayrı tədbirin, tapşırığın ola?

Eyvaz dedi:

– Lağımı görməklərindən arxayın ol. Məni elə qapıdan baxmağnan yoxlayırlar. Özgə tapşırığım da budu ki, bacarsanız, Çənlibelə bir adam qaçırın. Ehtiyat iyidin yaraşığıdı axı. Bir də yollarda adam qoyun. Mənim vədəm keçib. Əlyəqindi ki, Koroğlu məni axtarır. İşdi, bu tərəflərə gələn olsa, xəbər versinlər.

Kankanoğlu soruşdu:

– Tutaq ki, yaraqlı-yasaqlı adam gördük, nədən bilək ki, Çənlibeldəndi?

– Düz deyirsən. Əgər elə adam görən olsa, yanaşıb Mərcan xanımın adını versin ki, Mərcan xanım səni gözləyir. Bizim uşaqlar arifdirlər, onlardan olsa, deyəcək ki, göstər onun yerini, özgəsi olsa, deyər mən hara, Mərcan xanım hara! Belə nəm-nüm eləyənnən keçsinlər...

Bəli, əlac gözdəməyə qaldı. Kankan Mirzəlini xəbərə qaçırdılar, bir-iki yerə də adam qoydular ki, gələn olsa xəbər versin.

Günorta üstə Səlim qantər içində Kankanoğlunu tapdı:

– Mərcan xanım deyir, tez yetirsin özünü mənə.

Kankanoğlu təlaşla soruşdu:

– Xeyir ola, Səlim? Bir iş baş verməyib ki?

Səlim heç nə bilmədiyini söylədi. Vaxt itirmək olmazdı. Paltarlarını dəyişdilər. Kankanoğlu özünü yetirdi Mərcan xanıma:

– Xeyir ola, Mərcan?

Elə xeyiri yoxdu! Bu saat öyrənmişəm ki, qardaşım öz adamlarını yığıb tədbir istəyib. Qoçu Mehdi tədbir töküb ki, gecə ikən Eyvazı assınlar. İşi də tapşırıblar onun özünə. İndi gərək biz axşamdan qaçaq

ki, bir yana çıxa bilək. Hələ adamlar dağılandan sonra qardaşımnan Qoçu Mehdi tək qalıb ayrı nə tədbir tököblər, bilmirəm.

Kankanoğlu dedi:

– Nə tədbirin var, de, yerinə yetirim.

– Durmaq olmaz! Bilirsən ki, axşamdan şəhərdən atnan çıxmaq olmaz. Odu ki, gərək atları şəhərdən çıxarıb yaxın kəndlərin birində qoyasan, piyada çıxaq, ordan minib gedək.

Kankanoğlu baş üstə deyib çıxmaq istəyəndə Mərcan xanım dayandırdı:

– Darıxma, darıxma, ehtiyatlı ol!

Kankanoğlu yenə tərpənmək istəyəndə dayandı:

– Mərcan xanım, bəs axı o İstanbul, zəhər...

Mərcan xanım gülüb sözünü kəsdi:

– Elə şeylər yoxdu. Özüm elə deyirdim ki, işi səhərə qoymayasan!

Kankanoğlu vaxt itirməyib atları hazır elədi, nalladıb şəhərdən kənardakı dostunun yanına aparmağa başdadı. Üçüncü atı aparmağa qayıdırdı, şəhərin girəcəyindəki dərədə başına palaz atıb götürdülər. O zaman gözünü açdı ki, zindanda Eyvazın yanındadı.

Kankanoğlu elə bilirdi ki, lağmın üstü açılıb. Ağzını açırdı ki, Eyvazdan soruşa, Eyvaz onu qabaqladı:

– Ah, mənim qardaşım! Siz mənim ucumnan özünüzü bəlaya saldınız! De görüm, Mərcan xanımın başında nə var?

Kankanoğlu baxdı ki, burda arxayınlıqdı, dedi:

– Qəlbini sıxma, Eyvaz, heç nə yoxdu. Məni özgə səbəbdən tutublar. Bu saat işin əsasını bilərəm.

İncavara, onun əl-ayağını ipnən sarımışdılar. Xəcalət çəkə-çəkə Eyvazın yanına süründü:

– Dişlərinnən aç mənim qollarımı!..

Eyvaz, əvvəlcə eləmək istəmədi. Fikirləşdi ki, çıxıb o qızı da salar işə. Bir də ürəyində özünü danladı ki, bu, mənim yolumda özünü ölümə verir, qoy açım, bəlkə xilas ola. İpi çeynədi. Əlləri açılan Kankanoğlu ayaqlarını da özü açıb lağnan özünü atdı Mərcan xanımın yanına.

Mərcan xanım onu görəndə dəli kimi oldu:

– Sən nə iş görürsən, ay zalım? Bu boyda da saymazlıq olar? Günün günortasında öz paltarınnan gəlirsən!.. Əgər görən oldusa, işimiz bitdi!..

Kankanoğlu baxdı burda da arxayınlıqdı, özünü o yerə qoymadı:
– Özün demədinmi tez qaçmaq lazımdı. Day məni niyə qınayırsan?
Mərcan xanımın nəfəsi daraldı:
– Mən belə demişəm? Sən uşaq kimi iş tutursan...
Kankanoğlu baxdı qız onun görünməyinnən qorxur, dedi:
– Vallah, elə gəlmişəm ki, bir inni-cinni görməyib.
– Atlar hazırdı?
– Bə nə! Hazırdılar.
– Allaha pənah! Onda səni gizlədim, qaranlıq qovuşsun.
Kankanoğlu baxdı vaxt var, çıxıb o biri atı da aparmaq qərarına gəldi:
– Mən burda gizlənib dura bilmənəm. Bir çıxım hərlənim. Birdən Çənlibeldən gələn olar!..
Mərcan xanım çox dedi, Kankanoğlu az eşitdi. Axırda qızın əlacı kəsildi, Səlimi çağırdı, onlar paltarlarını dəyişdilər, Kankanoğlu özünü atdı çölə.
Qaş qaralırdı. Göyün üzünü qara bulud almışdı. Tək-tək yağış atırdı. Kankanoğlu İstanbul darvazasına çatanda baxdı ki, bir atlı gəlir. Ayağını saxladı. Atlı yaxınlaşanda baxdı ki, nərin biridi, yaraq-yasağına da söz ola bilməz. Əlyəqin elədi ki, bu, ya Koroğludu, ya da Dəli Həsən! Baxdı geridən biri də gəlir. Ürəyi atlandı ki, Çənnibellilərin ağzı açılıb. Yanaşdı qabaqda gələnə:
– Ağa, Mərcan xanım sizi gözləyir...
Onun ağzından söz qurtarmamış atlı əmr elədi:
– Düş qabağıma! Sözün yalan olsa, başın özünün deyil!
Kankanoğlu əlyəqin elədi ki, bu, Koroğludu. Düşdü qabağa...
Həmin adam Mərcan xanımın qapısını o zaman açdı ki, qız hər şeyi hazır eləyib, yönü o tərəfə balaca xəncərini belinə bağlayırdı. Qapı açılanda ürəyi atlandı, elə bildi gələn Kankanoğludu. Vəcdə gəlib dedi:
– Gəl, ay mənim sərvərim, gəl! Mən sənin qulluğunda hazıram!
Qapını açan adam da vəcdə gəldi:
– Mən də sənin qulluğunda qul olub durmuşam, ay mənim bəxt ulduzum, ay mənim mələyim! Bir gül üzünü bəri döndər görüm, sənə nə olub ki, belə rəhmə gəlibsən.
Mərcan xanım səsdən almadı. Geri dönəndə az qaldı ki, qışqırıb yıxılsın, huşunu itirsin. Amma özünü hünərnən ələ aldı!..

Qapının ağzında duran kim olsa yaxşıdı?

O, Əmir xanıydı.

İndi Mərcan xanımın halını özünüz fikirləşin... Qəşş eləməzdimi, özünü itirməzdimi?

Yox, Mərcan xanım ər kimi dayandı. Özünü sevinən göstərdi. Bir kövrəkliknən dedi:

– Bu nə layıxdı, ay Osmannı torpağının gələcək xotkarı? Heç gör çoban bunu elərmi ki, sən eləyirsən?! Bu boya gəlibsən, bilmirsən ki, zənən xaylağının üstünə izin almamış qapı açmazlar?!.

Əmir xan baxdı ki, doğrudan da yaman qanmazlıq eləyib, kəkələyə-kəkələyə dedi:

– Mərcan xanım, doğru buyurursan, səhv eləmişəm! Gözlərinə qurban olum, məni bağışla! Amma əslində günah səndədi. Vallah, sənin qulluqçun Mərcan xanım sizi gözdüyür deyəndə heç bilmədim sevindiyimdən neyliyim! Axı necə sevinmiyim! Budu, necə müddətdi yola gəlmiyən, məni atəşi-fərağında yandıran bir yar bu gün yolumda adam qoyub, məni gözləyib, intizarımı çəkib... Sınsın mənim qədəmlərimi ki, tez gəlməmişəm, səni intizarda qoymuşam! Başına dolanım, qoy qayıdım, təzədən gəlim!..

Mərcana da bu lazımıydı. İrəli yeridi, lap mülayimliknən dedi:

– Hə, əzizim! İncimə, qoy əyin-başımı düzəldim.

Əmir xan geri çəkildi. Mərcan xanım Kankanoğlunu səslədi:

– Ayə, ay maymağın biri maymax, içəri gəl!

Kankanoğlu əndikmiş özünü atdı içəri:

– Bu da Koroğlu! Mərcan, day nə istəyirsən?!.

Mərcan xanım aman vermədi:

– Karvanımız pis yerdə axşamlayıb! Bu, Əmir xandı. Ləngimək olmaz, çağır onları içəri. Özünü tox saxla! Mən nə desəm, onu elərsən! Səbrini əldən qoyma!..

Əmir xangili çağırdılar içəri. Mərcan xanım qu tükündən olan nazbalıncların ikisini qoydu üst-üstə, Əmir xana oturmağı təklif elədi. Əmir xan irəli yeriyib Mərcan xanımın behişt qoxulu əlinnən öpdü, bardaş qurub nazbalıncların üstündə oturanda, elə bildi ki, bütün dünyanın şahı oldu, qızıl taxtda əyləşdi, de başdadı basıb-bağlamağa:

– Mərcan xanım! İndi gör sənin o əziz atanın qanını Koroğludan nə sayaq alacağam! Bəyəm mən ölmüşəm ki, onun qanı yerdə qala?!

Mənə də Əmir xan deyəllər!.. O necə Eyvazıydı ki, mənim nişannımı ap-ap-apar...

O, kəkələdi. Baxdı ki, heç bu sözün yeri yoxuydu. Bir təhər özünü düzəltdi:

– Əlbəttə, sənin bir telini vermərəm min Hürü kimi kənizə! Qoyaram indi əllərini qoynunda. Allah qoysa, gələr o gün ki, onu elərəm sənin qavağında qaravaş!.. Səhər Allahın izniynən, sənin o ala gözlərinin qavağında gərək Eyvaza əvvəlcən sağ-sağ bir Əli-Vəli dağı çəkəm, sonra da kəsəm başını! Deyirəm, Mərcan xanım! Onun qanından içərik, izin versən, toyumuzu başlarıq, onun başını da qoyarıq xonçamıza...

Sözün bu yerində Mərcan xanım dözmədi, qaşlarını çatdı:

– Əmir xan! Mənim nənəm də gedib görsə ki, bir qurdun ayaqlarını sarıyıb yıxıblar yolun içinə, salar daşı başına, soyar dərisini, gətirər ki, nə var, nə var, mən də ovçuyam! Bilirsən ki, Eyvazı tutan oğullar var! Əhdim var ki, Eyvazın başını özüm kəsəm! Səni çağırmaqda məqsədim ayrıdı: gərək səhər gedib Koroğlunun başını gətirəsən, ikisinin başını qoşa qoyaq xonçamıza!..

Sözlər oldu zəhərli ox, Əmir xanın bu tayından dəyib o tayından çıxdı. Qovşurulub dedi:

– Noolu! Mərcan xanım, onu da elərik!.. İndi rusğat ver mən paşanın hüzuruna təşrif aparım!

Əmir xan bunu deyib dik ayağa qalxdı.

Yəqin ki, özünüz bu dəmdə Kankanoğlunun halını gözünüzün qabağına gətirirsiniz. Onun halı sizin fikirləşdiyinizdən də bədiydi. Axı, gecə keçib gedir, o tərəfdə dar ağacdarı qurulurdu!..

Əmir xan ayağa qalxanda, elə bil, dünyanı ondan alıb verdilər Kankanoğluna. O, özünü yığışdırdı ki, Əmir xan çölə çıxanda özünü üstünə atsın, ya canını versin, ya da onu bir yannıq eləsin ki, vaxdında bir yana çıxa bilsinnər...

Amma birdən yenə iş özgə cür oldu: Mərcan xanım irəli yeriyib gülə-gülə Əmir xanı məzəmmət elədi:

– Sən nə yaman dəymədüşərmişsən, ay dəli oğlan! Ay mənnən ötəri səbri-qərarı olmayan yar! Bəs birdən-birə nə oldu belə üz döndərdin, belə tez doydun? Sözdərim xətrinə dəydi? Mən hənək elədim, ay başımın tacı! Gəl otur! Səhər Allah qoysa, Eyvaz olacax sənin

ixdiyarında! Özün necə bilirsən, elə də elə! Amma gərək onun qanından göndərəsən, bir içəm!.. Qoyarammı gecə vaxdı gedəsən?! Yol gəlib yorulubsan. Özüm sənin əl-ayağını yuyub rahat eləməsəm olmaz. Otur!

Bu dil Əmir xanı elə məst eləmişdi ki, bu saat bütün dünyanın varını bir alma boyda eliyib uzadasan, özünü görməzliyə qoyar, gözünün ucuynan da baxmazdı.

O saat oturdu. O, Bəhlulu başından tez eləməkdən ötrü dedi:

– Bəhlul, dur get rahat ol! Səhər gələrsən, paşadan sana ənam alıb verərəm!

Onsuz da işdən şəkkə düşüb narahat olan Bəhlul burdan tez çıxıb özünü paşaya yetirməkdən ötrü sinoy gedirdi. Tez qalxdı ayağa...

Kankanoğlu Mərcan xanımın bu hərəkətinə mat qalmışdı. Şübhə onu götürmüşdü. Hazırlaşırdı ki, atılıb ikisini də doğrasın...

Mərcan xanım onun vəziyyətini görüb dedi:

– Ay gəda! Yatma. Yuxuda sana plov verəllər! Apar Bəhlulu yola sal, get dincəl, səhər tezdən gəl!..

Kankanoğlunda tərpənmək iqtidarı hardaydı?! Bəhlul qapıdan çıxanda, Mərcan xanım irəli yeridi, Kankanoğlunun qolundan tutdu:

– Genə niyə kar qulağına salıbsan? Ay o biri qulağı da tutulmuş!..

Onu çölə itələdi:

– Qoyma! Bəhlulun işini bitir, bağçada məni gözlə!..

Kankanoğlu yuxudan ayılan kimi birdən atıldı çölə, özünü yetirdi yazıq Bəhlula. Tutmağıynan cannan eləməyi bir oldu.

Çox keçmədi ki, Mərcan xanım göründü. Kankanoğlu yeridi irəli:

– Sən nə eləməkdəsən! Gecə keçib gedir!..

– Əmir xanı bihuş eliyib uzatmışam yerə! Sən neylədin?

– Mən onu bayaqdan bihuş eləmişəm. Di durma! Əmir xan ayılanacan bir yana çıxaq!..

Mərcan xanım aramla dedi:

– Sana demədimmi toxdax ol! İndi Səlimi çağır. Əmir xanı götürək zindana! Onu Eyvaznan dəyişək! Belə olsa, səhərə qədər arxayınlıq olar!..

Mərcan xanımın ağılasığmaz bu tədbiri Kankanoğlunu vəcdə gətirdi:

– Mənə heç kim lazım deyil, ay ağıl dəryası!

O özünü içəri atanda, Səlimin səsi eşidildi:

– Köməkdən zərər gəlməz, ay zəmanəsinin Rüstəmi-Zalı! Məni də yoldaş elə!

Əmir xanı götürdülər zindana. Onu elədilər Eyvaz, yıxdılar yerə. Amma Kankanoğlu elə elədi ki, assalar, tərpənib asanlara əziyyət verməsin. Asmasalar, dinib heç kimi yuxudan oyatmasın. Onlar çıxmaq istəyəndə, Kankanoğlu duruxdu. Mərcan xanım hövsələdən çıxdı:

– Day durmaq vaxdı deyil axı!

Kankanoğlu dedi:

– Mərcan xanım! Sən bilmirsən, amma Eyvaz bilir: gərək mən də zindandakı Eyvazın yanında olam ki, səhərə qədər arxayınlıq ola!

Mərcan xanım dinmək istədi. Kankanoğlu aman verməyib əhvalatı danışıdı. Mərcan xanım çaşbaş qalanda, Səlim irəli yeridi:

– Mənim əl-ayağımı sarıyın qoyun burda. Kankanoğlu, soyun paltarını! Bıy, elə sənin paltarın məndədi dana! Di durmayın! Sarıyın əl-ayağımı!..

Birdən Kankanoğlu özünü atdı çölə. Yazıq Bəhlulu hop götürdü içəri. Səlim Kankanoğlunun paltarını soyunmalı oldu. Onu da elədilər Kankanoğlu, qoydular zindandakı Eyvazın yanına. De tərpəndilər.

Çölə çıxanda, Kankanoğlu Əmir xanın atını açdı. Mərcan xanım genə dillənməli oldu:

– Artıx at nəyinə gərəkdi, Böyükkişi?!

– O atların biri nallananda mıxa düşüb, axsıyır.

Bəhlul da atdıydı axı. Səlim də onun atını açdı:

– Mən də siznən olmalıyam!..

Düşdülər yola...

Bunların yolu düşdü Ala dağdan. Səhərə qədər at sürdülər. Səhər gün vuranda, yetişdilər Ala dağdakı Qıvla bulağına. Təhlükədən sovuşduqlarını görən Mərcan xanım dedi:

– Burda düşək. Həm atlar otlasın, dincəlsin, həm də özümüz çörək yeyib dincələk.

Düşdülər. Bir az dincələndən sonra Mərcan xanım dedi:

– Böyükkişi, bu əkinlər görsədir ki, yaxınlarda kənd var. Bəlkə bir sınıxçı tapasan. Eyvazın qolu yaman şişib.

Kankanoğlu durmaq istəyəndə, Səlim xahiş elədi qoyun mən gedim. Razılaşdılar.

Çox keçmədi Səlim bir atdıynan qayıtdı. Atdı atınnan aşrılıb onlarnan görüşdü. Sonra düşdü Mərcan xanımın ayaqlarına.

Məlum oldu ki, o, Səlimin böyük qardaşıdı. Səlim balaca vaxdı diləndikləri zaman itibmiş. Bu təsadüf nəticəsində tapışıblar. Onun adı Murğuzuydu.

Murğuz onları evinə apardı. Sınıqçı gətirdilər. Eyvazın qolu sarındı. Bir gün dincəlib o biri günün axşamı düşdülər yola. Səlim xahiş elədi ki, izn verin, bir müddət qardaşımın yanında qalım. İzn verdilər.

Səhər dan yeri ağaranda, Kankanoğluynan Mərcan xanım baxdılar ki, başı qarlı uca dağların ətəyindədilər. Gördülər ki, Eyvaz özündən ixtiyarsız, atını qabaxda sürür. Bildilər ki, bura haradısa, Çənlibelə yaxın yerdi. Odu Kankanoğlu geridən Eyvazı səslədi:

– Eyvaz! De görək, daha burdan belə bizə bir xətər dəyməz ki?

Eyvaz atın başını çəkib ala gözlərini bir də dolandırdı. Çənlibelin qarlı zirvələri gözlərinin qabağında cilvələndi. Atın başını geri çevirib dedi:

Əziz qardaş, bura mərdlər yurdudu,
Namus buralarda, ar buralarda!
Tərlan oylağıdı bu dağlar tamam,
Qanad çala bilməz sar buralarda!

Koroğlu bəsliyib Çənlibel başı,
İyid bərəsidi onun hər daşı.
Canınnan yey bilər yoldaş yoldaşı,
Yetişər yarına yar buralarda!

Bura oylağıdı şux gözəllərin,
Saxlıyır sirrini ər oğlu ərin.
Suyu məcun olar, havası sərin,
Qalar təzə qara qar buralarda!

İyidlər məşq üçün düşəndə bəsə,
Dil açar qayalar, verər səs-səsə.
Namərdliynən xata dəyməz heç kəsə,
Qurulmaz məzluma dar buralarda!

Gündə üç yol ağır məclis qurular,
Yeyilər, içilər, damaq durular,
Kim tutsa başını, dərdi sorular,
İsdəsə, yetişər nar buralarda!

Bu azad dağları gəz vədəsində,
Bülbül gülü səsdər yaz vədəsində,

Gül bülbülə çatar öz vədəsində,
Qonmaz gül üstünə xar buralarda!

Mərcan, xan Eyvazın xilaskarıdı,
Kankanoğlu onun ixdiyarıdı,
Koroğlu mərddərin qoç sərkarıdı,
Əcəm də, türkman da var buralarda!

Söz tamam oldu. Eyvaz atın başını döndərdi Çənlibelə. Bir də gözünü dolandıranda, nə oldusa, kefi pozuldu, rəngi qaraldı, qaş-qabağı töküldü. Atın başını çəkib durdu.

Kankanoğlu atını irəli sürdü:

– Eyvaz, sənə nə oldu?

Eyvaz dinmədi.

Mərcan xanım da atını qabağa sürdü, soruşdu ki, Eyvaz sənə, nə oldu? Eyvaz dinmədi. Eyvaz, dərdini de! Eyvaz dinmədi. Qardaş, axı birdən-birə niyə belə elədin? Eyvaz dinmədi ki, dinmədi. Elə bil, dilinə qıfıl vurulmuşdu... Mərcan xanım dedi:

– Eyvaz! Bəlkə bizi gətirməyinə peşman olubsan? Bəlkə qorxursan biznən gəlməyinin üstündə üzünə söz gələ? Bəlkə Koroğlu bizi qəbul eləməz? İsdəyirsən, qayıdıb gedək!

Eyvazdan səs çıxmadı. Mərcan xanımı qəhərri qəzəb aldı. Gözləri doldu, qəhərnən dedi:

Mən aşığam, sinədə,
Qar əriyər sinədə,
Qadam namərdə dəysin,
Onun kölgəsinə də!

O, atının başını döndərdi geriyə, üz tutudu Kankanoğluna:

– Qaytar atını geri! Belələrinə pənah aparmaqdansa, ölümə getmək yaxşıdı. Görünür, day, bizim burdan belə getməyimizə razı deyil!

Onlar atları geri döndərəndə, Eyvaz yuxudan ayılan kimi oldu, fikirdən ayrılıb atını sürdü Mərcan xanımın atının qabağına.

Mən aşığam, küsən ər,
Ağac bara, küsənər,
Kimə şikayət eylər,
Bir gədadan küsən ər?!

Mərcan xanım elə haldaydı ki, çırtıq vursan, qanı damardı. O, ayaqlarını atın yanlarına sıxdı, cilovu tərpətmək istəyəndə Eyvaz baxdı ki, gedir, atını onun atının qabağına sürüb dedi:

Bir dərdim var, bu dağlardan böyükdü,
Onunçun qaraldı qanım, incimə!
Bağışla taqsırım, qulam, xatam var.
İnsafa gəl, Mərcan xanım, incimə!

Söz Mərcan xanıma əsər elədi. Amma qəhərini azaltmadı. Ala gözləri lap dolub gilələndi, titrək səsnən dedi:

Sənnən incimirəm, ay insan oğlu,
Fələk vurub mənə əl, incimişəm!
Öz qardaşım yağı çıxıb özümə,
Kömək etməz özgə el, incimişəm!

Eyvaz dərdinin vəcini demək istədi:

Dağlar kimi çən-dumana bürünüm,
Hansı üznən Koroğluya görünüm?..
Qoy yıxılım ayağına sürünüm,
Kəs başımı, axıt qanım, incimə!

Amma Mərcan xanım Eyvazın sözündən heç nə annaya bilmədi, daha da həm şübhəsi artdı, həm də Eyvaza acığı tutduğundan öz dərdini özünə danışdı:

Mən illərnən göz yaşımı tökmüşəm,
Qəm əlindən əlif qəddim bükmüşəm,
Məhəbbət ucundan nələr çəkmişəm,
Deyə bilməz onu dil, incimişəm!

Eyvaz da öz dərdindən danışdı:

Dərdim var göydəki ulduz sanında,
Günahkaram Koroğlunun yanında.
İtər etibarı Eyvaz xanın da,
Nə gizlədim, səndən danım, incimə!

Mərcan xanım yenə anlıya bilmədi ki, Eyvazın Koroğlunun yanında nə günahı ola. Nə fikirləşdisə, qara qaşları lap gəlib bir-birinə qovuşdu, qəzəbnən dedi:

Mərcana de, qaşın niyə çatırsan,
Açıx danış, niyə yasa batırsan?
Yayın gizdədirsən, oxun atırsan,
Belə işdərindən bil, incimişəm!

Eyvaz baxdı dərdini söznən deyə bilmədi, dilnən dedi:

– Mərcan xanım, budu, üç gündü biz yol yoldaşıyıq. Heç soruşmursunuz ki, mən Bayazidə niyə getmişəm. Necə getmişəm? Demirsiniz axı sizi bu əziyyətlərə niyə salmışam?!

Baxdılar kişinin oğlu düz deyir, soruşdular.

Eyvaz, əhvalatı biz necə biliriksə, eləcənə danışıdı onlara. Axırda da dedi ki, indi mən Çənlibelə nə üznən qayıdıram? Atım yox, qılıncım yox, geyimim də özümünkü deyil. Hünərim nə olub ki, sağ qolumu asmışam boynumnan?

Baxdılar ki, doğrudan da Eyvazın dərdi böyük, günahı da çoxdu. Amma nə eləmək olardı. Mərcan xanım incidiyinə peşman olub şübhələndiyinə görə xəcalət çəkə-çəkə dedi:

– Atalarımız keçənə güzəşt deyiblər, Eyvaz! Nə tökülən dolar, nə də keçən qayıtmaz. İyid yaranıb ki, başı qovğa-qal çəkə, gah vura, gah vurula. Düşmənnik qumar kimi bir şeydi, gah bir tərəf aparar, gah da o biri tərəf. Koroğlu sənin sağ olmağına şükür eləməlidi. Mən iltimas edərəm, günahından keçər. Allah qoysa, sağalan kimi də gedib Leyli xanımı gətirərsən...

Eyvazın eyni xeyli açıldı. Başladılar yollarına. Mərcan xanım sözü elə başladı, elə gətirdi ki, hər şey yaddan çıxdı...

Onların başı şirin söhbətə elə qarışmışdı, Ağqayadan necə keçdiklərindən xəbərləri olmadı. Bir də Eyvaz başını o zaman qaldırdı ki, At düzündədirlər. Gözünü dolandırdı ki, hər yer qara boyanıb, bərəbəndərgahlar da bomboşdu. Elə bil, Çənlibel yerinnən köçüb. Elə bircə dəfə, – Aman Allah, kimin başında nə iş var? – Koroğlununmu, Nigar xanımınmı?.. deyib huşunu itirdi. Kankanoğlu onu tez tuta bildi, atdan yıxılmağa qoymadı...

Kankanoğlu axırda dedi:

– Mərcan xanım Eyvazın başını aldı dizinin üstünə, mən də üzünə su səpirdim ki, o dəli adam gəldi, Eyvaz ayılıb ona yaxınlaşanda qayıdıb qaçdı, bir də gəldi. Özgələr də gəldilər, bizi gətirdilər. Budu sizin qarşınızdayıq. Amma məni bir şey narahat eləyir, Mirzəli gözümə dəymir. Yəqin başında iş var. Gərək izn verəsiniz qayıdam onun dalıncan...

Kankanoğlunun sözünün dalını heç kəs eşitmədi. Elə bil, qabağı çilləkən bağmış dağ selinin qabağı açıldı. Hamı axdı onnarın üstünə. De öpən kim, qucan kim, indi də sevindiyindən ağlıyan kim!.. Başınızı nə ağrıdım, Kankanoğlu o zaman gözünü aça bildi ki, axşam olub, şamlar yanıb. Eyvaznan ikisi də bir xanadadılar. Baxdı ki, bir arvad Eyvaza deyir:

– Eyvaz, bala! Bəs adam anasını belə unudar?

Süfrə açıldı. Yedilər-içdilər. Elə süfrə təzə yığılmışdı, bir nəfər qapını açıb dedi:

– Nigar xanım! Məclis arəstə olub. Koroğlu dedi uşaqları da, Zərqələm bacını da götürüb gəlsin.

Onlar durub məclisə yollandılar. Kankanoğlu yolda fikirləşdi ki, fürsət tapıb Koroğludan izn alsın, Mirzəlinin dalınca getsin. Onlar məclisə daxil olanda Kankanoğlu nə görsə yaxşıdı? – Baxdı ki, Mirzəli qan-tərin içində durub Koroğlunun qabağında, tövşüyə-tövşüyə deyir:

– Bayaziddən çıxar-çıxmaz məni tutdular, qaytardılar düz Mahmud paşanın yanına. Paşa məni çox döydü, çox söydü, çox hədə-hərbə gəldi ki, de görüm, mənim atımı minib hara gedirdin? Dinmədim ki, dinmədim. Bir istədi ki, cəllada əmr eliyə, başımı bədənimnən ayıra, sonra nə fikirləşdisə, əmr elədi ki, aparıb bunu salarsınız minib qaçdığı atın tövləsinə. Qoy Eyvazı bir təhər eləyim, onda baxaram işinə.

Məni saldılar tövləyə. Elə o gün səhər atdara yem verib çıxdıqları oldu. İki gün tövləyə gələn olmadı. Atdar da acından qırılırdı, mən də. Üçüncü gün qapı açıldı, iki adam girdi içəri. Baxdım biri o birinə deyir ki, Mahmud paşa necə müddətdi mənim Qəmər atımı gözümün qabağında minir. İndi gərək onun toyuna bu atın üstündə baxam!.. Bunların hərəsi bir ata yanaşdı ki, açalar, birdən məni gördülər. Biri atıldı üstümə ki, ay yazıq, paşanın hansı qəzəbinə düşübsən, dur, bu atlardan birini min, çıx paşanın toyunun tamaşasına. Əl-ayağımı açdılar. Day soruşa bilmədim ki, ay qardaş, nə paşa, nə toy. Hərəsi bir atı çəkdi çölə. Gözlərimi sildim ki, lap dibdəki axura bir at bağlanıb. Yanaşdım. Bir az dəlilik elədi, yox-yox, yəhəri basdım belinə, çəkdim çölə. Belinə atılma-

ğımnan götürülməyi bir oldu. Ha elədim yüyənini yığa, başını bir yana döndərə bilmədim ki, görəm nə toydu. Elə onu qənimət bildim ki, özümü bərk saxlayım. At quş olmuşdu. İncavara, düz gəlib bura çıxmışam. Amandı, Koroğlu! Durma! Özünü yetir, uşaqlar yaman dardadılar!..

Gülüşün şaqqıltısı məclisi titrətdi. Mirzəli qaldı çaşbaş ki, əyəm bura Çənnibeldisə, mən Koroğlunun hüzurundayamsa, bu nə şaqqanaxdı, axı Eyvaz dardadı... Fikirləşdi ki, özgə yerdə, Koroğlunun düşməninin məclisindəyəm, məni ələ salıblar.

Kankanoğlu özünü saxlaya bilmədi, atdı Mirzəlinin üstünə. Biçarə Mirzəli indi gözünü sildi ki, səhərdən bəri qənşərində oturan doğrudan da Mərcan xanımıymış. Görürmüş, amma ağlına sığmırmış ki, o ola.

Elə bu dəmdə dəli Mehtər qapını açdı ki, Koroğlu, muşduluğumu ver, o adam minib gəldiyi at Ərəbatdı!..

Ara sakit oldu, Koroğlu üz tutdu Aşıq Cünuna:

– Aşıq Cünun, dövran elə!

Aşıq Cünun elə buna bəndiymiş. Saz çoxdan köynəkdən çıxıb köklənibmiş. Ayağa qalxmasıynan sazı sinəsinə çəkib oxuması bir oldu:

Zəhmət çəkib, qal eyləyib, yorulub,
Namərddən qurtarıb mərdi Mərcanım!
Aslanın erkəyi, dişisi olmaz,
Ər istənən yerdə ərdi Mərcanım!

Aşıq Cünunun bir yaxşı xasiyyəti varıydı, hər təzə söz oxuyanda tərcüman, maddi-məna eliyərdi. Yenə sazı sağ qoltuğunun altınnan keçirib sözü tərcüman elədi. Hamı yer-yerdən Mərcan xanıma da, Cünuna da "Afərin", "Əhsən!" dedi, Aşıq Cünun sazı sinəsinə çəkmək istəyəndə, hardansa bir yanıqlı bayatı səsi eşidildi:

Mən aşıq, eyliyə nə,
Tək iyid eyliyə nə?
El yığılsa eləməz
Özünə eyliyənə!..

Amma bayatıya elə fikir verən olmadı. Aşıq Cünun oxudu:

İyidlər oylağı düşüb yadına,
Pənahlanıb Koroğlunun adına.
Darda çatıb Xan Eyvazın dadına,
Dağıdıb möhnəti, dərdi Mərcanım!..

Bayatı səsi yenə gəldi:

Mən aşığam, adada,
Gəmim qalıb adada!
Nə qardaş var, nə ata,
Kimim gəlsin a dada!..

Yenə fikir verən olmadı. Fikirləşdilər ki, həlbət cavan-coluxdu. Aşıq Cünun lap vəcdə gəlmişdi, oxudu:

Nigar xanım durna teli gətirsin,
Bəzək vursun, toy işini bitirsin,
Xudam onu murazına yetirsin,
Gözəllər içində birdi Mərcanım.

Bu dəfə bayatı lap aydın gəlir, aydın eşidilirdi. Hamı guş elədi ki, oxuyan zənən xaylağıdı, özü də cavandı:

Əzizim, sinəsinə,
Ov avla sinə-sinə.
Fələk bir ox atıbdı,
Dəyib qız sinəsinə!..

Birdən yadlarına düşdü ki, oxuyan Leyli xanımdı. Koroğlu hay vurdu, onu gətirdilər məclisə. Onnan bərabər paşa da, qasid də məclisə gətirildi. İçəri girəndə, üçünün də başı əyildi sinəsinə. Bunu belə görən Aşıq Cünun sazın lap zilində – boğaz pərdəsində Leyli xanımın bayaqkı bayatısını belə oxudu:

Mən aşıq sinəsinə,
Ov avla sinə-sinə,
Namərdliynən iş görən,
Baş əyər sinəsinə!

Sonra da öz sözünün möhürbəndini oxudu:

Aşıq Cünun alqış versin dilinnən,
Xoş dolansın il keçdikcən ilinnən,
Çənlinin getmişdi canı əlinnən,
Qaytardı özünə verdi Mərcanım!

Alqış səsi bu dəfə lap Çənlibeli titrətdi.

Adamlar sakitləşəndə Koroğlunun səsi eşidildi:

– İndi hər kəs günahını boynuna alıb cəzasını istəyəcək. Əvvəl söz paşanındı.

Paşa başladı yalvarmağa:

– Koroğlu! Atam-anam sana qurban! Məni dolandır bu məclisdəkilərin başına, bu dəfə aman ver, günahım böyükdü, keç günahımdan, öldürmə məni. Sənə dost olmağa layıq olmasam da daha bundan belə düşmən də olmaram! Əl mənimdi, ətək sənin, kəs əlimi, ətəyini kəsmə!..

Koroğlu onu oturdub qasidi qaldırdı. Yazıq qasiddə dil nə gəzirdi söz deyə. Koroğlu onu da oturtdu. Leyli xanımı qaldırdı. Leyli xanım dedi:

– Koroğlu, mənim günahım elə böyükdü ki, cəzası ölümdü. Bütün bu işləri mən eləmişəm, başınıza nə gəlibsə mənim ucbatımnandı. Amma bircə iltimasım var, qoy məni burda öldürüb dəfn eləsinlər, qəbrim da Çənlibeldə olsun.

Koroğlu onu da oturdub sözə başladı:

– Naşükür paşanın günahı çox, cəzası ölümüydü. Qorxaqlıq elədi, cəzasını istəmədi. Onu bağışdıyıram bu günkü günə, bir də Məhbub xanıma. Səhər qasidiynən aparıb yola salarsınız gedər. Leyli xanımın mərdliyi namərdliyindən çoxdu. Onun günahlarından keçirəm, özünü də verirəm Tüpdağıdana!..

Elə bil, Koroğlu Tüpdağıdanın ürəyindən halıymış. Az qaldı ki, atılıb düşsün...

Paşa məclisin havasından istifadə elədi, irəli yeridi:

– Can Koroğlu! Mümkünsə, bizi indi azad elə.

Koroğlu güldü:

– Bura Çənlibeldi, Asdan paşa! Burda xəyanət olmaz. Söz birdi. Bir də axı toyu olanın biri də sənin övladındı. Qal, iştirak elə, Allah mübarək eləsin de, xeyir-dua ver.

Üç igidin, üç gözəlin toyu quruldu. Eyvazın toyu təzələnmişdi, Zərqələm də, Qəssab Alı da dinə-imana gəlmişdilər.

Koroğlu bu toyları elə başladı, qırx gün elə şənlik oldu ki, Çənlibeldə hələ ruzigarın gözü belə şənlik, belə şaddıx, belə toy-busat görməmişdi.

Subaylarınıza qismət olsun belə toylar, mənim əzizdərim!

# Koroğlunun qocalığı

Koroğlu qocalmışdı. Dəlilər başından dağılmışdı. Davadan, vuruşdan yorulmuşdu. Yanında bircə vəfalı alagöz Nigar qalmışdı.

Bir yaz günü idi. Koroğlu paslı Misri qılıncı belinə bağlayıb Nigarı da yanına alıb piyada harayasa gedirdi. Baxdı yolun qırağında bir kişi bir cüt öküz otarır. Amma kişinin çiynində yarı taxta, yarı dəmir bir şey var. Kişinin yanına gəlib soruşdu:

– Ay kişi, bu nədi, çiyninə keçiribsən?

Kişi dedi:

– Bu, tüfəngdi.

– Tüfəng nədi?

– Bunun içində güllə olur. Adama, heyvana dəyəndə öldürür.

Koroğlu kişinin sözünə inanmadı. Tutdu yaxasından ki, vur mənə görək necə öldürür?

Kişi vurmaq istəmədi. Axırı çox deyişmədən sonra Koroğlu kişiyə dedi:

– İndi ki, belə oldu, al bu qan bahası, at öküzlərə görüm necə öldürəcək.

Kişi gördü Koroğlu əl çəkən bəla deyil. Axırda tüfəngini çəkib öküzün birini nişan aldı. Tüfəng açılan kimi öküz yerə yıxıldı.

Koroğlu gördü öküz doğrudan da öldü. Götürüb bir tüfəngin ora-burasına baxdı, sonra sazı bağrına basıb görək nə dedi:

Titrəyir əllərimi, tor görür gözüm,  
Mənmi qocalmışam, ya zəmanəmi?  
Dolaşmır dahanda söhbətim, sözüm,  
Mənmi qocalmışam, ya zəmanəmi?

Tutulur məclisdə iyidin yası,  
Kar görmür qılıncı, polad libası.  
Gəlib bic əyyamı, namərd dünyası,  
Mənmi qocalmışam, ya zəmanəmi?

Belə zaman hara, qoç iyit hara,  
Mərdləri çəkirlər namərdlər dara,  
Baş əyir laçınlar, tərlanlar sara,  
Mənmi qocalmışam, ya zəmanəmi?

Axır əcəl gəldi, yetdi hay, haray!
Çəkdiyin qovqalar bitdi hay, haray!
Tüfəng çıxdı, mərdlik getdi hay, haray!
Mənmi qocalmışam, ya zəmanəmi?

Koroğluyam, Qırat üstə gəzərdim,
Müxənnətlər başın vurub əzərdim,
Nərələr çəkərdim, səflər pozardım,
Mənmi qocalmışam, ya zəmanəmi?

Deyirlər Koroğlu sözün tamam eləyəndən sonra Misri qılıncı belindən açıb yerə tulladı. Dedi:

– Namərd əyyamıdı. Daha mən Koroğluluğumu yerə qoydum.

Nigar Koroğlunun gözünü oğurlayıb Misri qılıncı götürüb gizlətdi. Koroğlu Nigar ilə bərabər ordan yola düşdülər. O gün axşama qədər yol getdilər. Axşam vaxtı bir şəhərə çatdılar. Şəhərdə onları qonaq eləyən olmadı. Axırda naçar qalıb bir uca imarətin dibində gecələməli oldular. Gecədən xeyli keçmişdi, bir də baxdılar budu yeddi yaraxlı adam gizlənə-gizlənə gəlib imarətin üstünə çıxdılar.

Sən demə bu imarət Alı paşanın xəzinəsi imiş. O oğrular da xəzinəni yarmağa gəliblərmiş. Koroğlu fikir verib gördü bunlar damın üstünü söküb içəri girdilər. Xəzinəni yarıb yüklərini tutub getmək istəyəndə Koroğlu qalxıb başlarının üstünü aldı ki:

– Nəçisiniz? Gecə vaxtı burda nə gəzirsiniz?

Oğrular əkilmək istədilər.

Koroğlu onları tərpənməyə qoymadı. Tutub hamısının əl-ayağını bağladı, yerə uzatdı ki:

– Kişi mərd olar. Oğurluq it peşəsidi. Padşahlara ədavətiniz var, dava eləyin, açıq meydanda mərdi-mərdanə savaşın, sonra xəzinəsi də sizə halaldı. Yoxsa ki, gecə oğurluq eləməyin!

Oğrular nə qədər ona pul, qızıl vəd verdilərsə Koroğlu razı olmayıb dedi:

– Yox, mən bir mərd adamam. Belə alçaq işləri görə bilmərəm. Siz kişi deyilsiniz, kişilərin adlarını batırırsınız.

Qərəz, çox baş ağrısı olmasın, elə ki, sabah açıldı, xəzinəçi gəlib əhvalatı belə görəndə qaçıb Xotkara xəbər verdi. Xotkar əmr verdi, oğruları, Koroğlunu, Nigarı yanına gətirdilər. Koroğlu nə olmuşdu

başdan-ayağa hamısını xotkara danışdı. Xotkar oğruların cəzasını verəndən sonra Koroğludan soruşdu:

– Yaxşı, qoca, bəs sən kimsən ki, mənə bu yaxşılığı elədin?

Xotkarın cavabında aldı Koroğlu, görək nə dedi:

Çənlibeldə eli olan
Düşkün Koroğlu mənəm, mən.
Başında min dəli olan,
Düşkün Koroğlu mənəm, mən.

Mərdlik işlədib bir zaman,
Namərdə çəkdirdim aman,
İndi əlif qəddi kaman,
Düşkün Koroğlu mənəm, mən.

Laçın tək bərədə yatan,
Əmud vuran, şeşpər atan,
Yüz iyit qol-qola çatan,
Düşkün Koroğlu mənəm, mən.

Könlünün səməndin yoran,
Müxənnət boynunu vuran,
Mərdlər ilə dostluq quran,
Düşkün Koroğlu mənəm, mən.

Qoç Koroğlu görünməz şən,
Eyvazından ayrı düşən,
Qürbət eldə bağrı bişən,
Düşkün Koroğlu mənəm, mən.

Xotkarın qorxudan tükləri biz-biz oldu. Başındakı tükləri, o necə deyərlər, ayağına zalan gəldi. Baxdı ki, illərlə axtardığı qoç Koroğlu özü-öz ayağı ilə gəlib çıxıb buraya. Bir fikirləşdi əmr edib tutdursun. Ancaq Koroğludan o qədər yemişdi, onu elə tanımışdı, bildi ki, onu belə tutmaq mümkün olmayacaq. Ona görə də hiylə niqabını üzünə çəkib başladı onu aldatmağa. Üzünü Koroğluya tutub dedi:

– Ay Koroğlu, sən mənim düşmənimsən, amma bu gün dostluq elədin, mərdlik işlətdin. Mən daha səni özümə düşmən bilmirəm. İndi məndən nə istəyirsən istə, bu yaxşılığının əvəzində nə istəsən sənə verəcəyəm.

Koroğlu dedi:

– Mən səndən heç nə istəmirəm, məni burax gedim.

Xotkar dedi:

– Koroğlu, qocalmısan, daha dağlarda koroğluluq eləyəsi deyilsən, gəl mənim yanımda qal. Ölənə qədər sənə ata yerində qulluq eləyim. Sən də mənim məsləhətçim, tədbirçim ol.

Koroğlu Xotkarın sözlərini qəbul eləmədi. Gedəsi oldu. Xotkar üzdə onlara çox hörmət elədi. Koroğluya, Nigara yaxşı paltar verdirdi, hərəsinə bir at bağışladı. Koroğlu da onunla əl verib atlandı. Nigar ilə yola düşdü.

Koroğlunun getdiyi yer bəlli deyildi. Ağzı hayana gəlsə atı sürürdü. Onlar getməkdə olsunlar, sənə deyim Xotkardan. Elə ki, Koroğlu aralandı, Xotkar doqquz nəfər yaxşı tüfəngatan çağırıb onların dalınca göndərdi ki, dağlarda, daşların arasında Nigarı Koroğlunun əlindən alıb özünü də ya öldürsünlər, ya da diri tutub gətirsinlər.

Bu doqquz nəfər bir kəsmə yoldan gedib bərəni kəsdilər. Koroğlu başı aşağı Nigarla gedirdi. Bir də baxdı doqquz yerdən üstünə tüfəng lüləsi tuşlandı.

Koroğlu atları saxladı. Xotkarın adamları yol üstə çıxdılar. Koroğlunun üstünə qışqırıb atdan düşmələrini əmr etdilər. Koroğlu dava eləmək istəmirdi. Özü atdan düşdü. Nigarı da düşürdü. Adamlardan birisi yaxına gəlib yoğun bir kəndirlə onun qollarını möhkəm-möhkəm bağladı. Koroğlu yenə də bir söz demədi.

Adamlar Nigarı ondan ayırmaq istədilər. Koroğlu işi belə görəndə soruşdu:

– Onu haraya aparırsınız?

Dedilər:

– Paşaya aparırıq. Səni də aparıb zindana salacağıq. Sənə göstərəcəyik ki, koroğluluq necə olar?

Koroğlu gördü iyitlik, namus yeridi, alagöz Nigar əldən gedir. İş belə olanda aldı görək nə dedi:

Uca dağın ucasıyam,
Əskik olmaz qarım mənim.
Nər pələngin qocasıyam,
Karvan vurmaq karım mənim.

Qoç yarandım əzəl başdan,
Vursam cidam keçər daşdan,

Hələ davadan, savaşdan,
Qalmamış qollarım mənim.

Hanı Eyvaz burda əsə,
Bir qılınca qırx baş kəsə,
O dövranım dönüb tərsə,
Qar tökər baharım mənim.

Hanı Əhməd, şeşpər ata,
Dəmirçioğlu küşdü tuta,
Bu günümdə gəlib çata
Tərlan dəlilərim mənim.

Qoç Koroğlu bada içə,
Başları pəncər tək biçə,
Qoyarammı ələ keçə,
Alagöz Nigarım mənim?

Bunu deyib bir dəli nərə çəkdi. Kəndir tikə-tikə olub yerə töküldü. Qorxudan paşanın adamlarının əllərindən tüfəngləri töküldü. Vəfalı Nigar gizlətmiş olduğu Misri qılıncı çəkib Koroğluya verdi. Koroğlu onların hamısının boynunu vurub Nigarı götürüb təzədən Çənlibelə döndü.

Nigarla orada yaşamağa başladı. Bu işdən bir müddət keçdi. Bir gün Koroğlu yanında alagöz Nigar Çənlibeldə oturmuşdular. Bir də vəfalı aşıq Cünun gəlib çıxdı. De xoş-beş, on beşdən sonra Koroğlu soruşdu:

– Aşıq Cünun, nə yaxşı, köhnə dostu necə oldu ki, yada saldın?

Aşıq Cünun sazı döşünə basıb dedi:

Sənə deyim, qoç Koroğlu,
Düşmənlər gələcək oldu.
Sonun olar puç, Koroğlu,
Paşalar gələcək oldu.

Daldalama sən səsini,
Düşmənlə kəsmə bəsini,
Keçmiş köhnə qısasını,
Paşalar alacaq oldu.

Cünunam, dildən düşmüşəm,
Bülbüləm güldən düşmüşəm,
Qocalıb əldən düşmüşəm,
Paşalar gələcək oldu.

Aşıq Cünun saznan dediyi kimi söznən də dedi ki:

– Ay Koroğlu, Qıratı neyləmisən? Paşalar qoşun çəkib sənin üstünə gəlir.

Aşıq Cününa cavabında aldı görək Koroğlu nə dedi:

Sənə deyim, Aşıq Cünun,
Çağır gəlsin xan Eyvazı!
Tar eyləyim düşmən günün,
Çağır gəlsin xan Eyvazı!

Namərdliyi bildirərlər,
Yadı bizə güldürərlər,
Yoxsa məni öldürərlər,
Çağır gəlsin xan Eyvazı!

Koroğlu çəkməz haşalar,
Çətindi qollar boşalar,
Yerişir oğraş paşalar,
Çağır gəlsin xan Eyvazı!

Aşıq Cünun Koroğludan ayrılıb Eyvazı axtarmağa getdi. Dağları, daşları çox gəzdi, Eyvazı tapa bilmədi. Bir biçənəkdə Dəmirçioğluna rast gəldi. Gördü Dəmirçioğlu əlində yaba ot yığır. Aldı görək Aşıq Cünun Dəmirçioğluna nə dedi:

Dəmirçioğlu sənə deyim,
Çənlibelə düşmən gəlir.
Hayqıranda ordu basan,
Çənlibelə düşmən gəlir.

Bu sinəmi qəm alıbdı,
Şad qəlbimə dərd salıbdı,
Koroğlu yalqız qalıbdı,
Çənlibelə düşmən gəlir.

Çənlibeldə yox söhbət, saz,
Çırpınır göllərində qaz,
Hanı Əhməd, hanı Eyvaz,
Çənlibelə düşmən gəlir.

Sananmaz yüzlər, əllilər,
Düşmənə demə bəlilər,
Görünmür iyid dəlilər,
Çənlibelə düşmən gəlir.

Yoldadı Koroğlu gözü,
Qəlbində qocalıq közü.
Aşıq Cünun budu sözü,
Çənlibelə düşmən gəlir.

Aşıq Cünun saznan dediyi kimi, söznən də əhvalatı Dəmirçioğluna danışıb ordan çıxıb Çənlibelə getdi. Dəmirçioğlu gecə-gündüz çöldə olduğundan üzünü, başını tük basmışdı. Bir dəlləyin yanına gəlib dedi:

– Usta, mənim saqqalımı qırx.

Dəllək dedi:

– Mollalar saqqal qırxmağı qadağan eləyib. Qırxa bilmərəm.

Dəlləyin cavabında aldı Dəmirçioğlu görək nə dedi:

Sənə deyim, usta başı,
Qazı dibindən, dibindən!
Olmagilən işdə naşı,
Qazı dibindən, dibindən!

Deyərəm sənin şəstinə,
Paşalar girib qəsdinə,
Gəlir Koroğlu üstünə
Qazı dibindən, dibindən!

Sənnən hesabı çəkərəm,
Gözündən qan yaş tökərəm,
Əlif qəddini bükərəm,
Qazı dibindən, dibindən!

Dəmirçioğlu bilici,
Olarsan ellər gülücü,
Sənə yendirrəm qılıcı,
Qazı dibindən, dibindən!

Dəllək gördü bu o deyənlərdən deyil. Heç deyəsən istiot-zad dadmayıb. Bir az da oyan-bu yan eyləsə, elə doğrudan qılıncı yendirəcək. Canının qorxusundan onun üzünü, başını qırxıb təmizlədi. Dəmirçioğlu dəlləyin haqqını verib ordan yola düşdü. Dağları aşdı, dərələri keçdi. Bir qayanın ətəyində Dəli Həsənə rast gəldi. Aldı görək nə dedi:

Xotkarlar üstünə atlı gedəndə
Düşmən görən açıq gözün necoldu?
Oğraş paşalarla dava edəndə,
Nərə çəkən uca səsin necoldu?

Çənlibeldə ağır məclislər quran,
Ərəbat üstündə mərdanə duran,
Misri qılınc çəkib, boyunlar vuran,
Axtar görək xan Eyvazın necoldu?

Dəmirçioğlu bu sirləri biləndə,
Düşmanları ağlayanda, güləndə,
Hərdən qəzəblənib qeyzə gələndə,
Qabaqda boz duran üzün necoldu?

Dəli Həsən çox qocalmışdı. Dəmirçioğlu elə bilirdi ki, tay bu qədər ki, Dəli Həsən qocalıb, əvvəlki kimi Ərəbat üstündə yalın qılınc düşmən üstünə gedə bilməz, dəstələr dağıdıb, alaylar poza bilməz.

Dəli Həsən Dəmirçioğlunun bu sözlərindən tutuldu. Aldı görək nə dedi:

Yağı düşmənlərlə qovqa açmağa,
Hələ var qolumda qüvvətim mənim.
Qoşun gəlib Çənlibelə keçməyə,
Qəbul etməz namus, qeyrətim mənim.

Gürzüm işləyəndə dağları qırar,
Qorxusundan tapmaz düşmənlər qərar,
Paşanın, xotkarın bağrını yarar,
Ac aslan yerişim, heybətim mənim.

Mən Dəli Həsənəm, ər havadarı
Taparam Eyvazı, o namudarı,
Vuruşma vaxtında, dava bazarı,
Olmaz heç insafım, mürvətim mənim.

Söz tamam oldu. Dəli Həsən ilə Dəmirçioğlu atlanıb ordan yola düşdülər. Dağlara, daşlara çıxıb Eyvazı axtarmağa başladılar. Çölləri, yamacları bir-birinə vurdular. Gəzdilər, dolandılar. Axırda Eyvazı tapdılar. Eyvaz Dəmirçioğlu ilə, Dəli Həsənlə görüşüb öpüşdü. Götürdü görək Koroğlunu onlardan necə xəbər aldı:

Dağlar başı Çənlibeldən
Deyin görüm, nə xəbər var?
Başı qarlı bizim eldən,
Deyin görüm nə xəbər var?

Qırat, Ərəbat dururmu?
Koroğlu dövran qururmu?
Paşalar boynu vururmu?
Deyin görüm, nə xəbər var?

Eyvaz qolun gərmək istər,
Tər savaşa girmək istər,
Koroğlunu görmək istər,
Deyin görüm, nə xəbər var?

Eyvaz sözünü tamam elədi, ondan sonra Dəmirçioğlu götürdü ona belə cavab verdi:

Çənlidən xəbər gətirdim,
Qardaş, dur gedək, dur gedək!
Müşkül mətləbi bitirdin,
Qardaş, dur görək, dur gedək!

Koroğlu oxuyub-yazır,
Yalnız qalıb candan bezir,
Haray salıb səni gəzir,
Qardaş, dur gedək, dur gedək!

Dəmirçioğlu qədrin bilir,
Səni görüb üzü gülür,
Paşalar üstünə gəlir,
Qardaş, dur gedək, dur gedək.

Elə ki, söz tamam oldu Eyvaz, Dəmirçioğlu, bir də Dəli Həsən atlandılar. Dağlara, daşlara ün saldılar. Bir neçə günün içində bütün dəliləri yığıb Çənlibelə Koroğlunun yanına yola düşdülər.

Bunlar getməkdə oslunlar, sənə kimdən xəbər verim, Koroğlu ilə Nigardan. Koroğlu gözlədi-gözlədi gördü deyəsən gələn olmadı. Cünunu göndərdi şəhərə ki, getsin paşalardan bir xəbər öyrənsin. Görsün nə vaxt gəlirlər, necə gəlirlər. Özü yenə də alagöz Nigarla tək qaldı.

Nigar baxdı Koroğlu çox qəmgindi. Gəlib onun yanında oturub dərdi-dilinə yetişmək istədi. Koroğlu simləri qaralmış üç telli sazı sinəsinə basıb görək Nigara öz dərdi-dilini necə dedi:

Qarı düşmən güc gətirdi,
Qocaldım, Nigar, qocaldım.
Mənzilim başa yetirdi,
Qocaldım, Nigar, qocaldım.

Müxənnətin olmaz zatı,
Mərdin polad olar qatı,
İtirdim Qırat, Düratı,
Qocaldım Nigar, qocaldım.

Koroğlu qorxmaz yağıdan,
Badə içibdi sağıdan,
Hanı Eyvaz, Tüpdağıdan?
Qocaldım, Nigar, qocaldım.

Koroğlu elə təzəcə sözü deyib qurtarmışdı bir də gördü budu dəlilər gəlirlər. Koroğlunun könlü açıldı, ömrü təzələndi. Elə bil anadan təzə oldu. Aldı görək, dəlilərə necə xoş gəldin elədi.

Yenə ömür təzələndi,
Xoş gəldiniz dəlilərim!..
Qurtardım hicrandan, qəmdən,
Xoş gəldiniz, dəlilərim!..

Düşün, burda mehman qalaq,
Xotkarlara talan salaq,
Paşalardan qisas alaq,
Xoş gəldiniz, dəlilərim!..

Bir şur salın bu cahana,
Meydan boyansın al qana,
Səfər eyləyək hər yana,
Xoş gəldiniz, dəlilərim!

Aslan tək bərədə yataq,
Düşmənlərə şeşpər ataq,
Paşaları diri tutaq,
Xoş gəldiniz, dəlilərim!

Zimistanım döndü yaza,
Qulaq verin sözə, saza,
Koroğlu yetdi muraza,
Xoş gəldiniz, dəlilərim!

O tərəfdən Alı paşa, Mehdi paşanı da çağırıb əhvalatı ona danışdı. Axırda sözü bir yerə qoydular ki, bəs Koroğlu qocalıb, dəliləri başından dağılıb. Gedək ondan qisasımızı alaq. Paşalar başlarına qoşun cəm eləyib Çənlibelə yola düşdülər. Onlar gəlməkdə olsun, sənə Çənlibeldə Koroğludan xəbər verim. Koroğlu paşaların gəlmək xəbərini eşidib üzünü dəlilərə tutub, aldı görək nə dedi:

Yaraxlanın, dəlilərim,
Paşalar meydana gəlir.
Müxənnətlər qoşun çəkib
Üz tutub bu yana gəlir.

Sözlərimdə yoxdu yalan,
Düşmənlərə salaq talan,
Misri qılınc qılsın cövlan,
Boyanmağa qana gəlir.

Olun səf-səf, dəstə-dəstə,
Yeriyək paşalar üstə,
Yağı düşmən durub qəsdə,
Tülkülər aslana gəlir.

İgit əldən çıxmaz xata,
Qoç gərək pusquda yata,
Xan Eyvaz, min Ərəbata,
Bəlli Əhməd fərmana gəlir.

Pələng tək ovdan küsməyə,
Düşmənlər üstə əsməyə,
Paşalar başı kəsməyə,
Koroğlu mərdana gəlir.

Koroğlu o vaxtı ki, davadan əl çəkməyi əhd eyləmişdi, dəliləri başından dağıtmışdı. Qıratın da nallarını söküb çölə buraxmışdı. Amma gəl ki, vəfalı Qırat Çənlibeldən ayrılıb getməmişdi. İndi ki, iş belə oldu, bir tərəfdən də Aşıq Cünun gəlib xəbər verdi bəs paşalar dəm-hadəmdi ki gəlib Çənlibelə çatsınlar.

Koroğlu Eyvazı çağırıb göndərdi gedib Qıratı tapıb gətirsin. Eyvaz gedib Qıratı tapıb gətirdi. Koroğlu Qıratın gəldiyini görəndə ayağa qalxdı, sazı sinəsinə basıb dedi:

Budu, gəldi havadarım,
Dur, başına dolan, könül!..
Zimistanda dövr eylədin,
Yaz-bahara boyan könül!..

Qıratıma nal düzdürrəm,
Paşalar bağrın əzdirrəm,
Meylər, saqilər gəzdirrəm,
Başlar təzə dövran könül!..

Koroğluyam, mərd mərdana,
Çağırram, girrəm meydana,
Qılınc vuraram düşmana,
Xotkar taxtdan salan könül!..

Koroğlu yenə də Misri qılınc bağladı, qalxan taxdı, Qırata mindi. Dəlilər də yaraqlandılar. Düşmən qabağında hazır oldular. O tərəfdən paşalar başlarında qoşun gəlib Çənlibelə çatdılar. Koroğlu, yanında dəlilər özünü paşaların qoşununa vurdu. Qoca Koroğlunun nərəsindən, Qıratın kişnəməsindən, dəlilərin hayqırmasından paşaların qoşunu özünü itirdi. Koroğlu başında dəlilər hər tərəfdən hücuma keçdi. Qoşun davam gətirə bilməyib qaçmağa üz qoydu.

Koroğlu düşmanı qaçan görüb qanadlandı, qoca könlü coşdu, aldı görək nə dedi:

Qoşun çəkib gəldi paşa,
Düşmənləri seç, Eyvazım!..
Yağı gərək çəksin haşa
Tez hücuma keç, Eyvazım!..

Dəli könül almaz öyüt,
Qoca bədən, olma meyit!..
Misri qılınc, kəmtər iyit,
Al düşmanı biç, Eyvazım!..

Qıratın nalı sökülməz,
Koroğlu beli bükülməz,
İyid ölümdən çəkilməz,
Yağı qanı iç, Eyvazım!..

Qoca Koroğlu bir dəli nərə çəkib Qıratı ildırım kimi sürüb özünü paşalara yetirdi. Qaçaraqda hərəsinə bir qılınc vurdu. Başları bostan kəliyi kimi dığırlanıb yerə düşdü. Qoca Koroğlu başında dəliləri at sürüb özlərini paşaların torpağına yetirdilər. Qiymətdən ağır, çəkidən yüngül bütün şeyləri atlara çatıb geri qayıtdılar. Çənlibelə az qalmış Aşıq Cünun Koroğlunu dayandırıb soruşdu:

– Qoç Koroğlu, ində nə deyirsən? Dəliləri buraxırsan, ya yenə də öz yanında saxlayırsan?

Koroğlu dedi:

– Yox, Aşıq Cünun! Mən daha koroğluluqdan əl çəkmişdim. Amma baxıram ki, bu olmayacaq. Nə qədər ki xotkarlar, paşalar, bəylər, xanlar var, mən koroğluluğumu yerə qoya bilməyəcəyəm.

Bu sözü eşidəndə bütün dəlilər nərə çəkdilər. Atlar kişnədi, bədöylər oynadı. Qırat qızmış pələng kimi iki dal ayaqları üstündə qalxıb elə bir şeyhə çəkdi ki, dağ-daş titrədi. Hamısı bir yerdə təzədən Çənlibelə çəkildilər...

## "KOROĞLU" ARXİVİNİN TƏSVİRİ

(*Azərbaycan Milli Elmlər Akademiyasının Folklor institutunun elmi arxivindən*)

### Əlyazması. İnv. №715 (a)<br>"Koroğlu"

Söyləyəni *Aşıq Hüseyn Bozalqanlı* (təxəllüsü, əsil adı Hüseyn Cəfərqulu oğlu Quliyev; 1860-cı ildə Tovuz rayonunun Bozalqanlı kəndində anadan olub, 1941-ci ildə həmin kənddə vəfat edib). Ustad sənətkar kimi tanınan Aşıq Hüseyn Bozalqanlı aşıq şerinin bütün növ və şəkillərinə aid mükəmməl poetik nümunələr yaratmışdır. Onun şeirləri ilk dəfə "Aşıqlar" (1937) kitabında çap olunmuşdur. 1938-ci ildə "Aşıq Hüseyn Bozalqanlı" kitabı nəşr olunub. Aşığın qoşduğu "Tanrıverdi" dastanı 5-cildlik "Azərbaycan dastanları"nın sonuncu cildinə (1972) daxil olmuşdur. Hüseyn Bozalqanlının şeirləri 1973-cü ildə Azərbaycan və 1984-cü ildə rus dillərində Bakıda çap olunmuşdur. Aşığın bütün yaradıcılığını əhatə edən kitabı işıq üzü görmüşdür.

Qolun toplayıcısı əlyazmada göstərilmir. Son səhifədə "1936" yazılıb. Bu və bir neçə imla düzəlişləri xəttini Mirzə Mehdi Vəlizadəyə (haqqında məlumatımız yoxdur) məxsus olduğunu söyləmək imkanı verir. Deməli, elə qolun toplayıcısı da odur.

İki nüsxədən ibarət olan bu qol 16 səhifədir və latın əlifbasında makinada yazılıb. Yazıya alınma yeri göstərilməyib. Bu variantda korpusa daxil olmuş qoldakı süjet quruluşu qorunur. Bununla belə, bəzi dəyişmələr də nəzərə çarpır. Belə ki, Koroğlunun atası Alı Osmanlı paşanın ilxıçısıdır. Sonra süjetin inkişaf sxemi belədir:

1. Alı ilxını dərya kənarında otardığı zaman dəryadan iki erkək at çıxır. Biri qara göy, o biri isə qızılı boz rəngdə. Atların hərəsi ilxıda bir madyanı basıb sonra yenə də qayıdıb suya girirlər.
2. Dəniz atlarından qulunların doğulması.
3. Alı kişi qulunları cins at adı ilə paşaya təklif edir.
4. Paşa qəzəblənir, Alı kişinin gözlərini kor etdirir.
5. Qulunların böyüdülməsi.
6. Alı atları dörd yaşacan tövlədə saxlamağı tapşırır.
7. Bu variantda atlar haqqında geniş təsəvvür yaradılır.

Dörd il tamam olandan sonra Alı kişi oğlu ilə atlara baxmağa gəlir. Alı birinci atın belini, yalmanını, qollarını, sağrısını, dal ayaqlarını, buxovluğunu yoxlayır və görür ki, bu atın buxovluğu çox nazikdir, dırnaqları da kiçikdir. O, oğlundan atın rəngini soruşur. Oğlu cavab verir ki, bu at qızılı boz rəngdədir.

Alı sonra da o biri atı elə bu cür yoxlayır. Bəlli olur ki, ikinci atın buxovluğu yoğundur, döşü enlidir, yalı quyruğundan həm qalın, həm də yumşaqdır. Bu atın dırnağı da yumru və böyükdür. Alı bu atın da rəngini soruşur. Oğlu deyir ki, bu at hər rəngə: qırmızıya, göyə, qaraya çalır. Alı oğluna deyir: bu at səni nə düşmənə verər, nə də suda dayanar. Çünki o, su atının törəməsidir.

8. Alı kişi oğluna Çənlibelə getməyi məsləhət görür.

9. Alı Qoşabulağın olduğu yeri oğluna bildirir.

10. Ata Qoşabulaq suyunun sirrini oğluna açır. Alı kişi oğluna deyir: Qoşabulağa get. Bir bulağın suyunda əl-üzünü yu, o birisindən də doyunca iç və həmin bulağın üstündə də yat.

11. Alı həmçinin oğluna tapşırır ki, bu sudan Qırata da içirərsən. Əgər belə etsən onda o sudan sənə həm şairlik, həm də igidlik verilər. At isə o sudan içsə, onda həmişə sənin ürəyindən keçənləri biləcəkdir.

12. Rövşən atasının bütün tapşırıqlarına əməl edir. Qıratın üstündə atasının düşmənindən intiqam alır. Atası deyir: "Oğul, indi sən oldun Koroğlu. Bu ad ömrün boyu sənin üstündə qalacaq".

13. Koroğlu Çənlibeldə yurd salır.

Əlyazması. İnv. №715 (b)
"Koroğlu kim idi (Uruşan)"

Söyləyəni *Aşıq Əsəd* (Aşıq Əsəd Əhməd oğlu Rzayev). 1874-cü ildə Göyçə mahalının Böyük Qaraqoyunlu kəndində anadan olub, 1951-ci ildə Tovuz rayonunda vəfat edib. 1937-ci ildə Aşıq Əsəd Azərbaycan Yazıçılar İttifaqının üzvü seçilib. İlk kitabı 1938-ci ildə nəşr olunub. "Seçilmiş əsərləri"ni 1979-cu ildə Bakıda "Elm" nəşriyyatında nəşr olunub.

Toplayanı Mirzə Mehdi Vəlizadə (Bax: İnv. №715 (a). Qazax, 1936-cı il. Latın əlifbası ilə makinada yazılıb. 16 səhifədir.

Bu varianta görə Koroğlunun əsli Muradbəyli kəndindəndir. Atası Alı kişi əvvəl Şah Abbasa mehtərlik edir, sonra İstanbula gəlib Xotkarın baş mehtəri olur. Bu vaxt Alının oğlu Uruşan on beş-on altı yaşlarında bir qoçaq oğlan olur.

1. Alı kişi ilxını dərya kənarında otarır. Dəryadan bir qara göy rəngli ayqır çıxır. O, əvvəl bir, sonra ikinci bir madyanı basır və yenə qaçıb suya girir. Alı həmin madyanları gözdən qoymur. Onlar doğanda qulunları göydə tutur və madyanlar balalarını yalayıb qurtarandan sonra yerə qoyur.

2. Qulunlar biryaşar olanda Hindistan padşahının oğlu xotkara qonaq gəlir və ondan iki cins at istəyir. Alı kişi isə həmin iki daylağı seçib gətirir. Atlar bəyənilmir və acıqlanmış xotkar gizirin (hökmdarın yanında saxlanılan xüsusi tədbirçi – B.A.) təklifi ilə Alının gözlərini çıxartdırır, dayları da ona verir.

3. Alı kişi oğlu Uruşana atlar üçün tövlə tikdirir. Bir ildən sonra Alı atları yoluxmağa gəlir. Tövləyə işıq düşdüyünü oğlundan soruşur. Uruşan balaca bir deşiyin olduğunu bildirir və oranı tutur. Alı bir ildən sonra yenə tövləyə gəlib atlara baş çəkir. Atlar sınağa hazır idilər.

4. Dəryadan çıxan ayqırın basdığı əvvəlki madyandan olan qara göy qır tüklü bir at olduğu üçün Qırat adlanır. Sonrakı madyandan olana isə Dürat deyirlər.

5. Alının gözləri kor olduğu üçün oğlu Uruşanı da öz adı ilə deyil, Koroğlu çağırırlar.

6. Koroğlu atasının intiqamını alır.

7. Alı ilə Koroğlunun arxasınca qoşun gəlir, qoşunun qabağında da üç at. Alı oğlundan soruşdu ki, öndə gələn at necə atdır? O da deyir ki, kəhər təpəl atdır. Alı deyir: qorxma, o at gəlib bizə çata bilməz. Rövşən ikinci atın qızıl boz olduğunu söyləyir. Atası deyir: onu qabağa burax, sonra arxasınca atını çap. Koroğlu belə də edir. Qıratın yeli həmin bu ata dəyincə, beli sınır. Atası üçüncü atı soruşduqda bəlli olur ki, bu göy dəmir atdır. Alı deyir: Oğul, əgər atını suya salmasan, bu at gəlib səni yaxalayacaq. Qabaqda da Tufan çayı axırdı. Koroğlu atını çaya salır. Qırat su atından törəndiyi üçün çaydan çıxır, quru atı tərli-tərli suya salındığı üçün qolları tutulub suda qalır.

8. Bu variantda Koroğlunun sərkərdələri bunlardır: Esabalı, Bəlli Əhməd, Kosa Səfər, Çopur Mehti, Halaypozan, Tüpdağıdan, Tanrıtanımaz, Dilbilməz (əcəm dili bilmədiyi üçün belə ad daşıyır).

### Əlyazması. İnv. №715 (q)
### "Mehtər Alı"

Qolun söyləyicisi *Balakişi Böyükkişi oğlu Babayevdir*. B.B.Babayev 1878-ci ildə Gədəbəy rayonunun Dəyəqarabulaq kəndində anadan olmuş, 1985-ci ildə həmin kənddə vəfat etmişdir. "Mehtər Alı"nı B.Babayevin dilindən oğlu Yaqub Babayev yazıya almışdır. Qolun toplayıcısı folklorşünas Mürsəl Həkimovdur.

Göy mürəkkəblə yazılmış əlyazması 28 səhifədir. Qolun makinada yazılmış üç nüsxəsi var: 26 səhifə.

1. Alı kişi Həsən xanın ilxıçısıdır.

2. Toqatın paşası Hasan paşa eşidir ki, Həsən xanın yaxşı atları var; gəlir ondan iki dənə cins döllük ayqır aparmağa.

3. Həsən xan Qaf tərəfə gəlib Tərsəçay yaxınlığındakı Ağnabat qoruğuna çatanda çaparlar gəlişin xəbərini Həsən xana verirlər. Həsən xan paşanı Ağnabat qoruğunda qarşılayıb böyük kef məclisi qurdurur. Hasan paşa gəlişinin məqsədini bildirir.

4. Həsən xan paşa ilə Murğuz dağına ova çıxır və tapşırır ki, paşa üçün ilxıdan iki yaxşı döllük ayğır ayırıb oraya gətirsinlər.

5. Alı kişi dərya cinsindən olan iki dayçanı tutub Murğuz dağına aparır. Hasan paşa dayçaları görüb rişxəndlə Həsən xana deyir:

Gəl sənə deyim, Həsən xan,
Mən səndən cins at istədim.
Bu daylardan məndə çoxdu
Mən səndən cins at istədim.

At istədim ayğır olsun,
Əl dəyməmiş yay-qır olsun.
Demədim ki, yanqır olsun,
Mən səndən cins at istədim.

Dayçaların çöpük-çöpük,
Bir birindən salxa-sökük.
Uzun orta, özü tökük,
Mən səndən cins at istədim.

At gərəkdi mənzil kəsə,
Tərpənəndə yel tək əsə,
Meydan aça, girə bəhsə,
Mən səndən cins at istədim.

Eşit, xotkar gülər sənə,
Bəxşiş yaramaz şəninə,
Hasanam, dözməm tənənə,
Mən səndən cins at istədim.

6. Həsən xan paşanın sözlərindən bərk qəzəblənir. Alını yamanlayır. Alı da deyir ki, bu dayçalar dərya cinsindəndir. Üç yaşarda bunların Alosmanda tayı-bərabəri olmayacaq. Bu sözdən bir az da qəzəblənən Həsən xan deyir:

Həddin aşma axmaq qoca,
Həddin sənə bildirərəm.
Ağ gündüzün olar gecə,
Həddin sənə bildirərəm.

Paşa məndən at istədi,
Döllük amanat istədi,
Dayçaların can üstədi,
Həddin sənə bildirərəm.

Gözlərinə mil çəkərəm,
Didələrini tökərəm,
Qəddi-belini bükərəm,
Həddin sənə bildirərəm.

Sən batırdın ad-sanımı,
Qırram sənin amanını,
Bürüyər qan giryanını,
Həddin sənə bildirərəm.

Həsən xandan dağlar olar,
Oğlun Rövşən ağlar olar,
Nuri-didən qanla dolar,
Həddin sənə bildirərəm.

7. Alı kişi yenə sözündən dönməyib dayçaların yaxşı ayqırlıq olacağını bildirir. Hasan paşa da bərk hirslənir və Həsən xana deyir ki, bu dayçaları bağışla mehtərin sərraf gözlərinə, qoy dünya işığına həsrət qalsın. Alı kişi paşadakı qəddarlığı görüb deyir:

Zalım paşa, dinlə məni,
Göz insana yaraşıqdı.
Zəlil etmə gəl qocanı,
Göz insana yaraşıqdı.

İxtiyaram, etmə zülüm,
Qalxar göyə ahu-ünüm.
Çatıb yüzə mənim sinim,
Göz insana yaraşıqdı.

Day deyil, cins ayqır atdı,
Dosta o gözəl xalatdı.
Hər biri bir cəlalatdı
Göz insana yaraşıqdı.

Alı deyər, sözün düzü,
Qara etməz bəxtin üzü,
Nahaqdan zay etmə gözü,
Göz insana yaraşıqdı.

8. Həsən xanın əmri ilə cəllad Alı kişinin gözlərini çıxarır, dayçaları da ona verib qovurlar. İlxını da tapşırırlar Mehtər Mədətə.

9. Alı kişi gözləri kor halda evə qayıdanda oğlu atasının bu halını görüb soruşur:

Canım ata, gözüm ata,
Söylə nədi bu hal səndə?!
Oğul dözməz bu zulmata,
Söylə, nədi bu hal səndə?!

Oğul olan dözməz dərdə,
Verməm fürsət mən namərdə,
Qoymam qala qanın yerdə,
Söylə, nədi bu hal səndə?!

Rövşənəm, bir hay vuraram,
Rüstəm tək meydan quraram,
Namərdin boynun vuraram,
Söylə, nədi bu hal səndə?!

10. Alı kişi deyir ik, oğul, sənin Rüstəm Zal kimi asıb-kəsmək vaxtına hələ çox var. O, heybəsindən bir düyünçə çıxartdırıb açdırır. Oradakı sarı çiçəyi, kəklik otunu, çəmən çiçəyini bağırla birlikdə əzişdirib at südündə qaynatdırır, gözlərinə təpitmə qoyub yatır.

11. Alı oğlu Rövşəni, dayçaları götürüb Öyləndərə, Ağdərə, Arzulu dərədən keçib Qızılqaya səmtinə üz tutur, gəlib Qızılqaya yaxınlığındakı Cida qayaya çatır və buradakı Damcılı bulaq yanında oğluna özləri üçün sığınacaq, dayçalar üçün tövlə tikdirir. Həm də tövlə tikdirəndə Rövşənə tapşırır ki, elə et Damcılı bulağın suyu axurların yanından axsın və tövləyə bir qətrə də işıq düşməsin.

12. Deyilənlər hazır olandan sonra Alı kişi dayçaların sirrini Rövşənə açıb deyir ki, bunlar ilxıdakı çil madyanlarla dərya atının cinsindəndir. Bunlar iki il qırx gün işıq üzü görməməlidir.

13. Rövşən iki il otuz doqquz gün dözür, sonuncu gün üçün səbri çatmır. Atasını şirin yatan görüb tövlənin damından deşik açıb atlara baxır. Görür ki, atın biri qanadlıdı. Amma indi o qanadlar əriyir. Bilir ki, bu onun baxmağındandır. Tez deşiyi bağlayır, amma əhvalatı atasına bildirmir.

14. Alı kişi Rövşənlə atlara baxmağa gəlir. Əli ilə tövlənin sol tərəfində bağlanmış atın üz-gözünü, yalmanını, sağrısını, biləklərini yoxlayır, bir az fikrə dalır və deyir:

Zəndim gərək yanılmasın,
Oğul, ata yad göz baxıb.
Yoxdu atın yel qanadı,
Oğul, ata yad göz baxıb.

Cinsi bəlli dərya atı,
Yalmanına igid yatı,
Əriyibdi yel qanadı,
Oğul, ata yad göz baxıb.

On səkkiz, qırx olar tamam,
Qanad bağlar aram-aram,
Baxıb pis göz, olub haram,
Oğul, ata yad göz baxıb.

Çərx fələkdən eylərəm dad,
Miskin könül olarmı şad?
Alı haqdan dilər imdad,
Oğul, ata yad göz baxıb.

15. Rövşən əhvalatı atasına bildirir. Atası deyir ki, oğul, olana çarə yoxdur. İndi tövlənin bacasını aç ki, yeddi gün müddətində atların gözləri işığa öyrəşsin. Yoxsa, sürəkdə dəvdək olarlar. Yeddi günün tamamından sonra atları çıxarıb gündə üç dəfə məşq təlimi verərsən.

16. Başqa variantlarda olduğu tək, burada da atlar sınaqdan keçirilir, Alı kişi atların birinə Qırat, o birinə Dürat adı verir və belə deyir:

Sənə deyim, oğul bala,
Ərə yaraq, at gərəkdi.
Çəkə qılınc sağa-sola,
Ərə yaraq, at gərəkdi.

Qılınc, qalxan nizə kardı,
At igidə bir vüqardı,
Həm arxadı, həm də vardı,
Ərə yaraq, at gərəkdi.

İgid olan eldə gəzər,
Səxavəti dildə gəzər,
Qulac kəndir beldə gəzər,
Ərə yaraq, at gərəkdi.

Həsən məni kor elədi,
Ağ günümü kor elədi,
Dünya mədarı belədi,
Ərə yaraq, at gərəkdi.

Çox görmüşəm qeylü-qalı,
Əl çirkidi dünya malı,
Nəsihət der Mehtər Alı,
Ərə yaraq, at gərəkdi.

17. Alı kişi Murğuz dağından tapdığı ildırım daşı götürüb Rövşənlə dostu Dəmirçi Misirin yanına gəlir. Hal-qəziyyəni ona danışır. Dəmirçi Misir də Alıya təskinlik verib deyir ki, xanların çörəkləri dizləri üstədi. Həsən xan Mehtər Qəmbərin, Mehtər Əhmədin, nökər Səfərin, sarı Hacının da gözlərinə mil çəkdirib. Həsən xanın bir qənimi varsa, o da Dəli Həsəndir. O, Aslan bəyin, İbrahim ağanın, Sarı xanın başına gətirdiklərini Həsən xanın da başına gətirər.

18. Alı ildırım daşı Dəmirçi Misirə verib Rövşən üçün qılınc düzəltməyi xahiş edir və deyir ki:

And verirəm duz çörəyə,
Usta, qılınc sanlı gərək.
Vursan kəsə polad qatı,
Usta, qılınc sanlı gərək.

Cövlan edə havalarda,
Sına yağı ovalarda,
Korlaşmaya davalarda,
Usta, qılınc sanlı gərək.

Adın Alının dilində,
Misri qılınc ər əlində,
Ucaldı başı elində,
Usta, qılınc sanlı gərək.

19. Dəmirçi Misir yeddi günə qılıncın hazır olacağını bildirir. Vaxtın tamamında Alı kişi oğlu ilə dəmirçixanaya gəlirlər.

20. Dəmirçi Misir qılıncı Rövşənə verib deyir ki, bu qılınc ildırım daşından, suyu Misxana suyundan, ağzının oxarı da Alxar gümüşünün xam tozundandır. Bunun adını Misri qılınc qoyuram. Sonra Dəmirçi Misir Rövşənə belə nəsihət verir:

Sənə deyim, igid bala,
Misri qılınc əldə gərək.
Yağılara vermə aman,
Misri qılınc əldə gərək.

Düşmən tərəf güc eyləsə,
Namərd sənlə öc eyləsə,
Xan-xavənlər kəc eyləsə,
Misri qılınc əldə gərək.

Usta Misir sənə ata,
Düşmənlərin yasa bata,
Məndən sənə budu əta,
Misri qılınc əldə gərək.

21. Alı kişi Dürata, Rövşən Qırata minib Həsən xandan intiqam almaq üçün onun düşərgəsinə – Dərlıq tərəfdəki Ballıbulağa gəlirlər.

22. Həsən xan Alı kişi ilə oğlu Rövşəni tanıyıb qılınca əl atır ki, onlara hücum eləsin. Rövşən deyir:

Gəl sənə deyim, Həsən xan,
İgid gərək mərd meydanda.
Qılınc əldə sərt meydanda.
Açа savaş qənimiylə
İgid gərək mərd meydanda,
Qılınc əldə, sərt meydanda.

Meydan açıb sulayaram,
Yalquzaq tək ulayaram,
Al qanına bulayaram,
İgid gərək mərd meydanda,
Qılınc əldə, sərt meydanda.

Uydun namərdin sözünə,
Mil çəkdin atam gözünə,
Fərman verdin öz-özünə
İgid gərək mərd meydanda,
Qılınc əldə, sərt meydanda.

İgid gərək qollar bükə,
Qəniminin bağrın sökə,
Ovuc-ovuc al qan içə.
İgid gərək mərd meydanda,
Qılınc əldə, sərt meydanda.

Gen gününü dar eylərəm,
Al qanını car eylərəm,
Bəbəyini kor eylərəm,
İgid gərək mərd meydanda,
Qılınc əldə, sərt meydanda.

Yelqanadın üstündəyəm,
Şirin canın məstindəyəm,
Sənlə döyüş qəsdindəyəm,
İgid gərək mərd meydanda
Qılınc əldə, sərt meydanda.

Rövşənəm, qəniməm xana,
Talan salaram obana,
Boyanarsan qızıl qana,
İgid gərək mərd meydanda
Qılınc əldə, sərt meydanda.

23. Rövşən Misri qılıncla vurub Həsən xanın başın üzür. Adamlarını da qılıncdan keçirir. Həsən xanın ordusu bunların üstünə gəlir. Alı kişi ilə Rövşən atların başın buraxırlar.

Bundan sonrakı atların sınaq, özləri üçün qalmağa yer seçmə epizodu korpusa daxil olmuş çap materialları və digər variantlarla eynidir.

24. Çardaxlı Çənlibel məskən seçilir. Alı Rövşənə Ağqayanı göstərib deyir ki, bu dağın zirvəsində Qoşabulaq var. Hər yeddi ildən bir Məşriqlə Məğrib ulduzları doğub hərəkət edirsə, gecənin düz yarısında Çardaxlı Çənlibelin üstündə toqquşurlar. Onların nurundan Qoşabulaq çağlayıb köpüklənir. Kim bu bulağın suyundan içib çimsə yenilməz pəhlivan, ötkəm səsli aşıq olar. Nərəsindən aslanlar tük salar. Qılıncını bulağın suyuna salsa kəsəri kütləşməz. Atı su içsə sahibini darda qoymaz. Biraylıq mənzili yeddi günə kəsər. Yüz yaşlı qoca bu sudan içsə bənövşə bığlı növcavan olar. Korların gözünə işıq gələr. İndi həmin vaxtdı. Get, dediklərimə əməl et, məni də yaddan çıxartma. Gözlərimin əlacı o sudadı.

25. Rövşən Ağqayaya gəlir. Nə qədər çalışırsa, dağın zirvəsinə çıxa bilmir. Qırat ona bələdçilik edir. Rövşən Qoşabulağı tapır. Qoşabulaq köpüklənəndə atasının tapşırığının hamısını yerinə yetirir, başqa variantlarda olduğu tək, atası üçün su götürməyə macal tapmır. Qoşabulağın suyu çəkilir.

26. Rövşən atası üçün su gətirə bilməməyindən əzab, peşmançılıq çəkir. Alı deyir ki, bu tale yazısıdı. İndi mənim vaxtım yetişib, köçümü sürməliyəm. Rövşənə vəsiyyət edir ki, sən ki, o nərə sahibi olubsan, onu hər yerdə yox,

yalnız ər meydanında, kiməsə qalib gəlmək istəyəndə çəkərsən. Başına topladıqlarını sınaqdan keçirəndən sonra dəliliyə qəbul edərsən. Bir də Dəli Həsənlə dostluq etməyi oğluna tapşırır və onun yerini belə bildirir:

Gah Eldar, gah Qarayazı,
Oylağıdı bil, Həsənin.
Bir dəlidi, ürəyi saf,
Pənahdı el Həsənin.

Bir obadı səxa-sanı,
Mərd meydanda coşar qanı.
Sən də onu qardaş tanı,
Vuran qolu ol Həsənin.

Qənim görsə nərə çəkər,
Yağıların qanın tökər,
Paşaların bürcün sökər
Var oyunu bol Həsənin.

Alı gedir son məkana,
Dünya olub möhnətxana,
Dar günündə qıyar cana,
Bircə könlün al Həsənin.

27. Alı kişi oğlu Rövşənə deyir ki, bu gündən sənin adın "Koroğlu" oldu.

28. Alı kişi vəfat edir. Koroğlu onu Qoşabulağın yanında dəfn edir. Atasının vəsiyyəti ilə Dəli Həsəni axtarmaq üçün Qarayazıya yola düşür.

Əlyazması. İnv. №717
"Nigarın gətirilməsi", "Koroğlu-Həsən".

Latın əlifbası ilə makina yazısı, iki nüsxə, 28 səhifə. Söyləyən, toplayan, tarix və yer qeyd edilməyib. Qol başlıqsızdır. Xatırladılan başlıqlar sonradan karandaşla əl xətti ilə yazılıb.

1. İstanbul xotkarının qızı Nigar xanım görməzə-bilməzə Koroğlunun şöhrətini eşidib eşq badəsini içir, min könüldən bir könülə ona aşiq olur.

2. İstanbul kəndlərinin birində bığ yeri təzəcə tərləmiş Bəlli Əhməd adlı bir igid yaşayır. Bəlli Əhməd Koroğlunun igidlikləri haqqında çox eşidir. Onun dəstəsinə qoşulmaq arzusuna düşür.

3. Bəlli Əhməd İstanbula gəlir.

4. Bəlli Əhməd İstanbul bazarında olarkən görür ki, bazarda qaçhaqaç düşdü. Hamı dükanını bağlayıb aradan çıxır. Bəlli olur ki, xotkar Məkkə ziyarətinə gedib. Qızı Nigar xanım isə hər cümə günü məscidə gedir. Nigar məscidə gedən gün onu görən olmasın deyə camaat dükan-bazarı buraxıb evlərinə çəkilirmiş.

5. Bəlli Əhməd qaçıb bir göyərti dükanında gizlənir. Nigar kənizləri ilə buradan keçəndə göyərti dükanının bağlı olduğunu görüb şübhələnir.

6. Bəlli Əhməd gizləndiyi yerdən baxıb görür ki, Nigar xanımın, doğrudan da, yer üzündə misli-bərabəri yoxdur.

7. Nigar xanım Bəlli Əhmədi gizləndiyi yerdən çıxarır, kənizlər onu döyürlər. Çarəsi kəsilən Bəlli Əhməd özünü Koroğlu dəlisi tək tanıdır. Nigar xanım Koroğluya məktub yazıb aparmaq üçün Bəlli Əhmədə verir.

8. Bəlli Əhməd Çənlibelə gəlib məktubu Koroğluya verir. Koroğlu Nigar xanımın məktubunu oxuyandan sonra Bəlli Əhmədi zəncirlə bağlayır (O, Çənlibelə xəbərlə gələn hər kimsəylə belə edir. Xəbər doğru çıxdıqda həmin kəsə mükafat, yalan çıxdıqda cəza verərmiş).

9. Koroğlu İstanbula Nigar xanımın arxasınca yollanır. İstanbula çatha-çatda bir qarı ilə rastlaşır. Onun evində gecələyir. Qarının oğlu Nigar xanımın nar bağına gözətçilik edir.

10. Koroğlu bazara çıxır. Xotkarın adını yazdırmaqla bir möhür-damğa düzəltdirir. Bir mirzə tapıb ona deyir ki, qoca nənəm xəstədir, gedək ona bir dua yaz. Mirzə gəlib görür ki, xəstə yoxdur. Koroğlu mirzəyə xotkarın adından Nigara belə bir namə yazdırır: “Bu naməni sənə verən adam mənim çavuşumdur. Mənim barigahımda mənə olan hörmət gərək ona da ola”.

11. Koroğlu Mirzənin paltarını alıb özü geyir, əlinə də bir təsbeh alıb xotkarın sarayına yollanır.

12. Koroğlu qırx qapıdan keçib Nigar xanımın həyətinə girir. Əmmaməsini, əbasını bir yana tullayıb sazı sinəsinə basır.

13. Nigar xanım səsə bayıra çıxanda Koroğlu görür ki, bu qız doğrudan da, Bəlli Əhmədin söylədiyi qənirsiz gözəldi.

14. Koroğlu Nigar xanımı qaçırır.

15. Nigar xanımın qardaşı Bürcü Sultan qoşun götürüb onların arxasınca düşür.

16. Koroğlu Bürcü Sultanla döyüşüb onu məğlub edir, öldürmək istəyərkən Nigar ona toxunmamağı xahiş edir. Koroğlu Bürcü Sultanı Nigara bağışlayır.

17. Koroğlu qoşunla tək döyüşür. Elə bu vaxt dəlilər onun köməyinə gəlirlər.

18. Koroğlu Nigar xanımı Çənlibelə gətirib toy eləyir.

Əlyazması. İnv. №717
“Koroğlu ilə Nigarın nağılı”

Latın əlifbası ilə makina yazısı, 6 səhifə. Söyləyən və toplayan göstərilməyib. Toplama tarixi və yeri yoxdur.

Bu variant bəzi səciyyəvi cizgilərlə seçilir:

1. Koroğlu İstanbula çatanda bir çobanla rastlaşır. Ona qonaq olmaq istəyəndə çoban deyir: – sənin atın böyük olduğu üçün mənim qapımdan keçə bilməz. Odur ki, səni qonaq saxlaya bilmərəm. Koroğlu bildirir ki, Qırat bundan da balaca qapıdan keçməyə qabildir. Ata işarə verir, at ayaqlarını yığıb əyilə-əyilə içəri keçir.

2. Koroğlu kimliyini çobana bildirir.

3. Səhəri Koroğlu bazara gəlib saz almaq istəyir. Sazbənd saz vermir. Hazır olan sazı xotkarın oğlu üçün bağladığını bildirir.

4. Koroğlu özünü sazbəndə tanıtdırır:

Gəlib burda xub sərgərdən qalmışam,
Usta, qulun olum, yola sal məni.
Bunun tayın yüz tümənə almışam,
Usta, qulun olum, yola sal məni.

Mən çəkmədim sonalardan belə naz,
Ov etmişəm obalardan mən hər yaz,
Usta, mənimdi o divardakı saz,
Usta, qulun olum, yola sal məni.

Ayağım altında vardı xub keçə,
Koroğluyam, dünyanı sataram heçə,
Usta, qorx qılıncım ortannan keçə,
Usta, qulun olum, yola sal məni.

5. Usta Koroğlunu tanıyıb qorxuya düşür və sazı yüz tümənə Koroğluya satır.

6. Koroğlu çobanın anası ilə Nigar xanımın bağına gəlir.

7. Bu varianta görə Nigar Koroğlunun igid olmasını sınamaq üçün ona bir sillə vurur. Koroğlunun ürəyi keçir. Qızlar tez tökülüb onun əl-qolunu bağlayır, bir tərəfə tullayırlar.

8. Gizləndiyi yerdən bu əhvalatı izləyən çobanın anası oğluna xəbər gətirir. Çoban gəlib Koroğlunun əl-qolunu açıb xilas edir.

9. Koroğlu yenidən Nigar xanımın bağına gəlir.

10. Əlyazmasındakı epizoddan bəlli olur ki, Nigar xanım Koroğlunu bəyənmir. Koroğlu ona cavabında deyir:

Mənə qara deyən dilbər,
Qaşların qara deyilmi?!
Çatılıbdı dal gərdənə,
Saçların qara deyilmi?!

Çənlibeldə qurdum binə,
Bənzəyirsən aya, günə,
Ağ üzündə dənə-dənə,
Xalların qara deyilmi?!

Koroğlunun öz aləmi,
Əlində dəftər-qələmi,
Tanrının oxunan kəlamı,
Yazısı qara deyilmi?!

11. Qıratın belində oturan Koroğlu Nigara deyir: – Bir halda ki, məni bəyənmirsən, əl ver halallaşaq. Nigar xanım əlini uzadarkən Koroğlu tez onu atın tərkinə çəkib Çənlibelə üz tutur.

Əlyazması. İnv. №717

Latın əlifbası ilə əlyazması, 10 vərəq. Toplama vaxtı, yeri, söyləyici və toplayıcı qeyd edilməyib. İlk səhifəsi, sərlövhəsi olan vərəq qorunmayıb.

Bu variantda bir epizod əvvəlkilərdən seçilməsi ilə diqqəti cəlb edir:

1. Koroğlu Osmanlı torpağına çatıb xotkar karvanı ilə qarşılaşır.
2. Bəzirganbaşı Koroğluya etina etmir. Koroğlu ona belə hərbə-zorba gəlir:

Sənə deyim, ay bəzirgan,
İndi allam canın sənin.
Qırıb karvan, töksəm malın,
Necə olar halın sənin?

Haça şeşpəri ataram,
Qolların daldan çataram,
Qul edib səni sataram,
Gedər əldən malın sənin.

İndi şeşpər atsam başın,
Gedər canın, qalar leşin,
Koroğlu ölçər qumaşın
Necə olar halın sənin?

3. Koroğlu xotkarın karvanını talayıb yaxın obalardakı kasıblara, fağırlara paylayır. Özü isə Nigar xanımın narlı bağına yollanır.

Əlyazması. İnv. №725 (4)
"Cününun gətirilməsi"

Söyləyəni *Aşıq Mirzə Bayramov* (1998-ci ildə Tovuz rayonunun Cilovdarlı kəndində anadan olmuşdur. 1900-cü ildən aşıqlığa başlamışdır. O, Azərbaycan Yazıçılar İttifaqının üzvü olmuşdur. 1954-cü ildə vəfat etmişdir). 1936-cı ildə toplanılıb. Yer göstərilməyib. Toplayan bəlli deyil. Mətn tam deyil. Latın əlifbası ilə makinada yazılıb. Qalan vərəqlərin sayı 15-dir.

Bu variant bir sıra epizodlarla digərlərindən seçilir:

1. Koroğlu Ağqayadan baxıb Üççiməndə bir karvan görür. Koroğlu karvanın başının üstünü kəsib bac istəyir.

2. Karvan başçısının adı Sərrafdır. Amma başına həmişə qaş-daşla bəzənmiş qızıl tac qoyduğu üçün onu Zərkülah çağırırlar.

3. Bəzirgan Koroğluya 500 qızıl verir. Koroğlu götürmür. Onların arasında deyişmə olur (Korpusa daxil edilmiş variantda Koroğlu tək oxuyur. Burda isə bəzirgan onun sözlərinin qarşısına deyir):

Koroğlu:

Gəl sənə söyləyim, bəzirganbaşı,
Gəlmişəm mən səndən bac alam, gedəm!
Dağıdam qəfləni, tökəm malını,
Gəlmişəm mən səndən bac alam, gedəm!

Bəzirganbaşı:

Əcəm oğlu, heç də hədyan söyləmə,
İnnən sonra sənə para verməərəm!
Almadın verdiyim, yekəlik satdın
Zorluğunan bir dinarə verməərəm!

Koroğlu:

Görməyibsən mənim tək savaşanı,
Didənnən axıdam qannı yaşını,
Cidaynan ölçərəm al qumaşını,
Nağddarın olmasa vec alam gedəm!

Bəzirganbaşı:

Getdim İstanbula, gəldim Toqatdan,
Qayıtdım Bağdaddan, keçdim Dərvətdən,
Çəkərəm, salaram mən səni atdan,
Qaldırıb çaxaram yerə, verməərəm!

Koroğlu:

Koroğluyam sərp qayadan atıllam,
Hər yerdə istəsən orda tapıllam,
Ac qurd kimi cürbinizə təpilləm,
Ortadan olmasa, uc alam gedəm.

Bəzirganbaşı:

Sərrafıyam, mən bilirəm işimi,
Həm öz qüvvətimi, tər savaşımı,
Nə beş param, nə də qaş quruşumu,
Sənin kimi cocuqlara verməərəm!

4. Koroğlu karvana hücum edir, amma bəzirganbaşı onu atdan salır. Güləşirlər. Bəzirganbaşı Koroğluya qalib gəlir və qollarını bağlayıb İstanbulda qul tək satacağını bildirir.

5. Bəzirganbaşı Koroğludan kimliyini, haralı olmasını soruşur. Özünü aşıq tək təqdim edən Koroğlu Muradbəylidən olduğunu bildirir. Bəzirganbaşı ondan Koroğlunu tanıyıb-tanımamasını soruşduqda cavab verir ki, bəli, görmüşəm, tanıyıram. Bəzirganbaşı onun qollarını açıb Koroğludan oxumasını istəyir.

6. Koroğlunun burada oxuduğu qoşma ruhu, poetik ifadə zərifliyi ilə tutumludur:

Qul alallar, qul olmazlar bizlərdə,
Məni qul adına satma, əfəndim!
Düşmənlərim sonra şad olar gülər,
Sən elə işləri etmə, əfəndim!

Mənim gözü yolda qalannarım var,
Mərdlik silahına dolannarım var,
İstanbul elində düşmannarım var,
Azad eylə, məni tutma, əfəndim!

İndi gözdüyüllər bir neçə dəllər,
Oynadar şeşpəri, qılış sığallar,
Yolumu gözlüyür neçə gözəllər,
Koroğlu qanına batma, əfəndim!

7. Bəzirganbaşı Koroğlunu buraxır.

8. Dəlilər Koroğlunun gec qayıtmasından nigaran qalırlar. Dəmirçioğlu, Bəlli Əhməd, Halaypozan onun arxasınca gedirlər. Onlar gəlib Koroğlunu üst-başı toz-torpağa batmış halda tapırlar. Səbəbini soruşduqda Koroğlu deyir:

Çöl gedirkən Üççiməni aşanda,
Onda baxdı məni bildi bəzirgan.
Dedim, qoçaqlarım, ənam göndərin,
Əlini cibinə saldı bəzirgan.

Nə qədər hay vurdum yerdən durmadı,
Annadım ki, məni bir şey saymadı.
Bac-xərac istədim, mənə vermədi,
Dinmədi, deyəsən laldı bəzirgan.

Hay vuruban şeşpər aldım dəstimə,
İstədim ki, girəm onun qəsdinə,
At oynatdım özmü saldım üstünə,
Əlin əlinə vurdu, güldü bəzirgan.

Başına qoyubdu qızıldan bökü,
Hayqırdı yerindən kərgədan təki,
Əyninə geyibdi zənburdan kürkü,
Qaldırdı məni, yerə çaldı bəzirgan.

Mən dəlini aparırdı ölümə,
Əl çatmadı Çənlibeldə elimə,
Dustaq oldum, kəndir saldı qoluma,
Dedi ki, sataram quldu bəzirgan.

9. Dəlilər axışıb bəzirganın başının üstünü kəsirlər. Bəzirgan görür ki, bayaq tutub buraxdığı da bunların sırasındadır.

10. Koroğlu üzünü dəlilərə tutub oxuyur:

Haydı qoçaqlarım, kəsin ətrafı,
Talansın bəzirgan yeri yurd olsun.
Hər tərəfdən at oynadın üstünə,
İrəngi saralsın, gözü dörd olsun.

At oynadın, mərd dolun meydana,
Dağıdın, talayın tökün hər yana.
Tülkü nədi pəncə vursun aslana,
Gərək odu qurddan olan qurd olsun.

Nə bilirdi Koroğlunun halını,
Bu tər savaşını, bu zavalını,
Yükləyin karvanı, çəkin malını,
Qoy ah çəksin öz-özünə dərd olsun.

11. Dəlilər hücum edib bəzirganın malını alır, özünü isə buraxırlar.

12. Malların içərisində bir sandıq da olur. Sandıq açılanda içindən Aşıq Cünun çıxır. Koroğlu ondan soruşur ki, sən gecə-gündüz bəzirganbaşının yanında olursan, bəs uşaqlarını nə vaxt görürsən? Həmçinin bəzirganbaşının ona nə qədər xərclik verməsini və haralı olduğunu da soruşur.

Cünun cavab verir ki, Ərzurumluyam, bəzirganbaşı mənim ailəmin illik xərcliyini verir, ilin iki-üç ayını da öz yanında səfərlərə aparır.

13. Koroğlu Cünuna çoxlu qızıl verib Ərzuruma yola salır və tapşırır ki, bir aydan sonra qayıdıb Çənlibelə gəlsin.

14. Cünun Ərzurumda altı ay qalır və bu vaxt birdən Koroğlunun tapşırığı onun yadına düşür.

Variantın bundan sonrakı səhifələri olmadığından hadisələrin necə cərəyan etdiyi bəlli olmur.

### Əlyazması. İnv. №720 (b)
### “Aşıq Cünunun Eyvazın xəbərini gətirməsi, Eyvazın gəlməsi və Bağdad səfərinə getməsi”

Latın əlifbası ilə makina yazısı, 21 səhifə. Son vərəqləri yoxdur, qol yarımçıqdır. Pasport məlumatı yoxdur.

1. Aşıq Cünun Ərzurumda Cəfər paşanın yanında olarkən bazara çıxır. Bir qəssab dükanına gəlir. Görür hamı gəlib bu dükandan ət alır. Bu, Cünunu maraqlandırır. Cünuna bəlli olur ki, adamlar daha çox bu dükandakı 14-15 yaşlarında olan oğlanın gözəlliyinə tamaşa etmək üçün gəlirlər. O, oğlanın adının Eyvaz olduğunu öyrənir və yadına salır ki, Koroğlu belə bir oğlan axtarır.

2. Aşıq Cünun Eyvazın xəbərini Çənlibelə – Koroğluya gətirir.

3. Koroğlu, İsabalı, Dəmirçioğlu alverçi adı ilə Ərzuruma gəlirlər.

4. Koroğlu dəliləri ilə qəssabın evinə qonaq düşürlər. Qəssab qonaqlıq tədarükü görür.

5. Qəssabın oğlu Eyvaz axşam evə gəlir. Qonaqlarla görüşür. Koroğlunun əlini elə sıxır ki, Koroğlu ağrıdan əlini döşünə basır. Eyvaz dəlilərlə də görüşüb otaqdan çıxır.

6. Ortaya yemək gələndə deyir ki, Eyvaz süfrə başına gəlməsə mən çörək yeməyəcəyəm.

7. Qəssab Eyvazı qonaqların yanına gətirir. Eyvaz atasına deyir ki, süfrədə olan yeməklər azdır, əlavə xörək lazımdır.

8. Yeməkdən sonra qəssab qonaqlardan kim olmalarını, nə məqsədlə buraya gəlmələrini soruşur. Deyirlər ki, alverçiyik, qoyun almağa gəlmişik.

9. Səhər qəssab, oğlu Eyvaz və qonaqlar sürünün yanına gəlirlər. Koroğlu aldıqları qoyunların pulunu artıqlaması ilə verir. Eyvaz bu işə şübhələnir, atasına deyir:

Ata, bunlar nə xan deyil, nə paşa,
Bu qılıqda çoydar olmaz, ay olmaz.
Qeyzə gəlsə bağlar adamı daşa,
Bu qılıqda çoydar olmaz, ay olmaz.

Şahin kimi qənim üstə əsəndi,
Qanlı başı qansırğadan asandı,
Koroğludu, Dəmirçioğlu Həsəndi,
Bu qılıqda, çoydar olmaz, ay olmaz.

Qızılı, gümüşü sağ-sola xərşlər,
Paşaynan, xotkarnan davasın başlar,
Hər verəndə beş-beş, on beş bağışlar,
Bu qılıqda, çoydar olmaz, ay olmaz.

Bahar olcaq çeşmə sular bulanmaz,
Yaralarım köz-köz olar sulanmaz,
Oğul daha öz öyündə bulanmaz,
Eyvaz sənə oğul olmaz, ay olmaz.

10. Eyvaz işdən duyuq düşdüyü üçün Koroğluya əl vermək istəmir. Eyvazın atası oğluna deyir ki, alver etdiyimiz üçün əl tutub xeyir-dua ver. Eyvaz əl verərkən Koroğlu onun əlindən, Dəmirçioğlu isə ayaqlarından tutub Qıratın üstünə aşırırlar. Koroğlu yola düşür. Eyvaz atasına deyir: – Bu Koroğludur, məni Çənlibelə aparır. Əhdimə çatdım.

11. Koroğlu Eyvazı Çənlibelə gətirir, özünə oğul edir və onu dəlilərə başçı qoyur.

Əlyazmada bundan sonrakı hadisələr "Bağdad səfəri" ilə bağlı olduğu üçün bu barədə arxada bəhs açılacaq.

Əlyazması. İnv. №720 (j)
"Eyvazın Çənlibelə gətirilməsi"

Söyləyəni *Aşıq Əli Rəhim oğlu*, toplayanı *Hümbət Əlizadə*, yazıya alınan yer: Qazax rayonu, Köçəsgər kəndi. Latın əlifbası ilə makinada yazılmışdır, 31 səhifədir. 17-ci səhifə düşübdür.

Bu variantda korpusa daxil olan və digər variantlardan az seçilir.

1. Qolun başlanğıcında deyilir ki, Koroğlu Nigarı, Telli, Reyhan xanımı almışdısa da, korpusdakı və digər variantlardakı məlum səbəbə görə övladı olmamışdı.

2. Koroğlu Nigarın niyə qəmgin olmasını soruşduqda Nigar ona şeirlə cavab verir. Bu variantdakı həmin şeir on bənd, korpusa daxil olan və digər variantlarda, eləcə də H.Əlizadənin "Koroğlu"sunda səkkiz bənddir. M.H.Təhmasibin "Koroğlu"sunda da bu şeir on bənddir. Amma burada bəzi dəyişikliklər vardır. Variantdakı həmin iki bənd belədir:

Sənə deyirlər Koroğlu,
Kəsirsən dağlarda yolu.
Bir kərə söylə nə olu,
Dərdə çarə qılan yoxdu?

Dəlilər sana düzüldü,
Əlim əlimnən üzüldü,
Bağman öldü, bağ pozuldu,
Mən tək gülü solan yoxdu!

3. Aşıq Cünun Eyvazın xəbərini Çənlibelə gətirəndə bunu şeirlə deyir. Həmin şeir korpusda səkkiz bənd, sözü gedən variantda isə doqquz bənddir.

Korpusa düşməyən bənd belədir:

Mərəkədə başda duran,
Meydanda iyitlər yoran,
Hər pişvazına varam,
Qırx incə gəlin, qız gördüm.

M.H.Təhmasibin nəşr etdirdiyi "Koroğlu"da bu bəndin sonuncu misrası "Qırx incəbelli qız gördüm" şəklindədir.

4. Bu variantda Eyvazın arxasınca tək getməməyi Koroğluya Nigar xanım söyləyir.

5. Bu variantda Koroğlu – Ərəb Reyhan xətti yoxdur.

Əlyazması. İnv. №718 (a)
"Dəmirçioğlu"

Söyləyəni *Aşıq Hüseyn Bozalqanlı* (bax: İnv. №715 (a). Yazıya alanı *Mirzə Mehdi Vəlizadə* (Bax: İnv. №715 (a). Yazıya alınma tarixi: 1937. Yer göstərilməyib.

Latın əlifbasında makinada yazılmış bu qolun ilk üç səhifəsi "Dəmirçioğlu" adlanır. Dördüncü səhifədə isə "Dəmirçioğlunun qızın dalınca getməsi" yazılıb. Birinci üç səhifə də daxil olmaqla qol 40 səhifədir.

1. Koroğlu Ərəboğlu Kənanla Trabzona gəlir. Burada nalbənd Qasıma Qıratı nallatdırmaq istəyirlər. Nalbənd Qasım bunları tanıyıb oğlu Həsəni gizlədir.

2. Qırat bədnallıq edir. Atın ayaqlarını saxlamağa heç kəsin gücü çatmır. Dəmirçioğlu Həsən gizləndiyi yerdən çıxıb atın ayaqlarını tutur, atası nallayır.

3. Koroğlu pul verəndə o necə ki, nalları əzmişdi, Dəmirçioğlu da qızılları əzişdirib Koroğluya qaytarır.

4. Dəmirçioğlu Həsən Koroğludan nal pulu əvəzinə ata minib gəzməyi xahiş edir. Koroğlu razı olur. Dəmirçioğlu atın belinə qalxınca Koroğlu sıçrayıb tərkinə minir.

5. Ərəboğlu öz atına minib hər nə qədər çapırsa da, onlara çata bilmir.

6. Koroğlu Dəmirçioğlunu Çənlibelə gətirir.

7. Dəmirçioğlu Trabzona atasının yanına qayıdanda Koroğlu nərə çəkib onu atdan salır və qollarını bağlayır.

8. Koroğlu Dəmirçioğlunu Trabzona aparır, orada atasından halallıq alır və Dəmirçioğlunu gətirib öz dəlilərinə qoşur.

9. Dəmirçioğlu Cəfər paşanın bacısı Telli xanımın arxasınca gedir və əsir düşür.

10. Koroğlu Dəmirçioğlunun arxasınca gedib Cəfər paşanın qoşunu ilə döyüşüb onu məğlubiyyətə uğradır və Dəmirçioğlunu azad edir.

11. Koroğlu Telli xanımı da Çənlibelə gətirir və toy edib onu Dəmirçioğluyçun alır.

Əlyazması. İnv. №718 (b)
"Dəmirçioğlunun gətirilməsi"

Söyləyəni *Aşıq Alı*. Digər pasport məlumatları yoxdur. Latın əlifbası ilə makinada yazılıb, II səhifədir.

Bu variant, bəzi detallar nəzərə alınmazsa, korpusa daxil edilmiş mətnə uyğundur.

1. Koroğlu bir şəhərdə Qıratı nallatmaq istəyir. Nalbənd onu tanıyır. Oğlunu içəridə gizlədir. Qorxur ki, Koroğlu onun oğlunu özü ilə aparar.

2. Koroğlunun atın ayaqlarını saxlamağa gücü çatmır. Nalbənd məcbur olub oğlunu çağırır. O gəlib atın iki ayağını birdən tutub saxlayır.

3. Koroğlu Dəmirçioğlunda bu qüvvəni görüb məəttəl qalır və hiylə işlədir. O, nalları əlində əzişdirib nalbəndə qaytarır ki, bu cür xarab nal mənə lazım deyil. Nalbənd təzə nallar gətirib Qıratı nallayır.

4. Koroğlu pul verəndə Dəmirçioğlu barmaqları arasında sürtüb pulun sikkəsini pozur və qəlp pul deyib sahibinə qaytarır. Koroğlu pulu nalbəndin özünə verir.

5. Koroğlu gedəndən sonra nalbənd onun kimliyini oğluna bildirir.

6. Dəmirçioğlu belinə bir-iki kotan zənciri bağlayıb Koroğlunun arxasınca Çənlibelə yola düşür. Gecə vaxtı o, Çənlibeldə Koroğlu ilə qarşılaşır.

7. Koroğlu Dəmirçioğlunu tanıyır, amma özünü nişan verməyib oğru olduğunu deyir.

8. Dəmirçioğlu tövlənin damını sökür, Koroğlunu içəri salır ki, zənciri Qıratın belinə bağlasın, o da çəkib aparsın.

9. Koroğlu zənciri Düratın, Qıratın və o biri atların belinə bağlayır, özü də atın quyruğundan sallanır. Dəmirçioğlu bunların hamısını çəkib qaldırır. Koroğlu o biri atları açıb Düratı saxlayır. Dəmirçioğlu atı Koroğlu ilə bərabər çəkib çıxarır. Sonra o, atı minib Koroğlunu da tərkinə alır.

10. Yolda Koroğlu Dəmirçioğlunu şeşpərlə vursa da, ona təsir etmir. O, Dəmirçioğludan Koroğludan qorxub-qorxmamasını soruşur. Dəmirçioğlu deyir ki, yalnız Koroğlunun nərəsindən qorxuram. Koroğlu əlini qulağının dibinə qoyub bir dəli nərə çəkir. Dəmirçioğlu atdan yerə yıxılır. Koroğlu Dəmirçioğlunu zəncirlə bağlayır. Dəmirçioğlu dartıb zəncirləri qırır və Koroğluya dəli olacağını bildirir.

11. Koroğlu Dəmirçioğlunu Çənlibelə gətirir. Dəlilər, xanımlar onun belinin açıq olduğunu görüb fil dərisindən kəmər kəsdirib belinə bağlatdırırlar. Dəmirçioğlu bir güc verir, o da qırılır.

12. Dəmirçioğlu Koroğlu ilə dost olub Çənlibeldə qalır.

Əlyazması. İnv. №718 (v)
"Dəmirçioğlunun gəlməsi"

Söyləyəni *Aşıq Əsəd Rzayev*, toplayanı *Mirzə Mehdi Vəlizadə*, toplandığı tarix 1936-cı il. Toplama yeri göstərilməyib. Latın əlifbası ilə makinada yazılıb. 60 səhifədir. Qolun ikinci surəti 49 səhifədir. Bu qolun 8 vərəqdən ibarət iki yarımçıq surəti də vardır.

1. Aşıq Cünun Toqatda Hasan paşanın yanında aşıqlıq edir.

2. Aşıq Cünun Koroğlunu görmək üçün Çənlibelə gəlir. Koroğlu Cününa həmişəlik Çənlibeldə qalmağı təklif edir, o razı olmur. Koroğlu Toqatda Qıratı nallatmaq üçün yaxşı bir nalbənd tapmağı tapşırır.

3. Koroğlu Toqata gəlib Cününla nalbəndin yanına gedir. Qırat bədnallıq edir.

4. Dəmirçioğlu Həsən Qıratın ayaqlarını təkbaşına saxlayır, atası nallayır.

5. Koroğlunun gözü nalbəndin oğluna düşür və istəyir onu Çənlibelə aparıb özünə dəli etsin.

6. Aşıq Cünun bir cüt göyərçin gətirir. Həsən atasından bu quşları almağı xahiş edir. Cünun deyir ki, bu quşlar özgənindi, gedək mən sənə iki qəşəng quş verim.

7. Cünun Dəmirçioğlunu aldadıb Koroğlunun yanına aparır. Koroğlu da onu tərkinə alıb birbaş Çənlibelə gətirir.

Variantda sonrakı hadisələr, adlar dəyişilsə də, Koroğlunun Ərzurum və Toqat səfərlərinin əsasında cərəyan edir:

1. Hasan paşa Aşıq Cününu Çənlibelə getməsinə görə tənbeh etmək istəyir. Aşıq Cünun həqiqəti söyləyir.

2. Hasan paşanın qızı Dona xanım namə yazıb Cününla Koroğluya göndərir ki, gəlib onu Çənlibelə aparsın.

3. Dona xanımın arxasınca Dəmirçioğlu gəlir və onu qaçırır.

4. Dəmirçioğlu Dona xanımla gəlib Hasan paşanın at qoruğunda düşüb dincəlir, burada onu yuxu aparır.

5. Hasan paşa əhvalatı eşidib Dəmirçioğlunun arxasınca qoşun göndərir.

6. Dəmirçioğlu Dona xanımı bir kahaya salıb çıxacağın ağzını yekə bir qaya parçası ilə bağlayır, sonra Hasan paşanın qoşununu qırmağa başlayır.

7. Hasan paşa hiyələyə əl atır. Gecə döyüş meydanına lağız atdırır. Sabahısı döyüş zamanı Qıratın ayağı lağıma düşüb büdrəyir və Dəmirçioğlu yıxılır. Pusquda duran on iki kəməndçi hamısı birdən kəmənd atıb Dəmirçioğlunu tuturlar.

8. Qırat baş alıb Çənlibelə qaçır.

9. Koroğlu atı Dəmirçioğlusuz görüb dəlilərlə Toqata gəlir. Vuruşda Hasan paşanın qoşununu məğlub edib Dəmirçioğlunu da, Dona xanımı da Çənlibelə gətirir.

10. Çənlibeldə böyük toy çaldırıb Dona xanımı Dəmirçioğluya alır.

Əlyazması. İnv. №726 (1)

Latın əlifbası ilə qəhvəyi və qara mürəkkəblə yazılmış əlyazması, 25 vərəq. Söyləyəni *Aşıq Həsənbala*, toplayanı *Əliheydər Tahirov* (Nizami adına Ədəbiyyat İnstitutunun əməkdaşı olub, folklorun fəal toplayıcısı tək tanınıbdır. O, bir sıra folklor örnəkləri nəşr etdirib. Repressiyanın qurbanı olub). Qol Dəvəçi rayonundan toplanılıb. Toplama tarixi göstərilməyib. Eyni inventar nömrəsi ilə bu qolun latın əlifbasında yazılmış üç makina nüsxəsi də vardır. Nüsxənin biri tamdır, 21 səhifədir, qalan iki nüsxənin sondan səhifələri düşüb.

1. Koroğlu Çənlibeldə böyük şənlik məclisi qurdurub 7777 dəlisinə qonaqlıq verir. Koroğlu dəlilərdən soruşur ki, "bəs bu məclisdə çatmayan nədir?" Dəli Həsən cavab verir ki, aşıq çatışmır. Koroğlu üç günə aşıq tapıb gətirməyi Dəli Həsənin özünə həvalə edir.

2. Dəli Həsən Ərəbatı minib Ərzuruma yollanır. O, küçədə bir aşıqla rastlaşır, onun adı Cavan aşıqdır. Dəli Həsən aşığı tərkinə alıb Çənlibelə qayıdır.

3. Koroğlu aşığın qəmgin olduğunu görüb səbəbini soruşur. Aşıq əhli-əyalının intizarda olduğunu şeirlə Koroğluya bildirir. Koroğlu ona əhli-əyalını gedib görüb qayıtmaq üçün üç gün möhlət verir.

4. Ərzurum paşası Cəfər paşanın qızı Telli xanım Cavan aşığın Koroğlunun yanından sağ-salamat qayıtdığını eşidib onu qonaq çağırır, Koroğlunu soruşur.

5. Cavan aşıq Telli xanımın gözəlliyinə heyran qalıb sözü ondan başlayır:

Bu gün bu məclisdə bir gözəl gördüm,
Bu qədər gözəllik xanə yaraşır.
Gözəllərdə naznan gəzən çox olur,
Ceyran tək yerimək sənə yaraşır.

Firəng şişəsindən ağdı qolların,
Göyün ulduzuna bənzər xalların,
Saf güləbatın tək siyah tellərin,
Yayılanda dal gərdənə yaraşır.

Əndamın gümüşdən, kağızdan ağdı,
Sinəmə çəkilən düyündü, dağdı,
O qoynuvun içi cənnətdi, bağdı,
Qədir bilən bir bağmana yaraşır.

5. Telli xanım aşıqdan xahiş edir ki, Koroğludan oxusun. Aşıq oxuyur:

Qəflə bəzirgannan, gəlib ötənnən,
Müdam alır xərac, peşkəş Koroğlu,
Əyninə geyibən zərdən, zibadan,
Başdan-başa al qumaşdı Koroğlu.

Ona ər deyərlər, bir ər oğlu ər,
Meydana girəndə bir əsrəmiş nər.
Xotkar qorxusundan əsnəyib titrər,
Yeddi min leşkərin başı Koroğlu.

Cavan aşıq bu araya gəlməsə,
Saralıban gül irəngi solmasa,
Harda gözəl görsə, onu almasa,
Tarmar eylər dağı-daşı Koroğlu.

7. Telli xanım bir namə yazıb aşığa verir ki, Çənlibelə aparsın.

8. Aşıq vədə verdiyi vaxtda gəlib çıxmır. Koroğlu Dəli Həsəni onun arxasınca göndərir. O, aşıqla yolda rastlaşır.

9. Cavan aşıq Telli xanımın məktubunu Dəli Həsənə verir. O da məktubu gətirib Koroğluya verir.

10. Dəlilərdən heç biri Telli xanımın arxasınca getmək istəmir. Axırda Dəli Həsən irəli çıxır. O, Koroğlunun verdiyi bir cam şərabı içib yola düşmək istəyəndə Koroğlu deyir:

Uca-uca dağ başında,
Yel kimi əsdiyin varmı?
Heç tək-tənha bu çöllərdə
Ordular basdığın varmı?

Şeşpərinin ucun salla,
Düşmənə demə ey valla,
Hər tərəfdən beş-üç kəllə,
Heç kəsib asdığın varmı?

Koroğlu keçib canından,
Müxənnət ötməz yanından,
Ovcunla düşmən qanından
Doldurub içdiyin varmı?

11. Dəli Həsən də Koroğluya şeirlə cavab verir və Ərzuruma yola düşür. Burada bir qarıdan Telli xanımın olduğu evi öyrənib oraya gəlir. O, Telli xanımı gördükdə ona sözü olduğunu bildirib deyir:

Çənlibeldən and eləyib yeridim,
Ərzurumun gözəlinə gəlmişəm.
Ya qismət yetirib məni buraya,
Ya da əcəl bazarına gəlmişəm.

Hayıl-hayıl eyvanlardan baxan yar,
Şirin canım eşq oduna çaxan yar,
Namən gəlib Çənlibelə yetən yar,
Sən verdiyin o ilqara gəlmişəm.

Sənə qurban olsun bu şirin canım,
Bil, qeyri bir şeyə gəlmir gümanım,
Dəli Həsən deyir, ay Telli xanım,
Gül üzünə, xoş rəftara gəlmişəm.

12. Dəli Həsənin belə oxumasından sonra Telli xanımla onun arasında belə bir deyişmə başlayır:

Telli xanım:

Əbəs-əbəs bu sözləri söyləmə,
Əcəm oğlu, çəkilginən bu yerdən.
Girib eşqin dəryasına boylama,
Əcəm oğlu, çəkilginən bu yerdən.

Dəli Həsən:

Əbəs yerə bu sözləri söylərsən,
Əcəm oğlu sənsiz getməz bu yerdən,
Sənnən ötrü eşq dəryasın boylaram,
Əcəm oğlu, sənsiz getməz bu yerdən.

Telli xanım:

Hər yanını bürüyərlər qurd kimi,
Ol saat gözlərin olur dörd kimi,
Başın gedər, leşin qalar yurd kimi,
Əcəm oğlu, çəkilginən bu yerdən.

Dəli Həsən:

Əcəm oğlu gəlməyibdi yasdana,
Qılınc çalar, meydan dönər bostana,
Yeddi tülkü neylər bir ac asdana. (aslan)
Əcəm oğlu sənsiz getməz bu yerdən.

Telli xanım:

Atlanıban gəlsin türkmanlı bəylər,
Biz gedirik, boş qalacaq saraylar,
Telli xanım sənə iltimas eylər,
Əcəm oğlu, çəkilginən bu yerdən.

Dəli Həsən:

Mən qurbanam yarın siyah telinə,
Mən baxıram baxçasında gülünə,
Dəli Həsən getməz Çənlibelinə
Aparmasa əcəm getməz bu yerdən.

13. Dəli Həsən Telli xanımı qaçırır.

14. Cəfər paşa onların arxasınca beş yüz adam göndərir. Vuruşda Dəli Həsən tutulur. Onun ayağından başlamış şirin ətinədək soyub özünü torpağa basdırırlar.

15. Koroğlu yuxuda görür ki, dişinin birini çəkdilər. O saat bilir ki, Dəli Həsən dardadır. Bir nərə çəkib dəliləri başına yığır və deyir:

İsabalım, Eyvazbalım, oyanın,
Tutulubdu Dəli Həsən əldədi,
Amandı, Qıratı çatdırın mənə,
Kömək diləyibən gözü yoldadı.

Kosa Səfər, bağla Misir qılıncı,
Çap, çal qoy dağılsın ləşkərin ucu,
Bəlli Əhməd min iyidə girici,
Tutulubdu Dəli Həsən əldədi.

Koroğluyam mən görmüşəm duşumı,
Vaqiədə çəkdirmişəm dişimi,
Anlayanlar başa düşür işimi,
Tutulubdu Dəli Həsən əldədi.

16. Koroğlu dəlilərlə Ərzuruma yollanır.

17. Dəli Həsən dəlilərin gəlib yetişdiyini görəndə bayatı oxuyur:

Əzizim arxa haray,
Su gəlir arxa haray,
Düşmənim güclü olub
Çağırram arxa haray.

18. Koroğlu Dəli Həsəni bu halda görüb bərk qeyzlənir, Cəfər paşanı meydana çağırır. Cəfər paşa qorxusundan əsməyə başlayır. Koroğlu deyir:

Bu gün, dəlilərim, döyüş günüdü,
Kəllə gərək bu meydanda qalansın.
Mərd iyidlər yarasına baxanda,
Şeyda bülbül al qanına boyansın.

Necə gördü mərd iyidin üzünü,
Çıxardaram bu meydanda gözünü,
Göstər mənə Telli xanım üzünü,
Uruh cavanlaşsın, can təzələnsin.

Koroğluyam, bu meydanda gəzərəm,
Ləngə putu yannarınnan asaram,
Cəfər paşa, sənə qılınc basaram,
Bağırsağın cəmdəyinə dolansın.

19. Cəfər paşa Koroğluya qarşı durmağın əbəs olduğunu görüb Telli xanımı onlara verir.

20. Telli xanımı görən Dəli Həsən deyir:

Ədəb ilə, ərkan ilə
Telli gəlir qarşımıza.
Mən qurbanam o dildara
Əcəb gəlir xoşumuza.

Durub daldada baxanda,
Canım odlara yaxanda,
Yarın seyrinə çıxanda,
Əcəb gəlir xoşumuza.

Həsən deyir nə olacaq,
Gül solsa da, yar qalacaq,
Qadir mövladan gələcək
Nə yazılıb başımıza.

21. Koroğlu, dəlilər Telli xanımla Dəli Həsəni götürüb Çənlibelə qayıdırlar. Bir müddətdən sonra Dəli Həsənin yaraları sağalır. Koroğlu yeddi gün toy çaldırıb Telli xanımı Dəli Həsənə alır.

Əlyazması. İnv. №719 (b)
"Koroğludan bir parça"

Birinci səhifənin yuxarısında qəhvəyi mürəkkəblə "*Aşıq Hüseyn*" və "*Abbas Rəcəbli*" yazılıbdır. Digər pasport məlumatı yoxdur. Latın əlifbasında makinada yazılıb. 11 səhifədir.

1. Aşıq Cünun Çardaxlı Çənlibelə gəlib paşanın bacısı Telli xanımın kağızını, şəklini, yaylığını Koroğluya verir.

2. Koroğlunun dəlilərindən Dəmirçioğlu Həsən Telli xanımın arxasınca getmək istədiyini bildirir. Koroğlu razılıq verir.

3. Dəmirçioğlu silahxanadan 40 qılınc, 40 xəncər-şeşpər, 40 nizə, 40 qalxan götürür.

4. Koroğlu Dəmirçioğludan bu qədər silahı niyə götürdüyünü soruşduqda o, cavab verir ki, Ərzurum bərk qala olan yerdir, əsgərlər də orada çoxdur. Silahın birisi sınanda o birisini götürəcəyəm. Koroğlu deyir:

Oğul, gedirsən Ərzurumun elinə,
Ora bir dəryayi dala nisbətdi.
Arpa verib candan əziz bəsləmək,
Ərəbat mindiyin yelə nisbətdi.

Şeşpər yaxşı olur ələ almağa,
Qalxan yaxşı olur qala salmağa,
Ərəbat meydanda düşman qovmağa,
Cida bir buynuzlu kələ nisbətdi.

5. Dəmirçioğlu Koroğlunun belə deməsindən sonra silahların hərəsindən bir dənə götürüb Ərəbata minir və Ərzuruma yola düşür.

6. Yolda Dəmirçioğlunu yuxu tutur. O, atı biçənəkdə hörükləyib yatır. Yuxudan ayılanda görür ki, Ərəbat yoxdur. Hər tərəfi duman bürüyür. Dəmirçioğlu bir qədər piyada gedəndən sonra yolun kənarında bir karvanın düşdüyünü görür. Baxır ki, Ərəbat da burada bağlanıb.

7. Dəmirçioğlu atlara tərəf gedəndə karvanbaşçısı adamlarına deyir ki, əgər o adam başqa at tutmaq istədi, onda onu tutub bərk döymək lazımdır. Yox, əgər bağladığımız ata yaxınlaşsa, demək onun öz atıdır.

8. Dəmirçioğlu Ərəbatı açıb minir və gəlib karvanbaşçısına razılıq edəndən sonra üz qoyur Ərzuruma.

9. Dəmirçioğlu Ərzurumda qarının yardımı ilə Cəfər paşanın evinə gəlir. O, paşanın məclisində oxuya-oxuya Telli xanıma naməsinin gəlib Çənlibelə çatdığını anladır.

10. Cəfər paşa buna görə bacısını danlayır. Telli xanım aşığın yalan danışdığını bildirir. Bu vaxt Dəmirçioğlu deyir:

Dəmirçioğluyam yalan olmaz dilimdə,
Bircə zərrə qorxu yoxdu qəlbimdə,
Bağlamışam Misri qılınc belimdə,
Telli xanım, səni aparmağa gəlmişəm.

11. Bu sözü eşidən Cəfər paşanın ürəyi gedir, yıxılır. Dəmirçioğlu Telli xanımı qoltuğuna vurub çıxmaq istəyir. Qol burada bitir.

### Əlyazması. İnv. №719 (v)

Pasport məlumatı yoxdur. Latın əlifbası ilə makinada yazılıb. Yarımçıqdır. Qalan vərəqlərin sayı 8-dir. İnv. №719 (b)-nin davamına oxşayır.

1. Telli xanımın aparıldığını görən Cəfər paşa əsgərlərinə Dəmirçioğlunu tutmağı əmr edir. Əsgərlər kəmənd atıb Dəmirçioğlunu tutur və gətirib dərin bir quyuya salırlar.

2. Telli xanım kişi paltarında kənizləri ilə gəlib qaravulları qorxudur və Dəmirçioğlunu çıxarıb öz otağına aparır.

3. Telli xanım Dəmirçioğluna deyir ki, sən məni apara bilməzsən. Get, Koroğlu gəlsin. Dəmirçioğlu Telli xanımsız Çənlibelə getməyəcəyini bildirir.

4. Dəmirçioğlu gəlib qarıgildən Ərəbatını çıxarır. Telli xanımı da tərkinə alıb Çənlibelə yola düşür.

5. Yolda Dəmiçrioğlu Telli xanıma deyir ki, səni elə belə aparsam, Çənlibeldə deyərlər ki, bəs qızı oğurlamışam. Odur ki, gərək qayıdıb paşanın qoşunu ilə döyüşəm.

6. Döyüş zamanı Cəfər paşa hiyləyə əl atır. Dəmirçioğlunun üstünə bihuşdarı səpdirir. O, huşunu itirib yıxılır.

7. Ərəbat heç kəsi Dəmirçioğluya yaxın buraxmır. Cəfər paşa adamlarını geri çağırır. Ərəbat ətrafı adamsız görüb otlamağa başlayır. Fürsətdən istifadə edib Dəmirçioğlunu tutub qollarını bağlayır və həbsə salırlar. Qol burada bitir.

### Əlyazması. İnv. №719 (q)
### "Koroğludan bir parça"

Latın əlifbası ilə makinada yazılıb. 10 səhifədir. İnv. №719 "b", "v"-nin davamıdır. Pasport məlumatı yoxdur.

1. Cəfər paşa Dəmirçioğlunu həbsə salandan sonra Toqat şəhərinə Soltana xəbər göndərir ki, Koroğlunun bir dəlisini tutmuşuq, onunla nə edək? Soltan da bildirir ki, dəlini çarmıxa çəkib gündə dörd barmaq dərisindən soyun. O vaxta qədər ki, Koroğlu özü gəlib çıxsın.

2. Koroğlu yuxuda Dəmirçioğlu Dəli Həsəni qan dəryasının içində görür və bu zaman həm də Koroğlunun bir saf dişi ağrıyır. Yuxudan hövlnak oyanıb, Dəmirçioğlunun arxasınca getməyə hazırlaşır.

3. Koroğlu öz qaydasına görə səfərdən qabaq şərab istəyir. Eyvaz şərab tuluqlarını gətirir və bir neçə kərə Koroğluya şərab verir. Dəlilər Eyvaza

işarə edirlər ki, bizi dağdan-daşdan tökər, şərab vermə. Eyvaz şərabın arasını kəsir. Bunu görən Koroğlu deyir:

Eyvaz, bir badə, bir badə...
Bir də içim nuş eyləyim,
Bilmirəm az qaldı, ya çox,
Düşmən ömrün puç eyləyim.

Xəbər yoxdur yar yanından,
Oxları getməz canımdan,
Qıratı düşmən canından
Bir saat sərxoş eyləyim.

Qoç Koroğlu, olma naşı,
Titrəyir ürəyim başı,
Qırayım qohum-qardaşı,
Ala gözün yaş eyləyim.

4. Koroğlu dəlilərlə Ərzuruma yola düşür. Yolda dəlilərdən kimsə Koroğlunun qocaldığını söyləyir. Bunu eşidən Koroğlu deyir:

Ay qoçaqlar, ay dəlilər,
Namərd mərd oldu, mərd oldu.
Düşmənin tənəli sözü
Cana dərd oldu, dərd oldu.

Sular gəlir axa-axa,
Dağı, daşı yıxa-yıxa.
Yar yoluna baxa-baxa,
Rəngim zərd oldu, zərd oldu.

Koroğluyam öc almışam,
Yüz xotkardan bac almışam,
Ha deynən qocalmışam,
Adım qurd oldu, qurd oldu.

5. Ərzuruma çatanda Koroğlu dəlilərə şəhərə 4-5 girməyi tapşırır. Həm də deyir ki, mən özüm Cəfər paşanın imarətinin qabağına gedib orada söz oxuyacağam. Sözün başında “Koroğlu” adı gələndə hücuma keçin.

6. İmarətin qabağına çatanda yuxudan yenicə durmuş Cəfər paşanı görən Koroğlu deyir:

Cəfər paşa, bu gün döyüş günüdür,
Kəllə gərək bu meydanda dayansın.
Hay deyəndə ağır tüplər basaram,
Qanlı başlar qansırğadan asaram.
Misri qılınc qabırğana basaram,
Bağırsağın cəmdəyinə dolansın.

7. Yarasının ağrısından yata bilməyən Dəmirçioğlu Koroğlunun səsini eşidincə təkan verib çarmıxı yerdən qoparır. Dərisi böyründən sürünə-sürünə Koroğlunun yanına gəlir.

8. Telli xanım qardaşının yanına gəlib oxuyanın kimliyini soruşur. Cəfər paşa oxuyanın Koroğlu olduğunu bildirir. Telli xanım bunu bilcək üzünü Koroğludan gizlədir.

9. Cəfər paşa tutulub, qolları bağlanılır, döyüşə davam gətirə bilməyən qoşun da təslim olur.

10. Koroğlu heç kəsi şəhərdən kənara çıxmağa qoymur. Bir ay burada qalır ki, Dəmirçioğlunun yaraları tamam sağalsın.

11. Cəfər paşa Dəmirçioğlu ilə Telli xanımın toylarını Ərzurumda eləməyi təklif edir. Koroğlu razı olmur. Atlanıb Çənlibelə gəlirlər.

Əlyazması. İnv. №722 (a)
"Keçəl Həmzənin Qıratı aparması"

Söyləyəni *Aşıq İslam* (Aşıq İslam Yusifov 1882-ci ildə Basarkeçər rayonunun Nərimanlı kəndində anadan olub. Uşaqlıqdan Gəncədə yaşayıb. Azərbaycanın əməkdar incəsənət xadimi fəxri adı alıb), Gəncə, 1936-cı il. Toplayan məlum deyil. Latın əlifbası ilə makinada yazılıb. İki nüsxədir. Nüsxənin biri 33, digəri 34 səhifədir. (interval fərqinə görə səhifələr belə alınıb).

Bu variantda digərlərindən seçilən nöqtələr vardır:

1. Variantda Toqat paşasının adı Həsən, qızının adı isə Nərgizdir.

2. Keçəl Həmzə sübh tezdən Çardaxlı Çənlibeldə gəlib dəllək Əhmədin qapısına yetişir.

3. Qapıdan bir şəxs bayıra çıxır. Qarabaşlar deyir: Pəricahan xanım bu gün nə tez eşiyə çıxıb. Məsələ burasında idi ki, Pəricahan xanım həmişə dəlilərlə davaya getdiyi zaman geydiyi kişi paltarında eşiyə çıxmışdı. Keçəl Həmzə isə qarabaşların dediyini eşitmişdi.

4. Pəricahan xanım Keçəl Həmzəni gördükdə bərk əsəbiləşir ki, sabah-sabah camaatın qabağına güzgü-daraq çıxanda, bunun da qabağına belə bir pis sifət çıxır.

5. Keçəl Həmzə yalvarır ki, xanım, məni öldürmə. Pəricahan daha da hirslənir ki, mən kişi ola-ola niyə xanım deyirsən. Keçəl Həmzə deyir: – Xanım, qoy bir-iki kəlmə söz deyim, istəyirsən sonra öldür:

Öldürürsən, xanım, gəl məni öldür,
Öldürməynən, ağam, əlin qurbanı.
Ya hurisən, ya pərisən, ya mələk,
Xoş ixtilat, şirin dilin qurbanı.

Nədir qoynundakı o yumru-yumru,
Ört üstün görməsin cahili-cumru,
Gülşəndə nalə çəkir tutiyi-qumru,
Mən bülbüləm, qızılgülün qurbanı.

Humayın köynəkdə o zülfi narış,
Qədəmin basginən bir kəlmə danış,
Sinəsi döşəkdi, məməsi balış,
Ayna qabax, cığa telin qurbanı.

Mən Həmzəyəm, yaxşı keçmədi halım,
Kəs başım tökülsün məhlənə qanım,
Can sənə qurbandı Pəricahan xanım,
Gümüş kəmər, nazik belin qurbanı.

6. Pəricahan xanım Keçəl Həmzənin bu sayaq oxumasından xoşhal olur. Onu evlərində saxlayır və həkim çağırtdırıb başının keçəlini sağaltdırır.

7. Həmzə Koroğlunu görmək arzusunda olduğunu Pəricahana bildirir. O da Koroğlunu necə görməyi Həmzəyə başa salır.

8. Aradan bir müddət keçəndən sonra Keçəl Həmzə Koroğlunun Pərica-hangilin qapısı yanından keçdiyini görüb onun ayaqlarına döşənir və yalvarır ki, qovmayıb qapı-bacasında elə süpürgəçi saxlasın.

9. Keçəl Həmzə bir müddət süpürgəçilik edir. Sonra da Koroğlu deyir ki, səni mehtər qoyacağam.

Variantdakı hadislərin bundan sonrakı inkişafı az fərqlərlə korpusa daxil edilmiş qolla səsləşir.

Əlyazması. İnv. №722 (b)
"Həmzənin gəlişi"

Söyləyəni *Aşıq Teymur* (Aşıq Teymur Hüseynov 1895-ci ildə Şəmkir rayonunun Morul kəndində doğulub. 1916-cı ildən aşıqlığa başlamışdır. 1980-ci ildə vəfat etmişdir). Digər pasport məlumatı yoxdur. Latın əlifbasında makinada yazılmış bu variantın ortadan və sondan səhifələri düşüb. Qalan vərəqlərin sayı 18-dir.

1. Dəlilər çilingağac oyunu oynadığı vaxt Keçəl Həmzə gəlib Çənlibelə çatır. İsabalı onu tutub Bəlli Əhmədə tərəf atır. Bəlli Əhməd Ərəboğlunun, o da Burun Əhmədin, Burun Əhməd də xan Eyvazın ütsünə tullayır. Xan Eyvaz da nəhayət Həmzəni Koroğlunun üstünə atır.

2. Koroğlu görür ki, bu bir keçəldir. Həmzə gözlərini açıb Koroğluya yalvarır ki, onu qapısından qovmasın.

3. Dəlilər, Nigar xanım Koroğluya deyirlər ki, bu düz adama oxşamır. Olsun ki, paşalar, bəylər onu Çənlibelə bələdçiliyə göndəriblər.

4. Koroğlu Həmzədən haralı olduğunu soruşur, o da deyir ki, Qaf əhliyəm, İrandan gəlmişəm.

5. Koroğlu Nigarı Keçəl Həmzəyə göstərib deyir ki, bu xanıma söz qoşa bilsən səni burada saxlaram. Həmzə üzünü Nigara tutub deiyr:

Qaşdarıyın tayı yoxdu cahanda,
Açılıb köysündə qar sinən üstə.
Belin nazik, qəddin uca, üzün gül,
Zənəxdanda düşüb xal sinən üstə.

Xanım, qoynundakı bu nədi yumru?
Üstün ört görməsin cahili-cumru,
Hüsnün Züleyxadı, zəbanın qumru,
Yetişibdi bir cüt nar sinən üstə.

Həmzə qoy qul olsun yanında, xanım!
Heç insafın varmı sənin də, xanım!
Koroğlu əyləşib, yanında xanım,
Əmir ləblərindən bal sinən üstə.

6. Koroğlu Keçəl Həmzəni Çənlibeldə saxlayır.

Variantda bundan sonrakı hadisələrin necə inkişaf etdiyi bəlli deyil. Çünki səhifələr yoxdur.

Digər variantlarda olmayan bir maraqlı epizod da burada diqqəti cəlb edir.

1. Koroğlu Toqatdan Qıratı qaytarır. Gəlib Çənlibeldə bir qədər aralı bulaq başına düşür. Bu vaxt bir atlı gəlib buraya çıxır. Onun kimliyini soruşur. Həmin kimsə deyir ki, Ərzurumdan gəlib Toqata gedirəm. Eşitmişəm ki, Koroğlunun atını Toqata qaçırıblar. Namusum qəbul eləmir ki, xanlardan, paşalardan yoxsulların hayfını alan bir adamın atı namərdlər əlində qalsın. Gedirəm ki, bir xəbər öyrənim gəlib Koroğluya deyim. Bu söz Koroğluya çox xoş gəlir və deyir:

Ərzurumdan gələn oğlan,
Vətənnən xəbərin varmı?
Üç gün Qırat qüssəsinnən
Yatannan xəbərin varmı?

Gördüm düşmən savaşını,
Yedim aşın, lavaşını,
Toqatda Qırat başını,
Tutannan xəbərin varmı?

Koroğlu deyərlər bizə,
Müjdə xəbər olsun sizə,
Qıratı aparıb bir qıza
Satannan xəbərin varmı?

2. Atlı Koroğlunu tanıyıb çox şad olur. Koroğlu da ona yaxşı xərclik verib geri qayıdır.

Əlyazması. №722 (v)
"Koroğlunun Qıratının aparılması"

Söyləyəni *Aşıq Əsəddir*. Başqa pasport məlumatı yoxdur. Latın əlifbasında makinada yazılıb. 49 səhifədir.

1. Xotkar paşalara ya Koroğlunun özünü, ya da Qıratını tutub gətirməyi əmr edir. Xotkarın əmri Toqatda Həsən paşaya çatan kimi, o, Ərzurumdan Cəfər paşanı, Trabzondan Gülbəngi paşanı, Vannı Mahmud paşanı yanına çağırır. Uzun məşvərətdən, məsləhətdən sonra Keçəl Həmzə Qıratı gətirmək üçün Çənlibelə yola düşür.

2. Bu variantda Həsən paşanın Keçəl Həmzəyə boyun olduğu qızının adı Telli xanımdı.

Yenə də başqa variantlardan fərqli olaraq burada Keçəl Həmzə Çənlibelə sübh tezdən çatanda Dəli Mehtərlə rastlaşır. Dəli Mehtər onu düşmən adı ilə öldürmək istəyir. Koroğlu gəlib Həmzəni ölümdən xilas edir. Bundan sonrakı hadisələr azacıq fərqlə korpusdakı tərzdə inkişaf edir.

2. Bu variantda Koroğlu Qıratın arxasınca gedəndə qarının evinə yox, sübh tezdən Toqatın baş meydanına gəlib çıxır. Adamlar tez qaçıb naməlum bir kimsənin şəhərdə olduğunu paşaya xəbər verirlər. O da adam göndərib Koroğlunu məclisinə çağırtdırır.

3. Koroğlu məclisdə özünü İranlı kimi təqdim edir.

4. Bu variantda "Çənlibeldən səni deyib gəlmişəm" misrası ilə kitabdan-kitaba düşən şeir belədir:

Çənlibeldən səni deyib gəlmişəm,
Ömrümünən bəslədiyim Qırat, gəl.
Haqq tanıyıb, peyğəmbəri bilmişəm,
Ömrümünən bəslədiyim Qırat, gəl.

Məni görüb atım-atım atılı,
Qırğı qulaq bir-birinə çatılı,
Ucuzluqda min qızıla satılı,
Bahalıqda yox qiyməti Qırat, gəl.

Koroğlu der paşa bilməz halını,
Əşrəfidən kəsdirəcəm nalını,
Üç gözələ toxutduracam çulunu,
Alma gözlü, qız birçəkli Qırat gəl.

5. Koroğlu paşa məclisindən gəlib Qıratı saxlandığı yerdən bayıra çıxaranda üzəngini basan Keçəl Həmzədən on iki qala hasarının beş və üç qat olan hissələrini öyrənir.

6. Koroğlu Qıratı meydanda dolandırıb paşaların qarşısında oxuyur:

Bir qasiddən xəbər aldım,
Beşdi qalanın yolları.
Hayqırsam tüplər dağılı,
Boşdu qalanın yolları.

Kamandar atar oxunu,
Al eylədim mən çoxunu,
Qırat tökər nal-mıxını,
Daşdı qalanın yolları.

Koroğlu deməz yalanı,
Hayqırsam ölkən talanı,
Leş-leşin üstə qalanı,
Leşdi qalanın yolları.

7. Koroğlu qalanın beş qatlı olan yerindən Qıratı sıçradır və Dona çayını üzüb keçir. Sonra üzünü Həsən paşaya tutub deyir:

Çox da laf eyləmə, ay Həsən paşa,
Mənim ağır-ağır ellərim vardı.
Əlimə keçəni bağlaram daşa,
Mənim yüz sən kimi qullarım vardı.

Aşıq gətir bu dastanı yazmağa,
Misri qılınc düşmən başın əzməyə,
Qırat bir qəvvasdı dərya üzməyə,
Neçə Dona kimi göllərim vardı.

Koroğluyam bu dünyaya gəlmişəm,
Nə gün yaranmışam, özüm bilmişəm,
Laf eyləmə, öz atımı minmişəm,
Mənim yüz belə fənd, fellərim vardı.

8. Koroğlu Qıratı Çənlibelə gətirib şadlıq məclisi qurur.

9. Məclisdə Nigar Koroğluya qara olduğunu söyləyir. Bu epizod korpusa daxil olan, eləcə də indiyədək çap olunmamış və çap olunmuş variantlardan seçilir.

Koroğlu Nigarın sözü qarşısında deyir:

Mənə qara deyən gözəl,
Qaşların qara deyilmi?
Dal gərdəninə saldığın
Saçların qara deyilmi

Bu sözlərdən Nigar xanım dedi:

– Ay Koroğlu, saçnan qaşın qara olması təbiətin özündəndir. Özü qara yaradıb gözəllikdən ötrü. Amma sənin özün, yəni rəngin qaradı.

Koroğlu fikirləşdi ki, düzdü və dedi:

– Xanım düzdü, amma mənim irəngimdən artıq qara çox şey var, deyim sənə. Aldı Koroğlu:

Açılıb haqqın eşiyi,
Aləmə düşüb işığı,
Həsən, Hüseynin beşiyi,
Örtüyü qara deyilmi?

Nigar xanım bir də gülüb dedi:

– Koroğlu, uşaqsan. Özü də yaranmış. Amma üzünün qaralığını aparıb Hüseynin beşiyinin qaralığına oxşadırsan.

Koroğlu gördü bu da düzdü. Dedi:

– Xanım, dünyada elə qara şey var ki, aləm ona baş əyir. İstəsən onu deyim. Aldı Koroğlu:

Qalxıbdı haqqın aləmi,
Yerə yendirdi salamı,
Quranda Allah kəlamı,
Yazısı qara deyilmi?

Nigar xanım dedi:

– Ay Koroğlu, yenə səhv danışdın, çünki sən özün yaranmış, amma özünün qaralığını Qurandakı Allah kəlamına tay edirsən. Sən özünnən danış. Neynirsən özgə yeri axtarıb bulursan.

Koroğlu gördü düz deyir. Geri qayıdıb baxanda gördü ki, doğrudan da bu gözəldi. Amma gözlərinə qondarma sürmə çəkibdi lap gözəl olsun. Aldı Koroğlu:

Çənlibeldə qurdum binə,
Bənzəyirsən aynan günə,
Ağ üzündə dənə-dənə,
Xalların qara deyilmi?

– Koroğlu, xalı da mənə Allah verib, o da gözəlliyinin ziynətidir.

Koroğlu gördü ki, bu da düzdü, amma qondarma bircə bu sürmədi. Alıd Koroğlu:

Koroğlu mayıldı sizə,
Sən qulaq as saza, sözə,
Siyah sürmə, ala gözə,
Çəkibsən qara deyilmi?

Söz qurtaran kimi Nigar dedi:

– Düzdü, Koroğlu, özüm qəsdən bu sürməni çəkmişdim ki, daha da məni gözəl görkəzsin. İndi ki sən onu tapdın, mən də onu silirəm.

Əlyazması. İnv. №722 (q)
"Toqat səfəri"

Pasport məlumatı yoxdur. Latın əlifbası ilə makinada yazılıb, 32 səhifədir.

Bu variantda da hadisələr, digərlərində olduğu tək, çox az fərqlərlə cərəyan edir.

1. "Təzə sövdəgar olubsan" misrası ilə başlanan şerin burada belə bir bəndi də vardır:

Dəyirmanda nə çox qaldın,
Canını odlara saldın,
Qırı verdin, Duru aldın,
Soydan da mübarək oslun!

2. "Allahı çağırıb düşərəm yola" misrası ilə başlanan qoşmanın burada digər variantlarda olmayan belə bir bəndi də vardır:

Cannan keçdim mən Qıratın yolunda,
Qırat ağlar indi düşmən əlində,
Axtarıb tapmasam Toqat elində,
Dağıtmamış şəhər, qala qoymaram.

Bu variantda Koroğlu "Haralısan" sualına "Qafın o tayındanam" – deyə cavab verir. Bu variantda "Bizim təkənin bəyləri" misrası ilə başlanan şerin birinci bəndindəki son misra belədir: "Ağzı qanlı, boz qurd olu."

Əlyazması. İnv. №1014
"Gürcüstan səfəri"

Söyləyəni *Aşıq Behbud Əsəd oğlu Haşımov* (qolu 70 yaşı olanda söyləyib), əsli Qonaqkənd rayonundandır. Sonra Quba rayonunun Aşağı Xuc kəndinə köçüb. El aşığı olub. Əkinçiliyi özünə peşə seçib. Toplayanları *Teymurxanlı* və *Əhməd Çələbizadə*, Qubada 1936-cı ildə toplanılıb. Latın əlifbası ilə makina yazısı, iki nüsxə, 11 səhifədir.

Bu qolun orijinallığını nəzərə alıb onu müfəssəl nəzərə çatdırırıq.

1. Koroğlunun Cünun adlı bir aşığı var. Bu aşıq hər yeri gəzib dolaşır. Harda bir igid, bir gözəl görürdüsə Koroğluya xəbər verir. Koroğlu da gedib onları gətirir. Bu minvalla 7 min dəli Çənlibelə yığışır.

2. Cünun gəlib Gürcüstana çıxır. Burada Hürü xanım adlı bir qız var. O, Bolu bəyin göbəkkəsmə nişanlısıdır.

3. Hürü xanım, Koroğlu barədə, onun igidliyi haqqında çox eşitdiyindən Cünunun Gürcüstana gəldiyini bilib öz yanına apartdırır və Koroğlunun necə adam olmasını aşıqdan soruşur. Cünun deyir:

Qəflə bəzirganlar Hinddən, Misirdən,
Gətirər baftasın, şalın Koroğlu.
Zər, zərbaf geyinər yaşılnan, alnan,
Geyər hər vaxt al-qumaşı Koroğlu.

Görənlər adına ər deyərlər, ər,
Qovğa günü olar o əsrəmiş nər.
Xotkar qorxu çəkər, dağ-daş titrədər,
Yeddi min dəlinin başı Koroğlu.

Nə müddətdir yollarını basdırır,
Qanlı oxlar qansırğadan asdırır,
Hər nahara beş yüz quzu kəsdirir,
Dağıdır pılovu, aşı Koroğlu.

Cünun aşıq bu dünyanı gəzməsə,
Beş namazını əda qılmasa,
Harda gözəl görsə çəkib almasa,
Yıxar ol vaxt dağı-daşı Koroğlu.

4. Bolu bəy Hürüyə sifariş göndərir ki, toy etməyə hazırlaşır. Əmisi qızının könlü nə istəyirsə buyursun. Hürü cavab verir ki, sən ancaq mənəm-mənəm deyib Gürcüstanda gəzirsən. Ya Koroğlunun başını gətir, ya da məndən əl çək.

5. Bolu qoşun çəkib Koroğlunun üstünə gedir.

6. Koroğlu Daşqalada qaravulda olduğu zaman böyük bir qoşun görüb təəccüblənir. Əvvəl istəyir dəliləri xəbərdar etsin. Sonra fikirləşir ki, dəlilər elə bilər Koroğlu qorxusundan düşmənlə üzləşməyib bizi köməyə çağırır. Odur ki, paltarını dəyişib dilənçi qoca sifətində qoşunun içərisinə gəlir.

7. Qabaqlar Koroğlunun yanında olan Mehtər onu tanıyır. Bolu bəyə bunun Koroğlu olduğunu bildirir. Bolu əvvəl inanmır. Təkiddən sonra Koroğlunun qollarını bağlatdırır. İşi belə görən Koroğlu deyir:

Aman Bolu, mənə zülüm eyləmə,
Vallah Bolu, mən Koroğlu deyiləm.
Nahaq mənim üçün ölüm eyləmə,
Ağa Bolu, mən Koroğlu deyiləm.

Koroğluynan düz yeddi min dəli var,
Əyrimçədən keçən işkə beli var,
Qəhrəman tək ağır qolu, əli var,
Vallah Bolu, mən Koroğlu deyiləm.

Koroğlunun bir atı var coşandı,
Mənzilimiz Ərdəbildən keçəndi,
Gəl and içim mənim adım Rövşəndi,
Vallah Bolu, mən Koroğlu deyiləm.

8. Bolu Koroğlunun sözünə inanıb onun qollarını açdırır və Çənlibelə göndərir ki, Koroğludan bir xəbər gətirsin.

9. Koroğlu Çənlibelə gəlib əhvalatı dəlilərə bildirib deyir:

Tez atdanın, qoçaqlarım, atdanın,
Döyüş günü budu gəldi, ha gəldi.
Dörd tərəfdən tutun qılınc, qalxanı,
Savaş günü budu gəldi, ha gəldi.

10. Koroğlu dəlilərlə Bolu bəyin qoşununa hücum edir. Qoşun məğlub olur. Bolu bəyi öldürmək istərkən o yalvarıb deyir ki, mən əmim qızı Hürünü istəyirəm, vermirlər. Səni köməyə aparmağa gəlmişəm.

11. Dəlilərin etirazına baxmayaraq Koroğlu Boluya inanıb onunla Gürcüstana yollanır. Yolda Bolu Koroğlunu yaralayıb qollarını bağladır.

12. Qolu bağlı aparılan Koroğlu bir bəzirgan dostuna rast gəlib belə deyir:

Pünhanı sövdəgar qardaş,
Aparırlar pünhan məni.
Ərənlərə qurban olum,
Aparırlar pünhan məni.

Adımı qoydular yava,
Dərdimə bir yazın dava,
Dilimnən Eyvaza duva,
Aparırlar pünhan məni.

Koroğluyam tək qalmışam,
Qollarımı bağlatmışam,
Bəlkə mən dəli olmuşam
Aparırlar pünhan məni.

13. Sövdəgarlar əvvəl elə bilirlər ki, Koroğlu dəli olub, pirə aparırlar. Eyvazın adı çəkiləndə başa düşürlər ki, o, dara düşüb. Odur ki, Çənlibelə xəbər çatdırmağa tələsirlər.

14. Bolu Koroğlunu Gürcüstana gətirir. Gürcüstan paşaları yığılıb deyirlər ki, Koroğlu çox keflər çəkib, indi quyuya salaq ki, yeyib-içdiyi burnundan gəlsin.

15. Əhvalatı bilən Hürü xanım Koroğlu salınmış quyunun başına gəlir. Koroğlu ilə onun arasında belə bir deyişmə olur:

Koroğlu:

Gəlhagəl iyid qızı,
Gəlincə gözlərəm səni,
Sabah çıxan dan ulduzu,
Çıxınca gözlərəm səni.

Hürü:

Xoş gəlmişsən mənim ağam,
Doğru söylə sən Koroğlu.
Səni aparsam otağa,
Doğru söylə sən Koroğlu.

Koroğlu:

Qəbrimi qaz qatı-qatı,
Üstündə bəzət Qıratı.
Axır bir gün qiyaməti,
Olunca gözlərəm səni.

Hürü:

Koroğlunun yarı göyçək,
Ağ üzünə töküb birçək,
Sirri söyləginən gerçək,
Düzün söylə sən Koroğlu.

16. Hürü xanım qızların köməyilə uzun saçlarını quyuya sallayır. Koroğlu onun hörüklərindən tutub quyudan çıxır və Hürü xanımın otağına gəlir.

17. Sövdəgar Çənlibelə xəbər gətirən tək Eyvaz Qırata ox, yay yükləyir, özü isə Ərəbatı minib Gürcüstana yola düşür. O gəlib Hürü olan imarətin qabağına çatıb Koroğlunu soruşur. Bunu eşidən Koroğlu deyir:

Şükür olsun o Allaha,
Bu gələn Eyvaz səsidi.
Məni yadına salıbdı,
Bu gələn sərdar səsidi.

Qapıda durub xan kimi,
Gözləri dolub qan kimi,
Bir alıcı aslan kimi
Bu gələn aslan səsidi.

Yoldan tutarlar oğrunu,
Gətirərlər qol bağlını,
Yada salıb Koroğlunu
Bu gələn Eyvaz səsidi.

18. Eyvazı içəri aparırlar. Koroğlu Hürü xanıma deyir ki, hazırlaş getmək vaxtıdır. Hürü geyinir, Koroğlu onun uzun hörüklərini görüb deyir:

Hörüm-hörüm çox da qalxma havaya,
Hürü, tellərin başına bəladı.
Axır səni uğradar o zavala,
Hürü, tellərin başına bəladı.

Adətdi ki, toya gedən bəzənər,
Əyri telə sığal versən düzələr,
Bu gözəllik sənə bir ad qazanar,
Hürü, tellərin başına bəladı.

Durna gedər olsa Bağdad elinə,
Görsəm əlimi çatdırram əlinə,
Qoç Koroğlu qurban şirin dilinə,
Hürü, tellərin başına bəladı.

19. Eyvaz Ərəbatı çəkib Hürünü tərkinə alır, Koroğlu da Qıratı minib Çənlibelə üz qoyurlar. Yolda onlar Bolu ilə qarşılaşırlar. Koroğlu onu qılınclayır. Çənlibelə çatanda dəlilər Koroğlunun arxasınca getmədikləri üçün xəcalət çəkirlər. Koroğlu üzünü dəlilərə, xanımlara tutub deyir:

Eyvaz xana bu gəlini gətirdim,
Başlayın toyunu ta mən gəlincə,
Təflikçi göndərin Uruma, Şama,
Başlayın toyunu ta mən gəlincə.

Mən qurbanam Eyvazın şux boyuna,
Hamı sazəndələr gəlsin toyuna,
Yüz top zərbaf ölçün Eyvaz boyuna,
Biçsin dərzilərim ta mən gəlincə.

Çənlibeldə Koroğlu 40 gün toy çaldırıb Hürünü Eyvaza alır.

Əlyazması. İnv. №721
"Bağdad səfəri"

Latın əlifbası ilə əlyazması, 29 səhifə. Söyləyəni *Aşıq Hüseyn Bozalqanlı*, toplayanı *Əliheydər Tahirov*, Tovuz rayonu, 26 oktyabr 1937-ci il. Eyni əlyazmanın latın əlifbası ilə makina yazısı: 23 səhifə.

Bu variant korpusa daxil edilən və digər variantlardan bəzi cəhətlərlə fərqlənir.

1. Eyvaz Ərəb Reyhanın bacısı oğludur. Koroğlu Eyvazı gətirəndə Ərəb Reyhan əvvəl bacısı oğlunu onun əlindən almaq istəyir, sonra fikrindən daşınır.

2. Koroğlu Eyvazı özünə oğul gətirdiyi üçün Eyvaz da ona həmişə ata deyir.

3. Dəmirçioğlunun bağda yatan Eyvazı oyadarkən oxuduğu gəraylı korpusdakı və digər variantlardakı nümunələrdən seçilir:

Hər yannan qoşun yüyürür,
Oyan, xan Eyvazım, oyan.
Dörd ətrafımızı bürüyüb,
Oyan, xan Eyvazım, oyan.

Yoxdu bu qoşunun sanı,
Paşalar verir fərmanı,
Sel kimi tökərəm qanı,
Oyan, xan Eyvazım, oyan.

Dəmirçioğlu deyir sözlər,
Düşməndi dərələr, düzlər,
Nigar xanım yolun gözlər,
Oyan, xan Eyvazım, oyan.

4. Koroğlu Çənlibeldə Eyvazgilin yolun gözləyir. Vədə vaxtına onlar qayıtmır. Narahatlıq keçirən Koroğlu, digər variantlarda olmayan, bir gəraylı üstündə oxuyur:

Eyvazı göndərdim Şama,
Eyvaz əyləndi, gəlmədi.
Vədə vermişdi axşama,
Eyvaz əyləndi, gəlmədi.

Arazın qırağı sazdı,
İçindəki quba qazdı,
Düşmən çoxdu, dəllər azdı,
Eyvaz əyləndi, gəlmədi.

Səninçün bəslədim güllər,
Çəkildi gözümə millər,
Koroğlu, başına küllər,
Oğlum əyləndi, gəlmədi.

5. Eyvaz, Dəmirçioğlu, Bəlli Əhmədin tutulması xəbərini Çənlibelə – Koroğluya bəzirgan Xoca Əziz gətirir. O deyir:

Çənlibeldə nə yatırsan, Koroğlu,
Sənin dəlilərdən xəbərin varmı?
Bu dərdi-qəmini mənə satırsan
Gedən dəlilərdən xəbərin varmı?

Düşmənin üstündən yel tək əsəndi,
Ağır halay pozub, ordu basandı,
Eyvaz, Bəlli Əhməd, Dəli Həsəndi,
Sənin dəlilərdən xəbərin varmı?

Xoca Əziz qaldı qəmin qəhrində,
Ay, gün olmaz xan Eyvazın təhrində,
Qolu bağlı gördüm Bağdad şəhrində,
Gedən dəlilərdən xəbərin varmı?

6. Koroğlu dəliləri azad etmək üçün aşıq paltarında Bağdada gəlir.

7. Koroğlu dəliləri asmaq üçün Bağdada toplanmış paşaların, sədri-əzəmin hüzurunda çalıb oxuyur. Məclisi yaxşı keçirsin deyə, aşpaz onu aşpazxanaya aparır. Koroğlu çoxlu şərab içir, qoşunun yarısının payını yeyir. Aşpazın narazılığını görən Koroğlu onu öldürür. Koroğlu ikinci aşpazla da belə rəftar edir. Xəbər paşaya çatır. Paşa bildirir ki, eybi yoxdur, başımız açılanda ona tənbeh edərik.

Variantdakı sonrakı hadisələr korpusa daxil edilmiş qoldakı tək cərəyan edir.

8. Giziroğlu Mustafa bəy Koroğlunun qarşısını kəsir, onu vurub atdan salır: dizini sinəsinə dayayır. Koroğlu kədərlənir, gözləri yaşarır. Giziroğluya deyir ki, övladım, özümdən sonra yerimdə qalanım olmadığı üçün ağlayıram. Giziroğlu onu bağışlayır. Koroğluya deyir ki, məni yarala, gedim dəlilərimə deyim ki, güc gələ bilmədim, basıldım. Koroğlu onu yüngülcə yaralayır.

Variantdakı sonrakı epizod korpusdakı və digər variantdakının eynidir.

## Əlyazması. İnv. №721

Latın əlifbasında göy mürəkkəblə yazılmış 15 vərəqdən ibarət şagird dəftəri. Pasport məlumatı yoxdur. Əlyazmasının sonunda “Hüseynov Əhməd” yazılmışdır. Qol başlıqsızdır.

1. Bu varianta görə dəlilərin tutulma xəbərini bəzirgan gətirməmişdən qabaq Koroğlu yuxuda görür ki, Eyvaz qanlı köynək içindədir və hövlnak qalxıb “Xəbər verin dəlilərim oyansın” misrası ilə başlanan qoşmanı burada oxuyur.

2. Koroğlu qoca biçinçinin məsləhəti ilə şəhərə girmək üçün dəliləri dəstələrə bölür, sonra da onlara üz tutub deyir:

Dəlilərim, nə edəlim,
Yığılıb tədbir tökəlim,
Eyvaza kömək gedəlim,
Dörd bir yana, beş bir yana.

Tədbiri tökmüş biçinçi,
Dür dəhanından al inci,
Çəkəndə Misri qılıncı,
Baş bir yana, leş bir yana.

Hər nə oldu mənə oldu,
Peymanım qan ilə doldu,
Gördün ki, düşmən güc gəldi,
Al Eyvazı qaç bir yana.

3. Giziroğlu Alapaça atını minib Koroğlunun arxasınca gəlir. Alapaçanın hənirtisindən Qıratın əl-ayağı tutulur, yerindən tərpənə bilmir.

4. Giziroğlu Koroğlunu yıxıb dizini onun sinəsinə dayayanda Koroğlu ah çəkir. Giziroğlu deyir ki, igid ölüm üçün ah çəkməz. Koroğlu cavabında bildirir ki, mən ölümüm üçün düşünmürəm. Onun üçün ah çəkdim ki, mən ölsəm dəlilər başsız qalacaq, onlar dağılıb gedəcək, daha paşalara, xanlara divan tutan olmayacaq.

Giziroğlu Koroğlunu bağışlayır. Koroğluya deyir ki, məni yarala. Koroğlu bunu etmir.

Bu variantın da sonu digərləri ilə eynidir.

Əlyazması. İnv. №721

Latın əlifbası ilə makina yazısı, 72 səhifə, əvvəldən səhifələr düşüb. Ola bilsin ki, bu səbəbdən də pasport məlumatı aradan gedib.

1. Bu əlyazmasına görə durna teli üçün Eyvaz və Dəmirçioğluyla Bəlli Əhməd yox, İsabalı gedir.

2. Dəlilərin vaxtında qayıdıb gəlmədiyini görən Koroğlu narahat və pərişan olub belə oxuyur:

Göndərdim durna telinə,
Eyvaz əyləndi, gəlmədi.
Keçibdi düşmən əlinə,
Eyvaz əyləndi, gəlmədi.

Dəryanın qırağı sazdı,
Oxuyanlar quba qazdı,
Düşmən çoxdu, Eyvaz azdı,
Eyvaz əyləndi, gəlmədi.

Bilməmişəm gedib Şama,
Qılıncından qanlar dama,
Məni saldı dərdə, qəmə,
Eyvaz əyləndi, gəlmədi.

Eyvaza bitirdim güllər,
Oxuyur şeyda bülbüllər,
Koroğlu, başına küllər,
Eyvaz əyləndi, gəlmədi.

3. Bağdaddan dəlilərin tutulma xəbərini Çənlibelə gətirən Xoca Əziz Koroğluya deyir:

Gəl sənə söyləyim, ay qoç Koroğlu,
Sənin Eyvazından xəbərin varmı?
Seçilibdi adı bəlli igidlər,
Sənin Eyvazından xəbərin varmı?

Şahin kimi qənim üstə əsəndi,
Qanlı başı qansırğadan asandı,
Gedən İsabalı, Dəli Həsəndi,
Sənin iyidlərdən xəbərin varmı?

Xoca Əziz xocaların qəhrində,
Gül görmədim xan Eyvazın təhrində,
Qolu bağlı gördüm Bağdad şəhrində,
Sənin iyidlərdən xəbərin varmı?

4. Koroğlunun Bağdadda dəlilərə üz tutub oxuduğu “Uca-uca dağ başında” misrası ilə başlanan şeir bu variantda Çənlibeldə deyilir.

5. Bağdad səfərinə yola düşülən anda Nigar ilə Telli xanım irəli çıxıb Halaypozanı, Tüpdağıdanı, Çopur Mehdini, Kosa Səfəri, Bəlli Əhmədi kənara çəkir və onlara tapışrırlar ki, ya uşaqları buraya salamat gətirin, ya da ki, özünüz də qayıtmayın. Bunu eşidən Koroğlu üzünü Nigara tutub deyir:

Ala gözlü, telli Nigar,
Ağlama, Nigar, ağlama.
Bu gün çataram Eyvaza,
Ağlama, Nigar, ağlama.

Xan Eyvazım gül parçası,
İsabalı iyidlər xası,
Ucalsın dəlilərin səsi,
Ağlama, Nigar, ağlama.

Sənin mətləbin götürrəm,
Bu gün Bağdada yetirrəm,
Xan Eyvazı sağ gətirrəm,
Ağlama, Nigar, ağlama.

Sorma Koroğludan halı,
Soldurmaynan gül camalı,
Dəmirçioğlu, İsabalı,
Ağlama, Nigar, ağlama.

6. Bağdadda paşa məclisində aşıq paltarında oxuyan Koroğlu özünü iranlı kimi təqdim edir. İranın hansı kəndindən olduğunu paşa soruşduqda Koroğlu cavab verir ki:

Paşa, bizə Muradbəyli deyərlər,
Həmşə aralıqda mərdlik işləni.
Elimizdən qoçaq oğlanlar törər
Düşmənin gözünə biri beşləni.

Koroğlu sədri-əzəmlə də söhbət edir. Məlum olur ki, o da Muradbəylidəndir. Hələ uşaqlıqda Koroğlu ona bir sillə vurubmuş. O da qorxusundan qaçmış, indi gəlib sədri-əzəm olmuşdur. Koroğlu deyir:

Ağır-ağır bəylərim var,
Qırat keçməz çaylarım var,
Yeddi min yüz dəllərim var,
İndi bura gəlsə dava başlanı.

Koroğluyam, uca dağda duraram,
Ağır-ağır bəzirganlar qıraram,
Gündə üç yol belə işki vuraram,
Hər işkidə min tümənim xərşləni.

7. Aslan paşa Koroğluya deyir ki, elə hey özündən dəm vurursan, oxuyanda çığırırsan. Bir az yavaşdan oxuya bilməzsənmi?

Koroğlu cavabında deyir:
Uca-uca dağ başında,
Yel kimi əsdiyin varmı?
On dörd, on beş atlı ilə,
Heç ordu basdığın varmı?

Bənövşə boynun əyəndə,
Müxənnət özün öyəndə,
Şəmşir qalxana dəyəndə
Yəhərdən düşdüyün varmı?

Koroğlu keçib canından,
Müxənnət ötməz yanından,
Ovcunla düşmən qanından,
Doldurub içdiyin varmı?

8. Koroğlunun dəlilərə üz tutub oxuduğu "Meydan üstünə" rədifli gəraylısının iki bəndi korpusa daxil edilmiş və digər variantlarındakılardan seçilir:

Hanı mənim dəlilərim,
Gələ girə bu meydana,
Şahin kimi döyüş edə,
Tökülə al qan üstünə.

Hayxır bədöylər kişnəsin,
Misri qılınclar işləsin,
Kimi tənab qılınclasın,
Kimi Eyvaz xan üstünə.

9. Əlyazmasına görə Giziroğlunun atası Gizir Koroğlunun atası Alı kişinin gözlərini çıxartmışdır. Koroğlu isə Giziri öldürüb atasının intiqamını almışdır. Bu səbəbdən də Koroğlu ilə Giziroğlu arasında düşmənçilik vardır.

10. Koroğlunun paşaya dediyi "Sandım" rədifli gəraylı korpusa daxil olan və digər variantlardakından seçilir:

Salam verdim, salam almaz,
Salam yerə düşdü sandım.
Paşanın, sədri-əzəmin
Rəngi üzdən qaçdı sandım.

Gətirsinlər içim bada,
Sədri-əzəm düşdü oda,
Xan Eyvazım gəldi yada,
Can qəfəsdən uçdu sandım.

Koroğludu tədbir yazan,
Eyvazı cəfaya dözən,
Sənə deyim Halaypozan,
Sədri-əzəm qaçdı sandım.

11. Əlyazmada Koroğlunun Giziroğlu Mustafa bəy haqqındakı tərifi də seçilir:

Şeşpərinin ucu qanlı,
İyidlər var dəmir donnu,
Bir iyiddi, addı, sannı,
Giziroğlu Mustafa bəy.

Bir atadan beş olaydım,
Beşinnən on beş olaydım,
Mən onnan qardaş olaydım,
Giziroğlu Mustafa bəy!

Alapaça haya təpər,
Hayxıranda huya təpər,
Koroğlunu çaya təpər,
Giziroğlu Mustafa bəy!

Əlyazması. İnv. №721
"Koroğlunun Bağdad səfəri"

Söyləyəni *Aşıq Abdulla*. Digər pasport məlumatı yoxdur. Latın əlifbasında makinada yazılıb. 8 səhifədir. Qol yarımçıqdır. Sondan səhifələr yoxdur.

1. Bu variantda Çənlibel xanımları Nigar, Telli, Məhbub xanımla yanaşı, Nəfisə xanımın da adı çəkilir.

2. Bağdada gələn Eyvaz, Dəmirçioğlu, Bəlli Əhməd çoxlu durna ovlayırlar. Durnaların tellərini yolub bir tərəfə, tüklərini də başqa bir tərəfə yığırlar.

3. Külək əsib durnaların tüklərini Bağdadın bütün xurma bağlarına yayır. Bir şəxs qaçıb Bağdad paşası Həsən paşaya xəbər verir ki, üç nəfər əcəm oğlu gəlib durnaları qırıb kökünü kəsdilər.

4. Dəmirçioğlu ilə Bəlli Əhməd nə qədər çalışırlarsa da, Eyvazı yuxudan oyada bilmirlər. Odur ki, davasız-döyüşsüz Həsən paşanın göndərdiyi qoşuna özlərini təslim edirlər.

5. Həsən paşa elə bilir ki, Dəmirçioğlu Koroğlunun özü, o biri iki nəfər də onun dəliləridir. Hər tərəfə xəbər göndərir ki, Koroğlunu tutmuşam. Kimin intiqamı var gəlib alsın. Ərzurumdan, Təbrizdən, Toqatdan, Gəlinbəgidən paşalar axışıb Bağdada gəlirlər. Paşalar belə qərar çıxarırlar ki, üç gün şadlıq məclisi qurulsun və üçüncü gün Koroğlu yoldaşları ilə dar ağacından asılsın.

6. Koroğlu ilə duz-çörək kəsmiş bir tacir Koroğlunu görmək üçün həbsxanaya gəlir. O, keşikçilərə bildirir ki, Koroğlu mənim düşmənimdir. Ondan intiqam almaq istəyirəm. Keşikçilər taciri içəri buraxırlar. O görür ki, tutulan Koroğlu özü yox, dəliləridir. Məsləhət-məşvərətdən sonra tacir gəlib bazarda Qıratı topal at adı ilə (Qırat bilərəkdən özünü axsaq göstərmişdi) çox ucuz qiymətə alır. Sonra otuz arşın ağ, beş girvənkə qır alıb Qıratın belinə sarıtdırır. Özünü də möhkəm-möhkəm Qıratın üstünə bağlatdırıb birbaş Çənlibelə gəlib əhvalatı Koroğluya bildirir.

7. Koroğlu 7777 dəlisi ilə Bağdada yola düşür. Şəhərin kənarında qoca biçinçi ilə rastlaşırlar. Ona buğdanı biçməkdə kömək edirlər. Qoca da şəhərə girməyin qaydasını onlara başa salır.

Variantda bundan sonrakı səhifələr olmadığından hadisələrin necə cərəyan etdiyi naməlum qalır.

### Əlyazması. İnv. №720 (b)
### "Aşıq Cünunun Eyvazın xəbərini gətirməsi, Eyvazın gəlməsi və Bağdad səfərinə getməsi"

(Variant haqqında arxada məlumat verilmişdir. Burada həmin variantda özünə yer tapmış yalnız "Bağdad səfəri"ndən danışılacaq).

1. Bu variantda Nigar yox, Telli xanım deyir ki, durna teli Eyvaza elə yaraşarsa, gör bizə necə yaraşar.

2. Bağdada durna teli gətirməyə Dəmirçioğlu, Eyvaz, İsabalı gedir.

3. Dəlilər Bağdadda Aslan paşanın 100 əl durnasının hamısını qırır, tellərini yolub atlarının tərkinə bağlayırlar. Özləri də durna ətindən yeyib şərab içir və yatırlar. Dəmirçioğlu yatmır. Bağban qaçıb paşaya durnaların hamısının öldürüldüyünü xəbər verir.

Paşa qoşununu bunların üstünə yeridir. Dəmirçioğlu qoşunu görüb yatmış Eyvazı oyatmaq üçün oxuyur:

Yağı düşmən dörd bir yanı alıbdı,
Əgər yatıbsansa, ayıl, Eyvazım!
. . . . . . . . . . . . . . . . . . . . . .
Olmuşam dərdinə qail, Eyvazım!

Qoşun gəldi dörd bir yanı bürüdü,
Cavan canım bu qürbətdə çürüdü,
Paşa hökm elədi, əskər yeridi,
Əgər yatıbsansa, ayıl, Eyvazım!

Bircə dinlə Dəmirçioğlu sözünü,
Şəmsi-qəmər kimi göstər üzünü,
Qoysan öpəm mən Qıratın gözünü,
Gün kimi aləmə yayıl, Eyvazım!

4. Eyvazın yuxudan oyanmadığını görən Dəmirçioğlu döyüşsüz təslim olur. Paşanın adamları onları qala qapısına gətirirlər.

Aslan paşa əmr edir ki, əvvəl Eyvazın, sonra da o birilərin boynunu vurun. Dəmirçioğlu bu halı görüb oxuyur:

Hanı mənim qoç Koroğlum,
Gələ girə bu meydana,
Çəkəndə "Allah-əkbər"in
Hərəniz qaça bir yana.

Yoxdu Eyvazın əlacı,
Koroğlu ala xəracı,
İşlətsə Misri qılıncı,
Meydanı boyayar qana.

Dəmirçioğlunu dindir,
Suçunu boynuma mindir,
Biz iki qoçağı öldür,
Paşam, qıyma Eyvaz xana!

5. Aslan paşanın sədri-əzəmi – baş vəziri məsləhət bilir ki, bu dəliləri indi yox, üç gün şadyanalıq edəndən sonra öldürmək gərəkdir. Paşa buna razı olur.

Başqa variantlarda olduğu tək, bu variantda da Xoca Əziz Qıratı alıb özünü onun üstünə sarıtdırır və dəlilərin tutulma xəbərini Çənlibelə gətirir.

6. Koroğlu görür ki, bütün dəlilər atlanıb düşmən üstünə gedir. Odur ki, o, Çənlibeli, xanımları Xoca Əzizə tapşırır.

Qolda sonrakı hadisələr başqa variantlardakılardan çox az seçilir.

## Əlyazması. İnv. №726 (3)
## "Koroğlunun vuruşu"

Söyləyəni *Aşıq Hüseyn Bozalqanlı*. Başqa pasport məlumatı yoxdur. Latın əlifbasında makinada yazılmış bu qol 11 səhifədir. Bu variantın daha üç

nüsxəsi vardır. Bunlardan ikisi "Koroğlunun vuruşması" (Bir nüsxədə "vuruşması" sözü pozulub qəhvəyi mürəkkəblə latın əlifbasıyla "və Türkman qızı" yazılıb) beş səhifədir. Variantın bir nüsxəsi də "Koroğlu və türkman qızı" adı daşıyır. 9 səhifədir. Mətnlərin hamısı eynidir.

1. Koroğlu Türkmənistana gəlir. Burada Məhbub xanım adlı bir qız alır. Qızın bir madyanı olur. Bu madyan da Qıratdan dölə qalır.

2. Digər variantlarda olduğu kimi, burada da Məhbub xanımın bir oğlu olur. Uşaq böyüyüb çox qüvvətli yeniyetmə olur. Ona "atasız" deyirlər. O, həqiqəti anasından öyrənir və Qıratdan törəyən atı minib Çənlibelə yola düşür.

3. Koroğlu Çənlibeldə ətrafı seyr edərkən görür ki, Qırxbulaq düzündə bir nəfər uzanıb yanında elə Qırata oxşayan bir at var. Koroğlu buraya gəlir. Oğlan özünü tanıtmır. Onlar güləşirlər. Oğlan Koroğlunu yıxır. Koroğlu hiylə işlədir. İkinci dəfə güləşəndə Koroğlu dəli nərə çəkir. Oğlan bu nərəyə aşiq olur, qolları süstləşir. Koroğlu fürsətdən istifadə edib onu yıxıb başını kəsir.

Koroğlu oğlanın qolunda arvadı Məhbub xanıma verdiyi bazubəndi görür və başa düşür ki, öldürdüyü öz oğludur.

4. Koroğlu oğlunu Çənlibeldə dəfn edir. Oğlunun atını isə tuta bilmir. At baş alıb gəldiyi yerə qaçır.

5. Koroğlu arvadına başsağlığı verməyə gedir. Yolda o, oğlunun intiqamını almağa gedən Məhbub xanımla qarşılaşır. Məhbub xanım kişi paltarında olduğundan Koroğlu onu tanımır. Koroğlu oğlunun atını bu naməlum kimsədə görüb almaq istəyir. Onlar vuruşurlar. Koroğlu naməlum şəxslə güləşib onu yıxanda bunun qadın – Məhbub xanım olduğunu bilir. Koroğlu əhvalatı Məhbub xanıma söyləyir və onu Çənlibelə aparmaq istəyir. Məhbub xanım yeddi ay oğluna yas saxlayacağını bildirir.

6. Məhbub xanımın oğluna yas saxladığı müddət qurtardıqdan sonra Koroğlu onu Çənlibelə aparır.

### Əlyazması. İnv. №720 (3)
### "Koroğlunun Dərbənd səfəri"

Latın əlifbasında makinada yazılmış iki nüsxə (19 səhifə) variantın heç bir pasport məlumatı yoxdur. Bu variant H.Əlizadənin 1941-ci ildə çap etdirdiyi qola oxşasa da, ondan seçilən nöqtələri çoxdur.

1. Qol Koroğlunun övladı olmaması məlumatı ilə başlayır.

2. Koroğlu Çənlibeldə, alagöz Nigar da yanında böyük məclis qurdurub şadlıq edir. Bu vaxt Dəli Həsən Çənlibel tərəflərinin adamlarına oxşamayan bir nəfəri məclisə gətirir. O, cibindən bir namə çıxarıb Koroğluya verir.

Koroğlu baxıb görür ki, bunu Dəmirqapı Dərbəndin paşası Ərəbpaşanın qızı Möminə xanım yazıb. İstəyir ki, Koroğlu gəlib onu alıb Çənlibelə aparsın. Koroğlu Nigar xanımın razılığı ilə Dərbəndə gəlir.

3. Dərbənddə Koroğlunu Ərəbpaşanın hüzuruna dəvət edirlər. O, kimliyini şeirlə bildirir.

4. Möminə xanımın Koroğludan olan oğlu çox nadinc olduğu üçün Ərəbpaşa onun adını Kürdoğlu qoyur.

5. Kürdoğlu korpusa daxil olmuş qolda, eləcə də digər variant və çap olunmuş qollarda Əhməd paşa, Cəfər paşa ilə qarşılaşır. Vuruşda onlara qalib gəlir. Bu variantda isə Cəfər paşa yoxdur. O, yalnız Əhməd paşa ilə qarşılaşır. Odur ki, "Gəl sənə söyləyim, ay Cəfər paşa" misrası bu variantda "Gəl sənə söyləyim, ay dəli paşa" şəklindədir. Elə bu qoşmanın möhürbəndində də "Adım Həsən, Koroğlunun oğluyam" misrası "Kürdoğluyam, Koroğlunun oğluyam" kimi deyilmişdir.

Variantdakı sonrakı hadisələr korpusa daxil olan qoldakılardan seçilmir.

Əlyazması. İnv. №726 (3)
"Koroğlu ilə Kürdoğlu"

Pasport məlumatı yoxdur. 15 səhifədir.

Kiril əlifbasında makinada yazılmış bu variant əvvəlkindən fərqlənmir.

Əlyazması. İnv. №725.
"Koroğlu. Qulun qaçması"

Latın əlifbası ilə makina yazısı, 10 səhifə. Sondan qol yarımçıqdır. Pasport məlumatı yoxdur.

1. Koroğlunun paşalara, ağalara divan tutub yoxsullara yardım etdiyini eşidən Ərəbistanlı bir qara qul Çənlibelə gəlir.

2. Koroğlu quldan dəlilərdən kimlərin adını bildiyini soruşduqda qul bu adları söyləyir: Halaypozan, Tüpdağıdan, Xaqanqıran, Dəli Mehtər, Dəli Tanrıtanımaz, Yatardurmaz, Tutarqoymaz, Kosa Səfər, Gürcüoğlu Məhəmməd, İsabalı, Dəmirçioğlu, Dəli Həsən, Xan Eyvaz, Bəlli Əhməd.

3. Koroğlu Dəmirçioğluya deyir ki, qulun bir biləyindən yapış. Əgər mən oxyanda onun qolları polad kimi bərkisə, deməli nəslində iyidlik var. Koroğlu oxuyur:

Qoç quzudan quzu törər qoç olu,
Qoç iyiddən qoçaq olar, sultanım,

Mərd iyidlər dava günü şad olu,
Müxənnətlər qaçaq olu, sultanım.

Mərd iyidlər bir-birinə daldadı,
Heç çuğul yatmayıb sağı-soldadı,
Mərd meydannan qaçmaz, qənimin aldadı,
Qayıdanda boz qurd olu, sultanım.

Sərçə nədi qaranquşa don biçə,
İyid odu dolu badələr içə,
Namərddə qaydadı davadan qaça,
Daldada pəhlivan olu, sultanım.

4. Dəmirçioğlu deyir ki, Koroğlu, sənin bu sözlərinin dəyəri yoxdur. Di gəl ki, qulun heç tükü də tərpənmədi.

5. Koroğlu qula deyir ik, get ocağın dibində otur, qazanın qazmağından ye, dolan. Sən dəlilərə qoşula bilməzsən. Qara qul çox yalvarır axır ki, dəlilərə qoşulmağa Koroğlunu razı salır.

6. Bu zamanlar Şah Abbasın dövrü olur. Şah Abbas bütün torpaqları, var-dövləti xanların, bəylərin arasında bölüşdürmüşdü. Koroğlu da bunların mal-mülkünü talayıb kasıb-kusubu dolandırır.

7. Koroğlu dəlilərlə, birlikdə Türkman tərəfə yollanır. Qara qul da onlarla gedir. Arada o, fürsət tapıb Koroğlunun atını, qılıncını, qalxanını oğurlayıb Ələmqulu bəyin yanına qaçır. Gətirdiklərini bəyə satır, özü də onun sərkarı olur.

8. Koroğlu mülkədarlardan mal-dövlət alıb geri qayıdır və bir yerdə dincələndə Bəlli Əhmədə deyir ki, bax gör adamlarımız hamısı burdadı. Bəlli Əhmədin bir şakəri var idi ki, həmişə qoşuna üç dəfə göz gəzdirməklə kimin olub-olmadığını söylərdi. İndi də baxıb cavab verir ki, Ərəbistanlı quldan başqa hamı burdadı. Koroğlu bunu eşitcək qəzəbli-qəzəbli deyir:

Bir qulum qaçıbdı Ərəbistana,
Arayın, axtarın, tapın gətirin!
Qolların dalınnan çatın təngbətəng,
Ərəbat köksünə qatın, gətirin!

Axtarın dünyanı vurun baş-başa,
Sözlərim eşidən tez gərək coşa,
Əyər qaçıb girsə dəlikli daşa,
Aparın Fərhadı çapın gətirin!

Kəsin ətrafları həmlə eyləyin,
Arayın hər yeri bir-bir eyləyin,
Cəm Ərəbistanı əsir eyləyin,
Səğrin kəbirinə qatın gətirin!

Qaçan qara qulun adı Murtuza,
Bilin ki, bu da bir xəbərdi sizə,
Varı-əhvalını çəkin Təbrizə,
Dəyər-dəyməzinə satın gətirin!

9. Dəmirçioğlu Dəli Həsən, Gürcüoğlu Məhəmməd, İsabalı Ərəbistanlı qulu axtarmağa gedirlər və gəlib Ələmqulu bəyin sığırları olan yerdə tapırlar.

10. Qara qul deyir ki, Koroğlunun atını Ələmqulu bəyə satmışam. Əvəzində iki at verim, ancaq yerimi Koroğluya bildirməyin.

11. Gecə yatırlar. Səhər Gürcüoğlu Məhəmməd qara qulun başını kəsib torbaya salır, Ələmqulunun sığırlarını da qabaqlarına qatıb Koroğlunun yanına qayıtmağa hazırlaşırlar.

12. Əhvalatı eşidən Ələmqulu dəlilərin üstünə qoşun çəkir.

Bunu görən Dəmiçrioğlu deyir:

Dağlara alaca düşüb,
Baharmı, payızmı ola?
Deyəsən bəşər hərlənir,
Qarğamı, qazdımı ola?

Üstümüzə gəlir qənim,
Gəldiyini siz də bilin,
Yarı sizin, yarı mənim,
Söhbətdimi, sazmı ola?

Düşmən qoşununun yarısını Dəmirçioğlu özünə götürüb, yarısını Gürcü-oğlu Məhəmmədlə İsabalıya verdiyi üçün Gürcüoğlu Məhəmməd inciyir. Odur ki, Dəmirçioğlu deiyr:

Üstümüzə qoşun gəldi,
Gizli döyül, aşkar oldu.
Hər nə ki, var sənə verdi,
Yoxsa payın azmı ola.

13. Ələmqulu xanın qoşunu ilə dəlilər vuruşub onları məğlub edirlər. Ələmqulu xan bu üç nəfərin Koroğlu dəlisi olduğunu bilib bərk qorxuya

düşür. Xanın qızı Ruqiyyə xanım tədbirə əl atır. Atasını Koroğlu dəliləri ilə dostluq etməyə çağırır, özü də barışıq kağızı ilə onların yanına gedir.

14. Koroğlu dəliləri xeyli gözləyir. Qayıtmadıqlarını görüb onların arxasınca gedir və gəlib Ələmqulu xanın şəhərini mühasirəyə alıb deyir:

Eşidin sözlərim, xəbərdar olun,
Dəmirçioğlu bu şəhərə gəlibdi.
Bir az dözüb sizə möhlət verirəm,
Dəmirçioğlu bu şəhərə gəlibdi.

Şəhərin yerində bostan əkəcəm,
Zər-zibasın Çənlibelə çəkəcəm,
Misri qılınc çəkib qanın tökəcəm,
Dəmirçioğlu bu şəhərə gəlibdi.

Koroğlu fərmandı mərdi-mərdanə,
Dəli dəllər yerikləyir al qana,
Bir azdan baxarsan toza-dumana,
Dəmirçioğlu bu şəhərə gəlibdi.

15. Koroğlunun dəlilərlə birlikdə şəhəri mühasirəyə aldığını görəndə Ələmqulu xan qorxuya düşür və qızı Ruqiyyəni çağırıb deyir ki, dəlilər əvvəl üç idi, indi 7777 olublar.

16. Ruqiyyə xanım qayıdıb əhvalatı Dəmirçioğluya deyir. Üç dəli qara qulun başını Koroğlunun hüzuruna gətirirlər və Ələm qulu xanın onlarla dostluq etmək istədiyini bildirirlər.

17. Koroğlu dəliləri ilə üç gün Ələmqulu xana qonaq olurlar. Dördüncü gün Koroğlu Çənlibelə qayıtmaq istəyəndə Gürcüoğlu Məhəmmədin Ruqiyyəni sevdiyini Ələmqulu xana bildirmək istəyir.

Variantda bundan sonrakı səhifələr yoxdur.

### Əlyazması. İnv. №725 (q)
### "Koroğlu"

Söyləyəni *Aşıq Cahandar*, toplayanı *Əliheydər Tahirov*. İyun 1930-cu il. Toplama yeri göstərilməyib (Ə.Tahirov digər qolları aşıq Cahandardan Zabrat kəndində topladığından bu qolu da yəqin ki, elə orada toplayıb). Cəmi üç səhifədən ibarət olan bu qol latın əlifbasında makinada yazılıb. İki nüsxədir. Nüsxənin birində qəhvəyi mürəkkəblə qolun yarımçıq olması qeyd edilib.

1. Xotkar Koroğluya Murtuza paşanı tutmağı tapşırır.

2. Koroğlu qoşunla Murtuza paşanın üstünə gəlir. O, aşıq paltarında qalaya girir. Onu Murtuza paşanın hüzuruna aparırlar. Paşa ona oxumağa icazə verir. Koroğlu:

İgid xotkar bizə qulluq buyurmuş,
Murtuza paşanı tutun gətirin.
Var-dövlətdə nə ki malı var isə
Hamısını çalın, çapın gətirin.

Minin ərəb atın yeyinlərini,
Al-əlvan eyləyin çiyinlərini,
Üstünü, başını əyinlərini,
Özün at döşünə qatın gətirin.

Mən sevmişəm bir tərsanın xaçını,
Ağ üzündən almamışam maçını,
Qazını, tulasın, bəhri laçını,
Koldan, kosdan tamam tapın gətirin.

3. Koroğlu əmr edir, qoşun tökülüb Murtuza paşanın əl-qolunu bağlayır, aparıb xotkara verir.

4. Murtuza paşanın başına gələn əhvalatı dostu Giziroğlu Mustafa bəy eşidir. Durub Koroğlunun üstünə gəlir. Koroğlu Mustafa bəyin gəldiyini görüb arvadına sazını gətirtdirib belə oxuyur:

Hay deyəndə haya gəli,
Huy deyəndə huya gəli,
Giziroğlu Mustafa bəy,
Murtuz paşanı istəyir.

5. Mustafa bəy içəri girib Koroğluya deyir ki, Murtuza paşa mənim dostumdu. Sabah gedib onu azad etdirərsən.

6. Koroğlu xotkarın yanına gəlib Murtuza paşanı buraxdırır. Qol burada kəsilir.

Əlyazması. İnv. №725 (2a)
"Tona xanım"

Pasport məlumatı yoxdur. Qol iki nüsxədir. Biri yarımçıqdır. Əvvəldən ilk səhifəsi düşmüşdür. Hər iki nüsxə latın əlifbası ilə makinada yazılıb. Üç

intervalla yazılmış bütöv nüsxə 10, iki intervalla yazılmış yarımçıq nüsxə 5 vərəqdir.

1. Gülbəngi bəyimin dünyada misli-bərabəri olmayan Tona adlı qızına Tərlan xanım adlı bir gəlin deyir ki, gözəllikdə elə mən də sənə bərabərəm.

Bunlar mübahisəni kəsmək üçün qazının yanına gəlirlər. Qazının gözü gəlinə düşür və deyir:

Qafiyəsin düz düzmüşəm,
İndi gözəldən danış.
Hərcayıdan öyrənmişəm,
Şiri gözəldən danış,
Gözəli gözəl eyləyən
Ağ üzdə xaldan danış.

2. Bu vaxt Koroğlunun Bəlli Əhməd adlı dəlisi gəlib buraya çıxır. Qazının qızı qoyub gəlini tərifləməsinə dözə bilməyib qazıya üz tutaraq deyir:

Dəli könül, gir meydana,
Eyləmə nazdan danış.
Cahillər könlün almağa,
Məzəli sözdən danış.
Bülbül qonmuş gülşənə,
Baharla, yazdan danış.

Qazı:

Bülbül odu gedər qonar budağa,
Əyləşəsən söhbətinən otağa,
Canım qurban olsun, başım sadağa,
Bu gözəlin naziylə sazdan danış.

Bəlli Əhməd:

Dəli könül, nə gəzirsən nazınan,
Laçın olan gəzər ördək-qazınan,
Danış, söylə sən də xoş avazınan,
Səfa üçün incə bir beldən danış.

Qazı:

Molla deyir lal ol, balam, yat indi,
Qızı alıb, bil öyrətmək çətindi,
Həm yorğandı, həm döşəkdi yat indi,
Gen sarğılı, iştahlı daldan danış.

Bəlli Əhməd:

Bəlli Əhmədəm bil, ey molla həvəs,
Allah kərim, indilikdə bu da bəs,
Sirri vermə arvada, sən əbəs,
Dərdə dərman qılmağa qızdan danış.

3. Bəlli Əhməd tək olduğu üçün bir iş görə bilməyəcəyini başa düşür və Çənlibelə üz qoyur. Gəlib Koroğluya deyir ki, Trabzon şəhərində bir qızla gəlinin gözəllik üstə mübahisəsi başlayıb. Onları seçən yoxdur. Koroğlu Trabzona gəlib bunlarla rastlaşır. Tərlan xanım ki, gəlindi, Tona xanıma deyir ki, gəl bir bundan da soruşaq.

Gəlin:

Bu dünyada biz doymuşuq,
Bumu gözəl, mənmi gözəl?
Səni yolunnan qoymuşuq,
Bumu gözəl, mənmi gözəl?

Koroğlu:

Heyranam mən camalına,
O da gözəl, sən də gözəl!
Qurbanam qoşa xalına,
O da gözəl, sən də gözəl!

Gəlin başa düşə bilmir ki, qarşılarındakı müsəlmandı, yoxsa xristian.

Gəlin:

Başındakı o tac oğlan,
Kərbala, Məkkə, hac oğlan,
Sən kəlisa, bu xaç oğlan,
Bumu gözəl, mənmi gözəl?

Koroğlu:

Başımdakı tac haqqıyçün,
Kərbəla, Məkkə haqqıyçün,
Bu kilsəynən, xaç haqqıyçün,
O da gözəl, sən də gözəl!

Gəlin:

Bizi görənnər doyufdu,
Əlimdə naməm soyufdu,
Tərlan yolunnan qoyufdu,
Bumu gözəl, mənmi gözəl?

Koroğlu:

Koroğluyam dağa sarı,
O bülbüllü bağa sarı,
Sizin kimi yara sarı,
O da gözəl, sən də gözəl!

4. Koroğlu yaxınlıqdakı ilxıdan iki at tutub Tona xanımı birinə, Tərlanı da o birinə mindirib Çənlibelə gətirir. Tərlan xanımı Bəlli Əhmədə verib, Tonanı da özü alır.

Burada qola başqa bir epizod da əlavə olunur.

1. Koroğlu Çənlibelin üstündə oturub karvan yolu gözləyir. Bir də görür ki, böyük bir karvan gəlir. Bəlli Əhmədi, Mehdini, Kosa Nəsiri, Halaypozanı çağırıb karvanın üstünə göndərmək istəyir. Ərəboğlu Karvan deyir ki, Koroğlu, bu səfər karvanı qarət etməyə özün get. Koroğluya bu söz çox ağır gəlir. Özü gedib karvanı qarət edir. Qayıdanda arvadlar Koroğludan karvandan necə bac almasını soruşurlar. Koroğlu deyir:

Yol getdikdə çıxdı bir dənə karvan,
Gəldi göy çəmənə qondu bəzirgan.
Dedim qoçaxlarım, bacını göndər,
Qah-qah çəkdi mənə güldü bəzirgan.

Əynində geyməsi cılxa poladdan,
Cismimə saldı o yaloydan, oddan,
Yoldaşını vurub salanda atdan,
Quş kimi şığıyıb gəldi bəzirgan.

Mən qurbanam yaradanın pirinə,
Yaradıb dağları yerri-yerinə,
Üç kərə çırpındıq biri-birinə,
Məni atdan yerə saldı bəzirgan.

Başına qoyubdu qələmi börkü,
Çiyninə salıbdı qızıldan kürkü,

Koroğlu çağırdı beş dənə türkü,
Beş tümən qızılı saydı bəzirgan.

Hamı Koroğlunun hünərinə əhsən deyir. Koroğlu Ərəboğlu Karvanı oxuya-oxuya məzəmmət edir.

Əlyazması. İnv. №725
"Koroğluynan Ədil paşa"

Söyləyəni *Əli Yoldaş oğlu* (60 yaşında), Toplayanı *Əliheydər Tahirov*, Bakı, Corat kəndi, 1936-cı il. Qol sondan yarımçıqdır. Latın əlifbasında makinada yazılmış bu qolun qalan səhifələri yeddidir.

1. Ədil paşa çox zalım bir şəxs olur. Hətta ətrafdakı paşalar, xanlar onun adını eşidəndə tir-tir əsirlər.

2. Koroğlunun şan-şöhrətli olması, paşaları, xanları qırıb çatması sorağı gəlib Ədil paşaya da çatır. Ədil paşa məclis düzəldir, camaat yeyib içəndən sonra o, bir piyalə qaldırıb deyir ki, kim bu piyaləni alıb içər və gedib Koroğludan mənə bir xəbər gətirər. Məclisdəki aşıq bu səfərə getməyə razılıq verir.

3. Səfərdən yenicə qayıtmış Koroğlu Çənlibeldə şənlik məclisi qurdurmuşdu. Məclisin şirin yerində Koroğlu deyir ki, bir igid istəyirəm, belə bir məclisdən əl çəkib qılınc-qalxan qurşansın getsin, rastına çıxanı götürüb gəlsin. Dəmirçioğlu bu təklifi qəbul edir.

4. Ədil paşanın aşığı Çənlibelə Koroğlunu görməyə gəlir.

5. Dəmirçioğlu aşıqla qarşılaşır və götürüb Koroğlunun hüzuruna gətirir. Koroğlu aşığı yedirdib doyuzdurandan sonra kimliyini, haradan gəldiyini soruşur. Aşıq cavab verir ki, Kürdüstandan gəlirəm. Özüm də Ədil paşanın aşığıyam. Həm də bildirir ki, Ədil paşa çox zalım, zülmkar adamdı. İndi də məni göndərib ki, gəlib öyrənəm görək Koroğlu necə adamdı.

6. Koroğlu sazı aşıqdan alıb çala-çala belə deyir:

Məni binadan bəslədi,
Dağlar qoynunda, qoynunda.
Tülək tərlanlar səslədi,
Dağlar qoynunda, qoynunda.

Dolanda iyit yaşıma,
Yağı çıxdı savaşıma,
Dəlilər gəldi başıma,
Dağlar qoynunda, qoynunda.

Kəsdim yollar, vurdum karvan,
Çəkib soydum çox bəzirgan.
Uddurdum paşalara qan,
Dağlar qoynunda, qoynunda.

Əsir çəkdim Çənlibelə,
Qoç Koroğlu düşdü dilə,
Yeddi min dəli mənimlə,
Dağlar qoynunda, qoynunda.

7. Koroğlu aşığa yaxşı xalat, üstəlik ərəb atlarından da birini bağışlayır.

8. Aşıq dönəndə Koroğluya deyir ki, Ədil paşanın qızı Nərgiz xanım Çənlibelə layiq qızdı və onun gözəlliyinə tərif deyir:

Bir gözəldi sədasına,
Qoş əfəndim, qoş əfəndim.
Səs ver maral sədasına,
Qoş əfəndim, qoş əfəndim.

Kiçik deyildir nəsili,
Ağır elli xan əsilli,
Cahanda bəlli nəsilli,
Qoş əfəndim, qoş əfəndim.

Adı Nərgiz, özü pəri,
Verim sənə bu xəbəri,
Görübən dönməzsən geri,
Var əfəndim, qoş əfəndim.

Tirmə salıbdı başına,
Bənzəyir cənnət quşuna,
Çatıbdı on beş yaşına,
Qoş əfəndim, qoş əfəndim.

Ey mənim soltanım, xanım,
Sənə qurban mənim canım,
Görən deyir: Nərgiz yarım,
Olsun, durma, qoş əfəndim.

Aşıq deyir keçmək olmaz,
Bu sulardan içmək olmaz,
Bir baxmaqdan doymaq olmaz,
Durma aman, qoş əfəndim.

9. Koroğlu istəyir Eyvazı Nərgiz xanımın arxasınca göndərsin. Amma Murtuz çox inad etdiyindən onun getməsinə razılıq verir.

10. Aşıq Kürdüstana çatınca Ədil paşa onu yanına çağırıb Koroğlunun necə olmasını soruşur. Məclis qurulur. Ədil paşanın qızı Nərgiz xanım da libasını dəyişib qarabaş geyimində gəlib arvadların sırasında oturur. Aşıq sazı götürüb Koroğlunu belə təqdim edir:

Əyləşmişdi Çənlibelin elində,
Deyil işlərində naşı Koroğlu.
Misri qılınc həmayıldı belində,
Geyər hər vaxt al qumaşı Koroğlu.

Bir hay desə ağır tüplər basılır,
Qənarədən qanlı başlar asılır,
Hər məclisdə min-min quzu kəsilir,
Verir aşı, o bozbaşı Koroğlu.

Bir qılıncı vardı ucu qoşapər,
Meydana girəndə əsrəmiş bir nər,
Nərəsinnən paşa, soltan tük tökər,
Yeddi min dəlilər başı Koroğlu.

Cavan aşıq bu məclisdə ta qalmaz,
Şirin canın yanan odlara salmaz,
Yüz il gəzsə Koroğlu tək mərd tapmaz,
Çənlibelin iyid başı Koroğlu.

Qolun səhifələri bundan sonra olmadığından hadisələrin sonrakı davamı bəlli olmur.

Əlyazması. İnv. №1286 (1)
"Koroğlunun divlərlə döyüşü"

Qol 5 səhifədir. 3 səhifəsi qəhvəyi, iki səhifəsi göy mürəkkəblə yazılıb. Qovluğun iç üzündə və qolun son səhifəsində "Aşıq Əkbərin rəvayətindən" qeydi var. Toplayanı *Əli Salədddin.* Gəncə, 29.VI.1965.

1. Koroğlu Eyvazı sağında, Dəmirçioğlunu solunda, Nigarı qarşısında oturdub şadlıq məclisi qurdurur. Aşıq Cünun da ortada çalıb oxuyur. Koroğlu üzünü Aşıq Cününa tutub soruşur ki, biz bu qədər çalışırıq, vuruşuruq, adamlara kömək edirik, görəsən, gələcəkdə heç olmasa bir nəfərin yadına düşəcəyikmi?

2. Aşıq Cünun Koroğlunun sorğusuna belə cavab verir:

Gəl sənə söyləyim, gəl sənə deyim,
Yağılardan xərac alar Koroğlu.
Minib Qıratına alov qılıncı,
Düşmənin başına çalar Koroğlu.

Önündə qoşunlar özün itirər,
Nə mətləbi olsa başa yetirər,
Gedər gəzdiyini tapıb gətirər,
Aləmi heyrətə salar Koroğlu.

Cünun desin, bunu sən də eşit, bil,
Dolanır min fəsil, dolanır min il.
Səndən dastan söylər bu oba, bu el,
Tarix yaşadıqca qalar Koroğlu.

3. Keşikçilər bir oğlanı məclisə gətirib Koroğluya deyirlər ki, bunu Ağqayanın altında tutmuşuq. Mütləq səni görmək istəyir.

4. Koroğlu 18–20 yaşlı bu cavanı çağırıb nə mətləbə gəldiyini soruşur.

5. Gələn adam papağını başından çıxaranda saçları çiyinlərinə tökülür. Yalnız indi onun qız olması bəlli olur. Qız sağ hörüyünün arasından bir kağız çıxarıb Nigara verir. Nigar oxuyur:

Çənlibel elində igid Koroğlu,
Allahın adına gəl qurtar bizi.
Yolunu gözlərik hər səhər, axşam,
Məhəmməd adına gəl qurtar bizi.

Bunu yazanların qolları bağlı,
Qapıları bağlı, yolları bağlı.
Ürəyi sitəmli, sinəsi dağlı,
Əlinin adına gəl qurtar bizi.

Günümüz gecədir, gecəmiz zülmət,
Cavan yaşımızda çəkirik zillət,
Ataya, anaya qalmışıq həsrət,
Sən Quran adına gəl qurtar bizi.

Öz adım Sonadır, yoldaşım Tərlan,
Birisi Dünyadır, birisi Cahan,
Birisi Nərgizdir, birisi Heyran,
Göy imam adına gəl qurtar bizi.

Giriftar olmuşuq divin əlində,
Çürüyür ömrümüz düşmən əlində,
Zavallı qızların adı dilində,
Peyğəmbər adına gəl qurtar bizi.

6. Məktub oxunulub qurtarandan sonra gələn qızın dediklərindən bəlli olur ki, adları çəkilənlər bəy-paşa qızlarıdır. Göy div onları özünə arvad etmək üçün ata-analarından oğurlayıb Qafın arxasındakı Axarçıda öz məskənində dustaq eləyib. Qızlar ona könül vermədikləri üçün hamısını saçından asıb. Div bir gün sərxoş olduğundan qızın birini asmaq yadından çıxır. O da qızların yazdırdığı naməni götürüb Koroğlunun üstünə gəlib ki, xilas olmaq üçün onlara yardım etsin.

7. Əhvalatla tanış olan Koroğlu deyir:

Bilin, dəlilərim, bir səfərim var,
Göy divin məskəni dağılsın gərək!
Dustaq edilibdi bizim bacılar,
Göy divin məskəni dağılsın gərək!

Çəkərəm qılıncı, minərəm atı,
Gedərəm taparam mən o zülmatı,
Azaddır adamın əzəl həyatı,
Göy divin məskəni dağılsın gərək!

Koroğluyam, öz sözümdən dönmərəm,
Səməndərəm, alışmışam, sönmərəm,
Mən qartalam, uçub-uçub enmərəm,
Göy divin məskəni dağılsın gərək!

8. Koroğlu Dəli Mehtərə atı yəhərlətdirib Axarçıya gedir. Göy divi tapıb öldürür. Qızları azad edib Çənlibelə gətirir. Toy eləyib hərəsini bir dəliyə alır.

Əlyazması. İnv. №1286 (2)
"Koroğlunun Tehran səfəri"

Qol qəhvəyi mürəkkəblə yazılıb. 10 səhifədir. Söyləyici haqqında məlumat yoxdur. Toplayanı *Əli Saləddin.* Gəncə, 29.VI.1965.

Qol dastan nümunəsindən daha çox astral səciyyəli nağıla oxşayır.

1. İranın padşahı Əhməd şah zülmkarlığı ilə ad çıxarıb.

2. Yoxsullar məhəlləsində yaşayan Buludun Ulduz adlı sevgilisi olur. Əhməd şah Ulduzun atası Ayı, anası Qəməri yanına çağırıb qızları Ulduzla evlənmək istədiyini bildirir. Onlar razı olmur. Əhməd şah, Ayla Qəməri zindana salır, fərraşlara tapşırır ki, Ulduzu axşam onun Firuzə sarayına gətirsinlər.

3. Məsələdən xəbər tutan Buludla Ulduz Zöhrə dağına qaçırlar.

4. Zöhrə dağı hökmdarlardan, ağalardan narazı olan igidlərin məskənidir. Bu el igidlərinə Şirixurşud başçılıq edir.

5. Şirixurşud əvvəl muzdur olur. Ağası muzdunu vermədiyinə görə onu öldürüb özü tək bir neçə dəliqanlını başına yığıb Zöhrə dağına çəkilmişdir. Harada ədalətsizlik, haqsızlıq olur, Şirixurşud dəstəsini ora yeridib işləri öz yoluna qoyur. Kasıbları müdafiə edir.

6. Koroğlu Şirixurşudun tərifini, şücaətlərini eşidib necə olursa-olsun Zöhrə dağına gedib onunla görüşmək istəyir. Amma başı səfərlərə qarışdığı üçün buna imkan tapa bilmir. Nəhayət, Koroğlu Ballıca səfərindən qayıdandan sonra şənlik məclisində üzünü dəlilərə tutub deyir:

Eşidin sözümü, mərd dəlilərim,
O Zöhrə dağına kim gedə bilər?
Yeyir ürəyimi dərd, dəlilərim,
O Zöhrə dağına kim gedə bilər?

Bu gün çərşənbədir, sabah cümədi,
Ümidim, pənahım deyim kimədi?
Hər yan sakitlikdi, matəmdi, nədi,
O Zöhrə dağına kim gedə bilər?

Koroğlu sözünü söyləyər sağa,
İnsanlar qovuşar, çatmaz dağ-dağa,
Göylərdən üstünə od-alov yağa,
O Zöhrə dağına kim gedə bilər?

7. Dəlilər yerbəyerdən hər biri Zöhrə dağına getməyə hazır olduqlarını bildirirlər. Koroğlu deyir ki, yox, bu çox ağır səfərdir, Şirinxurşud təki pəhləvanın qabağına çıxan ondan qoçaq, hünərli olmalıdır. Odur ki, Koroğlu bu səfərə özünün gedəcəyini söyləyir və Qırata minib deyir:

Mən gedirəm, qalın hələ salamat,
Bu səfərim heç səfərə oxşamır.
Üz tuturam şahlar yurdu Tehrana,
Tehran şəhri heç şəhərə oxşamır.

İgid gərək igidlərlə dost olsun,
Meydan açsın, at oynatsın, ad alsın,
El obada söhbət salsın, saz çalsın,
Nəfər var ki, heç nəfərə oxşamır.

...Koroğlunun göydən enən vaxtıdı,
Qocalıqda deyib dinən vaxtıdı,
Mən Günəşdim, ömrün sönən vaxtıdı,
Bu səfərim heç səfərə oxşamır.

8. Koroğlu Çənlibeldən yola düşüb neçə-neçə kənddən, şəhərdən keçib Zöhrə dağına çatır. Deyilənə görə, dünyada heç şey Koroğluya dağ qədər təsir etməzmiş. Odur ki, Zöhrə dağını görən tək ürəyi qubarlanır və dağa belə müraciət edir:

Səni gördüm fikrə düşdüm,
Zöhrə dağı, Zöhrə dağı!
Ürəyimi kimə açım,
Zöhrə dağı, Zöhrə dağı!

İgid odu qalsın cavan,
Dəyişməsin onu zaman,
Qocalıqdan gələn aman,
Zöhrə dağı, Zöhrə dağı!

Mən nə günlər keçirmişəm,
Yada zəhər içirmişəm,
Düşünməkdi indi peşəm,
Zöhrə dağı, Zöhrə dağı!

Şirixurşud namım çəkə,
Düşmənimin qanın tökə,
Koroğludu o da bəlkə
Zöhrə dağı, Zöhrə dağı!

İgidlərlə dostluq edən,
Qoç Koroğlu, düşməz əldən,
Yanıq könlü olmaz zədən,
Zöhrə dağı, Zöhrə dağı!

9. Koroğlu yoluna davam edir. Bu vaxt arxadan səs eşidir. Geri baxdıqda at üstündə cavan bir oğlanın onu haqladığını görür. Burada Koroğlunun öz cavanlığı yadına düşür. Sanki cavan Rövşən qoca Rövşənlə üz-üzə gəlib. Onlar bir-birlərindən kimliklərini soruşur və aralarında belə bir sorğu-sual olur:

Koroğlu:

İgidsənsə sən kiçiksən, sən danış,
Bu yerlərdə Şirixurşud hardadı?
Ürəyimdə bardaş qurub qarlı qış,
Bu yerlərdə Şirixurşud hardadı?

Oğlan:

Heç demədin haralısan, sən kimsən?
Şirixurşud bu yerlərdə yaşayır.
Tayı yoxdu Arasbarda, İranda,
Şirixurşud bu yerlərdə yaşayır.

Koroğlu:

Danış oğul, danış görüm o cavan,
Halaldımı daşıdığı bu ad, san,
Zərbəsindən giriftardı paşa, xan,
Şirixurşud bu yerlərdə hardadı?

Oğlan:

Bir igiddi öz elində o cavan,
Halal olub daşıdığı o ad, san,
Zərbəsindən giriftardı, paşa, xan,
Şirixurşud bu yerlərdə yaşayır.

Koroğlu:

Koroğlunun çoxdu ona minnəti,
Bir dostluqdu ancaq onla niyyəti,
Tutub bütün bu dünyanı şöhrəti,
Bu yerlərdə Şirixurşud hardadı?

Oğlan:

Şirixurşud Koroğlunun quludu,
Olsa-olsa ancaq onun oğludu,
Qoç Koroğlu igidlikdə uludu,
Şirixurşud bu yerlərldə yaşayır.

10. Koroğlu ilə Şirixurşud bir-birlərini tanıyırlar. Şirixurşud Koroğlu ilə görüşdüyünə çox sevinir. Onunla dostluq etmək arzusunda olduğunu bildirir. Koroğluya qoşulub Çənlibelə gəlir. Koroğlu bu şərəfə böyük şənlik məclisi qurdurur. Şirixurşud dəlilərə qoşulub xanlara, paşalara qarşı mübarizəyə başlayır.

Əlyazması. İnv. №726 (8)
"Koroğluynan Xonxar"

Qolu *Əliheydər Tahirov* 17 iyun 1936-cı ildə Zabrat qəsəbəsində Bəşir Əsəd oğlundan toplamışdır. Latın əlifbasında makinada yazılmış bu qol on səhifədir. İkinci nüsxəsinin 1, 6, 9, 10 səhifələri qorunub. Bu səhifələr üstə qəhvəyi mürəkkəblə düzəlişlər aparılmışdır. Vaxtilə M.H.Təhmasib bu qolu nəşr etdirdiyi "Koroğlu"nun "Qeydlər"inə daxil etmişdir.

1. Koroğlu Çardaqlı Çənlibeldə kef məclisi qurdurub Eyvaza və digər dəlilərinə deyir ki, aşıq paltarımı gətirin, gəzməyə çıxacağam. Dəlilər Koroğlunun getməsinə razı olmurlar. Koroğlu bunlara qulaq asmır. Eyvazı öz yerinə Çənlibelə başçı qoyur, Qıratı da ona tapşırır.

2. Koroğlu aşıq paltarında gəlib bir neçə çadır qurulmuş yerə çıxır. Görür ki, burada böyük qoşun var, özləri də məclis qurub yeyir-içirlər. Bu qoşun Xonxarın qardaşı oğlu Qulu bəyindir. Onlar Koroğlunu tutmaq üçün buraya gəliblər. Koroğlu məclisə gedir. Adamlar onu dövrəyə alıb çalıb-oxumasını istəyirlər. Koroğlu ac olduğunu bəhanə edib oxumaq istəmir. Onu aşpazxanaya aparırlar.

3. Koroğlunun qaçmış bir dəlisi Qulu bəyin qoşunu içərisində olur. O, aşığın Koroğlu olduğunu Qulu bəyə xəbər verir. Qulu bəy əvvəlcə buna inanmır. Xəbərçi deyir ki, Koroğluda bir adət var: Oturduğu yerdə qarşısına zəncir atsan boynunu əyir. Qulu bəy xəbərçinin dediyini edir. Koroğlu boynun əyir. O saat onu tutub qollarını bağlayır və geri qayıdırlar.

4. Qulu bəyin əmisi qızı Dünya xanım bir cavanın qolu bağlı gətirildiyini görüb heyifsilənir və yanındakı qızlara bildirir ki, yəqin bunu namərdliklə tutublar.

5. Koroğlu Dünya xanımı görüncə oxumağa başlayır:

Qarşı yatan qarlı dağlar,
Mənim səndə nəyim qaldı?
Əlim çatmaz, ünüm yetməz,
Bir ah ilə zarım qaldı.

Məni tutdu Qulu bəylər,
Ağır zəncir boynum əylər,
Hanı o gülüstan ellər?
Orda mənim dəlim qaldı.

Bizi tutdu qəm əcəli,
Öldürər, verməz macalı,
Səkkiz dirək, dörd bacalı,
Qəsri eyvanlarım qaldı.

Dünya, mən səni alaydım,
Qolum boynuna salaydım,
Çənlibelə aparaydım
Nigar kimi yarım qaldı.

6. Qulu bəy xəbərçi dəliyə Koroğlunu öldürməyi tapşırır. O isə Koroğlunu öldürməyib gətirib qırx arşın dərinliyi olan bir quyuya salır.

7. Eyvaz Koroğlunun gec qayıtmasından nigaran qalıb dəlilərə onun arxasınca getməyin lazımlığını bildirir. Bu işi İsabalı öz boynuna götürür.

8. Xonxarın qızı Dünya xanıma yuxuda eşq camı içirdilib İsabalı buta verilir. Səhər o, yuxudan oyananda İsabalını öz bağında görür. Deyir ki, bu gecə səni mənə buta veriblər. Gərək məni alasan.

9. İsabalı da Dünya xanımı xoşlayır və başlayır onunla eşq sevdasına. Koroğlu yaddan çıxır.

Qulu bəy əmisi qızı Dünya xanımı istəyirdi. Xonxar da ona söz veribmiş ki, əgər Koroğlunu öldürsən qızımı sənə verəcəyəm.

11. Xonxara xəbər verilir ki, qızın Dünya xanım Koroğlunun dəlisi İsabalı ilə eyş-işrətdədir. Xonxar İsabalını tutmaq üçün üç yüz atlı göndərir. Dünya xanım atlıları görüncə İsabalıya çıxıb getməsini şeirlə deyir, İsabalı da şeirlə cavab verir. Şeir belədir:

Dünya xanım:

Başına döndüyüm, qurban olduğum,
Yeri, İsabalım, durma bu yerdə.
Ala gözlərinə heyran olduğum,
Yeri, İsabalım, durma bu yerdə.

İsabalı:

Qadasın aldığım, qurban olduğum,
Ölər İsabalı, getməz bu yerdən.
Ala gözlərinə heyran olduğum,
Ölər İsabalı, getməz bu yerdən.

Dünya xanım:

Dolu-dolu badələrdən içildi,
Qəm xələti bu boynuma biçildi,
Üç yüz atlı bu meydana seçildi,
Yeri, İsabalım, durma bu yerdə.

İsabalı:

Ac qurd kimi dərələrdən boylasın,
Xəncər alıb bağrım başın teyləsin,
Üç yüz tülkü mən aslana neyləsin,
Ölər İsabalı, getməz bu yerdən.

Dünya xanım:

Ac qurd kimi dərələrdən pusubdu,
Qulac qolun dal gərdənə bükübdü,
Ağanı da qolu bağlı tutubdu,
Yeri, İsabalım, durma bu yerdə.

İsabalı:

Ac qurd kimi dərələrdən pusubdu,
Hansı qoldu dal gərdənə çatıbdı,
Ağam özü gəlib, məgər tutubdu,
Ölər İsabalı, getməz bu yerdən.

12. İsabalı qılınc-qalxanını götürüb elə bayıra çıxanda Eyvaz dəlilərlə Çənlibeldən gəlib yetişir. Hücum edib Xonxarın qoşununu qırmağa başlayırlar. İsabalı Koroğlunun salındığı quyunu Eyvaza nişan verir. Kəmənd atıb onu quyudan çıxarırlar.

13. Koroğlu Qırata minib qoşunu qıra-qıra düz Xonxarın hüzuruna gəlir və ona deyir:

Gidi Xonxar, qıl başının çarəsin,
Koroğlu üstünə dəllərnən gəlib.
Alıblar qalanı, yıxıblar bürcü,
Koroğlu üstünə dəllərnən gəlib.

Qırx min gürcü, ləzgi, Rüstəm övladı,
Çəkər qılınc, kəsər dəmir poladı,
Salar cana qorxu Koroğlu adı,
Koroğlu üstünə dəllərnən gəlib.

14. Koroğlunun işarəsi ilə dəlilər Xonxarı tutub şəhər qapısında dardan asırlar. Koroğlu Çənlibelə çatınca Dünya xanımla İsabalı üçün toy başlayır. Məclisin qızğın çağında Koroğlu Reyhan dayəni çağırıb soruşur ki, bu toyda nə çatışmır. Dayə də cavab verir ki, qaz əti.

15. Eyvaz Sərdək atı minib Dəmirçioğlu, Telli Həsənlə qaz əti gətirmək üçün Həsən paşa gölünə gəlirlər. Burada nə qədər qaz, ördək var hamısını ovlayır, kabab bişirir, başlayırlar yeyib içməyə. Qarovulçu gəlib bunu Həsən paşaya xəbər verir. Həsən paşanın adamları bunları tutub salırlar dama.

16. Koroğlunun Yumruq Əhməd adlı dostu əhvalatı eşidən kimi, özünü zindana çatdırır. Qarovulçuları razı salıb Eyvazla görüşür. Eyvaz tutulmaları barədə Yumruq Əhmədlə Koroğluya bu məzmunda namə göndərir:

Uca dağların başından,
Yolum hey mədət, hey mədət!
Düşübdü ardımca gəlir
Ölüm hey mədət, hey mədət!

Bizi tutdu Həsən paşa,
Adımız yazıldı daşa,
Ömür gəlib yetdi başa,
Mədət, hey, mədət, hey mədət!

Çəkin gəlsin Sərdək atı,
Mərd igidin olar zatı,
Gəl dağıt bu məmləkəti,
Mədət, hey mədət, hey mədət!

Xan Eyvazxan, vurma lafı,
Simurq kimi gözlə Qafı,
Öldürər, yoxdu insafı,
Qardaş, hey mədət, hey mədət!

17. Yumruq Əhməd kağızı gətirib Çənlibeldə Koroğluya verir. Koroğlu hay verib dəliləri Eyvazgili qurtarmağa tələsdirir. Özü qabaqda Qırata minib yel tək gedir.

18. Qırat özlüyündə fikirləşir ki, bir belə Koroğlunu gəzdirirəm, görək o, mənim qədrimi bilir, ya yox. Odur ki, Koroğlunu sınamaq üçün başlayır yavaş-yavaş yeriməyə. Koroğlu bunu görüb deyir:

Qırat, mən səni alanda,
Baharınan yaz olaydı.
Kəkilin müşki ənbəri,
Boyun səlminaz olaydı,

Qarğıdandı qulaqların,
Poladdandı, dırnaqların,
Qırat, sənin oynaqların
Tüsürkatın düz olaydı.

Qırat, ipəkdəndi saçın,
Sancayılda dəli laçın,
Tutulubdu bala laçın,
Yetməyimiz tez olaydı.

Mirəssə yəhər belində,
Tayın yoxdu Rum elində,
Hər vaxt Koroğlu dilində,
Sənə tərif, naz olaydı.

Qırat bu tərifdən xoşhal olub yenə yelə dönür.

19. Onlar gəlib bir zəminin qırağına çatırlar. Görürlər bir qoca kişi taxıl biçir, amma çox qəmgindi. Koroğlu bunun səbəbini soruşduqda o deyir ki, Koroğlunun dəlilərini tutublar, ona görə qəmginəm. Koroğlu dəlilərə əmr edib qocanın zəmisini biçib taxılını yığırlar. Sonra Koroğlu gəlib Paşagəldi kəndinin varlılarını qarət edib oradan da Sancayıl kəndinə gəlir. Dəlilərə deyir ki, mən aşıq paltarında meydana gedirəm, sağ əlimi sağ bığıma çəkəndə hücum edərsiniz paşanın qoşununa.

20. Həsən paşanın adamları Koroğlunu aşıq bilib oxudurlar. Koroğlu deyir:

Dava günü qızıb girsəm meydana,
Düşmənlər üzsünlər qanında gərək.
Kəsilsin kəllələr, qalansın leşlər,
Qılınc paslanmasın qınında gərək.

Dolu piyalələr içək sağıdan,
Qorxmam haramidən, qanlı yağıdan,
Dəstələr sındıran, tüplər dağıdan,
Xan Eyvazım mənim yanımda gərək.

Hay deyəndə özün mənə yetirən,
Koroğluya yüz min qulluq bitirən,
Dava günü əmud, qalxan götürən,
Dəmirçioğlu mənim yanımda gərək.

Söz tamam olunca Koroğlu əlini atır sağ bığına. Dəlilər işarəni görüncə hücum edib qoşunu qırıb qurtarırlar. Həsən xanı da öldürüb dəliləri azad edir və şad-xürrəm geri dönürlər. İsabalının toyunu təzədən başlayıb şadlıq edirlər.

### Əlyazması. İnv. №726 (5)
### "Ağcaquzu"

Arxivdə saxlanılan bu qol latın əlifbası ilə makinada yazılmış 9 səhifədən ibarət yeganə nüsxədir. Qolun nə vaxt, harada, kimdən toplanıldığı və toplayıcının kim olduğu əlyazmada göstərilməyib. M.H.Təhmasibin özünün nəşr etdirdiyi "Koroğlu"ya yazdığı "Qeydlər"dən bu qolun 1935-ci ildə Qobu kəndində Cəlil Murad oğlundan toplanıldığı bəlli olur.

1. İstanbulda Həsən paşanın oğlu Ağcaquzu öz əmisi Cəfər paşanın qızı Pərizad xanımla göbəkkəsmə nişanlı olur. Pərizad xanım çox oxumuş, ismi-əzəm duasını bilən, həm də çox göyçək bir qız olur. O, əmisi oğlu Ağcaquzunu bəyənmir.

2. Bir gün Pərizad xanım məktəbdə əmisi oğlu ilə razılaşıb gəzməyə çıxırlar. Onlar gəzə-gəzə gəlib bir səhrayi-biyabana çatırlar. Bir dərənin ortasında Pərizad xanım çevrə çəkib əmisi oğluna deyir ki, biliyini göstər görək bu çevrəyə nə gətirə bilərsən. Ağcaquzu bu işdə aciz olur. Pərizad xanım ismi-əzəm duası oxuyub bütün yırtıcı, vəhşi heyvanları toplayır çevrənin içərisinə. Ağcaquzuya deyir ki, sənə yar olunca bu vəhşi heyvanlara qoşulub dünyanı gəzəcəyəm. İldə bir kərə gəlib İstanbula baş çəkəcəyəm. Sonra o, bir aslan dərisini boynuna keçirir, özü də aslana çevrilib vəhşi heyvanlara qoşularaq çıxıb gedir.

3. Ağcaquzu özündən gedib üç gün beləcə qalır. Ayılanda görür ki, ağalar ağası, Düldülün sahibi başının üstündə durub əlində də mey piyaləsi. O, piyaləni Ağcaquzuya verib deyir ki, al bunu iç, Pərizad xanım sənindi. Ağcaquzu alıb abi-kövsəri nuş edir və bir də baxıb görür ki, ona piyalə verən şəxs artıq yoxdur.

Ağcaquzu kor-peşman şəhərə qayıdıb əhvalatı atasına və əmisinə danışır, həm də Pərizad xanımın arxasınca gedəcəyini bildirir. Çox çalışırlarsa da, Ağcaquzunu saxlaya bilmirlər. Deyir ki, gedib yapışacağam Koroğlunun ətəyindən; o, Pərizad xanımı mənim üçün tapar.

4. Cümə günü Koroğlu Çənlibelin Daşqalasında tək oturubmuş. Bu vaxt görür ki, İstanbuldan bir karvan gəlir. Koroğlu irəli yeriyib görür ki, dəvənin üstündə bir cavan oğlan əyləşib. Öz-özünə fikirləşir ki, bundan sarı qılınc çıxarmağa dəyməz. Elə bir dəli nərə çəkərəm, huşu başından gedər, mən də dəvələri çəkib apararam. Belə deyib Koroğlu heyrətli bir nərə çəkir. Amma dəvənin üstündə oturan oğlanın heç tükü də tərpənmir. Koroğlu elə düşünür ki, o, kardır. Oğlan isə bildirir ki, yox kar deyiləm, səni saya almıram. Onlar bir-birinə hərbə-zorba deyirlər:

Koroğlu:

İstanbuldan bir şikara düşdü əlim,
Ver malını, qurtar canın çəkil get!
İndi boyanarsan qızıl qanına,
Ver malını, qurtar canın çəkil get!

Ağcaquzu:

Mərd igidlər bir-birilə üzdəşər,
Müxənnətlər kol dibində gizdəşər,
Qılınc vurram yaraların sızdaşar,
Baş getməmiş malım sənə verməərəm!

Koroğlu:

İndi gələr dəlilər ac qurd kimi,
Gözün olar birdən-birə dörd kimi,
Başın gedər, leşin qalar yurd kimi,
Ver malını, qurtar canın çəkil get!

Ağcaquzu:

Gəlməmişəm bu yerlərdə yastanam,
Qılıncımla meydan dönər bostana,
Min tülkü neyləsin bir ac astana,
Baş getməmiş malım sənə verməərəm!

Koroğlu:

Koroğluyam Çənlibeldə gəzərəm,
Uzaqdan, yaxından şikar süzərəm,
Dartıb boğazını dibdən üzərəm,
Ver malını, qurtar canın çəkil get!

Ağcaquzu:

Süsən mənəm, sünbül mənəm, gül mənəm,
Hər yetənnən danışmanam, gülmənəm,
Koroğlunu ayaq tozu bilmənəm,
Baş getməmiş malım sənə vermərəm!

5. Hərbə-zorbadan sonra onlar meydana girirlər. Koroğlunun hünəri Qıratladır. İndi o, Qıratsız olduğu üçün Ağcaquzuya qalib gələ bilmir. Ağcaquzu hansı mətləbə onun yanına gəldiyini bildirir. Koroğlu Ağcaquzunu götürüb Çənlibelə gəlir və məsələni dəlilərə agah edir.

6. Koroğlu, Eyvaz, Dəmirçioğlu, Dəli Həsən, Halaypozan dördü Pərizad xanımın arxasınca gedirlər və gəlib qız olan qayalıqlara çatırlar.

7. Pərizad xanım özünün olduğu yerə onların gəlib yetişdiyini görəndə təəccüb edir ki, insan çıxa bilməyən yerlərə onlar necə gəliblər?! Tez ismi-əzəm oxuyub gələnlərin qarşısında bağ-bostan əkir ki, əgər insandılarsa tamah salacaqlar, yox məlaikələrdisə onda nəzər etməzlər. Dağın qabırğasında bostan göyərir. Bunu görən Koroğlu təəccüblənir ki, bu cür dağ-daşda da qovun-qarpız bitərmi? Amma hansını kəsirlərsə, görürlər ki, apacı zəhərdir. Başa düşürlər ki, bu Pərizad xanımın sehri-cadusunun nəticəsidir.

8. Gələnlər dağın bir yerindən nazik tüstünün çıxdığını görürlər. Koroğlu tüstüyə müraciətlə Pərizad xanımı səsləyir. Pərizad xanım bir balaca deşikdən ilan cildində sürüşüb çıxır, amma Koroğluya insan şəklində görünür. O, Koroğluya təklif edir ki, atdan düşsün. Koroğlu cavab verir ki, sənin çıxdığın yerə mənim heç bir qolum sığışmaz. Evin yox, otağın yox, bu çöllü-biyabanda mən düşüb harada qalım?

Pərizad xanım ismi-əzəm oxuyub dağın arxa tərəfində yeddi mərtəbəli bir ev ucaldır. Koroğlunu yoldaşları ilə buraya gətirir. Hal-əhvaldan sonra Pərizad xanım Koroğludan tərif istəyir. Koroğlu deyir:

Uca dağların başında,
Mən bir aslana uğradım.
Yedim, içdim, dövran sürdüm,
Bağı-bostana uğradım.

Bəridən gəl, sən bəridən,
Ürəyim yağın əridən,
Silkənib çıxdın dəridən,
Məməli məstana uğradım.

Pərizad xanım Koroğlunun bu oxumasından narazı olub mərdanə sözlər oxumasını istəyir. Koroğlu:

Uca dağların başında,
Lopa-lopa qar görünür.
Mənim bu xəcil gözümə,
Ala gözlü yar görünür.

Pərizad xanım acıqlanıb deyir:

Dağların üstə pəncərəm,
Sinənin üstə xəncərəm,
Tərpənmə, səni sancaram,
Ağulu Şahmar görünür.

Koroğlu:

Bilmədim yarın fəndini,
Əməydim ləbin qəndini,
Açginən köksün bəndini,
Köksündəki nar görünür.

Pərizad xanım:

Pərizadam tanı məni,
Tərk edərəm xani-mani,
Şahmar kimi çallam səni,
Dünya gözə dar görünür.

Bu sözdən sonra Pərizad xanım ismi-əzəm duası oxuyur və evin divarları yığılıb Koroğlugili sıxmağa başlayır. Koroğlu oxuyur:

Qarşı bəri duran dağlar,
Ellər səni bəzər bir gün.
Güllü-bənövşəli bağlar,
Yarım səndə gəzər bir gün.

Hər igiddə olmaz hünər,
Qılınc qəbzəsindən enər,
Dövlətlidən dövlət dönər,
Ağıl başdan dönər bir gün.

Koroğlu Çənlibellərdə,
Qalmışam fitnə fellərdə,
Mən ölsəm qərib yerlərdə,
Kimlər qəbrim qazar bir gün.

Dəmirçioğlu görür ki, Pərizad xanım Koroğlunun sözlərindən daha da acıqlanıb və onların başına bəla açacaq. Odur ki, Pərizad xanıma deyir ki, qoy bir tərif də mən söyləyim. Pərizad xanım icazə verir və Dəmirçioğlunun sözləri ona xoş gəlir.

9. Koroğlu Pərizad xanıma bildirir ki, buraya gəlməkdə səbəb onu Çənlibelə aparıb Ağcaquzuya yetirməkdir. Pərizad xanım onlara qoşulub Çənlibelə gəlir. Koroğlu yeddi gün, yeddi gecə toy edib Pərizad xanımı verir Ağcaquzuya. Ağcaquzu da Koroğlunun dəlisi olub qalır Çənlibeldə.

Əlyazması. İnv. №726 (4j)
"Koroğlunun qocalıq günləri"

Söyləyəni *Aşıq Məhəmməd Sarıoğlu*, toplayanı Hümmət Əlizadə, Tovuz rayonu. Düzqırıxlı kəndi, 22 aprel 1938-ci il.

Latın əlifbasında makinada yazılmış 5 səhifə.

1. Qocalan Koroğlu bütün dəliləri başından dağıdır. Yanında təkcə Eyvazı, bir də Qıratla Ərəbatı saxlayır. O, davadan, vuruşdan əl çəkdiyi üçün bu atların da nalını söküb çölə buraxır, Eyvazla birgə dəyirmançılıq edir.

2. Koroğlunun düşməni paşa xəbər tutanda ki dəlilər Çənlibeldən dağılıb gedib, qisas almaq üçün qoca Koroğlunun üstünə qoşunla gəlir.

3. Paşanın hücum xəbərini dəyirmanda eşidən Koroğlu Eyvazı çağırıb deyir:

Qarı düşmən güc gətirdi,
Qocaldım, Eyvaz, qocaldım.
Mənzili başa yetirdim,
Qocaldım, Eyvaz, qocaldım.

Müxənnətin olmaz zatı,
Mərdin polad olar qatı,
Tap Qıratı, Ərəbatı,
Qocaldım, Eyvaz, qocaldım.

Koroğlu qorxmaz yağıdan,
Badə içibdi sağıdan,
Hanı Əhməd, Tüpdağıdan,
Qocaldım, Eyvaz, qocaldım.

4. Koroğlu üstlərinə düşmən gəldiyini Eyvaza bildirir və deyir ki, get Qıratla Ərəbatı tap, nallatdır gətir. Düşmənə təslim olmaqdansa, at üstündə mərdanə davada ölmək yaxşıdı.

5. Eyvaz atları tapıb nallatdırır. Koroğlu Eyvazı, atları görəndə könlü qalxıb deyir:

Budu gəldi havadarım,
Dur başına dolan, könlüm.
Bahar ilə dövr elərdim,
Zimistana dalan könlüm.

Qıratıma nal düzdürdüm,
Neçə düşman var əzdirdim,
Türfə gözəllər gəzdirdim,
İndi olub yalan könlüm.

Koroğluyam mərd-mərdanə,
Çığırıb girrəm meydana,
Qılınc basanda düşmana,
Paşa taxtdan salan könlüm.

6. Koroğlu Misri qılıncı belinə bağlayıb, polad qalxanı belinə keçirir və Qırata minir. Eyvaz da qılınc-qalxan qurşanıb Ərəbata minir, düşmənin yolunu gözləyirlər. O tərəfdən də paşa öz qoşunu ilə gəlib yetişir. Bunu görən Koroğlu üzünü Eyvaza tutub deyir:

Qoşun ilə gəldi paşa,
Düşmənləri seç, Eyvazım!
Yağı gərək çəksin haşa,
Tez hücuma keç, Eyvazım!

Dəli könül almır öyüt,
Qoca bədən, olma meyit,
Misri qılınc, həm tər iyit,
Al düşmanı biç, Eyvazım!

Qıratın nalı sökülməz,
Koroğlu beli bükülməz,
İyit ölümdən çəkilməz,
Yağı qanı iç, Eyvazım!

7. Koroğlu Eyvazla paşanın qoşununa hücum edir. Qoşundan qırılan qırılır, qırılmayan da baş alıb qaçır. Qoca Koroğlu ilə Eyvaz atlarını qamçılayıb Çənlibelə yollanırlar.

Əlyazması. İnv. №726 (4v)
"Koroğlunun qocalıq zamanı"

Söyləyəni *Aşıq Qəmbər*. Toplayanı qeyd edilməyib. Amma üstündəki əl yazısından xəttin H.Əlizadəyə məxsus olduğu görünür. Qol 21 aprel 1938-ci ildə Şəmkir rayonunun Zəyəm kəndindən toplanmışdır. Latın əlifbasında makinada yazılmış bu qol üstündə qəhvəyi mürəkkəblə əsaslı dəyişikliklər aparılmışdır. Cəmi 15 səhifədir.

1. Bu varianta görə, dəliləri başından dağıtmış Koroğlu, bir gün Qıratın üstündə yol gedir. O, qabağına yüklü bir öküz qatıb aparan kişiyə rast gəlir.

Başqa variantlarda olduğu tək burada da, çox çək-çevirdən sonra kişi tüfənglə öküzü güllələyib öldürür. Koroğlu öküzün haqqını verir, Qıratın nallarını çıxarıb atı çölə buraxır və bir daha Koroğluluq etməyəcəyini bildirir.

2. Bu varianta görə, paşaların qoşun çəkib Koroğlunun üstünə gəlməsi xəbərini Çənlibelə tacir Xoca Əhməd gətirir. Burada və bundan sonra hər yerdə "Xoca Əhməd" qəhvəyi mürəkkəblə pozulub yerinə "Aşıq Cünun" yazılmışdır.

Bu variantda da süjet digərlərində olduğu tək inkişaf etdirilir.

**Bəhlul Abdulla**

# SÖYLƏYİCİLƏR VƏ TOPLAYICILAR HAQQINDA

(Bütün qollar Azərbaycan MEA Folklor
İnstitutunun elmi arxivində qorunur.
Onların ancaq arxivdəki inventar
nömrələri göstərilir)

1. "Alı kişi". Söyləyəni Aşıq Əli, toplayanı H.Əlizadə, Qazax r-nu, 1937, qovluq №717.

2. "Koroğluynan Dəli Həsən". Söyləyəni Aşıq Həsənbala, toplayanı Ə.H.Tahirov, Dəvəçi r-nu (1935-1939-cu illərdə toplanıb), qovluq №716.

3. "Koroğlunun İstanbul səfəri". Söyləyəni Aşıq Abbas, toplayanı H.Əlizadə, Şəmkir r-nu, 1935, qovluq №717.

4. "Aşıq Cünun". Söyləyəni Aşıq Əli, toplayanı H.Əlizadə, Qazax r-nu, 1938, qovluq №725 (3).

5. "Koroğlunun Türkman səfəri". Söyləyəni Aşıq Əli, toplayanı H.Əlizadə, Qazax r-nu, 1934, qovluq №720.

6. "Dəmirçioğlunun Çənlibelə gəlməyi". Söyləyəni Aşıq Mirzə, toplayanı H.Əlizadə, Tovuz r-nu, 5 aprel 1938, qovluq №718.

7. "Koroğlunun Ərzurum səfəri". Söyləyəni Aşıq İbrahim Qaracaoğlu, toplayanı H.Əlizadə, Gəncə şəhəri, 21 aprel 1938, qovluq №719.

8. "Durna teli". Söyləyəni Aşıq İsrafil, toplayanı H.Əlizadə, Gəncə şəhəri, 2 mart 1938, qovluq №721.

9. "Koroğlunun Rum səfəri". Söyləyəni Aşıq Məhəmməd, toplayanı H.Əlizadə, Qazax r-nu, Canalı kəndi, 1934, qovlunq №723.

10. "Koroğluynan Bolu bəy". Söyləyəni Aşıq Sadıq, toplayanı H.Əlizadə, Qazax r-nu, 25 aprel 1938, qovluq №726 (2).

11. "Həmzənin Qıratı aparması", söyləyəni Aşıq Qoca, toplayanı H.Əlizadə, Tovuz r-nu, Bozalqanlı kəndi, 10 yanvar 1937, qovluq №722.

12. "Koroğluynan Ərəb Reyhan". Qolun arxiv nüsxələrində ifaçı və toplayıcı haqqında məlumat verilməmişdir.

13. "Koroğluynan Aypara". Söyləyəni Aşıq Cahandar, toplayanı Ə.H.Tahirov, Bakı şəhəri, Saray kəndi, 20 iyun 1936, qovluq №726 (7).

14. "Koroğlunun Bayazid səfəri", söyləyəni Aşıq Əli, toplayanı H.Əlizadə, Qazax r-nu, 1934, qovluq №724.

15. "Qulun qaçması". Söyləyəni Aşıq Mehdi Nəsib oğlu (toplayıcı göstərilməyib), Tovuz r-nu, 1935, qovluq №725.

16. "Ağcaquzu". Söyləyəni Aşıq Aslan Kosalı, toplayanı E.Məmmədli, Gürcüstan Respublikası, Qardabani r-nu, Kosalı kəndi, dekabr 1989 (xüsusi qovluq).

17. “Pərizad xanımın Çənlibelə gəlməyi”. Söyləyəni Aşıq Aslan Kosalı, toplayanı E.Məmmədli, Qardabani r-nu, Kosalı kəndi, 1989, (xüsusi qovluq).

18. “Mahru xanımın Çənlibelə gəlməyi”. Söyləyəni Aşıq Hüseyn Cavan, toplayanı M.Həkimov, Goranboy r-nu, Əzizbəyov kəndi, 1984, (xüsusi qovluq).

19. “Koroğluynan Bəylər”. Söyləyəni Əliş Səməd, toplayanı Ə.H.Tahirov, Bakı şəhəri, 1936, qovluq №726 (6).

20. “Koroğlunun Ballıca səfəri”. Söyləyəni Aşıq Muxtar, toplayanı H.Əlizadə, Ordubad r-nu, 1930, qovluq №726 (1).

21. “Koroğlunun Dərbənd səfəri”. Söyləyəni Şair Vəli, toplayanı H.Əlizadə, Tovuz r-nu, Bozalqanlı kəndi, 10 fevral 1932, qovluq №726 (3).

22. “Zərnişan xanımın Çənlibelə gəlməyi”. Söyləyəni Aşıq Hüseyn Saraclı, toplayanı M.Həkimov, Gürcüstan Respublikası, Bolinisi r-nu, Saraclı kəndi, 20-31 mart 1976 (xüsusi qovluq).

23. “Hasan paşanın Çənlibelə gəlməyi” (qolun arxiv nüsxələrində pasport məlumatı yoxdur), qovluq №1991 (2-ci qovluq).

24. “Mərcan xanımın Çənlibelə gəlməyi”. Söyləyəni Abbas İman oğlu Vəliyev, toplayanı Əli Qurbanov, Kəlbəcər r-nu, 1974 (xüsusi qovluq).

25. “Koroğlunun qocalığı”. Söyləyəni Aşıq Məhəmməd, toplayanı H.Əlizadə, Tovuz r-nu, 1938, qovluq №726 (4).

# L Ü Ğ Ə T

A x ç a – pul vahidi
A x t a r m a – qənimət
A l – hiylə; qırmızı; küpəgirən qarı, ifritə
A r ə s t ə – bəzənmiş, süslənmiş, hazır
A r x a l ı q – geyim, paltar növü
A r z u m a n – arzu, istək, həsrət

B a c – vergi, rüsum, təzminat
B a d ə – şərab, çaxır. Eposda qədəh mənasında işlənir
B a q q a l – ərzaq, yeyinti malları satıcısı
B a r – meyvə
B a r x a n a – malların bir dəstəsi, tayı
B a r i g a h – saray, iqamətgah
B a t m a n – çəki vahidi
B a z – şahin, tərlan. Quş ovu üçün öyrədilən ovçu quşu
B a z b u r u t – boy-buxun, görkəm
B a z u – qol; qüdrət, əzəmət
B a z u b ə n d (b a z m ə n d ) – qolbağ; içərisinə nəzir duası qoyulmuş meşin və ya parça
B ə d h e s a b – namərd, haqsız
B ə d k u y – bədxasiyyət, pis təbiətli
B ə d o y – cins at
B ə l ə n – dağ aşırımı
B ə n d ə r g a h – girəcək, keçid (liman)
B ə r ə – keçid
B ə y m ə n d – sinəbəndin qolları
B ə z i r g a n – tacir
B i h u ş d a r ı – bihuş edən dərman, yuxu dərmanı
B i n ə – məskən, yaşayış yeri
B r o y – yeri, get
B u l q a – yaşmaq

